*Bu kitab "**Firidun bəy Köçərli**. Azərbaycan ədəbiyyatı. İki cilddə. I cild" (Bakı, Elm, 1978) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni, müqəddimə, izah və qeydlərin müəllifi: **Ruqiyyə Qənbərqızı**

Redaktorları: **Əziz Mirəhmədov**
**Bəkir Nəbiyev**

**894.36109 – dc 21**
**AZE**
**Köçərli Firidun bəy. Azərbaycan ədəbiyyatı.** İki cilddə. I cild. Bakı, "AVRASİYA PRESS", 2005, 560 səh.

Azərbaycan ədəbiyyatının görkəmli nümayəndəsi, alim, tənqidçi və pedaqoq Firidun bəy Köçərlinin "Azərbaycan ədəbiyyatı" adlı fundamental əsərində ədəbiyyat tariximizin ən önəmli səhifələri, ədəbi proseslər elmi ardıcıllıqla nəzərdən keçirilmişdir. İndi də öz ədəbi və elmi dəyərini itirməyən "Azərbaycan ədəbiyyatı" əsəri milli-bədii söz sənətimiz haqqında mötəbər məxəz sayılmış və sayılmaqdadır.

**ISBN 9952-421-16-6**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# FİRİDUN BƏY KÖÇƏRLİ VƏ ONUN "AZƏRBAYCAN ƏDƏBİYYATI" ƏSƏRİ

Məşhur Azərbaycan alimi, tənqidçi və pedaqoqu Firidun bəy Əhməd ağa oğlu Köçərli (1863-1920) və onun oxucuya təqdim olunan bu samballı əsəri Azərbaycan ədəbiyyatşünaslığı, tənqidi və estetik fikri tarixində şərəfli yerlərdən birini tutur.

Qırx illik fəaliyyətini doğma xalqının ictimai və mədəni tərəqqisinə həsr edən Köçərli dahi mütəfəkkir-yazıçı M.F.Axundzadəun maarifçilik ənənələrinin fəal təbliğatçısı və yorulmaz davamçısı olmuşdur.

F.Köçərlinin fəaliyyətə başladığı XIX əsrin səksəninci illəri Azərbaycan millətinin təşəkkül etdiyi, milli şüurunun getdikcə qüvvətləndiyi bir dövr idi. Bu zaman "çar hökuməti və yerli irticaçıların hər cür maneələrinə baxmayaraq, mədəniyyət, ədəbiyyat, incəsənət və elm sahəsindəki yeniliklər Azərbaycana da nüfuz edirdi.

XIX əsrin ikinci yarısında Azərbaycanda bəzi elmlər, realist dramaturgiya, nəsr və nəzm inkişaf edir, ədəbiyyat ideyaca zənginləşir, Azərbaycan milli teatrının əsası qoyulurdu. Bir sıra şəhərlərdə əvvəlcə rus dilində, sonralar isə yerli dillərdə qəzetlər nəşr edilməyə başladı, kitablar və jurnallar meydana çıxdı...[1]

Azərbaycan ədəbiyyatı tarixini sistemli bir halda öyrənmək, yaratmaq ideyası da məhz bu illərdə möhkəmlənməyə başlamışdı. F.Köçərlinin "Татарские комедии" silsilə məqalələri[2] bu ideyanın ilk, nisbətən konkret və məhdud ifadəsi olsa da, onun gələcək "Литература азербайджанских татар"[3] və "Azərbaycan türklərinin[4] ədəbiyyatı" əsərləri üçün təməl daşları idi.

F.Köçərlinin çoxəsirlik Azərbaycan ədəbi irsini toplayıb, elmi prinsip və ardıcıllıqla öyrənərək öz tədqiqatının nəticələrini "Azərbaycan ədəbiyyatı" əsərində xalqın istifadəsinə verməsi onun ən böyük xidməti sayılır. Bu əsəri yazmaqla Köçərli müasir Azərbaycan ədəbiyyat tarixçiliyi elminin əsasını qoymuş və beləliklə, gələcək tədqiqatçılar üçün geniş bir yol açmışdı.

---

[1] Azərbaycan tarixi. Üç cilddə. II cild, Bakı, 1964, səh.334

[2] Ф. Кочарлинский. Татарские комедии. "Новое обозрение", qəz., 3, 7, 16 iyun 1895, №№ 3924, 3928, 3937

[3] Yenə onun. Литература азербайджанских татар. Tiflis, 1903. Tədqiqat əsərlərində kitab çox vaxt "Azərbaycan tatarlarının ədəbiyyatı" adlandırılır. Halbuki onu Köçərlinin özü kimi "Azərbaycan türklərinin ədəbiyyatı" və yaxud hələ o dövrdə tatar qəzeti "Tərcüman"da (17 oktyabr 1903, № 46), həmçinin alimin son zamanlar nəşr edilmiş "Seçilmiş əsərləri"ndə (Bakı, 1963, səh.43) olduğu kimi "Azərbaycan ədəbiyyatı" adlandırmaq daha düzgün olar.

[4] Bu müqəddimədə Köçərlidən gətirilən misallarda və kitabın hər iki cildinin mətnində "türk" sözü "Azərbaycan" (məs., "türk ədəbiyyatı" - "Azərbaycan ədəbiyyatı") və "azərbaycanlı" mə'nasında işlənmişdir.



* * *

"Azərbaycan ədəbiyyatı"nın yazıldığı dövrdə və ondan əvvəl Yaxın və Orta Şərq, həmçinin qonşu xalqlar ədəbiyyatşünaslığında olmasa da rus ədəbiyyatşünaslıq elmi sahəsində çox işlər görülmüşdü. Rus ədəbiyyatşünaslığı P.A.Yefremov, M.Qlazunov, L.N.Maykov, S.A.Venqerov, A.N.Pıpin, V.A.Nikolski, D.N.Ovsyaniko-Kulikovski, M. N.Speranski, N.K.Piksanov və başqalarının[5] yazdıqları, tərtib və ya nəşr etdikləri mükəmməl ədəbiyyat tarixləri, monoqrafiyalar, bioqrafik lüğətlər və s. əsərlərlə zəngin idi. Bu əsərlərdə rus yazıçılarının həyat və yaradıcılığı geniş və hərtərəfli təhlil olunur, ədəbiyyatşünaslıq elminin ayrı-ayrı məsələləri haqqında qiymətli mülahizələr söylənir, rus ədəbiyyatı tarixinin sistemli bir şəkildə tədqiqi sahəsində uğurlu addımlar atılırdı.

Azərbaycan ədəbiyyatşünaslığı isə hələ də təzkirə, çüng və müntəxəbat şəklindən uzağa gedə bilməmişdi. Əsrlər boyu təzkirə müəllifləri öz əsərlərini fars dilində yazmış və ona bu dildə yazan yazıçıları daxil eləmişdilər. Əhməd Razi, Lütfəli bəy Azər, Mirzə Tahir Nəsrabadi, Əlişir xan və b. təzkirəçilərin əsərlərində yalnız fars dilində yazan Azərbaycan şairlərinə yer verilmiş, ana dilində yazıb yaradan böyük sənətkarlar isə kənarda qalmışdı[6]. XIX-XX əsr Azərbaycan təzkirəçilərinə gəldikdə isə, akademik H.Araslının göstərdiyi kimi, onlar "orta əsr təzkirə müəlliflərindən o qədər də irəli gedə bilməmiş, qədim təzkirəçilərə az-çox əlavələr etsələr də, əsas yazıçıları əhatə edə bilməmişdilər"[7]. Doğrudan da Seyid Əzim Şirvani[8], Həsənəli xan Qaradaği[9], Mirmöhsün Nəvvab[10], Məhəmməd ağa Müctəhidzadə[11] və Məhəmmədəli Tərbiyət[12] kimi təzkirəçilər Azərbaycan dilində yazan son

---

[5] П.А.Ефремов. Материалы для истории русской литературы. СПб. 1867; М.Глазунов. Русская народная лирика (песни обрядовые, песни семейные, песни бытовые, песни удалые, обясителные статьи). СПб, 1894; Л.Н.Майков. Очерки из истории русской литературы XVII-XVIII столетий. СПб, 1889; Yenə onun. Историко-литературные очерки. СПб, 1895; С.А.Венгеров. Русская поэзия. В 3-х томах. I том. СПб, 1897; А.Н.Пыпин. История русской литературы. В 4-х томах. СПб, 1902-1903; В.А.Никольский. Сто русских писателей. СПб, 1904; Д.Н.Овсянико-Куликовский. История русской литературы XIX века. В 5-х томах. М.; 1908; М.Н.Сперанский. История новой русской литературы. М., 1910; Н.К.Пиксанов. Хронология русской литературы. СПб, 1914

[6] H.Araslı. XVII -XVIII əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 1956, səh.6

[7] Yenə orada.

[8] Seyid Əzim Şirvani. Əsərləri. Üç cilddə, III cild. Bakı, 1974

[9] Həsənəli xan Qaradaği. Təzkireyi-Qaradaği. RƏF, inv. 7602

[10] Mirmöhsün Nəvvab. Təzkireyi-Nəvvab. Bakı, 1913

[11] Məhəmməd ağa Müctəhidzadə. Riyazül-aşiqin. İstanbul, 1901

[12] Məhəmmədəli Tərbiyət. Danişməndani-Azərbaycan. Tehran, 1937

dövr şairlərinə xüsusi diqqət yetirsələr də, onların əsərlərində XVII-XVIII əsrlərin şairlərinə yer verilməmişdi.

Təzkirələrdə müəlliflər haqqındakı çox qısa məlumatlar faktik materiallar əsasında yazılıb bioqrafik və biblioqrafik səciyyə daşıyırdı. Çox vaxt təzkirəçi bu və ya başqa yazıçının adını, təxəllüsünü, doğum və ölüm tarixlərini, yerini və onun bəzi əsərlərinin adını göstərməklə kifayətlənirdi. Bundan sonra şairin əsərlərindən bir-iki nümunə verməklə təzkirə müəllifi öz işini bitmiş hesab edirdi.

Təzkirələrdən fərqli olaraq, poetik müntəxəbatlar yalnız ayrı-ayrı şairlərin əsərlərindən nümunələr əsasında tərtib olunurdu. Mirzə Yusif Qarabağinin "Məcmueyi-Vaqif və müasirini-digər"[13], Adolf Berjenin "Qafqaz və Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir"[14], Hüseyn əfəndi Qaibovun "Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir"[15] kimi mətbu və qeyri-mətbu məcmuələr Azərbaycan ədəbiyyatı nümunələrini əhatə baxımından dövrünə görə qiymətli əsərlər olsalar da, yenə naqis idilər. Bu müntəxəbatlar ayrı-ayrılıqda bütün Azərbaycan ədəbiyyatını əks etdirmirdi. Məsələn, M.Y.Qarabağinin məcmuəsinə Vaqif dövrünün (XVIII əsrin) və XIX əsrin birinci yarısının bir sıra şairləri daxil idi. A.Berjenin məcmuəsi isə "Qafqaz və Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir" adlandırılmasına baxmayaraq, onda əsasən Qarabağ şairlərinin əsərləri toplanmışdı. Köçərli düzgün yazırdı ki, bu əsər "Qarabağ şüərasının aşarı" təsmiyə olunsaydı, dəxi də haqq və savab olardı"*. H.Qaibovun müntəxəbatı isə bunlardan həcminin və əhatə dairəsinin nisbətən geniş olması ilə fərqlənirdi.

Əgər M.Y.Qarabağinin məcmuəsində əsas yer, təqribən kitabın üçdə ikisi Vaqifə verilib, Vidadi, Nişat Şirvani, Aşıq Pəri, Məhəmməd bəy Aşiq, Əsəd bəy, Ağaməsih Şirvani, Nabi əfəndi, Əhməd Şirvani, Mirzə Sadıq və Qasım bəy Zakirdən, A.Berjenin əsərində isə kitabın 113 səhifəsi** Vaqif və Zakirə həsr edilib, Ağaməsih, Aşıq Qənbər, Canıoğlu, Baba bəy Şakir, Mehdi bəy, M.F.Axundzadə və Aşıq Pəridən bir-iki şeir verilirdisə, H.Qaibovun "Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir" müntəxəbatı yüzə yaxın şairi əhatə edirdi. Burada yuxarıda göstərilənlərdən əlavə Qövsi, Aciz, Seyid Əzim, Abdulla bəy Asi və bir çox başqalarının əsərlərindən də nümu-

[13] M.Y.Q a r a b a ğ ı. Məcmueyi-Vaqif və müasirini-digər. Teymurxanşura, 1856

[14] Adolf B e r j e. Qafqaz və Azərbaycanda məşhur olan şüəranın əş'arına məcmuədir. Leypsiq, 1867

[15] Hüseyn əfəndi Q a i b o v. Azərbaycanda məşhur olan şüəranın əş'arına məcmuədir. Dörd cilddə. RƏF, I cild, A-131; II cild, A-132; III cild, A-133; IV cildə, A-134

* Bu nəşrin birinci cildindən gətirilən sitatların yeri oradaca mötərizədə göstərilir (ilk rəqəm - cild, ikincisi - səhifə). İkinci cilddən gətirilən sitatların yeri əsərin ilk nəşri üzrə qeyd olunur (ilk rəqəm - cild, ikinci - hissə, üçüncü - səhifə).

** Kitab 128 səhifədən ibarətdir



nələr gətirilmişdir. Qarabağinin məcmuəsində M.P.Vaqifi, Berjenin kitabında M.P.Vaqifi və Q.Zakiri – ən məşhur şairləri əvvəldə vermək prinsipi güdülürsə, Qaibovun əsərində heç bir qaydaya riayət olunmur. Onun əsərinin birinci cildi Zakir, ikinci cildi Vidadi, üçüncü cildi Aciz, dördüncü cildi Vaizlə başlanır. Əsərin tərtibində müəyyən bir prinsipin gözlənilməməsi ilk baxışdan diqqəti cəlb edir. Bəzən müəyyən bir şairin əsərləri kitabın bir neçə cildində verilir. Məsələn, Zakirin şeirləri birinci cildin 1-186, üçüncü cildin 863-867-ci səhifələrində gedir. Bu hələ əsərin ağartması – son variantı idi. F.Köçərlinin əlinə isə onun qaralması – bir cildlik "Məcmuə"si[16] düşmüşdü ki, o isə tərtibinə görə daha aşağı səviyyəli məxəz idi.

Doğma ədəbiyyatına aid təzkirə, məcmuə və müntəxəbatların bu cür birtərəfli, yarımçıq, naqis, sistemsiz yazılması və tərtibi Köçərlini Azərbaycan ədəbiyyatını daha artıq səylə toplayıb nizama salmağa və dövrün yeni elmi tələblərinə müvafiq tədqiq etməyə çağırırdı.

F.Köçərli "Azərbaycan ədəbiyyatı" üzərində işə başlarkən artıq ədəbi irsdən müəyyən qədər material toplamışdı. O.L.Azər, M.Y.Qarabaği, A.Berje və H.Qaibovun təzkirə və məcmuələrini, Füzuli, Qövsi, Aciz, Nəbati, M.F.Axundzadə, S.Əzim, M.Talıbov və başqalarının çap olunmuş əsərlərini, əlyazma divanlarını, çətinliklə də olsa, ələ gətirə bilmişdi. Klassiklərin tərcümeyi-hallarını yazmaq isə olduqca mürəkkəb bir iş idi.

O zaman Azərbaycanda ən qiymətli əlyazmalarının, çap kitablarının, qəzet və jurnal komplektlərinin əsas qisminin xüsusi əllərdə, xüsusi kitabxanalarda saxlanıldığı, tək-tək kitabxana və arxivlərdə zəngin kolleksiyalar olduğu, nəhayət, bütün bu elmi və ədəbi məxəzləri əldə edib öyrənməyin çətinlikləri nəzərə alınarsa, "Azərbaycan ədəbiyyatı" müəllifinin nə qədər ağır bir şəraitdə işlədiyi daha da aydınlaşar.

Alim hər hansı bir yazıçının tərcümeyi-halına dair məlumat toplamaq üçün ilk növbədə onun öz kitablarına, divanlarına müraciət edirdi. Lakin əksər hallarda o, istədiyinə nail ola bilmirdi. Çünki bu divanların çoxunda xəttatın, naşirin özü, hətta "abavü əcdadı" belə göstərildiyi halda, yazıçı haqqında bir-iki kəlmə də olsun yazılmırdı. Tədqiqatçı göstərirdi ki, "nədənsə bizim türk şüərasından bir çoxu öz əsl və nəsəblərindən və hansı zaman və məkanda dünyaya gəlib zindəganlıq etdiklərindən bir əsər və nişan qoymayıblar. Bu barədə heç olmazsa yeddi yüz sənə bundan müqəddəm dünyaya gələn farsların həkimi-danişməndi və şairi-ərcüməndi Şeyx Sədiyə peyrəvilik edib, öz əsr və zamanlarına da bir işarə etsə idilər, kifayət edərdi" (I, 239). Odur ki, tərcümeyi-halların tərtibi üçün başqa məxəzlərə müraciət etmək lazım gəlir. Alim təzkirələrdə, mətbu və qeyri-mətbu elmi kitablarda, mətbuat orqanlarında klassik ədəbiyyatın ayrı-ayrı nümayəndələri haqqında verilən bioqrafik və biblioqrafik məlumatlardan ilk məxəz kimi istifadə edir.

[16] H.Q a i b o v. Məcmuə. RƏF, S - 1091

L.Azərin "Atəşkədə"[17], A.Bakıxanovun "Gülüstani-İrəm"[18], İ.Şerrin "Всеобщая история литературы"[19], Ş.Saminin "Qamusül-əlam"[20], M.M.Axundovun "Nizami"[21] kitabları qədim və orta əsrlər ədəbiyyatı nümayəndələrini tədqiq etməkdə onun bələdçisi olur. F.Köçərli Məhəmməd Cəlalın "Osmanlı ədəbiyyatı nümunələri"[22] əsərindən Füzulinin, Ə.Həsənzadənin "Dəbistan" jurnalında çap etdirdiyi məqalədən[23] Əlişir Nəvainin, M.Y.Qarabağinin "Məcmueyi-Vaqif və müasirini-digər" kitabının müqəddiməsindən və Mirzə Camalın "Qarabağ tarixi" əsərinin M.M.Xəzani tərəfindən üzü köçürülmüş nüsxəsindən[24] M.P.Vaqifin, "Gülüstani-İrəm"dən A.Bakıxanovun, "Kəşkül" qəzetindən[25] M.F.Axundzadənin tərcümeyi-halına dair məlumat əldə edir.

Tədqiqatçı tarixi-coğrafi oçerklər üçün materialları isə əsasən "Gülüstani-İrəm", "Asarül-Cəmal", "Qarabağ tarixi"[26], "Asari-Dağıstan"[27], "Dərbəndnamə"[28] kimi tarixi əsərlərdən götürür.

Əlbəttə, çoxəsrlik tarixi keçmişi olan ədəbiyyatın nümayəndələrini tədqiq etmək üçün yuxarıda adları çəkilən məxəzlər həddindən artıq az idi. Odur ki, alim o zaman Rusiyada geniş yayılmış bir üsuldan da istifadə etməyə başlayır: dövrünün, demək olar, bütün görkəmli Azərbaycan ziyalılarına – yazıçılara, şairlərə, müəllimlərə, keçmiş ədəbi simaların qohum-qardaşlarına məktub yazıb, Azərbaycan ədəbiyyatı və folkloruna aid bildikləri, eşitdikləri və gördüklərini yazmağı, toplamağı və ümumi işin xeyri üçün ona göndərməyi onlardan xahiş edir. Qeyd etmək lazımdır ki, "Yüz rus yazıçısı" kitabının tərtibçisi V.A.Nikolski də əsərdəki materialların əksəriyyətini məhz bu yolla əldə edə bilmişdi[29].

F.Köçərli bu üsulla xeyli material toplayır. Qabaqcıl ziyalılardan Eynəli bəy Sultanov, Mehdi bəy Hacınski, Rəşid bəy Əfəndiyev, Ağaəli bəy Naseh, Abbas Səhhət, Abdulla Şaiq və başqaları ona xeyirxah işində böyük kömək

---

[17] L.A z ə r. Atəşkədə. Bombey, h.1277

[18] F.K ö ç ə r l i. "Gülüstani-İrəm"in rus dilində olan nüsxəsindən istifadə etmişdir (I, 143)

[19] И.Ш е р р. Всеобщая история литературы. СПб, 1879

[20] Ş.S a m i. Qamusül-əlam. Dörd cilddə. İstanbul, h.1306-1316

[21] M.M.A x u n d z a d ə. Nizami. Gəncə, h.1337

[22] Məhəmməd C ə l a l. Osmanlı ədəbiyyatı nümunələri. İstanbul, h.1312

[23] Ə.H ə s ə n z a d ə. Əlişir Nəvai. "Dəbistan" jurn., 1907, № 3

[24] M.M.X ə z a n i. Asarül-Cəmal. RƏF, B - 3336

[25] "Kəşkül" qəz., 1887, №№ 43, 44, 45

[26] Ахмед бек Д ж а в а н ш и р. О политическом существовании Карабагского ханства с 1747 по 1805 год. "Кавказ" qəz., 1884, №№ 139, 150, 154, 161, 167

[27] H.Ə l q ə d a r i. Asari-Dağıstan. Bakı, 1903

[28] M.C.S ü p e h r i. Dərbəndnamə. Dərbənd, 1891, RƏF, B - 333

[29] B.A.Н и к о л с к и й. Сто руссих писателей, səh.5



göstərirlər. Təbii ki, Köçərli material toplayıb göndərənlərin əməyini heç də itirməmiş, məktublarında olduğu kimi, "Azərbaycan ədəbiyyatı"nda da yeri gəldikcə onların bəzilərinin adını hörmət və minnətdarlıqla çəkmişdir. Əsərin əvvəlində isə alim yazmışdır: "Əşxasi ki, zəhmət çəkib mənə əhvalat cəm ediblər, boynuma böyük minnət qoyublar və milli şairlərimizin əhyası üçün himmət sərf ediblər" (I, 68).

F.Köçərli topladığı materiallar əsasında, bu vaxta qədər Azərbaycan ədəbiyyatına dair tərtib olunan əsərlərdən fərqli olaraq, bu ədəbiyyatın tarixini elmi şəkildə meydana çıxarır. Akademik K.Talıbzadənin qeyd etdiyi kimi, alim "təzkirəçiliyin çərçivəsini dağıdıb ədəbiyyat tarixinin tədqiqinə yeni bir istiqamət verir"[30].

* * *

F.Köçərli Azərbaycan ədəbiyyatı tarixinə aid əsər yazmaq fikrinə "XIX əsrin sonlarında"[31], "hələ İrəvən gimnaziyasında müəllimlik etdiyi illərdə [1885-1895-ci illərdə – *R.Q.*]"[32] düşmüşdü. Elə bu illərdən o, axtarışlar apararaq Azərbaycan ədəbiyyatına dair əlinə keçən böyüklü-kiçikli hər bir mətbu əsəri, əlyazmasını, məlumatı səylə toplamağa, tədqiq edib öyrənməyə başlamışdı. Alimi belə bir maraqlı, həm də çətin, mürəkkəb və məsuliyyətli işə təşviq edən Nizami, Füzuli, Vaqif, Zakir, Seyid Əzim və başqa məşhur klassikləri olan bu ədəbiyyatın o vaxtadək sistemli bir halda öyrənilməməsi, onun, müxtəsər də olsa, tarixinin yazılmaması idi. Bunun nəticəsi idi ki, bəzən hətta dövrün görkəmli ziyalıları belə dünya ədəbiyyatı xəzinəsinə misilsiz əsərlər vermiş Azərbaycan ədəbiyyatı haqqında həqiqətə uyğun olmayan fikirlər irəli sürürdülər. Məsələn, A.Berjenin "Qafqaz və Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir" əsəri vasitəsilə Vaqif, Zakir, Aşıq Pəri və b. şairlərin yaradıcılığı ilə tanış olan Eynəli bəy Sultanov F.Köçərlinin 1892-ci ildə nəşr etdirdiyi A.S.Puşkinin "Balıqçı və balıq nağılı"nın tərcüməsi[33] haqqındakı resenziyasında bu tərcümə əsərinin məziyyət və nöqsanlarından danışarkən azərbaycanlıların Vaqif, Zakir, Nəbati və başqaları tərəfindən yaradılmış "orijinal poeziya"sı olduğunu qeyd etdiyi halda, səhv olaraq guya "əsl mənada ədəbiyyat"ı olmadığını iddia edirdi[34].

---

[30] Kamal T a l ı b z a d ə. XX əsr Azərbaycan ədəbi tənqidi. Bakı, 1966, səh.257

[31] M.A r i f. Ədəbiyyat tariximiz. Azərbaycan ədəbiyyatı tarixi. Üç cilddə. I cild. Bakı, 1960, səh.6

[32] K.T a l ı b z a d ə. Firudin bəy Köçərli. Azərbaycan ədəbiyyatı tarixi. II cild. Bakı, 1960, səh.500; Yenə onun. XX əsr Azərbaycan ədəbi tənqidi, səh.434; Bəkir N ə b i y e v. Firidun bəy Köçərli (həyatı və yaradıcılığı). Bakı, 1963, səh.100

[33] A.S.P u ş k i n. Tərçu və balıq. Tərcümə edəni: F.Köçərli. İrəvan, 1892, 12 səh

[34] E.C-в. [Ейналы бек Султанов]. Библиография. "Новое обозрение" qəz., 31 yanvar 1892, H.2788

Bir tərəfdən qardaş xalqların öz ədiblərinin tarixi xidmətlərini təqdir edərək əsərlərini dəfələrlə çap etdiklərini, onların yubileylərini bayram kimi keçirdiklərini görən, digər tərəfdən isə zəngin doğma ədəbiyyat haqqında belə yazılarla rastlaşan Köçərli fikrə dalaraq öz-özünə suallar verirdi: "Aya, biz Azərbaycan türklərinin Sereteliləri və Çavçavadzeləri olmayıbdırmı? Bizim milli şairlərimiz ərseyi-dünyaya gəlməyibdirmi? Aya, bizlər belə möhtərəm şəxslərin vücudundan məhrummu qalmışıq?"[35]. Yaxud: "aya... biz də öz ədiblərimizin şan və şərafətini, qədr və qiymətini dərk edəcəyikmi?"[36].

F.Köçərli onu düşündürüb narahat edən belə suallara məhz tədqiqat nəticəsində cavab tapır. Ona birdəfəlik aydın olur ki, "bizim də çox böyük, müqtədir və xoştəb milli şairlərimiz olubdur və lakin, məəttəəssüf, onların qədr və qiyməti nə öz vaxtlarında və nə bu halda bilinməyibdir"[37].

Bu sözləri yalnız öz elmi amalını həyata keçirməkdə çətinliklərə rast gələn bir ədəbiyyat tarixçisinin şikayətləri kimi qiymətləndirmək sadəlövhlük olardı. Məsələ onda idi ki, "şan və şərafətimizə, vətən və millətimizin sərəfrazlığına səbəb olan, dilimiz və ədəbiyyatımıza rövnəq verən" Azərbaycan yazıçılarının irsinə Köçərli təkcə bir milli tarixi sərvət kimi baxmır, onu öz dövrü, öz həmvətənləri üçün böyük ideya-estetik tərbiyə, ictimai-mədəni tərəqqi vasitəsi hesab edirdi: "Hərgah Vaqif və Vidadi kimi məşhur şairlər özgə millətlərin arasında zühur etmiş olsa idilər, bişübhə, indiyə kimi onların asar və əş'arı dəfəat ilə çapdan çıxıb əbnayi-millət içində yayılmışdı. Onların qəbirləri üstündə nişangah qoyulmuşdu və vəfatlarının əlli və yüz sənəlik yubileyi – yövmi-alisi artıq cəlal və təntənə ilə yad olunmuşdu.

Amma bizim türklərdə bu hissiyyat və qədrşünaslıq yoxdur. Şan və şərafətimizə, vətən və millətimizin sərəfrazlığına səbəb olan, dilimiz və ədəbiyyatımıza rövnəq verən əziz və möhtərəm vücudların qədr və mənzilətini bilmirik və onların asari-güzidələri ilə iftixar etmirik. Əzbəs ki, avamıq və avamlığımızdan milliyyət hissi bizlərdə ayılmayıbdır, vətənimizin, dilimizin və ədəbiyyatımızın qədrini bilmirik" (I, 214). Bununla belə, uzaqgörən alimə təsəlli verən zəngin ədəbi irsin yavaş-yavaş üzə çıxmağı və bir də onun işıqlı gələcəyə böyük inamı idi. O inanırdı ki, bir gün gələcək, xalqın "zirək və qədrşünas balaları" Azərbaycan yazıçılarının əsərlərini üzə çıxarıb öyrənəcəklər, o zaman gənclik "onların şan və şöhrətini uca məqama qalxızarlar və unudulmuş əsərlərini intişar etməklə adlarını zində qılarlar. Çünki bizim şüəra cismən ölüb fövt olublarsa da, ruhən və mənən həlak olmayıblar". "Farsların Sə'disi və Hafizi diri qalan kimi, bizlərin də Zakiri və Seyidi, Nəbatisi, Saliki, Arifi, Kamisi gərəkdir diri qalsınlar".

[35] F.K ö ç ə r l i. Seçilmiş əsərləri, səh.175

[36] Yenə orada, səh.213

[37] Yenə orada, səh.175



Əlbəttə, bu sözləri yazmaqla Köçərli böyük elmi, mədəni əhəmiyyəti olan bu işi özgələrin, yalnız gələcək nəslin öhdəsinə qoymaq fikrində deyildi. O, sözü ilə işi düz gələn şəxsiyyət olduğu üçün ilk növbədə özü bu istiqamətdə gərgin, səmərəli fəaliyyətə başlamışdı.

Topladığı ilk materiallar əsasında Köçərli əvvəlcə 1895-ci ilin ortalarında "Татарскийе комедии" silsilə məqalələrini çap etdirir. 1903-cü ilin ikinci yarısında isə onun "Azərbaycan türklərinin ədəbiyyatı" kitabçası çıxır. Azərbaycan ədəbiyyatı tarixçiliyi sahəsində yazılmış bu ilk əsər mütərəqqi ziyalılar tərəfindən böyük maraq və sevinclə qarşılanır. Onun müəllifinə dostlarından, tanışlarından, ədəbiyyat həvəskarlarından çoxlu təbrik məktubları, teleqramları gəlir[38].

Əsərin rus dilində yazılması onun daha geniş yayılmasına, şöhrət qazanmasına səbəb olmuşdu. Ölkənin çox yerindən sifarişlər gəlirdi. Polşadan Köçərliyə həmin əsəri almaq arzusunda olanların ünvanları ilə bərabər böyük bir siyahısı göndərilmişdi[39]. Kitabı Omskda əldə edib oxuyan Məhəmmədov familiyalı bir nəfər 1903-cü ildə müəllifə yazmışdı: "Sizi inandırıram ki, Rusiyanın müsəlmanları Sizin bu əsəriniz çıxmayınca Azərbaycan ədəbiyyatından heç nə bilməzdilər"[40].

"Şərqi-Rus", "Каспий", "Tərcüman" və "Тифлисский листок" qəzetlərində kitabın qısa məzmununu verən və müəllifin Vaqif, Zakir, M.F.Axundzadə, S.Ə.Şirvani yaradıcılığını düzgün qiymətləndirdiyini təsdiq edən resenziya və qısa xəbərlər dərc olunmuşdur[41]. "Тифлисский листок" qəzetindəki resenziyada deyilirdi ki, müasir oxucunun böyük əksəriyyətinə Azərbaycan ədəbiyyatı haqqında "...heç bir şey məlum deyildir. Onunla ancaq bəzi mütəxəssislər tanışdırlar. Buna görə də bir neçə gün əvvəl haqqında müxtəsər məlumat verdiyimiz F.Köçərlinin yenicə çıxmış, azərbaycanlıların ədəbiyyatına həsr olunan kitabçası xüsusi maraq oyadır"[42].

F.Köçərlinin əvvəlcə "Кавказский вестник" məcmuəsində[43] nəşr olunmuş həmin əsərinin kitabça şəklində çap etdirilməsini alqışlayan, onun əhəmiy-

[38] F.A ğ a z a d ə. [Şərqli]. Firidun bəy Köçərlinin bioqrafiyası. Nizami adına Ədəbiyyat İnstitutunun elmi arxivi, inv. 566, səh.31

[39] Azərbaycan klassik yazıçı və şairlərinin ayrı-ayrı əsərlərinin siyahısı. RƏF, arx. 24, Q-1(15), inv.17953

[40] F.A ğ a z a d ə. Göstərilən yazısı, səh.31

[41] Rəşid bəy Ə f ə n d i y e v. Azərbaycan türklərinin ədəbiyyatı. "Şərqi-Rus" qəz., 29 oktyabr 1903, № 89; Литература азербайджанских татар. "Каспий" qəz., 31 oktyabr 1903, № 234; "Azərbaycan ədəbiyyatı. "Tərcüman" qəz., 17 noyabr 1903, № 46; Литература азербайджанских татар. "Тифлисский листок" qəz., 16 dekabr 1903, № 289

[42] Sitat K.Talıbzadənin "XX əsr Azərbaycan ədəbi tənqidi" kitabından götürülmüşdür (səh.56)

[43] Ф.К о ч а р л и н с к и й Литература азербайджанских татар, "Кавказский вестник" журн., 1901, №5

yəti ilə yanaşı bəzi nöqsanlarını da göstərən "Каспий" qəzeti isə, alimi bu tədqiqat işini davam etdirərək bütün Azərbaycan ədəbiyyatını əhatə edən əsər yazmağa çağırır və həm də xalqa belə bir xidməti doğma ədəbiyyatını dərindən bilən, sevən, təbliğ edən Köçərli kimi ziyalıya borc bilirdi: "Bu kitabı oxuyarkən qarşıya çıxan bir çox məsələləri o, cavabsız qoymuşdur. Bununla belə cənab Köçərliyə qarşı çox da tələbkar olmayaq. "Azərbaycan türklərinin ədəbiyyatı"nı tərtib etməkdə o, ilk təcrübə aparmışdır ki, buna görə çox sağ olsun. Ümidvarıq ki, tərtibçi bu təcrübəsi ilə kifayətlənməyəcək və doğma ədəbiyyatına dair hazırkı icmalı üzərində işləyəcəkdir"[44].

Əsərin Azərbaycan dilində yazılmasını arzulayanlar da çox idi. Rəşid bəy Əfəndiyev "Şərqi-Rus" qəzetində dərc etdirdiyi resenziyasında yazırdı ki, həmin məcmuə Azərbaycan dilində daha faydalı, daha lazımlı olardı[45]. Bu fikrə F.Ağazadədə də rast gəlirik: "Hər yandan məktublar yağdırılırdı ki, bu əsər ikinci dəfə türk dilində və daha müfəssəl çap etdirilsin"[46]. O zaman Odessada təhsil alan N.Nərimanov məktublarının birində tələbə yoldaşlarının və özünün arzusunu F.Köçərliyə belə bildirmişdi: "Sizin bu kitabçanız bütün türk tələbələrinin xoşuna gəldi. Tələbələr bilirlər ki, Sizin daha çox materiallarınız var, bunları Siz türkcə çap etdirmək xəyalındasınız, ona görə şad oldular və bunun türkcəsini çapda görmək arzusundadırlar"[47].

Çox maraqlıdır ki, Köçərlinin ilk kitabçası çap olunandan sonra bir sıra ədəbiyyat həvəskarlarında belə bir işə girişməyə həvəs oyanmışdı. O zaman ticarətlə məşğul olan, sonralar isə Köçərlinin qələm dostu Salman Mümtazı (1884-1941) ədəbiyyatşünaslığa təşviq edən amillərdən biri, ehtimal ki, bu əsər olmuşdu. Azərbaycan ədəbiyyatının toplanılması və nəşrində mətnşünas-alim kimi böyük xidmətləri olmuş Mümtazın elmi fəaliyyətə başlamasının təxminən Köçərlinin ilk kitabının çapdan çıxması ilə bir vaxta düşməsi, yəqin ki, təsadüfi deyildir. Həmin dövrü Mümtaz sonralar "Sabir haqqında xatirələr"ində yad edərək yazırdı: "Mən 1903-cü ilin son yarısından etibarən Azərbaycanın müstəqil dil və ədəbiyyatını meydana çıxarmaq üçün material və məlumat toplayırdım"[48].

İlk imtahandan müvəffəqiyyətlə çıxan Köçərli xalqın ona olan inam və etimadını doğrultmaq, özünün çoxdankı fikrini həyata keçirmək üçün ədəbiyyat tarixçiliyi sahəsindəki tədqiqatını ildən-ilə genişləndirir və ana dilində yeni, sanballı bir əsər üzərində işləyir.

---

[44] "Каспий" qəz., 31 oktyabr 1903, №234

[45] Rəşid bəy Ə f ə n d i y e v. Göstərilən məqaləsi

[46] F.A ğ a z a d ə. Göstərilən yazısı, səh.29

[47] Yenə orada, səh.31

[48] S.M ü m t a z. Sabir haqqında xatirələr. Azərb. Res. Mərkəzi Dövlət ədəbiyyat və incəsənət arxivi, f.162. səh.1, v.65



Gərgin əmək və geniş tədqiqat nəticəsində o, 1908-ci ildə əsərin ilk variantını yazıb qurtarır[49]. Bundan xəbər tutan "Zakafkazskoye obozreniye" qəzeti həmin əlamətdar hadisəni öz oxucularına xəbər verib yazırdı ki, məşhur ədəbiyyatşünas Köçərli Azərbaycan ədəbiyyatına dair "iri həcmli əsərini yazıb qurtarmışdır. Bu kitab məzmununa görə yeganədir". Müəllif Azərbaycan dilində yazdığı bu əsər üzərində "uzun illər işləmiş və indiyə kimi heç kəsə məlum olmayan materiallar toplaya bilmişdir"[50]. Eyni zamanda qəzet öz təəssüfünü gizlətməyərək qeyd edirdi ki, "F.Köçərlinin maddi vəsaiti olmadığı üçün bu çox qiymətli əsərin çapı, ola bilsin ki, uzun illər ləngiyəcəkdir"[51].

Əsərini kitab halında buraxdırmaqda böyük çətinliklərə rast gələn alim öz işini bitmiş hesab etməyib, mətn üzərində bir neçə il də işləyir, onu təkmilləşdirir. Bu dövrdə o, eyni zamanda, Azərbaycanın ayrı-ayrı şəhər və kəndlərində mühazirələr oxuyaraq xalqı öz doğma ədəbiyyatı ilə əyani tanış etməklə də məşğul olur. Vaxtilə Azərbaycan ədəbiyyatı tarixinə dair sistemli bir əsərin yoxluğundan şikayətlənən E.Sultanov alimin 1908-ci ilin yayında Dilican yaylağında oxuduğu üç mühazirəsini dinlədikdən sonra "Tərəqqi" qəzetində öz keçmiş səhvlərindən əl çəkdiyini etiraf etmişdi. O yazırdı ki, bu vaxta qədər bizlər o fikirdə idik ki, Azərbaycan ədəbiyyatı nümunələri "keçmiş əsrlərin qaranlığında itib-batıbdır və onu tapıb, tərtib edib, tarix nizamına mindirmək qeyri-mümkündür. Amma indi, Firidun bəyin üç leksiyasından sonra böylə fikir çaş olması məlum oldu. Öz vaxtında türk qardaşlarımızın qalanları dəxi şəkkdən çıxarlar. Çox çəkməz ki, bizim ədəbiyyat tarixi dirilər"[52].

F.Köçərli bu cür mühazirələri ilə harada, hansı auditoriyada, hansı millətin nümayəndələri arasında çıxış edir-etsin, məclis iştirakçıları onu böyük diqqət, maraq və razılıqla dinləyirdilər. 1911-ci ilin fevralında Bakıda rus-Azərbaycan məktəbləri müəllimləri üçün təşkil edilmiş kursların məşğələsi müəllimlərin xahişi ilə bir gün uzadılmış və Köçərli orada Azərbaycan ədəbiyyatından mühazirə oxumuşdu. "Каспий" qəzeti yazırdı ki, alimin öz mühazirəsində həyatı və yaradıcılığı haqqında danışdığı "şairələrin əksəriyyəti iştirak edənlərin çoxuna tanış deyildi. Auditoriya mühazirəni çox məmnuniyyətlə dinlədi"[53]. Köçərli özü də dostu A.Şaiqə məktubunda müəllimlərin onu böyük həvəslə, razılıqla dinlədiklərini xəbər vermişdi[54].

---

[49] B.N ə b i y e v. Göstərilən əsəri, səh.101; K.T a l ı b z a d ə. XX əsr Azərbaycan ədəbi tənqidi, səh.405

[50] Новые книги. "Закавказское обозрение" qəz., 28 oktyabr 1908, № 36

[51] Yenə orada.

[52] E.S.[Eynəli bəy Sultanov]. Dilicandan. "Tərəqqi" qəz., 14 avqust 1908, № 30

[53] Из жизни и прессы мусульман. "Каспий" qəz., 19 fevral 1911, № 40

[54] F.Köçərlinin A.Şaiqə 10 oktyabr 1911-ci il tarixli məktubu. RƏF, arx. 39, Q – 13(88). RƏF-də Köçərlinin Şaiqə məktubları eyni şifrə altında saxlanıldığı üçün bundan sonra onların ancaq yazılma tarixi göstəriləcəkdir.

Deməliyik ki, Köçərli Azərbaycan ədəbiyyatından mühazirələr oxumaq üçün icazəni çox çətinliklə alırdı: ucqarlarda qabaqcıl mədəni təşəbbüsləri boğan çar hakim dairələri çox vaxt onun xahişlərini rədd edirdi. 1912-ci ilin yanvarında o yenə A.Şaiqə ürək ağrısı ilə yazırdı: "...bizim bu əsri-şumda ağzını açıb iki kəlmə söz danışmağa da izn vermirlər. Mənim qəsdim bu idi ki, əvvəlcə Gəncəyə gedib orada bir-iki leksiya oxuyub, oradan Bakıya azim olam. Amma Tiflisdə məsləhət olunmadı. Mən dəxi kiriyib fərağat oturdum. Görək, bir vaxt olar bizim də ağzımız açılar, dərdimizi açıq söyləyə bilərik"[55].

Alimin Azərbaycan ədəbiyyatını öz doğma xalqı arasında təbliğ etməsi səmərəsiz qalmırdı. Getdikcə onun səsinə səs verənlər, başladığı işə qoşulanlar meydana çıxırdı. Bu baxımdan "Rəhbər" jurnalının həmin yolda atdığı addım, məhdud cəhətlərinə baxmayaraq, təqdirəlayiqdir. Ədəbiyyatımızın təbliğinə jurnal bu sözlərlə başlamışdı: "Azərbaycan türklərinin ədəbiyyatı yoxdur!" Biz hamımız bu təsəvvürdəyik. Doğrudur ki, Azərbaycan türklərinin Sə'disi, Hafizi, Şekspiri yoxdur, amma Vaqif, Vidadi, Nəbati, Seyid Şirvani və çox-çox bunlar kimi şairlərimiz var ki, hər bir millət olur-olsun onlarla fəxr edə bilər. İş bundadır ki, bu şairlərimizin nə əsərlərindən və nə də məsləklərindən xəbərimiz var. Biçarə şairlərimiz öz əsrlərində bir para nadanların məzəmmət və sərzənişlərinə təhəmmül edib, yüz min xunabələr ilə yazdıqları gözəl əsərləri qoyub gediblər, bu əsərlər isə orda-burda dağınıq və gün-gündən məhv olmaqdadırlar. Pəs, bizə lazımdır ki, keçmiş şairlərimizin o əsərlərini əhya edək, sonra yavaş-yavaş ədəbiyyatımızın zəmanəyə müvafiq sərvətlənməsinə çalışaq. Buna görə "Rəhbər"in ilk nömrəsindən Köçərli Firidun bəyin "Ədəbiyyatımıza dair" məqaləsi ilə bu işə şüru edirik"[56].

1911-ci ilin əvvəllərində Köçərli əsərinin son variantını işləyib qurtarır[57]. Bütün Azərbaycan ədəbiyyatını əhatə edən bu əsəri buraxdırmaq üçün o elə həmin vaxtlarda "Nəşri-maarif" cəmiyyətinə müraciət edir. Əvvəlcə cəmiyyətin sədri milyonçu ziyalı İsa bəy Aşurbəyov əsəri öz xərcinə çap etməyi boynuna götürür[58]. Lakin o, "əhdinə vəfa və sözünə əməl etməyib", müxtəlif bəhanələrlə əsərin çapını ildən-ilə dala atır[59].

"Nəşri-maarif" cəmiyyətindən ümidi kəsilən Köçərli əsəri o zaman Kiyevdə təhsildə olan yazıçı Yusif Vəzir Çəmənzəminliyə göndərərək onun

[55] Yenə onun A.Şaiqə 8 yanvar 1912-ci il tarixli məktubu. Azərb. Milli EA Tarix muzeyi, kl – 7058, f.e.n. 2059

[56] "Rəhbər" jurn., 1906, №1

[57] R.Q ə n b ə r q ı z ı. F.Köçərlinin "Azərbaycan ədəbiyyatı tarixi materialları" əsərinin yazılması və nəşri tarixindən. Azərb. EA Xəbərləri. Ədəbiyyat, dil və incəsənət seriyası. 1976, №4

[58] Из жизни и прессы мусульман. "Каспий" qəz., 19 fevral 1911, №40

[59] F.Köçərlinin A.Şaiqə 10 oktyabr 1911-ci il tarixli məktubu



vasitəsilə hissə-hissə çap etdirmək fikrinə düşür[60]. Çünki o zaman Kiyev universitetində oxuyan azərbaycanlı tələbələr Yusif Vəzirin başçılığı ilə Rusiya müsəlmanları üçün elmi, ədəbi, kütləvi kitabçalar nəşr etməyə başlamışdılar[61]. Lakin aydındır ki, onlar iri həcmli bir kitabı çap etdirmək imkanına malik olmadıqlarına görə, çox böyük ehtiram bəslədikləri alimin xahişinə də əməl edə bilməzdilər.

Tərəqqipərvər ziyalıların gücü hələlik ancaq öz arzu və istəklərini mətbuat səhifələrində xalqa yetirməyə çatırdı. Misal üçün, A.Səhhət 1916-cı ilin fevralında yazırdı: "...Firidun bəy Köçərli cənablarının Qafqaz ədəbiyyatına dair cəm etdiyi məcmuə neçə sənələrdən bəri cəmiyyətlərimizin əlində bazîçə olaraq qalmışdır. Biz kəndimiz öylə əsərlərə qədr-qiymət verməyib, nəşrinə himmət göstərmirik və böylə müəllifləri tərğib və təşviq etmirik, bir daha yeni müəlliflər yeni-yeni əsərlər yazmağa həvəs edərmi? Haşa və kəlla! Böylə olduqda sairin bizi nerədən bilib və nə ilə tanıyacaqdır? Yaxud lisan və ədəbiyyatımızı məktəblərdə oxumaq üçün var qüvvəmizlə çalışmasaq, övladımız onları nasıl bilər?"[62] Eyni şikayət motivinə S.Mümtazın məqaləsində rast gəlirik: "Böyük bəradərim Firidun bəy Köçərli cənablarının "Azərbaycan tarixi-ədəbiyyatı"nı toz-torpaq basmaqdadır"[63]. Ə.Qəmküsarın çap etdirdiyi bir xəbərdə deyilirdi ki, "möhtərəm ədibimiz Firidun bəy Köçərli iyirmi illərlə zəhmət çəkib topladığı "tarixi-ədəbiyyati-Azərbaycan" kitabını on illərdir çap edə bilmir"[64]. Nəhayət, Y.V.Çəmənzəminli alimin ədəbiyyatşünaslıq sahəsindəki xidmətlərini yüksək qiymətləndirərək yazırdı: "Ədəbiyyatımızı müntəzəm bir şəklə salmaq və ümumə tanıtmaq əhəmiyyətli məsələlərdəndir. Bu yolda iyirmi ildən bəri çalışması ilə və ədəbiyyatımızı nizama salması ilə məşhur – Firidun bəy Köçərlidir.

Firidun bəy ən müqtədir, ən sevgili ədiblərimizdən biridir. Bu şəxs ədəbiyyat tariximizi yazmaq ilə bütün keçmişimizi diriltdi, şairlərimizin ülvi ruhlarını canlandırdı və həyati-fikriyyəmizi təbii yoluna saldı.

Çox heyf ki, Firidun bəy həzrətlərinin çox az əsərləri oxuculara mal oldu. Ən güzidəsi – "Azərbaycan türklərinin ədəbiyyatı tarixi" hələ təb olunmayıb qalır. Bizə kitab lazımdır ki, bizi həm özümüzə, həm də əcnəbilərə tanıtsın. Bu kitab da ədəbiyyat tariximizdir"[65].

[60] F.Köçərlinin Y.V.Çəmənzəminliyə 17 mart 1913-cü il tarixli məktubu. RƏF, arx. 26, Q – 13 (270)

[61] Bax: Azərbaycan kitabı. Biblioqrafiya. Üç clddə. I cild, Bakı, 1963, səh.140

[62] A.S ə h h ə t. Məktəblərdə ana dili. "Açıq söz" qəz., 22 fevral 1916, № 117

[63] Salman M ə h ə m m d ə m i n o ğ l u. "Mühakimətül-lüğəteyn". "Açıq söz" qəz., 20 iyun 1917, № 502

[64] "Gələcək" qəz., 31 yanvar 1919, № 4. Sitat İ.Ağayevin "Əliqulu Qəmküsar" monoqrafiyasından (Bakı, 1976, səh.43) götürülmüşdür

[65] Yusif V ə z i r o v. Milli və mə'dəni işlərimiz. F.Köçərlinin əsərləri. "Azərbaycan" qəz., 3 avqust 1919, № 241

F.Köçərlinin özünün və digər qabaqcıl ziyalıların fəryadla, şikayətlə dolu bütün bu yazıları çar hökumətinin Rusiyada yaşayan millətlərin mədəni tərəqqisinə biganə, düşmən olduğunu göstərdiyi kimi, çarizm və milyonçu ağaların laqeydliyinə qarşı kəskin bir ittihamnamə rolu da oynayır. Digər tərəfdən Köçərlinin əsərinin acınacaqlı müqəddəratı ümumiyyətlə o zaman mütərəqqi ziyalıların necə ağır şəraitdə, necə fədakarlıqla yaşayıb yaratdıqlarını göstərən çoxlu faktdan biridir.

"Azərbaycan ədəbiyyatı"nı tamam iyirmi ilə təlif etdiyini, iyirmi il bu kitab üçün zəhmət çəkdiyini" niskillə qeyd edən[66] Köçərli kitabını küll halında çap etdirə bilməməsinə baxmayaraq, heç də ruhdan düşmür, onun ayrı-ayrı hissələrini Azərbaycan və rus mətbuatı orqanlarında, o cümlədən "İrşad", "Dəvət-Qoç", "Каспий", "Rəhbər", "Dəbistan", "Zakavkazye", "Tərəqqi", "Məktəb", "Səda", "Yeni iqbal", "Yeni irşad", "Respublika" və b. qəzet və jurnallarda çap etdirməli olur.

F.Köçərli M.F.Axundzadənin yüzillik yubileyi ərəfəsində "M.F.Axundzadə"[67] əsərini, hələ 1908-ci ildə bitirdiyi[68] "Balalara hədiyyə"[69] kitabçasını, çətinliklə də olsa, çap etdirir. Bu əsərlər tərəqqipərvər oxucular tərəfindən rəğbətlə qarşılanır. "Balalara hədiyyə" haqqında Əli Sultanov yazırdı ki, "...bu kitabdan vətən qoxusu, dağların ətri, köçərilərin tüstüsü gəlir"[70]. Kazımoğluya görə, bu kitabdakı nağıl və hekayələr azərbaycanlıların ata-babadan qalma düzgü və tapmacaları, misal və nəğmələri "bizi keçmişimizlə aşina edir, bizi kəndimizə tanıtdırır və keçmişimizə qarşı bizdə milli bir duyğu oyandırır"[71]. Abdulla Şaiq belə hesab edirdi ki, "bizim el ədəbiyyatımız o qədər vüsətlidir ki, onu yazmaqla qurtaracaq şeylərdən deyil. Millətimizin istedad və məharəti-fitrilərinə və əhvali-ruhiyyəsinə aşina olmaq istəyənlər möhtərəm bəradərim Firidun bəy Köçərli cənablarının təlif etdiyi "Balalara hədiyyə" nam kitabçasından istifadə edə bilərlər. Həqiqətdə bəradərim Firidun bəy camaatımızın arasındakı nağıl, məsəl, tapmaca və şeirləri bir yerə toplamaqla Qafqaz müsəlmanlarının boynuna böyük bir haqq qoymuşdur. Söz yox ki, itmiş-batmış o qiymətli gövhərləri cəm etmək Firidun bəy cənablarına ağır zəhmət ilə müyəssər olmuşdur"[72]. Alimdə gələcəyə inam hissi yaradan

---

[66] Firidun bəy K ö ç ə r l i. "Bəsirət" qəz., 2 may 1915, № 43. Əsərin əvvəlində həmin müddətin on il göstərilməsi, çox güman ki, kitabın ilk nəşri zamanı texniki xəta üzündən baş vermişdir (I, 69).

[67] Kitabın titul səhifəsində yazılmışdır: "Mirzə Fətəli Axundzadə həzrətlərinin təvəllüdündən yüz il mürur etmək münasibətilə yazılmış risaleyi-yadigaranədir". Tiflis, 1911, səh.71

[68] "Zakavkaskoye obozreniye" qəz., 28 oktyabr 1908, № 36

[69] Balalara hədiyyə. Bakı, 1912, səh.101

[70] F.A ğ a z a d ə. Göstərilən yazısı, səh.32

[71] "İqbal" qəz., 23 may 1913, № 366

[72] Abdulla Ş a i q. Əsərləri. Beş cilddə. IV cild, Bakı, 1977, səh.122-123



onun əməyinə müasirləri tərəfindən verilmiş məhz belə obyektiv qiymətlər idi; o inanırdı ki, vaxt gələcək "üdəba və şüəramızın qədr və qiyməti bilinəcəkdir". Özü də "o vaxt" yaxınlaşıbdır[73].

* * *

XX əsrin ilk illərindən başlayaraq ölkəmizdə milli ədəbiyyatların tədqiqi, toplanılması və nəşri üçün geniş şərait yarandı. Respublikada klassik irsin nəşri sahəsində atılmış ilk müvəffəqiyyətli addımlardan biri F.Köçərlinin əsərini çap etmək oldu. Əsərin kitab halında buraxılmasına Köçərlinin arvadı, Azərbaycanın maarifpərvər xadimlərindən Badisəba xanım Köçərli yaxından kömək etdi. Azərbaycan Xalq Maarif komissarlığının ali və orta məktəblərdə müəllim və tələbələrin Azərbaycan ədəbiyyatı tarixi dərsliyinə olan ehtiyacını ödəmək üçün yollar axtardığı bir zamanda o, uzun zaman əlyazması halında qalmış əsəri 1923-cü ilin axırlarında komissarlığa verdi[74].



1924-cü il mayın 22-də Azərnəşrin B.Köçərli ilə bağladığı müqavilənamədə göstərilirdi ki, "kitab yazılan kimi çap ediləcəkdir". "Firidun bəy Köçərlinin yazdığından başqa heç bir şey əlavə olunmayacaqdır"[75].

1925-1926-cı illərdə Azərbaycan Dövlət Nəşriyyatı tərəfindən əsərin iki cildi "Azərbaycan ədəbiyyatı tarixi materialları" adı ilə çap edildi. Əsər nəşriyyat işinin yenicə formalaşıb yoluna düşdüyü mürəkkəb bir vaxtda çap olunduğundan ona münasibət də müxtəlif idi. Həmin illərdə Köçərlinin ədəbiyyatşünaslıq və tənqidi fəaliyyəti H.Zeynallının "Azərbaycan ədəbiyyatı tarixi materialları"na yazdığı müqəddimə[76] və qeydlərdə, o zaman hələ çox gənc olan M.Hüseynin əsər haqqındakı resenziyalarında və "Vaqif" əsərində[77], M.Quliyevin "Oktyabr və türk ədəbiyyatı" kitabında[78] lazımınca qiymətləndirilməmiş və kəskin tənqid olunmuşdur. Adları çəkilən "müəlliflər vulqar sosioloji təhlil yolu ilə gedərək böyük əməyin məhsulu olan faydalı bir əsərin tarixi əhəmiyyətini göstərə bilməmiş", Köçərlinin "əbədi fəaliyyətinin məhdud və ziddiyyətli cəhətlərini mübaliğəli və qabarıq verməyə çalışmışlar"[79].

---

[73] F.K ö ç ə r l i. Ədəbiyyatımıza dair, "Səda" qəz., 3 dekabr 1909

[74] B.N ə b i y e v. Göstərilən əsəri, səh.104

[75] Müqavilənamə. RƏF, arx. 24, Q – 3 (85)

[76] F.K ö ç ə r l i. Azərbaycan ədəbiyyatı tarixi materialları, I cild I hissə, səh.3-8. "Azərnəşr" imzası ilə verilmiş həmin müqəddimənin H.Zeynallı tərəfindən yazıldığını K.Talıbzadə göstərmişdir. Bax: K.Talıbzadə. XX əsr Azərbaycan ədəbi tənqidi, səh.55

[77] M.H ü s e y n z a d ə. Azərbaycan ədəbiyyatı tarixi materialları. "Yeni fikir" qəz., 15 iyul 1926, № 1138; Yenə də. "Yeni məktəb" jurn., may-iyun 1926, № 5-6; yenə onun. Vaqif, Bakı, 1928

[78] M.K у л и е в. Октябрь и тюркская литература. Bakı, 1930, səh.38-39

[79] K.T a l ı b z a d ə. XX əsr Azərbaycan ədəbi tənqidi, səh.55

Deməliyik ki, Köçərlinin elmi fəaliyyətinə, onun "Azərbaycan ədəbiyyatı" əsərinə birtərəfli, haqsız, ədalətsiz münasibət bir çox ziyalılarda elə həmin dövrdə etiraz doğururdu. Təsadüfi deyildir ki, M.Hüseynin "Yeni fikir" qəzetində çap etdirdiyi resenziyasının ardınca "İdarədən" başlığı altında yazılmışdı: "Məqalə sahibinin F.Köçərlinin əsərləri haqqında yürütdüyü fikrin çox hissəsinə şərik olmayaraq, yalnız bu yazını müzakirə təriqi ilə buraxırıq".

Köçərliyə qarşı ədalətsiz münasibət sonralar da bir müddət davam etmiş, hətta ədəbiyyatşünaslıqda vulqar sosiologiya nəzəriyyəsinin təsiri ilə o, burjua alimi kimi qələmə verilərək uzun zaman tədqiqatdan kənarda qalmışdır.

Onu da qeyd etməmək olmaz ki, Köçərlinin şəxsiyyəti və elmi konsepsiyasına inkarçı münasibət bəsləndiyi, onun adı və əsərləri tədqiqatlarda yad edilmədiyi illərdə belə Azərbaycan ədəbiyyatı tarixinin bu və ya digər dövründən, bu və ya digər klassikdən yazan alimlərin çoxu üçün "Azərbaycan ədəbiyyatı", xüsusilə bu kitabdakı bədii mətnlər əsas, mötəbər məxəzlərdən biri olmuşdur.

Alimin qırx ilə yaxın ədəbi, ictimai və pedaqoji fəaliyyəti Azərbaycan ədəbiyyatşünasları tərəfindən geniş və obyektiv şəkildə öyrənilmiş və bu iş hazırda davam etdirilir[80]. Elə həmin illərdən başlayaraq Köçərli yaradıcılığında əsas yeri tutan "Azərbaycan ədəbiyyatı" öz obyektiv elmi qiymətini almağa başlamışdır.

Bu sahədə ilk təşəbbüsü 1946-cı ildə professor Mir Cəlal "Azərbaycanda ədəbi məktəblər" (1905-1917) adlı doktorluq dissertasiyasında etmişdi. Tədqiqatçı "Azərbaycan ədəbiyyatı"nın "yalnız "materiallar" deyil, ədəbi tarixi müəyyən dərəcədə əks və şərh edən sistemli, tədqiqi bir əsər" olduğunu ayrıca göstərmişdi[81]. O, doğru olaraq yazırdı ki, Köçərlinin əsəri "...bütün

[80] K.T a l ı b z a d ə. Firidun bəy Köçərli. Azərbaycan ədəbiyyatı tarixi, II cild, səh.485-512; Yenə onun. F.Köçərlinin "Seçilmiş əsərləri"nə müqəddimə; Yenə onun. XX əsr Azərbaycan ədəbi tənqidi, səh.401-456; B.N ə b i y e v. Göstərilən əsəri; A.A b d u l l a y e v. Azərbaycan dilinin tədrisi tarixindən. Bakı, 1958, səh.123-133; C.Ə h m ə d o v. Azərbaycan ədəbiyyatının tədrisi tarixindən. Bakı, 1971, səh.3-60; A.A l m ə m m ə d o v. Ürəklərin birliyi. Bakı, 1975, səh.17-34; İ.B ə k t a ş i. Firidun bəy Köçərli və "Molla Nəsrəddin". ADU-nun Elmi əsərləri. Dil və ədəbiyyat seriyası. 1968, № 3; Yenə onun. F.K ö ç ə r l i. Demokrat mətbuat uğrunda. Yenə orada, 1968, № 5; Yenə onun. F.Köçərli ədəbi-bədii dil haqqında. Yenə orada, 1969, № 5-6; Yenə onun. F.Köçərli realizm uğrunda. Yenə orada, 1970; № 5-6; F.A.B a y r a m o v. F.Köçərli və biblioqrafiya. "ADU"-nun Elmi əsərləri. Kitabxanaçılıq və biblioqrafiya seriyası". 1971, № 1; Yenə onun, F.Köçərli və Azərbaycan kitab mədəniyyəti. Yenə orada, 1973, № 2; S.Ə z i m o v a. F.Köçərlinin publisist fəaliyyəti haqqında. Azərbaycan dili və ədəbiyyatı tədrisi (metodik məqalələr məcmuəsi). Birinci buraxılış, 1969 və s.

[81] M.C.P a ş a y e v. Azərbaycanda ədəbi məktəblər (1905-1917). Bakı, 1946, səh.242



keçmiş məcmuələrdən fərqli olaraq, birinci dəfə ədəbi təhlili, yalnız ədəbiyyatı öyrənmək deyil, həm də qiymətləndirmək təşəbbüsünü irəli sürən əsər idi"[82].

Akademik F.Qasımzadə XIX əsr Azərbaycan ədəbiyyatının ilk mənbələri içərisində ən mühüm yeri Köçərlinin "Azərbaycan ədəbiyyatı" tutduğunu qeyd edir[83]. Lakin F.Qasımzadənin mülahizələrində bu əsər haqqındakı keçmiş səhvlərin bəzi izləri hələ də qalmışdır.

F.Köçərli yaradıcılığını, xüsusilə alimin tənqidi görüşlərini tədqiq edən professor K.Talıbzadə "Azərbaycan ədəbiyyatı"nı "Azərbaycan ədəbiyyatından bəhs edən əsas mənbələrdən biri kimi qiymətləndirir[84]. O yazır: "Azərbaycan türklərinin ədəbiyyatı" kitabını "material" hesab edənlər, onun elmi mahiyyət daşımadığını iddia edənlər ciddi səhv edirlər"[85].

F.Köçərli haqqında ilk monoqrafik əsərin müəllifi professor B.Nəbiyev alimin həyatı və yaradıcılığı ilə yanaşı onun "Azərbaycan ədəbiyyatı" əsərini də ətraflı tədqiq etmişdir. O göstərir ki, "Azərbaycan ədəbiyyatı" təkcə Firidun bəy Köçərlinin yaradıcılığında deyil, Azərbaycan ədəbiyyatşünaslıq elminin tarixində görkəmli yer tutur"[86]. Əsərin quruluşu, tərtib prinsipləri, əhatə etdiyi yazıçılar haqqında maraqlı fikirlər söyləyib elmi nəticələrə gələn tədqiqatçı "Azərbaycan ədəbiyyatı"nı keçən əsrin sonlarında S.A.Venqerovun redaksiyası ilə çap olunmuş "Rus poeziyası" ilə müqayisə edib göstərir ki, Köçərlinin əsərinin "tərtib prinsipləri "Rus poeziyası"nın tərtib prinsiplərini xatırladır". "Azərbaycan ədəbiyyatı"nda olduğu kimi, "bu əsərdə də şairlərin irsindən geniş nümunələr dərc edilmişdir"[87]. İki əsər arasında bu cür oxşar cəhətlər tapdığına görə B.Nəbiyev haqlı olaraq Köçərlinin "Rus poeziyası"nın tərtib prinsiplərindən istifadə etdiyini ehtimal edir (bu barədə aşağıda ayrıca bəhs olunacaqdır). B.Nəbiyevin həmin ehtimalını Azərbaycan-rus ədəbi əlaqələrinin görkəmli tədqiqatçısı Şıxəli Qurbanov da təsdiq etmişdir: "F.Köçərli Azərbaycan ədəbiyyatı tarixinin öyrənilməsi sahəsində böyük iş görmüşdür. Onun bu sahədə yaratdığı əsər ədəbiyyat tarixinin yaradılması yolunda atılan əhəmiyyətli bir addım idi. Rus ədəbiyyatşünaslıq elminin zəngin təcrübəsi ilə yaxından tanış olması bu işdə Köçərliyə böyük kömək etmişdir"[88].

[82] M.C.P a ş a y e v. Azərbaycanda ədəbi məktəblər (1905-1917). Bakı, 1946, səh.242

[83] F.Q a s ı m z a d ə. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 1956, səh.7

[84] K.T a l ı b z a d ə. Firidun bəy Köçərli. Azərbaycan ədəbiyyatı tarixi, II cild, səh.511. Yenə onun. XX əsr Azərbaycan ədəbi tənqidi, səh.451

[85] Yenə onun. XX əsr Azərbaycan ədəbi tənqidi, səh.451

[86] B.N ə b i y e v. Göstərilən əsəri, səh.100

[87] Yenə orada, səh.115

[88] Şıxəli Q u r b a n o v. Əsərləri. Üç cilddə. II cild, Bakı, 1970, səh.458-459

B.Nəbiyev həmçinin yazır: "Abbasqulu ağa Bakıxanovun "Gülüstani-İrəm" əsəri tarixşünaslıqda olduğu kimi, "Materiallar"* da Azərbaycan ədəbiyyatşünaslığında ilk və mötəbər mənbələrdən biridir"[89].

Doğrudan da Köçərlinin əsəri sonralar mötəbər bir məxəz kimi istər bütövlükdə, istərsə də ayrı-ayrı əsrlər üzrə yazılmış "Azərbaycan ədəbiyyatı tarixi" kitabları üçün bünövrə məqamında olmuşdur. Ədəbi irsimizin tədqiqi, tənqidi, pedaqoji və estetik fikrimizin tarixi ilə məşğul olan tədqiqatçıların, demək olar hamısı ondan istifadə etmiş və müəyyən dərəcədə bəhrələnmişdir.

* * *

F.Köçərli "Azərbaycan ədəbiyyatı"nı qələmə alarkən "Hacı Lütfəli bəy ibn Xaqan "Azər" təxəllüsün "Atəşkədə" nam kitabında tutduğu qayda və rəvişi intixab" etdiyini, yəni Azərbaycanda olan hər bir şəhər və diyarın şair və ədibləri haqqında ayrı-ayrı məlumat verməyi münasib bildiyini yazır (I, 69).

Müəllif əsərini "Atəşkədə"də olduğu kimi, coğrafi bölgü üzrə qruplaşdırdığını ön plana çəkməsinə baxmayaraq, əsl həqiqətdə onun kitabında təsnifat ilk növbədə dövrlər üzrə, coğrafi bölgü isə dövr bölgüləri daxilində aparılmışdır. "Azərbaycan ədəbiyyatı" "Rus poeziyası"na məhz dövr bölgüsü baxımından yaxınlaşır. Məlumdur ki, üç cilddən ibarət olan "Rus poeziyası" XVIII əsr – klassizm mərhələsi, XIX əsrin birinci yarısı, XIX əsrin qırxıncı və altmışıncı illəri kimi hissələrə ayrılmışdır.

"Azərbaycan ədəbiyyatı"nı "Rus poeziyası"na yaxınlaşdıran digər mühüm cəhət isə hər ikisinin ədəbi-tarixi prosesi bütünlüklə əks etdirməsidir. "Rus poeziyası"nın əvvəlində nəşrin əsas məqsədindən danışılarkən deyilirdi: "Qlavnaya sel izdaniya – istoriko-literaturnaya polnota. Poetomu v neqo, pomimo poetov pervostepennıx, voydut ne tolko poetı vtorostepennıe, no daje i takie, kotorıe polzuyutsya isklyuçitelno otrisatelnoy izvestnostyu, kak napr. qraf. Xvostov i dr..."[90] Bu cəhət eynilə "Azərbaycan ədəbiyyatı"nda da özünü büruzə verir. Əsərə görkəmli, məşhur və orta istedadlı yazıçılarla yanaşı Xəstə Qədir, Məşədi Hidayət bəy Xaki kimi ədəbiyyat tarixinin inkişafında heç bir rolu olmayanlar da daxil edilmişdir.

Göstərilən oxşar cəhətlərlə yanaşı bu iki əsər arasında kəskin fərqlər də vardır. Hər şeydən əvvəl, "Azərbaycan ədəbiyyatı"nda elmi təhlillərdən ibarət olub, kitabın əsas hissəsini təşkil edən səhifələrdə Köçərlinin qələmi tamamilə sərbəst və orijinal olub, bir çox özünəməxsus xüsusiyyətlərə malikdir. S.A.Venqerovun "Rus poeziyası" isə ayrı-ayrı müəlliflərin elmi əsərləri, məqalələri əsasında tərtib olunmuşdur. "Rus poeziyası"nın təkcə birinci

* Müəllif əsər boyu kitabın adını qısa şəkildə bu cür işlətmişdir

[89] B.N ə b i y e v. Göstərilən əsəri, səh.117

[90] C.A.B e н г e p o в. Русская поэзия. səh.4



cildində 116 şair haqqında verilmiş ədəbi-tənqidi materialı tərtibçi 251 mənbədən əxz etmişdi. Əsərdə, məsələn, A.Kantemir haqqında V.Stoyuninin, M.V.Lomonosov haqqında N.Buliçin məqalələri getmişdir və habelə bu cür məqalələrdən sonra hər şairin irsindən nümunələr verilir.

F.Köçərlinin özünün bəzi qeydlərinə və bir sıra müasirlərinin xatirə və yazışmalarına, həmçinin mətbuatda verilmiş məlumatlara əsaslanan tədqiqatçılar "Azərbaycan ədəbiyyatı"nın həcmindən danışarkən belə bir qənaətə gəlmişlər ki, əsər üç cilddə yazılmış və hazırda əldə edilməyən üçüncü cild F.Köçərlinin müasirlərinə – XX əsr Azərbaycan yazıçılarına həsr edilibmiş[91]. Uzağa getməyib, Köçərlinin əsərə yazdığı girişin ilk abzasına diqqət yetirmək kifayətdir: "1903-cü ildə "Azərbaycan türklərinin ədəbiyyatı" ünvanında rus dilində bir kitabça tərtib edib çapa vermişdik. Ərbabi-qələm bizim bu zəif əsərimizə lütf nəzəri ilə baxıb, onun intişarına himmət və riayət göstərməklə belə bizdən xahişmənd oldular ki, məzkur kitabçanın məalına bəst verib, öz ana dilimizdə milli ədəbiyyatımıza dair bir kitab tərtib qılaq. Tainki bizim Azərbaycan şüəra və üdəbamızın əşarü asarı və özlərinin namü nişanları unudulub, ədnayi-vətənin xatirindən bilmərrə çıxmasın. Maarifpərvər ədiblərimizin bu gözəl arzu və təmənnalarını sədədində olduğumuz fikrü mərama müvafiq görüb, ol vaxtdan indiyədək məzkur əsəri əncama yetirmək üçün lazım olan məlumatı cəm etməyə məşğul olduq" (I, 68). Deməli, Köçərli "özlərinin namü nişanları unudulub, əbnayi-vətənin xatirindən bilmərrə çıxmaması" üçün çalışan ziyalıları da "Azərbaycan ədəbiyyatı"na daxil etmişdir.

Bu yazıçılar kimlərdən ibarət olmuşdur?

Respublika Əlyazmaları fondunda alimin şəxsi arxiv fondunun Badisəba xanım Köçərli tərəfindən tərtib edilmiş təsviri saxlanılır[92]. İki şagird dəftəri həcmində olan həmin təsvirdə "Azərbaycan ədəbiyyatı"nın 1908-ci ildə bitmiş ilk variantı əsasında tutulmuş cədvəl diqqəti cəlb edir[93]. Həmin cədvəldən aydın olur ki, əsərin ilk variantı 27 ümumi dəftər – 1314 səhifədən ibarət imiş və onda Mirmehdi Xəzani, Mehdiqulu xan Vəfa, Lətif Şirvani, Mirzə Ələkbər Sabir, Abbas Səhhət, Məmmədtağı Sidqi, Mirmöhsün Nəvvab, Abbas ağa Nəzir, Məmməd Səid Ordubadi, Təbrizli Fəna, Mirzə Səməndər, Fazil Dərbəndi, M.Ələsgər kimi yazıçılar haqqında da oçerklər olmuşdur. Dövrlər üzrə qruplaşdırıldığını nəzərə alaraq demək olar ki, əksəriyyəti

[91] B.N ə b i y e v. Göstərilən əsəri, səh.105-109; K.T a l ı b z a d ə. XX əsr Azərbaycan ədəbi tənqidi, səh.406-407

[92] RƏF, arx. 24, Q – 1 (15)

[93] Ətraflı bax: R.Q ə n b ə r q ı z ı. F.Köçərlinin şəxsi arxiv fondunda saxlanılan bir əlyazması haqqında. Azərb.SSR EA Xəbərləri. Ədəbiyyat, dil və incəsənət seriyası. 1976, № 1

Köçərlinin müasirləri olub, "Azərbaycan ədəbiyyatı"na düşməyən həmin yazıçılar haqqındakı oçerklər, görünür, əsərin üçüncü cildinə daxil imiş[94].

Mətbuatda yazıldığına görə, Köçərlinin əsərin 1911-ci ilin əvvəllərində çap etdirmək istədiyi son variantı[95] 30-dan artıq qalın dəftər həcmində olmuşdur[96]. Lakin bu variantın əlyazmasının, yaxud heç olmazsa oraya daxil edilmiş yazıçıların siyahısının hazırda əldə olmaması üçüncü cildin mündericatı haqqında tam təsəvvür almağa imkan vermir. Bununla belə Köçərlinin bir neçə qeydinə əsasən həmin cilddə Nəcəf bəy Vəzirov, Əbdürrəhim bəy Haqverdiyev, Yusif Vəzir Çəmənzəminli, Abdulla Şaiq, Sultan Məcid Qənizadə və başqa yazıçılara yer verildiyi ehtimal olunur[97].

* * *

İki cildlik "Azərbaycan ədəbiyyatı" bu hissələrdən ibarətdir: əsərin tərtib prinsipləri, yazılma tarixi və səbəblərini müəyyən dərəcədə əks etdirən "Müəllifi tərəfindən bir neçə söz", "Başlanğıc"* adlı geniş elmi-nəzəri müqəddimə, Gəncə, Şirvan-Şamaxı, Qarabağ, Quba, Nuxa, Ordubad, İrəvan və Dərbənd haqqında səkkiz yığcam tarixi-coğrafi icmal, 128 yazıçının həyat və yaradıcılığına həsr olunmuş irili-xırdalı oçerk və kiçik məlumat.

Bu vaxta qədər tədqiqat əsərlərində "Azərbaycan ədəbiyyatı"nın təsnifatı məsələlərindən danışılan zaman Köçərlinin Lütfəli bəy Azərin "Atəşkədə"si haqqında yuxarıda misal gətirilmiş sözləri əsas götürülərək əsərin coğrafi prinsip üzrə qruplaşdırıldığı göstərilmiş və bu onun metodoloji nöqsanlarından biri sayılmışdır[98]. Halbuki əsərə daha diqqətlə yanaşıldıqda bu fikrin birtərəfli və qeyri-dəqiq olduğu meydana çıxır.

Düzdür, əsərdə yazıçılar əraziyə görə bölüşdürülür: amma bu, "Azərbaycan ədəbiyyatı"ndakı təsnifatda əsas prinsip deyildir. Çünki burada yazıçıların coğrafi ərazi üzrə bölüşdürülməsi müəyyən dövr bölgüləri daxilində aparılır. Tekstoloji araşdırmadan aydın olur ki, əsərdə əsasən tarixilik prinsipi əsas götürülmüş və çoxəsirlik ədəbi irsimiz qədim və orta əsrlər, XVIII əsr, XIX əsrin birinci yarısı və nəhayət, XIX əsrin ikinci yarısı kimi dövrlərə ayrılmış-

[94] Yenə orada

[95] Yenə orada

[96] Из жизни и прессы мусульман. "Каспий" qəz., 19 fevral 1911, № 40

[97] F.K ö ç ə r l i. Mirzə Fətəli Axundzadə, səh.28-29; Yenə onun Y.V.Çəmənzəminliyə 12 fevral 1914-cü il tarixli məktubu. RƏF, arx. 26, Q – 13 (269); Yenə onun. Soltan Məcid Qənizadə. "Məktəb" jurn., 1912, № 21; K.T a l ı b z a d ə. F.Köçərlinin A.Şaiqə məktubları və s.

* Hazırkı nəşrdə həmin iki müqəddimə birləşdirilib "Bir neçə söz" başlığı ilə verilir.

[98] B.N ə b i y e v. Göstərilən əsəri, səh.119; K.T a l ı b z a d ə. XX əsr Azərbaycan ədəbi tənqidi, səh.451



dır. Göstərilən dövrlərə əsərdə nə sərlövhə qoyulur və nə də hər hissənin əvvəlində dövrün ədəbi-tarixi icmalı verilir. Bununla belə hər dövrün adını mətndən müəllifin işlətdiyi spesifik sözlərdən sezib müəyyənləşdirmək mümkün olur. Məsələn, burada qədim və orta əsrlər ədəbiyyatı – "sabiqdə vücuda gəlib nəşvü nüma tapan əazimi-şüəra" (I, 123) "Nizaminin və Xaqaninin müasirləri və onlardan sonra Qafqaziyada vücuda gələn üləma, şüəra və hükəma" (I, 143) – "qüdəmalar" (II, I, 1), XVIII əsr ədəbiyyatı – "Molla Pənah dövrü" (I, 153), XIX əsrin birinci yarısı ədəbiyyatı – "hicrətin on üçüncü əsrinin əvvəllərində və əvasitində zindəganlıq edən" şüəra (I, 493), XIX əsrin ikinci yarısı ədəbiyyatı isə "Bahar [Bahar Şirvani. – *R.Q.*] əyyamı və Seyid Əzim dövrü" (II, I, 7) – "mütəəxxirin" (II, I, I) kimi ibarələrlə ifadə olunur. Kitabda birinci dövrün Nizami, ikinci dövrün Vaqif, üçüncü dövrün A.Bakıxanov, dördüncü dövrün Bahar Şirvani ilə başlaması da həmin nəticəyə gəlməyə əsas verir.

F.Köçərlinin əsərdə apardığı dövrləşdirmə Azərbaycan ədəbiyyatı tarixçiliyində həmin sahədə ilk və olduqca əhəmiyyətli addımlar kimi qiymətləndirilə bilər.

Yuxarıda deyildiyi kimi, "Azərbaycan ədəbiyyatı"nda coğrafi prinsip üzrə bölgü dövr bölgüləri içində aparılır. Bunun nəticəsidir ki, eyni coğrafi ərazidə yetişmiş yazıçılar ardıcıl deyil, əsərin ayrı-ayrı hissələrində gedir. Məsələn, Gəncə şairləri həm qədim və orta əsrlər, həm XIX əsrin birinci yarısı, həm də XIX əsrin ikinci yarısı bölmələrində verilir. Yaxud Şirvan-Şamaxı yazıçıları əsərin bütün dövrlərində gedir və h.b.

Ərazi üzrə bölgü zamanı coğrafi başlıq və həmin əraziyə aid tarixi-coğrafi oçerk ilk dəfə hər hansı bir dövr yazıçılarından danışıldıqda işlədilirsə, gələcək dövrlərdə həmin sərlövhələr və icmallar təkrar olunmur. Məsələn, qədim və orta əsrlər bölməsində Gəncə yazıçılarının əvvəlində "Gəncə" başlığı ardınca tarixi-coğrafi oçerk getdiyindən əsərin XIX əsrin birinci yarısına və XIX əsrin ikinci yarısına aid hissələrində həmin ərazinin nümayəndələrindən danışılarkən daha bu cür sərlövhələrə ehtiyac duyulmamış, birinci halda Şirvan-Şamaxı şairlərinin, ikincidə isə Qarabağ şairlərinin ardınca birbaşa Gəncə nümayəndələrindən söhbət açılmışdır. Nuxa haqqında oçerk "Mirzə Fətəli Axundzadə", Ordubad haqqında isə "Hacıağa Fəqir Ordubadi" bəhsinin əvvəlində gedir (həmin hissələrə əlahiddə sərlövhə qoyulmadığı üçün tədqiqat əsərlərində "Azərbaycan ədəbiyyatı"nın tarixi-coğrafi oçerklərinin sayı səhvən altıya endirilir)[99].

Kitabın ayrı-ayrı bölmələrində Qazax və İran Azərbaycanı yazıçılarına geniş yer verildiyi halda, əsərə xas olan ümumi prinsip, tədqiqat metodu po-

[99] B.N ə b i y e v. Göstərilən əsəri, səh.117

zulur və həmin yerlərin tarixindən, coğrafiyasından söhbət açılmır. "Azərbaycan ədəbiyyatı"nın ilk variantına aid mündəricatdan[100] görünür ki, onda "Qazax şairləri" adlı tarixi-coğrafi oçerk də olmuşdur. Həmin oçerkin əsərə düşməməsi səbəbi hələlik məlum deyildir.

"Azərbaycan ədəbiyyatı"nda klassik irsin dövrlər üzrə, dövr daxilində ərazi üzrə, ərazi içərisində xronoloji prinsip üzrə qruplaşdırılması bu və ya digər səbəblərə görə pozulmuşdur. Xronoloji prinsipin birinci halda – dövr bölgüsündə pozulması vəziyyəti alimin hər hansı bir yazıçının yaşadığı əsri dəqiq müəyyənləşdirə bilməməsi, bu barədə dürüst məlumat əldə etməkdə çətinlik çəkməsi nəticəsində baş vermişdir. Məsələn, Nəsimi yaradıcılığından xəbərsiz olan Köçərli müasiri Ağaəli bəy Nasehin səhv məlumatına əsaslanaraq XIV əsr Azərbaycan dahisinin adını XIX əsrin birinci yarısında – "Ağaməsihdən və Nişatdan sonra" – "hicrətin on üçüncü əsrinin əvvəllərində və əvasitində" "xaki-mübarəki-Şirvanda ərseyi-vücuda gələn şüəra", Məhvəşi Şirvani, Vaiz əfəndi Şirvani, Zülali Şirvani və başqaları sırasında çəkir və onların, Nəsimi də daxil olmaqla, "əşari-mütəfərriqədən səva bir namü nişan qoymadıqlarını" qeyd edir (I, 493). Məhz Nəsimi haqqında bu əqidədə olduğu üçün alim onun H.Qaibovun "Məcmuə"sindəki:

Dünü gün müntəzir oldum ki, bu pərgar nədir,
Gərdişi-çərxi-fələk, günbədi-dəvvar nədir?

– mətləli qəzəlinin öz kitabına köçürür və bununla da şair haqqında sözünü qurtarmalı olur (I, 519). Həmçinin Əlican Qövsi yaradıcılığından danışarkən alim şairin yaşadığı əsri düzgün müəyyənləşdirmir. Bu bəhsdən belə məlum olur ki, tədqiqatçının əlinə "Qövsi" təxəllüslü bir şairin divanı keçmişdir. Şairin tərcümeyi-halına dair məlumat toplamaq üçün bir sıra məxəzlərə müraciət etmişsə də, heç bir şey əldə edə bilməmişdir. O, Qövsi divanının özünə müraciət edib şairin "Azərbaycanın İran dövlətinə mütəəlliq məhəllələrində", "xüsusən Təbrizdə və ya ona qərib şəhərlərin birində" doğulduğunu müəyyənləşdirməyə müvəffəq olur (I, 219). Son tədqiqatda göstərildiyinə görə, doğrudan da Əlican Qövsi Təbrizdə anadan olmuşdur[101]. Lakin Qövsinin "Gətir, saqi, qədəh kim, novbahari-eyşü işrətdir" misrası ilə başlanan tərcibəndində adı çəkilən XVII əsrdə yaşamış Uğurlu xan Ziyad oğlu Musahibi 1766-1777-ci illər Gəncə xanı Uğurlu xan Ziyad oğlu ilə səhv saldığı üçün Köçərli Qövsini Molla Pənah Vaqifin müasiri hesab edir və onu XVIII əsr Azərbaycan şairləri cərgəsində verir. Halbuki Köçərli özü əsərin əvvəllərində "Gülüstani-İrəm"dən istifadə edərək Uğurlu xan Ziyad oğlu

[100] RƏF, arx. 24, Q – 1 (15)

[101] M.S e y i d o v. Qövsi Təbrizi, Bakı, 1963, səh.18



Müsahib Gəncəvi haqqında düzgün məlumat verib, onun Şah Abbas Səfəvinin (1587-1629) müasiri olduğunu göstərmişdir (I, 149).

F.Köçərli ərazi daxilində xronoloji bölgünü yazıçıların ölüm tarixlərinə görə aparmışdır. Məsələn, İrəvan şairləri sırasına daxil edilən yazıçılar belə düzülmüşdür: Bəzmi (1846-1888), Müttəle (1932-1892), Seyid Rza Sabir (?-1906), Lə'li (1845-1907).

Lakin həmin prinsip əsərdə heç də həmişə gözlənilmir, ondan kənara çıxmaq halları, əvvəla, alimin haqqında danışdığı yazıçıların təvəllüd və vəfat tarixini müəyyənləşdirə bilməməsi üzündən baş verir. İkincisi, bu eyni ərazidə yetişmiş yazıçıların ən məşhurunu bilərəkdən əvvəldə vermək məqsədilə edilir.

Yazıçıların coğrafi prinsip üzrə təsnifatında bir neçə cəhət özünü göstərir. Əgər yazıçı bir yerdə doğurub, orada da yaşayıb yaratmış və vəfat etmişsə, alim onu həmin yerin nümayəndələri sırasında verir. Əgər yazıçı müəyyən bir yerdə doğulub, başqa bir yerdə "nəşvü nüma" tapır və vəfat edirsə, ikinci yerin nümayəndələri cərgəsinə daxil edilir; məsələn, Qazax şairi Vaqif Qarabağ, İran Azərbaycanı şairi Lə'li İrəvan şairləri sırasında verilir və h.b.

"Bahar Şirvani" oçerki bu cəhətdən istisna təşkil edir. Şairin orta yaşlarında İrana gedib, orada evlənməsi və 1883-cü ildə Təbrizdə vəfat etməsinə baxmayaraq, Köçərli onu Şirvan şairləri cərgəsində verir.

Bəzən müəllif bu məsələdə tam tərəddüd keçirir. Məsələn, İran Azərbaycanının Xoy şəhərində anadan olub otuz yaşlarında Gəncəyə gəlmiş və sonralar otuz ilə yaxın Qazaxda yaşayıb orada evlənmiş və nəhayət, vətəninə qayıdan Molla Hüseyn Sabiti Gəncə şairləri cərgəsində versə də, əslində onu hansı ərazinin nümayəndələrinə aid etmək məsələsi alimi düşündürür: "Məlum deyil ki, Sabit cənablarını hansı yerin şüəravü üdəbası silkinə daxil etmək, Qazaxmı, Gəncəmi və yaxud Azərbaycan İraqı?" (II, I, 266).

Dahi Azərbaycan şairi Məhəmməd Füzulinin mənşə etibarilə hansı xalqa mənsub olduğunu göstərdikdə isə alim çox böyük xətaya yol vermişdir. Məlumdur ki, inqilaba qədər Azərbaycan, rus və Avropa ədəbiyyatşünaslığında Azərbaycan xalqının yetirməsi dahi Füzuli əsasən türk şairi kimi qələmə verilirdi. Köçərli Füzulinin tərcümeyi-halına dair ətraflı məlumat tapa bilməmişdir. O, Füzulinin öz "Divan"ından[102] və türk alimi Məhəmməd Cəlalın "Osmanlı ədəbiyyatı nümunələri" kitabından[103] şairin H.900-cü ildə Bağdadda anadan olduğunu aşkara çıxarır. Daha heç bir məxəz əldə edə bilmədiyindən tədqiqatçı, başqa müasirləri kimi, məhz Bağdadda doğulduğuna görə, Füzulini türk şairi hesab edir. K.Talıbzadə "XX əsr Azərbaycan ədəbi tənqidi" kitabında belə bir nəticəyə gəlir ki, Köçərli "Füzuli türk şairlərinin

[102] Məhəmməd F ü z u l i. Divan. İstanbul, H.1308

[103] Məhəmməd C ə l a l. Osmanlı ədəbiyyatı nümunələri. İstanbul, H.1312

babası hesab olunur" deyərkən şairi "ədəbiyyatımızın Azərbaycan dilində yazan ən böyük, ən qədim nümayəndələrindən biri" hesab edirmiş.[104] Əlbəttə, əgər F.Köçərli bir az əvvəldə Yaxın Şərq ədəbiyyatlarının, o cümlədən fars və türk ədəbiyyatlarının Azərbaycan ədəbiyyatına təsirini səciyyələndirərkən "türk şairlərinə gəldikdə, bunlardan Molla Məhəmməd Bağdadi Füzulinin Azərbaycan şüərasına hamıdan artıq təsiri olubdur" (I, 82) – sözlərini yazmasaydı, bu qənaətə gəlmək olardı.

F.Köçərli açıq-aydın nəzərə çarpdırır ki, o, Füzulinin öz ədəbiyyat tarixinə məhz əsrlər boyu Azərbaycan şairləri onun davamçıları olduqları, ona "peyrəvilik" etdikləri üçün salmışdır: "Azərbaycan şüəra və üdəbasından bəhs edib də, onların sərvəri və pişrəvi məqamında olan Füzulinin ismi-şəriflərini zikr etməmək bir növ haqqı və əməyi itirmək kimidir. Bir halda ki, ol fəsahət və bəlağət kanının təsiri bu əsrdəki şüəramızın əşarında dəxi müşahidə olunmaqdadır" (I, 84). Başqa bir yerdə: "Füzulidən sonra Azərbaycan şüərasına az-çox nüfuzu olan Yusif Nabi Çələbi və Əlişir Nəvai olubdur ki, onlardan hər birinin barəsində bir para məlumat verməyi lazım bildik. Bir halda ki, hər üçü Azərbaycan şüərasının ustadları məqamında olublar" (I, 83).

Gətirilən misallardan aydın olur ki, Füzuli yaradıcılığına yüksək hörmət və məhəbbət bəsləyən, onu dərindən öyrənib tədqiq edən Köçərli şairi Azərbaycan yazıçıları cərgəsində deyil, əsərə əlavə etdiyi "Azərbaycan şüərasının ustadları" (I, 83) bölməsinə hansı mülahizə ilə daxil etmiş və haqqında Yusif Nabi və Əlişir Nəvai barəsində olduğu kimi ancaq "bir para məlumat" vermişdir.

F.Köçərli "bizim fazil və həkim bir şairimiz" (I, 131) adlandırdığı Nizaminin əsərlərini azərbaycancaya "açıq dildə tərcümə edib, milli ədəbiyyatımızı dövlətləndirməyi" fars dilini yaxşı bilən "şairlərimizin baş vəzifələrindən biri" hesab edirdi. O göstərirdi ki, "insaf deyil ki, onun möcüznüma kəlamları Avropa dillərinə tərcümə olunub intişar tapsın, bizlər isə onu öz dilimizdə mütaliə edib feyzyab olmaqdan məhrum qalaq" (I, 132).

Ümumiyyətlə, XX əsrin əvvəllərində Azərbaycan klassiklərindən fars dilində yazanlar çox vaxt fars, Füzuli və başqa ədəbi simalar isə Osmanlı ədəbiyyatına aid edilirdi ki, Köçərli də bu səhvdən yaxasını qurtara bilməmişdi. Bu halın Avropa şərqşünaslığında, həmçinin İran, Türkiyə ədəbiyyatşünaslığında sonralar da davam etdiyi məlumdur. Eduard Branunun fars ədəbiyyatı tarixinə dair dörd cildlik əsəri, Şarl Rionun tərtib etdiyi kataloq buna misal ola bilər[105].

Faktlar göstərir ki, Köçərli də, bir sıra müasirləri kimi, yalnız ana dilimizdə yazılan əsərləri Azərbaycan xalqının doğma ədəbiyyatının malı hesab

[104] K.T a l ı b z a d ə. XX əsr Azərbaycan ədəbi tənqidi, səh.121

[105] H.A r a s l ı. Göstərilən əsəri, səh.8



etmişdir. Halbuki böyük sənətkarların xarici dillərdə əsər yaratmaları halı təkcə Azərbaycan ədəbiyyatına aid olmayıb istər Şərq, istərsə də Qərbin bir çox xalqlarının ədəbiyyatlarında müşahidə olunur. Xarici dillərdə yaradılmış əsərlər yazıldıqları dillərin deyil, yazıçının mənsub olduğu öz doğma xalqının məhsulu olmuşdur. Əlbəttə, məşhur rus yazıçısı İ.S.Turgenevin fransız və alman dillərində, ingilis yazıçısı Oskar Uayldın fransız dilində, alman şairi Henrix Heyne və isveç yazıçısı Avqust Strindberqin fransız dilində, fransız şairi Rayner Mariya Rilkenin alman və rus dillərində yaratdıqları sən'ət incilərı yazıldıqları dillərin ədəbiyyatlarını deyil, öz aid olduqları xalqların ədəbiyytlarını zənginləşdirmişdir[106]. Həmçinin Əbülüla, Xaqani, Nizami, Məhsəti, Şəms Təbrizi, Füzuli, Axundzadə, Bahar Şirvani, M.Ə.Talıbov və başqa Azərbaycan klassiklərinin fars və ərəb dillərində, İ.Qutqaşınlının fransız dilində ("Rəşid bəy və Səadət xanım") yaratdıqları əsərlər Azərbaycan ədəbiyyatının məhsulu olub onun inkişafına xidmət etmişdir.

* * *

F.Köçərli çoxcəhətli yaradıcılığı boyu bir ədəbiyyat tarixçisi, nəzəriyyəçi və tənqidçisi kimi tədqiq və təbliğ etdiyi sahənin, demək olar, bütün əsas məsələlərinə toxunmuş, onlar barədə öz görüşlərini aydın izah etməyə çalışmışdır. O, ədəbiyyatı hər bir xalqın "şən və əzəmətinə, tərəqqi və səadətinə bais olan səbəblərdən biri" (I, 70) hesab edib iki hissəyə ayırmışdır: şifahi və yazılı ədəbiyyat.

Alim "ədəbiyyatı-lisani" və yaxud "el ədəbiyyatı" adlandırdığı folklor ədəbiyyatının "ağızda söylənən nağıl, hekayətlərdən, cürbəcür milli nəğmələrdən, aşıq sözlərindən, məsəllərdən, tapmacalardan, yanıltmaclardan, ağıçı sözlərdən, bayatılardan ibarət" olduğunu göstərir (I, 71), bunlara hər bir xalqın qiymətli mənəvi-bədii sərvəti kimi baxırdı. O, qeyd edirdi ki, tarixi keçmişini, dilini, vətənini sevən inkişaf etmiş millətlər öz şifahi xalq ədəbiyyatı nümunələrini "kəmali-şövq və diqqətlə cəm edib, ziqiymət sərmayə kimi saxlayır və balalarının ilk təlim və tərbiyəsini onları öyrətməklə başlayır"[107]. Çünki ağızdan-ağıza söylənən bu ədəbiyyat "hər bir millətin hal və şəninə və övzai-məişətinə müxtəss olub, onun dünya üzrə və növ yaşamasına şəhadət verir" (I, 76).

Vətəni Azərbaycanda ədəbiyyatın bu növünün kifayət qədər qiymətləndirilməməsi alimi çox düşündürürdü. Bir tərəfdən də "qonşularımız türk millətinin əsrlərcə yaradıb vücuda gətirdiyi nəql və hekayətləri və xoşlarına gəldiyi məsələləri özlərinə məxsus edib "Erməni nəqli və məsələləri" adı ilə

[106] М.П.А л е к с е е в. Текстологические особенности издания И.С.Тургенева. Текстология славянских литератур. Л., 1973, səh.10-11

[107] F.K ö ç ə r l i. Balalara hədiyyə, səh.2

başqalarına elan" etmələri, yəni bu yolla Azərbaycanın mənəvi sərvətini və milli dəyərlərini mənimsəyib açıq-aşkar talan etmələri Köçərlini bərk narahat edirdi. O, əgər "bunları cəmləşdirib çapa verməsək, itib-batıb gedərlər"[108] – deyə ziyalılara müraciət edib, onları xalqın əsrlər boyu yaratdığı qiymətli folklor incilərini toplamağa təşviq edirdi. Lakin Köçərlinin dövründə folklora aid bəzi kitabçaların çap olunmasına, dərsliklərdə folklor nümunələrinə də müəyyən yer verilməsinə baxmayaraq, bütün bunlar həmin zəngin sərvətlə müqayisədə çox qeyri-qənaətbəxş idi. Köçərli və onun qabaqcıl müasirlərinin arzusu yalnız keçən əsrin 20-ci illərindən sonra layiqincə həyata keçirildi.

F.Köçərli gənc nəsli düzgün tərbiyə etmək, onda vətənə, xalqa, ana dilinə məhəbbət duyğuları oyatmaq üçün uşaqları hələ kiçik yaşlarından şifahi ədəbiyyat nümunələri ilə tanış etməyi ilkin tərbiyə üsullarından sayır və bunu valideynlərə məsləhət görürdü. Nahaq deyil ki, o, çap etdirdiyi şifahi xalq ədəbiyyatı nümunələri kitabına bu baxımdan çox mənalı olan "Balalara hədiyyə" adı vermişdi.

F.Köçərli yazılı ədəbiyyata tərif verib deyirdi: "İkinci qisim ədəbiyyat üdəba və şüəranın, üləma və hükəmanın asari-qələmiyyələrindən vücuda gələn təhrirat və təsnifatdan ibarətdir ki, bunlar xah nəsr ilə yazılmış olsun, xah nəzm ilə, xah ülum və fünuna dair olsun və xah əxlaq və ətvardan, şeir və qəzəliyyatdan bəhs eləsin" (I, 71). Alim şifahi və yazılı ədəbiyyatları səciyyələndirərkən onları bir-birindən ayırd edən xüsusiyyətləri, inkişaf yollarını özünəməxsus bacarıqla və aydınlıqla izah edirdi. O göstərirdi ki, şifahi ədəbiyyatı "yaradan və yoxdan var edən millət özü olur. Bunlar ağızlarda söyləmək ilə ümumxalq arasında intişar tapır", nəsildən-nəslə, atadan-oğula və oğuldan nəvəyə keçir (I, 76-77).

Yazılı – "qələmi ədəbiyyat isə başqa tərz ilə husula gəlir. Bunda hər bir nağıl və hekayənin məxsusi katibi və münşisi və hər bir təsnifin öz müsənnifi və hər bir şeir və qəzəlin müəyyən şairi vardır" (I, 77).

Müasir oxucuya bir qədər bəsit görünə biləcək bu izahat öz dövrünə görə həmin istiqamətdə ilk təşəbbüslərdən biri olduğuna görə, elmi cəhətdən əhəmiyyətli, faydalı idi. Belə izahatlar oxucunun ədəbiyyatın növləri, onların spesifik xüsusiyyətləri haqqında biliyini artırırdı.

F.Köçərli sən'ət əsəri və sənətkara qiymət verən zaman düzgün nəticələrə gəlib çıxır. Alimə görə, sən'ət əsəri sənətkarın fikir və hisslərini düzgün və dərindən əks etdirməlidir. Məhz belə olduqda sənətkar öz məqsədinə nail ola bilər: "Hər bir müəllif və şairin baş arzusu qarelərin qəlblərini təsxir etməkdir və bu arzuya vasil olmaq ancaq o vaxt mümkün olar ki, əşarü asarın törənəcək yeri hissiyyat ola və hissiyyat nə qədər ali və təbii olsa, bir o qədər kəlamın təsiri artıq olacaqdır"[109]. Füzuli irsinin əbədiliyini o, iki əsas səbəbdə görürdü ki, birincisi bu idi: "Füzulinin asari-qələmiyyəsinin hələ daha da çox zamanlar həyat üzrə davam edib, tərü təzə qalmağına iki ümdə səbəb vardır. Onlardan birisi budur ki, haman əsərlərin tamamisi pak, həqiqi və təbii hissiyyatdan nəş'ət etmiş əsərlərdir ki, eşqi-həqiqidən bəhs edir" (I, 92). İkinci səbəbi Köçərli bu əsərlərin "elm və təcrübə üzü ilə təbi-səlimdən doğub vüğua gəlmələri"ndə görürdü (I, 93). O, müasir ziyalıların diqqətini Füzulinin "elmsiz şeir əsası yox divar kimi olur və əsassız divar qayətdə bietibar olur" kəlamına cəlb edib yazırdı: "Füzulinin qələmi-gövhərrizindən vücuda gələn lölə və cəvahir ilə tikilmiş imarətin divarları elm və maarifin möhkəm bünövrəsi üstündə qərar tutmuşdur və afəti-zəmanədən ona bir xövfü xətər yoxdur, zira bir xanənin binası nə qədər möhkəm olsa, bir o qədər onun daimi və əbədi olması yəqindir" (I, 93).

[108] F.Köçərlinin A.Şaiqə 14 sentyabr 1912-ci il tarixli məktubu



XX əsrin əvvəllərində ədəbi ictimaiyyəti məşğul edən məsələlərdən biri ədəbiyyatın xəlqiliyi problemi idi. Demokratik ədəbi tənqiddə həyatı olduğu kimi əks etdirmək, mövzunu real həyatdan, real varlıqdan alıb onu mühitlə, aktual ictimai problemlərlə bağlamaq sən'ətdə ən düzgün yol kimi qiymətləndirilirdi. M.F.Axundzadənin yüksək zirvəyə qaldırdığı realist sənətkarlıq xüsusiyyətlərini N.Vəzirov, M.Ə.Sabir, C.Məmmədquluzadə, N.Nərimanov və başqaları davam etdirirdilər. M.F.Axundzadədən sonra Azərbaycanda realizmin ən qüdrətli təbliğatçısı, onun nəzəriyyəsini yeni inkişaf mərhələsinə qaldıran isə Köçərli idi. "O, realist Azərbaycan ədəbiyyatının öz təcrübəsinə, onun zəngin ənənələrinə istinad edərək realizm nəzəriyyəsini daha da inkişaf etdirirdi"[110].

Vaxtilə M.F.Axundzadə ədəbiyyatda realizmdən, xüsusilə Vaqif və Zakirin bu sahədəki gözəl ənənələrindən bəhs edərək yazırdı ki, həmin sənətkarların əsas tarixi xidməti öz dövrlərini, xalq həyatını, insan psixologiyasını, məişət və adət-ənənələri düzgün, təbii, canlı göstərmələrindədir. Onlar öz əsərlərində "vəqaye və güzarişatı və əhvali-müasirini və ətvari-pürcəvanı bir növ ilə bəyan edirlər ki, insan vəcdə və zövqə gəlir"[111].

F.Köçərli də bədii ədəbiyyata realist nəzərlə baxıb onu "millətin aineyi-həqiqətnüması" (I, 70) adlandırırdı. Elə bir ayna ki, bu aynada xalqın tarixi inkişafı, milli adət-ənənələri, "dolanacağı", "övza'i-məişəti", "dərəceyi-tərəqqisi", "mərtəbeyi-kəmalı", "qüdrət və cəlalı" bütün varlığı ilə əks olunur[112]. Elə bir ayna ki, bu ayna "onun maddi və mənəvi tərəqqisini və istiqbalı üçün nicat və səadət yollarını eyni ilə göstərir" (I, 70).

[109] F.K ö ç ə r l i. Seçilmiş əsərləri, səh.99
[110] K.T a l ı b z a d ə. XX əsr Azərbaycan ədəbi tənqidi, səh.442
[111] M.F.A x u n d z a d ə. Əsərləri. Üç cilddə, II cild, Bakı, 1961, səh.203
[112] F.K ö ç ə r l i. Seçilmiş əsərləri, səh.98

Yazıçılara gəldikdə isə, Köçərli onları öz əsrlərinin və vətən mülkünün "müsəvvir və nəqqaşına", "Puşkinin deməyinə görə, qayalardan və dərələrdən gələn əks-sədaya bənzədirdi. Elə bir müsəvvir və nəqqaşa ki, onun qələmindən çıxan nəqşələr və təsvirlər hamının rəğbət və məhəbbətini qazanır, onların əsərlərində dərin fikirlər olur və buna görə də "vicdan üzərinə təsiratı külli, tərbiyeyi-əfkar və təhzibi-axlaq yolunda faydası artıq, əhəmiyyəti böyük və məziyyəti ziyadə" olur[113].

F.Köçərliyə görə, sənətkar gərək xalqın kədər və sevincinin tərcümanı olsun, "onu qəflətdən bidar edib, tərəqqi və maarif səmtinə cürət və cəsarət ilə dəvət" etsin[114]. Fikirlərini aydınlaşdırmaq və sübuta yetirmək üçün Köçərli tez-tez dünya ədəbiyyatının Sə'di və Hafiz, Şekspir və Bayron, Russo və Hüqo, Gete və Şiller, Puşkin, Dostoyevski və Tolstoy kimi klassik simalarını yad edib, onların öz "millətlərinin ən böyük müəllimi və ən mahir və müqtədir mürəbbisi olub, əsərləri ilə onların təhzibi-əxlaqına rifət və səadət tapmasına, şöhrət və qüvvət kəsb etməsinə hüsni-tədbirlər və salamat təriqlər göstərdiklərini"[115] yazır.

"Azərbaycan ədəbiyyatı" müəllifi öz xalqının bəşər mədəniyyəti xəzinəsinə verdiyi inciləri də sərraf kimi tapıb qiymətləndirməyi bacarır, Azərbaycan ədəbiyyatının böyük ideallarla, sağlam və yüksək hisslərlə zəngin olduğunu iftixarla təhlil və sübut edirdi. Bu məqsədlə Köçərli Azərbaycan klassiklərindən M.V.Vidadi, M.P.Vaqif, A.Bakıxanov, Q.Zakir, M.F.Axundzadə, S.Ə.Şirvani, N.Vəzirov, M.Ə.Sabir, C.Məmmədquluzadəni misal gətirir, onlardan çoxunun yaradıcılığını və ədəbi irsini geniş təhlildən keçirirdi. Alim Azərbaycan ədəbiyyatında yaranan realist ədəbi cərəyanın özünəməxsus xüsusiyyətlərini, inkişaf yolunu və ideya istiqamətlərini də məharətlə üzə çıxarırdı.

Vaqif realizmini Köçərli "öz müasirlərinin" – "bizim ata-babalarımızın dolanacağını, adabü əxlaqını, libas və təamlarını, arzu və təmənnalarını, fikir və xəyalatını və filcümlə, ol əsrin övza və dəstgahını gözəl əşar və kəlamiabdar ilə yazıb, gələcək nəsil üçün unudulmayan bir əlamət və yadigar qoyduğu ilə (I, 174) izah edirdi. O göstərirdi ki, Molla Pənah milli şair olduğuna görə, onun şeir və qəzəliyyatı bizə "ziyadə xoş gəlir və hər nə onun qələmindən zühura gəlibsə, xah müxəmməsat və xah mürəbbeat və xah qəzəliyyat, təmamisi ürəkdən və həqiqi həyatdan nəş'ət edən əsərlərdir" (I, 172). Köçərlinin bu mühakimə və izahının böyük sələfi Axundzadənin bir az əvvəl misal gətirdiyimiz sözləri ilə çox səsləşdiyini hiss etmək çətin deyildir.

113 F.K ö ç ə r l i. Seçilmiş əsərləri, səh.98

114 Yenə orada, səh.99

115 Yenə orada, səh.98



F.Köçərli ədəbiyyatın xəlqiliyini hər hansı bir yazıçının xalq həyatı ilə, ictimai varlıqla münasibətlərinin mütərəqqi mahiyyətində görürdü. Yazıçının öz mənsub olduğu xalqın mənəvi aləmi ilə sıx bağlı olmasını o, bu işdə həlledici şərt sayırdı: "...Bir müsənnif və şair nə qədər öz millətinə yavuq olsa, onun adət və xasiyyətləri üzrə nəşvü nüma tapsa, milliyyət qanı onun damarlarında nə qədər artıq cərəyan etsə, bir o qədər onun əsərlərində dəxi milliyyyət qoxusu və milliyyət nişanəsi artıq görünəcəkdir" (I, 77). Köçərli şair Zakiri məhz belə sənətkarlardan hesab edirdi. O yazırdı ki, Zakirin realizmi XIX əsrin birinci yarısındakı ictimai varlığı əks etdirən canlı bədii lövhələrlə zəngindir: "Qasım bəy Zakir həqiqi bir milli şair imiş. Öz əsrinin aynası olubdur və məişəti-milliyyəsini – necə ki, var imiş, – eyni ilə yazıb, bizim üçün böyük bir yadigar qoyubdur. Öz əsrində şayani-diqqət olmuş olan bir şey qoymayıbdır ki, ona əl aparmamış olsun. O vaxtın adamlarının adabü əxlaqını və dolanacaqlarının övzavü əsasını mahir nəqqaş kimi özlərinə məxsus rənglərlə çəkib bizə göstərir. Məişətin hər bir sinif və təbəqatına ətraflı nəzər yetirib sairlərin gözlərinə görsənməyən şeyləri görüb təftiş və tənqid edibdir" (I, 377). Zakirin "O viladə mehribanlıq görmədim" misrası ilə başlanan şerində göstərdiyi hallara Köçərli XX əsr Azərbaycan həyatında da rast gəlir: "Hər kəs Zakirin bu kəlamını diqqəti-təmam ilə oxuyub, onda şair yad etdiyi məqamları seyrü təfərrüc qılsa və əzəlki hal ilə indiki övzavü əhvalı tətbiq etsə, bilaşübhə, onun da ürəyi qan ilə tutulub, gözlərindən bilaixtiyar yaş tökülər" (I, 396). M.F.Axundzadə realizminin xəlqiliyi, həyatla, xalqla möhkəm bağlılığı Köçərlinin diqqətini xüsusi cəlb etmişdi.

M.F.Axundzadənin ən böyük tarixi xidmətlərindən birini Köçərli onun Azərbaycanda dramaturgiyanın binasını qoymasında görürdü. O göstərirdi ki, "ədəbiyyatın bu növündə əsərlər vücuda gətirmək üçün elm və savaddan başqa təcrübə, bilik və millətin məişətinə ətraflı bələdiyyat dəxi lazımdır" (I, 435). M.F.Axundzadə komediyalarına Köçərlinin verdiyi bu qiymət böyük rus tənqidçisi V.Q.Belinskinin A.S.Puşkinin "Yevgeni Onegin" əsəri haqqında yazdığı aşağıdakı sətrlərlə səsləşir: "В своей поеме он умел коснуться так многого, намекнуть о столь многом, что принадлежит исключительно к миру русской природы, к миру русского общества! "Онегин"а можно назвать енсиклопедией русской жизни и в высшей степени народным произведением"[116]. Belinski "Yevgeni Onegin"i "rus həyatının ensiklopediyası" adlandırırsa, Köçərli Axundzadənin komediyalarını "məişətimizin aynası"na bənzədir.

F.Köçərli böyük sənətkarlardan danışarkən onların yaradıcılığına müasirlik baxımından yanaşır, klassik ədəbiyyatın müasir əhəmiyyətini müəyyənləşdirməyə çalışır. O, XIX əsr Azərbaycandakı bir çox ictimai problemlərin hətta

116 В.Г.Б е л и н с к и й. Собрание сочинений. В 3-х т. III том. М., 1948, səh.566

XX əsrin əvvəllərində də qaldığını nəzərə alaraq Axundzadə irsinin müasir, aktual əhəmiyyəti olduğunu yazırdı: "Axundzadə komediyalarında göstərdiyi eyiblərimizə diqqət yetirib, onların dəfinə və islahına çalışsaydıq, bu qədər avam qalmazdıq, içimizdə, dolanacağımızda müşahidə olunan küfrü zəlalət və xilafi-əqlü qanun əməllər cari olmazdı. Oğurluqdan və əyrilikdən ikrah edib daşınardıq; halal kəsb dalısınca gedib şənü hörmət kəsb edərdik; zindanxanalar və məhbəsxanalar müsəlmanlar ilə dolu olmazdı" (I, 452). Əsərinin başqa bir yerində alim özünün bu müddəasını daha da inkişaf etdirərək, "Aldanmış kəvakib"dəki ictimai ideyaların eynilə XX əsrin əvvəlindəki İran üçün aktual olduğunu göstərərək yazır ki, əgər "müsəlman məmləkətlərində, xüsusən İranzəmində ümuri-dövlətə mübaşir olan vüzəravü vükəla və sair ərkani-səltənət – ki, Mirzə Fətəlinin əsrindən indiyə kimi gəlib gediblər, – "Aldanmış kəvakib"də zikr olunan qüsurlarına diqqət yetirib məmləkətlərinin məmuru və səlahı üçün sərfi-himmət etsəydilər, Yusif şah öz müvəqqəti əyyami-səltənətində işlətdiyi binagüzarlıqları və tədbirləri icra etsəydilər, müsəlman məmləkətləri hərgiz belə fəna və pozğun hala düşməzdi və əcnəbi millətlərin çəngali-təsərrüfünə keçməzdi. Onlar da sair dövlətlər kimi qüvvət və miknət kəsb edib, əmnü asayiş üzrə yaşardı" (I, 452-453).

Qeyd etməmək olmaz ki, Axundzadənin povestinin müasir əhəmiyyətini göstərməkdə düz iş görən Köçərli öz fikrini şərh edərkən eyni zamanda öz dünyagörüşünün məhdudluğunu da gizlədə bilmir: o elə güman edir ki, İranın "Aldanmış kəvakib"də ifşa olunmuş "vüzəra və vükəlası" Axundzadənin əsərindən lazımi nəticə çıxarıb ölkə üçün faydalı fəaliyyət göstərsəydilər, hər şey düzəlmiş olardı.

F.Köçərlinin Seyid Əzim Şirvani yaradıcılığına verdiyi qiymətlər onun ədəbi görüşlərində, tənqidi baxışlarında xüsusi yer tutur. Alim "külli-Azərbaycanın bülbüli-xoşnəvası" Seyid Əzimi öz xalqını elm və maarifə, "himmət və qeyrətə" ittihad və ittifaqa, tərəqqi və təməddünə dəvət" etdiyinə görə tərəqqipərvər, humanist şair adlandırırdı.

"Azərbaycan ədəbiyyatı"nda Köçərli ictimai və mədəni tərəqqi uğrunda qələm çalan, yaxşını – yaxşı, pisi – pis kimi göstərən, mövhumat, qəflət və dini xürafatı ifşa edən "həqpərəst və millətpərvər ədiblərə" daha artıq yer vermiş, onların yaradıcılıq problemlərini geniş şərh etməyə çalışmışdır. S.Ə.Şirvanini məhz belə sənətkarlardan biri kimi qiymətləndirmişdir. O yazır: "Hansı alim məhz belə sənətkarlardan biri kimi qiymətləndirmişdir. O yazır: "Hansı millətin içində belə hünərmənd və sahibi-rəyü mərifət peyrəvilər olmasa, vay o millətin halına! Belə sahibsiz millət tezliklə zəlalət və rəzalət quyusuna düşüb, cəhalət çəngində boğulub məhvü nabud olacaqdır" (II, I, 49).

F.Köçərli tarixçi olduğu qədər ədəbiyyatın müasir inkişafı məsələləri ilə də məşğul olan istedadlı bir tənqidçi idi. Müasir ədəbiyyatın ideya, mövzu, bədii sənətkarlıq, dil və s. məsələləri onu daim maraqlandırırdı.



Klassiklərdən danışarkən öz müasirlərinə onların ölməz ənənələrini öyrənib davam etdirməyi məsləhət görən Köçərli yeni dövrdə keçmiş ədəbiyyat üçün səciyyəvi olan moizə və nəsihət yolu ilə getməyi kəskin surətdə pisləyir, elm və maarifin "yaxasını tutub" gecə-gündüz onları tərifləyən yazıçıları cəmiyyət həyatını, xalqın arzu və ehtiyaclarını daha geniş, daha dərindən əks etdirməyə çağırırdı. O yazırdı: "Bu halda bir kəs tapılmaz ki, elmin fəzilət və mənfəətini və onun cümləyə zərur olmasını inkar edə. Belə olan surətdə uzun-uzadı şeirlərlə elmi və kəmalı tərif etməyə nə hacət var". İndiki zamanda xalq üçün "gözəl nəsihətlər, hikmətamiz hekayələr, vətənə məhəbbət, millətə xidmət, təvarixdən şayani-diqqət əhval və rəvayətlər, dostluqda sədaqət, əhdə vəfa etmək və bunlar misilli min cürə uca fikirlər və müqəddəs hisslər" haqqında əsərlər yaratmaq lazımdır[117].

* * *

F.Köçərli təkcə Azərbaycan ədəbiyyatının tədqiqi ilə kifayətlənməyib, əsərlərində Şərq, Qərbi Avropa, rus, gürcü və s. ədəbiyyatların klassikləri haqqında da elmi mülahizələr yürütmüş, ədəbi əlaqələr baxımından qiymətli fikirlər irəli sürmüşdür.

Ümumiyyətlə, keçən əsrin sonu, yeni əsrin əvvəlində Azərbaycan ədəbi fikrini məşğul edən məsələlərdən biri də dünya ədəbiyyatına münasibət məsələsi idi. Enişli-yoxuşlu uzun yollar qət etmiş Azərbaycan ədəbiyyatı bu dövrdə yeni inkişaf mərhələsinə qədəm qoymuşdu. "Böyük nailiyyətlər əldə edən bir ədəbiyyatı isə öz milli ənənələri çərçivəsində qalmaq təmin etmirdi. O, öz ədəbi yaradıcılıq miqyasını genişləndirməyə, dünya ədəbiyyatının təcrübələrini öyrənməyə can atır və ədəbi əlaqələrin müasir dövr üçün əhəmiyyətini və zərurətini dərk edirdi. Demokratik tənqid və ədəbiyyatşünaslıq isə bu ehtiyaca dünya ədəbiyyatını daha dərindən öyrənməklə, onun böyük simalarını xalqa tanıtmaqla cavab verirdi"[118].

F.Köçərli rus ədəbiyyatı və ədəbiyyatşünaslığı ilə Qori müəllimlər seminariyasında oxuyarkən tanış olmuşdu. O, bütün yaradıcılığı boyu bu zəngin ədəbiyyatın görkəmli nümayəndələrinin əsərlərini sevə-sevə oxumuş, XIX əsr rus ədəbi tənqidi və elmi fikirlərini, o cümlədən, V.Q.Belinski, N.Q.Çernışevski, K.D.Uşinskinin əsərlərini müntəzəm mütaliə eləmişdi[119]. Hələ tələbə ikən o, belə bir qənaətə gəlmişdi ki, rus ədəbiyyatı və mədəniyyəti ilə, rus məişəti ilə tanışlığın Azərbaycan xalqı və ədəbiyyatının inkişafında böyük əhəmiyyəti ola bilər. Bunun üçün o, azərbaycanlıların ilk növbədə rus dilini öyrənmələrini vacib məsələlərdən biri sayırdı. İmtahan işlərinin birində Köçərli yazmışdı: "...Rus xalqı ilə Qafqaz əhli arasında səmimi və

[117] F.K ö ç ə r l i. Seçilmiş əsərləri. səh.102

[118] K.T a l ı b z a d ə. XX əsr Azərbaycan ədəbi tənqidi. səh.258

[119] B.N ə b i y e v. Göstərilən əsəri, səh.87

müqəddəs məhəbbət, birlik və dostluq onlar bir-birini mümkün qədər çox başa düşdükdə, bir-birinin dilini bildikdə və birgə hərəkət etdikdə mümkün ola bilər"[120]. Günün vacib məsələsinə toxunan tələbə Köçərlinin o zaman hələ "Ey oğul, hər lisanə ol rağib, Xassə ol rus, elminə talib" misralarının müəllifi Seyid Əzim Şirvaninin də həmin fikirdə olduğundan xəbərsiz idi. Seyid Əzim öz tədqiqatçısından hələ neçə illər əvvəl Azərbaycan xalqı arasında rus dili, ədəbiyyatı və elminin yayılması və öyrənilməsinin vacibliyini dərk etmişdi. Sonralar Seyid Əzimin əsərləri ilə tanış olan alim Köçərli öz sələfinin fikrinə qüvvət verərək rus dilinin öyrənilməsi və məktəblərdə tə'liminin "müsəlmanlar üçün ən lazım əmrlərdən birisi olduğunu" bir daha qeyd edirdi (II, I, 63). Köçərli özü də dünya klassikləri Şekspir, Bayron, Russo, Hüqo, Gete, Şiller və başqalarının yaradıcılığı ilə məhz bu dilin vasitəsilə tanış ola bilmişdi.

Rus ədəbiyyatını həm bir müəllim, həm tənqidçi, həm də tərcüməçi kimi öyrənib təbliğ edən Köçərlinin Puşkindən "Torçu və balıq", Lermontovdan "Üç xurma ağacı", Koltsovdan "A kişi, niyə yatıbsan?"[121], Çexovdan "At familiyası"[122] kimi tərcümə əsərlərini ədəbi ictimaiyyət rəğbətlə qarşılamışdı. Bu tərcümələr "ədəbiyyatı ideya cəhətdən zənginləşdirmək məqsədi güdürdü"[123]. Onun M.F.Axundzadənin "Aldanmış kəvakib" povestini rus dilinə çevirməsi də çox yaxşı bir təşəbbüs idi.

Rus ədəbiyyatının Azərbaycanda yayılması və təbliğində Köçərli bir çox müasirlərindən öz işinin ardıcıllığı ilə seçilirdi. O, bu ədəbiyyatın ayrı-ayrı nümayəndələri haqqında mətbuat səhifələrində qiymətli məqalələr ilə də çıxış edir, ədəbiyyat tarixinə dair kitablarında və qələm dostlarına yazdığı məktublarda nəzəri fikirlər söyləyir, məsləhətlər verirdi.

F.Köçərli eyni zamanda rus dilində yazdığı əsərləri ilə Azərbaycanın klassikləri M.F.Axundzadə, M.P.Vaqif, M.V.Vidadi, Q.Zakir, N.Vəzirov, N.Nərimanov, C.Məmmədquluzadə və başqalarını rus xalqına və bu dil vasitəsilə sair xalqlara tanıtmaqda çox böyük, faydalı iş görmüşdür. Onun bu əsərləri Azərbaycan ədəbiyyatının şöhrətini daha da artırmış, rus və başqa xalqların ədəbiyyat elmi üçün ən mötəbər məxəzlərdən olmuşdur.

F.Köçərlinin rus klassikləri yaradıcılığına verdiyi düzgün qiymətlər bu gün də öz əhəmiyyətini saxlamaqdadır. O, XIX əsr Azərbaycan ədəbiyyatını tədqiq edərkən dönə-dönə rus ədəbiyyatına müraciət edir, iki ədəbiyyat arasında əlaqələr baxımından maraqlı müşahidələr, ədəbi paralellər aparır. Köçərli rus ədəbiyyatının və mədəniyyətinin inkişafında Puşkin və Qoqolun

[120] Sitat B.Nəbiyevin göstərilən əsərindən götürülüb, səh.78

[121] M.Y.L e r m o n t o v. Üç xurma ağacı; A.K o l t s o v. A kişi, niyə yatıbsan? Şuşa, 1895

[122] A.P.Ç e x o v. At familiyası. "Şərqi-Rus" qəz., 16, 17 iyun 1904

[123] Şamil Q u r b a n o v. Lermontov və Azərbaycan ədəbiyyatı. Bakı, 1976, səh.35



böyük rolu olduğunu xüsusi qeyd edirdi. Alim göstərirdi ki, "rusların milli ədəbiyyatının binasını qoyan Puşkin və Qoqol olubdur. Bu iki müqtədir ədib milli ədəbiyyatlarını məişətlərinin aineyi-həqiqətnüması edib, özlərindən sonra gələn üdəba və şüəraya salamat bir məslək, müstəqil bir yol açıblar"[124]. Köçərli Puşkin və Qoqol yaradıcılığındakı realizmi səciyyələndirərkən yazırdı: "Puşkin durbin kimi məişətin uzaq yerlərini və gözəl mənzərələrini işıqlı və qəşəng bir halda göstərirkən, Qoqol zərrəbin kimi yaxında olan və gözünün önündə, şişənin altında tərpənən nifrətəngiz həşərat və mikrobları böyüdüb göstərir"[125].

Məlum olduğu kimi, Qoqol rus mədəniyyətinin inkişafı tarixində parlaq rol oynamış, rus ədəbiyyatında tənqidi realizmin əsasını qoymuşdur. Rus ədəbiyyatına yeni demokratik ideyalar gətirən, ədəbiyyatı cəmiyyətlə daha sıx bağlayan yazıçı öz əsərlərində xalqın həyatını, məişətini, istək və arzularını, sevinc və kədərini əks etdirib, təhkimçilik quruluşunu, nadanlıq və cəhaləti cəsarətlə tənqid etmişdir. Köçərli bu həqiqəti aydın dərk edərək yazırdı: "Qoqol həqiqətnəvis ədiblərin (realistlərin) babası və pişrəvi mənzələsindədir. Qoqol və Puşkin və bunlardan sonra Nekrasov, Turgenev, Dostoyevski, Qonçarov, L.Tolstoy, Çexov və hal-hazırda Maksim Qorki və L.Andreyev əllərində məşəl rusların məişətinə daxil olub, onun hər səmtinə və küncünə işıq salıb, millətin yaralarını, ruhani və cismani küdurətlərini, qəm və şadlıqlarını görüb və gördüklərinin surətini mahir nəqqaş kimi eyni ilə çəkib bütün aləmə göstərib deyirlər: "Baxın, görün! Budur bizim millət; bu sayaqdır onun diriliyi və dolanacağı; budur onun halı, fikirləri, hissiyyatı və xəyalatı!"[126]

Bu sitatdan bir daha görünür ki, Köçərli Puşkinlərin, Qoqolların Rusiya üçün tarixi rolunu, onların əsərlərindəki dərin realizmi, milli koloriti, vətənpərvərlik və xəlqiliyi göstərməklə bərabər, rus ədiblərinin bu ənənələrə sadiq olduqlarını, rus klassikləri arasındakı ideya-varislik əlaqəsini də qabarıq şəkildə nəzərə çatdırmağı lazım bilmişdir.

M.F.Axundzadə yaradıcılığını tədqiq edərkən Köçərli onunla Qoqol arasında ideya-sənətkarlıq cəhətdən böyük yaxınlıq olduğunu üzə çıxarır: "Mərhum Mirzə Fətəli rus ədiblərindən və dramnəvislərindən məşhur Qoqolun müasiri idi. Hər iki ədib zatən psixoloq yaranmışdır. Bunlar adamların boşluğunu, səfahət və həmaqətini, büxl, həsəd, şərarət və fəsadını, zahiri və batini aləmlərin görürlərmiş. Zahirdə güldükləri adamların halına ürəkdən yanıb ağlayırlar və onların əsərlərini mütaliə edən şəxslərin qəlblərində yatmış hissləri oyadıb, məhəbbət çırağını yandırırlar. Bununla bərabər-

[124] F.K ö ç ə r l i. Seçilmiş əsərləri, səh.205

[125] Yenə orada, səh.212-213

[126] Yenə orada, səh.205

yət aləminə böyük xidmət göstəriblər"[127]. Başqa bir yerdə Köçərli hər iki sənətkarın realizminin qüdrətinə, həyatilik və xəlqiliyinə işarə edib yazırdı: "Bizim ədiblərimizdən mərhum Mirzə Fətəli Axundzadə asari-qələmiyyəsi ilə Qoqola çox bənzəyir". Qoqol kimi "Mirzə Fətəli dəxi öz komediyalarında, xəyalat gücü ilə və savad zoru ilə bir şey yaratmayıb, hər nə yazıbsa, dolanacağımızın eynindən və məişətimizin övzai-əhvalından götürübdür. Mərhum Mirzə dəxi zahirdə yazdıqlarının üstə gülürsə də, batində ağlayır və həqiqətən bir az dərin fikir etsək görərik ki, onun Molla İbrahimxəlili, Hacı Qarası, Hatəmxan ağası, Tarıverdisi, Ağamərdanı və qeyriləri yazıq və bədbəxt adamlardır, onların halına gülməkdən isə ağlamaq lazımdır"[128].

F.Köçərli göstərirdi ki, "necə ki, Qoqolun Qorodniçisi, Xlestakovu, Dobçinski, Bobçinskisi hal-hazırda Rusiyanın bəzi yerlərində müşahidə olunmaqdadırlar, habelə də Mirzə Fətəlinin Hatəmxan ağası, Hacı Qarası, Molla İbrahimxəlili, Namazı, Zalxası, Ağakərim Miyançısı və qeyriləri bu halda sağ və salamat bizim içimizdə dolanıb, hər biri öz fe'lü əməllərini işlətməkdədirlər" (I, 436).

Azərbaycan ədəbiyyatı ilə rus ədəbiyyatı arasında paralellər, müqayisələr aparmaq üsuluna Köçərlinin əsərlərində tez-tez rast gəlmək mümkündür. O, Zakir yaradıcılığının məziyyətlərindən danışanda, xüsusilə şairin təmsillərini təhlil edəndə belə bir nəticəyə gəlmişdi ki, "bu təmsillərdə o qədər həyati həqiqət ifadə olunmuşdur ki, həmin təmsilləri İvan Andreyeviç Krılovun təmsilləri ilə müqayisə etmək olar"[129]. Yaxud ideya-estetik cəhətdən böyük yaradıcılıq nailiyyətləri əldə edən, həm lirika, həm də satira sahəsində mahir olan Seyid Əzim, Köçərliyə görə, "rusların Puşkininə, ingilislərin Bayronuna və polyakların Miskeviçinə bərabər imiş" (II, I, 43). Nəhayət: "Məmmədquluzadənin istedadlı rus yazıçısı Çexovun əsərlərini xatırladan hekayələri bizim mədəni ziyalılarımızın nəzərini cəlb etməyə tam layiqdir"[130].

* * *

Yuxarıda qeyd olunduğu kimi, F.Köçərli dünya ədəbiyyatını yaxşı öyrənmişdi. Onda Şərq ədəbiyyatına, ümumiyyətlə, ədəbiyyata marağın oyanmasında atası Əhməd ağanın böyük rolu olmuşdu. Qarabağın orta bəylərindən sayılan Əhməd ağa savadlı bir şəxs olub, fars dilini mükəmməl bilirdi. Şərq poeziyasına xüsusi məhəbbəti olduğundan onun dahi sənətkarlarının əsərlərini müntəzəm mütaliə edər, xüsusilə, Firdovsinin "Şahnamə"sindən bütöv fəsilləri əzbər deməklə ədəbi məclislərdə öz həmsöhbətlərini heyran

[127] F.K ö ç ə r l i. Seçilmiş əsərləri. səh.274

[128] Yenə orada, səh.213

[129] Yenə orada, səh.63

[130] Yenə orada, səh.138



qoyarmış[131]. Şərq poeziyası nümunələrini ilk dəfə atasından eşidən gənc Köçərli sonralar bir ədəbiyyatşünas-tənqidçi kimi özü onları sevə-sevə, duya-duya mütaliə etmişdi. Ona görə, çox təbiidir ki, o, bütün elmi fəaliyyətində olduğu kimi, "Azərbaycan ədəbiyyatı" əsərində də Şərqin böyük ədəbi simaları – Firdovsi, Sədi, Hafiz, Əttar, Xəyyam, Rumi, Cami və başqalarının yaradıcılığı ilə ətraflı tanış olub, onlar haqqında qiymətli mülahizələr söyləmiş, türk şairi Yusif Nabiyə isə ayrıca oçerk həsr etmişdi. Azərbaycan ədəbiyyatının tədqiqi zamanı alim bu ədəbiyyatda Şərq poetik ənənələri, ideya, fikir, üslub yaxınlığı müşahidə etdikdə onları yerli-yerində göstərməklə yanaşı, ədəbiyyatların milli özünəməxsusluğunu, fərqli cəhətlərini təyin etməyi unutmurdu. O, məsələn, Vaqiflə Sədi (I, 189), "həqiqətpərəst" şairlər adlandırdığı Məhvəşi Şirvani və Nişat Şirvani ilə "sufiməslik Şeyx Əttar, Şəms Təbrizi* və Mövlana Cəlaləddin Rumi" (I, 495) arasındakı oxşar və fərqləndirici cəhətlər haqqında fikir yürütmüşdür.

Cəlaləddin Ruminin "Məsnəvi"sində, mənzum hekayə və təmsillərindəki fəlsəfi fikirlər, M.F.Axundzadə[132] kimi, Köçərlini də heyran etmişdi. O yazırdı ki, şair "timsal və hekayələrində" "adi bir şeyin üstə söz açıb, tülküdən, canavardan, atdan, eşşəkdən və ya insan növi şahdan, gədadan, dərvişdən və qənidən bəhs etdiyi əsnada məqamı gəldikcə münasibi-məqal haşiyələr çıxıb, xeyli həkimanə və fəlsəfanə sözlər söyləyir ki, onların məalü məzmunu cümləni heyrətə salır" (II, II, 231). Alim XIX əsr Azərbaycan şairi Xalxalinin "Sələbiyyə"sində böyük mütəfəkkirin yaradıcılığına yaxın məziyyətlər aşkara çıxarmışdı. Xalxalinin "Sələbiyyə"də "tutduğu nizamü rəvişin Mollayi-Ruminin şivəvü qaydasına bənzədiyini" (II, II, 231) göstərəndən sonra Köçərli eyni zamanda bu iki şair arasındakı fərqləri də izah edib yazırdı: "Əlbəttə, Xalxali ilə Mollayi-Rumi arasında fərq çoxdur: biri şəkkəri-Hindustan isə, o biri şəkkəri-Mazandarandır, amma bunu dəxi inkar etmək olmaz ki, ikisində də şirinlik vardır. Mollayi-Ruminin "Məsnəvi"sində olan dərin fikirlər, hikmətamiz sözlər, barik nüktələr, əlbəttə, Məhəmməd Bağırın "Sələbiyyə"sində yoxdur, amma onun "Sələbiyyə"sində dəxi xeyli gözəl nəsihətlər və müşfiqanə öyüdlər, nazik işarələr və məqbul zarafatlar olmağını dəxi inkar etmək olmaz" (II, II, 231).

F.Köçərli A.Bakıxanovun "Ey xoda, xahəm qəmo rənco bəla" misrası ilə başlanan məsnəvisini də Cəlaləddin Ruminin məşhur "Məsnəvi"sinə bənzədir (I, 302), Seyid Əzim Şirvanini qəlb oxşayan dərin mənalı qəzəllərinə görə farsların Hafizi ilə yanaşı qoyurdu (II, I, 126).

[131] B.N ə b i y e v. Göstərilən əsərləri, səh.14

* Şəms Təbrizi fars dilində yazdığı üçün Köçərli onu da fars şairi hesab edir

[132] M.F.A x u n d z a d ə. Mollayi-Ruminin də onun təsnifatının babında. Əsərləri, II cild, səh.204-209

F.Köçərlinin "Azərbaycan ədəbiyyatı"nda dahi özbək şairi Əlişir Nəvai haqqında oçerk (I, 117-123) mətbuat səhifələrində gürcü yazıçı və şairlərinə, o cümlədən, Sereteli, Qoqevaşvili və Lomouriyə həsr etdiyi məqalələri[133] onun bu xalqın ədəbiyyatına bəslədiyi böyük məhəbbət və dərin hörmətin təzahürüdür.

* * *

Ədəbiyyatın mövzular dairəsi, ideya istiqaməti ilə bərabər bədii forma, o cümlədən, ədəbi-bədii dilin saflaşdırılması məsələləri də Köçərlini düşündürən məsələlərdən idi.

Ümumiyyətlə, əsrin əvvəllərində Azərbaycan ədəbi dilinin müqəddəratı məsələsi mühüm bir problem kimi qarşıya çıxmışdı. Bu sahədə müxtəlif təmayüllər vardı. F.Köçərli ürək ağrısı ilə göstərirdi ki, "indiyədək mənəvi tərəqqimizə mane olan illət bir isə, indi iki olur. Bir tərəfdən hürufat qüsuru, digər tərəfdən dil qüsuru əlimizi və ayağımızı bağlayıb qoymur ki, irəli gedək"[134].

M.F.Axundzadə və M.Şahtaxtinskidən sonra Azərbaycan mədəniyyətinin inkişafı naminə əlifba islahatı aparılması yolunda çalışan xadimlərdən biri kimi Köçərli dönə-dönə ərəb əlifbasının dil, ədəbiyyat, təhsil və mətbuat sahəsində törətdiyi çətinliklərdən bəhs edirdi. O, tərəfdarları ildən-ilə çoxalan əlifba islahatı ideyalarının gec-tez həyata keçəcəyinə inanırdı: "Çox çəkməz bu mühüm məsələ həll olunar və müsəlmanların əlifbası dəyişdirilib və asanlaşıb sair mədəniyyətli millətlərin əlifbası kimi, ülum və maarifin intişarına" kömək edən qüvvətli vasitə olar (I, 435). Lakin Köçərli bu fikirdə idi ki, ikinci qüsuru aradan qaldırmaq, Azərbaycan dilini başqa dillərin zərərli təsirindən qorumaq üçün isə hələ çox böyük mübarizə aparmaq lazımdır.

Bu mühüm vəzifə Azərbaycanın bütün demokratik qüvvələrini vahid bir cəbhədə birləşdirmişdi. F.Köçərli, Y.V.Çəmənzəminli, Ü.Hacıbəyli, Ö.F.Nemanzadə və başqa mütərəqqi ziyalılardan ibarət olan bu cəbhə Azərbaycan ədəbi dilini canlı xalq dilinə getdikcə daha artıq yaxınlaşdırmaq, onu bu dil üzərində inkişaf etdirmək uğrunda inadla mübarizəyə qalxmışdı. Onlar dili millətin əvəzsiz sərvəti hesab edirdilər. Köçərli "Azərbaycan ədəbiyyatı" əsərində məşhur rus pedaqoqu K.D.Uşinskinin aşağıdakı sözlərini misal gətirmişdi: "Madam ki, bir millətin özünə məxsus ana dilisi xarici dillərin təqəllüb və təsəllütündən salamat qalıbdır, o millət özü də salamatdır. Əgər

[133] F.K ö ç ə r l i. Milli bayram. Seçilmiş əsərləri, səh.173-176; Yenə onun. Gürcü şairi A.Sereteli yubileyinə dair, orada, səh.177-186; Yenə onun. Yakov Semyonoviç Qoqebaşvili, orada, səh.286-287; Yenə onun. Redaksiyaya məktub, orada, səh.284-285; Yenə onun. Dost və müəllim N.O.Lomourinin xatirəsi, orada, səh.296-297

[134] F.K ö ç ə r l i. Seçilmiş əsərləri, səh.179-180



onun cəmi maddi və mənəvi dövlətini əlindən alasan, vəli ana dilinə toxunmayasan, o millət fövt olmaz və az müddətin zərfində yenə özünə mal və dövlət cəm edər. Və biləks heç bir mal və dövlət ilə bir milləti əhya etmək olmaz, zəmani ki, onun ana dilisi və milli lisanı olmaya" (I, 382).

F.Köçərli göstərirdi ki, "tərəqqi və səadət fikrində olan və əbədi zindəganlıq arzusuna düşən qövm və millət gərəkdir ən əvvəl öz ana dilinin vüsət və qüvvət tapmağına səy və himmət göstərsin" (I, 70-71). Alimə görə, kamil şair və ağıllı ədib həqiqətdə o şair və o ədibdir ki, "öz millətinin dili ilə danışa, ürəyi ilə, hissi və ağlı ilə fikir edə" (I, 77). Çünki "milləti haqq və savaba irşad edən, şöhrət və hörmətə yetirən onlardır. Öz asarü əşarı ilə onlar millətin cisminə şəfa, ruhuna səfa, fikrinə cila, ağlına və təmami mənəvi qüvvələrinə balü pər verib uca məqama qaldırırlar" (I, 70). Buna görə onların əsərləri elə bir dildə yazılmalıdır ki, onu xalq anlayıb başa düşsün.

F.Köçərli Azərbaycan dilinin əsrlər boyu inkişaf edib "şirin ləhcəli və gözəl şivəli" bir dilə çevrildiyini qeyd edirdi. O, bu inkişafa ərəb və fars dillərindən alınma sözlərin də böyük təsiri olduğunu göstərməyi unutmurdu. Lakin o həmin dillərin lüğətindən ən zəruri hallarda istifadə etməyi lazım bilirdi: "Vəqta ki, ana dilində şeyin özünün məxsusi adı var, və yainki ana dili ilə bir mənanı bəyan etmək və bir əhvalatı necə ki, lazımdır söyləmək mümkün olur, insaf deyil ki, elm göstərmək və mollalıq izhar etmək iddiasına düşüb, kəlamı qəliz ibarələr ilə və çətin anlaşılan ərəbi və farsi sözlər ilə doldurub, əsl mənanı dəxi və dərinə salmaq" (I, 79).

F.Köçərlinin dilə dair görüşlərində mətbuat dili məsələləri də mühüm yer tuturdu. Ümumiyyətlə, ədəbi-bədii dildə olduğu kimi, burada da onun ardıcıllıqla müdafiə və təbliğ etdiyi fikir mətbuatın xalq dilinə yaxın, aydın, sadə, anlaşıqlı bir dildə olması tələbi idi. Bu barədə mülahizələrini alim belə izah edirdi: "...Qəzetlərimizdə dərc olunan qəliz ibarələr ilə yazılmış bəzi siyasi, ədəbi və fənni məqalələri oxuyanlar anlamayıb məyus olurlar və qəzet oxumaqdan ikrah edirlər. Bu açıq həqiqəti nədənsə qəzet və jurnal verənlər başa düşmürlər və osmanlı qəzetçilərinə müqəllidlikdən əl çəkmirlər. Cəridələri bir il, para il ömür sürüb, müştərisizlikdən qapanır, zəhmətləri puça çıxır, külli xərc və məsarifləri hədər gedir" (I, 79). Odur ki, "dilimizi saxlamaq üçün "Əkinçi" kimi bir ruznamə çıxarmaq lazımdır. Əgər bizim dilimizdə bir qəzetimiz olmasa, dilimiz əldən gedəcəkdir. Meymunların ədədi gün-gündən artıb çoxalmaqdadır. Az-çox bunların qabağını "Molla Nəsrəddin" jurnalı kəsibdir"[135].

F.Köçərli müasir ziyalılara və tələbələrinə Azərbaycan dilini yaxşı bilmək, bu dilin canlı üslubunda yazıb yaratmaq üçün Vaqif, Vidadi, Bakıxanov, Zakir, Axundzadə, Seyid Əzim, Zərdabi kimi yazıçıların əsərlərini oxuyub

[135] F.Köçərlinin Y.V.Çəmənzəminliyə 12 fevral 1914-cü il tarixli məktubu

öyrənməyi məsləhət görürdü. O, qeyd edirdi ki, Vaqifin "adını eşitməyən və şənində söylənən "Hər oxuyan Molla Pənah olmaz" məsəlini bilməyən qafqazlı oğlu yoxdur. Vaqifi belə şöhrətləndirən, əlbəttə, onun rəvan təbi, mövzun kəlamı və gözəl qafiyələri olubdur", şairin əsərləri indi də dillər əzbəridir. Vaqifin kəlamlarını oxuduqda bilaixtiyar onlara rəğbət bəsləyirik. "Şair hər nə vücuda gətiribsə, öz ana dilimizin tərzü şivəsində gətiribdir. Onun əşarında istemal olunan türk və ya türkləşmiş fars və ərəb sözləri elə bir məharətlə nəzmə çəkilibdir ki, oxuyanları valeh və heyran edir" (I, 190). Köçərli başqa bir yerdə Zakirin təkcə bir qoşmasında işlənmiş "bizim başımızda çatdadı çanaq", "qoyun oturaq", "qurdu badalaq", "hamıdan qıvraq", "bir qarış torpaq", "bir qədim ocaq", "olgil göz-qulaq", "nə diş bilsin nə dodaq", "deyək, danışaq" və s. kimi xalq dilindən alınmış təbii, gözəl qafiyələri misal gətirərək yazırdı: "Bunlar camaatımızın ağzında müdam işlənən sözlərdir. Şair özü el içində nəşvü nüma tapmış eloğlu olduğu üçün asanlıqla o sözləri məxsusi malı kimi sərf edir. Necə ki, millətimiz diridir, bu sözlər istemaldan düşməyəcəkdir, yəni əcnəbi lisanlardan əxz olunmuş qəliz ibarələrin hücumu altında boğulub tərk olmayacaqdır" (I, 381).

Klassiklərin məziyyətini bir də onların dilə ehtiram və məhəbbətində, söz ustaları olmalarında görən alim göstərirdi ki, "böyük ədiblərin yazısı həmişə belə açıq və sadə olur. Mirzə Fətəli Axundzadənin, Qasım bəy Zakirin, Həsən bəy Məlikzadənin asari-qələmiyyələri bizim bu qövlümüzə şahiddir. Rus şüəra və ədiblərindən ən məşhurları – Puşkin, Nekrasov, Turgenev, Tolstoy və Çexov öz əsərlərini belə açıq, sadə və rəvan dildə yazıblar.

Qəliz, çətin və dolaşıq dildə yazan ədiblərin fikirləri də dolaşıq olur; onların əsərləri çətin və ağır oxunulur və insana fərəh əvəzinə qəm və kədər gətirir" (I, 304).

Beləliklə, görkəmli ədəbiyyatşünas alim, tənqidçi və maarif xadimi Firidun bəy Köçərlinin elmi fəaliyyəti Azərbaycan tarixinin qiymətli səhifələrindən, onun "Azərbaycan ədəbiyyatı" monoqrafiyası isə milli ədəbiyyatşünaslığın yeni istiqamətdə inkişafında böyük rol oynayan və özünün saysız-hesabsız müsbət, mütərəqqi cəhətləri ilə bu gün də əhəmiyyətini, təravətini itirməyən əsərlərdən biridir.

***Ruqiyyə Qənbərqızı***



# Azərbaycan ədəbiyyatı

# BİR NEÇƏ SÖZ

1903-cü ildə "Azərbaycan türklərinin ədəbiyyatı" ünvanında rus dilində bir kitabça tərtib edib çapa vermişdik[1]. Ərbabi-qələm bizim bu zəif əsərimizə lütf nəzəri ilə baxıb, onun intişarına himmət və riayət göstərməklə belə bizdən xahişmənd oldular ki, məzkur kitabçanın məalına bəst verib, öz ana dilimizdə milli ədəbiyyatımıza dair bir kitab tərtib qılaq. Tainki bizim Azərbaycan şüəra və üdəbamızın əş'arü asarı və özlərinin namü nişanları unudulub, əbnayi-vətənin xatirindən bilmərrə çıxmasın. Maarifpərvər ediblərimizin bu gözəl arzu və təmənnalarını sədədində olduğumuz fikir və marama müvafiq görüb, ol vaxtdan indiyədək məzkur əsəri əncama yetirmək üçün lazım olan mə'lumatı cəm etməyə məşğul olduq.

Əgərçi sə'y və miqdarınca əhvalat cəm edə bilmədik, çünki şüəra və üdəbamızın öz əsrlərində qədir və qiymətləri bilinmədiyindən əsərləri və xüsusən tərcümeyi-halları, yəni hansı zaman və məkanda nə növ yaşayıb zindəganlıq etməkləri itib batıbdır və bu halda bir kəsə mə'lum deyil, onlardan bə'zilərinin ancaq bir adı və şerlərindən bir neçə ədəbiyyat və qəzəliyyat qalıbdır, onlar ilə şairin rütbeyi-kəmalını və təb'i-şe'riyyəsini təhqiq və təmyiz etmək mümkün deyil, amma bununla belə bə'zi maarifpərvər şəxslərin himmət və müavinəti ilə xeyli mə'lumat yığıb və onları zübdələyib, aşağıda zikr olunan qayda üzrə tərtib qılıb möhtərəm oxuculara təqdim edirik və onlardan acizanə təvəqqə eləyirik ki, bizim bu əsərin mütaliəsinə şüru' etdikdə onun qüsurunu ki, onlardan xali deyil, əfv buyursunlar. Varın verən utanmaz. Əlimizdən gələn ancaq bu oldu. Əşxası ki, zəhmət çəkib mənə əhvalat cəm ediblər, boynuma böyük minnət qoyublar və milli şairlərimizin əhyası üçün himmət sərf ediblər.

Üdəba və şüəramızın tərcümeyi-hallarına və əsərlərinə şüru' etməkdən əqdəm ədəbiyyat barəsində filcümlə mə'lumat verməyi lazım gördük. Və bu kitabı yazmaqda mərhum Hacı Lütfəli bəy ibn Xaqan "Azəri" təxəllüsün "Atəşkədə"[2] nam kitabında tutduğu qayda və rəvişi intixab etdik, yə'ni Azərbaycanda olan hər bir bilad və diyarın şüəra və üdəbası haqqında ayrı-ayrı mə'lumat verməyi münasib bildik. Vəli mərhum Hacı Lütfəli bəyin kitabı ilə bizim məcmuənin arasında təfavüt çoxdur. Belə ki, mərhum Azəri "Atəşkədə"sində hər bir şairin tərcümeyi-halına dair

müxtəsər əhval yazıb, əsərlərindən azacıq və bir-birinə münasibəti olmayan nümunələr göstərir. Amma biz mümkün olduğu qədərdə məşhur şüəra və üdəbamızın həm tərcümeyi-hallarına və həm asari-qələmiyyələrinə dair ətraflı mə'lumat vermişik, məzkur əsərlərin haqqında öz rə'y və təsəvvüratımızı yazıb, tövsif və ya tənqidə layiq olan məqam və nüktələri şərh və bəyan etmişik.

Hər bir şairin məsləkini, üslubi-kəlamını və öz əsr və zəmanəsinin təqazasınca nə növ əsərlər vücuda gətirdiyini və onların camaatımıza hüsni-tə'sirini, xeyir və ya zərərini bəqədri-qüvvə açıb göstərmişik.

Vəli Azərbaycanın İran dövlətinə mütəəlliq hissəsində, ya keçmişdəki və ya hali-həyatda olan şüəra və ürəfası haqqında çəndan əhəmiyyətli və vüs'ətli mə'lumat verə bilmədik. Bu səbəbə ki, onların barəsində bizə əhvalat cəm edib göndərən adamlar tapılmadı. Belə ki, Mirzə Məhəmmədbağır Xalxali cənablarının barəsində nə qədər cüstücu etdiksə də, sərih və doğru əhval təhsil edə bilmədik. Habelə Dilsuz, Aciz[3], Divani[4], Raci, Dəxil[5] və qeyriləri xüsusunda qədri-kəfafınca mə'lumat kəsb etmək, məəttəəsüf, müyəssər olmadı.

Bu məcmuə on illik zəhmət və təlaşımızın səmərəsidir ki, neçə vaxtdan bəri toz basa-basa yatıb qalmışdı. Bunda milli və sevgili şairlərimizin, əziz və möhtərəm ədiblərimizin tərcümeyi-halları və bərgüzidə əsərləri zikr olunubdur.

Bu bizim üçün əziz və mübarək bir kitabdır. Ona binaən lazım idi ki, o, ləyaqətli tərzdə və gözəl surətdə təb' olunaydı. Vəli maddi cəhətincə bizdə o qədər bacarıq və tavana yox idi ki, bu işə iqdam edə biləydik, bir heyndə ki, məcmuə ziyadə böyük və zəxim halda başa gəlibdir.

* * *

Ərbabi-daniş və kamala mə'lumdur ki, hər bir millətin şə'n və əzəmətinə, tərəqqi və səadətinə bais olan səbəblərdən birisi də onun ədəbiyyatıdır. Ədəbiyyat millətin aineyi-həqiqətnüması̇dır ki, onun maddi və mə'nəvi tərəqqisini və istiqbalı üçün nicat və səadət yollarını eynilə göstərir. Ədibi-fazil və şairi-qabil millətin maarif xadimləridir. Milləti haqq və səvaba irşad edən, şöhrət və hörmətə yetirən onlardır. Öz asar və əş'arı ilə onlar millətin cisminə şəfa, ruhuna səfa, fikrinə cila, ağlına və tamami mə'nəvi və ruhani qüvvələrinə balü pər verib uca məqama qaldırırlar. Şeyx Sə'dinin[6] əsrində onun hikmətamiz əsərləri sayəsində Şiraz əhli fələyə naz edirdi. Necə ki, şair demişdir:

**Şeyx Sə'di ke ta dəm zəd ze Şiraz,**
**Resid şiraziyanra bir fələk naz[7].**



Hal-hazırda Avropa qit'əsində ən müqtədir və müəzzəm dövlət millətlərinin ədəbiyyat və mətbuatı artıq dərəcədə tərəqqi etmişdir. İngilis, Fransa, Alman və Rus dövlətlərinin ədəbiyyatı gündən-günə tərəqqi və şöhrət kəsb etməkdədir. Bu millətlərin içində vaxt-bəvaxt zühur edən və mədəniyyət aləminə hüsni-xidmətlər göstərən, ülumi-mütənəvvəəyə və fünuni-müxtəlifəyə vüs'ət və qüvvət verən üləma və hükəma, üdəba və şüəra məşhuri-cahandır.

Bunun əksi olaraq zə'f və əcz halında yaşayan, cəhalət içrə ömür keçirən miləl və əqvamın ədəbiyyatları dəxi öz hal və şə'nlərinə müvafiqdir. Nə qədər bir qövm və tayfa elmsiz və mə'rifətsiz olsa, bir o qədər onun ədəbiyyatı zəif və biməzmun olacaqdır. Hətta çox tayfalar vardır ki, vəhşiyana zindəganlıq edib, ədəbiyyat nə olduğunu bilməzlər. Bunların ülum və maarifdən bilmərrə xəbərləri olmaz. Bunlar dünya üzündə çox müddət yaşamayıb puç və zay olurlar və yainki özgə bir müqtədir və mə'dəni millətlərin təhti-təsərrüf və nüfuzuna düşüb, mürurі-əyyam ilə öz adat və ayinlərini itirib və ana dillərini unudub, onlar ilə qaynayıb qarışırlar və bilkülliyyə öz milliyyətlərini itirirlər. Bəs, tərəqqi və səadət fikrində olan və əbədi zindəganlıq arzusuna düşən qövm və millət gərəkdir ən əvvəl öz ana dilinin vüs'ət və qüvvət tapmağına sə'y və himmət göstərsin və ədəbiyyati-milliyyəsini asari-nəfisə və təsnifati-məmduhə ilə zənginləşdirsin.

Ədəbiyyat iki qisimdir: bir qismi ağızda söylənən nağıl, hekayətlərdən, cürbəcür milli nəğmələrdən, aşıq sözlərindən, məsəllərdən, tapmacalardan, yanıltmaclardan, ağıçı sözlərindən, bayatılardan ibarətdir. Bu qisim ədəbiyyata ədəbiyyati-lisani və ya əfvahi və yaxud el ədəbiyyatı deyilir. İkinci qisim ədəbiyyat üdəba və şüəranın, üləma və hükəmanın asari-qələmiyyələrindən vücuda gələn təhrirat və təsnifatdan ibarətdir ki, bunlar xah nəsr ilə yazılmış olsun, xah nəzm ilə, xah ülum və fünuna dair olsun və xah əxlaq və ətvardan, şe'r və qəzəliyyatdan bəhs eləsin. Hər iki qisim ədəbiyyatın bünövrəsi və təkyəgahı sözdür ki, qüdrəti-ilahi ilə insanın ağzında xəlq olunubdur və onun vasitəsi ilə insanın batini aləmi mə'lum və zahir olur, dəqayiqi-məani onunla bir-birindən təmyiz qılınır və bundan əlavə yer üzündə insanın sair məxluqat ilə mabeynində vüqua gələn müamilatı və rəftarı və mədarisi şərh və bəyan eləyən sözdür. Söz olmasaydı, əlbəttə, ədəbiyyat dəxi olmazdı. Bu surətdə insan ilə heyvanın arasında artıq bir fərq də qalmazdı və hal-hazırda müşahidə olunan tərəqqi və təməddündən dəxi bir əsər görünməzdi.

Ustadi-şüəra Molla Məhəmməd Bağdadi Füzuli[8] sözün şə'nində yazdığı qəzəli burada münasibi-məqal görüb, eynilə gətiririk:

Xəlqə ağzın sirrini hər dəm qılır izhar söz,
Bu nə sirdir kim, olur hər ləhzə yoxdan var söz.

Artıran söz qədrini sidq ilə qədrin artırar –
Kim, nə miqdar olsa, əhlin eylər ol miqdar söz.

Ver sözə əhya ki, tutduqca səni xabi-əcəl,
Edə hər saət səni ol uyğudan bidar söz.

Xazini-gəncineyi-əsrardır, hər dəm çəkər
Rişteyi-izharə min-min gövhəri əsrari-söz.

Bir nigari-ənbərinxətdir, könüllər almağa
Göstərir hər dəm niqabi-qeybdən rüxsar söz.

Olmayan qəvvasi-bəhri-mə'rifət arif deyil –
Kim, sə'dəf tərkibi-təndir lö'löyi-şəhvar söz.

Gər çox istərsən, Füzuli, izzətin, az et sözü –
Kim, çox olmaqdan qılıbdır çox əzizi xar söz[9].

Farsın ən məşhur və müqtədir şairi Əbülqasım Firdovsi Tusi sözün mədhində buyurubdur:

Ze niku soxən beh çe əndər cəhan,
Bəru afərin əz kəhano məhan.
Əgər beh nəbudi soxən əz xoday,
Nəbi key bodi nəzde-ma rəhnomay[10].

Və əyzən sözün fəzilətində Əbuməhəmməd ibn Yusif Şeyx Nizami[11] deyibdir:

Ançe u həm novəst, həm kohənəst,
Soxənəsto dər in soxən soxənəst.
Ze afərineş nəzde-madəre-kon,
Hiç fərzənd xubtər ze soxən.
Soxəni kançe ruyi-bieybəst,
Xazene-gənce-xaneye-ğeybəst.
Qesseye-naşenide u danəd,
Nameye-naneveşte u xanəd.
Bengər əz hər çe afərid xoday,
Ta əz u coz soxən nəmand becay.
Yadeqari kəz adəmizadəst,
Soxənəst an degər həme badəst[12].



Və yenə Şeyx Nizami özgə bir məqamda sözü tə'rif qılıb, axəri-kəlamda belə buyurubdur:

Sədrneşintər ze soxən nist kəs,
Douləte-in molk soxənrast bəs[13].

Hacı Seyid Əzim Şirvani[14] sözün barəsində deyibdir:

Gövhəri-paki-pürbəhadır söz,
Töhfeyi-dərgəhi-xudadır söz.
Zinəti-bəzmi-Mustafadır[15] söz,
Madehi-şahi-"həl'əta"dır[16] söz.

Mərhum Sabir[17] sözün mədhində demişdir:

Ey söz, nola dersəm sənə xurşidi-səmavat,
Səndən alıyor nurü ziyanı həmə zərrat.

Bir nuri-həqiqətsən, edib həq səni nazil –
Kim, bəxş edəsən gülşəni-nasutə füyuzat.

Gəh lövhdə məstur, qələmdən gəhi cari,
Gəh ərşdə misbah, gəhi fərşdə mişkat.

Sübhi-əzəlidən üzün etdikdə təcəlla
Məhv oldu cahanı bürüyən pərdeyi-zülmat.

Olmuş bütün ərbabi-nəzər aşiqi-hüsnün,
Tənviri-üyun eyləyir ərbabi-kəmalat.

Bir mohibeyi-lütfi-xudasan ki, həqiqət,
İnsanlar edir zatın ilə fəxrü mübahat.

Vicdanü dili-Sabirə nəşr eylə füyuzun,
Ta kim, bitə könlündə rəyahini-kəmalat.

Amma bilmək gərəkdir ki, hər bir millət öz lisanında iste'mal etdiyi sözlərin icad və ixtirası üçün uzun ömürlər sərf edibdir. Sözlərin tərkib və təsrifi, haldan-hala dəyişirilməsi və bir-birilə covlaşıb bir mətləb bəyan etməsi ancaq müddəti-mütəmadiyyədən sonra hüsula gəlibdir. Belə ki, hər iki qisim ədəbiyyatın bina tutub nəşvü nüma tapmağı tək-tək kəlmələrin və qisim-qisim sözlərin tərkib və icadına nisbətən xeyli asan vəch ilə bəhmə gəlibdir.

Neçə min illər gəlib keçibdir ol əsrdən ki, bizim ulu babalarımız vəhşiyanə qayalar arasında və mağaralar güncündə sükunət edib, daş əsbab və alat vasitəsilə özləri üçün azuqə və ət'imə kəsb edirdilər və məzkur alat ilə özlərini xəta və bəladan və şərri-ə'dadan mühafizət qılardılar. O əsrlərdə ki, ona daş əsri deyilir, bizim babaların dillərində iste'mal olunan sözlərin ədədi çox az olub, hər bir şeyi və məxluqu ibtidada öz sövtü ilə adlandırardılar və öz barmaqlarından artıq say və hesab bilməzdilər. Amma müruri-əyyam ilə miləl və əqvamın məişətləri vüs'ət və rifahət tapdıqca, mədəniyyət və məmuriyyət artdıqca, onların dilləri dəxi tərəqqi etməkdə olubdur və bu halda mə'dəni millətlərin dillərində neçə yüz min sözlər tələffüz və iste'mal olunmaqdadır. Məsələn, ingilis millətinin dilində bir milyona kimi müxtəlif sözlər işlənir. Vəli bununla belə bizim bu tərəqqi əsrimizdə kürreyi-ərzin bə'zi yerlərində vəhşi halında dolanan bir para qövm və tayfalar dəxi vardır ki, dilləri çox fəqir, rəkik və naqisdir. Bu hal ona dəlalət edir ki, məzkur qövm və tayfalar əvvəl binadan cövhərsiz və maddəsiz xəlq olunubdur. Xilqətdən onların xəmirlərində iste'dad və qabiliyyət mayası qoyulmayıbdır. Bu qisim qəbilə və tayfalar min illərcə bir halət üzrə yaşayırlar və bunların dillərində əsla bir tərəqqi əsəri müşahidə olunmur. Bunların həyatı ilə məmatı arasında bir fərq yoxdur. Hər iki halətlərində bəni-növ'i-bəşərə bunlardan bir xeyir və səlah yetişməz.

Bəs, hər bir millətin danışdığı dil onun hal və şə'nini, ümuri-məaşda dərəceyi-miknət və qüvvətini şərh və bəyan eləyir. Millətin dolanacağı genişləndikcə, zəruri ehtiyacları təhsil olunduqca, sərvət və dövləti, şan və şövkəti artdıqca, onun dili dəxi haman qərar üzrə tərəqqi və vüs'ət tapır və bir məqama çatır ki, millət hər növ fikir və xəyalatını, hər qisim hissiyyat və təsəvvüratını, ətrafında görüb eşitdiyini, müşahidə qıldığı əlamət və əhvalatı və əxlaq və ətvara dair çox nazik mə'naları şərh və bəyan etməyə qadir olur. Bu halda millət başlayır qisim-qisim nağıl və hekayələr düzməyə və sinədən sözlər və mahnılar (nəğmələr) toxumağa. Nağıllarda həqiqəti-hal ilə xəyalat aləmi, doğru ilə yalan, mümkün ilə qeyrimümkün elə bir məharət ilə bir-birinə covlaşır ki, əqli-insan heyrətdə qalır. Sinədən toxunan nəğmələrdə millət özünə ariz olan qəm və qüssəni və yainki şadlıq və fərəhi və filcümlə onun qəlbini ləbaləb edən növbənöv hissləri uca avaz ilə oxuyub, öz dəruni halətini və batini aləmini cümləyə izhar edir və bu minval sinəsini ənduh və məlaldan xilas edib, qəm ilə şadlığına qeyriləri də şərik eləyir.

Bunlardan maəda millət həddən ziyadə məsəllər, hikmətamiz sözlər, tapmacalar icad edibdir ki, bunların vasitəsilə öz biliyini, təcrübəsini, hikmətini izhar edir və hər bir ittifaqda münasibi-hal söyləməyini, dünyada dolanmasını, insanlar ilə rəftarını və sair məxluqat ilə əlaqəsini az sözlü, amma dərin mə'nalı – müfid-müxtəsər kəlam ilə bəyan qılır. Məsələn, atalar təcrübə ilə yəqin ediblər ki, kişi hər nə iş tutsa, yaxşı ya yaman, axırda onun nəticəsini görəcəkdir. Ona görə deyiblər: "Hər nə doğrarsan aşına, o çıxar qaşığına" və yainki "hər nə əkərsən, onu biçərsən". Hər bir işdə səbr lazım olmağını təcrübə edib deyibdir:

Səbr ilə halva bişər, ey qora, səndən,
Bəsləsən, atlas olar tut yarpağından.

İkisözlü adamın haqqında deyilibdir:

Tazıya tut, – deyir, dovşana qaç.

Əxlaq və ətvar cəhətincə övladın ata və anasına və xüsusən, qız uşağının anasına oxşamağını təcrübə edib deyibdir:

Qırağına bax, bezini al,
Anasına bax, qızını al!

Həmçinin atalar dəfəat ilə imtahan ediblər ki, avam və nainsaf xalq ilə rəftar etməkdə yalqız mülayimət kifayət etməz və bir az zor da gərək işləsin. Ona binaən deyilibdir: "Kiş-kiş ilə donuz darıdan çıxmaz" və habelə. Türk dilində neçə min hikmətamiz məsələlər var ki, təmamisi təcrübə üzü ilə deyilibdir və onları burada yazmaq ilə qurtarmaz. Nağıllarımızda şahzadə Məlik Məmməd və ya Məlik Əhməd haqq və doğru yolunda çalışıb, candan və başdan keçir. İntihasız bir bəyanatdan, otsuz-ələfsiz səhralardan qət'i-mə'nazil edib, dərin dərələrdən adlayıb, uca dağlardan və sərt qayalardan aşıb, qalın və qaranlıq meşələrdən keçib, qisim-qisim bəla və müsibətlərə düçar olur. Gah ağ div ilə və gah əjdəhalar ilə cəngü cidal edib, axırda onları tələf edir. Belə ki, haqq batilə, doğru yalana qalib gəlir və nağılların çoxu şadlıq ilə qurtarır. Yar eşqində böyük zəhmət və məşəqqətlər çəkən şahzadəyə qırx gün, qırx gecə toy olunur və nağıl söyləyən nağılını gülüş üzü ilə qurtarıb deyir: "O yedi, yerə keçdi, siz də yeyin, dövrə keçin!"

Heyvanat qisminə gəldikdə, onlardan hər birisi bizim nağıllarda insana mənsub olan bir xasiyyəti göstərir. Məsələn: çöl heyvanlarından aslan – rəşadət və mərdanəliyi, ayı – qanmazlığı, qurd – axmaqlığı, tülkü – hiyləgərliyi, dovşan – qorxaqlığı, maral – gözəlliyi və habelə. Ev heyvanlarına gəldikdə, bunların da hər birisinə məxsus öz sifətləri vardır: at – e'tibarı, it – vəfanı, eşşək – həmaqəti, dəvə – səfahəti, öküz – inadlığı, inək – ina-

yəti, qoç – igidliyi, keçi – hiyləbazlığı, qoyun – bərəkəti, quzu – yazıqlığı, pişik – e'tibarsızlığı göstərir. Məşhur sayaçı sözlərində ev heyvanları çox gözəl tərzdə vəsf olunubdur. Bu sözlərdə hamıdan artıq vəsf olunan qoyundur. Ona "nənəm" deyib xitab olunur. Mə'lum olunur ki, keçmişdə bizim babalarımız qoyun saxlarmış və məaşları onun südü, əti və yunu ilə keçərmiş.

Sayaçı sözlərindən nümunə üçün bir neçəsini burada zikr etməyi münasib gördük*.

Nənəm, o narış qoyun,
Yunu bir qarış qoyun,
Çoban səndən küsübdür,
Südü ver, barış, qoyun.
Nənəm, a şişək qoyun,
Yunu bir döşək qoyun,
Bulamanı bol eylə,
Bulamanı tez yetir,
Qırıldı uşaq, qoyun.

Keçinin vəsfində deyilibdir:

Nənəm, o xallı keçi,
Məməsi ballı keçi,
Ayağı nallı keçi,
Uca qaya başında
Tutubdu yallı keçi.

Sayaçı sözlərində çoban da unudulmayıbdır. Onun haqqında deyilibdir:

Göydə gəzən buludlar
Yorğanıdır çobanın.
Yastı-yastı təpələr
Yastığıdır çobanın.
Yumru-yumru qayalar
Yumruğudur çobanın.
Əlindəki dəyənək
Qalxanıdır çobanın.
Yanındakı boz köpək
Yoldaşıdır çobanın.
Ağzı qara canavar
Düşmənidir çobanın.

---

* Sayaçı sözlərini və el ədəbiyyatına dair bir çox mə'lumatı əhli-qələmlərimizdən möhtərəm Eynəli bəy Sultanov[18] cəm edib, lütf üzü ilə bizə bəxş etmişdir.



Burada əfvahi ədəbiyyat barəsində mətləbə tul və təfsil verməyi lazım görmədik. "Balalara hədiyyə"[19] nam məcmuəyə rücu etməli! Bu qisim ağızdan-ağıza söylənən əfvahi ədəbiyyat hər bir millətin hal və şə'ninə və övza'i-məişətinə müxtəss olub, onun dünya üzrə nə növ yaşamasına şəhadət verir. Bə'zi qövm və tayfalar əfvahi ədəbiyyatdan səva özgə bir asar-əlamət zahir etməyib, öz nağıl və hekayələri və milli nəğmələri və məsəlləri ilə bir müddət dünyada ömür edib, sonradan binişan, puç və zay olub gedibdir. Amma o qövm və millətlər ki, xilqət və təbiətlərində qabiliyyət toxumu və hünər mayası vardır, ümuri-məişətdə qeyrilərə sibqət ediblər, onlar bir əfvahi ədəbiyyatlarına və ağızlarda söylənən nağıl və hekayələrinə iktifa etməyib, qələmi ədəbiyyata, yə'ni fikir və hisslərini qələm ilə yazmağa məşğul olublar. Əfvahi ədəbiyyatda nağıl və hekayələri tərtib edən və nəğmələri düzən müəyyən bir şəxs olmayıb. Bunları yaradan və yoxdan var edən millət özü olur. Bunlar ağızlarda söyləmək ilə ümumxalq arasında yayılıb intişar tapır və nəslən bə'di nəsl atadan oğula və oğuldan nəvəyə keçməkdə olur.

Qələmi ədəbiyyat isə başqa tərz ilə hüsula gəlir. Bunda hər bir nağıl və hekayənin məxsusi katibi və münşisi və hər bir təsnifin öz müsənnifi və hər bir şe'r və qəzəlin müəyyən şairi vardır. Əlbəttə, bu qisim əsərlərdə milliyyət nişanəsi və milliyyət rayihəsi çəndan müşahidə olunmaz. Vəli bir müsənnif və şair nə qədər öz millətinə yavuq olsa, onun adat və xasiyyətləri üzrə nəşvü nüma tapsa, milliyyət qanı onun damarlarında nə qədər artıq cərəyan etsə, bir o qədər onun əsərlərində dəxi milliyyət qoxusu və milliyyət nişanəsi artıq görünəcəkdir.

Şairi-kamil və ədibi-fazil həqiqətdə ol ədib və şairdir ki, öz millətinin dili ilə danışa, ürəyi ilə, hissi və ağılı ilə fikir edə.

Azərbaycan türklərinin dəxi özlərinə məxsus ədəbiyyatı vardır. Bu türklər Zaqafqaziyanın şərq və cənubunda sükna edən Şəki, Şirvan, Səlyan, Bakı, Gəncə, Qazax, Qarabağ, İrəvan və Naxçıvan əhalisindən və İran dövlətinin şimali-şərqisində güzəran edən əqvam və təvayifdən ibarətdir. Azərbaycan türklərinin danışdığı dilin şivəsi çox isə də, binası və kökü birdir. Belə ki, hər mahalın xalqı başqa bir şivədə və qeyri bir ləhcədə danışıb qonuşur. Hər məhəl və məskənin özünə məxsus istilahları və sözləri vardır. Qarabağ və Qazax əhalisi bir cürə, Şəki xalqı özgə bir cürə, Şirvan, Səlyan, Bakı və Quba adamları başqa bir sayaqda, İrəvan, Naxçıvan, Təbriz, Xoy, Maku vilayətlərinin əhalisi qeyri bir şivə üzrə danışırlar. Amma bununla belə, bunların cümləsi söylədiyi dil bir dildir və bir mahalın əhalisi özgə bir Azərbaycan mahalının əhalisi söylədiyi dili açıq anlayıb, onunla hər bir qisim mətalib və məsail barəsində mükalimə edə bilir. Neçə sənə bundan

müqəddəm "İrşad"[20], ya "Tərəqqi"[21] ruznaməsində Azərbaycanın hər bir mərkəzindən göndərilən mə'lumati-mütənəvvеə və əxbari-siyasiyyə dərc və nəşr olunurdu. Məzkur mə'lumatı "Təzə həyat"[22] ruznaməsinin müştəriləri oxuyub başa düşürlərdi və hər qisim mətalibdən ittilaat kəsb edirlərdi. "Təzə həyat"da yazılan mə'lumatdan dəxi "Tərəqqi"nin müştəriləri istifadə edirlərdi. Hal-hazırda "Molla Nəsrəddin"in[23] və "İqbal"ın[24], "Sədayi-həqq"in[25] və "İqdam"ın[26] müştəriləri hər yerdən yazılan mə'lumat və xəbərləri oxuyub başa düşürlər.

Yüz sənə insan üçün bir əsr və lisan üçün bir dövrdür. Əsr və zamanlar mürur etdikcə hey'əti-ictimaiyyeyi-insan və onunla müttəfiq ləhcə və şiveyi-lisan dəxi neçə-neçə təbdilat və təğyirata düçar olur. Ədibi-fazil Əhməd Cövdət əfəndinin[27] buyurduğuna görə, "əbkari-əfkar sanki hər mövsümdə bir gunə qəbayi-lətafətnümayə bürünüyor və hər cəmiyyətdə miləl nükət ilə və mə'zaya ilə görünüyor. Binaünileyh hər lisanın üsuli-tə'limi-ədəbiyyatı mə'zaci-dövrə tövfiq olunmaq lazım gəlür". Buna görə, Azərbaycan türklərinin dili dəxi müruri-əyyam ilə dəyişirilib, özgə bir tərkib və qaydaya düşüb də. Belə ki, indi iste'mal olunan türki-cədid əzəlki türki-qədimə oxşamaz. Hal-hazırda danışılan dilin başqa üslubu olduğundan əlavə türki-qədimə nisbət bu dil həm dövlətli də, şirin ləhcəli və gözəl şivəli bir dil hesab olunur. Dini-mübini-islamın türklərə yetirdiyi şərafəti-e'tiqadiyyəsindən əlavə böyük bir xeyri də bu olubdur ki, onun feyz və bərəkətindən türklər ərəb və fars lisanından tədriclə çox sözlər, gözəl ibarələr alıb, öz dillərini dövlətləndiriblər və müruri-əyyam ilə əxz və iqtibas olunan kəlmələr və istilahlar o qədər işlənib təhrif və təsrif olunubdur ki, türk dili ilə onlar qaynayıb qarışıbdır və onlarsız türk dili bir mə'nanı ifadə etməkdə acizdir. Ərəb və fars dillərindən götürülmüş sözlər və ibarələr bir dərəcədə türkləşibdir ki, savadı az olan adamlar onları məhz türk sözləri hesab edib, əsla güman etməzlər ki, "söhbət" və "zəhmət" sözləri ərəbdən, "rəncbər", "kəfgir", "xakəndaz" sözləri farsdan alınıbdır. Və bə'zi yerlərdə kəsrəti-iste'maldan "rəncbər"ə "rəşbər", "kəfkir"ə "kəvgir" və "xakəndaz"a "xəkəndaz" deyilir və bu qəbil ərəb və fars dillərindən götürülmüş sözlərin çoxu türkləşib, əvvəlki halından özgə bir tərkibə düşübdür. Bu nəhv ilə Azərbaycan türklərinin dili ərəb və fars sözləri ilə məxlut və məmzuc olmaqla belə, bir lisani-lətafətrəsan olubdur ki, onunla ülum və fünuna dair hər qisim mətalibi-əfkari-aliyyə və hekəmiyyəni və məsaili-siyasiyyə və ədliyyəni şərh və bəyan etmək mümkündür. Bu yolda osmanlılar bizim Azərbaycan türklərinə sibqət ediblər və daha da ziyadə öz dillərini ərəb və fars lüğat və əlfazı ilə dövlətli qılıblar. Necə ki, osmanlı lisanının barəsində yenə ədibi-kamil Əhməd Cövdət əfəndi buyurubdur: "Guya dərzxaneyi-məanidə tərzi-ərəb üzrə biçilmiş və üsuli-farsi üzrə tikilmiş olan dibayi-zibayi-türkiyyəyə bürünmüş bir şahidi-şirinədayi-bədiül-bəyandır. Zatən siyəğ təsərrüficə ən mükəmməl bir lisan olduğu halda əlsineyi-sairədən əxz və iqtibas eylədiyi əlfaz ilə xeylidən xeyli zəngindir. Ərəbi və farsinin neçə xəvas və mə'zayasını möhtəvi olmaq həsbilə ədəbiyyatca dəxi qayət nazik və rəngindir".

Və lakin ərəb və fars kəlmə və ibarələrinin şövq və həvəsində olub, ehtiyac olmadığı halda onları ana dilinə qatıb-qarışdırmaq, bizim əqidəmizcə, böyük səhvdir. Vəqta ki, ana dilində şeyin özünün məxsusi adı var və yainki ana dili ilə bir mə'nanı bəyan etmək və bir əhvalatı necə ki, lazımdır söyləmək mümkün olur, insaf deyil ki, elm göstərmək və mollalıq izhar etmək iddiasına düşüb, kəlamı qəliz ibarələr ilə və çətin anlaşılan ərəbi və farsi sözlər ilə doldurub, əsl mə'nanı dəxi də dərinə salmaq və onun üzünə ərəb və fars dillərindən bəhmə gəlmiş qəliz, müğləq ibarələr ilə toxunmuş pərdə çəkmək. Ol cəhətdəndir ki, bizim vaizlərin əksəri məscidlərdə və'z və nəsihət etdiyi əsnada ibarətpərdazlıq edib, öz və'z və nəsayihlərini o qədər qəliz və çətin ibarələr ilə söyləyirlər ki, onlara qulaq asanın çoxu bir şey anlamayıb, əsl mətləb nədən ibarət olduğunu başa düşmürlər və heyrətdə qalırlar. Hasili-kəlam bu olur ki, nə və'z edən və nə moizəyə qulaq asan – nə öyrədən və nə öyrənən əsl məqsədə yetişməyib, gözəl vaxtlarını bihudə sərf edirlər. Habelə, qəzetlərimizdə dərc olunan qəliz ibarələr ilə yazılmış bə'zi siyasi, ədəbi və fənni məqalələri oxuyanlar anlamayıb mə'yus olurlar və qəzet oxumaqdan ikrah edirlər. Bu açıq həqiqəti nədənsə qəzet və jurnal verənlər başa düşmürlər və osmanlı qəzetçilərinə müqəllidlikdən əl çəkmirlər. Cəridələri bir il, para il ömür sürüb, müştərisizlikdən qapanır, zəhmətləri puça çıxır, külli xərc və məsarifləri hədər gedir.

Dil nə qədər açıq, sadə və güşadə olsa, bir o qədər gözəl, göyçək və məqbul olar. Əlbəttə, dilimizə qarışıb türkləşmiş "fayda", "zərər", "xeyir", "şər'", "dost", "düşmən" və bunlar misilli həddən ziyadə iste'mal olunan ərəbi və farsi sözlərinin barəsində bizim bir iradımız yoxdur. Necə ki, bu barədə öz fikrimizi yuxarıda bəyan etdik və həmçinin ülum və fünun sayəsində təzə kəşf və ixtira olunan alat və əşyaya və fikrimizdə doğan təzə mə'nalara öz ana dilimizdə münasib və müvafiq adlar tapa bilməsək, lazım gəlir ki, ərəb və fars dillərinə rücu edib, onların köməyi ilə təzə ixtira olunan şeylərə və yeni doğan mə'nalara ad qoyaq və bu vəch ilə dilimizdə olan nöqsanı və rəkakəti götürüb, onu təshih və təkmil edək. Bu mətləbi başlıca anlamaq istəyənlərə məsləhət görürük ki, "Həyat"[28] ruznaməsinin 1905-ci sənədə 7-ci nömrəsində ədibi-kamil Əli

bəy Hüseynzadənin[29] "Qəzetimizin dili haqqında bir neçə söz" sərlövhəsində yazdığı məqaləni mütaliə etsinlər[30]. Bundan maəda "Türk yurdu"nun[31] əvvəlinci ilinin 12-ci sayında "Türk dili, ədəbiyyatı haqqında mütaliələr" sərlövhəsində yazılmış məqaləyə müraciət etməlidir. Bu məqalədə ədib Əhməd Hikmət bəy əfəndi[32] 16-cı Müstəşriqlər Konqresində türk dilinin haqqında fransızca ətraflı danışdığını mə'lumat verir. Məqaləni məcmuə müdiri türkə tərcümə edibdir. Əhməd Hikmət bəyin verdiyi mə'lumata görə, türk dili özlüyündə xeyli mətin, rəvan və dövlətli bir dildir. Vəli qədrini bilənlər olmayıb da bə'zi səbəblərdən dolayı unudulurdu və onun yerini fars və ərəb kəlmələrinin bir xəlitəsi tuturdu. Bir dərəcədə ki, əsl türk dili ancaq kəndlərdə və ümmi arvadlar arasında mühafizə edilə bildi.

Dövri-intibahdan sonra türklərdə də, başqa millətlərdə olduğu kimi, bir hissi-milli, bir vicdani-milli doğub böyüməkdədir. Türklər də damarlarında əsl bir qanın axdığını duydular və öz xalis dillərinə rövnəq vermək fikrinə düşdülər və onu əcnəbi kəlmələrdən, əcnəbi tərkiblərdən, türk ruhu ilə əsla saziş etməyən dəbdəbəli, gurultulu və biməzmun ibarələrdən qurtarıban, ona öz rəngini, sifətini və sadəliyini qaytarmaq qəsdinə düşdülər. Milli dilin tərəfdarları gündən-günə artıb çoxalmaqdadırlar və onların himməti ilə İstanbulda "Türk dərnəyi"[33], "Türk yurdu" və "Xalqa doğru"[34] və Osmanlının bə'zi yerlərində milli ceridələr təb' və nəşr olunmaqdadır.

Azərbaycan türklərinin ədəbiyyatı az zamandan bəri başlayıbdır ki, kök və rişə salıb bina tutmağa. Keçmişdə şövkət və qüvvət sahibi olan İran dövləti müddəti-mütəmadiyyə ilə təmami Azərbaycan vilayətinə sahiblik və hökmranlıq edibdir. Azərbaycan türkləri bu dövləti-əzimənin təhti-hökumətində xeyli zaman zindəganlıq edibdir. Bu cəhətə İranın nüfuz və tə'siri Azərbaycan türklərinə həddən ziyadə olubdur. Bu tə'sirat zahiri, yə'ni hey'ət və qiyafətdə, tərzi-libas və xörəkdə və sair övza'i və əhvalda və əmri-məaşda görsəndiyi kimi, batini və mə'nəvi surətdə dəxi olubdur ki, onlar əxlaq və ətvarda, ayin və adabda, lisan və ədəbiyyatda müşahidə olunan əsərlərdir. Mə'lum ola ki, Azərbaycan türkləri hər dildən ziyadə xoşladığı, meyl və rəğbət göstərdiyi fars dili olubdur. "Ləfz – ləfzi-ərəbəst, farsi – şəkərəst, türki – hünərəst"[35] – dedikdə bizim türklər ərəb lisanını tə'rif edib və türk dilində söyləməyi hünər bilib, hər iki dildən ziyadə meyl və həvəs göstərdikləri "şəkər" olubdur ki, fars dilindən ibarətdir. Bu dilin ziyadə şirin və xoş şivəli olmağına bir kəsin şübhəsi yoxdur. Ona binaən bizim məktəblərdə bu axır vaxtlara kimi tə'lim



və tədris fars dilində olub, uşaqlarımızın oxuduğu fars kitabları olubdur. Nəviştəcat və mərsulatımız dəxi bu dildə cari olub, türk dilinə artıq meyl və rəğbət görsənilməyibdir. Azərbaycanın İrana mütəəlliq hissələrində indi dəxi tə'lim və tədris və kitabət fars dilində işlənir. Zaqafqaziyada ana dili ancaq az vaxtdan bəridir ki, Azərbaycan türklərinin diqqətini cəlb edib, özü üçün bir növ hörmət və əhəmiyyət kəsb etməyə başlayıbdır.

İş bu hal üzrə olduğu üçün sabiqdə hər əhli-savadımız bilümum, üləma və hükəmamız, şüəra və üdəbamız bilxüsus öz tə'lifat və təsnifatını həmin fars dilində inşa edib, türk dilinə artıq e'tinaları olmayıbdır. Bir halda ki, fars dili türk dilinə nisbətən həm vüs'ətli və həm xoş qaydalı bir lisandır. Belə ki, bizim ədiblərimizin asari-qələmiyyələri ancaq fars ədəbiyyatını dövlətləndirib, öz milli ədəbiyyatımıza onların çəndən dəxl və təsərrüfləri olmayıbdır. Türk lisanında qələm işlədən üdəba və şüəramıza gəldikdə, onlar da fars üdəba və şüərası tutduğu təriq ilə gedib, fars dilinin şivə və üslubunda yazmağa sə'y ediblər. Bunlar yazdıqları əş'ar və asarın məzmun və məalı dəxi əksəriyyət farsın məşhur şüəra və hükəması əsərlərindən əxz olunmuş mə'nalar olub. Kimisi Şeyx Müslihəddin Sə'dinin hikmətamiz nəsihətlərinə, kimisi Şəmsəddin Məhəmməd Xacə Hafizin[36] qəzəliyyatına, kimisi Firdovsinin "Şahnamə"sinə, bə'zisi Cəlaləddin Ruminin[37] "Məsnəvi"sinə, Şeyx Əttarın[38] "Nan və halva"sına, Ömər Xəyyamın[39] "Rübaiyyat"ına, Nizaminin "Xosrov və Şirin"inə və bunlar kimi sahibi-xirəd və təb'i-səlim vücudların kəlami-mö'cüznümalarına nəzirə yazıb, ustadlarına peyrəvilik və müqəllidlik ediblər və bu peyrəvilikdə üdəbayi-türkdən bə'ziləri böyük hünər və məharət göstəriblər. Necə ki, Şamaxıda Ağaməsih Şirvani[40], Mirzə Nəsrullah Bahar[41], Hacı Seyid Əzim Şirvani, Qubada Abbasqulu ağa Qüdsi[42] və Xürrəmi[43], Qarabağda Qasım bəy Zakir[44], Abdulla bəy Asi[45], Knyaz Mehdiqulu xan Vəfa[46], Mirzə Rəhim Fəna[47], Gəncədə Mirzə Mehdi Naci[48], Nuxada İsmayıl bəy Nakam, İrəvanda İsmayıl Bəzmi, Üştibində Seyid Əbülqasım Nəbati, Qazaxda Mustafa ağa Nasir[49] və qeyriləri.

Belə ki, bizim Azərbaycan şüərasının əsərlərində görünən ali fikirlər, gözəl hisslər, uca mə'nalar, nazik və lətif mətləblər, hikmətamiz nəsihətlər və həmçinin dostluqda sədaqət və dəyanət, hər bir işdə mürüvvət, ədalət və insanı zinətləndirən sair övsafi-həmidələr, demək olur ki, tamamən fars ədəbiyyatının bərəkətindəndir. Bununla belə eşqbazlıq, mədhi-dilbər və tə'rifi-gözəl, zəmanədən şikayət, rəqibdən nifrət, hicr və fəraqdan nalə və fəryad və bir para ləğviyyat, məzhəkat və həcviyyat və habelə saxta və yalan hissiyyat yenə farsların son ədəbiyyatının bərə-

kətindəndir. Heyfa ki, ədəbiyyatın bu axırkı növləri bizim şüəraya ən xoş gələn üslub olub ki, bu yolda həddən ziyadə nəzirələr yazılıbdır. Və hətta bir növ türk şairləri farslara sibqət ediblər, çünki türk dilində yazılan həcviyyatın misli və bərabəri nəinki fars lisanında, bəlkə heç bir lisanda tapılmaz...

Gözəl mədhində dəxi yəqinən demək olur ki, heç bir fars şairi Molla Pənah Vaqif[50] və Qasım bəy Zakir kimi duzlu sözlər deməyibdir. Bu xüsusda, filhəqiqə, bunlar məliki-şüəradırlar. Türk şairlərinə gəldikdə, bunlardan Molla Məhəmməd Bağdadi Füzulinin Azərbaycan şüərasına hamıdan artıq tə'siri olubdur. Və bir türk şairi olmayıbdır ki, Füzulinin kəlamına nəzirə yazmamış olsun. Füzulidən sonra Azərbaycan şüərasına az-çox nüfuzu olan Yusif Nabi Çələbi[51] və Əlişir Nəvai[52] olubdur ki, onlardan hər birinin barəsində bir para mə'lumat verməyi lazım bildik, bir halda ki, hər üçü Azərbaycan şüərasının ustadları məqamında olublar.



## MOLLA MƏHƏMMƏD BAĞDADİ "FÜZULİ" TƏXƏLLÜS

Molla Məhəmməd Bağdadi türk şairlərinin babası hesab olunur. Ona binaən, Azərbaycan şüəra və üdəbasından bəhs edib də, onların sərvəri və pişrəvi məqamında olan Füzulinin ismi-şəriflərini zikr etməmək bir növ haqqı və əməyi itirmək kimidir. Bir halda ki, ol fəsahət və bəlağət kanının tə'siri bu əsrdəki şüəramızın əsar və əş'arında dəxi müşahidə olunmaqdadır.

Məşhur qövlə görə, Molla Məhəmməd ibn Süleyman Kərbəlada və Bağdadın həvalisində Hillə adlı balaca bir qəsəbədə, Sultan Süleymanın[53] əsrində – hicrətin 900-cü[54] tarixində təvəllüd etmişdir[55]. Bə'zi rəvayətə görə, yetmiş sənəyə qədər ömür edibdir. Tarixi-vəfatı dürüst mə'lum deyil isə də, ömrünün müsinn çağında dari-bəqaya rehlət eləməyi öz kəlamından dəxi anlaşılır[56]. Necə ki, deyibdir:

Ey Füzuli, qədimiz qıldı fələk xəm, yə'ni
Vəqtdir çıxmağa dünya qapısından, əyilin[57].

Füzuli kimi məşhur və mö'təbər şairin tərcümeyi-halına dair mə'lumat, heyfa ki, çox azdır. Bu barədə özgə bir mə'xəz və mənbədən əhvalat götürməkdə aciz qalıb, ol dürri-yeganənin öz əsərlərinə rücu etməkdən başqa bir çarə bulmadıq. Divani-bəlağətünvanının dibaçəsində ol fəsahət bustanının əndəlibindən və ibarət çəməninin bülbülündən, yə'ni Füzulinin öz lisani-bəlağətsəncindən halına dair bir para mə'lumat verilir, xüsusən, onun türk lisanında yazmağına səbəb nə olduğu filcümlə bəyan edilir.

Məzkur müqəddimədən mə'lum olur ki, Füzuli uşaqlıqdan şe'r və qəzəl deməyə ziyadə həvəsnak imiş və ol dürri-yeganənin hənuz səbi ikən üfüqi-tə'binə hilali-mövzuniyyət tülu' etmişdir və xurşidvəşlərdən iqtibasi-nuri-şövq qılmışdır və onun əş'arının şöhrəti çox yerlərə dağılmışdır. Necə ki, özü deyir:

Seyti-fəsahət ilə sözüm tutdu aləmi,
Mən məhdi-e'tibardə tifli-zəbun hənuz.

Buyi-xoşumla oldu müəttər dimağlər,
Mən nafeyi-vücuddə bir qətrə xun hənuz[58].

Və lakin şair öz əsərlərinə diqqət yetirib, onları hülyeyi-elmdən müərra görüb, bir müddət nəqdi-həyatın ülumi-əqliyyə və nəqliyyə kəsbinə

sərf edibdir və öz əsrində müt'ədavil fünun və ülumun cümləsinə malik olmuşdur. Əgərçi şair türk lisanında şe'r və qəzəl yazmağına ümdə bunu səbəb göstərir ki, türk tayfalarının sahibi-şövq və məzaqları dəxi onun bustani-kəlamından şükufələr dərib bəhrəmənd olalar və bu təklifi ona guya bir nigari-mişkinxətt etmişdir və lakin həqirin anladığına görə, Füzuli özü türk oğlu olmağa binaən, öz ana dilini artıcıq sevib də, ona rövnəq verməyi baş vəzifələrindən birisi hesab edirmiş. Və insafən demək olur ki, türk ədəbiyyatının banisi Molla Məhəmməd Bağdadi olubdur. Əgərçi ondan müqəddəm türklərdən də bə'zi mö'təbər şairlər olubdur, vəli onun kimi müqtədir və cəm'i lisana malik və came'i-fünuni-nəzm və nəsr olmayıbdır. Və həqiqətdə demək olur ki, türk dilinə rövnəq verən və onu xarü xaşakdan təmizləyib bir göyçək və səfalı çəmənə bənzədən Füzuli olubdur. Və bununla biz türklərin üstə ümumən və Azərbaycan türklərinin boynuna xüsusən böyük bir minnət qoyubdur. Türk dilinin üstündə sərfi-himmət və qeyrət göstərdiyini şair özü bir məqamda bəyan etmişdir:

Ol səbəbdən farsi ləfzilə çoxdur nəzm kim,
Nəzmi-nazik türk ləfzilə ikən düşvar olur.
Ləhceyi-türki qəbuli-nəzmi-tərkib eyləsə,
Əksəri-əlfazı namərbut, nahəmvar olur.
Məndə tövfiq olsa, bu düşvarı asan eylərəm,
Novbahar olğac tikandan bərgi-gül izhar olur[59].

Burada bunu dəxi əlavə etmək lazımdır ki, Füzuli özündən müqəddəm və ya öz dövründə olan ali və rəqiq bir şair bulub da, onun əsərlərinə təqlidən bir şey vücuda gətirməmişdir. Nəsr və nəzmdə bir şəxs onun ustadı olmayıbdır. Əazimi-üdəbadan bir nəfərinin asarını sərməşq və ittixaz etməyibdir. Necə ki, bu barədə Məhəmməd Cəlal "Osmanlı ədəbiyyatı nümunələri" nam məcmuəsində buyurubdur: "Bağdadi-gülzar ədəbiyyatının əndəlibi-xoşəlhanı olan Füzuli Osmanlı şairlərindən əsərlərinə ətba olunacaq bir şair və yaxud nasir görmədiyi halda bu gün ədəbiyyati-səhihəyi əhya edəcək bədaye' vücuda gətirmiş. Bu bədaye'i bir şairdən deyil, bəlkə dərələrin cuşeşindən, ruzigarın iniltisindən, bir ahunigahın suzişindən, bir təbəssümün tə'sirindən, bir bədəvi qızın hüsni-mə'sumanəsindən iqtibas eyləmişdir. Bu cəhətlə ən birinci şair mütləq Füzulidir" [60].

Onun müqəllid olmadığı xüsusda Məhəmməd Cəlal belə yazır: "Əgər bir şəxs bizə bu günə sual versə: "Bəlkə Füzulidən əvvəl ərəblər, əcəmlər "Leyli və Məcnun"u, "Yusif və Züleyxa"nı, "Xosrov və Şirin"i yazmış olsunlar da Füzuli də təqlid etmiş olsun?"



Biz cavab veririz: "Xeyr! Hətta mərhumun ruhi-lətifi nitqə gəlib bizə bu babda: "Bən də müqəllidəm!" – demiş olsa, inanmayız. Ehtimal ki, bu böyük şairin zehninə fikri-təqlid gəlmiş olsun. Fəqət "Leyli və Məcnun" təqlid olmaq üzrə yazılan asardan deyil.

Bəs nədir?

Bütün göz yaşlarıdır. Lakin burasını düşünməli: iqtibas başqa, təqlid yenə başqadır. Bünaünileyh "Leyli və Məcnun" bütün-bütün Füzuliyə aiddir. Bu xəzineyi-qiymətdara heç bir əcnəbi müdaxilə edəməz!"[61]

"Leyli və Məcnun" barəsində aşağıda söz olunacaqdır.

Divani-əş'arın cəm etdikdən sonra Füzuli kəmali-inkisar ilə ərbabi-bəlağət və əshabi-fəsahətə üz çöndərib, onlardan təvəqqe eləyir ki, onun divani-kəlamını mütaliə etdikdə deməsinlər ki, Füzuli tamami-ömrünü bir məhəldə, yə'ni İraqi-Ərəbdə keçirib, qeyri bir məmləkətə səyahət etməyibdir və lazimeyi-təcrübə və kəmali-təhsil qılmayıbdır. Bu illəti mucibi-süquti-e'tibar bulmasınlar və məhəlli-məqamına görə rütbeyi-iste'dadına həqarətlə baxmasınlar. Zira, qızıl torpaqda yatmaqla ciladan düşməz...

Bundan sonra şair dərgahi-ilahiyə üz tutub deyir: "İlahi! Bu məhəbbətnameyi-nami və bu fərzəndi-dilbəndi-girami ki, zadeyi-təb'ifüsunsaz və nəticeyi-idraki-sehrpərdazımdır, nə diyara getsə və nə vilayətə yetsə, məqdəmi-şərifin mübarək və meymun və mətlə'i-lətifin xücəstə və hümayun edəsən"[62]. Doğruluqla demək olur ki, Füzulinin bu duası dərgahi-həqqdə dərəceyi-qəbula irişdi və onun təb'i-füsunsazından vücuda gələn fərzəndi-dilbəndi, yə'ni divani-əş'arı hər ölkə və diyarda əziz və möhtərəm oldu. Bundan əlavə, Füzuli həqqdən niyaz edir ki, "bu məhbubi-cahanpeymanı və şahidi-rə'nanı ümumən əhli-fəsaddan və xüsusən üç tayifeyi-bədnihaddan hüsni-himayətində məhfuz və məhrus qılsın. Bu üç tayifədən biri ol katibi-naqabildir ki, xameyi-müxalifəttəhriri tişeyi-bunyani-maarifdir və kilki-küdurət tə'siri me'mari-binayi-zəxarifdir. Gah bir nöqtə ilə "məhəbbət"i "möhnət" göstərər və gah bir hərf ilə "ne'mət"i "niqmət" oxudar:

Qələm olsun əli ol katibi-bədtəhririn –
Ki, fəsadi-rəqəmi sözümüzü şur eylər.
Gah bir hərf süqutilə qılır "nadir"i "nar",
Gah bir nöqtə qüsurilə "göz"ü "kur" eylər.

Biri ol naqisi-bədsavaddır ki, təb'i-namövzunu ilə məclis və məhafildə də'vayi-iste'dad qılıb, şe'r oxuduqda nəzmi nəsrdən seçilməyə və ədayi-süstü ilə şahidi-mə'ni camalından niqab açılmaya:

Binəsib olsun nəimi-xülddən ol zişt kim,
Namülayim ləhcəsi mövzunu namövzun edər.
Tişeyi-ləfzi binayi-nəzmi viran eyləyib,
Süst göftarı fəsahət əhlini məğbun edər.

Və biri ol hasidi-cəfapişədir ki, təb'i-namövzunu ilə də'vayi-şe'r edə, amma dəqayiqi-əş'arə sahibşüur olmaya və idraki-rəkiki ilə lafi-nəzm ura, amma həqayiqi-göftarə rahi-təsərrüf bulmaya. Lacərəm, həsəd dideyi-insafın kor edib, idrakına e'timad edə və cahillər hüzurunda bihudə-bihudə laflar urub, hərzə-hərzə dəxllər eyləyə, ta kim, şe'rdən zövqi-istima gedə:

Xəzandır gülşəni-ürfanə hasid,
İlahi, hasidi xar eylə daim.
İşidir mə'rifət əhlinə azar,
İlahi, hasidi zar eylə daim[63].

Füzuli türklər ədəbiyyatında "Ustadi-şüəra" ləqəbini alıbdır və bu za-ti-şərif məzkur ləqəbdən səva Azərbaycan vilayətində "Ustadül-məkatib" ismilə dəxi şöhrətlənmişdir. Füzulinin məşhur əsərləri bunlardır: 1) "Külliyyati-divani-Füzuli", 2) "Hədiqətus-süəda", 3) "Şikayətnamə" ki, nəsr ilə yazılmışdır və bu axırıncı əsər bizim nəzərimizə çatmayıbdır[64].

"Külliyyat"a daxil olan əsərlər bunlardır: Müqəddimətül-kitab, qəsaid, tərkibbənd və tərcibənd, "Bəngü badə", "Nişançı Paşa xidmətinə yazılan məktubi-hikmətüslub", "Saqinamə", "Mərsiyə dər həqqi-xamisi-Ali-əba həzrəti-Seyyidüş-şühəda", qəzəliyyat, müsəddəsat, müxəmməsat, mürəbbeat, əlmüqəttəat, "Dastani-Leyli və Məcnun"[65]. Bu "Külliyat"ın ən mö'təbər çapı sabiqdə İstanbulda fars dilində təb' olunan "Əxtər" cəridəsinin[66] mətbəəsində 1308-ci[67] sənədə çap olunanıdır. Bu divani-Füzuli artıq diqqətlə təshih olunmuş nüsxələrdən birisi olub, açıq və aydın hürufat ilə sarı rəngə mail kağız üstə təb' olunmuşdur.

"Hədiqətüs-süəda" on bir baba təqsim olunubdur. Bu qərar üzrə:

Əvvəlinci bab bə'zi ənbiyayi-üzam və rüsüli-kiramın surəti-əhvalları bəyanındadır.

İkinci bab həzrəti-Rəsulun Qüreyşdən çəkdiyi ə'zaların bəyanındadır.

Üçüncü bab həzrəti-Seyyidül-mürsəlinin keyfiyyəti-vəfatı bəyanındadır.

Dördüncü bab həzrəti-Fatimeyi-Zəhranın vəfatı bəyanındadır.

Beşinci bab Əliyyül-Mürtəza həzrətlərinin vəfatı bəyanındadır.



Altıncı bab həzrəti-İmam Hüseynin bəzmi-bəlada sağəri-bəqa nuş etdiyi bəyanındadır.

Yeddinci bab həzrəti-İmam Hüseynin Mədinədən Məkkəyə təvəccöhü bəyanındadır.

Səkkizinci bab Müslüm ibn Əqilin şəhadəti bəyanındadır.

Doqquzuncu bab İmam Hüseynin Məkkədən Kərbəlaya təvəccöhü bəyanındadır.

Onuncu bab həzrəti-İmamın ləşkəri-Yezid ilə müharibəsi bəyanındadır.

On birinci bab xatimeyi-kitab və müxəddərati-əhli-beytin Kərbəladan Şama getdikləri bəyanındadır.

Tətimmeyi-kitabda on iki imamın 43 təriqi-icmal üzrə əhvalları bəyan olunubdur.

"Hədiqətüs-süəda" dəxi türk dilində inşa olunubdur. Bu bərgüzidə əsərin türk lisanında təhrir olunmağının səbəbini Füzuli bu minval üzrə bəyan edib, itmamına həqqdən müavinət istəyir: "Çün cəm'i müddətdə məcalis və məhafildə təqrir olunan vəqayeyi-Kərbəla və keyfiyyəti-əhvali-şühəda farsi və tazi ibarətində bəyan olmağın əşrafi-ərəb və əkabiri-əcəm təməttö bulub, əizzeyi-ətrak ki, cüz'i-ə'zəmi-tərkibi-aləm və sinfi-növ'i-bəni-adəm olub, sətri-zaidi-səhaifi-kütüb kimi süfufi-məcalisdən xaric qalıb, istifayi-idraki-həqayiqdən məhrum qalırlardı, bu səbəbdən iqtizayi-ümumi-matəmi-Ali-əba zəbani-hal ilə məni-xaksarə təərrüz etdi və dəsti-təərrüz ilə giribanım tutdu ki, ey pərvərdeyi-xani-ne'məti-şahi-Kərbəla – Füzuliyi-mübtəla, nola ki, bir tərzi-mücəddədə müxtərə olasan və himmət tutub bir məqtəli-türki inşa qılasan ki, füsəha türki zəbanında iste'malından təməttö bulalar və idraki-məzmunundan ərəbdən və əcəmdən müstəğni olalar.

## QİT'Ə

Təkrari-zikri-vaqieyi-dəşti-Kərbəla,
Məqbuli-xasü amü sığarü kübardır.
Təqrir edənlərə səbəbi-izzü ehtişam,
Təhrir edənlərə şərəfi-ruzigardır.

Bu həqir və fəqir ki, bu nəsihəti işğa qıldım və bu xidmətin məhz səadət olmağın mühəqqəq bildim, ədəmi-istitaət və qilləti-bizaətdən ehtiraz və ictinab etməyib tərtibinə təvəccöh qıldım. Əgərçi ibarəti-türkidə bəyani-vəqaye düşvardır, zira ki, əksəri-əlfazı rəkik və ibaratı nahəmvardır, ümmiddir ki, hikməti-övliya itmamına müsaidət və əncamına müavinət qıla.

## NƏZM

Ey feyzrəsani-ərəbü türkü əcəm,
Qıldın ərəbi əfsəhi-əhli-aləm.
Etdin füsəhayi-əcəmi İsadəm,
Mən türkzəbandan iltifat eyləmə kəm.

İlahi! Vaqifi-keyfiyyəti-hal və alimi-dəqayiqi-əf'alsan. Bilirsən ki, səndən qeyri müinü müzahirim yoxdur və ətrafü cəvanibdə hasid və müanidim çoxdur. Əmimi-məkarimindən və kərimi-mərahimindən təvəqqe budur ki, bu binayi-mücəddəd tə'mirində və bu mülki-müəbbəd təsxirində əlfaz və məanidən cəm'i məsalihim mühəyya qılasan və ərbabi-həsəd və əshabi-inad hücum etdikcə mənə müin və müsaid olasan: "innəkə ələ kulli şeyin tədirun"[68].

Əgərçi "Hədiqətüs-süəda" nəsr ilə təhrir olunubdur və bə'zi məqamlarda münasibi-hal və müvafiqi-məqal gözəl şe'rlər vasitəsilə şərhimə'na qılınıbdır və lakin bu nəsrdə Füzuli o qədər məharət və fəsahət göstərmiş ki, və əhvali-keyfiyyəti-şühədanı elə bir gözəl və şirin dil ilə yazmış ki, əhli-zövq və ərbabi-mə'rifət indində onun dərəcə və mənziləti çox nəzmlərdən artıqraqdır. Bu vaxta kimi füsəhayi-türk və əcəmdən bir kəs belə bir xoş ibarəli və şirin ləhcəli və gözəl şivəli əsər vücuda gətirməyibdir – desək, səhv etməmiş olarıq.

Füzulinin asari-qələmiyyəsindən nümunələr göstərməyi lazım görmədik. Bu cəhətə ki, Azərbaycan türklərinin handa azacıq savadlısı varsa, onun əsərləri ilə az-çox tanışdır. Hətta bu axır vaxtlara kimi onun divani-qəzəliyyatı və "Leyli və Məcnun" hekayəsi məktəblərdə tə'lim kitabı olub, uşaqlara ondan dərs verilirdi. İndi də köhnə məktəblərdə tə'lim almış adamlardan hər birisini dindirsən, "Leyli və Məcnun" hekayəsinin ibtidasını – "Dehqani-hədiqeyi-hekayət, Sərrafi-cəvahiri-rəvayət..." başlayıb əzbərdən oxuyacaqdır. Amma çoxları bu qəribə hekayənin mə'nasını əsla fəhm etməyib, tutuquşu kimi ancaq onun ləfz və ibarəsini öyrənmişlər. O ki, qaldı Azərbaycan şairlərinə, onlardan çoxu Füzuliyə peyrəvilik edib, xüsusən qəzəliyyat və müxəmməsat qismi əsərlərində ustadi-girамiləri getdiyi təriqi ixtiyar edib, onunla getmişlər və bə'ziləri bu müqəllidlikdə övci-məqama yetişib, fünuni-şe'rdə böyük bir məharət kəsb etmişlər. Məsələn, Nuxa şairlərindən məşhur İsmayıl bəy "Nakam" təxəllüs Füzulinin atidə zikr olunan müsəddəsinə yazdığı bir nəzirə xeyli mərğub və dilpəsənd kəlamlardan birisidir.



## MÜSƏDDƏSİ-FÜZULİ

Dün sayə saldı başimə bir sərvi-sərbülənd –
Kim, qəddi dilrüba idi, rəftarı dilpəsənd,
Göftarə gəldi ta ki, açıb lə'li-nuşxənd,
Bir püstə gördüm onda tökər rizə-rizə qənd.
Sordum: – Məgər bu dürci-dəhəndir? dedim dedi:
– Yox, yox, də'vayi-dərdi-nihanındürür sənin!

Əymiş hilali üstünə tərfi-külahini,
Çox dilşikəstənin göyə yetirmiş ahini,
Zülfün dağıtdı, gizlədi əbr içrə mahini,
Gördüm yüzündə həlqeyi-zülfi-siyahini.
– Ol piçü tabı çox nə rəsəndir? – dedim, dedi:
– Dövri-rüxümdə rişteyi-canındürür sənin!

Vermiş füruğ şəm'i-rüxi gün çirağına,
Salmış şikəst sərv qədi gül budağına,
Dün sərv tək basanda qədəm göz bulağına,
Bir neçə xardən ə'ləm irmiş ayağına.
– Gül bərginə batan nə dikəndir? – dedim, dedi:
– Müjgani-çeşmi-əşkfişanındürür sənin!

Seyr ilə saldı bağə güzər ol səmənüzar,
Ənva'i-zibü zinət ilə fəsli-novbahar,
Tökmüş gül üzrə sünbüli-giysuyi-müşkbar,
Yaxmış ayağına yenə gülbərk tək nigar.
– Nəsrinə rəngi-lalə nədəndir? – dedim, dedi:
– Qəmzəm xədəngi tökdüyü qanındürür sənin!

Seyli-sirişkim oldu rəvan xaki-kuyinə,
Can valeh oldu lə'li-ləbü göftguyinə,
Dil düşdü dami-silsileyi-müşkbuyinə,
Ol ləhzə kim, sataşdı gözüm zülfü ruyinə,
– Əqrəb məhi-münirə vətəndir? – dedim, dedi:
– Vəhm eylə kim, xətərli qiranındürür sənin!

Düşmüş üzarı üzrə müənbər səlasili,
Aşüfəthal edib neçə bisəbrü bidili,
Əqlimi valeh eylədi şəklü şəmayili,
Göz gördü qamətin, dilü can oldu mayili,
– Vəh, bu nə türfə sərvi-çəməndir?! – dedim, dedi:
– Mənzuri-dideyi-nigaranındürür sənin!

Dün sübhdəm ki, laləvü nəsrin salıb niqab,
Gül çöhrəsindən aldı səba pərdeyi-hicab,
Gülzarə çıxdı seyr edə ol rəşki-aftab,

Şəbnəm nisar etdi günəş lö'löi-xoşab.
– Lö'lömü, yoxsa dürri-Ədəndir? – dedim, dedi:
– Əbsəm, Füzuli, əşki-rəvanındürür sənin![69]

Bu dürri-Ədən və lö'löyi-xoşab ilə arastə və tərtib olunmuş kəlami-behcətəngizə nəzirə olaraq İsmayıl bəy Nakam demişdir:

Guyi-nigarə duş gedib eylədim büka,
Guş eləyib fəğanımı ol türki-dilrüba.
Dərdimi bildi, heyrətimi gördü cabəca,
Rəhm etdi halimə, dedi: – Ey ərseyi-bəla,
Kim eyləmiş bu dərdə səni mübtəla? Dedim:
– Mən bilməm özgə, aşiqi-heyranınam sənin...

Bu kəlamın tamamisi cənab Nakamın seyr və süluku babında dərc olunacaqdır. Oraya baxmalı![70]

Nakamdan əlavə Qasım bəy Zakir, Abdulla bəy Asi, Mehdiqulu xan Vəfa, Hacı Seyid Əzim Şirvani, Bixud[71], Mustafa ağa Nasir, Qövsi[72], Molla Qədir Naci[73] və Azərbaycanın qeyri müəzzəm və məşhur şairləri Molla Məhəmməd Bağdadiyə peyrəvilik edib, fünuni-şe'rdə özləri üçün şan və şöhrət kəsb etmişlər. Zənnimizcə, Füzulinin nüfuzu xeyli müddət bizim Azərbaycan şairlərinin asari-qələmiyyələrində müşahidə olunacaqdır və onun ruhpərvər olan əş'ari-mütəəddidəsinin hüsni-tə'sirindən bizim şüəranın da təb'ləri səfalanıb, nuraniyyət kəsb edəcəkdir.

Füzulinin asari-qələmiyyəsinin hələ daha da çox zamanlar həyat üzrə davam edib, tərü təzə qalmağına iki ümdə səbəb vardır. Onlardan birisi budur ki, haman əsərlərin tamamisi pak, həqiqi və təbii hissiyyatdan nəş'ət etmiş əsərlərdir ki, eşqi-həqiqidən bəhs edir. Füzulinin özü həqiqi aşiq olduğu üçün kəlamı dəxi başdan-ayağa aşiqanədir. O pakizəlik və lətafət və o naziklik və nəzakət ki, Füzulinin şe'rlərində hiss olunur, heç bir şairin kəlamında o dərəcədə məhsus deyildir. Bilafərq Füzulinin hansı qisim kəlamını mütaliə etmək istəsəniz, mütaliə buyurun, onun hüsni-tə'sirini oxuduqda öz vücudunuzda dərk edəcəksiniz. Və bu tə'sirdən içəri aləminiz bir növ təmizlənib paka çıxacaqdır, vicdanınız uyqudan ayılan kimi olacaqdır. Fikir və xəyalınız sizi başqa bir ali məqama – mə'nəviyyət aləminə tərəf çəkəcəkdir. Burada nümunə üçün uzaq getməyib, divani-qəzəliyyatından əvvəlinci qəzəlinə iktifa edəlim ki, məhəbbəti-əzəli ilə başlanıbdır:

Qəd ənarəl-eşqə lil-üşşaqi mənhacül-hüda[74],
Saliki-rahi-həqiqət eşqə eylər iqtida.



Eşqdir ol nəş'eyi-kamil kim, ondandır müdam
Meydə təşviri-hərarət, neydə tə'siri-səda.

Vadiyi-vəhdət həqiqətdə məqami-eşqdir –
Kim, müşəxxəs olmaz ol vadidə sultandan gəda.

Eyləməz xəlvətsərayi-sirri-vəhdət məhrəmi
Aşiqi mə'şuqdən, mə'şuqi aşiqdən cüda.

Ey kim, əhli-eşqə söylərsən: məlamət tərkin et!
Söylə kim, mümkünmüdür təğyiri-təqdiri-xuda?

Eşq kilki çəkdi xətt hərfi-vücudi-aşiqə –
Kim, ola sabit həq isbatında nəf'yi-maədа.

Ey Füzuli, intihasız zövq buldun eşqdən,
Böylədir hər iş ki, həqq adına qılsan ibtida[75].

Bu şe'rləri mütaliə etdikdə, filhəqiqə, oxucular bir növ həqiqət yolunda sə'y edən saliklər cümləsinə daxil olub, onların fikir və xəyalı vadiyi-vəhdət tərəfinə meyl edir ki, onda sultan ilə gəda və əğniya ilə füqəra arasında bir fərq və təfavüt yoxdur. Füzulinin əş'ar və kəlamının bəqasına ikinci səbəb onların elm və təcrübə üzü ilə təb'i-səlimdən doğub vüqua gəlmələridir. Necə ki, şair özü deyir ki, şairliyim təsdiq olub, avazeyi-nəzmim ilə aləmlər dolub şöhrət tapdımsa da, məşşateyi-himmətim rəva görmədi ki, müxəddəreyi-hüsni-nəzmim pirayeyi-maarifdən xali və rişteyi-silki-şe'rim cəvahiri-elmdən ari qalsın. Zira ki, elmsiz şe'r əsası yox divar kimi olur və əsassız divar qayətdə bie'tibar olur (Bu irada bizim şüəra diqqət yetirməlidir və elm və maariflə öz şe'rlərinə möhkəm bina və əsas saz etməlidir). Pəs, Füzulinin qələmi-gövhərrizindən vücuda gələn lö'lö və cəvahir ilə tikilmiş imarətin divarları elm və maarifin möhkəm bünövrəsi üstündə qərar tutmuşdur və afəti-zəmanədən ona bir xövf və xətər yoxdur, zira bir xanənin binası nə qədər möhkəm olsa, bir o qədər onun daimi və əbədi olması yəqindir. Bu cəhətə, Füzulinin təb'i-gövhərbarından zühur etmiş və ülum və maarifin ələyindən ələnmiş və əqli-səlimin tərəzisində müvazinə olunmuş əş'ari-həkimanə və asari-fəlsəfanə onun ismi-şəriflərini, necə ki, dünya vardır və türk tayfaları sağdır, baqi saxlayacaqdır. Ol dürri-yeganənin uşaqlar əlinə tə'lim üçün verilən "Leyli və Məcnun" dastanında o qədər hikmətamiz sözlər, dərin fikirlər, nazik imalar və rəqiq işarələr, şairanə nəzmlər və fəlsəfanə şe'rlər vardır ki, cümləsini burada zikr etməyə və şərh qılmağa nə xamədə qüdrət və nə lisanda bir o qədər təlaqət və fəsahət vardır. Avropa hükəma və fəlasifəsindən məşhur

Şopenhauer[76] "Məhəbbət nədən ibarətdir" sərlövhəsilə yazdığı bir əsərində bəst verdiyi şərh və bəyanatın çoxunu Füzulinin abdar şe'rlərində tapırıq. O fikirlər ki, alman filosofu əlli sənə bundan irəli bəyan etmişdir, onları Molla Məhəmməd Bağdadi üç-dörd yüz sənə bundan müqəddəm xeyli ədibanə və mərğub surətdə rişteyi-nəzmə çəkmişdir.

Füzulinin həkimanə kəlamlarından nümunə üçün ancaq "Leyli və Məcnun" hekayəsinin ibtidasında dərc olunmuş münacatın bə'zi yerləri-ni burada yazmaqla iktifa edirik:

## BU, MÜNACAT DƏRYASINDAN BİR CÖVHƏRDİR VƏ TƏZƏRRÖ' MƏ'DƏNİNDƏN BİR GÖVHƏRDİR.

Ya rəb, kərəm et ki, xarü zərəm,
Dərgahə bəsi ümidvarəm.
Topraqdan eylədin bir insan,
Müstövcibi-əqlü qabili-can.
Gər can isə xaki-dərgəhindir,
Vər əql isə saliki-rəhindir.
Mən gülşəni-can içində xarəm,
Ayineyi-əqli pürqubarəm.
Ol gün ki, yox idi məndə qüdrət,
Qıldın mənə qeybətimdə rəğbət.
Can verdinü sahibi-dil etdin,
İdraki-ümurə qabil etdin.
Yüz şükr ki, yox sənə xilafım,
İnsafım varü e'tirafım.
Öylə deyiləm ki, bu arada
Sədd ola sülukim e'tiqadə.
Rahi-tələbində biqərarəm,
Əmma tələbimdə şərmsarəm.
Doğru yola getmədim, nə hasil?
Bir mənzilə yetmədim, nə hasil?
Bir ərsədə hər əsər ki, gördüm,
Sənsən dedim ol əsər, yügürdüm;
Çün verdi xəyal ona xəmü piç,
Mən münfəil oldum, ol əsər hiç.
Mən əqldən istərəm dəlalət,
Əqlim mənə göstərər zəlalət.
Təhqiq yolunda əql netsin,
Ə'məvü qərib qanda getsin?
Tövfiq edəsən məgər rəfiqim,
Ta səhl ola şiddəti-təriqim.
Dünya nədirü təəllüqatı,
Əndişeyi-mövtdür həyatı.
Əmma deməzəm yalandır ol həm,
Sərmənzili-imtəhandır ol həm.
Billah ki, bu dilfərib mənzil
Öylə mənə verdi rahəti-dil –
Kim, əski məqamımı unutdum,
Sandım vətənim, məqam tutdum.
Müşkül gəlir indi tərkin etmək,
Bir özgə məqama dəxi getmək.
Mən böylə qılıram e'tibarı –
Kim, bunda olur könül qərarı.
Əmma çü sənindürür bu göftar –
Kim, dünyadan özgə axirət var.
Oldur ki, məqami-cavidandır,
Kami-dilü rahəti-rəvandır.
Göftarına e'tiqad qıldım,
Ol dəxi yek olduğunu bildim.
Bildim bu imiş sənin muradın –
Kim, əhli-kəmal ola ibadın,
Bunda yetə rütbeyi-kəmalə,
Onda yetə dövləti-vüsalə.
Bu rahdən etmək olmaz ikrah,
Xoşrahdürür sənə gedən rah.
Ol ləhzə həm etmə şəfqətin kəm.
Tövfiqinə qıl rəfiq hər dəm.
Çün əql ilə can əmanətindir,
Məndə əsəri-inayətindir.
Bunları mənimlə zar qılma,
Bir neçə əzizi xar qılma!
Ta kim, bu məqamı tərk edəndə,
Məndən sənə əzm edib gedəndə,
Məndən cəzə' ilə getməsinlər,
Dərgahə şikayət etməsinlər.
Şum olmasın onlara vüsalım,
Olmasın olardan infialım.
Etmək gərək əhli-feyzi-biniş,
Təhqiqi-vücudi-afəriniş.
Bilmək gərək onu kim, cəvahir
Nə gənci-nihandan oldu zahir?
Nə dairədir bu dövri-əflak,
Nə zabitədir bu mərkəzi-xak?
Cismə ərəzi kim etdi qaim.
Narə nədən oldu nur lazim?
Hər xilqətə gərçi bir səbəb var,
Aya, səbəbi kim etdi izhar?
Gər kaf ilə nundan oldu aləm.
Aya nədən oldu kafü nun həm?[77]
Bihudə deyil bu karxanə,

Bifaidə gərdişi-zəmanə.
Haşa ki, bu türfə nəqşi-qərra
Nəqqaşından ola mübərra.
Haşa ki, bu bargahi-ali,
Bir dəm əyasından* ola xali.
Fikr eylə və gör, nədir bu üslub,
Nə saniədir bu sün'i-mənsub?
Hər zərreyi-zahirin zühuri
Bir özgəyə bağlıdır zəruri.
Gər ğayətə eyləsən təəmmül,
Zahir olur onda məzhəri-küll.
Versən özünə fənayi-mütləq,
İsbat olur ol fəna ilə həqq.
Gər var isə mə'rifət mə'zaqi,
Fani sənə bəs dəlili-baqi.
Həqqa ki, həmin vücud birdir,
Bir zatə vücud münhəsirdir.
Əksidir onun vücudi-əğyar,
Mənidə yox e'tibar ilə var.
Var olanı xəlq yox sanırlar,
Yox varlığına aldanırlar.
Yoxdur bu vücudun e'tibarı,
Həq ayinədir, cahan qübarı.
Ey əql, ədəbi riayət eylə,
Bu bilmək ilə kifayət eylə!
Təhqiqi-sifatə qane olgil,
Əndişeyi-zatə mane olgil!
Ol pərdəyə kimsə rah bulmaz,
Təhqiq bil, onu bilmək olmaz.
Gər yetsə idi bu sirrə idrak,
Deməzdi rəsul "maərəfnak"[78].
Xəlq oldu bu bəhri-heyrətə qərq,
Ta xəlqdən ola xaliqə fərq.
Hər riştə ki, həqq ə'yan edibdir,
Sərriştəsini nihan edibdir.
Faş oldu ki, sirri-həqq nihandır,
Aləmdə nişanı binişandır.

## BU, İZHARİ-E'TİRAFİ-CƏHALƏTDİR VƏ İQRARİ-İSRAFİ-MƏ'SİYYƏTDİR.

Ey hikmətə baxmayan nəzərsiz,
Əhvali-zəmanədən xəbərsiz!
Tə'n etmə ki, çərx bivəfadır,

* Əyasından – yə'ni sahibindən, yiyəsindən deməkdir



Daim işi cövr ilə cəfadır.
Şərh eylə mənə ki, çərx netdi?
Ondan nə cəfa zühura yetdi?
Nən var idi kim, əlindən aldı,
Nə mərtəbədən aşağı saldı?
Dövranə gətirdi mehrü mahi,
İçində sepidiyü siyahi.
Gəh atəşə zəcri-ab verdi,
Gəh badə qəmi-türab verdi.
Şəm'i-əməlin münəvvər etdi,
Hər nə dilədin müyəssər etdi;
Qıldı səni hiçdən bir adəm,
Əsbabi-tə'nə'ümün fərahəm.
Çərxin xud işi səninlə böylə,
Sən neylədin onun ilə, söylə!
Hər dəm onu bivəfa oxursan,
Dönsün – deyü bəddua oxursan.
Çün ol sənə qıldı mehribanlıq,
Yaxşılığa eyləmə yamanlıq!

## RUHA XİTAB[79]

Ey ruh ki, cami-cəhl edib nuş,
Hübbi-vətən eylədin fəramuş.
Kim saldı səni bu təng rahə,
Qandan düşdün bu damgahə?
Sən tərk qılıb ədəm diyarın,
Bulduqda vücud e'tibarın,
Qılmışdı səninlə hikmətüllah,
Əcnasi-həvasü əqli həmrah.
Ta aləmə qəldiyin zamanda,
Bazari-tərəddüdi-cahanda
Sərmayələrindən edəsən sud,
Ol sud nədir? – Rizayi-mə'bud.
Hala ki, xəsarət oldu vaqe,
Sərmayələrin təmam zaye''.
Heyranü mükəddərü təhidəst,
Əhvali xərabü rütbəsi pəst.
Dönsən yenə gəldiyin məqamə,
Qabilmi düşəsən ehtiramə?
Əlbəttə, zəlilü xar olursan,
Bu fe'l ilə şərmsar olursan.

## NƏFSPƏRƏST QAFİLƏ XİTAB

Ey nəfspərəstü cismpərvər,
Olma qəmi-hirs ilə mükəddər!
Sə'y eylə məta'i-mur yığma,
Cəhd eylə əzabi-gur yığma!

Alma ələ səğari-meyi-nab –
Kim, qərqə edər səni bu girdab!
Olma nigərani-səbzeyi-bəng –
Kayineyi-dininə salır cəng!
Dəf' kimi köksdə ləhv qoyma!
Ney kimi həvayi-nəfsə uyma!
Damani-təriqi-şər'i tutgil,
Hər nə ki, xilafi-şər'dir, unutgil!
Təhqiqi-vəsileyi-vüsul et!
Təqlidi-şəriəti-rəsul et[80].

Qədim Yunanıstanda şüəra sinfi bir qissə və hekayət yazmaq istədikləri əsnada Muza adlı şe'r ilahəsinə rücu edib, ondan kömək və mədəd dilərdilər. Bu adətə oxşar əski əcəm və ərəb və türk şairləri dəxi saqiyisafzəmirə və sadəruya üz çöndərib, ondan kərəm və himmət dilərdilər. Füzulinin "Leyli və Məcnun" qisseyi-pürqüssəvü məlalının ibtida və intihasında və hekayənin bə'zi məqamlarında yazdığı saqinamələr onun ən xoşməzmun və dilpəzir kəlamlarından ədd olunsa gərəkdir. Bu saqinamələrdə o qədər mühəssənat, lətafət və mövzuniyyət vardır ki, onları yazmaqla başa gələsi deyil. Onları diqqətlə oxuyanlar bir tərəfdən dünyayi-dunun qeydindən və nəfsi-şumun hirs və təmə'indən, alçaq və rəzil əməllərdən, pis işlərdən, fasid və batil fikirlərdən xilas olub, nuraniyyət kəsb edirlərsə də, digər tərəfdən onların qəlbi bir növ məhzun və könlü tutqun olur. Bu hala səbəb oldur ki, Füzuliyi-şikəstəhalın qələmigövhərsənci tökdüyü dürri-safın əksəri gözdən tökülən əşki-müsəffaya bənzəyir, nəinki şadlıq çəmənində yağan barana. Füzuli, demək olur ki, möhnət yükünün barkeşi olub, aləmi-insaiyyətdə tamami qəmzədələrin və möhnətkeşlərin yüklərini götürmək və məzlumların halına yanmaq üçün xəlq olunmuşdur. Füzulinin ahü nalələri qarelərə dəxi sirayət edib, onları da özü ilə atəşi-hüzn və ələmə yandırır. Amma bu yanmaqda bir feyz və səadət və ülviyyət vardır ki, o atəşə yanan istər ki, bir də yansın. Bu cansuzluq pərvanənin şam başına dolanıb yanmağına bənzəyir.

Füzuli tamam aləmin dərd və qəmin çəkdiyini "Hədiqətüs-süəda"nın axırında bəyan edir. Bu qəm və ə'ləm nüsxəsini tamam etdikdən sonra şair füzəlayi-bəlağətpişə və füsəhayi-diqqətəndişədən təvəqqe və rica edir ki, binayi-tə'lifinə və tərhi-təsnifinə diqqət yetirdikdə, islahixətasına iqdam və ehtimam edələr və mühərririn duayi-xeyir ilə yad edib, qəbuli-üzr ilə hər nöqsanın tamam qılalar. Və sonra bu şe'ri gətirir:

Hücumi-möhnəti-dövran məluli,
Giriftari-qəmi-aləm Füzuli.
Deyil ol ləhceyi-göftarə qabil –
Kim, ola qabili-səm'i-əkabir.



Qılır cəmiyyəti-dil ləfzi dilkəş,
Müşəvvəş söyləməz, illa müşəvvəş.
Gəl, ey hali-təkəllümdən xəbərdar,
Tərəhhüm qıl, təərrüz qılma zinhar![81]

"Leyli və Məcnun" hekayəsinin səbəbi-nəzmini bəyan qıldığı saqinamədə Füzuli deyir: Bu, bir bəzmi-müsibəti-bəladır ki, onun əvvəli qəm, sonu bəladır. Bu hekayənin nə badəsinə nişatdan rəng, nə nəğməsinə fərəhdən ahəng var. İdrakı verir xəyala azar, əfkarı edər məlali əfkar.

Hərgah bu, bir bəhcət gətirən və fərəh yetirən hekayə olsaydı, bunun tövcihinə rağib olanlar çox olardı. Bu, pürməlal bir dastandır ki, hər bir fəsihin halını pərişan edib nitqini bağlar və sözlərini kutah elər. Necə ki, bu babda Nizamiyi-şirinkəlam deyibdir:

Əsbabe-soxən neşato nazəst,
Zin hər do soxən bəhane sazəst.
Meydane-soxən fərax bayəd,
Ta təb' dər u honər nəmayəd.
Dər gərmiye-riko səxtiye-kuh,
Ta çənd soxən rəvəd beənbuh[82].

Füzuli Şeyx Nizaminin bu sözlərini saqinaməsində zikr edib deyir:

Bir iş ki, qılır şikayət ustad
Şagirdə olur rücu'i bidad[83].

Amma bu əmr nə qədər düşvar isə də, Füzuli onu əncama gətirməyə şüru' edib, öz təb'i-lətifindən və qələmi-gövhərrizindən himmət tələb edir:

Ey təb'i-lətifü əqli-vala,
İdraki-büləndü nitqi-guya!
Düşdü səfərim diyari-dərdə,
Kimdir mənə yar bu səfərdə?
Hər kimdə ki, vardır istitaət,
Dərdü qəmü möhnətü qənaət,
Oldur bu müsafirətdə yarım,
Zövq əhlinə yoxdur etibarım...[84]

## QƏLƏMƏ XİTAB

Ey xameyi-sərkəşi-səbükxiz,
Vəqt oldu ki, olasan göhərriz!
Mən acizəmü bu əmr müşkil.
İmdad dəmidir, olma qafil!
Asari-mürüvvət eylə izhar,

Bir təprən, əgər mürüvvətin var!
Sən qıl hünəri, mən alayım ad,
Sən çək ələmi, mən olayım şad.
Çün nəxli-hədiqeyi-hünərsən,
Müftahi-xəzineyi-göhərsən,
Cəhd eylə, çıxar cəvahiri-pak,
Fikr etmə ki, yoxdur əhli-idrak!
Demə ki, bulub kəsad bazar,
Bulmaz bu məta'imiz xəridar...[85]

* * *

Ey bəxt, vəfasız olma sən həm,
Həmrahlıq et bizimlə bir dəm[86].

Əlhəqq, deməmək olur, bu əmri-müşkili, yə'ni "Leyli və Məcnun" hekayəsini ustadi-şüəra və əfsəhi-füsəha Molla Məhəmməd Bağdadi Füzuli kəmali-fəsahət və bəlağət ilə əncama yetiribdir ki, onda zərrəcə bir qüsur yoxdur və ümumi-şüəra və üdəba bu qövlə şərik və müqirrdir.



# YUSİF NABİ

Molla Məhəmməd Bağdadidən sonra Azərbaycan şüəra və üdəbasına şüərayi-sələfdən artıq nüfuzu olanı Yusif Nabi olubdur. Nabi əfəndi türklərin müqtədir və zor şairlərindən birisi hesab olunur. Divani-Nabidə ki, zəxim bir kitabdan ibarətdir[87], hər qisim kəlam mövcuddur. Təmamisi nəzm ilə inşad olunubdur. Haman mənzumat bu qayda üzrə divani-Nabidə təb' olunmuşdur: 1) Babul-mədh və nə't; 2) Qəsaid; 3) Təxmis və maddeyi-tarix; 4) Məsnəvi; 5) Rübaiyyat və qəzəliyyati-türki; 6) Müqəttəat və müəmmayat; 7) Divani-qəzəliyyati-farsi; 8) "Xeyriyyeyi-Nabi"[88].

Nabi əfəndi "Xeyriyyə"sində oğlu Əbülxeyr Məhəmməd Çələbiyə yazdığı pəndnaməsində öz tərcümeyi-halına dair icmalən mə'lumat verir. Bu mə'lumatdan görünür ki, Məhəmməd Çələbi Nabinin ömrünün müsinn çağında, yə'ni 54 yaşında doğulmuşdur və onun vücuda gəlməsi ilə şairin gözləri nur və qəlbi sürur ilə dolur; guya ona təzədən bir həyat verilir. Belə ki, Nabi əfəndi deyir:

Pərtövi-nuri-həyatım sənsin,
Məhz xeyrü bərəkatım sənsin,
Salalı başimə zatın sayə,
Bən səninlə bakaram dünyayə[89].

Məhəmməd Çələbinin təvəllüdü şairin 54-cü yaşında vaqe olmasına onun bu şe'rləri şəhadət verir:

Səni verdi bana, ey feyzməab,
Mövsimi-sinni-kəbirimdə vəhab.
Toğıcaq aləmə hüsnün mahi,
Güzəran olmuş idim pəncahi.
Çarü pəncahdə verdi səni həq,
Həft salında yazıldı bu vərəq[90].

Məhəmməd Çələbinin maddeyi-tarixindən ki, Nabi əfəndi özü onu inşa edibdir, mə'lum olur ki, onun vəqti-təvəllüdü hicrətin 1106-cı[91] salında vüqua gəlibdir. Haman maddeyi-tarix bu şe'rlərdən ibarətdir:

Sərmayeye-fetrətəm Əbülxeyr –
Kəz lotfe-əzəl pənah darəd,
Tarixe-veladəte-şərifəş
"Əz dərd xoda neqah darəd"[92].

Bu hesab ilə Yusif Nabinin təvəllüdü hicrətin 1052-ci[93] sənəsinə təsadüf edir. 1106 sənədən 54 sənə çıxanda qalır 1052 sənə ki, haman salda

Yusif Nabi vücuda gəlibdir Rəha şəhərində. Rəha isə Qüdsi-Xəlil canibində Şam xittəsində basəfa qəsəbələrdən birisidir ki, xoş ab-havası ilə məşhurdur. Nabi əfəndi vətəni olan Rəhanı belə vəsf edir:

Vətənim şəhri-dilarayi-Rəha,
Vəqti-təhrir müqirrim Şəhba*.
Nə Rəhá, nüsxeyi-gülzari-cinan,
Məsqətürrəsi-Xəlilül-Rəhman.
Nə Rəha qibtəgəhi-xitteyi-Şam,
Məzhəri-mö'cüzeyi-bərdü səlam [94].

Nabi əfəndi vətəni-mə'lufunda nəşvü nüma tapıb, tə'lim və tərbiyə aldıqdan sonra 30 sənəyə qədər Ədirnə və İstanbul şəhərlərində bə'zi mənsəbləri ə'da etməklə sükunət etmişdir və sonradan bu zati-şərifin aramgahı Hələb şəhəri olmuşdur:

Bir zaman Ədirnəvü İstanbul
Oldu si sal bana cayi-nüzul.
Lilləhilhəmd neçə mənsəbü cah
Oldu bu bəndəyə ehsani-ilah.
Qalmayıb sonra dimaği-dövlət,
Oldu üftadeyi-künci-üzlət.
Cəzbeyi-abü həva oldu səbəb,
Oldu aramgəhim şəhri-Hələb[95].

Şairin kəlamından belə anlaşılır ki, Hələb şəhəri xeyli canfəza və xoşhava bir məkandır ki, çahar fəsli düzgün keçir. Bu şəhərin vəsfində şair deyibdir:

Şərabə şərm verir abi-canfəzayi-Hələb.
Şəm'imi-cənnəti məhcub edər həvayi-Hələb.
Ləbi bütanə olur xəndərizi-istehza
Nəməksirişta, ləb püstə fəzayi-Hələb.
Buna həvadə İraqü Əcəm müxalifdir –
Ki, çar fəsldə novruz edər səbayi-Hələb.
Behişt qanda görər hüsnünün təmaşasın,
Tururkən ayineyi-abi-dilgüşayi-Hələb[96].

Yusif Nabi xeyli müddət dünyada zindəganlıq edibdir və əyyami-zindəganlığı Məhəmməd Sultanın[97] oğulları – Mustafa Sultanın və Əhməd xan Sultanın zamani-hökumətlərinə təsadüf etmişdir. Şair hər birisinin vəsfi-şə'nində xeyli qərra və səlis qəsidələr yazıbdır ki, manəndi

* **Şəhbə** – Hələb şəhəridir ki, istilahda "Hələb-Şəhba" deyilir



az tapılar. Onun bir qəsidəsindən anlaşılan budur ki, Sultan Əhməd xan ibn Məhəmməd xanın cülusi-humayunu şairin 50-ci salında vaqe olubdur. Məzkur qəsidə bu sayaq başlanır:

Bir şəbangəh ki, çirağı-xirədi-əbdi-fəqir
Eyləmişdi hərəmi-qəsri-dimağım tənvir,
Nagəhan mükməni qeybin açılıb pərdələri
Oldu yer səf sipəharayişi-meydani-zəmir.
Birinin nami qələm, biri vərəq, biri dəvat,
Biri mə'ni, biri məzmun, biri hüsni-tə'bir.
Dedilər birdən: – Əya, piri-rəhi-nəzmi-süxən,
Ey köhən cövhəri, sövqi-bəyanü təhrir,
Nə əcəb xeyli zamandır ki, təməvvücdə deyil,
Bəhri-zəxxari* – xəyal, əbri-göhərpaşi-zəmir?
Sana noldu, nə turursan, nə günə saklarsan,
Ta bekey nəsri-cəvahirdə bu dəklü tə'xir?
Əlli yıldır ki, müsəlləm sana səccadeyi-nəzm,
Şimdi sənsən şüəra zümrəsinə şeyxi-kəbir.
O zamanlar sana təslim idi meydani-süxən –
Ki, sənin sözlərinə Naili** olmuşdu əsir.
Meyvəsi az isə də, ləzzəti əfzuntər olur
O dirəxtin ki, xiyabani-süxəndə ola pir.
Dedim: – Ey lövhənəvisani-dəbistani-hünər,
Ey məbaniyyi-məaniyə müdara tə'mir,
Həp bilürsiz ki, qədi-rastimi xamə kibi,
Etdi əngüşt kibi xəmzədə bari-təhrir.
Qalmadı tabü təvan teyyi-rəhi-əfkarə,
Oldu əndişə də tərkibi-vücudum kibi pir.
Leyk var cibi-zəmirimdə nəhüftə çoxdan
Bir göhər əqdi ki, olmaz ana aləmdə nəzir.
Saklaram namına bir padşəhi-dövranın –
Ki, edəm müjdə bəşarət kim edərsə təbşir.
Gəlsin ol padşəhin əsri-şərifində görək
Bülbüli-köhnə necə eylər imiş bəsti-səfər.
Dedilər: – Müjdələr olsun, sana, ey rastnəzər –
Ki, səni istədiyin əsrə yetirdi təqdir.
Lilləhilhəmd ki, bir vifqi-murad etdi cülus
İntizar eylədiyin padşəhi-aləmgir.
Oldu tə'yidi-ilahilə misali-xurşid.
Zati-valatəri arayişi-balayi-sərir.
Zilli-məmdudi-xuda həzrəti-Xan Əhməd kim,
Sayeyi-sərvi-ə'ləm, dövlətidir mehri-münir[98].

* **Zəxxar** – dolu və daşqın mə'nasındadır

** **Naili** – Abdulla Paşa Nailiyə işarədir ki, Sultan Osman xani-salis dövründə bir neçə sənə sədarəti-üzmadə bulunubdur. Arif, müt'ədəyyin və münsif bir zat imiş

Və lakin bizə rast gəlmədiyindən mə'lum olmadı ki, Nabi əfəndi Hələb şəhərindəmi vəfat edibdir, yoxsa İstanbulda. Vəli çox ehtimal var ki, onun vəfatı İstanbulda ittifaq düşübdür. Çünki şairin öz kəlamından görünür ki, ol cənab ömrünün həftad sinnində Hələbdən Ruma əzimət edib və Hüzuri-Sultan Əhməd xanda sahibi-mənsəb olmuşdur və dəxi onun İstanbuldan Hələbə mühacirət etməyi haqqında divanında bir işarə yoxdur[99]. Şairin bu qoca sinnində və ixtiyar halında talibi-izzü cah olması bə'zi əhli-qərəz və kəcnəzərlərin lisani-e'tirazını diraz edib, onu müttəhim qılmışlar. Necə ki, bu babda şair özü deyibdir:

Həqqin olub dərində nəsimi-inayəti,
Gülşənsərayi-Rumə düşürdükdə qisməti.
Yə'ni olub diyari-Hələbdən keşidəpa,
Təhrik edincə Rumə rikabi-əziməti.
Nagah vəhmü vəsvəsəfərmayi-kəcnəzər
Urdu inan əzmimə dəsti-cəsarəti.
Bəsti-müqəddimati-sualə edib şüru',
Zəmm etdi xeyrxahlıq üzərə sədaqəti.
Əbvabi-e'tirazə güşayiş verib təmam,
Etdi ədlə ilə mö'kədi-ibarəti.
Dedi ki, ey fisürdə xirəd, piri-natəvan,
Həftad sinndə bu səfərin nəy ki, hikməti?
Bu sinnü saldə qərəzin izzü cah isə,
Yox izzü cahə cismi-nizarın ləyaqəti.
Var isə arizuyi-münasib zəmirdə,
Anın da tazəlikdədir ayinü şövkəti.
Əsbabi-ehtişamə əgər var isə həvəs,
Piranın ana daxi yakışmaz qiyafəti.
Sövdayi-kəsbi-malla məali isə dilin,
Anın da pirlikdə nədir qədrü qiyməti?
Gəhi ocaq başında, gahi bağı-zardə
Eylərkən əhli-danişü elm ilə söhbəti,
Kətm etmə, doğru söylə nədir məqsədü murad,
Böylə dəyişmədən süfreyi-zövq üzləti.
Divan büsatı ilə əgər əsb isə murad,
Bazulərində zəbtinə yox istitaəti.
Halın sənin bu gunə ikən, ey fisürdəhuş,
Bilməm bu rahə sən nədən etdin əziməti?
Gördüm məqalı gərçi deyil vəchdən təhi,
Əmma əsabət üzrə deyil hiç həqiqəti.
Dedim əgərçi cümləsi vardır bu sözlərin
Bən daxi anlamaz deyiləm rəncü rahəti.
Məchuldur təbiət kəc beyninə sənin,
Tədbirə qalib olduğu həqqin iradəti.
Mə'lumdur bu hər kəsə, vazeh təriqdir,



Likən nəhüftə var dəxi çox sirrü hikməti.
Görməzmisən bu mətbəxi-sü'ni-həkimdə
Cəzb etdiyin keşan-keşan insani qisməti?
Əz cümlə ol sənin dedigin rahətü fərağ
Mətlubi-cismdir, yox anın canə nisbəti.
Asudəlikdə gərçi könül müstərih olur,
Həp hisseyi-bədəndir anın həddü qayəti.
Bir istirahətin ki, ola mərcəi bədən,
Yoxdur o rahətin dil ilə canə nisbəti.
Səm'ü bəsər vəzifəsin alamaz kənardə,
İkisi də qidadə çəkərlər zərurəti.
Səm'in qidasi mə'niyi-pakizə nitqdir,
Çeşmin qidasi hüsndür anınla hekayəti[100].

Nabi əfəndinin bu axırkı sözlərində çox nazik mə'nalar vardır ki, onlara diqqət yetirməmək olmaz. Həqiqətdə məhz istirahəti-bədən və fəraqəti-cism ilə dolanmaq heyvaniyyətdən bir az bəridir. Künci-üzlət və qənaəti qənimət bilib, beş günlük ömrü xabi-qəflətdə, yə'ni ancaq yeyib-içməkdə keçirmək, məhz bir bədənə xidmət edib, onun zəruriyyatını mühəyya etməyə çalışmaq və ruhun varlığından bilmərrə bixəbər olmaq insanın sırf cəhalət və avamlığına dəlalət elər. Odur ki, Nabi əfəndi deyir və həqiqətdə çəməni-mə'naya dürr və cəvahir saçır:

Bir istirahətin ki, ola mərcəi bədən,
Yoxdur o rahətin dil ilə canə nisbəti.

Sonradan Nabi əfəndi ətfi-kəlam edib, İstanbulu və onun əhlinin kamal və mə'rifətini və hüsni-ədalarını tə'rif edir:

Minayi-çeşmi qərqeyi-nuri-sürur edər,
Xubani-şəhryanın o hüsnü lətafəti.
Hüsni-ə'da, hüsni-vəfa, hüsni-hər ümur
Ol şəhri bibədəldə bulur hüsni-qayəti.
Ol dilgüşa məallar, ol xürdə nüktələr
Mümkündür bola Ərəbistanda surəti?
Ol canfəza süxənlərin, ol şux ədalərin
Əkamlər lisanına olsunmu nisbəti?
Olsunmu hiç kəlami-zərifanəyə bədəl
Əsbər şəvi təala tənəqşö' ibarəti?
"Bə'di", "ləkə" xitablarından gəlirmi heç
Ləfzi-"a canım", "ay əfəndim" hǝlavəti?[101].

Və bundan sonra şair sədri-ə'zəm Məhəmməd paşanın vasitəsilə müqərrəbi-hüzuri-Xan Əhməd Sultan olmağından və sultanın ol şairisalxürdəyə iltifat və mərhəmət göstərməklərindən danışıb deyir:

Naziklik ilə də'vət edib pişgahına,
Etdi müqabilində qüudə işarəti.
Zərrinsitanə dövlətilə eyləyib nəzər,
Nərgislər oldu naili-çeşmi-inayəti.
Dəsti-mübarəkilə edib çidə xakdən,
Etdi səri-həqirimə vəz'i-əlaməti.
Yə'ni duayi-cahıma vəqf eylədim səni,
Var eylə ta zəmani gəlincə bu xidməti.
Allaha şükr can bədənə etmədin vida
Göstərdi həqq bana bu zaman səadəti.
Dərgahi-dövlətinə olunmazmı ruymal
Ol davərin ki, sibqət edə bu kəraməti[102].

Bu şe'rlərdən mə'lum olur ki, Nabi əfəndi Xan Əhməd Sultanın qəsrində öz kamal və mə'rifəti və xüsusən, təb'i-şe'riyyəsi ucundan iqamət edib, vəzifəxarlar cümləsindən olubdur.

Nabi əfəndi öz hali-həyatında, yəqin ki, məriz olduğu əsnada ölümünün yaxınlaşmağını dərk edib, tarixi-vəfatını yazmışdır. Bu maddeyi-tarix hesabilə onun vəfatı vaqe olubdur hicrətin 1124-cü[103] ilində 77 yaşında. Məzkur tarixi-vəfat bu şe'rlərdən ibarətdir:

Çon ruhe-kəmine-Nabi dər locceye-nur aməd,
Əz təngiye-tə'n va rəst dər dare-sorur aməd.
Tarixşenasane-mə'naye-şohudə ğoyub
Qoftənd: peye-tarix "Nabi behozur aməd"[104].

Yusif Nabi, necə ki, əsərlərindən mə'lum olunur, hikmət və mə'rifət əhli imiş. Onun da Füzuli Bağdadi kimi asari-həkimanələrində xeyli dərin mə'nalar, uca fikirlər, müstəqim və mətin rə'ylər vardır ki, daimül-övqat zində və baqi qalacaqdır. Bundan əlavə mərhum Nabinin oğlu Əbülxeyr Məhəmməd Çələbiyə xitabən yazdığı dəlayili-aqilanə və nəsayihi-müşfiqanə ki, nəticəsi cümleyi-nasə aiddir, bizim dünyəvi səadətimiz, üxrəvi nicatımız və mə'nəvi tərəqqimiz üçün ən məqbul və mö'təbər bir dəsturül-əməldir. Bu "Xeyriyyə"də qeyrilərin də səlahı mənzur olduğunu şair özü açıq deyir:

Hər zaman istərəm, ey cani-pədər,
Ola avizeyi-guşun bu göhər,
Bunu nazik tutasan canından,
Bir dəm ayırmayasan yanından.
Ta bəməhşər ola feyzi cari,
Həm sənə, həm ola qeyrə sari[105].

Əlbəttə, Füzuli Bağdadinin əsari-nəfisələrində olan fəsahət və bəlağət, onun əş'ari-aşiqanələrində hiss olunan lətafət və təravət Nabi əfən-



dinin kəlamlarında müşahidə olunmur və lakin hikmət və fəlsəfə nöqteyi-nəzərincə Nabinin kəlamlarına diqqət yetirilsə və Füzulinin bu qisim asari-qələmiyyələri ilə tətbiq olunsa, bəlkə Nabi əfəndinin kəlami-hikmətamizi ürəfa və üqəla nəzərində Füzulinin kəlamlarından əskik olmaya. Bainhəmə hər iki şairin özlərinə məxsus rütbə və məqamları vardır; hər birisinin şiveyi-lisanları və tərzi-kəlamları başqadır; hər birisinin təb'i-rəvanpərvərlərində başqa bir yaradıcılıq qüvvəsi mövcuddur; hər birisinin şe'r və kəlamından başqa bir ətir və rayihə hiss olunur; hər birisində başqa bir zövq və səfa vardır ki, onları ancaq ərbabı və sərrafı təşxis və təmyiz edə bilər. Belə ki, bunlardan birisini qeyrisinə tərcih vermək müşkül əmrlərdən birisidir. Bu isə bizim vəzifəmizdən bala və qüdrətimizdən xaricdir. Belə pürqiymət dürrlər bizim tənqid tərəzimizdə çəkiləsi daşlar deyil.

Hərçənd Yusif Nabinin əsərləri də cümlə mə'rifət əhlinə və xassə şüəra sinfinə mə'lumdur və lakin onlar Füzulinin tə'lifatı kimi camaatımız arasında intişar və iştihar tapmayıbdır. Zaqafqaziyada ancaq Şəki mahalında, xüsusən Nuxa şəhərinin və Qəbələ mahalının ürəfa və zürəfası arasında Nabi əfəndinin hikmətamiz kəlamları özlərinə xiridar tapmışlar. Sair oxucularımızı da ol zati-əzizin kəlamları ilə aşina etmək üçün burada bə'zi nümunələr göstərilir. Nabi əfəndi öz "Xeyriyyə"sində oğlu Məhəmməd Çələbini sə'y və elmə bu sayaq tərğib və təşviq edib, sə'y və elmin vəsfində və cəhlin zəmmində yazır:

Ey nihali-çəmənarayi-ədəb,
Nurbəxşayi-dilü dideyi-əb,
Sə'y qıl elmi-şərifə şəbü ruz,
Qalma heyvansifət, ol elmamuz.
Elmə sə'y eyləməməkdən həzər et,
Elmü sə'y ikisi birdir, nəzər et.
Müddəaya bu süxən şahiddir,
Elmü sə'yin ədədi vahiddir.
Bulamaz elm bilasə'y vücud,
Biri getsə, biri olur nabud.
Sifəti-həzrəti-Mövladır elm,
Cümlə övsafdən ə'ladır elm.
Mətləbi-elmə çalış ol ə'ləm,
Fərzdir dedi rəsuli-əkrəm,
Dəxi əmr eylədi ol sahibi-elm:
Məhddən ləhdə dək ol talibi-elm.
Elm üçün oldu şəhi-xitteyi-nur,
Rəbb zədni tələbilə mə'mur.
Bula gör öylə Mədinəyə vüsul –
Ki, qapusi ola damadi-rəsul.

Elmdir maşteyi*-ruyi-vühud,
Elmdir vasiteyi-budü nəbud.
Elmdir maideyi-rəbbani,
Elmdir muhibeyi**-yəzdani.
Elmdir rabiteyi-izzü ə'la,
Elmdir baisi-təmkinü səfa.
Elmdir zabiteyi-cahü-cəlal,
Elmdir rabiteyi-bərrü nəval.
Elm bir lücceyi***-bisahildir,
Anda aləm keçinən cahildir.
Cəhlə həq mövt dedi, elmə həyat,
Olma həmhali-güruhi-əmvat.
Olma məhrumi-həyati-əbədi,
Elmlə fərq edə gör nikü bə'di.
Elmin ənva'i ilə ol hali,
Bəlkə lazım gələ iste'mali.
Bilmək, əlbəttə, deyilmi əhsən,
Sorsalar bən anı bilməm deməndən.
Həzrətin nasə budur təlqini:
"Utlubul-elmi vəlo bis-Sini"[106].
Etmə ar, öyrən oxu əhlindən,
Hər şeyin elmi gözəl cəhlindən.
Cühəla alimə nisbət xərdir,
Bəlkə xərdən də belə əbtərdir.
Qandadır bixəbərü qanda xəbir.
Mütəsavi deyil ə'miyyü bəsir.
Nə qədər bulsa da izzət, şövkət,
Cah ilə cahilə gəlməz rif'ət.
Cəhldir maideyi-şərmü xiclət,
Cəhldir muresi-zillü nikbət.
Cəhldir adəmə zindani-bəla, –
Ki, düşənlər görəməz ruyi-rəha.
Cəhldir məhz ədəm, elm vücud,
Heç bərabərmi olur bud, nəbud?
Şərəfi-elmə nəhayət yoxdur,
Sifəti-bariyə qayət yoxdur[107].

Şərəfi-hüsni-xülq babında və sözün məqam və əndazəsi xüsusunda:

Ey səraməd göhəri-bəhri-həyat,
Nüsxeyi-müntəxəbi-hüsni-sifat,
Məskənət xislətin eylə ə'dad,

* **Maştə** – məşşatə – gəlinin üzünə zinət verən
** **Muhibə** – ətiyyə, bəxş və ehsan olunan şey
*** **Luccə** – dərya



Ol mülayimdilü dərvişnihad!
Ol qənitəb'ü təvazöpişə,
Sal gülüstani-fəlahə rişə.
Sana helmü ədəbü hüsni-süluk
Edər əhrari zəruri məmluk.
Hüsni-əxlaq deyil ərzani,
Çini-əbru girehi-pişani.
Xəndəruluq əsəri-rəhmətdir,
Turşuluq səbəbi-nifrətdir.
Xuyi-bəd, adəti-bəd, məşrəbi-bəd,
Edər ərbabını mərdudi-əbəd.
Qürrə olmaq sifəti-şeytandır,
Randeyi-bargəhi-rəhmandır.
Səndə zahir olıcaq kibrü qürur
Qism edər* zöhrini Allahi-qəyur.
Tutalım çərxə irişmiş cahın,
Yenə ədna qulusan Allahın.
Nə qədər cahın olursa ali,
Damənin busədən olsun xali.
Sana lazım yerə yüzün sürtmək,
Qula düşməz əl-ayaq öpdürmək.
Ənbiya məsləkini eylə qəbul,
Oldu mə'mur müdaraya rəsul.
Bimüdara olamazsan rahət,
Fəxri-aləm dedi rə'si-hikmət.
Kəşfi-raz eyləmə biganələrə,
Vermə yol məclisə divanələrə.
Hər kəsi məhrəmi-əsrar etmə,
Sirrini zivəri-bazar etmə.
Hər kəsin qövlünü sadiq sanma.
Cümləyi leyk münafiq sanma.
Olma məclisdə nə bir gunə xəmuş,
Vəqtlə gah zəban ol, gah guş.
Süxəni ibrəti-dürrü göhər et.
Mümkün olduğu qədər müxtəsər et.
Sözdə olsun sənə dəsturi-əməl
Mə'niyi-nükteyi-ma qəllə və dəl
Olur insanda zəban bir, iki guş,
Sən dəxi söylə bir, ol iki xəmuş.
Et kəlamın nə qəsirü nə təvil,
Gözlə vəqtin, nə xəfif ol, nə səqil[108].

Hüsni-kəlami-mövzun babında və şüərayi-islamın mədhində və fil-cümlə, əsl şairin vəzifə və təklifi xüsusunda deyibdir:

* **Qism etmək** – qırıb sındırmaq

Ey səfayabi-kəlami-mövzun,
Aşinayi-süxəni-gunagun,
Təb'in eylərsə əgər şe'rə həvəs,
Sənə mə'nasını fəhm etmək bəs.
Söxənani-şüərayi-əslaf
Qəlbi ayinəviş eylər səfaf.

## TÜRK ŞÜƏRASI

Türkidə Nəf'i ilə Baqiyə* bax,
Qeyr divanları da qıl mülhəq,
Anların şe'ri mətindir, amma
Qeyrisində dəxi var çox mə'na.

## ƏCƏM ŞÜƏRASI

Şüərayi-əcəmin divani
Hüsni-mə'niyyü məarif kani.
Talibü Saibü Ürfiyyü Səlim,
Feyziyü hind Nəziriyü Kəlim,
Təzə guyan zamanda Şövkət**
Mə'niyi-tazəyə verdi surət.
Camiyü Ənvəriyü Xaqani
Hər biri mülki-süxən sultani.
Bülbüli-şaxi-tərazi-Şiraz,
Sə'diyü Hafizi-mənipərdaz,
Süxənani-qüdəmayi-şüəra,
Həq budur: biri-birindən ə'la.
Yox nəhayət şüərayi-əcəmə,
Həm əsamiləri sığmaz qələmə.

## ƏRƏB ŞÜƏRASI

Şe'ri çoxdur şüərayi-ərəbin –
Ki, o da mayəsi Şamü Hələbin.
Demə əbyatına namövzundur,
Anın ozanları digərgundur.
Neçə mə'naları var rəqsavər,
Məş'əlasa tökər əsma'ə şərər.
Var içində neçə əş'ari-kübar,

* **Nəf'i və Baqi** – türk şairlərinin təxəllüsüdür

** Bunların da cümləsi şüərayi-əcəmdən, ya Nabi əfəndinin müasirləri və ya ondan bir az irəli olan şairlərin təxəllüsüdür.



Qoyamaz ayineyi-dildə qübar.
Neçə bin nə'ti-şərifi-nəbəvi,
Midhəti-mö'cizeyi-Müstəfəvi,
Hər biri qiteyi-əlmasi-səmin,
Hər biri dürri-girənqədri-mətin.

## ŞE'RİN HAQQINDA

Hikmətamiz gərəkdir əş'ar –
Ki, məali ola irşadə mədar.
Abi-hikmətlə bulur nəşvü nüma
Gülşəni-şe'rü riyazi inşa.
Olmasa şe'r məcazi-mütləq,
Versə mə'nayə həqiqət rövnəq,
Yoxsa hər nəzmi-təhiyyü sadə
Ola mə'nadən o da azadə.
Baxüsus olmaya təşbihi-tamam
İstiaratü cinasü ibham.
Demədən şe'ri sükut övladır,
Şe'rdən məqsəd olan mə'nadır.
Baxsan əksər süxəni-şairi-xam
Zülfü sünbül, gülü bülbül, meyü cam.
Çıxamaz daireyi-dilbərdən,
Qəddü xəddü ləbü çeşmi-tərdən.
Gəh baharə dolaşur, gəh çəmənə,
İlişür sərvü gülü yasəmənə.
Rəhi-narəftədə cövlan edəməz,
Sapa vadiləri seyran edəməz.
Edəməz seydi-məaniyyi-bülənd,
Atamaz qeyr şikarına kəmənd.
Keçinür mə'niyi-xabidə ilə,
Ləfzi-məşhurü cəhandidə ilə.
Qoxusuz laləyə bənzər o süxən –
Ki, ola ləfzi təhi mə'nadən.
Həcvdən əlhəzər, ey cani-pədər –
Ki, verər məşribi-ürfanə kədər.
Həcvə mayil süfəhadır ancaq,
Aqil etməz anı, eylər əhmət[109].

Nabi əfəndinin "Xeyriyyə"sində o qədər hikmətli sözlər, gözəl nəsihətlər və xoş mə'nalı şe'rlər var ki, cümləsini başdan ayağa kimi yazsaq, nəf' və faydadan xali olmaz, amma məcmuəmizdə yer olmadığına görə, ancaq bu qədər yazılana kifayət etdik.

İndi ol möhtərəm vücudun başqa qisim əsərlərindən dəxi bir neçə nümunələr gətirməklə əziz oxucularımızı daha da artıcıq onunla aşina edək.

Qəzəli-Nabi:

Xətt girdi-arizində ki, gahi ə'yan olur,
Dillər qübari-heyrətlə rikdan olur.

Sorduqca çeşmi hali-əsiran qəmzəsin,
Bimü ümmid arayə girər tərcüman olur.

Mövzunqəddanü simtənanü şəkkərləban
Pirə əsa, fəqirə qina, cismə can olur.

Lazım deyil kitabi-"Gülüstan" o afətə,
Nə nüsxə qursa sinəsinə gülsitan olur.

Şəhri-Sitambulun nə gözəl mərdümanı var,
Ən sadəlövhü nazik olur, nüktədan olur.

Bahərfi-təlx kim var isə xaki-şəhrdir,
Əbnayi-şəhər cümləsi şirinzəban olur.

Hüsni-nəməkbəduş bulunmaz kənardə,
İstanbul içrə, Nabi, o da rayigan* olur[110].

* * *

Adəm əsiri-dəsti-məşiyyət degilmidir?
Aləm zəbuni-pənceyi-qüdrət degilmidir?

Bu pərdənin dərunina bax, iztirabı qoy,
Hər möhnətin vəra'sı** məsərrət degilmidir?

Bəzli-həyat rahi-məhəbbətdə aşiqə
Təklif olunca canına minnət degilmidir?

Yox gərçi sədmeyi-sitəmindən gürizimiz,
Əmma ki, dəsti-nazikə zəhmət degilmidir?

Həp sənmi kamyab olacaqsan zəmanədən,
Ey təngçeşm, kar benovbət degilmidir?

Möhtaci-rizqi-xaliq ikən sərbəsər cəhan,
Məhluqdən niyaz məzəllət degilmidir?

Nabi, zəbani-nitqim edən xameyi-məcaz
Məşşateyi-ərusi-həqiqət degilmidir[111]?

* **Rayigan** – müzdsüz ələ keçən, məccanən
** **Vəra'** – şeyin o biri tərəfi



* * *

Bən ol xakəm ki, xurşidi-cahanara cəlisimdir,
Tə'nim süfladır, əmma mə'niyi-ülvi ənisimdir.

Bu tufanzari-həstidə bən ol kəştiyyi-Nuhəm kim,
Nəfəs balayi-sərdə badban, ruhim rəisimdir.

Gülüstani-cahan ləbtəşneyi-təşrifi-insandır,
Olan rəhzən bənə birahiyi-nəfsi-xəbisimdir.

Edər girdi-səri-insanə gərdiş kaseyi-gərdun,
Nəvali*-afərinişdə məlaik kasəlisimdir**

Xiyali-pirəhən etdikcə qəddi-şuxi-mə'nayə,
Fələkdə çərxeyi-mahi-şəbara pənbərisimdir.

Bəyazə xameyi-zərlə dəbiri-sübh amadə,
Ütarid məclisi-mə'nadə müsəvvədənəvisimdir.

Xüruşi-çar cuyi-təb'imin asari, ey Nabi,
Səfayi-çar mövci bəhri-asari-səlisimdir[112].

Bu qəzəldə Nabi əfəndi insanın vücudu iki hissədən – ruhi-lətif ilə cismi-kəsifdən əmələ gəlməsini xeyli zərifanə və şairanə bəyan edib, xurşidi-cahanara ilə həmcəlis olmağını iddia eləyir və kamali-iftixar ilə sərkeşlik edib deyir ki, özüm torpaqdan xəlq olunmuşamsa da və tə'nim süfla isə də, amma ruh, ağıl və fəhm sayəsində hər bir məxluqdan əşrəf və ə'zəməm, mə'niyi-ülvi mənim ənisimdir.

Bu tufanzari-həstidə, yə'ni bu aləmi-imkanda və varlıq dünyasında mən Nuhun ol nicatverici gəmisiyəm ki, balayi-sərdə əql və idrakım ol kəştinin badbanı və ruhum onun rəisidir. Axırkı beytlərdə dəxi şair özünün sair məxluqatdan ə'ləm və əfzəl olmağını, yə'ni kaseyi-gərdun onun başına dolanmağını və fövci-məlayik nəvali-afərinişdə onun kasayalayanı olmağını və göy üzündə mahi-şəbaranın çərxəsi onun pambıqəyirəni olmağını və məclisi-mə'nada Ütarid ulduzu onun müsəvvədənəvisi olmağını şairanə nəzmə çəkir. Nabi əfəndinin bu əfkari-aliyyəsi Avropa hükəmaları və Məşriqzəmin şüərası əsərlərində dəxi təzkar olunmuşdur. Amma Nabi əfəndi ərusi-mə'nanı qəribə bir libasa və əcibə bir dona geyindirib izhar etmişdir. Özgə bir qəzəlində Nabi əfəndi bu mə'nanı daha

* **Nəval** – vergi, ehsan və ətiyyə mə'nasındadır
** **Kasəlis** – kasayalayan

da açıq ifadə etmək üçün insanı pər və balsız bir quşa təşbih etmişdir ki, aşiyani-aləmə iktisabi-qüvvəti-pərvaz üçün düşmüşdür. Biçarə quşun meyl və həvəsi havaya qalxmaqdır və uca məqamlarda seyr etməkdir. Amma iqtizayi-təbiəti olan bu arzunu icra etməyə qanad və quyruğu yoxdur. Zəlil və müztərr xak üzrə taqətsiz düşüb, əsiri-havayi-nəfs olmuşdur:

Mürqi-qədsiz iktisabi-qüvvəti-pərvaz üçün
Aşiyani-aləmə bibalü bipər gəlmişiz.
Cəhldən üftadəyiz xudrə'yliq vadisinə,
Yoxsa nəqşiz, mə'niyi-nəqqaşə məzhər gəlmişiz[113].

Atidə zikr olunan qəzəl dəxi Nabinin pürməzmun əsərlərindən birisi hesab olunur:

Qələmmisal əmin ol, qələmtəraş olma,
Vərəqnigar kamal ol, vərəqtəraş olma!

Sepervəş eylə təhəmmül, zərrəvəş ol qəmxar,
Təsəllüt eyləmə xəlq üzrə durbaş olma!

Kəmanmisal gəc ol, tək atılma yabanə,
Xədəngi-rastrovü vaditəlaş olma!

Sərində nəş'eyi-səhba ətasidir xakın,
Təəddüb eylə, rüxi-xakə cür'əpaş olma!

Həramzadeyi-möhnət təvəllüd eyləməsin,
Zənan fikr məhal eylə, həmfəraş olma!

Qonarsa cuşi-xəridardən dərunə qubar,
Bu gunə, ey gül, ümidi-xoşqumaş olma!

Dü gündə qərəz asayiş isə, ey Nabi,
Bədazmavü bədamuzü bədməaş olma![114]

Bu qəzəldə zikr olunan bə'zi gözəl fikirləri və müşfiqanə nəsihətləri avizeyi-guş edib, əlbəttə, unutmamalıdır. Necə ki, deyibdir:

Sərində nəş'eyi-səhba ətasidir xakın,
Təəddüb eylə, rüxi-xakə cür'əpaş olma!

Yə'ni torpağın qədrini bil, onun üzərinə cür'əpaş olma, sənin mayeyi-həyatın, eyş-işrətin və zövq-ləzzətin torpaq hasilə gətirdiyi ne'mətlərdən əmələ gəlmişdir: başındakı nəş'eyi-mey xakın ətasıdır və habelə vəliniə-



min qədrini bilib, əməyini zay etmə, qədrşünas ol, şükri-ne'mət eylə, ta ki, haqq-taalanın nəzəri-mərhəməti həmişə üstündə olsun, fəzl və ne'mət qapısı üzərinə açıq olsun.

Ancaq Nabi əfəndinin bu qəzəldə bir nəsihətini qəbul edə bilmədik ki, o da şəxsin məhz bir salamatlığını və xətadan eymən olmağını icab edirsə də, onu təriqi-istiqamətdən və rastrəvişlikdən bir növ əyriliyə və nəfspərəstliyə sövq edir. Nabi əfəndi hifzi-can və asudeyi-tə'n üçün tövsiyyə edir ki, "kaman misal kəc ol!", yə'ni kaman kimi bükülüb və qatlanıb künci-fəraqətdə salamat otur, həqir və üftadə ol, gərdənkeşlik və sərfərazılıq etmə, tək və tənha özünü meydani-müharibəyə atma, səni tapdalayıb əzərlər, başına bəlalar gələr; əgər sən də düz və rast gedən ox kimi vadiyi-təlaşda sə'y etsən, onda yəqin ki, daşa və qayaya toxunub, murada vasil olmamış sınacaqsan.

Əlbəttə, tək öz nəfsinin salamatlığını mənzurda tutmayıb, ümumnasın xeyir və salahı yolunda sə'y və təlaş edən şəxsin başında bəlalar çoxdur, nəinki ol adamın ki, cümlə məxluq ilə müdara edib, hər işdə vahid öz mənfəəti-şəxsiyyəsini gözləyə. Əlbəttə, rastrovluqda, dürüstkirdarlıqda və həqpərəstlikdə xəta və xətər çoxdur, nəinki haqq söyləməkdən çəkinib, məhz öz səlahı üçün künci-fəraqətdə sükunət ixtiyar etməkdə. Amma bununla belə, bizim ixtiyarımız yoxdur ki, xalqı haqq söyləməkdən, dürüstkirdar olmaqdan və haqq yolunda fədakarlıqdan daşındıraq. Bil'əks, hər bir sahibi-vicdanın və əhli-daniş və mə'rifətin əvvəlinci vəzifəsi əbnayi-milləti düzlüyə və doğruluğa də'vət etməkdir. Vətən uğrunda və millətin tərəqqisi və təalisi yolunda onları candan və başdan keçməyə, cür'ətli, şəci' və müstəqim olmağa tərğib və təşviq etməkdir. Və illa adam bir öz başını və nəfsini qorumaqla, öz mənfəəti-şəxsiyyəsini güdməklə, hər qisim cövr və sitəmə tab gətirib, hər bir bari-töhmət və məzəmmətə mütəhəmmil olmaqla və bu qədər xar və zəlil olub, qeyrilərin təhti-hökumətində əsirvar güzəran edib, bu günə dolanmağın adını "müdara" qoymaqla həqiqi səadətə və həqiqi nicata vasil olmaz. Belə dolanmağın nəticəsi qorxaqlıq, kəmcür'ətlik və yasarlıqdan başqa, zillət və məşəqqətdən səva bir şey olmaz. Öz rə'y və fikrimizi açıq deməkdən çəkinib, əyri ilə doğruya fərq qoymayıb, haqqa və nahaqqa "bəli, bəli" deməklə belə fəna hala düşmüşük. Bizim əqidəmizə görə, tərəqqi və səadətimizə lazım olan əsbablardan birisi də cür'ətli, fədakar və dürüstkirdar olmaqdır. Buna binaən Nabi əfəndinin məzkur fərdini bu ibarə ilə dəyişib yazsaq, daha gözəl və məqbul olar:

Kəmanmisal kəc olma, hərasi-can etmə,
Xədəngi-rastrovü vadiyi-təlaş olgil!

Aşağıda yazılan qəzəl dəxi Nabinin hikmətamiz kəlamlarından birisidir. Bu qəzəldə şair insanın hər fe'l və əməlində bir qərəz və bir mənzur olduğunu bildirir:

Verməzdi kimsə kimsəyə nan, minnət olmasa,
Bir məsləhət görülməz idi rüşvət olmasa.

Xəlqin miyanəsində bulunmazdı ittihad,
Məşriblərində vasiteyi-xissət olmasa.

Kəndi vücuduna böylə qılmazdı məali xəlq,
Qəsdi-nümayişi-şərəfü şövkət olmasa.

Yox biqərəz müamilə əhli-zəmanədə,
Kimsə ibadət etməz idi cənnət olmasa.

Təhsili-elmin üstünə tərcih edərmi nas,
Təhsili-məal vasiteyi-rif'ət olmasa.

Kəmyab idi miyani-lə'imandan imtizac,
Mabeynində əlaqeyi-cinsiyyət olmasa.

Etməz zühur ərsədə bir kimsədən kərəm,
Zimnində qəsdi-daiyeyi-şöhrət olmasa.

Baxmazdı kimsə ayineyi-safə, Nabiya,
Xudbinlik əlaqəsinə alət olmasa[115].

## MÜQƏTTƏATINDAN NÜMUNƏLƏR

Tə'sirin anınla canibi-ülvidən olduğun
Seyr et cəmaətin hərəkatın ə'zan ilən.

İnsan odur ki, bir söz ilə bəndi-pa ola,
Heyvan odur ki, bağlayarlar risman ilən.

Nöqsanı başqasilə olur, Nabiya, tamam,
Hər kimsə kim, təkəllüm edər tərcüman ilən[116].

* * *

Dil ərşi-ilahidir, anı eyləmə təxrib,
Dəsti-bəşər ol xanəyi tərmim* edə bilməz[117].

* Tərmim – pozulanı və xarab olanı tə'mir və tə'sis etmək mə'nasındadır



* * *

Bihicr zövqi-vəsl nə mə'lum, Nabiya,
Azadəlik səfası giriftarlıqdadır[118].

* * *

Bir zərrə yox bu kargəhi-sün'də əbəs,
Vabəstədir biri-birinə çərxi saətin[119].

* * *

Həqiqi sanma hər bir gördüyün pərhizkarını,
Fəsadə dərdməndin neyləsin, dəstində alət yox.

Yapılmış, hazır olmuş səndən ol cümlənin kari,
Sənin tədbirinə, ey çərx, zəhmət çəkmə, hacət yox.

Cahanın zirü balasın təfəhhüs eylədim, Nabi,
Təvəkkül kişvərindən qeyri yerdə istirahət yox[120].

* * *

Allah isə və'zində əgər niyyəti-vaiz,
Kürsiyyi-səmavatə çıxar şöhrəti-vaiz.

Əshabi-fəzilət ana möhtac degildir,
Cahillərə, nadanlaradır xidməti-vaiz.

Satmazsa əgər xəlqə vəzifə ilə pəndi,
Nabi, o zamanlar bilinir qiyməti-vaiz.

Söz yoxdur əgər dəstinə məhşərdə girirsə,
Balayi-məcalisdə olan rif'əti-vaiz[121].

* * *

Taki-həqirdə bulunan miyveyi-ləziz
Ol qaməti-büləndə bədəldir çinardə[122].

* * *

Bədtər deyilmi çəğçəğeyi-asiyabdən,
Nabi, o bəzm kolmaya* növbətlə göftgu[123].

Bu müxtəsər nümunələrdən əlavə, Nabinin müqəttəat babında nazik işarələri və hikmətli sözləri çox çoxdur, amma cümləsinin buraya küncayişi yoxdur[124].

* Ki, olmaya – *red.*

# ƏLİŞİR NƏVAİ ƏMİR NİZAMƏDDİN*

Əlişir Nəvai hicrətin doqquzuncu əsrinin axırlarında yetişən cığatay (türk) və əcəm şüərasının ən məşhurlarındandır[125]. Bu şair əslən cığatay türklərindən isə də, Azərbaycan şüərası arasında artıq hörmət və şöhrət kəsb etmişdir və onlara Nəvainin tə'siri artıq dərəcədə olubdur. Buna da ümdə səbəb onun təb'i-lətifindən törəyən asari-nəfisə və əş'ari-məmduhəsi olubdur ki, çox şirin və dadlı dil ilə rişteyi-nəzmə çəkilmişdir. Əmir Əlişir fars lisanını dəxi əkməl vəchdə bilirmiş və fars dilində onun ziyadə mövzun və xoşməzmun kəlamları vardır. Türk və fars dillərinə dara olduğu üçün "Züllisaneyn" ləqəbi ilə müləqqəb olmuşdur.

Nəvainin atası sülaleyi-teymuriyyədən Sultan Əbusəidin vəziri olub oğlunun tə'lim və tərbiyəsinə artıq sə'y və diqqət yetirmişdir. Əmir Əlişir özü uşaqlıqda Sultan Hüseyn Bayqara ilə məktəb yoldaşı olub, əyyamitüfuliyyətdə alinəsəb yoldaşından kəsbi-kəmal və əxzi-ədəb etmişdir. Sultan Hüseyn Bayqara Teymurləng övladından olub, 875-ci[126] tarixdə Xorasan padşahı olmaqla Heratda təxti-səltənətdə əyləşmişdir. Əlişir əvvəlcə bir müddət Xorasanda və bə'd Səmərqənddə təhsili-ülum və fünunə məşğul olub, hüsnxətt, rəsm, musiqi və nəqqaşlıq sən'ətlərində böyük məharət kəsb etmişdir. Amma bu fənlərin cümləsindən artıq onun meyl və şövqü şe'r deməyə və qəzəl yazmağa idi. Cavanlıq mövsümünün və şəbablıq əyyamının müqtəzasında dimaği-lətifi həvayi-hüsni-xəttü xal ilə, könlü badeyi-eşq ilə dolmuş ikən öz hisslərini gözəl şe'rlər vasitəsilə bəyan edərdi. Necə ki, Əlişir özü əyyami-şəbabda hali-dilini bu qərar üzrə təhrir qılmışdır: "Bu pərişan əczanın vərəqnigarı və bu aşüftə övraqın qissəgüzarı, möhnət peymanəsinin cür'əçeşi və məlamət xümxanəsinin səbukeşi, şeydalıq məhəlləsinin rüsvası və rüsvalıq küçəsinin şeydası:

beyt

Vəfa bustanın dastansərayi,
Məlamət bülbüli, yə'ni Nəvai.

Qüfranüllah zünubühu andaq ərz qılır kim, şol caq kim, Xorasan təxti gurganlıq dəvacı belə zinətəfzay və gurgan fərqi cəhanbanlıq tacı bilə fələkfərsay irdi, ömrüm şəbistanı şəbab şamları nuridin münəvvər və həyatım gülüstanı yigitlik gülləri ətridin müəttər irdi. Sinn müqtəzasidin təbiətğə həva qalib, həva qələbəsidin təbiət ləhvğə talib irdi. Köngülagim çakidin köksümdaki əski tuganlar bir-bir ə'yan və kugragimdaki kisgan yanqi əlflaridin köngülagim xət-xət qan. Mudam mey rəğbəti köngülgə məhbub və həmişə məhbub ülfəti xatirimğə mərğub. Canım eşq badəsidin məst və köngülüm badeyi-eşqdin meypərəst irdi:

Bulmasa aləmdə gülrux, saqi, əhvalım xərab,
Yox isə saqidə gülgun cami-mey, bağrım kəbab.

Az vəqtdə badə seylidin huşü əqlim evi yıkıldı və eşq bərqi səlahü afiyətim xərmənin kül qıldı"[129].

Vəqta ki, Sultan Hüseyn Bayqara – Nəvainin məktəb yoldaşı Heratda təxti-səltənətdə əyləşdi, Əlişirin sorağına düşüb və hər yerdə onu axtarıb Səmərqənddə sorağını aldı. Əlişir sultanın də'vətini qəbul edib, Səmərqənddən Herata gəldi. Şəhərə daxil olan zamanı Sultan Hüseyn tərəfindən artıq cəlal və təntənə ilə istiqbal olunub, onun lütf və ehsanına nail olmuşdur. Sultan əvvəlcə Əlişiri möhürdarlıq xidmətinə tə'yin edib, sonradan özünə vəziri-ə'zəm etmişdir. Bilmək gərəkdir ki, Sultan Hüseyn xan alim və adil, rəiyyətpərvər, üləma, ürəfa sinfini dost tutan, xoşəhval və həmidəxisal bir padşah idi. Bu zati-şərifin təb'i-şe'riyyəsi dəxi var imiş. Amma bundan maədə ziyadə dəqiq, nazikanlayan və fünuni-şe'r və ədəbiyyatda qabil və mahir bir vücud imiş. Belə ki, fünuni-şe'rdə sultanın bir dərəcədə ittilaatı var imiş ki, Nəvai kimi müqtədir şairin əsərlərində müşahidə olunan qüsuru təshih qılarmış, necə ki, bu qövlə şair özü şəhadət verib deyir: "Vəqta ki, məcalisdə bə'zi əbyatım məzkur və məhafildə bə'zi qəzəliyyatım məstur bolur irdi, gahi ibarətim qüsurin təğyir bermak birlə nöqsandin müərra qılur irdi. Bə'zi beytimdin bir az namünasib ləfzni çıxarıb bir dəstə şibh içrə bir dürri-şahvar tartqandik bir az ləfz gitürür irdi və bə'zi qəzəlimdin bir az nəhəncar beytğə xətt urub pozuq bir dəşt içrə bir qəsri-zərringar yasağandik bir az beytğə dəxl büruz irdi. Bu aşüftə əbyatımda ol xətt və bu pərişan qəzəliyyatımda ol beyt:

Xara arasında irdi gövhər yanlıq,
Ya küllər içində irdi əxkər yanlıq,
Yaxud tikən içrə güli-əhmər yanlıq,
Bəlkəm tə'n ara ruhi-müsəvvər yanlıq.

Çün bu beytlər eyvanı ola, islahlar nəqşü nigaridin rəşki-nigarxaneyi-Çin və bu qəzəllər bustanı ol ehtimamlar bəharidin qeyrəti-xüldi-bərin bola, başladı sahibnəzərlər göziga məhbubraq və əhli-dillər könliga mərğubraq bolub hörməti qayətdin ötdü və şöhrəti nəhayətdin keçdi"[130].

* Nəvainin tərcümeyi-halına dair mə'lumatın bir parasını "Dəbistan" jurnalının 3-cü nömrəsində təb'' olunmuş Əliağa Həsənzadənin fəqərəsindən[127] və bə'zisini divani-qəzəliyyatının dibaçəsində mərqum olunmuş müqəddimədən və ən mühümünü Sami bəyin "Qamusül-ələm"ından[128] götürmüşük.

Əlişir öhdəsinə götürdüyü ümuri-vəzarəti ləyaqətincə icra edib, asudə vaxtlarını gah mütaliə ilə və gah tə'limi-kitab və tənzimi-əş'ar ilə keçirirdi. Həmə vəqt dairəsi məcmə'i-üləma və füzəla idi. Ədib və şairlərə və cümlə ərbabi-elm və sən'ətə ən'am və ehsan qapısı açıq idi. Bu halla maarif və sənayenin tərəqqisinə çox xidmətlər etmişdir. Bu zati-alihimmət bir müddətdən sonra mənsəbi-vəzarətdən əl çəkib və məmuriyyəti-siyasiyyədən iste'fa edib, Heratda guşənişinlik ixtiyar etmişdir. Bu hal üzrə bir neçə vaxt ömür edib, tarixi-hicriyyənin 906-cı[131] ilində haman şəhərdə vəfat etmişdir.

Əlişir Nəvai yalqız şair olmayıb, danişmənd və həkimi-nadir bir vücud imiş. Ondan əvvəl cığatay türklərinin şivəsində kimsə o lətafət və mətanətdə əş'ar yazmadığı kimi, ondan sonra dəxi bu dildə elə lətif, abdar və xoşgüvar şe'r və qəzəllər yazılmamışdır. Filcümlə, asari-nəfisələri xeyli qiymətdardır.

Əlişirin xeyir yadigarlığı və ehsanatı dəxi çox olubdur; neçə-neçə mədrəsələr və əbniyeyi-xeyriyyə binasına müvəffəq olmuşdur. Böyük və mükəmməl bir kütübxanası var imiş ki, elm və mə'rifətə şövq və həvəsi olanlara həmişə onun qapısını açıq tutarmış. Əlişir Nəvainin türk dilində olan bərgüzidə əsərləri bunlardır: "Məcalisün-nəfayis", "Mühakimətül-lüğəteyn", "Heyrətül-əbrar", "Məhbubül-qülub", "Fərhad və Şirin", "Leyli və Məcnun", "Səddi-İskəndər", "səb'eyi-səyyarə", "Siracül-müslimin", "Lisanüt-teyr", "Halati-pəhlivani-Əbusəid", "Əruzi-türki", "Təvarix və qafiyə", "Müfrədat dər fənni-müəmma", "Münşəati-türki", "Qisseyi-Şeyx Sən'an", "Xəmsətül-mütəhəyyirin" və qeyri. Bundan əlavə "Nəzmül-cəvahir" adlı bir kitab fars dilində təhrir etmişdir.

Əlişirin təxəllüsü türkcə "Nəvai" və farsca "Fani" olubdur. Mərhumun əş'arından nümunə olaraq izzəti-nəfs və qənaətkarlıq barəsində yazdığı beytdir:

Həqdin əzizliq tilasin eldin üz təmə' –
Kim, xəlqnin əzizi demiş: "İzzə min qənəə"[132].

Yə'ni ey Nəvai, əgər həqqdən əzizlik təmənna edərsən, xalqdan təməini kəsgilən. Necə kim, xalqın əzizi fəxri-kainat həzrətləri hədisi-şərifində buyurubdur: "İzəə min qənəə, zillə min təməə" – yə'ni qənaətkar əziz və tamahkar zəlildir.

Nəvainin musiqi elmində artıq məharəti olub. O fənnə eşq və zövqü nə rütbədə olduğu bu beytindən anlaşılır:

Kamança tari-zülfün vəsfini min til ilə söylər,
Deyil qövlü zəif anın əgərçi qil ilə söylər.



Əlişir üç-dörd yüz il bundan əqdəm söylədiyi bu aşağıdakı beytin məzmunu əsrimizdə rəvac tapmış ədl və müsavat əfkari-hürriyyətkaranəsinə xeyli münasibdir:

Deyr içrə yox sifal* ilə altun qədəhdə fərq,
Şahü gədan bir oldu, əcəb karxanədir.

Bu aləmdə cahü cəlal puç və fani olub, ancaq yaxşılıq baqi qalacağından bəhs etdikdə deyir:

İrür çün aləm içrə cah fani, yaxşı ad baqi,
Sin el kamin rəva eylə özüni kamran görgəc.

Yə'ni sən kamran və sahibi-iqtidar olduğun halda "el kamın", fəqirlər ehtiyacın, üftadələr təmənnasın rəva elə və bu yoxsullara himayət qıl, çünki dünyada cümlə cah və cəlal fani olub, yaxşı ad baqi qalacaqdır.

Nəvai ondan fünuni-şe'rdə və xüsusən qəzəlguluqda şüəradan hansının artıq ustad və mahir olduğunu sual edənlərə bu əbyat ilə cavab vermişdi:

Qəzəldə üç kişi tövridir ol nö'v –
Ki, ondan yaxşı yox nəzm ehtimali.
Biri möcüzbəyanlıq "Sahiri-hind" –
Ki, eşq əhlini urtar suzi-hali.
Biri qüdsi əsərliq "Arifi-cam" –
Ki, cami-Cəm dürər sınğan sifali.
Biri İsa nəfəsliq "Rindi-Şiraz",
Fəna dəhriğə məstü laübali.
Nəvai nəzmğə baxsan yəmasdır,
Bu üçnün haldin bir beyti xali.
Sanasin güzgüdür ki, əks salmış
Ona üç şuxü məhvəşnin cəmali.

Yə'ni qəzəldə üç kişi elə mahirdirlər ki, onlardan yaxşı daha nəzm – şe'r yazmaq ehtimal etmək olmaz. Onlardan biri "Sahiri-hindi", yə'ni Nasir Xosrov Dəhləvidir[133], o birisi "Arifi-cam", yə'ni Molla Əbdürrəhman Camidir[134] və üçüncüsü "Rindi-Şiraz", yə'ni Xacə-Hafiz Şirazidir. Amma Nəvainin öz nəzminə baxsaq, bu üç şairin halından Nəvainin bir beyti xali deyildir. Belə ki, Nəvainin beytləri sanki bir güzgüdür və ona bu üç şux məhvəşin camalının əksi düşmüşdür. Burada Nəvai demək istəyir

* Sifal – saxsı

ki, onun əş'arına diqqət olunsa, üç şairi-züliqtidarın ruhlarını onun kəlamının içində görmək olur.

Nəvai özgə bir məhəldə bu möhtərəm kəlam ustadlarının ismi-şəriflərini lisani-bəlağətşüarı ilə belə yad edir: "Əmma əş'ar tədvin qılğanlardin bə'zi kim, bəqa mülkidə fanidurlar və bə'zi kim, hala fəna deyridə baqidurlar, əvvəlqi zümrədin bavücud dərd pişəsinin qəzənfəri və eşq atəşgahının səməndəri, mə'dəni-cavahiri-mə'nəvi Əmir Xosrov Dəhləvi və fəna meyxanəsinin rindi-xirqəçaki və bəla peymanəsinin məsti-bibaki və eşq və məhəbbət əsrarı əminlərinin həmrazi Xacə Hafizi-Şirazi və sonku firqə din şəbistanının şəm'i-ənvəri və üns gülüstanının əndəlibisüxənvəri və bəlağət şəkkəristanının tutiyi-şirinkəlami cənabi-məxdumi Mövlana Əbdürrəhman Cami məddəllah təala zülali-irşadə ila müfariqültalibin divanları aradə bolğay..."[135]

Nəvainin bu təhriratından mə'lum olur ki, Mövlana Əbdürrəhman Cami əleyhirrəhmə onun müasiri olubdur.

"Qamusül-ə'lam" sahibi Sami bəyin yazmağına görə, mərhum Əlişir Nəvainin əsərlərindən "Mühakimətül-lüğəteyn" fars ilə türk lisanı arasında ədibanə və adilanə bir mühakimədən ibarət əsərdir ki, bunda türk lisanının fars lisanından daha da zəngin və daha da mükəmməl olduğu isbat olunur. Belə olan surətdə, əlbəttə, mərhumun bu əsəri biz türklər üçün ən lazımlı və qiymətli bir kitabdır. Amma heyfa ki, nüsxəsi nadir olduğundan çətinlik ilə ələ gəlir. Əlişir Nəvainin, necə ki, yuxarıda zikr olundu, bizim Azərbaycan şüəralarına artıq dərəcədə tə'siri olubdur və hətta onlardan bə'zi Nəvainin əş'ar və kəlamına və lisani-möcüzbəyanına o qədər meyl və rəğbət göstəriblər ki, özləri də cığatay türklərinin lisanında şe'r və qəzəl deməyə və Nəvaiyə nəzirə yazmağa mö'tad olublar. Onlardan məşhuru Qarabağda Abdulla bəy Asi, Həsən Qara Hadi və Mirzə Əliəsğər Novrəs, Şamaxıda mərhum Hacı Seyid Əzim, Qazaxda Kazım ağa Salik, Dərbənddə Mirzə Cəbrayıl Süpehri[136] və qeyriləridir. Mərhum Abdulla bəy Asinin cığatay dilində elə dilpəzir qəzəlləri vardır ki, Nəvainin öz kəlamına bənzəyir; ancaq bu dilin ərbabı onlara tərhic verə bilir. Onun cığatay lisanında Şirvan şüərasına yazdığı tərcibənd ki, öz məqamında dərc olunacaqdır, hər bir əhli-zövq və mə'rifəti valeh edə bilir.

Nəvainin türk lisanında mütəəddid asari-lətifləri ilə dürüst bələd olanlar yəqin edərlər ki, türk dili o qədər fəqir və rəkik deyil, necə ki, bizim nəzərimizə gəlir. Dilimizin kökünü və əslini bu mənbədən axtarıb tapmaq və iste'maldan düşən əlfaz və ibarələrə dübarə dirilik və rövnəq vermək möhtərəm ədiblərimizin baş vəzifələrindən birisidir. Əl'an bu yolda İstanbulda nəşr olunan "Türk yurdu"nun mühərrirləri, xüsusən



Məhəmməd Emin bəy artıq şövq və həvəslə işləməkdədirlər. Nümunə üçün burada Nəvainin bu qəzəlini yazmağa iktifa edirik:

Könüllər naləsi zülfün kəməndin nagəhan görgac
İrür andaq ki, quşlar qıçqırışğaylar yılan görgac.

Könül çakin gözümdə əşki-rəngin elgə faş etti,
Balıq zəxmini fəhm eylərlər el dəryadə qan görgac...

Boyalğan qan ara can pərdəsi yetgac qəmi-hicrin
Könül bağida bərgidür ki, al olmuş xəzan görgac...

İrür çün aləm içrə cah fani, yaxşı ad baqi,
Bəs, el kamın rəva eylə özünü kamran görgac...

Nəvai, xürdə nəzminni andaq eylədin təhrir
Ki, sacğay xürdə başın üzrə şahi-xürdədan görgac.

Burada Azərbaycan şüərasının pişvaları və ustadları məqamında olan Füzuli Bağdadidən, Yusif Nabi və Əlişir Nəvaidən mümkün olduğu qədərdə mə'lumat verdikdən sonra özümüzə borc hesab edirik ki, milli şairlərimizə şüru' etməzdən müqəddəm vətəni-mə'lufumuzun sabiqdə mühüm məkəzləri sayılan Gəncə, Şirvan, Şamaxı vilayətlərinin tarixinə məxsus və o yerlərdə vücuda gəlib nəşvü nüma tapan ə'azimi-şüəradan ustadi-şüəra Əbülülanın, Şeyx Nizaminin, həkim Xaqaninin və qeyrilərin ismi-şərəflərini zikr edib, hər birinin tərcümeyi-hallarına və əsərlərinə dair icmalən mə'lumat verək.

# GƏNCƏ

Gəncə şəhəri çox qədim və böyük şəhərlərdən birisi olduğuna onun ətrafındakı əsari-ətiqə şəhadət verir. Bu asar isə köhnə qəbristanlıqlardan, əski tə'miratın uçuq bünövrələrindən, əski qala və hasarların dağılmış divarlarından və bu növ sair əlamətlərdən ibarətdir. Necə ki, təvarixdə görünür, Gəncənin başında çox böyük hadisələr vüqua gəlmişdir, onun üstündə çox qanlar tökülüb, canlar fədaya getmişdir və müruri-əyyam ilə başıbəlalı Gəncənin yaxası əldən-ələ keçib, müxtəlif miləl və əqvamın yədi-təsərrüfünə düşmüşdür.

Yeddinci əsrin əvaxirində Gəncə İran dövlətinin ixtiyarından ərəblərə keçib və ərəblərin bu yerlərdə xəzərlər ilə bir çox böyük dava və qırğınları vüqua gəlmişdir. Tarixi-miladın 1138-ci sinəsində vüqui-zəlzələdən şəhər bilmərrə dağılıb, sabiqi yerindən qeyri bir məhəllə nəql olunmuşdur[137]. On dördüncü əsrin axırlarında Teymurləngin hücumundan yeni bina tutmuş şəhər dübarə viran və əhalisi pərişan olmuşdur. Tarixi-məsihiyyənin on altıncı əsrində Gəncə yenə İran dövlətinə tabe olur və on yeddinci əsrin ibtidasında Şah Abbas Səfəvi[138] şəhəri indiki məhəllinə köçürüb, möhkəm və xoşsəliqə binalar yapmaqla onu xeyli abad edir və İranzəmindən Azərbaycan türklərindən çoxlu evlər köçürdüb Gəncəyə gətirdir. Bu türklərin sə'y və ehtimamı və tə'mirat işlərində onlara məxsus olan məharət və qabiliyyətləri sayəsində şəhər az bir vaxtın içində zayidə, mə'mur və abad olunur. Şəhərin ortasında Şah Abbas ali və müzəyyən bir cameyi-şərif yapdırıb, müdərris və tələbələr üçün onun ətrafında hücrələr tikdirir. Bu məscidin əmsalı indi də nadir tapılır. Camenin özünün və onda təhsil edən tələbələrin idarə və məxarici üçün böyük və vəsi' bir karvansara tikilib vəqf olunmuşdur.

Cameyi-şərifin tə'miri miladın 1620-ci sənəsində vaqe olmuşdur*. On səkkizinci əsrin əvvəllərində Gəncə otuz ilədək Osmanlı dövlətinin təhti-idarəsinə keçib, sonra miladın 1735-ci ilində Nadir şah[139] ilə osmanlıların beynində Gəncə üstündə böyük toqquşma və vuruşmalar vüqua gəlib. Axirüləmr, Nadir şah osmanlılara qalib gəlir və Osmanlı əsgərlərini şəhərdən çıxmağa məcbur qılır. Bundan sonra on doqquzuncu əsrin ibtidasına kimi Gəncə gah İran dövlətinin təbəiyyətində, gah Gürcüstan padşahlarının təhti-hökumətində və gah müstəqillən öz xanlarının idarəsi altında olmuşdur.

---

* Eyni bir tarixdə Şah Abbas ermənilər üçün də möhkəm bir kilsə şəhərin yuxarı səmtində tə'mir etdirmişdir ki, indi də durur.



Rus dövlətinin əvvəlinci dəfə Gəncəyə sahiblik etməyi miladın 1796-cı sənəsində olubdur. Amma bu sahibliyin müddəti çox çəkməyibdir. 1804-cü ildə knyaz Sisianov[140] Gəncənin üstünə əskər sürüb, onu müddəti-mütəmadi mühasirə eləyir. Gəncə xanı Cavad xan şəhərin müdafiə və mühafizəsi üçün ixtiyarında olan qoşuna özü sərkərdəlik etmişsə də, axırda məqtul olur.

Cavad xan məqtul olandan sonra onun adamları rus qoşununun zor və hücumuna tab gətirə bilməyib pərakəndə olublar və Gəncə yenə müvəqqəti rusların yədi-təsərrüflərinə keçir. Amma sonradan miladın 1813 tarixində "Gülüstan" sülhnaməsinin hökmünə görə, Gəncə xanlığı bilkülliyə istiqlaliyyətini itirib rus dövlətinə tabe olur. Əvvəlcə uyezdni şəhər qərardadında, sonradan 1862-ci sənədə dəyişirilib qubernski şəhər halına düşür. 1862-cı ilin iyul ayında Fətəli şahın[141] oğlu nayibüssəltənə Abbas Mirzə Allahyar xan ilə bərabər güclü qoşun götürüb, Gəncənin üstünə hücumavər olub, rusları şəhərdən çıxmağa məcbur qılır. Və lakin haman il sentyabrın 4-də general Mədədovun və Paskeviçin sərkərdəliyi ilə İran qoşunu ilə rus qoşununun arasında Gəncənin yeddi verstliyində böyük bir müharibə vüqua gəlib, İran tərəfi məğlub və münhəzim olur.

Knyaz Sisianov Gəncəni fəth edəndən sonra ona imperatoriçə Yelizavetta Alekseyevnanın adını vermişdir, ona binəan Gəncə Yelizovetpol adlanır.

Gəncənin məhəlli-mövqeyi gen və açıqdır; içindən Gəncə çayı axır. Bə'zi rəvayətə görə, şəhər bina olduqdan sonra məzkur çayın adı ilə təsmiyə olunmuşdur. Gəncənin torpağı məhsuldar və münbit olur, hər qisim meyvəcat yetirir. Şəhərin dörd ətrafı bağ və bostandır; artıq meyvəli və mədaxilli bir yer hesab olunur. Vəli abü havası çəndan səlamət deyil. Yay fəslində şiddətli isti olmağa görə, qızdırma (isitmə) və qisim-qisim naxoşluqlar əmələ gəlir. Şəhərin nücəba qismi və varlıları yay mövsümündə Hacıkənd adlı yaylağa – ki, Gəncənin yaxınlığındadır, – köçüb, orada istirahət edirlər. Fəqir-füqəra şəhərdə qalıb növbənöv mərəzlərə mübtəla olurlar. 1905-ci sənədə Gəncə şəhəri dəxi erməni tayfası ilə müsəlmanların arasında vüqua gələn fəsad və toqquşmadan salamat qalmadı. Onun mərkəzində olan müsəlman tikililəri və Şah Abbas karvansarası yanıb tələf oldu. Amma indi onların yerində daha gözəl evlər, mağazalar, mehmanxana və karvansaralar tə'mir olunubdur, düz və enli küçələr salınıbdır.

Gəncə əhlinin əksəri müsəlmandır. Bu axır vaxtlardan bəri ülum və maarif kəsbinə rəğbət göstərməkdədirlər və demək olur ki, tərəqqi yoluna düşüblər.

# ƏBÜLÜLA GƏNCƏVİ

Şüərayi-mütəqəddimin Əbülülanı "Ustadi-şüəra" ləqəbi ilə yad etmişlər; o cəhətə ki, həkim Xaqani və Fələki[142] onun şagirdləri olub, fünuni-şe'r və bəlağətdə ondan tə'lim almışlar. "Atəşkədeyi-Azəri"də Əbülülanın Gəncə əhli olmağı zikr olunubdur[143]. Hicrətin altıncı əsrinin axırlarında şirvanşahların əyyami-səltənətində "Məliküş-şüəra" adlanırmış. Şirvan şahı və onun fərzəndi Cəlaləddin Mənuçehr Əbülülaya lütf və inayət edib, xatirini əziz tutarlarmış və bunlar hər ikisi fəzl və kəmal əhlinə, xüsusən, şüəra və üdəba sinfinə artıq dərəcədə iltifat və ehtiram göstərməkləri səbəbinə onların seytü sədası hər yerə yayılmışdı və adları xeyir ilə zikr olunurdu. Necə ki, bu barədə Əbülülanın, Şeyx Nizaminin, Xaqaninin və Fələkinin divan və əş'arında məzkur padşahların maarifpərvər olmaqları tə'rif və tövsif olunmuşdur.

Belə rəvayət olunur ki, şahi-Şirvan və onun oğlu Cəlaləddin Mənuçehr Bəhram Çubinin nəslindəndirlər ki, Ərdəşir Babəkanın övladından məhsubdurlar. Əbülüla Xaqaniyə tə'lim və tərbiyə verəndən sonra öz qızını ona nikah ilə verdi. Vəli ustadının qızına Fələki dəxi müştəri imiş və bu işdən mə'yus və mükəddər oldu. Onun xatirini də ələ gətirmək üçün Əbülüla min dirhəm qızıl ona bəzl elədi. Ustadi-şüəra hicrətin 560-cı[144] sənələrində sağ imiş. Altıncı əsrin[145] axırlarında Gəncədə vəfat etmişdir.

Rəvayət olunur, vəqta ki, Xaqani şahın hüzurunda hörmət və şöhrət kəsb edib sahibi-nüfuz oldu, öz ustadı və qaynatası Əbülülaya başladı kibr və qürur izhar etməyə və hətta onun şə'ninə layiq olmayan həcvlər inşa elədi. Haqqı batil edən şagirdin belə rəftarından ustadı mükəddər oldu və bir neçə qit'ə həcvlər o da Xaqaninin haqqında yazdı:

Xaqaniya, əgərçe soxən nik daniya,
Yek nokte quyəmət beşno rayqaniya:
Həcve-kəsi məkon ke, ze to məh bovəd besenn,
Şayəd ke, u pedər bevədo to nədaniya[146].

**HECA**

Mən an dəm ke, əz madər dəhr zadəm,
Befəzlo hönər dər cahən ostadəm.

Məra şəst saləst kəz xake-İran[147],
Bovəd şanədəh ta be Şirvan fetadəm.

Ço pire-zə'ifəm sənaquye xosrov,
Nəquyəm ke, Keyxosrovo Keyqobadəm.



To ey Əfzələddin, əgər rasta porsi,
Becane-əzizət ke əz to naşadəm.

To xod qorrətol-eyno fərzənde-mai,
Mənət həm pedər xande həm ostadəm.

Ço rəğbət nəmudi beşagerdiye-mən,
Beto tohfe əz vəslevo sim dadəm.

Kəmərəra betə'lime-şəfqət bebəstəm,
Zəbane-to bər şaeri bərqoşadəm.

Ço şaer şodi bər dəmət pişe-xaqan,
Be Xaqaniyət həm ləqəb bərnəhadəm...

To hər dəm bemən mən çe cuşi ço atəş,
Nə to abo atəş nə mən xako badəm[148].

Əgərçi Hacı Lütfəli bəy ibn Xaqan Azəri "Atəşkədə"sində Əbülülaya "Gəncəvi" deyib, onu Gəncə əhalisindən hesab eləyir, vəli şairin öz kəlamından anlaşılan budur ki, onun əsli iranlıdır. On altı il olur ki, Şirvanzəminə varid olub, burada sükunət ixtiyar edib, namü şöhrət kəsb etmişdir. Mə'lum olsun ki, o vaxtları Zaqafqaziyanın tərəfi-şərqisində olan vilayətlərin əksəri Şirvan şahlarına tabe olmağa görə, şair Gəncəni dəxi Şirvan ismi ilə zikr edibdir. Əbülülanın əslən iranlı olmağına bu şe'ri dəlalət edir:

Məra şəst saləst kəz xake-İran,
Bovəd şanzdəh ta be Şirvan fetadəm.

# ŞEYX ƏBUMƏHƏMMƏD İLYAS İBN YUSİF İBN MÜƏYYƏD NİZAMİ

Şeyx Nizami böyük şairlərdən birisi olub. Onun kimi fəsih, rəvantəb' və şirinzəban şair dünya üzünə az gəlibdir. Heç bir şair o lətafət və zəriflikdə söz deməyibdir. Onun cümləyə məşhur olan "Xəmsə"si ki, ona "Pənc gənc" dəxi deyilir, bimisil və binəzir əsərlərdir ki, həqiqətdə xəzinə malıdır. Bə'zi rəvayətə görə, Nizami Qum şəhərində təvəllüd edib, nəşvü nüma tapdıqdan sonra Gəncəyə gəlibdir və burada ömrünün axırına kimi qalıbdır. Amma səhihi budur ki, onun ata-babası Qumdan Gəncəyə gələn zaman Nizami hənuz dünya səraçəsinə ayaq basmamışdı və ol gövhəri-pakın təvəllüdü Gəncədə hicrətin 520-ci[149] sənəsində vaqe olmuşdur.

"Atəşkədeyi-Azəri"də və Şəmsəddin Sami bəyin "Qamusüləlam"ında Şeyx Nizaminin şəhri-Gəncədə anadan olması sərahətən yazılmışdır[150]. Ədibi-şəhir Müsyö Şe'rr "Tarixi-ədəbiyyati-ümumi" əsərində Şeyx Nizaminin Gəncədə təvəllüd etməsini təsdiq edir[151]. Bu cəhətə şair "Nizami Gəncəvi" deyilməklə mə'rufdur. Belə olan surətdə çox ehtimal var ki, Nizaminin anası gəncəli qızı olmuş ola. Necə ki, bu halda İran təbəəsindən çoxları Qafqaziyaya gəlib, burada evlənib, əhl-əyal sahibi olub kök salırlar, həmçinin sabiqdə dəxi İran dövlətinin hər bir yerlərindən Qafqaz torpağına mühacirət edənlər çox olurmuş və burada İran mədəniyyətini, İran adabü ayinini intişar edirlərmiş. Ol vaxtdan bəridir ki, fars dili və fars ədəbiyyatı bizim vətənimizdə şöhrət və özü üçün böyük hörmət və əhəmiyyət kəsb edibdir. Vəli Şeyx Nizami Qafqaz qit'əsində vücuda gəlibsə də, əslən iranlı olmağını inkar və nisyan etməyib "İqbalnamə"sində buyurmuşdur:

Nezami ze gəncine boqşay bənd,
Gereftariye-Gənce ta çənd, çənd.
Ço dor gərçe dər bəhre-Gənce qoməm,
Vəli əz qohestane-şəhre-Qoməm[152].

Nizaminin vəsfində bir şey yazmaqda bizim qələmimiz acizdir. Həkim Xaqani onun mədhində demişdir:

Xakəş be Məsih tutiyabəxş,
Səngəş be Kəlim kimyabəxş,
Mərzəş ze kəyestane-qolestan,
Şəkkərzaro qərənfelestan[153].

Nizami dünyadan əl çəkib əhli-qənaət və saleh bir zat olduğu üçün ömrünü ibadət və riyazətdə keçirərmiş. Hətta zəmanəsinin müluk və səlatini ona hörmət və riayət etdikləri halda sair şüəra kimi kimsəni mədh və tə'rif etməmişdir və tamahkar və əhli-dünya mülazimi olmaqdan nəfsini saxlayıb, ömrünün axırına kimi məddahlıq ismini şə'ninə layiq və rəva görməmişdir və padşahlar dərbarında şöhrət və izzət tələbkarı olmamışdır. Bəlkə onun öz astanası böyüklər və xosrovlar məlcə' və mə'vası olub. Müasirləri onun söhbətindən feyzyab olmağa talib olmuşlar. Belə ki, Atabəy Qızıl Arslanın[154] imtahan qəsdi ilə Şeyx Nizami olduğu zaviyəyə gedib, onu qəribə bir halda görməyi "Atəşkədeyi-Azəri"də rəvayət olunubdur[155]. Şeyx aləmi-batində Qızıl Arslanın qəsd və niyyətini anlayır və sultanın nəzərində onun şərafət və böyüklük ulduzu cilvələnir. Atabəy baxıb görür ki, bir piri-zəif bir parça keçənin üstündə əyləşib. Ətrafında başqa bir şey yoxdur, bəqeyr əz-qələm, dəvat və əsayi-piri. Əlində Qur'an və şeyx onun mütaliəsinə məşğul. Atabəy şeyxin bu halına diqqət yetirdikdə onun haqqında e'tiqadi-kamil hasil edib, şeyxin müqəddəs bir vücud olmağını təsdiq eləyir. Və həmçinin rəvayət olunur ki, İran padşahlarından birisi Azərbaycan vilayətini təsxir etdikdə şeyxə riayət göstərib, Gəncə şəhərinin təxminən 24 verstliyində – cənubi-şərqi səmtində vaqe bir kənd bağışlamışdı. Sabiqdə haman qəryə Həmdünyan adlanırmış. İndi İlə adı ilə məşhurdur. Şeyx özü bu barədə demişdir:

Nəzər bərkişo bərexlase-mən kərd,
Dəhe-Həmdunyanra xase-mən kərd[156].

Nizami əleyhirrəhmə Gəncə şəhərində hicrətin 591-ci[157] ilində və bir qövlə görə 606-cı[158] tarixində vəfat etmişdir. Qəbri şəhərin təxminən 4 verstliyində, şimali-şərqi səmtindədir. Məqbərəsi ziyarətgahdır. Mövləvilər artıq şövq ilə onun qəbrini ziyarət edirlər. Nizaminin məqbərəsi vaqe olan səhra "Şeyx düzü" adı ilə Gəncə xalqının arasında məşhurdur. Onun qəbrinin üzərində olan əski günbədi, səhih rəvayətə görə, rus ədiblərindən məşhur Qriboyedov[159] təsis etdirmişdir. İndi, necə ki, möhtərəm Mirzə Məhəmməd Axundovun[160] "Şeyx Nizami" ünvanında mərhum şeyxin tərcümeyi-halına dair yazdığı kitabçadan görünür, Nizaminin qəbri və üstünün günbədi uçub-dağılıbdır və kəndçilər qışda soyuqdan və yay fəslində istidən daldalanmaq üçün içinə at və eşşək bağlayırlar. Budur bizim fazil və həkim bir şairimizin türbəsinə olan hörmət!..

Mirzə Məhəmməd Axundov münasibi-hal bu şe'rləri inşad etmişdir:

Yol kənarında bir məzari-həqir,
Dağılıb günbədi, olub viran.
Ona məxluqdən olur təhqir,
Bağlanır günbədinə hər heyvan.

Mənzəri adəmə edir tə'sir,
Axıdır qəlbə hər dəqiqədə qan,
Kimsə etməz sual: "Kimdir bu?"
Ona quşlar olubdu fatihəgu.

* * *

Bu xarəbə məzardə aya
Görəsən kimdi böylə xar yatır?
Kimsə etməz bunu sual əsla,
Sizə mən eyləyim onu təqrir.
Edəsiz ol məzarı siz əmma –
Layiqincə, əzizlər, tə'mir.
O yatan Gəncəli Nizamidir,
Şüəra qisminin üzamidir[161].

Şeyxin "Xəmsə"si bu mənzumələrdən mürəkkəbdir: "Məxzənül-əsrar", "Leyli və Məcnun", "Xosrov və Şirin", "Həft peykər", yaxud "Bəhramnamə" və "İsgəndərnamə". Bu kitabların hər birisinin xüsusunda və onların tarixi və səbəbi-tə'lifi barəsində Mirzə Məhəmməd Axundovun kitabçasında qədri-kifafınca mə'lumat verilmişdir. Bunlardan başqa Şeyx Nizaminin iyirmi min beytə qədər qəsaid və qəzəliyyat və rübaiyyatı və sair əş'arı olduğu rəvayət olunursa da, əksəri bu halda itib-batıbdır. "Xəmseyi-Nizami" İranda və Hindistanda dəfəat ilə təb' olunubdur. Və hətta Müsyö Şarmua[162] tərəfindən Fransa dilinə tərcümə edilib və 1845-ci sənədə Petroqrad şəhərində təb' və nəşr olunubdur.

Nizaminin əsərlərindən türk dilinə tərcümə olunan ancaq "Xosrov və Şirin" hekayəsidir. Bunun mütərcimi Qazax şairi mərhum Mustafa ağa Qiyasbəyov "Nasir" təxəllüs olubdur. Vəli çox əfsus ki, şair bu hekayəni itmama yetirməmiş vəfat edibdir. Haman "Xosrov və Şirin" hekayəsi bu axır vaxtlarda Mirzə Cəlal Yusifzadə[163] cənablarının sə'y və himməti ilə opera şəklinə çöndərilibdir.

Atalar sözündən sayılan: "Kəs nəquyəd ke, douğe-mən torşəst" – məsəli müşarileyhə mənsubdur. Söz yoxdur ki, bu məsəli sonradan Azərbaycan türkləri şeyxdən əxz və tərcümə ediblər, çünki türk dilində "Heç kəs ayranına turş deməz" məsəli indi də işlənir.

Fars lisanına dara rəvantəb' şairlərimizin baş vəzifələrindən birisi də Şeyx Nizami əleyhirrəhmənin əsərlərindən bə'zilərini türkə açıq dildə tərcümə edib, milli ədəbiyyatımızı dövlətləndirməkdir. İnsaf deyil ki, onun mö'cüznüma kəlamları Avropa dillərinə tərcümə olunub intişar tapsın, bizlər isə onu öz dilimizdə mütaliə edib feyzyab olmaqdan məhrum qalaq.

Şeyx Nizaminin əsərlərindən nümunə olaraq bir qəsidə və bir qit'əsini "Atəşkədeyi-Azəri"dən götürüb, onlar ilə kitabımıza zinət veririk:



## QƏSİDEYİ-NİZAMİ

Mələkol-moluke-fəzləm befəziləte-məani,
Zəmiyo zəman gerefte bemesale-asemani.

Nəfəse-boləndsoutəm cərəse-boləndseyti,
Qələme-cəhannəvərdəm ələme-cəhansetani.

Səre-hemmətəm reside bekolahe-Keyqobadi,
Pəre-heşmətəm qozəşte ze pərənde-Qurxani.

Soxən əz mən afəride, ço fotovvət əz morovvət,
Honər əz mən aşekara ço təravət əz cəvani.

Qəzələm besəm'ha dor ço səma'e-ərğənuni
Nəməkəm bezouğha dor ço şərabe-ərğəvani.

Hərəkate-əxtəranra mənəm əslo u tefili,
Təbəqate-asemanra mənəm abo u əvani.

Nəzənəm bexire təbli, ço zənəm bovəd ərusi,
Nəkonəm bexotbe ləhti, ço konəm bovəd əğani.

Məhəmo ço məh nəgirəm kələfe-siyahruyi,
Dorəmo ço dor nədarəm bərə'se-sepidrani.

Beeşarəte-ləbe-mən dele-xəlq baz bəndəd,
Ço şekufeye-rəyahin behəvaye-mehrəqani.

Əgər in neşatgəhra nəğəmate-mən nə başəd,
Ke zənəd dəre-moğənni, ke xorəd meye-moğani?

Ço sədəf həlalxarəm, ço qohər həlalzade,
Ze həramzade durəm şəbo ruz dər rəmani.

Vələdozzenast hased, mənəm an ke koukəbe-mən
Vələdozzenakoş aməd ço setareye-yəmani.

Səre-an cəride bər nə dəre-in qəside boqşa –
Ke, bərənd boq'e-boq'e fozəla be ərməğani.

Şəbehi nə dər xəzine çe konəm qohərfeşani,
Qohəri nə dər xərite çe konəm sədəfdəhani.

Delo din şekəstə an gəh həvəsəm bərəzmcui,
Səro pa berəhne an gəh soxənəm bemərzbani.

Mələkavo badşaha rəveşi kəramətəm kon –
Ke bedan rəveş begərdəm ze bədivo bədqomani.

Hərəme-to aməd in del ze həsəd neqahdarəş –
Ke, fereşte ba şəyatin nəkonəd həmaşiyani.

Ədəbəm məkon ke, xerdəm, xələləm məbin ke, xakəm
Bebər əz nəhade-təb'əm dodeliyo dəhzəbani.

Ze qonah oz boqzər, benəvazo rəhməti kon,
Bexəcaləti ke bini bezərurəti ke, dani.

Həme momkenol-vocudi rəqəme-həlak darəd,
To ke, vacebol-vocudi əzəlo əbəd bemani.

Betəfile-taəte-to tə'ne-xiş zende darəm,
Ço nabəşəd in səadət çe məno çe zendeqani.

Əgər əz Nezami aməd qonahəş əfvgərdan –
Ke, kəs eyməni nədarəd ze qəzaye-asemani.

To resandei ze əvvəl besəadəte-vücudəş,
Ço nəfəs beaxər ayəd, beşəhadətəş resani[164].

## QİT'Ə[165]

Duş rəftəm bexərabat, məra rah nəbud,
Mizədəm nə'revo fəryad, kəs əz mən nəşnud.

Ya nəbud hiçkəs əz badeforuşan bidar,
Ya ke, mən hiçkəsəm, hiçkəsəm dər nəqoşud.

Nimi əz şəb ço beşod, biştərək ya kəmtər,
Rendi əz ğorfe bər avərd səro rox benəmud.

Qoftəməş: dər boqoşa Qoft: boro, hərze məqu –
Ke, bəraye-to dər in vəqt kəs in dər nəqoşud.

İn nə məsced ke, behər ləhze dərəş boqşayənd –
Ke, to dir aiyo əndər səfe-piş osti zud.

Hər çe dər comleye-afaq dər inca hazer,
Henduyo hormeziyo moumeno tərsavo yəhud.

Gər to xahi ke, konəd pire-moğanət nəzəri
Xake-paye-həme şo ta ke beyabi məqsud.

**Mustafa ağa Nasirin "Xosrov və Şirin"dən tərcümə etdiyi hissələr öz məqamında zikr olunacaqdır[166].**



# ŞİRVAN VƏ ŞAMAXI

Şamaxı şəhəri Qafqaz xittəsində ən qədim şəhərlərdən birisi hesab olunub. Məşhur qövlə görə, Şamaxı sasanilərdən Ənuşirəvani-adilin əyyami-səltənətində bina olunmuşdur ki, əsri-nəbəviyə təsadüf eləyir. Səhih rəvayətə görə, Şamaxı keçmişdə Şirvan şahlarının paytaxt şəhəri sayılırmış. Şirvan şahlığı isə vəsi' və müstəqil bir məmləkət olub, iyirmi yeddi nəsil dalbadal onda hökmranlıq etmişlər imiş. Bu məmləkətə daxil olan vilayətlərdən məşhuru bunlar imiş: Dərbənd, Quba, Badkubə, Şirvan, Astara, Səlyan tamami-Cavad uyezdi, Mil düzü ilə Gəncə və İrəvan quberniyalarının cənub və qərb səmtləri ta İran sərhəddinə kimi.

Şirvan şahlarının zəmani-hökuməti, qövli-məşhura görə, tarixihicriyyənin beşinci və altıncı əsrlərində olubdur. Sonralardan mürури-əyyam ilə bu dövlət inqiraz olub, Şirvan mahalı dəxi Qafqaz xittəsinin sair mərkəzləri kimi gah ərəblərin və gah türklərin və gah farsların təsəllütünə keçir və axırda mərhum Mustafa xanın əsrində – tarixi-miladın 1804-cü sənəsində imperator Əvvəlinci Aleksandrın zəmanı – hökumətində rus dövlətinin təhti-idarəsinə daxil olur.

Şah Abbas Səfəvinin vaxtında Qafqazın çox yerləri Osmanlı dövlətinin təhti-hökumətində imiş. O cümlədən Şamaxı da Osmanlıya tabe olub, onda Əhməd paşa valilik edərmiş. Şah Abbas Qafqazın çox ölkələrini asanlıq ilə təsxir etmiş isə də, Şamaxının üstündə xeyli zəhmətlər və əziyyətlər çəkmişdir. Mərhum Mirzə Həsən əfəndi Əlqədari əd-Dağıstani[167] "Asari-Dağıstan" adlı mötə'bər əsərində yazdığına görə, Şah Abbas Şamaxı qalasının üstündə altı aya kimi əlləşibdir və axırda naəlac qalıb, Gəncədən oraya böyük toplar gətirdib, lazimeyi-tədbir və ehtimamlar edib, ol qalanın bə'zi bürclərini və hasarlarını təxrib etdikdə, məhsurlar çarəsiz qalıb ondan aman tələb ediblər və şah onları əmin edəndən sonra qalanı ona təslim ediblər və onların cümləsindən Əhməd paşanı Şah Abbas mülatifət ilə xatircəm edibdir. Ol səbəbdən ki, Əhməd paşa aqil və süxəndan və karamuz bir şəxs imiş. Və lakin Şəmsəddin paşanı və qeyrilərini ihanətlə qətlə yetiribdir[168]. Və necə ki, Abbasqulu ağanın "Gülüstani-İrəm" adlı kitabında məsturdur, Şah Abbas Şamaxını fəth etdikdən sonra onda böyük bir məscid tə'mir etdiribdir və həmçinin Şirvanın bə'zi yerlərində məscidlər, mədrəsələr, kəhrizlər və karvansaralar tikdirib ol vilayəti dəxi sair təsxir qıldığı ölkələr kimi mə'mur və abad etmişdir.[169]

Şah Abbasdan sonra Şirvan yenə bir vaxt Osmanlı dövlətinin ixtiyarına keçir və Nadir şahın əsrində Osmanlı tərəfindən tə'yin olunmuş qazıqumuqlu çolaq Surxay xan orada xanlıq edirmiş. Nadir şah Şamaxının üstünə

qoşunla gələn zamanı Sultan Mahmud xan Surxay xana fərman göndərib ki, oradan çıxsın və məmləkəti İran şahına təhvil eləsin, çünki onların mabeynində bu barədə müsaləhə olunubmuş. Məəhaza, Surxay xan həman fərmanı gətirən Astara hakimi talış Musa xanın xadimini qətl edib cavab veribdir ki, mən Şirvanı ləzgi islamlarının qılınclarının zərbi ilə təsərrüf eləmişəm, nəinki Osmaniyyə dövlətinin təvəccöhü ilə. Bu cavab Nadirin qulağına yetişdikdə onun atəşi-qəzəbi cuşa gəlib, məhz Surxay xanı tənbeh etməkdən ötrü Şirvana tərəf hərəkət eləyibdir. Və lakin Surxay xan Nadirin hücumunu eşidib, oradan qaçıb Qəbələ tərəfə. Ləzgilərdən və Şəki əhlindən və oralarda qalan osmanlılardan özünə qoşun cəm etməyə məşğul olubdur. Nadir şah miladın 1734-cü sənəsində avqust ayının 17-ci günündə davasız və şavasız Şamaxı şəhərinə daxil olub, burada lazım olan tədbiratı edib və hakimlər nəsb qılıb, oğlu Təhmasibqulu xanı Surxay xanın üstünə Qəbələ canibinə göndəribdir və özü də on iki min qoşun ilə Quba səmtinə azim olubdur.

Knyaz Sisianov (ki, "inspektor" və türklər arasında "işpextor" ləqəbi ilə məşhurdur,) ondoqquzuncu əsrin ibtidalarında, yə'ni 1802-1806-cı illərdə rus dövləti tərəfindən Gürcüstanı idarə edən zaman Şamaxının hakimi Mustafa xan imiş. Bu xanın vəqqi-hökumətində Şirvan mahalı, – necə ki, yuxarıda zikr olundu, – rus dövlətinə mülhəq olunubdur. Mustafa xan ədalətli və mürüvvətli və işbilən bir hakim imiş ki, əhaliyi-Şirvan onun sayeyi-himayətində asudə və mürəffəhhal dolanırmış və cümlə rəayası onu canü dildən istərmiş.

Rus dövləti tərəfindən Sisianovdan qabaq Gürcüstana nazir tə'yin olunmuş Kovalenskinin yazdığına görə, əvvəllərdə nə qədər ol sə'y edibsə Mustafa xanı Rusiya dövləti ilə yavuqlaşdırsın, mümkün olmayıbdır. Amma sonradan bə'zi səbəbləri müraat edib Mustafa xan Kovalenskinin bir elçisini qəbul edib, ona iltifat göstəribdir və bir elçi dəxi öz tərəfindən Kovalenskinin hüzuruna göndərib və bu növ ilə rus dövləti ilə xani-məzkurun aralarında dostluq və məvəddət binası əlaqə bağlayıbdır. Mustafa xan Dağıstan ilə dəxi qət'i-əlaqə etməyib Dağıstan xanları ilə sülhdə dolanırmış və Dərbənd hakimi Şıxəli xana zərurət vaxtında lazımi kömək göstərərmiş. Və bu səbəbə Səlyan mahalı – ki, sabiqdə Dərbənd xanına tabe imiş, – Mustafa xanın idarəsi altına keçibmiş. Gürcüstan padşahı ilə dəxi Mustafa xan sülhdə dolanırmış, amma mabeynlərində artıq dostluq və yaxınlıq yox imiş. Həmçinin İran şahı ilə çəndan əlaqəsi və rəbtsəbti yox imiş. Həmişə özünü müstəqil saxlamağa sə'y edirmiş. Fətəli şah ona elçi göndərib, İran dövlətinə tabe olmağını təklif qıldıqda xan elçiyə əmr edibdir ki, padşahına deyilən ki, padşahlıq qılıncı məndə də var.



Keçmişdə Şamaxı şəhəri ticarət üçün mühüm bir mərkəz hesab olunurmuş. Xüsusən, onda ipək və qumaş mal satılarmış. Amma çifayda, bu gözəl şəhər dəfəat ilə zəlzələnin dəhşətli sədəməsindən təxrib və zirzəbər olmuşdur. Rus dövlətinin ixtiyarına keçəndən bir neçə vaxt mürur etmiş Şamaxı 1846-cı ildə qubernski şəhər olub, indiki Bakı və Gəncə quberniyalarının mərkəzi-idarəsi hesab olunurmuş. Amma 1859-cu ildə vüqua gələn zəlzələdən sonra quberniya mərkəzi idarəsi Bakıya nəql olundu və o vaxtdan bəri Şamaxı başladı tənəzzül etməyə. Bu axırıncı zəlzələdən sonra – ki, 1902-ci sənədə yanvarın 31-də vüqua gəlibdir, – şəhər daha da artıq rövnəqdən düşdü və adamları ətrafü əknafa dağıldı və üç minə qədər canlar bir türfətül-eyndə tələf oldu.

Şirvan vilayəti və xüsusən, Şamaxı şəhəri qədimdən mərkəzi-ülama və füzala və məskəni-üdəba və şüəra olub, onda çox kamil vücudlar və arif şəxslər dünyaya gəlmişdir. Əgər Şirvan şairlərinin məhz adlarını burada zikr etməli olsaq, məcmuənin bir neçə səhifələrini yalqız onlar ilə doldurmaq lazım gəlir.

Biz bu halı Şamaxının abü həvasının və xaki-pakının tə'sirinə həml edirik və bu e'tiqad üzrə sabitqədəm oluruq ki, hər yerin torpağının təbiətində və abü həvasının tə'sirində böyük hikmətlər vardır ki, onun nəticəsi əhalisində görsənilir. Hər bir məhəllü və məkanın əhalisinin əxlaq və ətvarı, zehn və fərasəti, iste'dad və qabiliyyəti o yerin abü həvasının tə'sirinə bağlıdır. Bə'zi yerlərin torpağı qızıl və gümüş, firuzə və yaqut, lə'lü və cəvahir yetirən kimi, bir para məhəllü və məkanın dəxi torpağı və abü həvası qabil və kamil vücudlar, xoştəb' şairlər, xoşavaz xanəndələr, mahir sazəndələr və qabil nəqqaşlar yetirir. Şirvan vilayəti qədimdən şüəra və ürəfa beşiyi olmağını mərhum Hacı Seyid Əzim dəxi öz tərcümeyi-halına dair yazdığı mənzumatında təsdiq edib deyir:

İki yüz əlli birdə bə'di-həzar,
Əsri-Sultan Məhəmməddi-Qacar,
Rumə Əbdülməcid idi sultan,
Oldu darül-viladətim Şirvan.
Hansı Şirvan, o gülüstani-qədim –
Konda* şirvanşəhilər oldü müqim.
Nə Şəmaxi ki, onda İzzəddin[170]
Nəzmdən zahir etdi sehri-mübin.
Məsqətür-rə'si-paki-Xaqani,
Hünərin zülfüqari-bürrani.
Nə Şəmaxi ki, onda təbi-Bahar
Etdi yüz min baharlar izhar.

* Ki, onda – *red.*

Seyidin bu şeirlərindən mə'lum olur ki, Şamaxıda İzzəddin, Xaqani, Ağaməsih Şirvani və Mirzə Nəsrullah Bahar kimi böyük şüara vücuda gəlib rüxsari-şeir və kəlamı bədr ayı tək münəvvər qılmışlar. Və lakin sə'd heyif ki, elm və mə'rifət və xüsusən, fünuni-şeir və ədəbiyyat övci-məqama çatdıqda, – necə ki, fövqdə zikr olundu, – böyük və dəhşətli zəlzələlər vüqua gəlməklə gözəl şəhəri zirü zəbər edib, əhalisinin bir parasını fəlakətə yetirib və bir parasını dəxi vətəni-mə'luflarından dərbədər və pərakəndə qılmışdır, necə ki, bu babda mərhum Seyid deyibdir:

Olmuş ikən səfadə rəşki-cinan,
Tapdı eynül-kəmaldən nöqsan.
Etdi Şirvanı payimali-məlal
Rəcfətül-ərzü sə'dmeyi-zilzal.
Xəlqi-Şirvan olub pərakəndə,
Hər biri bir qəribə məskəndə.
Dağılıb, şəhri qoydular bərbad,
Etdilər Badkubəni abad...

Amma bununla belə Şamaxıya zəlzələdən külli sədəmələr və afətlər yetişdisə də, yenə ol mübarək torpaq əhli-mə'rifətdən xali qalmayıb, hər zaman fazil ülama, xoştəb' şüəra və zürəfa yetirməkdədir.



# İBRAHİM İBN ƏLİYYÜN-NƏCCAR XAQANİ

Şirvan vilayətinin xaki-pakı pərvəriş verib yetirdiyi şüərayi-üzamdan ən məşhuru və müqtədiri İbrahim ibn Əlliyün-nəccar həkim Xaqanidir. Xaqaninin əvvəlcə təxəllüsü "Həqayiqi" imiş, amma sonra Xaqani-kəbirdən "Xaqani" ləqəbini götürmüşdür. Xaqani Azərbaycan torpağında ərseyi-dünyaya gəldiyinə görə, ol cənabı biz öz şüəramız silkinə daxil elədik. Həkim Xaqani, qövli-məşhura görə, Şirvan şahlarından Şah Sultan Xəlil Xaqanın əsrində zindəganlıq edirmiş. "Atəşkədeyi-Azəri"də dəxi həkim Xaqani İbrahim ibn Əlliyün-nəccar Şirvan şahlarından Xaqani-kəbirin və Alp-Arslan Səlcuqinin müasiri olmağına şəhadət verilibdir[171].

Xaqaninin əsli Şamaxının yaxınlığında Məlhəm adlı qəryədəndir ki, bu halda dəxi haman kənd durur və əhalisi türk ilə qarışıq fars dilində danışırlar. Xaqaninin əsli Şirvandan olmağına bu şe'ri dəxi dəlalət edir:

Mən Hoseyne-əsr, əduyan Yəzidə Şemre-mən
Ruzeqarəm comle aşuravo Şirvan Kərbəlast[172]

Xaqaninin atası Əlinin nəccar olmağına bu şe'ri şəhadət verir.

Nuh nə bəs elm daşt,
Gər pedəre-mən bodi
Qəntərc bəsti ze elm
Bər sərc-tufan u[173].

Həkim Xaqani, məşhur qövlə görə, əyyami-tüfuliyyətdən zəkavət, ağıl və dirayət sahibi olduğunu öz fe'l və qövlü ilə izhar edərmiş və özünün də bir kəsdən və bir şeydən qorxusu yox imiş. Ziyadə cür'ətli, zirək və hazırcavab bir uşaq imiş. Belə rəvayət olunur ki, bir dəfə balaca İbrahim öz yoldaşları ilə kəndin ətrafında oynamağa məşğul ikən ittifaqən şah öz müqərrəbləri ilə haman yerdən keçib şikara gedirmiş. Uşaqlar şah təntənəsini və üstünün adamlarının gördükdə qorxudan qaçıb dağılıblar. Amma balaca İbrahim güzərgahda rast durub yerindən tərpənməyibdir. Uşağın belə cür'ətlə yol üstə durmağı şahın diqqətini cəlb edib. Atını ona sarı sürüb ondan soruşubdur ki, sən burada nə qayırırsan? Uşaq cavab veribdir ki, mən burada çör-çöp düşürürəm. Şah soruşubdur ki, çöp çöpdür, bəs çör nədir? İbrahim cavab veribdir ki, çör – dik duranıdır, çöp – yıxılanı.

Uşağın belə cür'ətli və hazırcavab olmağı şahın xoşuna gəlib ondan soruşubdur ki, kəndinizdə böyük sayılan kimdir? Uşaq cavab veribdir ki, camış. Şah gülümsünmüş deyibdir ki, mən dediyim o böyük deyil. Mən

dediyim odur ki, hərgah sizin kəndə özgə yerdən bir şəxs gəlsə, kim onun qabağına çıxıb söz danışar? Uşaq cavab veribdir ki, it. İbrahimin bu sayaq hazırcavablığı şaha dəxi də artıq xoş gəlib, istəyib ona bir qızıl bağışlasın, amma uşaq almayıbdır ki, atam məni döyər. Şah səbəbini soruşduqda İbrahim cavab verib ki, atam belə zənn elər ki, mən onu oğurlamışam. Şah buyurub ki, atan bunu hardan alıbsan – deyib xəbər alsa, cavab ver ki, şah bağışlayıbdır. İbrahim deyibdir ki, atam deyər ki, yalan deyirsən, əgər şah versə, çox verərdi, bir qızıl verməzdi. Bu günə sual-cavabdan sonra şah balaca İbrahimin ağıl və fərasətini görüb əmr edibdir ki, onu gətirsinldər şəhərə. Burada – şahın sarayında tə'lim və tərbiyə alıbdır[174].

Bu rəvayətin nə dərəcədə mötə'bər və doğru olduğuna bir söz deməyib, ancaq bunu inkar edə bilmirik ki, həkim Xaqani səbilikdən Şah Sultan Xəlilin sarayına düşüb, orada tərbiyə və tə'lim almışdır və hənuz cavan ikən şeir deməklikdə artıq məharət büruz etmişdir. Şah Xaqaninin belə təbi-rəvan sahibi olduğunu müşahidə buyurub, onu "Fələki" təxəllüslü başqa bir tizfəhm və xoştəb', cavan şair ilə Gəncəyə – məşhur Əbülüla şairin yanına fünuni-şeirdə tə'lim almaq üçün göndəribdir. Xaqani bir neçə müddət Əbülülanın təhti-tərbiyəsində qalıb və fünuni-şeirdə lazımeyi-mə'lumat kəsb etdikdən sonra ustadının qızını alıbdır. Və bu qız aqilə və cəmilə olduğu üçün Fələki dəxi buna müştəri düşür, amma qız Xaqaniyə nəsib olur. Bundan sonra Xaqani vətəni Şirvana müraciət edib şahın hüzurunda böyük mənsəb sahibi olubdur.

Bə'zi rəvayətə görə, Xaqani cahü rütbə axtaran və şöhrət sevən, qeyzli və tündməcaz bir vücud imiş ki, çox kəslərə ondan qövlən və fe'lən zülm və cəfalar yetərmiş və xəlayiq onu dürüşt və bədxasiyyət olduğu üçün dost tutmazlarmış. Amma "Atəşkədeyi-Azəri"də belə rəvayət olunur ki, həkim Xaqani axirül-əmr tərki-rəyasət və təcridi-ixtiyar qılıb, riyazət və mücahidəti-batinini özü üçün eyni-səlah görüb dövləti işlərdən dəstbərdar olmuşdur və səlatinə qulluq etməkdən boyun qaçırdığı üçün bir neçə müddət məhbus olmuşsa da, yenə divani xidmətləri qəbul etməmişdir. Və bir rəvayət də budur ki, Həccə gedib, övdətində Üzi adlanan bir qövmün əlinə əsir düşüb. Dini-məsihi qəbul etmək təklifi olunmuşdur və lakin Xaqani bu təklifi rədd etmişdir və bu səbəbdən bir monastrda həbs olunmuşdur. Hər halda bir xeyli vaxt məhbus qalıb və məhbusiyyəti haqqında əş'arı vardır. Həccdən qayıdan zamanı İraqdan keçməklə bu xittələrin əhvalını öyrənib "Töhfətül-İraqeyi" ünvanı ilə bir kitab yazmışdır.

Bundan əlavə "Həft iqlim"[175] ünvanı ilə bir mənzuməsi və mürəttəb bir divanı vardır. Və "Atəşkədə"də həkim Xaqaninin vəsfində yazılmış bu sətirləri təbərrükən burada zikr edirik: "...və behəmrahiye-karvane-niyazerahnəvərd badiyeye-Hicaz gəşte və məsnəviye – "Tohfətol-İraqeyn"ra dər ərze-rah benəzm avərde və əlhəq dər hiç fənn əz fonune-nəzm əz fohuleostadan kəmtər nist. Dər fənne-soxənvəri tərze-xassi extera kərde sahabeməaniye-bolənd və əlfaze-delpəsənd əst"[176].



Belə rəvayət olunur ki, Xaqani ustadi-möhtərəmi olan qayınatasını incidib və bir həcv yazmaq ilə mükəddar və rəncidəxatir etmişdir. Əsirəddin Əxsikəti[177] ilə müasir olub, mükatibə təriqi ilə beynlərində bir çox müşairələr vüqu bulmuşdur və atidəki iki beyt Əsirəddin Əxsikətiyə qarşı söyləmiş olduğu bir fəxriyyəsindədir:

Be kerdqar ke doure-zəman pədid avərd,
Ke dour doure-mənəsto zaman zəmane-mənəst.
Mənəm bevəhye-məani peyəmbəre-şoəra –
Ke, moceze-soxən emruz dər bəyane-mənəst[178].

Xaqaninin vəfatı Təbrizdə olubdur, hicrəti-rəsulun 582-ci[179] sənəsində və orada Sürxab adlanan məhəllədə dəfn olunubdur. Çün şüəra silkindən cəm'i-kəsir onun civarında mədfundur, ona binaən o yer "Məqbərətüşşüəra" adı ilə məşhurdur ("Bahariyyat"ını dəxi Təbrizdə inşa qalıbdır). Xaqaninin asari-qələmiyyəsindən nümunə üçün burada onun günəşə xitabən yazdığı kəlamı zikr edirik:

Ey mohre-dəhanə-ruzedaran,
Candaruye-elləte-bəharan.
Əz səhme-to dər neqabe-xəzra.
Məstureye-sə'd hezar rə'na,
Əz feyze-to dər do qahvare,
Do henduye-tefle-şirxare,
Darəd ze to ruye-rumiyan ab,
Girəd ze to muye-zəngiyan tab.
Dibaçeye-rumra ze to rəng,
Aineye-zəngra ze to jəng,
Zər paşiyo naqoşade gənci,
Təb' dariyo nakeşide rənci,
Gəh kousəre omre-zay başi.
Gəh atəşe-canqozay başi,
Ba anke berəhnegi gəzini,
Zərbəft dəhi behər ke bini.
Hər mah bepeyke-asemani,
Xələt dəhiyə va setani.
Ya xələ mədeh bezirdəstan,
Ya dadeye-xiş baz məstan.

Meyle-to berouzənəm çera nist,
Dər rouzənəm axər əjdəha nist.
Dər rouzəne-an yeki foruzi,
Gəz rouzəne-pəst yaft ruzi.
An nur ke bidəriğ dari.
Əz Xaqaniye-xod dəriğ dari.
An kəs ke bezər qəvist rəyəş,
Zərbənde şemoro zər xodayəş,
Dər kiseye-hər ke zər foru şod,
Çon kise tənab dər gəlu Şod
Çon kise tənab dər gəlu şod.
Zər çist to atəşe-fesorde,
Xaki bimar bəlke morde.
Lə'l ərçe şərareist xoşrəng,
Xunist fesorde dər dele-səng.
Mərd əz peye-lə'l o zər nəpuyəd,
Tefləst ke sorxo zərd cuyəd[180].

Qəzəliyyatından bir neçə fərdlər – ki, "Atəşkədeyi-Azəri"də məsturdur, – burada zikr olunur:

Ey sobhdəm bebin bekoca miferestəmət,
Nəzdike-aftabe-vəfa miferestəmət.

İn sər bemohre-name bean mehreban resan,
Kəsra xəbər məkan ke koca miferestəmət.

Can yek nəfəs derəng nədarəd, qozəştənist,
Vər nə, bein şetab çera miferestəmət.

İn dərdha ke bər dele-Xaqani əmədəst,
Yek-yek bequy, bəhre-dəva miferestəmət.

* * *

Dərdi ke məra həst bemərhəm nəforuşəm,
Gər afiyətəş sərf dəhi həm nəforuşəm.

Bər kurdelan suziye-İsa nəseparəm,
Bər mordedelan reşte'ye-Məryəm nəforuşəm.

Ey xace məno to çe foruşim bebazar,
Şadi nəforuşi tovo mən ğəm nəforuşəm.

* * *

Xəyyate-ruzeqar bebalaye-hiç kəs
Pirahəni-nəduxt ke, axər qəba nəkərd.[181]



Cənnətməkan Abbasqulu ağa "Qüdsi" təxəllüs – ki, onun tərcümeyi-halı gələcəkdə zikr olunacaqdır, – "Gülüstani-İrəm" adlı kitabında Nizaminin və Xaqaninin müasirlərindən və onlardan sonra Qafqaziyada vücuda gələn üləma, şüəra və hükəma barəsində filcümlə mə'lumat veribdir. Heyfa ki, "Gülüstani-İrəm"in farsi nüsxəsi əlimizə düşmədi və lazımi qədərincə ondan istifadə edə bilmədik. Ancaq rus dilinə tərcümə elədiyi bir nüsxəsi müvəqqəti əlimizə keçdi. Fürsəti qənimət bilib, aşağıda təhrir olunan mə'lumatı rusdan türkə çöndərməklə məcmuəmizi zinnətləndirdik.

Abbasqulu ağa yazır: "...Və hər əsrin ruhu və övza'yi-əhvalı və hər bir millətin dərəceyi-kəmalı, tərəqqi və təməddünü ol əsr və millət hasilə yetirdiyi ədəbiyyatdan və əsari-atiqədən müşahidə olunur. Qafqaziyanın cənubi-şərqində həddən ziyadə xərabə şəhər, qəsəbələr, uçuq hasar və minarələr, qədim mə'bədgahlar (monastrlar), Aranzəmində Həvariyyundan müqəddəs Şəmunun qəbri, Bərdədə, Gəncədə, Şamaxıda və Bülbülə kəndində imamzadələrin rövzeyi-mütəhhərələri və bunlardan əlavə Şirvan, Şəki, Gəncə, İrəvan, Qarabağ mahallarında bir çox möhtərəm seyidlərin, şeyxlərin və pirlərin qəbirləri ona şəhadət verir ki, keçmişdə bu yerlər üləma, ürəfa və şüəara mərkəzi olubdur. Bu yerlərin mötədil abühəvası, münbit torpağı, qalın meşələri, dilgüşa və basəfa dağları və təpələri, laləzar çəmən və səhraları, meyvəli və güllü bağ və bostanları hər qism ne'mət və meyvacat yetirməkdədir. Bu cəhətə ən qədim əsrlərdən müxtəlif qövm və tayfaların nəsli burada sükunət ediblər. Müxtəlif şəkil və heykəldə, siyrət və surətdə olan millətlərin övladı bu yerlərdə bənd olub qalıblar. Onlardan hər biri elm və hünərindən, cibilli iste'dad və qabiliyyətindən, ayin və adətlərindən və xasiyyətlərindən bir nişan və əlamət qoyublar. Belə ki, Qafqaz əhalisi bir çox mə'nəvi dövlət və irslərə varis olublar və şəklü şəmayildə dəxi qeyri-millətlərdən tərcih tapdıqları cəhətə Qafqaziya ünsürünə (rasasına)* Avropa millətləri dəxi özlərini mənsub qılıblar.

Fəqət Qafqaz xittəsi sabiqdə müttəsil dava və qovğa meydanı olub, bir an vuruşma və toqquşmadan asudə qalmayıblar. Bununla belə bu yerlər üləma, hükəma və şüəra sinfindən xali qalmayıbdır. Burada bir çox mötə'bər və müqtədir şəxslər vücuda gəliblər ki, hər biri öz əsrinin fəridi və mümtazı olubdur. Və bunu da bilmək gərəkdir ki, Qafqaz torpağından çıxıb başqa diyara mühacirət edən kəslər qürbət vilayətlərdə və əcnəbi məmləkətlərdə böyük nam və şöhrət qazanıblar.

* İrqinə – *red.*

Şirvan şahlarının zəmani-səltənətlərində – ki, dörd yüz ildən ziyadə çəkibdir, – bu yerin əhalisi eyni-əmn asayişdə yaşayıb, vilayəti abad və mə'mur qılıblar. Səfəvilər əsrinin ibtidasında Qafqaziyanın bə'zi yerlərində osmanlılar ilə əcəmlər arasında bir çox müharibələr vüqua gəlməklə belə vilayətin övza' və nizamı pozulur. Ancaq Şah Abbasi-dövvüm Qafqazın şərq səmtini təsxir etdikdən sonra təzə nizam və qanun təsis eləyir və bu əmn asayiş Şah Sultan Hüseynin zəmani-səltənətinədək davam edir. Vəli Nadir şah zühur edib Dağıstanın üstünə hücum qılır. Yenə davalar başlanır; hər tərəfdən qan sel kimi axır, övza'yi-məmləkət nizami-qaydadan düşür...

Bununla belə əlimizə düşən pərişan namələrdən istifadə edərək zeyldə adları zikr olunan üləma və əhli-qələmlərimizin tərcümeyi-hallarına və əsərlərinə dair müxtəsərən mə'lumat veririk:

1. Şeyx Əbuabdullah Əli ibn Məhəmməd Badkubeyi bir çox mötə'bər müvərrixlərin yazdıqlarına görə, din və dünya elmlərindən baxəbər bir vücud imiş. Cavan sinnindən başlayıb əsrinin mötə'bər üləmasından elm təhsil etməyi. Onun müdərrisləri Şeyx Abdullah Xəfif və Şeyx Əbülqasım Kaşifi kimi böyük alimlər olubdur. Məşhur Şeyx Əbusəid Əbülxeyr ilə onun arasında bə'zi elmi və fənni mübahisələr vüqua gəlibdir. Şeyx Əbülabbas ilə mabeynlərində ülfət və dostluq əlaqə bağlayıbdır.

Məzkur Əbülabbas Şeyx Əuabdullah Əli Badkubeyinin alim və fazil bir vücud olmağını öz əsərlərində zikr və təsdiq edibdir. Şeyx Əbuabdullah ömrünün axırlarında dünyadan və xalqdan qət'i-əlaqə edib, Şirazın yazınlığında bir mağarada e'tikaf və ibadətə əyləşir. Burada şeyxi öz əsərinin məşhur üləma və füzəlası ziyarət edərmiş. Vəfatı hicrətin 442-ci tarixində vaqe olubdur ki, miladın 1051-ci ilinə mütabidir. Asari-qələmiyyəsi olubsa da, bizə erişməyibdir.

2. Məhsəti Gəncəvi vəcihə və nəcibə bir qız imiş. Sultan Səncər Səlcuqinin sarayında artıq şöhrət kəsb etmişdi. Fünuni-şeirdə ən zərifə və qabilə bir vücud imiş, təbiəti-şe'riyyəsi var imiş. Gözəl və dilpəsənd qəzəllər inşad edərmiş. Əşar və asarından bir çox nümunələr "Atəşkədə"də məsturdur.

3. Fələki Şirvani öz əsərinin ən mə'lumatlı və xoştəb' şairlərindən birisi hesab olunur. [182]Onun əsl adı Məhəmməddir və necə ki, yuxarıda zikr olundu, Xaqaninin müasiri və dostu imiş. Rəvayət olunur ki, cavanlıq sinnində ikən bir münəccimin oğlu ilə dostlaşıb, onun atasından münəccimlik elmini öyrənmişdi və bu elmdə artıq məharət və qabiliyyət büruz etmişdi. Fünuni-şeirdə dəxi ustadi-şüəra Əbülüladan tə'lim almışdı və münəccimlik elmini sevdiyindən "Fələki" təxəllüsü götürmüşdü.



Bir çox əş'arı "Təzkirətüş-şüəra"da[183] zikr olunubdur. Onlardan ən məqbul və səlisi Şirvan mənuçehrlərinin şə'nində yazdığı qəsidələrdir.

4. İzzəddin Şirvani dəxi Xaqaninin müasiri olub, ziyadə danişmənd və maarifpərvər bir vücud imiş. Dövlətmənd və alitəb bir şəxs olduğu üçün müdam onun məclisi ürəfa, üləma və şüəra ilə ziynətlənərmiş; şüəra sinfinə cümlədən ziyadə riayət göstərərmiş və bə'zi kəlami-bəlğindən müqtədir şair olduğu görünür.

5. Mücirəddin Beyləqani cavan ikən Şirvana azim olub, burada həkim Xaqaniyə şagird olur. Fünuni-şeirdə ondan tə'lim alıb, özü dəxi şeir yazmaqda mahir olur. Xaqani yazdığı əş'ar və kəlamın üzünü ağardarmış. Şirvanda olan vaxtı Mücirəddin Xaqaninin əqrəbalarından birisinin qızına aşiq olub, onu almaq istəyir. Vəli biçiz və fəqir şair mən olunur və öz müəllimindən gözlədiyi köməyi və tərəfdarlığı görməyib, mə'yusanə Azərbaycan diyarına azim olur[184] və burada öz kamal və mə'rifəti sayəsində Atabəyin[185] ən müqərrəb adamlarından birisi olur. Atabəyin vasitəsi ilə Qızıl Arslanın və fərzəndi Sultan Toğrulun[186] hüzuruna müşərrəf olur. Hər iki sultanın şə'nlərində gözəl qəsidələr inşad qılmışdı.

6. Hüseyn ibn Əli Seyid Zülfüqar Şirvani özünün elmi və təbiəti-şeiriyyəsi ilə iştihar bulmuşdu. Şirvan vüzərasından Sədr Səid onun yazdığı bir qəzələ əvəz olaraq yeddi xarvar* ipək ona bəxş etmişdi. Axır vaxtlarda Seyid Zülfüqar Xorasana əzimət edib, orada Sultan Məhəmmədin tərcümeyi-halını və ümuri-səltənətdə icra etdiyi gözəl tədbirləri nəzm ilə yazmışdı. Sonra Hülaku xanın oğlu Əbakə xanın vəziri Atabəy Yusif Seyid Zülfüqarı ömrünün axırına kimi öz təhti-himayəsinə alıb, şairin haqqında lütf və ehsanatını əsirgəməzdi. Seyid Zülfüqar Əbakə xanın zəmani-səltənətində Təbrizdə vəfat edibdir və "Məqbərətüş-şüəra"da dəfn olunubdur.

7. Əbusəid Abdal Badkubeyi bəzl və ehsanı ilə və mehmannəvazlığı ilə şöhrət kəsb etmiş dərvişsifət bir zat imiş. Bakı şəhərinin yaxınlığında sükunət edərmiş. Cüz'i mədaxilinə qane olmaqla belə füqəraya kömək və evinə gələn qonağa hörmət və inayət göstərərmiş. Padşahlardan fərman ilə ona verilmiş neft quyusundan və Şibanidəki əkin yerlərində yetişən məhsulat, fərmanların hökmüncə, onun vəfatından sonra da füqəra və məsakinə təqsim olunarmış və qəbrinin üstündə olan mücavirlərə vəzifə verilərmiş və lakin müruri-əyyam ilə Şirvan şahlığında vüqua gələn inqilab və siyasi hadisələr tə'sirindən Əbusəidin məscid və hücrələri və müsafirxanası təxrib və qəbri sə'dəmeyi-ruzgardan torpaq ilə yeksan olur.

* Hər xarvar əlli batmandır (1 batman səkkiz kiloqramdır) – *red.*

Hicrətin 1232-ci tarixində ki, miladın 1817-ci sənəsinə mütabiqdir, Hacı Qasım bəy vələdi-Mənsur xan Badkubeyi Əbusəidin qəbrini axtarıb tapır və məscidini hücrələri ilə və müsafirxanası ilə təmim qıldırır. Məscidin və müsafirxananın və neft quyusunun açılmağından yəqin olunur ki, bu haman dərviş Əbusəidin binalarıdır ki, onun vəsfi-şə'nində Məhəmməd ibn Mahmud "Nəfayisül-fünun" adlı kitabında bu minval yad etmişdi ki, Hülaku xanın nəvəsi Sultan Məhəmməd xan Xudabəndə – ki, miladın 1314-ci tarixinlə tamami İrana padşahlıq edirmiş,[187] Badkubə şəhərinin canibində bir dərvişə rast gəlir ki, orada bir neft quyusu qazdırıb, onun mədaxili ilə həm özü məaş edərmiş və həm də müsafirlərə və füqəraya xərc qılarmış. Dərviş məzkur adətinə görə, padşaha da ziyafət tərtib qılır. Sultan Məhəmməd Xudabəndə dərvişin bu himmət və alitəbliyini gördükdə ona pürqiymət töhfələr bəxşiş eləyir, vəli Əbusəid qəbul etməyib deyir: "O qədər ki, mənə lazımdır, varımdır. Daha başqa şeyə ehtiyacım yoxdur!" Əbusəidin cavabı sultana o qədər xoş gəlir ki, onun əlini sıxıb, dost və qardaş olmağına əhd və peyman edir. Dərviş bə'zi vaxtı dostuna cüz'i hədiyyələr göndərərmiş və sultan o hədiyyələri satdırıb onlardan hasil olan məbləğə özü üçün kəfənağı aldırmağı vəsiyyət etmişdi.

Əbusəidin asari-qələmiyyəsindən bizə bir şey vasil olmayıbdır.

8. Seyid Yəhya Badkubeyi hicrətin səkkizinci əsrində bu vilayətdə böyük alim və müdərrislərdən hesab olunurmuş. Qafqazın hər tərəfindən tələbə və suftələr onun başına cəm olub, elm mə'rifət kəsb edərlərmiş. Ülumi-diniyyəyə dair bir çox mötə'bər əsərləri vardır. Seyid Yəhyanın adı bə'zi şər'i kitablarda kəmali-ehtiram ilə zikr olunubdur. Onun ibadət etdiyi hücrə və mədrəsəsi Abbasqulu ağa Qüdsinin əsərində mövcud imiş. Məscid mərhumun adı ilə təsmiyə olunub – "Seyid Yəhya məscidi" adlanırmış.

9. Şeyx Molla Yusif Müsküri əslən ərəb imiş. Abav və əcdadı hicrətin yeddinci əsrində Mədinədən Qafqaza hicrət ediblər və ibtidada Qarabağ mahalında sakin olarlarmış. Bədən Qarabağdan Quba mahalına köçüblər və burada "Müskür" adlı məhəldə Şeyx Molla Yusif təvəllüd edibdir. Şeyxi-məzkur ibtidai tə'limdən sonra Seyid Yəhya Badkubeyiinn hüzuruna gedib, ondan ülumi-ilahiyyəni və ehkami-şər'iyyəni təhsil etməyə başlayır. Seyid Yəhyanın təhti-tərbiyəsində şeyx xeyli müddət kəsbi-kəmal edib öz zehn və iste'dadı ucundan bir çox elmlərə dara olur və ustadi-möhtərəmi onun müdərrisliyinə xeyir-dua edib yola salır. Şeyx Molla Yusif öz vətə'ninə müraciət edib müdərrisliyə qurşanır və bir çox möhtərəm şəxslər onun tədris və tə'limi bərəkətindən ad və şöhrət qazanırlar, xüsusən, onun istəkli şagirdi qubalı Şeyx Məhəmməd öz əsrinin



fəridi olur. Şeyx Molla Yusifin nəsli camaat içində və el arasında həmişə əziz və möhtərəm sayılıblar. O qəryədə ki, şeyx dəfn olubdur və onun övladı sakindirlər, şeyxin adı ilə məzkur qərya təsmiyə olunubdur – "Şeyxulla" kəndi adlanır. Şeyx Molla Yusifin əsərlərindən bizə yetişən onun ərəb dilində "Bəyanül-əsrar" adlı yazdığı kitabıdır. Bu kitab bir müqəddimədən və iyirmi dörd babdan ibarətdir ki, məalı insanın əhvalı-ruhiyyəsinə və əxlaq və ətvarına şamildir. Şeyx vəfat edibdir hicrətin səkkizinci əsrinin axırlarında.

10. Bədr Şirvani öz əsrində ən zərif şairlərdən birisi hesab olunurmuş. Şeirşünaslıqda və elmi-tənqiddə artıq dərəcədə məharəti var imiş. Xeyli zaman Şirvanda naz və ne'mət içrə möhtərəm yaşayıb. Əsərlərindən bir neçəsi bizə yetişibdir. İranın məşhur şairlərindən Katibi Turmizi* Bədr Şirvaninin ziyarətinə Şirvana gəlib, xeyli vaxt aralarında fünuni-şeir və ədəbiyyat babında mübahisələr olubdur. Dövlətşahın dilindən rəvayət olunur ki, Şirvan valisi Əmir İbrahim Katibinin bir şeirinə bədəl olaraq ona on min dinar qızıl bağışlayır. Bu məbləği Katibi bir ayın müddətində Şirvan karvansarasında sərf eləyir: o, pulun bir hissəsini fəqir şairlərə və bir hissəsini də füqəraya verir, bir hissəsini də oğurlayırlar. Belə ki, ay tamam olmamış Katibinin yeməyə bir batman unu da qalmır. Bu halda Əmir İbrahimə aşağıdakı məzmunda bir şeir yazıb göndərir: "Dünən aşpazıma əmr etdim ki, mənim və qonağımın aclığını rəf' etmək üçün bağri** bişirsin. Aşpaz mənə cavab verdi ki, evimizdə bir az ət və yağ olur ki, tapılsın, amma unu kim verəcəkdir, o mə'lum deyil. Mən ona dedim ki, göyün dəyirmanını işlədən kəs bizə un verər".

11. Əbdürrəşidi-sani Badkubeyi təvəllüd edibdir hicrətin 805-ci ilində ki, miladın 1403-cü tarixinə mütabiqdir. Əsərlərindən qalanı ərəb dilində yazdığı coğrafiya kitabıdır[189] ki, onda rusların, slavyanların, varyakların, peçeneqlərin haqqında müfəssəl mə'lumat veribdir. Avropa üləmasından məşhur akademik Fren[190] "İbn Fədlan" nam adlı təb' olunmuş əsərində Əbdürrəşid Badkubeyi yazdığı coğrafiyadan bir çox mə'lumat əxz etmişdir.

12. Kəmaləddin Məs'ud Şirvani çox böyük üləmadan birisi hesab olunur. Uzun müddət Heratda Sultan Hüseyn Bayqarının zəmani-səltənətində müdərris olubdur. 905-ci[191] tarixi-hicriyyədə Heratda vəfat edibdir. Xorasan üləma və hükəma firqəsi Kəmaləddin Şirvaninin elm və fəzlini kəmali-ehtiram ilə öz əsərlərində zikr ediblər.

* "Turmizi" ləfzinin dürüst olmasını təsdiq edə bilmirik. Əzbəs ki, onu ruscadan tərcümə etmişik, rusca belə yazılmışdır. Kyatibi Turmizi[188].

** Bağri – bişmiş adıdır, guşbərə və Şəki mahalında girs adlanır

13. Müsahib Gəncəvi – ki, Kərbəlayı Əlixan Ziyadoğlu ismilə məşhurdur, – Gəncə və Qarabağ bəylərbəyisi olubdur. Ziyadə xirədmənd, baxəbər və xoşsöhbət bir vücud imiş. Şah Abbas Səfəvinin lütf və inayətinə nail olduğu üçün "Müsahib" ləqəbi almışdı. Ümuri-məmləkətdə ziyadə mahir və durbin olduğundan maəda şeirşünasdıqda yədi-beyzası var imiş. Özü dəxi şeir deyərmiş və bir çox şeir və qəzəlləri qalıbdır.

14. Molla Mirzə Şirvani ziyadə alim və fazil bir zat imiş ki, hər növ elmdən baxəbər və öz əsrinin filosofu sayılırmış. Üləma firqəsilə müttəsil müzakirə və mübahisədə olub, hər kəsə ariz olan elmi müşkilat və şübhələri kəşf və bəyan edərmiş. Abbasqulu ağa Qüdsinin zamanında da Molla Mirzə Şirvaninin adı İranzəmində təhsin ilə yad olunarmış. Ömrünün axır vaxtlarında İsfahanda və Kərbəlayi-müəllada üləma və müctəhidlər zümrəsində keçiribdir. Vəfatı da orada olubdur, Şah Sultan Hüseyn Səfəvinin zəmani-səltənətində.

15. Molla Məhəmməd ibn Molla Nəcəfəli Badkubeyi öz əsrinin alim və fazil bir şəxsi imiş ki, hər növ elm və fənlərə dara imiş. Ziyadə xoşxülq, paktinət bir vücud olduğu üçün cümlənin hörmət və rəğbətini kəsb etmişdi. Mirzə Məhəmməd xani-dövvümün[192] müəllimi və mürəbbisi olubdur. Bir neçə mötə'bər əsərləri qalıbdır ki, onların cümləsindən Şeyx Bəhaəddinin[193] "Kəşkül" nam ərəb lisanında yazdığı kitabın şərhi ilə farscaya tərcüməsidir. Bu tərcüməni Molla Məhəmməd Fətəli xanın [194] fərmayişi ilə eləyibdir. Səhih rəvayətə görə, Molla Məhəmməd ilə Məhəmməd Çələbi Əlicəli* sünni və şiə məzhəb arasında olan nifaq və ədavəti götürüb, sülh və saziş etmək üçün xeyli müddət müzakirə və müşavirə ediblər və bu xüsusdə Məhəmməd Çələbi ərəb dilində mötə'bər bir kitab yazıbdır. Haman kitabı ərəbdən fars dilinə mərhum Abbasqulu ağa Qüdsi pədəri Məhəmməd xani-saninin buyurmağı ilə tərcümə eləyibdir.

16. Hacı Məhəmməd Çələbi Əlicəli Qübbə nahiyyəsində öz əsərinin bilikli və gözüaçıq alimlərindən sayılırmış. Hacı Məhəmməd Çələbinin hər elmdən xəbərdarlığı var imiş. Xüsusən, ülumi-ehkami-şər'iyyədə əmsalı yox imiş. Mərhum Çələbinin bir neçə mötə'bər əsərləri qalıbdır ki, üləma indində məqbul və bə'ziləri dəsturüləməl hökmündədirlər. Hacı Məhəmməd Çələbi yeddi dəfə Həcc ziyarətinə gedibdir, vəfatı Hicrətin 1223-cü ilində vaqe olubdur ki, miladın 1808-ci salına mütabiqdir. Zəmani ki, Mustafa xan rus qoşununun içində Quba həvalisində Şıxəli xan ilə müharibə edirlərmiş Hacı Məhəmməd Çələbinin cəsədini dəfn etmək üçün şəhər qəbiristanlığına gətirirlər. Bu əsnada alimin cəsədinə

* Rusca Məhəmməd Çələbi Əlicəli "Магомет Челаби Алиджинский" yazılıbdır.



ehtiram göstəribən hər iki tərəf yaraq və əsləhələrini yerə qoyub, müvəqqəti sülh edirlər.

17. Məstəli Şirvani – ki, əsl adı Hacı Zeynalabdin ibn Axund İsgəndərdir – təvəllüd edib şəhəri-Şamaxıda Hicrətin 1194-cü ilində ki, tarixi-məsihiyyənin 1779-cu salına mütabiqdir. Altı ay onun təvəllüdündən sonra atası Axund İsgəndər əhlü əyalını götürüb gedib Kərbəlayi-müəllaya. Məstəli Şirvani on yeddi yaşına kimi bə'zi elmləri öz atasından və sair məşhur alimlərdən təhsil edibdir və cavan ikən dərvişlər silkinə daxil olub, dərviş Mə'suməli şah* Hindistaninin tə'lim və söhbətindən istifadə edir. Bundan sonra Bağdada köçüb, orada elm və biliyini kamala yetirmək üçün Nurəli şah İsfahanidən başlayır dərs almağa. Elmini tamam edəndən sonra İraqi-əcəmə, Gilana, Şirvana və Azərbaycana səfər edib, hər məkanü məhəldə bir neçə vaxt iqamət edib, təcrübə və biliyini daha da artırır. Məstəli Şirvana Azərbaycandane azim olur Təbəristana, oradan Xorasana, Zabilistana və Kaabula əzimət edir. Hər yerin üləma və hükəması ilə aşina olub, məclislərinə daxil olur. Xeyli müddət Həsənəli şahın xidmətində qalıb, hüsni-təvəccöhlərinə müvəffəq olur və onun vəfatından sonra – ki, vaqe olubdur Hisndistanda Pişvərdə 1216-cı (1802) tarixində, – Məstəli Şirvani Pəncab səmtinə və oradan Dehliyə, Allahabada, Benqalya, Dəkənə və Hindistanın sair yerlərinə səfər edib. Bəd Hindistan və Xita cəzirələrini gedib gəzir.

Bundan sonra Məstəli Multandan keçib Kəşmirə, Müzəffərabada və oradan keçib Kabula, Təbəristana, Bədəxşana, Xorasana, İraqa və İraqdan Farsa. Bu uzun və pürzəhmət səyahətdən sonra Məstəli bir neçə müddət yorğunluğun almağa məcbur olur. Bir az rahat olandan sonra Məstəli yenə səyahət qəsdilə Ərəbistanın çox yerlərini və qərbi-cənubunda olan şəhər və qəsəbələri gəştü güzar edib, oradan Həbəşə keçibdir və bir az vaxt orada iqamət edəndən sonra Məkkəyə qayıdıbdır. Məkkədən Mədinəyə və Mədinədən Əlqahirəyə, oradan Qüdsi-Xəlilə və Qüdsdən Arçıblaq[195] cəzirələrinin bə'zini seyr edib İstanbul tərəfinə azim olubdur və İstanbulda bir müddət iqamət etdikdən sonra – Rumeli şərqinə və Bolqarıstana gedib, o yerlərin əhalisi və övza'ı ilə filcümlə tanış olur və bəd yenə İstanbula qayıdıb və oradan Anadoluya, Diyarbəkr vilayətində və Diyarbəkrdən Ermənistana və buradan Azərbaycan səmtinə azim olur. Azərbaycanın bir çox yerlərini gəzdikdən sonra Tehrana səfər edir.

* Burada "şah" ləfzi dərvişlərə mənsub bir ləqəbdəir. Məmləkət və səltənət sahiblərinə verilən "padşah" və "şah" kəlmələri ilə bunu qarışdırmamaq.

Məstəli Şirvani hər iki səyahətində dünyanın yarısını gəştü güzar edib, altmışdan ziyadə müxtəlif ayin və adət üzrə yaşayan və yek-digərinə zidd və müğayiri-din və məzhəb, ehkam və üsulunu icra edən miləl və əqvam ilə tanış olubdur və "Riyaz" adlı kitabında yuxarıda zikr olunan dinlər və məzhəblər babında və hər bir yerin tarix və coğrafiyasına və əhalisinin məişətinə dair ətraflı mə'lumat veribdir. Məstəli Şirvani bir neçə vaxt dərviş-məczub Əli şah Həmədaninin yanında qalıb, Ne'mətullah məzhəbilərin şeyxi və müəllimi olmağa xeyir-dua ilə icazə alıbdır. Amma dünyagir və nəfspərəst üləmadan bə'zi onun ziddinə gedib, ədavət başlayıblar və onu dini-islama müğayir başqa bir əqidədə olmaqla Fətəli şahın nəzərində müttəhim və müqəssir ediblər.

Məzkur şahın qəzəbindən ehtiyat edib, Məstəli Şirvani əvvəlcə Şiraza və oradan Kirmana azim olur. Kirman hakimi İbrahim xandan çox iza və cəfalar çəkib axırda öz vətəni Şirvana müraciət eləyir və burada hicrətin 1236-cı tarixində – ki, miladın 1821-ci salına mütabiqdir, – evlənir. Amma vətənində çox vaxt sakin olmaq ona nəsib olmur. Təəhhülündən bir il sonra vəba naxoşluğu düşür və çox adamlar tələf olur. Məstəli əyalını götürüb İrana gedir. Bir az İsfahanda və bəd Qum şəhərində sakin olur və burada öz "Səyahətnamə"sini yazır"[196].

Abbasqulu ağa Qüdsinin zamanında Məstəli Şirvani Şirazda olurmuş və özü də həm ərkani-dövlət indində və həm camaat nəzərində möhtərəm və müzzəz bir alim sayılırmış.[197]

Burada adları zikr olunan məşhur qələm əhllərindən və üləmadan başqa Qafqaziyada hər bir əsr və zamanda sair möhtərəm və danişmənd şəxslər dəxi vücuda gəlibdir ki, özlərindən sonra əsərləri qalıbdır və o əsərlər cümlə ürəfa və ərbabi-kəmal indində məqbuldur. Mərhum Abbasqulu ağa onların tərcümeyi-hallarına dair mə'lumat verməyibdir; ancaq ismi-şəriflərini zikr etməklə iktifa edibdir. Şeyxlərdən məşhuru bunlar olub: "Səlyanda Əbuəli Rudbari Səlyani, Şabranda Şeyx Yaqub Çərxi, Qubada Şeyx Əbdülkərim və Şirvanda Baba Rüknəddin Şirvani. Üləmadan: Sidqullah Bərdəvi, Hənəfi Qarabaği, İbrahim Ərşi, Ağdaşda Bürhanəddin Ağdaşi, Şəkidə Əbdürrəhim əfəndi Şəkui, Məhəmmədəmin əfəndi, Əyyub əfəndi, Baba əfəndi, Şirvanda Axund Şərif Şirvani, Bakıda Axund Nəcəfəli Badkubeyi və Dərbənddə Mollaağa Dərbəndi.

Şüəradan: Nişat, Ağaməsih Şirvani, Mirzə Əsgər, Zülala Şirvani, Yusif Kosa, Asəf, Molla Pənah Vaqif, Molla Vəli Vidadi, Mirzə Məhərrəm Məriz Qarabaği və Fətəli bəy Hali Ziyadoğlu Gəncəvi.[198]



Dağıstanda məşhur üləmadan bunların adları zikr olunur: Məhəmməd Qədəqi, İbrahim Ürəvi, Fazil İmaqi, Yusif Zərif Qumuqi, Davud Üsuli, Seyid Şünasi.

Yuxarıda isimləri zikr olunan şüəradan – ki, cümləsi xan əsrlərinə mənsubdurlar, ən məşhuru Molla Pənah Vaqifdir ki, öz əsərinin və ondan sonra vücuda gələn bir çox şüəranın ustadı və pişrəvi olubdur. Sadə ana dilimizin şivəsində əvvəlcə şeir yazan Molla Pənah Vaqif olubdur.

Kitabımızın əvvəlinci cildindən Molla Pənah dövrü başlanır. Çün Molla Pənah cavanlıq sinnindən əsl vətəni olan Qazax mahalını tərk edib, Qarabağ xanlığına hicrət eləyibdir və orada İbrahim xanın ən müqərrəb adamlarından birisi olub və ömrünün axırına kimi Qarabağda qalıb namü şöhrət qazanıbdır, ona binaən onun tərcümeyi-halına rücu etməkdən müqəddəm lazım bildik ki, yeni bina tutmuş Qarabağ xanlığının övza'vü əhvalından şəmməi mə'lumat verək; gir halda ki, şairin sərgüzəştini Qarabağ xanlığının tarix və keyfiyyətindən ayırmaq olmaz və bundan maəda Şuşa şəhəri mənbeyi-fəzl və kamalat olub, bir çox mahir ədiblər və rəvantəb' şairlər ərseyi-vücuda gətiribdir.

# QARABAĞ – ŞUŞA ŞƏHƏRİ

Sabiqdə Şuşa şəhəri Qarabağ xanlarının paytaxt şəhəri hesab olunurmuş. Bu şəhərin banisi Pənahəli xan[199] olubdur. Şəhərin tə'mir və binası vaqe olubdur 1170-ci sənədə ki, tarixi-məsihiyyənin 1757-ci ilinə mütabiqdir.[200] Bu şəhər əvvəlcə öz banisinin adı ilə adlanırmış, Pənahabad. Sonradan şəhərin üç-dörd verstliyində olan Şuşa kəndinin adı ilə təsmiyə olundu. Pənah xan mərhum Şuşa şəhərini tə'mir və təsis edib, ətrafına möhkəm hasar çəkdirdi və sonra hamı xalqa müəyyən yurd və məkan göstərib, fəraqət dolanmaqlarına lazımi binagüzarlıq edibdir və yeni bina etdirdiyi şəhərin adı ilə gümüş pul zərb etdirdi – "Pənahabad" ki, rusların indiki gümüş üçşahılığı vəznində imiş.

Mə'lum ola ki, Pənahəli xanın əsli Qarabağlıdır və Sarıcalı qəryəsindəndir və Sarıcalı onun babalarından birisinin adı ilə – ki, Sarıcalı imiş, – təsmiyə olunubdur.

Mərhum Mirzə Cəmal[201] öz tarixində Pənahəli xanın abavü əcdadı şə'nində belə yazır: Pənah xanın ata-babaları həmişə Cavanşir elinin içində məşhurü mə'ruf və sahibi-ismü rəsmü nan və sahibi-hörmətü dövlətü ehsan olublar. Atasına İbrahimxəlil ağa deyərlərmiş. Çox qövmü qəbilə və əqrəba arxası çox olan şəxs imiş ki, dövlət və ne'məti bipayan və avazəsi və şöhrəti məzkurul-lisan olmuş, necə ki, Ağdamda Tağbənd damı və divarı və Arasbarda çarpasının mərateyi və asarı və yaylaqda dəxi İbrahimxəlil ağa qalaqı (qalası), məşhur olan imarəti və nişanəsi vardır. Bunların hamısı onun sahibi-dövlət və hişmət olmağına dəlil və şahidibibədəldir.

Zəmani ki, Nadir şah Əfşar indiki Zaqafqaziya vilayətlərini – ki, ibarət ola Gəncə, Tiflis, Qarabağ, Şirvanat və sair yerlərdən, – öz təsəllütünə götürdü, öz adət və qaydasına görə hər bir el və oymağın içində bir rəşid, qoçaq və kardan adam olsa idi, onu gətirdib öz hüzurunda xidmətkar edərdi və ləyaqətinə görə ona mənsəb və məvacib verərdi, o cümlədən Cavanşir elindən dəxi İbrahimxəlil ağanın qabağınca böyük oğlu Fəzləli bəyi və onun vəfatından sonra Pənahəli bəyi gətirdib hüzurunda xidmətkar elədi. Tezliklə onun ziyadə fərasətli və rəşid olmağını görüb, hüsni-xidməti və sədaqəti əvəzində məvacib və rütbəsini artırdı və ol vaxtlarda Rum qoşunu ilə – ki, Abdulla paşa Köprülüoğlunun sərkərdəliyində idi, – Nadir şahın neçə yerlərdə böyük davaları vüqua gəlibdir və bu davalarda Pənah xanının artıq rəşadət və hünərləri Nadir şahın daha da ziyadə iltifat və şəfəqqətini cəlb eləyir və lakin bir neçə paxıl və şərir kəslər Pənah xanını bu minval tərəqqi tapmağına həsəd aparır, ondan



bədgüluq etmək binasını qoyurlar və Nadir şahın hüzurunda onu müqəssir edib, qətlinə fitva verirlər. Pənah xan əhvalı bu növ ilə görüb, canının qorxusundan fürsət tapıb, Nadir şah Xorasanda olan vaxtı bir neçə nəfər əqvami-müxlisələrdən özü ilə müttəfiq görüb, Qarabağ vilayətinə qaçır. Nadir şah Pənah xanın qaçmağından çox qəzəbnak olub, dalınca çaparlar göndərir ki, onu yoldan tutub gətirsinlər. Amma müyəssər olmayıb və Qarabağda dəxi onun tutulmağına çox sə'y və təlaş edirlərsə də, bir şey bacarmırlar. Ancaq onun elindən qövmü əqrəbasını və əhlü əyalını Nadirin hökmü ilə Xorasan məmləkətində Sərəxs torpağına sürürlər. Sonralardan 1160-cı[202] tarixində Nadir şah Xorasanda qətlə yetəndən sonra Pənah xan qorxudan çıxıb, Qarabağın içində özünü zahir edibdir. Bu vaxta kimi Pənah xan gah Qarabağın dağlarında və meşələrində öz xəvasları il əvə bir para əqrəbaları ilə quldurmanənd dolanarmış və gah Şəki vilayətində və Qəbələ mahalında ovqat keçirərmiş. Nadir şahın qətlindən sonra onun hökmü ilə Xorasana sürgün olan Qarabağ elatı əzancümlə Pənah xanın əhlü əyalı böyük oğlu İbrahim xan ilə bir yerdə xudsər köçüb öz əsli vətənlərinə qayıdırlar.

Mərhum Pənah xan çox tədbirli, aqibətəndiş və karkön bir adam imiş. Özünün hökumət və istiqlaliyyətini möhkəmləndirmək üçün Qarabağın qoçaq və rəşid cavanlarından özünə bir dəstə mükəmməl atlı saz eləmişdi. Çün ətrafdakı vilayətlər – Şəki, Şirvan, Gəncə, İran, Qarabağ xanları onunla düşmən idilər, özünü bunların hücumundan eymən və salamat saxlamaq üçün əvvəlcə 1161-ci[203] ildə indiki Kəbirli mahalında Bayat qalasının binasını qoydu. Üç-dörd il bu qalada sakin olub, sonra görür ki, bu yer münasib deyil, özü də aranzəmindir və əhli istidən zəhmət çəkir. Onda Tərnakut yaxud Tərnaut qalasının bina etdirir ki, "Şahbulağı" adı ilə məşhurdur. Bu qalanın binası 1165-ci sənədə – ki, tarixi-məsihiyyənin 1752-ci sənəsinə mütabiqdir, – vaqe olubdur. Beş sənə də bu Tərnakut qalasında qalıb, sonradan indiki Şuşa qalası olan məhələ hicrət edir. Çünki ol vaxtı Azərbaycan hakimi Məhəmməd Möhsün xandan çox ehtiyat olunurdu ki, İran qoşununu Qarabağa çəkib, onun əmval və ehşamı payimal olunsun. Şuşa qalasının yeri çox möhkəm və ətrafı sıldırım qayalar və dərin dərələr olmağa görə, onu təsxir eləmək hər halda mümkün deyildi. Odur ki, neçə dəfə Qızılbaş qoşunu onun üstünə gəlib, onu mühasirə ediblərsə də, fəthində aciz qalıb, mə'yus və pərişanhal geri qayıtmağa məcbur olublar.

Qarabağ vilayətinin Rusiyaya mülhəq olması Pənah xanın oğlu İbrahim xanın vaxtında, 1804-cü sənədə vaqe olubdur. Haman sənədə qış fəslində İbrahim xan mərhum və oğlanları Məhəmməd Həsən ağa və

Mehdiqulu ağa ilə və Qarabağın bir neçə mütəşəxxis bəyləri və ə'yanları ilə şəkili Səlim xan ilə – ki, onun damadı idi, – Kürək çayında knyaz Sisianov ilə görüşürdü və burada cəşn və ziyafətlərdən sonra miyanlarında mühavirat və müahidat vaqe olub, hər iki canibdən binayü-əhdü peyman qoyuldu və şürutnamə yazıldı. Mərhum İbrahim xan və sərdar Sisianov öz möhürləri və dəstxətləri ilə haman şürutnaməni imza qıldılar.[204] Bu əhdnamənin hökmüncə İbrahim xan dövləti-Rusiyyəyə itaət etməyi qəbul etdisə də, amma həm özü və ondan sonra nə qədər varisi vardır nəslən bə'di-nəsl imperaturi-əzəm tərəfindən Qarabağ vilayətində bilistiqlal hakim olmaqları təsdiq olunur və bu məclisdə İbrahim xana general-leytenantlıq və səlim xana general-mayorluq, Məhəmməd Həsən ağaya və Mehdiqulu ağaya polkovniklik çini verilmək üçün sərdar Sisianov tərəfindən vəsatət olundu və lakin Sisianov Bakıda məqtul olandan sonra İbrahim xanın meyli bir növ İrani dövlətinin tərəfinə dönür. Şuşa qalasında duran bir fövc batalyon rus qoşunundan böyük mayor Lisaneviç bir para şərir və həli-qərəz adamların təhrik və iğvası ilə gecə vaxtı iki yüz soldat götürüb, şəhərin iki verstliyində İbrahim xanın olduğu səngəri əhatə edir və tamamını böyük zülm və ədalətsizliklə qətlə yetirir.

İbrahim xandan sonra onun yerində oğlu Mehdiqulu xan canişin olur ki, onun qızı şairə Xurşidbanu "Natəvan"[205] təxəllüs Şuşa şəhərində 1315-ci[206] sənədə və Xurşidbanunun oğlu Mehdiqulu xan "Vəfa" təxəllüs 1318-ci[207] sənədə Tiflis şəhərində vəfat ediblər.

Şuşa qalası Zaqafqaziyanın gözəl və basəfa şəhərlərindən birisi hesabı olunurdu və axır vaxtlarda artıq sürət və abad olmağa üz qoymuşdu. İçində çox gözəl imarətlər yapılmışdı. Yay fəslində altmış-yetmiş minə qədər nüfus bu şəhərə cəm olurdu, çünki Şuşanın abü-havası xeyli saf və salamat olmağa görə, yaylaq mənzələsindədir. Qarabağın tarixinə və sair övza'vü əhvalına dair bir para mə'lumat Molla Pənah Vaqifin tərcümeyi-halı nəql olunduqda söylənəcəkdir.

Şuşa şəhərinin ab-havasının tə'sirindən və torpağının bərəkətindən burada çox zürəfa, üdəba və şüəra vücuda gəlibdir. Belə ki, Şuşa qalası Zaqafqaziyanın Şirazı[208] mənzələsində olub, ərbabi-zövqü səfa oymağı və əhli-hal və sahibi-dil yatağı hesab olunur. Şuşa əhli həmişə eyşü işrətdə olub, günlərini gəzməkdə, seyrü səyahətdə keçirirdilər və buranın sazəndə və xanəndələri indi də məşhuri-cahandır.

Heyfa ki, 1905-ci ildə erməni və müsəlman davasında bu şəhər ermənilərin cahilinə rəftarı və vəhşiyanə kiridarı ucundan yanıb zir-zəbər oldu. Yüz ildən bəri babaları ənvayi-zəhmət və məşəqqət çəkib, külli məxaric və



məsariflər töküb abad elədiyi vətəni bu gün onun cünunluq mərəzinə mübtəla olmuş övladı belə rəhmsiz və ağılsız viran olmağına canlarını nisar elədilər. Yüz ildən bəri iki mehriban qonşu kəmali-sədaqət və məvəddətlə bir yerdə dolanıb, bir hava ilə nəfəs alıb, asudə və mürəffəhülhal zindəganlıq etməklərindən güya diltəng və narazı olub, bir-birlərinin canına və malına yağı olmaqları qəribə bir hal heyrətəngiz bir sirrdir.

Bu halda Şuşa şəhəri əhalidən, demək olar ki, boş qalıbdır. Az-çox varı və tavanası olanlar qeyri bilad və ölkələrə hicrət edib, hər birisi bir növ güzəran etməkdədirlər. Şəhərdə qalanlar ancaq əlsiz-ayaqsız, əhli-kəsbü sən'ətdir ki, onların də məişəti tərəddüd və alış-veriş olmadığına görə, artıq dərəcədə çətinlik ilə keçir.

# MOLLA PƏNAH "VAQİF" TƏXƏLLÜS

Azərbaycan türklərinin məşhur və müqtədir şairi Molla Pənah hesab olunur ki, bizim ədəbiyyatımızın banisi və müəssisi adlanmağa onun haqqı vardır. Molla Pənah öz zamanında bir çox ülum və fünuna vaqif olduğu üçün özünə "Vaqif" təxəllüs ittixaz etmişdir. Müasirləri onun dərin elmini və mollalığını müşahidə edib haqqında demişdir: "Hər oxuyan Molla Pənah olmaz!" və bu istilah indi də Zaqafqaz türkləri arasında bir məsəli-məşhurdur. Milli şairlərimizdən onun kimi sadə və açıq lisanda və ana dilimizin şivəsində şeir və qəzəl yazan az olubdur. Müasirləri ona nəzirə yazmağa sə'y və təlaş ediblərsə də, onun kimi mühəssənatlı, gözəl və açıq kəlam söyləməkdə aciz qalıblar.

Vaqif ziyadə zövqü səfa əhli olduğu üçün gözəl mədhində xeyli mərğub və nazik şeirlər yazmışdır ki, onların cümləsi qəlbdən nəş'ət edən hissiyyatdır ki, oxuyanlara dəxi sirayət edib, onları şövq və həvəsə gətirir. Molla Pənah artıq fəsih və şirinzəban və hazırcavab bir vücud imiş ki, hər qisim mətləbi öz məqamında, münasibi-hal söylər imiş. Onun həməsri aşıq Əli Qaracadaği Kəlibəri[209] Molla Pənahı bu gunə tə'rif edibdir:

Bu gövhər sözlərin, ey alicənab,
Tamam aşiqlərin səminə gəlmiş.
Fəsahətdə, bəlağətdə sənin tək
İnanma ki, ruyi-zəminə gəlmiş.

Bu əsrdə şairlərin xanisən,
Müdərrisə bərabərsən yə'ni sən,
Elmin mədənisən, gövhər kanisən,
Eşidənlər sözün dəminə gəlmiş.

Aşiq oldum bir qaməti-rə'nayə,
Onu sevdim, canım düşdü bəlayə,
Vallah, billah, sən düşdüyün sövdayə,
Artıq mən fəqirin sərinə gəlmiş.

Əli çəkər gecə-gündüz ahü zar,
Kəsildi müdara, getdi ixtiyar,
Vaqif olsun bu mə'nadan xəbərdar,
Mədinə kuyinə Səkinə* gəlmiş.

* Səkinə Aşıq Əlinin arvadının adıdır. Qaracadağdan Qarabağa gələndə Aşıq Əli öz hərəmini dəxi özü ilə gətirmişdi və Molla Pənahın övrəti Mədinə ilə Səkinə görüşübdür. Bu axırkı fərd ona işarədir.



Molla Pənahın əsli Qazax mahalından, bir rəvayətə görə Həsənsu kəndindən və qeyri bir rəvayətə görə Salahlı qəryəsindəndir[210]. Axırıncı rəvayətin doğru olmağına bir para dəlillər mövcuddur. Belə ki, Molla Pənahın nəslindən indi də Salahlı qəryəsində vardır ki, "Mehdioğlu" ləqəbi ilə məşhurdurlar. Çünki Molla Pənahın babası Mehdioğlu adlanırdı və onlar Sarıqamış adlanan yerdə olurdular. Sarıqamış keçmişdə Salahlı qəryəsinin səfalı bir hissəsi idi. Mə'lum ola ki, Salahlı qəryəsi Molla Pənahın əsrində özgə bir məkanda idi. Onun mövqeyi Kür çayının sağ tərəfi idi və özü də çaya çox yavuq idi. Müruri-əyyam ilə yaz fəslində məzkur çay daşdıqca Salahlı kəndini basıb və qumsal yerləri yuyub və orada olan dam-daşları uçurub tələf edib. Ona binaən Salahlı əhalisi əvvəlki yurdlarını tərk edib kənara açıqlığına çıxıblar və bu halda basəfa yerdə özləri üçün gözəl tə'mirat tikdirib orada olurlar.

Molla Pənahın Salahlı qəryəsindən olmağına öz yazdığı şeirlər dəxi şəhadət verir. İbrahim xan bir vaxtı Tiflisə səfər edəndə Molla Pənahı dəxi özü ilə aparıb[211] və əsnayi-rahda Molla Pənah xandan izn alıb, öz vətənini və qohum-əqrəbasını ziyarət etmək üçün gəlibdir. Və lakin burada bir neçə gün iqamət etdikdən sonra öz əhlü əyalının müfariqətinə tab gətirməyib, münasibi-hal bu fərdləri deyibdir:

Vətən xoşdur, deyə, Vaqif, məni çəkdin Salahlıya;
Nədir onda səlahın kim, çü yari-canfəza yoxdur.
Əzəl başdan şəkərləblər olurdu Sarıqamışda*,
Gəlib sordum sorağın, şimdi onlardan səda yoxdur[212].

Hicrətin 1172-ci ilində – ki, tarixi-məsihiyyənin 1759-cu sənəsinə mütabiqdir, – Gürcüstan padşahı İrakli xanın vaxtında və Qazax mahalının vəkili Pənah ağanın zamanında bir para şuriş və inqilabın vüququna görə Qazax mahalından bir neçə elat Gürcüstan hökumətinin zülm və təəddisindən təngə gəlib, Qarabağ vilayətinə köçüb gediblər. Məzkur elat bunlardır: Qaraçarlı, Cinli, Salahlı, Dəmirçihəsənli, Qızılhacılı, Qaraqoyunlu, Alpaut, Səfikürd, Boyəhmədli, Kəngərli, Xəlfəli və qeyriləri. Bu köçmək elat içində "eldöndü" adlanır. Məzkur elatın təmamisi köçməyib, onlardan bə'zi oymaqlar öz vətənlərində qalmağı qürbət vilayətə köçməyə tərcih ediblər.

Molla Pənah dəxi öz obası ilə müttəfiq Qarabağa hicrət edib Cavanşir mahalında sakin olur. Mə'lum ola Qazaxdan köçən obaların çoxusu Cavanşir mahalında Tərtərbasarı özləri üçün məhəlli-iqamət intixab ediblər. Molla Pənah bir neçə vaxt təzə vətənində qalıb, oradan Şuşa şəhərinə

* Sarıqamış Salahlı qəryəsində bir yerdir ki, orada ələn da qamış bitir.

azim olur. Əvvəl vaxtlarda Molla Pənahın məaşı çox təng keçirmiş. Bu barədə həzl təriqi ilə münasibi-hal bu şeirləri yazıbdır ki, onun pərişan halını və şikəstə xatirini eyni ilə bəyan edir:

Bayram oldu, heç bilmirəm neyləyim,
Bizim evdə dolu çuval da yoxdur.
Dügiylə yağ hamı çoxdan tükənmiş,
Ət heç ələ düşməz, motal da yoxdur.

Allaha bizmişik naşükür bəndə,
Bir söz desəm, dəxi qoymazlar kəndə,
Xalq batıbdır noğla, şəkərə, qəndə,
Bizim evdə axta zoğal da yoxdur.

Bizim bu dünyada nə malımız var,
Nə də evdə sahibcəmalımız var,
Vaqif, öyünmə ki, kamalımız var.
Allaha şükür ki, kamal da yoxdur[213].

Molla Pənah ziyadə maddəli, elmli və zirək bir adam olduğuna görə, əlbəttə, həmişə zillət və üsrət ilə güzəran etməyəcək idi. Onun ağır günləri və kasıblığı tezlik ilə xeyrə və xoş günə mübəddəl oldu. Qala[214] şəhərinə varid olandan sonra Molla Pənah, bə'zi rəvayətə görə, indiki Saatlı məhəlləsində tə'limi-ətfal üçün bir məktəb açır. Şuşa şəhərində əvvəl güşad olan Molla Pənahın məktəbi olubdur. Burada Molla Pənah uşaqlara dərs deməyə məşğul olub, yavaş-yavaş təzə bina olunmuş şəhərdə özünə dost və aşina cəm eləyir. Öz fitrət və qabiliyyəti sayəsində az vaxtda şöhrət və hörmət kəsb edib, Qarabağın ə'yan və əşrafı arasında mötə'bər və ləyaqətli adamlardan birisi hesab olunur.

İbrahim xanın müqərrəblərindən bir nəfəri onun yaxın dostu imiş və xanın sarayında olan əhvalatdan həm də Molla Pənaha söylərmiş. Molla Pənah artıq həvəs və diqqətlə haman əhvalata və xandan sadir olan hökm və əmrlərə qulaq asarmış. Bir dəfə xanın bir şikayətçiyə etdiyi ziyadə biməzmun və gülünc binagüzarlığını Molla Pənah eşidib, öz xəyalından keçirir ki, mən tezlik ilə gərəkdir xana müdəbbir və məsləhətçi olam. Və filhəqiqətə çox çəkmir ki, Molla Pənahın tə'rif və tövsifi xanın qulağına çatıb, onu hüzuruna də'vət eləyir və xan mollanın elmü kəmalına və ədəbü əxlaqına diqqət yetirəndən sonra onu bəyənib, eşikağası mənsəbini ona verir və sonralardan Molla Pənahın kəmalının dərəcəsini və sahibiəqlü tədbir olmasını anlayıb, onu özünə əvvəlinci müdəbbir eləyir. Belə ki, xanın cəm'i işlərinə dəxl və təsərrüfü olur.



Molla Pənahın Qarabağa, İbrahim xanın qapısına düşməyinə özgə bir rəvayət də budur ki, Molla Pənah Daşsalahlıda məşhur Şəfi əfəndidən elm təhsil edir imiş. Daşsalahlıda molladan bir xəta üz verməyə görə, orada artıq qala bilməyib gedir yaylağa. Çün o vaxtı yay mövsümü imiş. Şəfi əfəndi Molla Pənahın dağa getməyindən xəbərdar olub izhari-təəssüf edir ki, heyfa ki, Molla Pənah elmini tamam eləmədi və öz arvadına deyir ki, sən axırda eşidərsən ki, Molla Pənah böyük bir şəxs olacaqdır. Çünki o, çox zirək, maddəli və cövhərli adamdır.

El dağdan enəndə Molla Pənah vətəninə qayıtmayıb, Gəncə tərəfə azim olur və orada Şah Abbas məscidinin canibindəki hücrələrin birisində özünə sığınacaq tapıb yenə başlayır təhsili-elmə məşğul olmağı. Bu heyndə Qazax mahalından bir qarının oğlu Cavad xanın əmri ilə Gəncədə dustaq imiş. Arvad məscidə gəlir ki, xana ərizə yazdırıb versin, taki xan onun oğlunu azad eləsin.

Molla Pənah qarının ərizəsini yazıb verir və ona bərk tapşırır ki, xan soruşsa, deməsin ki, ərizəni kim yazıbdır.

Qarının ərizəsi Cavad xana ziyadə xoş gəlir və ondan soruşur ki, bunu kim yazıbdır. Qarı əvvəlcə cavab vermir. Amma xan tə'kid edəndən sonra Molla Pənahı nişan verir. Xan Molla Pənahı hüzuruna çağırıb, ondan soruşur ki, bu ərizəni sənmi yazıbsan? Molla cavab verir ki, bəli, mən yazmışam. Xan ona tapşırır ki, bundan sonra mənə hər nə ərizə yazılsa, tamamını sən yaz və hər birinə bir qızıl qələmhaqqı al və Molla Pənah bu sayaq edirmiş. Bir neçə vaxtdan sonra İbrahim xan Gəncəyə Cavad xanın mülaqatına gəlibmiş. Burada İbrahim xan Cavad xandan bir qabil mirzə təmənna edir. Cavad xan Molla Pənahın elm və məharətini ona tə'rif edib, öz qonağına mirzə verir və ona tapşırır ki, oradan mərhəmət nəzərini kəsməsin. İbrahim xan xoşhallıq ilə onu qəbul edib, özü ilə Qarabağa aparır, orada onu özünə ən müqərrəb şəxslərdən biri edir.

Amma bizim anladığımıza görə, əvvəlki rəvayət gərəkdir artıq səhih olsun və Əhməd bəy Cavanşir* dəxi Molla Pənahın barəsində rus dilində yazdığı bir fəqərə ona şəhadət verir ki, Molla Pənah öz elatı ilə XVIII əsrin əvaxirində Qazax mahalından köçüb Qarabağa gəlmişdi[215]. Əvvəl dəfələrlə Mollanın artıq üsrət ilə güzəran etməyini Əhməd bəy də təsdiq edib, sonralardan onun öz elm və mə'rifəti səbəbindən xana müqərrəb olmasını göstərir.

* Əhməd bəy Cavanşir ziyadə mə'lumatlı ədiblərimizdən birisi hesab olunur. On sənə bundan əqdəm vəfat edibdir. Onun babası Məhəmməd bəyin əmri ilə Molla Pənah qətlə yetibdir. Əhməd bəyin barəsində gələcəkdə danışılacaqdır[216].

1209-cu səneyi-hicriyyədə – ki, miladın 1795-ci ilinə mütabiqdir, – Ağa Məhəmməd şah əsakiri-əzim və ləşkəri-kəbir götürüb, Qarabağı və Tiflisi və İrəvan və Gəncə və Talış vilayətlərini təsxir etmək üçün rö'yəti-əzimət əfraştə edib Azərbaycana varid oldu. Onun məşhur sərkərdəsi şahsevən Əliqulu xanı bir para sair xanlar ilə İrəvan qalasını təsxir etmək üçün tə'yinü müqərər buyurub, özü dəxi İran qoşunun tamamən götürüb, cəmiyyəti-firavan və əsakiri-bipayan ilə Şuşa qalasın təsxir etməyə və İbrahim xana tənbeh etməyə Arazdan keçib, Qarabağa varid oldu və qalanın on iki mənzilliyində ordusu ilə düşüb aramyab oldu. Mə'lum ola ki, ol vaxtda Tiflis valisi İrakli xan və İrəvan hakimi Məhəmməd xan və Talış hakimi Mirmustafa xan İbrahim xan ilə and içib sözbir olmuşdular ki, heç vaxt Ağa Məhəmməd şahın itaətini qəbul etməyib bir-birilə müttəfiq və həmrə'y olsunlar. Bu əhdə görə, Qarabağın elat camaatından xan bir parasına izn vermişdi bə'ziləri Tiflis səmtinə və bə'ziləri İrəvan səmtinə getmişdilər və baqi elatın ki, əksəri dəftərdə və siyahidə qoşun cümləsindən idilər, Qarabağın dağlarında və qalanın içində sakin olub, çox süvarə və piyadə böyük və kiçik toplar ilə amadeyi-cəng olub, qaladarlıq əsbabına məşğul var idilər. Otuz üç gün Ağa Məhəmməd şah qalanın həvalisində əyləndi və o qədər sipahi-əzim ilə qadir ola bilmədi ki, qalanın üç-dörd verstliyində olan Şuşa çayının kənarına yavuqlaşa bilsinlər.

Qarabağın atlı və piyada qoşunu, elat və dehat əhlləri və mahali-Dizaq və Vərəndə və Xaçın məlikləri dərələrdə, meşələrdə və güzərgahlarda qarət və təsəllüt əllərin qızılbaş qoşununa açıb, hər gün onlara zərərlər yetirib və kəsiblər gətirib müzahim olurdular. Mərhum Mirzə Cəmal vəzir Qarabaği yazır ki, "ol vaxtda mən həm özüm İbrahim xanın hüzurunda idim və hər gün sadir olan vaqeatı, vəqaye və əhvalatı görürdüm və Qarabağ əhli – müsəlman və erməni külli qoşun ilə xanın hüzurunda cəngə amadə durmuşdular. Bir gün Ağa Məhəmməd şah xanı qorxutmaq və xövfə salmaq üçün bu fərdi münasibi-məqam bilib, divani-qəsaidi-Seyid Məhəmməd Şirazi təxəllüsdən İbrahim xana yazıb göndərdi:

Ze məncənəqe-fələk sənge-fetne mibarəd,
To əbləhane gerefti miyane-Şişe qərar[217].

Bu kağız xana yetişən kimi verdi öz nədimi-həzrəti və müşiri-məmləkəti Axund Molla Pənah "Vaqif" təxəllüsə. Axund mütaliə edib, filfovr haman məktubun dalına bu fərdi özü inşa edib xana verdi və o da geri yollandı. Haman fərd budur:



Gər negəhdare-mən anəst ke mən midanəm,
Şişera dər bəğəle-səng negəh midarəd[218].

Elə ki, Ağa Məhəmməd şah bu kəlamı oxudu, atəşi-qəzəbi cuşa gəlib, əmr elədi ki, qalanı gülləbaran edib, saiqəbar və atəşkirdar toplara od qoysunlar. Amma nə xan və nə onun ə'yanü ənsarı və dilavər qoşun sərkərdələri əsla qorxmayıb, bu gunə təhdidatı nəzərə almadılar və gecə-gündüzlər Qarabağın atlı və piyada qoşunu fövc-fövc yolları kəsib, Ağa Məhəmməd şahın ordusuna gələn azuqə karvanını və ordudan kənara çıxan qoşun əhlini və ulağını tutub öldürüb, əsir və qarət edib, xanın hüzuruna gətirirdilər. Neçə dəfə Ağa Məhəmməd şah öz külli qoşunu ilə hücum etdi ki, qalanı təsxir eləsin, amma İbrahim xanın rəşid və qoçaq süvarə və piyadə əsakiri və dilir olan sərkərdələri onun müqabilinə çıxıb, mərdanə dava edib, onu mə'yus və məğlub geri qaytardılar. Axırda Ağa Məhəmməd şahın əli puça çıxıb, Gürcüstan səmtinə üz qoydu. Çiləbörd mahalının məliki Məlik Cünun və Gəncə xanı Cavad xan Ağa Məhəmməd şahı Qarabağdan salamat çıxarıb, Tiflis səmtinə vali üstünə aparmağa bələdlik və dəlillik etdilər. Ağa Məhəmməd şah Tiflis şəhərini fəth və qarət edəndən sonra Muğan səhrasına qayıtdı, bu qəsd ilə ki, qış fəslini orada keçirib, baharda yenə Şuşa qalasının üstə gəlsin. Amma qışın axırlarında şaha İrandan xəbər gəldi ki, Şiraz və Kirman vilayətlərində inqilab düşübdür. Lütfəli xan Zənd şaha yağı olub, ol vilayətlərə təsəllüt tapıbdır. Bu xəbəri eşitcək Ağa Məhəmməd şah Qala üstə gəlməyi mövquf edib, İran səmtinə mütəvəcceh oldu.

Bu halda Rusiya sərdarı general Zubov Yekaterinanın əmri ilə Gürcüstan padşahı İraklinin istimdadına Dərbənd şəhərinə yetişdi və Qalanı müsəxxər qılıb, Səlyana gəldi və oradan Şamaxı həvalisinin qürbündə ordusu ilə bir gözəl səhrada əyləşdi. İbrahim xan öz oğlu Əbülfət xanı Qarabağın neçə şayistə bəyzadələri ilə cins atlar və mərğub töhfə və hədiyyələr ilə Zubovun hüzuruna göndərib, kəmali-riza və rəğbət ilə öz xahişilə Rusiya dövlətinə dil verib, izhari-itaət qıldı. Və xülusi-təmam ilə bir ərizə Molla Pənaha yazdırıb, imeratoriçə Yekaterinaya göndərdi.

General Zubov Əbülfət xana və onunla gələn bəyzadələrə və sair elçilərə artıq hörmət və izzət göstərib, xanın ərizəsini mərsul olunmuş mö'təmid ilə öz eşikağasına qoşub, Rusiya imperatoriçəsinin qulluğuna göndərdi və İbrahim xana yaxşı və ləyaqətli tövfələr göndərdi və onların cümləsindən mürəssə cəvahirli əsa xanın müşiri Molla Pənah Vaqifə tərsil elədi.

Hicrətin 1212-ci sənəsində – ki, tarixi-məsihiyyənin 1797-ci ilinə mütabiqdir, – Ağa Məhəmməd şah ikinci dəfə, bahar mövsümü olanda

sipahi-besyar və əsakiri-bişümar ilə Qarabağa, Şuşa qalasının üstə gəlməyə azim oldu və İbrahim xanın rus imperatoruna itaət göstərməyini eşitmişdi. Ona görə xana onun ədavət və küdurəti həddən ziyadə idi. Çün o vaxtı Qarabağ vilayətinə afəti-səmavi və ərzi üz vermişdi və böyük aclıq və qəhətlik hüsula gəlmişdi və necə ki, bu aclığın barəsində Qarabağın məşhur müvərrixi Mirzə Cəmal yazır: "Buğdanın bir çetverti (yə'ni səkkiz pudu) yüz manata, arpa və darının çetverti altmış manata çətinlik ilə tapılırdı və xalq at, eşşək və qatır əti yeyirdilər. Onların, əlbəttə, dava və döyüş etməyə qüvvət və tavanaları yox idi və hərə bir tərəfə dağılmışdı. Çox adamlar aclıqdan həlak olurdular. İbrahim xan gördü ki, Ağa Məhəmməd şahın hücum və hərəkətinə müqabilə etmək qeyri mümkündür, ona görə labüd öz evini və ətfal-əyalını və cannisar olan mülazimlərini və bir para mə'ruf və xəvassları özü ilə götürüb, Dağıstanın car və Tala vilayətinə azim oldu və orada Bələkanda Ümmə xanın evində sakin oldu. Və bu tərəfdən Ağa Məhəmməd şah davasız və şavasız Qala şəhərinə varid olub, İbrahim xanın böyük oğlu general-mayor Məhəmməd Həsən ağanın imarətində əyləşdi və bu heyndə çox adamları qətlə yetirdib, Molla Pənahı zindana saldırdı. Bu qəsd ilə ki, onun haqqında böyük siyasət eləsin, çünki onun İbrahim xana müqərrəb olmağını eşitmişdi və qədimdən onunla ədavəti var idi[219].

Mirzə Cəmal qalabəyi öz tarixində Molla Pənahın ölmək əhvalatını bu sayaq yazır: "Molla Pənah bir sahibi-kəmal və müdəbbir, təcrübəkar və xoşgöftar bir adam idi və özü dəxi İbrahim xanın vəziri və çox mö'təmidi idi ki, ümuri-hökumətdə İbrahim xan Molla Pənah axundun tədbiri və müşavirəsi ilə rəftar edərdi və xan dəxi qəlbən ona inanıb, etimad etmişdi. Belə ki, övladından artıq onun xatirini mənzur tutardı və ona çox hörmətlər edib, ixtiyari-külli vermişdi. Xan Dağıstana və car-Bələkana gedən vaxtda Molla Pənah, bir rəvayətlə muğanlı Cəmil ağanın ittifaqı ilə – ki, Təklə Muğanlı hm əslən qədim Qazax elindəndirlər, – ikisi Tiflis canibinə getmişdilər və oradan Qarabağa müavidət edən zamanda və yainki bir rəvayətə görə, Ağa Məhəmməd şahın qorxusundan Qarabağdan qaçıb, xanın dalısınca o tərəfə əzm etdiyi halda Gəncə dağlarının həvalisində Gəncə hakimi Cavad xan onu özünə ümdə və böyük sovqat bilib, tutub öz ittifaqı ilə Ağa Məhəmməd şahın hüzuruna gətirmişdi. Çünki şah onun qətlinə şövqmənd idi. Elə ki, Molla Pənahı dəstgir edib Ağa Məhəmməd şahın hüzuruna gətirdilər, axşam olmağına görə, şah buyurdu ki, onu möhkəm saxlasınlar ki, sübh açılanda onu əzim siyasətlə qətlə yetirəcəyəm. Əzqəza iş belə gətirdi ki, haman gecə şahın özü qətlə yetişdi və Molla Pənah salamat qaldı.



Çün Molla Pənahı qürüba bir və ya iki saat qalmış əlibağlı Məhəmməd Həsən ağanın imarətinin qapısına gətirdilər ki, şah orada mənzil etmişdi, Məhəmməd Hüseyn xan Qacar sərkeşbaşı – ki, şaha çox müqərrəblərdən idi, – axundu qapıda əlibağlı görüb, soruşdu ki, bu kimdir? Cavabında dedilər: "Bu haman Molla Pənahdır ki, eşidibsiniz". Və haman dəm ağzını föhş və latayilata açıb, Molla Pənaha çox yaman föhşlər və itab-xitablər elədi. Axundi-biçarə ərz elədi ki, ey xani-əzimüş-şə'n, siz böyük şəxssiniz və padşahi-İranın mö'təmidi və müqərrəbi-hüzurusunuz, layiq deyil ki, siz dəstgir və günahkar və müqəyyəd və giriftar və biçarə dərmandələrə yaman kəlmələr və föhşü hədyan sözlər buyurasınız. Sizin rütbə və məratibinizə şayistə budur ki, ətvar və əxlaqi-həsənə və göftar və rəftari-nəcibanə sizdən zühur eləsin və bu gunə dərmandə, əsir və xayif olan acizlərə siz gərək dildarlıq verib, əltaf və mərhəmət və əfvü ətayə ümidvar qılasınız, nəinki şahın qəzəbindən müqəddəm siz qəzəbnak olub, dilazarlıq edəsiniz. Məhəmməd Hüseyn xan bu gunə əlamatdan əsla mütəəssir olmayıb yenə föhş və hədyanını ziyadələndirdi. Molla Pənah "hər ke dəst əz can beşuyəd, hər çe dər del darəd bequyəd"[220] məzmununca dəxi tab gətirməyib, haman biədəb xanın cavabını ziyadə föhşkarlıq və dürüştgöftarlıq ilə verib dedi: "Ey xani-nanəcib, qəzayi-sübhanı və dövri-zamanı və müqəddimeyi-fərdanı sən nə bilirsən? Bəlkə sabah şah mənə ənam və xələt də verib xoşhal və azad edəcəkdir və ya fələkikəcrəftar və təqdiri-pərvərdigar bir qeyri təriq ilə yol gedəcəkdir?! Şəb abestənəst, ta çe zayəd səhər[221]. Əgər dustağəm – dustaği-şahəm. Sən nəçisən ki, mənə bir zərrəcə asib yetirəsən. Haman bu gunə göftar və rəftar sənin məhz nanəcib və naqabilliyinə nişanədir. Haqq-taala kərim və rəhimdir. Türklər məsəlidir: "Mıxı mismar eləyən xaliq var". Belə rəvayət olunur ki, haman gecə ki, Molla Pənah dustaqxanada məhbus idi və sabahı günü gərək ona tənbeh və bazxast oluna idi, Ağa Məhəmməd şahı iki nəfər pişxidmətləri – Səfərəli bəy və Abbas bəy qətlə yetirdilər. Molla Pənah sabaha kimi yatmayıb, başladı, Ağa Məhəmməd şahın dünyada neçə müddət ömür sürməyini və nə vaxtı fövt etməyini hesablayıb cüstücu etməyə. Buna görə rəml atıb, qism-qism sıfırlar yazıb, onları sağdan sola və soldan sağa keçirib, çox diqqətlə hesaba baxanda ona yəqin oldu ki, şah gərəkdir haman gecə qətl olunub, bir də sübh tülu'unu və günün şəfəqini görməyə onun macalı olmasın. Ürəyi təskinlik tapıb, zindanböyüyündən soruşdu ki, şəhərdə təzə bir əhval və şuriş yoxdur ki? O, cavab verdi ki, bir şey bilmir. Molla Pənahın gözünə yuxu getməyib, sübh tezdən yenə zindanbandan istifsar etdi ki, şəhərdə nə xəbər var? Şuriş və inqilab asarı müşahidə olunmur ki? Zindanböyüyü bu səfər də Molla Pənahın ürəyini sakit edə bilməyib, cavab verdi ki, o, bir xəbər

eşitməyibdir. Amma çox çəkmədi ki, Ağa Məhəmməd şahın qətlə yetişmək xəbəri şəhərə dağıldı. Böyük şuriş və qovğa əmələ gəldi. Qızılbaş xanlarının hər birisi sərasimə və pərişan öz təvabeləri ilə əllərinə gələni götürüb, fövc-fövc yola düşüb qaçmağa şüru' elədilər və şəhər xalqının bə'ziləri şah olan imarətə tökülüb, qarət etməyə başladılar. Ağa Məhəmməd şahın başını – ki, bədənindən cüda etmişdilər, – bihörmət edib, təpiklər altına saldılar. Tamami dustaqxana əhlini azad etdilər. Molla Pənah dəxi salamat zindandan çıxdı; "mıxı mismar eləyən tanrı" onun dadına yetişdi və çoxlarını Ağa Məhəmməd şahın qəzəbindən xilas elədi.

Şahın bu sayaq məqtul olmağı Molla Pənaha ziyadə tə'sir edib, aşağıdakı əş'arı Molla Vəli "Vidadi"[222] təxəllüsə – ki, o da əhli-təb' və onunla birelli idi, – yazıb göndərdi:

Ey Vidadi, gərdişi-dövrani-gəcrəftarə bax!
Ruzigarə qıl tamaşa, karə bax, kirdarə bax!

Əhli-zülmü necə bərbad eylədi bir ləhzədə,
Hökmü adil padşahi-qadirü qəhharə bax!

Sübh söndü şəb ki, xəlqə qiblə idi bir çıraq,
Gecəki iqbalı gör, gündüzdəki idbara bax!

Taci-zərdən ta ki, ayrıldı dimağı-pürqürur,
Payimal oldu təpiklərdə səri-sərdarə bax!

Mən fəqirə əmr qılmışdı siyasət etməyə,
Qurtaran məzlumu zalimdən o dəm qəffarə bax!

İbrət et Ağa Məhəmməd şahdan, ey kəmtər gəda,
Ta həyatın var ikən nə şahə, nə xunkarə bax!

Baş götür bu əhli-dünyadan ayaq tutduqca qaç,
Nə qıza, nə oğula, nə aşina, nə yarə bax!

Vaqifa, göz yum, cahanın baxma xubü ziştinə,
Üz çevir ali-əbaya, Əhmədi-Muxtarə bax![223]

Ağa Məhəmməd şahın bu gunə hökmi-adili-padşahi-qadirü qəhharın qəzəbinə giriftar olub, qəflətən ölməyi barəsində Mirzə Cəmal Qalabəyi öz tarixində bu şe'ri yazıbdır:

Ari, bu növ' adət edibdir bu ruzigar,
Hərgiz cəlalü şövkətinə yoxdur etibar.



Nakam, həsrət ilə gələnlər gedib tamam,
Sultanü xan, mirü gəda, şahü şəhriyar.

Dilşad olmağa hanı fürsət zəmanədə,
Beş gün murad ilə keçə, haşa, bu kəcmədar[224].

Hərçənd Molla Pənah Ağa Məhəmməd şahın əlindən xilas oldu, amma Məhəmməd bəyin əlində giriftar və məqtul oldu. Məhəmməd bəy dəxi İbrahim xanın qardaşı Mehrəli bəyin oğlu idi ki, rəşadət və şücaətdə məşhur bir xoşsurət və hünərmənd cavan idi ki, hamı xəlayiq onu sayıb hörmət edərdilər. Ağa Məhəmməd şah məqtul olandan sonra Məhəmməd bəy onun tamami nəqdi-cinsinə sahib və mütəsərrif olub və Qarabağ əhlini başına cəm edib, bir neçə müddət, İbrahim xan Bələkəndən müraciət edənə kimi, hökmranlıq elədi. Məhəmməd bəyin Molla Pənahı öldürtməyinə bir neçə səbəblər göstərirlər. Əzancümlə birisi budur ki, Molla Pənah İbrahim xanın yanında sahibi-ixtiyar və müdəbbiri-kar bir şəxs idi. Ol vaxt Məhəmməd bəy ona çox hörmət edərdi ki, onun vəsatəti və tədbiratı səbəbinə İbrahim xana yaxın ola və bir para mətləbləri və muradı var idi. xahiş edirdi ki, Mollanın tədbiri ilə xandan o mətləblər hasil ola. Amma Məhəmməd bəyin düşməni çox idi. Tamam əmizadələri və İbrahim xanın əqrəbaları və müqərrəbləri ona hasid və müanid idilər və mane olardılar ki, məbadə xan Məhəmməd bəyi özünə müqərrəb edə və həmə vəqt onun pisliyini xana söylərdilər və Məhəmməd bəy bu barədə Molla Pənahdan bədgüman olmuşdu.

Bir səbəb dəxi bunu göstərirlər ki, Molla Pənahın Qızxanım adında bir cəmilə övrəti var idi ki, Məhəmməd bəy onun hüsnü camalının tə'rifini eşidib, ona məhəbbət və əlaqə bağlamışdı. Övrət cahilə və cavan, axund qoca və piran idi və bundan əlavə Məhəmməd bəyin rəşadət və şücaəti, xoşəndam və kamalü fərasəti və padşah xəzinəsi əlində olmağı övrəti dəxi də ziyadə əlaqələndirmişdi və o, Məhəmməd bəyə demişdi ki, nə qədər ki, Molla Pənah hali-həyatdadır, mən şərən sənə gedə bilmərəm və bu səbəbə Məhəmməd bəy Molla Pənahın qətlinə həris idi və bir səbəb də bu idi ki, bir para bədxahlar özlərinin səlahı üçün Məhəmməd bəyi təhrik etmişdilər ki, Molla Pənahı öldürtsün, ta ki, onlar Məhəmməd bəyin hüzurunda sahibi-kar və nəf'bərdar olsunlar. Qərəz, hər hal ilə olmuş isə də, yəqini budur ki, Məhəmməd bəyin əmrilə Molla Pənahı oğlu Əliağa ilə və bir qövlə görə, Qasım bəy ilə Cıdır düzü adlanan yerdə – ki, Şuşa şəhərinin günçıxan səmtində bir səfalı yerdir, – həlakətə yetiriblər[225].

Belə rəvayət olunur ki, çün Molla Pənahı oğlu Əliağa ilə qətlgaha gözübağlı aparırdılar və qətlgah Xəzinə qayası hesab olunurdu – ki, ziyadə

dəhşətli, uca və sıldırım bir qayadır ki, oradan müqəssirləri xanın hökmü ilə atarlarmış, – əsnayi-rahda Molla Pənah onu qətlgaha apardıqlarını anlayıb, getməyə taqəti olmayır və bilaixtiyar yerə yıxılıb təvəqqe edir ki, əvvəlcə onu qətlə yetirsinlər ki, oğlunun ölməyini görməsin. Burada onların hər ikisini qətlə yetirirlər. Haman yerdə Mollanı dəfn edib, qəbrinin üstə günbəz tikdiriblər ki, "Molla Pənah günbəzi" adı ilə məşhurdur. Amma bu halda haman günbəz uçub dağılıbdır. Onu təzələyib qaydaya salmaq Qarabağ şüəra və üdəbasının mühüm vəzifələrindən hesab olunur[226]. Molla Pənah qətl olunubdur haman salda ki, Ağa Məhəmməd şahın məqtul olunması vaqe olubdur. 1212-ci tarixi-hicriyyədə ki, miladın 1797-ci ilinə mütabiqdir. Qətlə yetişən zaman təxminən həştad sinnində imiş.

Molla Pənah Vaqifin asarü əş'arına gəldikdə kəmali-təəssüflə bunu deyə bilərik ki, onlar əlan nüdrətən tapılmaqdadırlar və Azərbaycan türklərinin çoxusu onlardan bixəbərdirlər.

Hicrətin 1244-cü sənəsində – ki, miladın 1828-ci sənəsinə mütabiqdir, – Mirzə Yusif Qarabaği[227] məşhur Mirzəcan bəy Mədədovun[228] ilhah və təvəqqeyinə görə, bir məcmuə tərtib elədi. Haman kitabça "Məcmueyi-Vaqif"[229] adlanıbdır ki, onun dibaçəsində müxtəsərən Vaqifin tərcümeyi-əhvalı zikr olunub və onun əş'arından və kəlamından ümdələri, əvvəl müəşşərat və müxəmməsat və ondan sonra qəzəliyyat və mürəbbeat yazılıbdır. Haman məcmuə 1272 (1856)-ci sənədə Teymurxanşurada təb' olunubdur ki, indi çox çətinlik ilə tapılır. Və bundan əlavə bir məcmuə dəxi Adolf Berjenin[230] sə'y və himməti ilə tərtib olunub, 1857-ci sənədə Leypsiq şəhərində çap olunubdur. Əgərçi bu məcmuə "Azərbaycan şüərasının asarı və əş'arı"[231] adlanır, amma ona ancaq Molla Pənah Vaqifin, Qasım bəy Zakirin və bir para Qarabağ şairlərinin kəlamı daxil olubdur. Belə ki, "Qarabağ şüərasının asarı" təsmiyə olunsaydı, dəxi də haqq və savab olardı və cənab Berjenin məcmuəsini tərtib edən Zaqafqaz müftisi Hüseyn əfəndi Qaibov olubdur ki, ol cənabın şeir və ədəbiyyata artıq meyl və həvəsi var idi. Bu məcmuə dəxi əlan çox az tapılır.

Bundan əlavə Molla Pənah Vaqifin divani-əş'arı sabiqdə "Təzə həyat" ruznaməsinin və bəd "Sədayi-həqq"in müdiri mərhum Haşım bəy Vəzirovun sə'y və ehtimamı ilə 1-cı sənədə – ki, tarixi-məsihiyyənin 1908-ci ilinə mütabiqdir, – Badkubədə çap olunub, "Təzə həyat"ın müştərilərinə hədiyyə olaraq paylanıbdır[232]. Müştəri olmayanlar üçün nüsxəsi bir manatdan satılmaqdadır.

Vaqifin əş'ari-nəfisəsi Vəzirov cənabları tərtib qıldığı məcmuədə bu qərar üzrə mətbudur: müəşşərat, tərcibənd, müəşşərati-müstəzad, müxəmməsat, müxəmməsati-müstəzad, qəzəliyyat və mürəbbeat. Məcmuənin başında Haşım bəy Vəzirov Molla Pənahın tərcümeyi-halına dair bir para mə'lumat veribdir. Və lakin bu məcmuəyə yenə də Molla Pənah Vaqifin bə'zi əş'ar və kəlamları daxil olmayıbdır. Hər halda Haşım bəyin bu zəhməti şayani-təhsin və təbrik bir əsərdir ki, onda məşhur şairimizin asarı cəm olubdur.



Eşitdiyimizə görə, bu kitab satılıb qurtarıbdır. Onun ikinci dəfə təb və ucuz qiymətə intişar olunması məmuldur.

Vaqifin əş'ar və kəlamından bir neçəsini nümunə üçün burada yazmaqdan irəli gələn bu müqəddiməni zikr eləməyi lazım bildik. Molla Pənah milli şair olduğuna binaən, onun şeir və qəzəliyyatı bizim Azərbaycan türklərinə ziyadə xoş gəlir və hər nə onun qələmindən zühura gəlibsə, xah müxəmməsat və xah mürəbbeat və xah qəzəliyyat, tamamisi ürəkdən və həqiqi həyatdan nəş'ət edən əsərlərdir ki, yuxarıda zikr olundu. Bu qisim əsərlərdən masəva Molla Pənahın bir çox əş'ar və ədəbiyyatı dəxi vardır ki, onlarda öz müasirlərinin ayinü adatı, adabü əxlaqı və dolanmaları artıq məharət ilə rişteyi-nəzmə çəkilibdir. Belə ki, onlar gələcək nəsl üçün böyük bir yadigar məqamındadır. Hərgah Vaqif ilə Vidadinin bir-birinə yazdıqları kağızları möhtərəm oxucularımız mütaliə buyursalar, sözümüzü təsdiq edərlər. Nümunə üçün onlardan bir neçəsini burada göstəririk.

Molla Vəli "Vidadi" təxəllüs həzl və lətifə yolu ilə öz dostu Vaqifə yazır ki, Vaqif, sən nə tez sənəmlərdən usanıbsan ki, onların birini bir inəyə qiymət eləyirsən və bir az vaxt mürur edəndən sonra onların birini bir keçiyə satacaqsan və hətta müştəri naz eləsə, ona minnət də edəcəksən. Sonradan yazır ki, Vaqif, sənin "ipin dolaşıbdır", düşübsən araya və səni qınamaq da rəva deyil, çünki zəmanə dəyişirilibdir – oğul ataya baxmaz, qız anaya. Möhlət ver bir övrət də mən alaram örkən, çatı toxunmaq üçün. Yə'ni sənin kimi mən də sənəmlərin qədr və qiymətini ucuz tutaram.

Vaqif dəxi lətifə sayağında Vidadinin cavabında xan qulluğunda olmağına dair bu şeirləri yazır:

Ey Vidadi, yenə xan qulluğunda
Qaim olub, nə qiymət eylərsən?!
Yaman gözdən Allah özü saxlasın,
İxlas ilə, kişi, xidmət eylərsən.

Belə dursan o qapıda qış və yaz,
Yetişərsən bir çörəyə sərəfraz,
Bu doğru yolundan əyilsən bir az,
Yəqin bil ki, çox xəyanət eylərsən.

Bizim hərəmlərdir Qur'an oxuyan,
Üstündən-başından ənbər qoxuyan,
Onlar deyil örkən, çatı toxuyan,
Kimin işin kimə nisbət eylərsən?!

Dolu-dolu qocalıbsan babalıq,
İndi belə sal kürkünə yamalıq,
Pis övrətin peşəsidir cul, alıq,
Yaxşılara onu nisbət eylərsən?!

Qapıda uzadar uzun gəbəni,
Sayıq dur, toyuğa yedirmə dəni,
Övrət döyə-döyə öldürür səni,
Nə belə yatırsan, qəflət eylərsən.

Sizdə ki, bir övrət qurar bir palaz,
Boşalıb, olanda əbrişi nasaz,
Çağırır, çaxdırır hər yerinə paz,
Bunu ona bir mə'rifət eylərsən.

Xoş halına sənin, uzun dırnaqlı,
Baldırı çirməkli, yalın ayaqlı,
Yorğanı, yasdığı tozlu, torpaqlı
Həmdəm ilə hər dəm söhbət eylərsən.

Əllərin, üzlərin yuduqları yox,
Yaşlarında doğru dedikləri yox,
Hazır çobandılar, düdükləri yox,
Onlar ilə necə ülfət eylərsən?!

Günün qulağı ta oradan batar,
Mitilin bürünər çaşta dək yatar,
Öz evini tamam özgəyə satar,
Əgər yanın bir dəm xəlvət eylərsən[233].

Qəribə hal budur ki, yüz ildən bəri bizim tərəkəmə xalqının dolanacağı dəyişilməyibdir. Necə ki, Vaqifin əsrində onlar narahat və natəmiz və fəna bir halda güzəran edirdilər, indi də haman qərar üzrə məişət etməkdədirlər. Tərəkəmə övrətlərinin çoxusu əsla təmizlik bilməzlər. Necə ki, şair onları vəsf edir, uzun dırnaqlı, baldırı çirməkli, yalın ayaqlı, yorğanı, yasdığı tozlu-torpaqlı, həmin bizim tərəkəmə xalqının övrətləridir ki, əllərin, üzlərin həftədə bir dəfə yumazlar, başların daramazlar, danışmaq bilməzlər və örkən, çatı toxumaqdan qeyri bir şeyə qabiliyyətləri yoxdur. Həqiqətdə "Hazır çobandılar, düdükləri yox".



Bunlardan əlavə, Vaqifin tə'rifi-çuxa, nimtənə, kürk, tüfəng və vəsfi-həmmam və mədhi-valiyi-Gürcüstan barəsində yazdığı müxəmməslər bə'zilərə boş və biməzmun gəlir isə, həqiqətdə əhli-mə'rifət nəzərində gözəl əsərlərdir. Yüz sənə bundan irəli ata-babalarımızın dolanacağını, adab və əxlaqını, libas və təamlarını, arzu və təmənnalarını, fikir və xəyalatını və filcümlə, ol əsrin övza' və dəstgahını Vaqif əleyhirrəhmə – ki, sözün ustadi-bimisli hesab olunur, – gözəl əş'ar və kəlami-abdar ilə yazıb, gələcək üçün unudulmayan bir əlamət və yadigar qoymuşdur. Məsələn, Vaqif özü həm molla və şair isə də, vaxtın təqazasına görə onun meyl və könlü silah və əsləhəyə dəxi olub, igidlik iddiasına həm düşürmüş və məqami-zərurətdə özü yaraq götürüb davaya çıxarmış. Bu cəhətdən şairin Şirvan hakimi Məhəmmədhəsən xandan tüfəng arzu və təmanna etməyi gərək bizə əcaib gəlməsin və tüfəngə onun nə qədər meyl və şövqü olmağı şairin öz sözlərindən görünür:

Qıvrılar könlüm tüfəngdən dəm vuranda mar tək,
Od çıxar ağzından ol dud ilə çaxmaq bar tək,
Güllәsi əşkim əsər, çeşmim şərarı nar tək,
Müşk, barut ətrilə həm türreyi-tərrar tək,
Etmədi mütləq dimağımı müəttər bir tüfəng[234].

Şairin tələb etdiyi tüfəng gərəkdir hər cəhətdən bieyb və mümtaz olsun, yoxsa o, hər bir sınıq-sökük tüfəng arzusunda deyil:

Hər kim istər kim, vücudi mərəkə ara gərək,
Kəndi zatından silahü əsləhə ə'la gərək,
Güllәsilə xuni-ə'da tökməyə sövda gərək,
Gər tüfəng olsa, bizə mümtazü bihəmta gərək,
Vaqifa, yoxsa, deyil məqbulumuz hər bir tüfəng.

Məhəmmədhəsən xan Şirvani Vaqifin xahiş və təmənnasını, əlbəttə, yerinə yetirib və özü gözəl bir şe'ri-müxəmməs yazıb tüfəng ilə ona irsal etmişdir və haman kağızda Vaqifin şeir və kəlamına təhsin oxuyubdur:

Şe'rinə təhsin ki, yetməz hiç bir əş'ar ona,
Hər kimin var isə həddi, söyləsin göftar ona,
Kimsə ləb tərpətməsin kim, gəlməz istifsar ona,
Eybdir Müştaqdan bu sözləri izhar ona,
Tutmasın nəzm rəkakət, var isə kəmtər tüfəng.

Vaqifin gözəl əş'arlarından birisi də Tiflisin tə'rifində yazdığı müxəmməsdir ki, onda Tiflis gözəllərin tə'rif edib, hamamlarda təbiətdən

cari olan suları və Kür çayının suyunu vəsf qılıbdır, valinin mədhi ilə xətmi-kəlam edir. Haman müxəmməsdə Vaqif Tiflisi dünya şəhərlərinin cənnəti hesab eləyir ki, ona huri və pərinin cəmiyyəti yığılıbdır və hər bir qism ne'mət ilə haqq-taala o məkanı məmlüvv qılıbdır. belə ki, şair baği-rizvanda dəxi Tiflisin gözəlləri ikim məhvəşləri təsəvvürə gətirə bilmir:

Baği-rizvanda əgər huriyü qılman çoxdur,
Bu gözəllər kimi məqbulü müzəyyən yoxdur.
Nəslbərnəsl gözəllik bulara buyruqdur,
Mən görənlər ki, mələkdən, pəridən artıqdur,
Hələ derlər ki, bulardan dəxi əlaları var.

Hamamların barəsində yazmışdır:

Yeddi həmmam, nə həmmam ki, sərmənzili-hur,
Həşt cənnət kimi hər guşəsi bir mətlə'i-nur,
Bir əcəb abi-rəvan gərm qılıb onda zühur,
Şükr təqdirinə, ey qadirü qəyyumü qəfur,
Lütfünün bəndələrə ne'məti-üzmaları var.

Mənbəi-cudü kərəmdən açılıb dürri-xoşab,
Basəfa hovza dəmadəm tökülür misli-gülab,
Görsə bir kərrə onu mən kimi bir xanəxərab,
Getməz ondan dəxi bir canibə manəndi-hübab,
Getsə də badə başı, mənzilü mə'vaları var*.

Gürcüstan valisinin haqqında bu sayaq xeyir-dualar eləyir**:

Vaqifa, səndə ki, yoxdur bilirəm zöhdü riya,
Şərti-ixlas gərək eyləyəsən şimdi əda,
Eylə bu valiyə, oğlanlarına xeyr-dua
Saxlasın onları öz hifzi-pənahında xuda,
Hasil etsin nə qədər dildə təmənnaları var.

Özgə bir müxəmməsində Vaqif valinin oğlu Eulon xanı belə tə'rif eləyir:

Valinin çeşmi-çırağı, vəh, nə türfə can imiş,
Külli Gürcüstanın üstə sayeyi-sübhan imiş,
Düşməni pamal edən sərdari-valaşan imiş,

* Mə'lumdur ki, rus şairlərindən məşhur Puşkin[235] dəxi tiflis hamamlarını vəsf qılmışdır. Vəli Vaqif yazdığı vəsflər daha da ziyadə şairanə vəsflərdir.

** Gürcüstan valisi – İrakliyi-dövvüm ki, Gürcüstanın müqtədir padşahı hesab olunur



Aləmin sərdəftəri, adı Eulon xan imiş,
Saxlasın Allah pənahında, əcəb oğlan imiş.

Hiç yoxdur nisbəti özgə diyarın xanına,
Bir cavandır kim, yaraşır padşahlıq şanına,
Dəyməsin afət yeli, ya rəb, güli-xəndanına,
Sərbəsər aləm gərəkdir baş əyə fərmanına,
Taqi-əbruyi-lətifi qibleyi-iman imiş.

Xoş tamaşa eylədim, gördüm tamam ətvarını,
Çox bəyəndim özünü, həm ləhceyi-göftarını,
Maşaallah, zahir etmiş ululuq asarını,
Belə sandım ki, mələkdir əvvəla didarını,
Xeyli çağdan sonra bildim ki, gözəl insan imiş.

Sair oğlundan xanın gər olmadıq biz ruşinas,
Mane'i yox, onları həm eylədik bundan qiyas,
Bu çiraq böylə çiraqdır*, eyləmiş nur iqtibas,
Vaqifa, sən qıl xudaya hər zaman şükrü sipas,
Valinin ocağı böylə gün kimi taban imiş.

Bu əş'ardan mə'lum olan budur ki, Vaqif İbrahim xan ilə və yainki muğanlı Cəmil ağa ilə bir yerdə Tiflisə gedən zaman İrakli padşahın oğlu Eulon xan ilə görüşübdür və bəlkə onun xələt və ənamına nail olubdur. İştə bu münasibətlə onu tə'rif və tövsif eləmişdir. Həmçinin Vaqif Tiflisdə olan vaxtda və ol beytüs-səfanı seyr və tamaşa edən əsnada onun gözü kəlisadan çıxan tərsa qızlarına sataşıb və onlardan birisi şairi valeh və heyran edibdir:

Vaqifəm, ta ki, gözüm onun sataşdı qaşına,
İstədi mehrabü mənbərdən xəyalım daşına,
Şimdi bildim ki, nə gəlmiş Şeyx Sən'an başına,
Ya budur kim, Tiflisi qərq eylərəm göz yaşına,
Ol sənəm vəsli mənimçün ya kəlisadan çıxar.

Xan qızının Şuşa qalasından çıxıb, Gəncəyə getməyini dəxi Vaqif suznak sözlər ilə nəzmə çəkib və gözlərinə xitabən deyir ki:

Qan ağla, gözüm kim, sabah ol qaşı kamanın
Peykanı çıxıb zəxmi-cigərdən gedəcəkdir.

* Berjenin məcmuəsində "çıraq" əvəzində "ocaq" yazılıbdır: Bu ocaq böylə ocaqdır, eyləmiş nur iqtibas.

Bu xüsusda yazdığı müxəmməsi şair bu bənd ilə tamam edir:

Yarın sənə iqrarı gər iqrar isə, Vaqif,
Hər dərdi-dilindən ki, xəbərdar isə, Vaqif,
Səbr eylə, əgər yar sitəmkar isə, Vaqif,
Çək başına, bir fikrin əgər var isə, Vaqif –
Kol* sərvqədin sayəsi sərdən gedəcəkdir.

Mirzə Camalın tarixində İbrahim xan ilə Cavad xanın mabeynində qərabət olduğu yazılmışdır. Vaqifin bu müxəmməsinin bir bəndindən belə anlaşılır ki, xan qızını Gəncəyə gəlin aparırlarmış:

Saqi, nə durubsan, sölə, dövran yola düşsün,
Hamı dağılıb, mütrübi-xoşxan yola düşsün,
Çalsın dəfü ney, naləvü əfqan yola düşsün,
Bu gecə gərəkdir irəli can yola düşsün,
Fərda ki, sürahiqədü gərdən gedəcəkdir.

Vaqifin məşhur müxəmməslərindən birisi də övsafi-dilbər barəsində yazdığıdır. Rəşid Əfəndiyev "Şaki" təxəllüs yazdığı nəzirə də Məhəmməd əleyhissəlamın mədhi barəsindədir.

Vaqif:

Gülşən sənə yoxdur bu nəzakətdə qərinə,
Kuyin çəməni tə'nə vurar xüldi-bərinə,
Sünbül onu görgəc özünü saldı qəminə,
Bəh, bəh, nə əcəb, şükr xudanın kəreminə,
Olmaz belə qamət, belə gərdən, belə sinə.

Şaki:

Qur'anı xuda nazil edib bəndələrinə,
Təklif edib onunla qamu aləmi dinə,
Vəhyi gəlib ol müxbiri-siddiqül-əminə,
Atasıdır Abdulla, anasıdır Əminə,
Olsun səlavat ruhi-rəsulüs-səqilinə.
İsmi ki, Məhəmməd, yox mədhinə hacət, qurban ola ümmət
Bir sahibi-elmə, bir xazini-fənnə, bir baniyi-dinə,
Qurban belə elmə, belə fənnə, belə dinə,
Bəh, bəh, nə deyim, şükr xudanın kərəminə.

Vaqifin müxəmməsi-müstəzadının ən mərğubu budur:

* Ki ol – *red.*



Ey zülfü siyəh, sinəsi əbyəz, gözü alə,
Nə türfə cavansan!
Ağzın kimi yox qönçə, yanağın kimi lalə,
Gülzari-cinansan!
Görsə yüzünü məh yetər, əlbəttə, zəvalə,
Xurşidi-cahansan!
Heç bəndə sənə olmaya, ya rəb ki, həvalə,
Sən afəti-cansan!
Söz yox bu zənəxdanü rüxə, bu xətü xalə,
Xubluqda ə'yansan!

Dibaçeyi-lövhə qələmi-katibi-qüdrət
Yazmış səni əvvəl,
Heç adəmə üz verməmiş əsla belə surət.
Pürzinətü seyqəl,
Zülfün sözü hər nüsxədədir, ey pəritələt,
Bir şərhi-mütəvvəl.
Göydə yetirər müttəsil ayə, günə xiclət,
Hüsnündəki məşəl.
Müjganın urar tə'nə oxun göydə hilalə,
Xub qaşı kamansan!

Rəftari-qədin eylədi sayə kimi pamal
Şümşadı çəməndə.
Qan ağladar ol qönçeyi-xəndanı məhü sal,
Lütfündəki xəndə.
Sultani-cahan sərvərisən, sahibi-iqbal,
Aləm sənə bəndə.
Göftarın edər tutiyi-şəkkərşikəni lal,
Hər nitqə gələndə.
Sən Xosrov olubsan, bəli, hər şərhi-məqalə
Şirini-zamansan!

Sənsən, sənəma, cümleyi-xubanə şahənşəh,
Yox sən kimi dilbər.
Bürqə üfüqündən ki, üzün bir çıxa nagəh,
Xurşidə bərabər,
Salır özünü ziri-niqabə şəfəqi-məh,
Manəndeyi-əxtər.
İnsan ola bilməz bu sifət pakü münəzzəh,
Cəm olsa sərasər.
Sən cinsi-mələksən yetişibsən bu kəmalə.
Ya ruhi-rəvansan?

İsna əşərə çakəri-kəmtər ola Vaqif,
Sərdaridir ə'la,
Xaki-dəri-övladi-peyğəmbər ola Vaqif,
Neylər dəxi dünya?

Ol gündə ki, həngameyi-məhşər ola, Vaqif,
Tut daməni mövla!
Fəryadrəsin Heydəri-səfdər ola, Vaqif,
Xövf eyləmə əsla!
Sən qərqsən hərçənd ki, dəryayi-vəbalə,
Tövfiq bulansan!

Molla Pənahın gözəllik babında və dilbər vəsfində yazdığı qafiyələr bir o qədər lətif, açıq və aydın sözlər ilə nəzmə çəkilmiş kəlamlardır ki, nə qədər cövhərsiz və mə'rifətsiz adam onları eşitsə, mütəəssir və məsrur olar. Nümunə üçün bir neçəsini zikr edək:

Ay qabaqlı, bulud zülflü gözəlin
Duruban başına dolanmaq gərək.
Bir evdə ki, böylə gözəl olmaya,
O ev bərbad olub talanmaq gərək.

Sərxoş durub sarayından baxanda,
Ağ gərdənə həmayillər taxanda,
Qaşa vəsmə, gözə sürmə yaxanda,
Canım eşq oduna qalanmaq gərək.

Çıxa sarayından canlar alan tək,
Xişmə gələ gəh-gəh qəhri olan tək,
Dal gərdəndə qıvrım saçı ilan tək,
Tərpənəndə hər yan bulanmaq gərək.

Vaqif, sənin işin müdam ah olsun,
Səg rəqibin ömrü qoy kütah olsun,
Həmdəmsiz kimsənə istər şah olsun,
Gədadır ol kimsə, dilənmək gərək.

* * *

Qaynar gözlərindən, şux baxışından
Əcayib fitnələr, fe'llər görünür.
Səf-səf duran siyah kirpiklərindir,
Yoxsa ki, gözümə millər görünür?

Gedən, getmə, bir bəri bax, ay gedən,
Gözüm doymaz sən tək gözəl kimsədən,
Gah yaxadan şö'lə verir ağ bədən,
Gah olur ki, nazik əllər görünür.

Qəddin tə'nə vurar o sərvi-naza,
Can qurban eylərəm sən tək şahbaza,
Üzün kimi, zülfün kimi tər-taza
Nə lalələr, nə sünbüllər görünür.



Vaqif, yad et səni yad eyləyəni,
Mən sevirəm mənə yarım deyəni.
Qoymaz göz önündən sevən sevəni,
Könüldən könülə yollar görünür.

* * *

Al geyinib çıxsan gülşən seyrinə,
Yığılır başına güllər, dolanır.
Məhtabi-hüsnünə bəndə fərmandır,
Qulluğunda aylar, illər dolanır.

Görməmişəm sən tək bir mələkzadə,
Dərdini çəkərəm həddən ziyadə,
Kirpiklərin ucu düşəndə yadə,
Bağrımın başında millər dolanır.

Mən bir Fərhad, sən bir Şirindəhansan,
Dərdin zahir, amma özün nihansan,
Gözəllik babında şahi-cahansan,
Qulluğunda daim ellər dolanır.

Ləblərin bağrımı pürxun eyləmiş,
Açılmış göz yaşım Ceyhun eyləmiş,
Həsrətin Vaqifi Məcnun eyləmiş,
Onun üçün gəzər çöllər, dolanır.

* * *

Doldu dimağıma zülfün ənbəri,
Valeh oldu könül həvadən sənə.
Əlim yetməz, namə yazıb dərdimi
Göndərəydim badi-səbadan sənə.

Oturuşun gözəl, duruşun gözəl,
Sallanışın gözəl, yerişin gözəl,
Xuyun, xülqün gözəl, hər işin gözəl,
Bəxş olub bu xubluq xudadən sənə.

Qəm evindən saldın küncə Vaqifi,
Eylədin muyindən incə Vaqifi,
Neçün incidirsən bunca Vaqifi,
Nə hasil bu cövrü cəfadən sənə?

Sevgili yarın fərağında badi-səbadan əhval diləyir:

Badi-səba, bir müjdə ver könlümə,
Ol güli-xəndanım neçün gəlmədi?
Xəyalım şəhrini qoydu viranə,
Sərvərim, sultanım neçün gəlmədi?

Ağzı xeyir sözlüm, dili diləklim,
Bir türfə ağ əllim, gümüş biləklim,
Qarıçqay cilvəlim, tavus bəzəklim,
Libası əlvanım neçün gəlmədi?

Qaşı kəman, kirpikləri qəməlim,
Ağzı şəkər, dodaqları yeməlim,
Əlvan kəlağaylı, bəyaz məməlim,
Sinəsi meydanım neçün gəlmədi?

Vaqif, ilə döndü bir saətimiz,
Nə səbrimiz qaldı, nə taqətimiz,
Olur indən belə qiyamətimiz,
Gəlmədi cananım, neçün gəlmədi?

* * *

Ey Kə'bəm, Kərbəlam, Məkkəm, Mədinəm,
Hər zaman kuyində ziyarətimdir.
Qiblə deyib, qaşlarına baş əymək
Gecə-gündüz mənim ibadətimdir.

Hər nə desəm, sən incimə sözümdən,
Sərxoşunam, yox xəbərim özümdən,
Şol qamətin yayılanda gözümdən,
Sanasan ki, həşrü qiyamətimdir.

Bağlamışam din-imanı zülfünə,
Mənim kimi heyran hanı zülfünə?
Tapşırıb gedirəm canı zülfünə,
Yaxşı saxla, səndə əmanətimdir.

Sənsən mənim ayım, günüm, hilalım,
Dövlətim, iqbalım, cahım, cəlalım,
Gözəl üzün daim fikrü xəyalım,
Sözün dildə şirin hekayətimdir.

Sonalar xəcildir siyah telindən,
Tutilər lal olur şirin dilindən,
Şikəstə Vaqifəm, sənin əlindən
Hər kimə ki, yetsəm, şikayətimdir.

### Gözlərin vəsfində yazıbdır:

Kaman qaş altında, al yanaq üstə
Nə xoş xumarlanır məstanə gözlər.
Sürməli kirpikdən oxlar çəkilib,
Eyləyir bağrımı nişanə gözlər.



Qəmzə peykanilə tökdü qanımı,
Xətalara saldı din-imanımı,
Əyri durdu, süzgün baxdı, canımı
Aldı o şux gözlər, amma nə gözlər.

Siması şəhlayi, tərhi badami,
Baxışı mehriban, özü hərami,
Quldur ona siyah zülfün təmami,
Ola bilməz belə şahanə gözlər.

Səmən iyli, səhabi zülf, ay qabaq,
Qönçə dəhən, dür diş, ərğəvan dodaq,
Münəvvər üz, lalə zənəx, tər buxaq,
Tamam bir yanədir, bir yanə gözlər.

Vaqif ki, düşübdür əqlü kamaldan,
Əksik olmaz başı qovğadan, qaldan,
Nə zülflərdən bilin, nə xəttü xaldan,
Eyləyibdir onu divanə gözlər.

### Zülfün vəsfində:

Ay kənarı qabağında qıy kimi
Bürünür, çulğanır yanağa zülfün.
Sanasan bulutdur, ənvər üzünü
Bədr ayı tək almış qucağa zülfün.

Şahmar təki gərdənində bulanır,
Güllər ilə sığallanır, sulanır,
Həlqə düşüb, buxaq altda dolanır,
Baş qoyur, sarınır qulağa zülfün.

Xəstə Vaqif onun sərgəştəsidir,
Bağrı qızıl qanın ağüştəsidir,
Hər tari-tərranın can riştəsidir,
Qoyma ki, tökülsün ayağa zülfün.

### Ayrılıqdan şikayət:

Yenə məni yaxar-yanar odlara –
Dağılmış ayrılıq saldı, sevdiyim!
Mən ha öldüm möhnət ilə, dərd ilə,
Can sənin yanında qaldı, sevdiyim!

Siyah zülfün buxaq altda qıvrılır,
Ala gözlər can almağa sayrılır,
Canandan ayrılan candan ayrılır,
Xalq içində bir məsəldi, sevdiyim!

Sərv qəddin sənubərə tay deyil,
Tamam sənin təki gülbədən deyil,
Dəxi əzəlki tək sən görən deyil,
İndi halım yaman haldı, sevdiyim!

Ol Xədicə haqqı, Səkinə haqqı,
Xeyrənnisa haqqı, Əminə haqqı,
Kə'bə, Məkkə haqqı, Mədinə haqqı,
Dərdin bu Vaqifi aldı, sevdiyim!

* * *

Yenə səni gördüm, bağrım oxlandı,
Ey əf'i baxışlı, havalı sərxoş!
Üzün göyçək, qaşın cəllad, gözün şux,
Görmədim sən təki maralı sərxoş!

Didarına müştaq olub qalmalı,
Başına dönməli, dərdin almalı,
Bir ayna qabaqlı, əyri çalmalı,
Əlvan kəlağaylı, səfalı sərxoş!

Gözləri sürməli, yanağı xallı,
Bir laçın sövdalı, tərlan xəyallı,
Qolları bazbəndli, boynu heykəlli,
Ağ əlləri əlvan hənalı sərxoş!

Oturuşu Şirin, duruşu Leyli,
Qəmzəsi sitəmkar, yarı gileyli,
Gecə-gündüz zövqü səfadə meyli,
Həm özü, həm fikrü xəyalı sərxoş!

Əqlin aldın, yarə deyin, Vaqifin,
Yanaltdın əlifin, beyin Vaqifin,
Üz göstərdin, yıxdın evin Vaqifin,
Həm özü, həm fikrü xəyalı sərxoş!

* * *

Sevdiyim, ləblərin yaquta bənzər,
Sərasər dişlərin dürdanədəndir.
Sədəf dəhanından çıxan sözlərin
Hər biri bir qeyri xəzanədəndir.

Nədəndir sözümə cavab verməmək,
Həm camal gizlədib, üz göstərməmək,
Gecələr gözlərim xabı görməmək
Ol siyəh-nərgisi-məstanədəndir.



Mən ha səni nuri-ilahi sannam,
Camalının şö'ləsinə dolannam,
Atəşinə mərdü-mərdanə yannam,
Bu xasiyyət mənə pərvanədəndir.

Bir namə yazmışam can üzə-üzə,
Badi-səba, aparasan gülüzə,
Soruşar yar ki, bu kimdəndir bizə?
Söyləgilən: Sizin divanədəndir.

Xumar-xumar baxmaq göz qaydasıdır,
Lalə tək qızarmaq üz qaydasıdır,
Pərişanlıq zülfün öz qaydasıdır,
Nə badi-səbadan, nə şanədəndir.

Müştaqdır üzünə gözü Vaqifin,
Yolunda payəndaz özü Vaqifin,
Sənsən fikrü zikri, sözü Vaqifin,
Qeyri söz yanında əfsanədəndir.

* * *

Ey camalı günəş, zülfləri dilkəş,
Cana saldın atəş çıxanda sərxoş,
Qaldım yana-yana misli-pərvanə,
Olmuşam divanə, getdi əqlü huş.

Çeşmin aldı cani, zülfün im'ani,
Kirpiklərin qani tökər nihani.
Ey Yusifi-sani, məlahət kani,
Sənə bənzər hanı dilbəri-ləbnuş.

Zəhi pəripeykər, qəddi sənubər,
Aləm sənə yeksər qulami-kəmtər,
Sənsən əcəb sərvər, sərdari-ləşkər,
Sultani-ziəfsər, şahi-dibapuş.

Hicrində bizarəm, zəlilü xarəm,
Müştaqi-didarəm, ixlaskarəm,
Bəsa ahü zarəm, dərintizarəm,
Qövlünə əğyarın gəl eyləmə guş.

Boyun sərvi-cənnət, gülşənə zinət,
Qaşın məddi ayət, qibleyi-taət,
Vaqifi-pürmöhnət çox çəkib həsrət
Ta səninlə xəlvət ola həmağuş.

* * *

Ey şahı xubların, şuxu dilbərin,
Səndən sənubərin xəcaləti var.
Xoş yaraşır sənə diba nimtənə,
Bu bəzəyin yenə əlaməti var.

Bu zibü ziynətin, şanü şövkətin,
Meraci-rifətin, babi-dövlətin,
Hüsnü məlahətin, çeşmi-afətin,
Bu qəddü qamətin qiyaməti var.

Məhbubi-müntəxəb, bir alinəsəb,
Qəmzəsində qəzəb, sən saxla, ya rəb!
Gül ruxlu, qönçələb, turuncu ğəbğəb,
Lisanında əcəb hekayəti var.

Olmaz belə adəm, yığılsa aləm,
Mələkdən mükərrəm, əlavü əzəm,
Özü bir şux sənəm, istiğnası kəm,
Bizə əmma hər dəm nəzakəti var.

Qışı yay, çeşmi şux, müjganları ox,
Cümlə kəsdən artıq, bərabəri yox,
Cəmalı yanında ayü gün mənsux,
Vaqifin ondan çox şikayəti var.

Vaqifin bu mürəbbeatında şayani-diqqət budur ki, hər misra iki hissədən tərtib olunmuş və gözəl qafiyələr ilə bağlanmış bəndlərdən əmələ gəlir. Hər bəndin özünəməxsus mə'nası ziyadə məharətlə nəzmə çəkilib, gözəlin hər bir ə'zası öz rəng və təbii haləti üzrə tövsif olunubdur. Məsələn:

Məhbubi-müntəxəb, bir alinəsəb,
Qəmzəsində qəzəb, sən saxla, ya rəb!
Gül ruxlu, qönçələb, turuncu ğəbğəb,
Lisanında əcəb hekayəti var.

Bir dilbərin ki, əslü nəsəbi ali olsa, qəmzəsində qəzəb görünə və o qəzəbdən Allah özü saxlaya, ruxu gül yarpağı kimi lətif, nazik və sürxə mayil ola, ləbi qönçəyə bənzəyə, çənəsi turunc misal müdəvvər və müəttər ola və lisanından xoş avaz ilə əcəb hekayətlər cari ola, əlbəttə, ancaq belə dilbərə məhbubi-müntəxəb demək olar.



Başqa bir qafiyəsində Molla Pənah gözəllik nişanəsini belə bəyan edir:

Açıqbaşda olsa əgər bir dilbər,
Onda bu nişanlar müəyyən gərək:
Əndamı ayinə, qəddi mötədil,
Siyah zülfü qamətinə tə'n gərək.

Yanağı laleyi-bahari kimi,
Ləbləri yaqutun kənari kimi,
Bir dənə nasüftə mirvari kimi,
Başdan ayağadək ağbədən gərək.

Təmizliyə ola meylü həvəsi,
Olmaya aşiqə nazü qəmzəsi,
Gül təki qoxuya nitqü nəfəsi,
Zülfü ya bənəfşə, ya səmən gərək.

Qövli sadiq ola, hər fe'li həlal,
Bilməyə kim, fitnə nədir, məkrü al,
Şam kimi qabaqda dura nitqi lal,
Kəsilsə də başı dinməyən gərək.

Novrəsidə, ondörd, onbeş yaşında,
Eyb olmaya kirpiyində, qaşında,
Həyasi üzündə, əqli başında,
Ağzı, burnu nazik, üzü gen gərək.

Tavus kimi cilvələnə hər səhər,
Bəzək verə camalına sərbəsər,
Dindirməmiş verə könüldən xəbər,
İşarə anlayıb hal bilən gərək.

Yaşadıqca cavanlana, yenlənə,
Bir hicabda, bir pərdədə əylənə,
Nitqü nəfəsindən canlar dinlənə,
Qulluqda, söhbətdə müstəhsən gərək.

Yaxşı canan gərək, Vaqif, can üçün,
Çox çalışmaq nədir bu cahan üçün,
Bir gözəl lazımdır bizim xan üçün,
Vali qulluğunda ərz edən gərək.

Belə mə'lum olur ki, bu şeirləri Vaqif xanın xahişinə görə yazıb, valiyi-Gürcüstana firistad etmişdir və ondan arzu və təmənna etdiyi Gürcüstan gözəlidir. Əvvəlki bənddən anlaşılan budur ki, Vaqifin vəsf qıldığı dilbər gərəkdir Minqreliya gözəllərindən alinəsəb bir nəcibə

olsun. Çünki Minqreliya keçmişdə "Açıqbaş" adlanarmış, başları açıq gəzməkləri səbəbinə. Odur ki, qafiyə "Açıqbaş" sözü ilə başlanır. Belə rəvayət olunur ki, vali xan üçün üç vecihə və gözəl qız göndəribmiş. O qızlardan birisini xan özü alıbdır ki, İzzət bəyimin və Mehdi bəyin anasıdır, adı Nisəxanımdır*. Birisini Məhəmmədqasım ağa[236] alıbdır, adı Minaxanımdır və birini də Əbülfət xana[237] veribdir.

Yuxarıda zikr olunan gözəl və mövzun qafiyələrdən başqa ki, onların ədədi çoxdur və cümləsini buraya küncayişi yoxdur, Molla Pənah Vaqifin bir çox şe'ri-müstəzadı və müxəmməsatı vardır. Onlardan məşhuru əbnayiruzigarın bivəfa və dəyanətsiz olmağı xüsusunda yazdığı müxəmməsdir ki, onun məal və məzmunu, – necə ki dünya vardır, – həmişə təzəlik və doğruluq üzrə baqi qalacaqdır. Haman müxəmməs eyni ilə burada dərc olunur:

Mən cahan mülkündə, mütləq, doğru halət görmədim,
Hər nə gördüm, əyri gördüm, özgə babət görmədim.
Aşinalar ixtilatında sədaqət görmədim,
Beyətü iqrarü imanü dəyanət görmədim,
Bifəvadan, lacərəm, təhsili-hacət görmədim.

Xah sultan, xah dərvişü gəda bilittifaq,
Özlərin qılmış giriftari-qəmü dərdü fəraq,
Cifeyi-dünyayədir hər ehtiyacü iştiyaq,
Munca kim, etdim təmaşa, sözlərə asdım qulaq,
Kizbü böhtandan səvayı bir hekayət görmədim.

Xəlqi-aləm bir əcəb düstur tutmuş hər zaman,
Hansı qəmli könlü kim, sən edər olsan şadiman,
Ol sənə, əlbəttə kim, bədguluq eylər, bigüman,
Hər kəsə hər kəs ki, etsə yaxşılıq olur yaman,
Bulmadım bir dust ki, ondan bir ədavət görmədim.

Alimü cahil, müridü mürşidü şagirdü pir,
Nəfsi-əmmarə əlində sərbəsər olmuş əsir,
Həqqi batil eyləmişlər işlədir cürmi-kəbir,
Şeyxlər, şəyyadü abidlər əbusən qəmtərir,
Hiç kəsdə həqqə layiq bir ibadət görmədim.

Hər kişi hər şeyi sevdi, onu behtər istədi,
Kimi təxtü, kimi tacü, kimi əfsər istədi.
Padşahlar dəmbədəm təsxiri-kişvər istədi,
Eşqə həm çox kimsə düşdü vəsli-dilbər istədi,
Heç birində aqibət bir zövqü rahət görmədim.

*** Bir rəvayət də budur ki, Gürcüstan valisi İbrahim xan Qarabağiyə göndərdiyi dilbər Cəvahir xanım imiş ki, Gövhər ağayi-mərhumənin validəsidir.**



Mən özüm çox kuzəkarı kimyagər eylədim,
Sikkələndirdim qübari-tirəni, zər eylədim,
Qara daşı döndərib yaquti-əhmər eylədim,
Daneyi-xərmöhrəni dürrə bərabər eylədim,
Qədrü qiymət istəyib, qeyr əz xəsarət görmədim.

Gün kimi bir şəxsə gündə xeyr versən sə'd həzar,
Zərrəcə etməz ədayi-şükri-ne'mət aşikar,
Qalmayıbdır qeyrətü şərmü həya, namusü ar,
Dedilər ki, etibarü e'tiqad aləmdə var,
Ondan ötrü mən də çox gəzdim, nəhayət, görmədim.

Eyləyən viranə Cəmşidi-Cəmin eyvanını,
Yola salmış bəlkə bəzmi-işrətin çəndanını,
Kim qılıbdır ki, onun qəm tökməyibdir qanını?
Dönə-dönə imtahan etdim fələk dövranını,
Onda mən bər'əkslikdən qeyri adət görmədim.

Müxtəsər kim, böylə dünyadan gərək etmək həzər,
Ondan ötrü kim, deyildir öz yerində xeyrü şər',
Alilər xaki-məzəllətdə, dənilər mötə'bər,
Sahibi-zərdə kərəm yoxdur, kərəm əhlində zər,
İşlənən işlərdə ehkamü ləyaqət görmədim.

Dövlətü iqbalü malın axırın gördün tamam,
Hişmətü cahü cəlalın axırın gördüm tamam,
Zülfü ruyü xəttü xalın axırın gördüm tamam,
Həmdəmi-sahibcəmalın axırın gördüm tamam,
Başadək bir hüsni-surət, qəddü qamət görmədim.

Ey xoş onlar kim, Məhəmməd Mustəfanı sevdilər,
Oldular aşiq, Əliyyül-Mürtəzanı sevdilər,
Sidqü ixlas ilə pənc Ali-əbanı sevdilər,
Çardəh mə'sum tək müşkülgüşanı sevdilər,
Dəxi onlardan gözəl yaxşı cəmaət görmədim[238].

Ya imam-əl-ins vəl-cinnü şəhənşahi-ümur,
Getdi din əldən, bu gündən böylə sən eylə zühur,
Qoyma kim, şeytani-məl'un eyləyə imanə zur,
Şöleyi-hüsnünlə bəxş et tazədən dünyayə nur –
Kim, şəriət məşəlində istiqamət görmədim.

Baş ağardı, ruzigarım oldu gün-gündən siyah,
Etmədim, sə'd heyf kim, bir mahruxsarə nigah,
Qədrbilməz həmdəm ilə eylədim ömrü təbah,
Vaqifə, ya rəbbəna, öz lütfünü eylə pənah,
Səndən özgə kimsədə lütfü inayət görmədim.

Vaqifin bu kəlamında hikmətamiz və ibrətamiz sözlər çoxdur ki, onları şair təcrübə üzü ilə söyləyibdir və əksəri dəruni-qəlbdən çıxan suzişli fəryad və nalələrdir. Bu sözlər acı və pürkədar isə də, mənən haqq və doğrudur. Bunları batil etməyə əldə dəlilimiz yoxdur.

Filhəqiqə, hansı bir məkan və zamanda və hansı miləl və əqvamın arasında Vaqifin sözləri məzmundan düşüb cifeyi-dünyaya ehtiyac və iştiyaq olmayacaqdır və adamların ə'malü əf'alında kizb və böhtan əvəzində doğruluq, qiybət və şeytanət yerində sülh və sazişlik işlənəcəkdir? Bu suallara təskinlik bəxş edici cavablar verməк olurmu?

Tutalım ki, düzlük və sədaqət yoxdur. Bəlkə Adəm atanın övladı arasında haqqşünaslıq, şükrani-ne'mət, şərm və həya, himmət və qeybət, etibar və e'tiqad vardır? Əfsus ki, şair bunların da yoxluğunu təsdiq edib, bizi mə'yus və əfsürdəlil eyləyir. Budur, oxuyun:

Gün kimi bir şəxsə gündə xeyr versən sə'd həzar,
Zərrəcə etməz ədayi-şükri-ne'mət aşikar,
Qalmayıbdır qeyrətü şərmü həya, namusü ar,
Dedilər ki, etibarü e'tiqad aləmdə var,
Ondan ötrü mən də çox gəzdim, nəhayət, görmədim.

Doğrudan da e'tiqad və etibar, qeyrət və namus, ittihad və ittifaq qeyri millətlər arasında var isə də, heyfa ki, biz müsəlmanlar içində yoxdur. Əgər onlardan bir əsər olsa idi, belə zillət və fəlakətə düçar olmazdıq və bu anə qədər biz də ağ günə çıxardıq...

Şe'rin qəzəliyyat növündən Vaqifin beş-altı qəzəlləri vardır[239]. Onlardan məşhuru və xoşməzmunu Molla Vəli Vidadiyə yazdığı qəzəllərdir:

Kim ki, sövdayi-səri-zülfi-pərişanə düşər,
Gah zindanə, gahi çahi-zənəxdanə düşər.

Afəti-dəhr dəyər ol kəsə kim, kamildir,
Mah hər gün ki, kəmalə yetə, nöqsanə düşər.

Mərd igidlər özünə məhbəsi meydan bilər,
Sanma ki, nakəsü namərd bu meydanə düşər.

Eybdən saf çıxar, pakü mübərra görünər,
Hər təla kim, küreyi-atəşi-suzanə düşər.

Piçü tabə düşənin işi, bəli, üzdə olur,
Zülf bu vəchlə ol gülruxi-cananə düşər.

Hər yaman yer ki, ola yaxşıların mənzilidir,
Lə'l daş içrə, xəzinə dəxi viranə düşər.



Şami-qəm şadlıq əyyamına xoş zivərdir,
Necə kim, xali siyəh arizi-canənə düşər.

Ey Vidadi, qəmi-hicranə giriftar olmaq
Bir sənə, bir mənə, bir Yusifi-Kən'anə düşər.

Eşqə düşmək sənə düşməz, qocalıbsan, belə dur,
Belə işlər yenə Vaqif kimi oğlanə düşər.

Bu qəzəldə Molla Pənahın təcrübə və hikmət yolu ilə söylədiyi kəlam və bə'zi təşbihat və istiareyi-təmsiliyyə şayani-diqqətdir. Əlhəqq, dünyada afət və bəlaya giriftar olan əksər övqat kamal və mə'rifət əhli olub, cühəla və dənitəblər eyş və səfada, dövlət və ne'mət içində ömür sürürlər və nə məqsəd və mətləbdən ötrü xəlq olunmaqlarından və özlərinə borc olan təkliflərdən mütləq bixəbərdirlər. Məhbəs və zindani-bəla mərd igidlər üçün vüs'ətli meydan mənzələsində olduğu halda namərdlərin hünəri deyil ki, bu meydanə qədəm qoysunlar. Dar gün, cismani əziyyətlər və ruhani küdurətlər alitəblərin e'tiqad və sədaqətini dəxi də möhkəmləndirib, polad kimi onları safa çıxarır; necə ki, atəş kürəsində qızıl və gümüş safa çıxır. Lə'lin yeri daş və xəzinənin yeri viranə künclər olduğu kimi, möhnətsəralar dəxi yaxşıların mənzili olur və hicran qəmində şair həm özünü və həm dusti-həqiqisi Vidadini Yusifi-Kən'ana təşbih edib bununla təsəlliyab olur:

Vidadidən gələn kağız məni fərxundəhal etdi,
Bu halı gördü qəm, filhal məndən intiqal etdi.

Uçub könlüm quşu pərvaz qılsa övci-əlayə,
Əcəb yox kim, bu məktubu özünə pərrü bal etdi.

Ziyayi-şəms tək yetdi, məni bədr eylədi hala
Əgərçi qəddimi dövrani-filmazi hilal etdi.

Səvadi namənin, ey dil, məgər zülmati-heyvandır –
Ki, ruhum Xızr tək ondan bəsi kəsbi-kəmal etdi?!

Xəyal etmişdi Vaqif kim, rəvan bir xoş qəzəl yazsın,
Rəvan olmuşdu qasid kim, bunu ancaq xəyal etdi[240].

Bu qəzəldən mə'lum olur ki, Vaqif bunu ömrünün müsinn çağında yazıbdır ki, candan əziz olan qədrşünas dostunun müfariqətində xeyli cəfalar çəkibdir. Şair Vidadidən vüsul olan naməni könlünün quşuna pərü bal edib onu övci-əlaya qalxızır. Əgərçi keçmiş zəmanənin inqilab və iğtişaşı şai-

rin qəddini əyib hilal qılmışdır və lakin haman dusti-binəzirin naməsi ziyayi-şəms tək onun qəddini rast və qəlbini münəvvər eləyir və səvadi-namə ruhuna səfa və həyati-əbədi bəxş edir.

Afərin belə dostluğa və mərhəba bu sədaqətə!

Bu qəzəl Şeyx Sə'dinin[241] dostluq barəsində yazdığı qəzələ bənzəyir. Təfavüt ancaq burasındadır ki, Şeyx Sə'di həqiqi dostluğun şürut və vəzifəsi nə olduğunu bildirib, ümum nasə xitabən yazmışdır. Amma Vaqif isə öz dostundan gələn kağızdan məsrur olub onun qədr və mənzələsini bəyan edir. Sə'di əleyhirrəhmə dostluq barəsində buyurubdur və həqiqətdə çəməni-mə'nayə dürr saçıbdır:

Yar an bovəd ke səbr konəd bər cəfeye-yar,
Tərke-rezaye-xiş konəd bər rezaye-yar.

Gər bər vocude-aşeqe-sadeq nəhənd tiğ,
Binəd xətaye-xiş nəbinəd xətaye-yar.

Yar əz bəraye-xiş gereftən təriq nist,
Ma nəfse-xiştən bekoşim əz bəraye-yar.

Mən rəh nemibərəm məgər anca ke kuye-dust,
Mən sər neminəhəm məgər anca ke paye-yar[242].

Dusti-həqiqi və yari-cani həqiqətdə o dostdur ki, öz xeyir və rizasını və səlahi-ümurunu dost rizası və səlahı yolunda tərk edib, ondan mal və canını müzayiqə etməyə, dostun adı çəkilən yerdə başdan keçə. Heyfa ki, bu vəsvəseyi-şeytan və dəğdəğeyi-insan ilə dolmuş əsrimizdə bu qism dostların vücudu ənqa quşu kimi nayabdır. Bu əsri-şumda həqiqi bir dost tapılmaz ki, onun sədaqət və dəyanətinə etibar oluna və dar gündə dəstgirliyinə ümid bağlana...

Necə ki, fövqdə zikr olundu, Molla Pənah Vaqifin ədəbiyyatımızın banisi, müəssisi adlanmağa haqqı vardır. Tamami Qafqazda ondan müqəddəm bir müqtədir ədib, xoşkəlam və mövzuntəb şair Ənhür etməyibdir ki, ibtidayi-süxən onun adı ilə başlansın. Əgərçi Azərbaycanın İrana mütəəlliq hissələrində Aciz, Divani, Qövsi, Arif[243] kimi bə'zi şairlər vücuda gəlibdir və illa onların asari-qələmiyyələri və xüsusən, tərcümeyi-halları millətimiz arasında intişar bulmayıbdır. Ancaq bə'zi mütəfərriq şeir və qəzəlləri xanəndələr və qəzəlxanlar vasitəsilə gəlib bizə yetişibdir.

Molla Pənah Vaqif isə cümləmizə mə'lumdur. Onun adını eşitməyən və şə'nində söylənən "hər oxuyan Molla Pənah olmaz" məsələni bilməyən Qafqaz oğlu yoxdur. Vaqifi belə şöhrətləndirən, əlbəttə, onun rəvan



təb'i, mövzun kəlamı və gözəl qafiyələri olubdur ki, indi də o qafiyələr ümum nasın dillərində caridir. Vaqifin kəlamlarını oxuduqda bilaixtiyar onlara meyl və rəğbət bağlayırıq. Şair hər nə vücuda gətiribsə, öz ana dilimizin tərz və şivəsində gətiribdir. Onun əş'arında iste'mal olunan türk və ya türkləşmiş fars və ərəb sözləri elə məharətlə nəzmə çəkilibdir ki, oxuyanları valeh və heyran edir. Məsələn, bu sadəlikdə hansı bir türk şairi qafiyələr tərtib edibdir:

Bağlamışam din-imanı zülfünə,
Mənim kimi heyran hanı zülfünə?
Tapşırıb gedirəm canı zülfünə,
Yaxşı saxla, səndə əmanətimdir.

Və yainki bu şeirlər:

Xumar-xumar baxmaq göz qaydasıdır,
Lalə tək qızarmaq üz qaydasıdır,
Pərişanlıq zülfün öz qaydasıdır,
Nə badi-səbadan, nə şanədəndir.

Bu sadə və rəvan şeirlər ki, mənən dəxi ziyadə məqbul və müstəhsəndir, şairin artıq dərəcədə ana dilinə dara olmasına və milli şairliyinə dəlalət edir. Əlbəttə, Molla Pənaha bu eybləri irad tutmaq olmaz ki, o milli şair olduğu halda millətinin hürriyyətinə dair, tərəqqi və təalisinə məxsus bir əsər qoymayıbdır. Molla Pənah dəxi sair şairlər kimi öz zamanının oğlu olub, onun təqazasınca şeir yazarmış. Ondan çox sonra gələn şairlərin kəlamlarında da "millət", "hürriyyət", "din" və "vətən" sözləri hərgiz iste'mal olunmayıbdır.

Bununla belə Vaqifin yuxarıda zikr olunan müxəmməs və qəzəliyyatında təcrübə üzü ilə deyilmiş pürmə'na sözlər və dərin fikirlər vardır ki, həmə vəqt həyat üzrə baqi qalacaqdır. Bundan maəda Vaqifin milli ədəbiyyatımıza hüsni-xidməti bu olubdur ki, Türkiyə və İranzəmin şüərasına müqəllidlik etməyibdir, bəlkə onun üçün əsan və təbii bir yol açıbdır ki, ondan sonra gələn şairlər ona peyrəvilik edib, bir çox gözəl əsərlər meydana gətiriblər. Bu cəhətə Molla Pənah Vaqifin Qafqaziyada vücuda gələn şairlərin babası və ustadı adlanmağa haqqı vardır.

## MOLLA VƏLİ "VİDADİ" TƏXƏLLÜS

Azərbaycan şairlərinin məşhurundan birisi də Molla Vəli "Vidadi" təxəllüsdür ki, Molla Pənahın müasiri, dostu və bir qövlə görə, əqrəbası imiş. Molla Vəli Qazax mahalında Şıxlı qəryəsində təvəllüd edibdir. Bə'zi rəvayətə görə, Molla Vəlinin atası Məhəmməd ağa İrandan gəlmədir və Məhəmməd ağanın atası Həmzə sultanın nəslindəndir ki, səfəvilərin dövründən İranda olurmuş[244].

Molla Vəlinin yaxşı elm və savadı və rəvan təb'i var imiş və özü də zöhd və təqva əhli olub, vaxtının çoxunu ibadətlə keçirərmiş. Haqq söyləyən və haqqı dost tutan bir vücud imiş ki, hər kəsin eybini açıq söyləməkdən bak və ictinab etməz imiş. Ona binaən şairdən dilgir və rəncidə olanların ədədi az deyil imiş. Amma bununla belə hamı onu sayarmış, xatirini əziz və möhtərəm tutarmış. Müasiri vəkil Əhmədağa ilə aralarında dostluq və zarafat var imiş və çox vaxtı şair ona kinayə və istehza təriqincə acı sözlər deyər imiş, amma Əhmədağa onun sözlərindən inciməz imiş. Belə ki, bir vaxtı bunlar yaylaqda olan zamanı evlərindən çıxıb gözəl və çiçəkli dağlarda seyr edirlər. Bu əsnada duman gəlib onları əhatə edir. Molla Vəli xovfa düşür ki, onlar azacaqlar. Amma Əhmədağa ona ürək verib deyir: "Qorxma, mən məni salamat yurdumuza apararam" və doğrudan da Vidadini salamat gətirib şenliyin içinə çıxarır.

Bu barədə qeyrilərin yanında Əhmədağa özünü öyüb, zehn və fərasətini zikr etdikdə Molla Vəli təngə gəlib deyir: – Ağa, bu qədər özünü öymə, bu bir böyük hünər deyil, qara mal da (sığır) heç azmaz.

Bə'zi rəvayətə görə, Molla Vəli Vidadi Qazax mahalında ən mötə'bər, tədbirli və nüfuzlu bir adam hesab olunduğuna bənaən, Gürcüstan valisi İrakli xan onu özünə müqərrəb edib və onun ağıl və kamalını görüb, bə'zi ittifaqlarda Qazax mahalına dair məsələlər vüqua gəldikdə onun tədbir və səlahdidilə iş görərmiş. Bu əhvalı onun dostu Molla Pənah Vaqif eşidib Qarabağdan Vidadinin hal və şə'ninə münasib bu şeirləri yazıb göndərmişdir:

Ey Vidadi, yenə xan qulluğunda
Qaim olub, nə qiyamət eylərsən?
Yaman gözdən Allah özü saxlasın,
İxlas ilə, kişi, xidmət eylərsən.
Belə dursan o qapıda qış və yaz,
Yetişərsən bir çörəyə sərəfraz,
Bu doğru yolundan əyilsən bir az,
Yəqin bil ki, çox xəyanət eylərsən...



Və lakin Vidadinin İrakli xana müqərrəb və məsləhətçi olduğunu nə gürcü və rus və nə də bizim tarixlərdə görmədik. Özgə bir qövlə görə, əzancümlə mərhum Əhməd bəy Cavanşirin yazmağına binaən – ki, onun Qarabağ tarixinə dair artıq bələdiyyəti var idi, – Molla Pənah mərhum İbrahim xanın müqərrəbi-hüzuru olan zamanı öz dostu Molla Vəlini yazıb Qazaxdan Qarabağa gətirdibdir[245] və burada onun xana yavuq olmağına səbəb düşübdür və xan Molla Vəlinin ağıl və kamalını dərk edib və xüsusən onun mö'min və müttəqi bir şəxs olduğunu görüb, ona lütf və mərhəmət göstərərmiş və hər qisim rö'ya görsə imiş Molla Vəliyə söylər imiş. Molla dəxi onları xeyli münasib təb'ir edərmiş. Amma bu rəvayəti dəxi təsdiq etməyə əldə bir dəstavizimiz yoxdur. Bunun doğruluğuna şəhadət verici "Qarabağ tarixi"ndə bir işarə görmədik.

Doğrudur Mirzə Cəmalın yazdığı tarixdə Mirzə Vəli adlı bir şəxsin ismi zikr olunubdur, vəli haman Mirzə Vəli Qarabağda Şuşa uyezdində Baharlı qəryəsindən bir şirinzəban və kardan və zirək bir adam imiş ki, İbrahim xan onu öz əmizadəsi Əbdüssəməd bəy ilə Ağa Məhəmməd şah əvvəl dəfədə Azərbaycanın cənub səmtində vaqe olan vilayətləri hiytəyi-təsərrüfünə götürdükdə zəval rəsmi ilə şaha göndərmişdir. Məzkur Mirzə Vəlinin nəsli bu halda Qarabağda və Bakıda mövcud və Vəliyev familiyası ilə məşhurdurlar.

Bəs, Baharlı Mirzə Vəli ilə Şıxlı Mirzə Vəlini qarşıdırmaq böyük səhvdir. Təəccüb budur ki, Qarabağın əhval və tarixinə bələd olanlar və onların cümləsindən şair Mirmöhsün ağa Ağamirzə[246] Şıxlı Molla Vəlinin vücudunu bilmərrə inkar edib, Molla Vəli Vidadi ancaq Mirzə Vəli Baharlıdan ibarət olmasını tə'kid edirlər[247] və Mirmöhsün ağanın qövl və iddiasının qüvvəsincə bunu dəxi əlavə edə bilərik ki, neçə sənə bundan müqəddəm Baharlı qəryəsindən Həmid bəy Vəliyev ismində bir şəxs ilə tanış olduq. Bu cənabın ziyadə xoşsöhbət və dilavər olduğunu təhsin etdikdə bizə cavab verib dedi ki, filankəs bizim babamız çox dilavər və fəsih bir adam imiş, özünün də təb'i-şe'riyyəsi var imiş. Babasının adını soruşduqda bizə cavab verdi ki, babamızın adı Molla Vəlidir, "Vidadi" təxəllüs.

Əşarından bir neçələrini oxumağı təvəqqe elədik. Başladı Vaqifin Molla Vəliyə zarafatyana tərəkəmə arvadlarının barəsində yazdığı kəlamın bir neçə bəndlərini oxumağa:

Xoş halına sənin, uzun dırnaqlı,
Baldırı çırmaqlı, yalın ayaqlı,
Yorğanı, yasdığı tozlu, torpaqlı
Həmdəm ilə hər dəm söhbət eylərsən.

Əllərin, üzlərin yuduqları yox,
Yaşlarında doğru dedikləri yox,
Hazır çobandılar, düdükləri yox,
Onlar ilə necə ülfət eylərsən?!

Bu sözləri eşidib, Həmid bəyə ərz etdik ki, bu, Vaqifin kəlamıdır, Molla Vəlinin kəlamı deyil və Molla Vəli özü Qazax əhlidir, Şıxlı qəryəsində təvəllüd etmişdir. Müşarileyh təbəssüm ilə cavab verdi ki, "xeyr, səhv edirsiniz. Qazaxda Molla Vəli olmayıbdır. Molla Vəli Vidadi ancaq birdir, o da bizim babamızdır".

Hər halda cənab Mirmöhsün ağa, Həmid bəy və qeyriləri Baharlı Mirzə Vəli ilə Şıxlı Molla Vəlini qarışdırırlar. Bu böyük səhvdir. Vidadi mərhumun övladı əlan Qazax mahalında və bə'ziləri Tiflis şəhərində sakindirlər.

Səhihi buldur ki, Molla Vəli Vidadini onun dostu Vaqif çağırıb Qarabağa gətirdibdir. Və burada Cavanşir uyezdində məşhur "Gülüstan" adlanan yerdə – ki, sabiqdə xırdaca bir xanlıqdan ibarət imiş, – Molla Vəli Vaqifin vasitəsilə ora xanının hüzurunda müqərrəb və möhtərəm şəxslərdən birisi olubdur. Bu əhvalın doğruluğuna Vaqif ilə onun arasında vüqua gələn müşairə dəlalət eləyir.

Vaqif yazır:

Belə dursan o qapıda qış və yaz,
Yetişərsən bir çörəyə sərəfraz,
Bu doğru yolundan əyilsən bir az,
Yəqin bil ki, çox xəyanət eylərsən.

Xanın məhəbbətin könlündə yatır,
Bit yeyər ətini, olarsan qotur,
Tərpənmə yerindən, əlbət, bərk otur,
Vay halına bir hərəkət eylərsən.

Evini, malını yadına salma,
Xan izin versə də, boynuna alma,
Ömərin, Osmanın qaydına qalma,
Sözlərini bidəyanət eylərsən*.

Cavanşir xəlqilə ol qohum-qardaş,
Qazaxın sözünü heç eyləmə faş,
Deməηəm, dinini eylə qızılbaş,
Əqlin olsa, özün, əlbət, eylərsən.

* Bu sözləri Vaqif dostuna, əlbəttə, zarafat vəchi ilə yazmışdır. Onların arasında bu qisim göftügular çox ittifaq düşərmiş.



Xanı qoyub əgər evə getməsən,
Qarğa mənə* mətləbinə yetməsən,
Ülüləmrin itaətin etməsən,
Tərki-sünnət vəl-cəmaət eylərsən.

Vidadi Vaqifə yazdığı cavabın bir bəndində deyibdir:

Dovtələb olubsan gedibsən xandan,
Ölüncə çıxmanam ta Gülüstandan,
Sən hərgah çalışsan habelə candan,
Hər nə desən, bil, aqibət eylərsən.

Molla Vəlinin oğlu Məhəmməd ağa – ki, babasının adı ona qoyulmuşdur, – sonralardan haman Gülüstanda, Qazi Səidəddin əfəndinin qövlünə görə, xanlıq edibdir. Vidadinin bir oğlu dəxi məşhur Osman əfəndi imiş ki, Tiflisdə ikinci müfti olubdur ki, elm və kəmalı ilə məşhur imiş. Osman əfəndinin fərzəndlərindən birisi üçüncü müfti Məhəmməd əfəndi olub və o birisi dəxi Qazi Səidəddin əfəndidir ki, sabiqdə Qarabağda qazilik edərmiş və bəd müddəti-mədidə Qazax mahalında məsnədi-qəzavətdə ikən həştad sinnində dari-üqbayə rehlət eləyibdir.

Vidadi yüz ilə kimi, bəlkə bir az da artıq zindəganlıq edibdir. Sinndə Vaqifdən böyük imiş. Odur ki, Vaqif ona yazdığı bir qəzəlində demişdir:

Eşqə düşmək sənə düşməz, qocalıbsan, belə dur,
Belə işlər yenə Vaqif kimi oğlana düşər.

Vidadi bunun cavabında yazdığı qəzəldə demişdir:

Nə qədər olsa qoca gərçi Vidadi xəstə,
Yenə Vaqif kimi, əlbəttə, yüz oğlana dəyər.

Molla Vəlinin müsinn çağında fərzəndi-giramisi Osman əfəndi ona xidmət və riayət göstərərmiş və şairin gözləri yaxşı görmədiyindən onun əlindən tutub gəzdirərmiş və hər növ ehtiyacatını rəf' qılmağı özünə borc hesab edərmiş və Vidadi dəxi onu canü dildən sevib, əziz tutarmış və onun haqqında belə xeyir-dua etmişdi:

Ey həlimü əlimi-rəbbani,
Elm ilə möhtərəm qıl Osmani.

* Q a r ğ a  m ə n ə – yə'ni mənə qarğış və nifrət elə

Filhəqiqə Osman əfəndi atasının duası bərəkətindən elmü helm ilə fəridül-əsr bir vücud olub. Onun namü şöhrəti nəinki tək Qafqazda, hətta Osmanlı məmləkətində dəxi intişar tapmışdır.

Molla Vəli Vidadi vəfat edibdir tarixi-hicriyyənin 1224-cü ilində ki, miladın 1809-cu sənəsinə mütabiqdir[248]. Dəfn olunubdur Şıxlı qəbiristanlığında ki, "Gəmiqayası" adlanan yerdə vaqedir. Qəbir daşının üstündə bu beyt həkk olunubdur:

Kim Vidadi xəstənin qəbrin görüb etsə dua,
Edə həq rəhmət, şəfi ola Məhəmməd Mustafa.

Vidadinin əsərlərindən məşhuru Şəki və Şirvan hakimi Hüseyn xan "Müştaq" təxəllüsün sərgüzəşti və onun öz əmisi Hacı Əbdülqadirin hiyləkarlığı və ədavəti ilə məqtul olduğu babında yazdığı müxəmməsdir ki, eyni ilə burada dərc olunur:

Gəl, könül, bir ibrət al bu gərdişi-dövranə bax!
Cami-heyrətdən dəmi məxmur olub, məstanə bax!
Tut təfəkkür damənin, bir dəm dili-heyranə bax!
Kimsəyə qılmaz vəfa, bu dəhri-bipayanə bax!
Olma mə'murinə rağib, axiri viranə bax!

Bivəfadır mülki-dünya, malına aldanma çox,
İzzü cahü dövlətü iqbalına aldanma çox,
Tutma ümmid, əqlü fəhm əhvalına aldanma çox,
Qövmü qərdaşü rəfiq əqvalına aldanma çox,
Hər biri bir rəmz ilə səndən olur biganə, bax!

Şərhi bimümkün gəlib getmiş cahana çox hümam*,
Hər biri əsrində bir sahibhünər, aliməqam,
Şah ola, istər gəda, divanə ya əhli-nizam,
Yetməmiş məqsudinə aləmdə heç ərbabi-nam,
Cümləsin məqtul edib, bu bisərü samanə bax!

Dinlə, ey tüğyani-möhnət, bir hekayət söyləyim,
Didələr giryan edən şərhi-məlalət söyləyim,
Dərdi-bidərmanü daği-binəhayət söyləyim,
Bu sözə nisbət sənə, gəl, bir hekayət söyləyim,
Lütf edib, qıl bir nəzər, bu müxtəsər dəstanə bax!

Noldu gör ol sərvəri-dövran, əmiri-möhtərəm,
Mənbəi-cudü səxavət, mədəni-lütfü kərəm,

---

* **Hümam** – himmət əhli olan böyük padşahlar və sərkərdələr



Mərdi-meydan, əhli-ürfan, sahibi-tiğü qələm,
Ərseyi-rif'ətdə guya kim, tikilmiş bir ə'ləm,
Hakimi-Şirvan, Şəki, yə'ni Hüseyn xanə bax!

Şirdil bir mərd idi kim, şövkətü şə'ni əzim,
Səfşikən, ədafikən, şəmşirzən, bixövfü bim,
Sərvəri-sahibhəşəm, ətbai çox, mülkü qədim,
Xoşnüma, xəndanliqa, şirinsüxən, təb'i həlim,
Neylədi, gəl gör, müqəddər, hikməti-yəzdanə bax!

Həqpərəst, əhli-təvəkkül, pakdil, safcigər,
Baki yox heç kimsədən, cahü cəlalı bikədər,
Bilməmiş rəşkü həsəd insanı eylər dərbədər,
Bağlamış onunla kin ədavü ədna sərbəsər,
Saldılar hər rəng dəvalar tutub böhtanə bax!

Hacı Əbdülqadirü Hacı Məhəmməd kinədar
Saldılar yüz dürlü dəva, oldular ondan fərar,
Etdilər ol dəmdə Dardoqqazı səngər üstüvar,
Tapdı düşmən hər tərəf, yüz oldu qovğa aşikar,
Buldular fürsət, təmami girdilər meydanə, bax!

Kəndxudalar göndərib oğluyla çox and eylədi,
Etmədi bir sud hərçənd əhdü peyvənd eylədi,
Hacı Əbdülqadir ol dəm gör necə fənd eylədi,
Tutdu onları təmamən yerbəyer bənd eylədi,
Verdi İbrahim xana, həm saldılar zindanə, bax!

Gör nələr gəldi o dəm Hacı Məhəmməd başına,
Tutdurub həm anı dəxi qoydu qələ daşına,
Qaldı bir il, verdi can axır əcəl pərxaşına,
Böylədir, hər kim olursa xain öz yoldaşına,
Getdi hər nə var isə mərdümliyi məccanə bax!

Ol Qarabağ hakimi dövlətli İbrahim xan
Əvvəl-axır onun ilə ta yaman idi yaman,
Gördü fürsət gəldi, fövt etmək deyil əqlə nişan,
Oldu Əbdülqadir ilə müttəfiq həm ol zaman,
Yığdılar bihədd ləşkər, car edib hər yanə, bax!

Qıldı bu sərriştədə hər hal ol sə'yü əmək,
Etmədi təqsir, hər dəm verdi simü zər demək,
Gəldilər Carü Tala bəylər təmami binəmək,
Keçdi çox dava-döyüşlər, tül olur şərh eyləmək,
Öldü əvvəl Hacı xan tək novcəvan fərzanə, bax!

Çəkdi Ümmə xanü Əhməd xani-Cöngətay cəri,
Hər biri Dağıstan içrə külli ləşkər sərvəri,
Biləsincə neçə başçı, cümləsi meydan əri,
Bir tərəfdən göndərib topxanə, verdi ləşkəri,
Arxa durdu onlara valiyi-Gürcüstanə bax!

Eylədi hər bir qoşun gəldikcə bir dürlü savaş,
Hər tərəfdən qoydular can almağa meydanə baş,
Keçdi müddət, düşdü xəlqə öylə bir qəhti-məaş,
Olmayıb bir böylə zillət mətləqa aləmdə faş,
Gəlməyib böylə müsibət Rumə, ya İranə, bax!

Artdı qovğa üz verib hər ləhzə bir cəngü cidal,
Öylə kim, gəlməz hesabə oldu məqtulü qital.
Gördü kim, ol mərdi-meydani-bəla, ol pürməlal
Günbəgün etməkdədir əyyam onu aşüftəhal,
Dəmbədəm salmaqdadır dövran onu nöqsanə, bax!

Fətəli xan yanına əzm eyləyib, hicrət qılıb,
Neylədi ol mərd gör ə'da ikən hörmət qılıb,
Çəkdi ləşkər biləsincə neçə yol qeyrət qılıb,
Etdi mə'yus onu həm iqbali-binüsrət qılıb,
Neyləsin insan əgər yar olmasa sübhanə, bax!

Gah Ağası xan Şirvan hakimilə bir zaman –
Baş qoyub ədayə qarşı atdılara meydanə can,
Öylə bir cəng etdilər kim, su yerinə axdı qan,
Hasili ol dərdməndə vermədi nüsrət inan,
Atəşi-meydanlara etdi özün pərvanə, bax!

Döndü çün iqbali-dövlət, gəlmədi pərva ona,
Olmadı hər yanə üz tutdusa bir mə'va ona,
Hər nə var yarü müsahib oldular ə'da ona,
Hər tərəfdən verdilər qətl etməyə fitva ona,
Cümlə xunxarü nəmeksiz ol Şəki, Şirvanə bax!

Gör necə döndü, təmaşa qıl onun əqranına,
Aşikaravü nihan qəsd etdilər ta canına,
Duydu halı, hər tərəfdən yığdı ləşkər yanına,
Olmadı, çün çarə yox həqdən işin imkanına,
Hər nə tədbir ilə sə'y etdisə ol mərdanə, bax!

Cəm olub qətlinə onun bir neçə əşrarlər,
Bilməyən nanü nəmək, bihörmətü biarlər.
Ölməyə öldürməyə bərk etdilər iqrarlər.
Cümlə öz əqvamü əqranı təmam xunxarlər,
Qövm-qardaşa inan, gəl dosta bax, yarənə bax!



Bir günorta vaxtı xali buldular fürsət məgər,
Qalmamış, getmiş dərində hiç dərbandan bəşər.
Doldular ol xabi-qəflətdə yatarkən bixəbər,
Böylədir təqdir: "iza caəl-qəza əməl-bəsər"[249],
Özgə fikrə düşmə çox, həqdən gələn fərmanə bax!

Çıxdı ta olcaq xəbər ədayə qarşı bidirəng,
Bir zaman naçar, tənha eylədi şiranə cəng,
Neyləsin yox dəsti-bəxt, iqbali-nüsrət, payi ləng.
Hər tərəfdən üstünə yağdırdılar tiğü tüfəng,
Aqibət məcruh olub qərq oldu əlvan qanə, bax!

Etdilər sülh üzrə ol dəm bir neçə qövlü qərar,
Oldu razı, bildi yalan olduğun biixtiyar,
Saxlayıb bir həftə axır qətl edib məcruhü zar,
Külli-varın etdilər taracü yəğma, tarümar,
Əhli beyti cümlə düşdü növhəvü nalanə, bax!

Əl qoyub cümlə fəsadə tikdilər şeytan evin,
Etdilər guya xərabə din evin, iman evin,
Açdılar babi-fəsad, bağladılar ehsan evin,
Qırdı öz övladını, yıxdı onun sübhan evin,
Hacı Qadir tək cahanın fitnəsi şeytanə bax!

Gəl, yetər, ey zülmə rağib, səngdil, səxtcigər,
Bunca xunriz olma, eylə zülmi-nahəqdən həzər,
Yadına gəlməz məgər ruzi-cəza, ey bixəbər,
Noldu, həqdən bir zaman şərm eylə, çıx şamü səhər,
Guş edib məzlumlardan ol gələn əfqanə bax!

Ah kim, ta aləm olmuş mehrü mahın mənzili,
Eyləmiş rövşən dili ahi-siyahın mənzili,
Gah düşər nisbət gədayə padşahın mənzili,
Gah şiri-nər yerin eylər rubahın mənzili,
Dövri-bər'əksə nəzər qıl, çərxi-kəcrəftarə bax!

Kimsə qalmaz nikü bəd, ancaq qılır aləmdə ad,
Namurad eylər cahan, hər kim ki, istər bir murad,
Bu müsibətnamə tarixin bil, ey fərruxnihad,
İki yeddi, iki qırx olmuşdu min yüzdən ziyad[250].
Oldu mərhumü şəhid ol gövhəri-yektayə bax!

Böylədir dövran işi, hər gündə bir al eyləmiş,
Aqili nadan ilə pəjmürdəəhval eyləmiş,
Üz verib namərdə, hər dəm mərdi pamal eyləmiş,
Ey Vidadi, gəl ki, bu heyrət məni lal eyləmiş,
Gör nələr qıldı fələk Müştaqi tək insanə, bax!

Mə'lum ola ki, Hüseyn xan ibn Həsən ağa "Müştaq" təxəllüs məşhur Şəki hakimi Hacı Çələbinin nəvəsidir. Hacı Çələbinin vəfatından sonra onun oğlu Ağakişi bəy atasının yerində hakim olub. Amma onun hökumət zamanı çox çəkməyibdir. Ol əsnada Qazıqumuq xanı Məhəmməd xan ibn Surxay xan – ki, cabbar və zülmkar bir hakim imiş, – güclü ləzgi qonşu ilə Şəkinin üstünə gəlibdir və Ağakişi bəyi məsləhət bəhanəsi ilə yanına çağırıb qətlə yetiribdir və özü Şəki şəhərində sakin olub xanlıq edibdir. Və lakin onun xanlığı çox müddət çəkməyibdir. Şəki əhalisi onun cövrü zülmündən rəncidə olub və axırda Hüseyn xan ibn Həsən ağa Dərbəndə qaçıb Fətəli xandan istianət edib və Fətəli xan Qubadan qoşun cəm etdirib Hüseyn xan ilə Şəki nahiyəsinə irsal eləyib və Şəki əhalisi bunlar ilə müttəfiq olub Məhəmməd xanı təbəələri ilə Şəkidən ixrac eyləyiblər.

Məhəmməd xan Qızılqumuğa qaçıbdır, ondan sonra Hüseyn xan Şəkidə xanlıq edibdir. Onun başına gələn qəza və qədəri mərhum Vidadi yuxarıda yazılan müxəmməsdə bəyan etmişdir. Heyfa ki, onun əsərlərindən ələ düşmədi. Hər halda Hüseyn xan Müştaq öz əsrinin əhli-kəmal və ürfanından xoşməqal və sahibhal bir vücud olduğu Qafqaz tarixində zikr olunubdur. Vidadinin bu şe'ri ona dəlalət eləyir:

Noldu gör ol sərvəri-dövran, əmiri-möhtərəm,
Mənbəi-cudü səxavət mədəni-lütfü kərəm,
Mərdi-meydan, əhli-ürfan, sahibi-tiğü qələm,
Ərseyi-rif'ətdə guya kim, tikilmiş bir ə'ləm,
Hakimi-Şirvan, Şəki, yə'ni Hüseyn xanə bax!..

Vidadinin mövzun və pürməzmun kəlamlarından birisi də dünyanın heç kəs ilə payidar və bərqərar olmadığı barəsində yazdığı şe'ri-müsəddəsidir ki, şair özünə xitabən yazmışdır. Dünyaya və onun mal və dövlətinə pabənd olmaqdan və qeydkeşlikdən asudə və hürr olmağı tövsiyə və tənbeh etmişdir:

Gəl çəkmə cahan qeydini sən, can belə qalmaz,
Qan ağlama çox, dideyi-giryan belə qalmaz,
Gül vaxtı keçər, seyri-gülüstan belə qalmaz,
Hər ləhzə könül xürrəmü xəndan belə qalmaz,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tə'n bir gün olur xak ilə yeksan, belə qalmaz.

Əzbəs bu camal ilə ki, canan ola fani,
Bu işvə ilə qəddi-xuraman ola fani,
Bu gərdəni-xoş, zülfi-pərişan ola fani,
Bu, əhsəni-surətdə ki, insan ola fani,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tə'n bir gün olur xak ilə yeksan, belə qalmaz.



Sultani-cahan olsa, gedər, canə inanma,
Bir gün pozulur, şövkəti-divanə inanma,
Çün baqi deyil, mülki-Süleymanə inanma,
Gər aqil isən, gərdişi-dövranə inanma,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tə'n bir gün olur xak ilə yeksan, belə qalmaz.

Yüz mövsümi-xoş xürrəm olub illər açılsa,
Yüz lalə bitib susənü sünbüllər açılsa,
Yüz bağı-cahan tazələnib güllər açılsa,
Könlüm ki, açılmaz neçə müşküllər açılsa,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tə'n bir gün olur xak ilə yeksan, belə qalmaz.

Ah, aldı məni dərdi-fəraqü qəmi-həsrət,
Sərməstü xərab etdi yenə badeyi-heyrət,
Bir mehrü vəfa etməli yox kim, ola rəğbət,
Fövt eyləmə gəl, var ikən əldə dəmi-fürsət,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tə'n bir gün olur xak ilə yeksan, belə qalmaz.

Fikr etsən əgər, dəhrin işi bəhri-bəladır,
Bir dürri-giranmayəsi min canə bəhadır,
Hər nəqşi bir ayineyi-isbati-xudadır,
Məqsudi-dü aləm yenə təhsili-rizadır,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tə'n bir gün olur xak ilə yeksan, belə qalmaz.

Ey xəstə Vidadi, bu cahan bir quru səsdir,
Bir dəmdə keçir, öylə ki, fəryadi-cərəsdir,
Bu bəzmi-fənadə bu nə həngami-həvəsdir,
Gəl durma ki, ömrün keçir, əncami-nəfəsdir,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tə'n bir gün olur xak ilə yeksan, belə qalmaz[251].

Nə qədər ki, Molla Pənah Vaqif əhli zövq və səfa imiş və beş günlük ömrün qədrini bilib, istərmiş ki, onu eyş-işrətdə keçirib könüldə bir həsrət və arzu qoymasın, bir o qədər onun dostu Molla Vəli Vidadi dünyanın zövq və səfasına bel bağlamayıb, onun bivəfa olmasından mə'yus və şaki imiş. Könül və meyli axirət dünyası ilə olub, ibadətlə ömrünü keçirməyi eyşizəmanəyə tərcih qılarmış. "Hər nəqşi bir ayineyi-isbati-xuda" olan dünyadan vaz keçib, "təhsili-rizaya ki, məqsudi-dü aləmdir" məşğul olarmış.

Təəccüb burasıdır ki, bu iki nəfər həməsr şairlərin əxlaq və əqaidlərində, təbiət və məzaclarından müşahidə olunan bu qədər təfavüt və zid-

diyyət onların sədaqət və dostluqlarına mane olmaz imiş. Hər iki şairin rə'y və e'tiqadları, bu dünyaya nə göz ilə baxmaqları və təbiətlərində olan müğayirat onların bir-birinə yazdıqları kağızlardan görünür.

Vaqif və Vidadi yek-digərinə zarafat təriqincə irad tutub mübahisə edirlər. Çün Vidadinin fikir və xəyalı axirət dünyası ilədir və hər ləhzə onu yada salıb gözlərindən yaş tökür, Vaqif istehza edib yazır ki, hala nə var ki, sağ və salamat ola-ola ağlayırsan, sənin ağlamalı günün qabaqdadır. Bu mükaliməni şairlərin öz sözləri ilə bəyan etsək, daha yaxşı olar:

Vaqif

Ey Vidadi, sənin bu puç dünyada
Nə dərdin var ki, zar-zar ağlarsan?
Ağlamalı günün axirətdədir,
Hələ indi səndə nə var, ağlarsan?

Vidadi

Vaqif, nə çox yan baş-ayaq atarsan,
Mənə dersən: nə bu qədər ağlarsan?
Sənin də başında məhəbbət beyni –
Əgər olsa, eylər əsər, ağlarsan!

Vaqif

Ta cəsədin cüda olmayıb candan,
Bil özünü artıq sultandan, xandan,
Habelə ayrılıq nədir ki, ondan
Bu qədər çəkibən azar, ağlarsan?

Vidadi

Ağlamaq ki, vardır, məhəbbətdəndir,
Şikəstəxatirlik mərhəmətdəndir,
Əsil bunlar cümlə mürüvvətdəndir,
Olsa ürəyində, betər ağlarsan!

Vaqif

Say qənimət diriliyin dəmini,
Keçən həmdəmlərin çəkmə qəmini,
Ağlın olsun, sil gözünün nəmini,
Dəxi geri gəlməz onlar ağlarsan!

Vidadi

Oxumadın "fəlyəzhəku"[252] ayətin,
Çəkməyibsən yarü həmdəm firqətin,
Bilsən əgər ağlamağın ləzzətin,
Ta gedincə nuri-bəsər ağlarsan.



Vaqif

Kimdi indi bu dövrdə ol adəm,
Pərisi yanından heç olmaya kəm.
Qaralırsan bulut kimi dəmadəm,
Ağ yağış tək yaşın yağar, ağlarsan.

Vidadi

Billəm çox uşaqsan, ürəyin toxdur,
Ləhvü ləəb ilə həvəsin çoxdur,
Qocalıq əsəri könlündə yoxdur,
Hələ sonra əqlin kəsər, ağlarsan!

Vaqif

Toy-bayramdır bu dünyanın əzabi,
Əqli olan ona gətirər tabi,
Sən təki oğlana deyil hesabi,
Hər şeydən eləyib qubar ağlarsan!

Vidadi

Oğlan, sən uşaqsan, cavansan hələ,
Yenicə cisminə düşüb vəlvələ,
Təzə dəyənəyi alıbsan ələ,
Qaim tut ki, nagah düşər, ağlarsan.

Vaqif

Kəndini əlindən aldıran fələk,
İnəklərə buzov saldıran fələk,
Yarü yoldaşını öldürən fələk,
Məgər səni belə qoyar, ağlarsan?

Vidadi

Neylərsən söyləmiş buzov-inəyi,
Bizimlə eyləmiş belə hənəyi,
Həzrətqulu bəyin ağ dəyənəyi –
Alıbsan əlinə məgər, ağlarsan!

Vaqif

Bidəmağ olmaqdan nə düşər ələ,
Şükr elə Allaha, gəz gülə-gülə!
Uşaq ha deyilsən, tez-tez habelə –
Könlünün şişəsi sınar, ağlarsan.

Vidadi

Uzaqdan bax, yaxşı fəhm et satirə,
Bu iş baxmaz heç könülə, xatirə,

İstər yüz il bu yollarda qatirə,
Bir gün yanar canü cigər ağlarsan!

Vaqif

Keçən işdən mərd igidlər pozulmaz,
Atalar deyibdir: "Tökülən dolmaz".
Qatıq üçün qışda ağlamaq olmaz,
İnşaallah, gələr, bahar, ağlarsan!

Vidadi

Dövlətindən yetdik nanü nəməyə,
Düşdük indi cadü qatıq yeməyə,
Söz ki, çoxdur, yeri yoxdur deməyə,
Əgər bilsən, ey bixəbər, ağlarsan.

Vaqif

İç qatığı, ye darının cadını,
. . . . . . . . . . . . . . . . . . . . . . .
İstəmə dövranın dadlı zadını,
Sənə olur o zəhrimar, ağlarsan!

Vidadi

Ey mənə göstərən qatığı, cadı,
Onu yeyən tapar külli muradı,
Dünyanın sənə də ləzzəti, dadı –
Bir gün olur axır zəhər, ağlarsan!

Vaqif

Nə qədər dirisən, ölü deyilsən,
Qocalıban yaylar kimi əyilsən,
Padşahsan, əgər özünü bilsən,
Neçün olub candan bizar, ağlarsan!

Vidadi

Elə ki, taxıldı burnuna çeşmək,
Qocalıq əl verib, dəxi nə şimşək!..
Uşaqlar içində düşər gülüşmək,
Sənin də acığın tutar, ağlarsan!

Vaqif

Yalqız çox qocalan bayatı sevər,
Gah öyünər, tək-tək özündən deyər,
Sən də yetişibsən o həddə məgər,
Beyninə bayatı uyar, ağlarsan?



Vidadi

Külli Qarabağın abi-həyatı,
Nərmü nazik bayatıdır, bayatı,
Oxunur məclisdə xoş kəlimatı,
Ox kimi bağrını dələr, ağlarsan!

Vaqif

Müxəmməs deməyin seyrəklənibdir,
Bayatıda zehnin zirəklənibdir,
Qocalıbsan, qəlbin köyrəklənibdir,
İşdən-gücdən olub bikar ağlarsan.

Vidadi

Gəl danışma müxəmməsdən, qəzəldən,
Şe'ri-həqiqətdən, mədhi-gözəldən,
Sənin ki, halını billəm əzəldən,
Elə deyib canan, dilbər ağlarsan.

Vaqif

Yetmişdə ki, belə nəm gələ gözə,
Kəsməyə arasın, baxmaya sözə,
O zaman ki, yaşın yetişər yüzə,
Gör ki, onda nə bişümar ağlarsan.

Vidadi

Sarı Çobanoğlu gəlsin yanına,
Axund deyib canın qatsın canına,
Onun şövkətinə, sənin şanına,
O, yaxşı müxəmməs düzər, ağlarsan.

Vaqif

Çökər bir gün qabağına Əzrayıl,
Deyər: ey kor bəndə, qəflətdən ayıl!
Görərsən bir əcəb şəklü şəmayıl,
Ürəyinə qanlar damar, ağlarsan.

Vidadi

Əzrayıl ki, çəngəl çalar canına,
Çevrilib baxarsan hər bir yanına,
Ol zamanda sənin o əfğanına,
Nə bir gəlin, nə qız yetər, ağlarsan!

**Vaqif**

Onun ki, çəngəli ə'zayə düşər,
Çaxnaşar cəsədin, lərzəyə düşər,
Tamam sümüklərin vay-vayə düşər,
Diriykən dərini soyar, ağlarsan.

**Vidadi**

Axirət sözünü salma yadına,
Mütləq dürüst deyil e'tiqadına,
Məhşər günü kimsə yetməz dadına,
Fəryadın fələyə çıxar, ağlarsan.

**Vaqif**

Yanarsan, tə'nindən çıxar tütünün,
Tutuşar boğazın, kəsilər ünün,
Hələ vardır bundan betər pis günün,
Üqbayə edəndə səfər ağlarsan.

**Vidadi**

Mö'min olub qəlbin olsaydı səlim,
Bilərdin xudanın olduğun kərim,
Sənə kərəm eylər əzizü həkim,
Nə çəkərsən xövfü xətər, ağlarsan!

**Vaqif**

Çün gedərsən o qaranlıq dar yerə,
Qonşu olmaz, çağıranda səs verə,
Bir kimsə tapılmaz qapından girə,
Görərsən dörd tərəf divar, ağlarsan.

**Vidadi**

Mö'minəm, zikrimdir daim ilahi,
Uzaqdır könlümdən külli mə'nahi,
Əfv olur mö'minin cümlə günahi,
Sənin də könlündən keçər ağlarsan.

Bu göftügulardan sonra dostların arasında vüqua gələn nazik mükaliмə keçir sünni və şiə məsələsinin üstə. Onlardan hər birisi zərifanə digərinin üstünə gülüb, bə'zi irad diqqətləri edib nazmə çəkirlər ki, onların zikrini burada lazım görmədik.

Möhtərəm oxucularımız yuxarıda dərc olunan şeirlərə diqqət yetirsələr, Vaqif ilə Vidadinin təbiət və xasiyyətlərində olan təfavütü özləri təmyiz edə bilərlər.



Vaqif üçün dünyanın əzabı da toy-bayramdır. O cəhətə Vidadiyə irad tutub deyir ki, sənin kimi oğlana yaraşmaz hər şeydən ötrü könlünü qəmli və xatirini qubarlı edib ağlayasan. Necə ki, cəsədin candan cüda olmayıbdır, bu dünyanın beş günlük zindəganlığını qənimət bil və özünü xandan və sultandan artıq və mükərrəm tut.

Vidadi isə Vaqifə deyir ki, çox yan baş-ayaq atma. Yə'ni, bihudə söyləmə: ağlamaq məhəbbətdəndir və şikəstəxatirlik mərhəmətdəndir. İnsanda gərəkdir vəfa, məhəbbət və mürüvvət olsun. Sən də ki, bunlardan bir əsər yoxdur, "fəlyəzhəku" ayəsin oxuyub anlamayıbsan və yar və həmdəm firqətin çəkməyibsən. Əgər sən ağlamaq ləzzətin bilsəydin, nuri-bəsər gedincə ağlardan. Vaqifə bu sözlər tə'sir etməyib, Vidadinin üstə gülüb deyir:

Bidəmağ olmaqdan nə düşər ələ,
Şükr elə Allaha, gəz gülə-gülə!
Uşaq ha deyilsən, tez-tez habelə
Könlünün şişəsi sınar, ağlarsan.

Vidadinin qəzəllərindən məşhuru atidə zikr olunanlardır:

Hər səhər bad əsər, arizi-canane dəyər,
Toxunar sərvə gəhi, gah gülüstanə dəyər.

Şəm gər yansa, səvadi-şəb üçün heyf olmaz,
Şö'ləsi çünki onun arizi-cananə dəyər.

Olmasa qabil əgər dəhr, cəfa verməz ona,
Təm biləzzət olanda necə dəndanə dəyər.

Söhbəti-nakəsü namərd həmin söhbət imiş,
Tut ki, bir mərd ətəyin dövləti-xaqanə dəyər.

Mən ki, meydani-bəla içrə sərim top edərəm,
Ta düşər əldən-ələ axırı çovganə dəyər.

Nə qədər olsa qoca gərçi Vidadi xəstə,
Yenə Vaqif kimi, əlbəttə yüz oğlana dəyər.

Bu qəzəli Vidadi xəstə Vaqifin ona yazdığı "Kim ki, sövdayi-sərizülfi-pərişanə düşər" qəzəlinə cavab yazmışdır. Vidadinin pürməzmun qəzəllərindən birisi də budur:

Könül səbrü qərar etməz, gedər yar olmayan yerdə,
Məhəbbət payidar olmaz vəfadar olmayan yerdə.

Vəfa qıl bir vəfadarə, ulaşma hər biiqrarə,
Mətaın atma bazarə, xiridar olmayan yerdə.

Mənim həmrazü həmdərdim, deyim hər bədnüma gördüm,
Hünər kəsb eyləməz mərdüm, bəli, ar olmayan yerdə.

Xuda, sən saxla gəl fərdi, çətindir yalqızın dərdi,
Pərişanlıq tapar mərdi havadar olmayan yerdə.

Dila, laf etmə mütləqdən, düşərsən zülmə nahəqdən,
Neçün mərdüm dönər həqdən bir azar olmayan yerdə?!

Gəl, ey könlü olan rövşən, qəbul et bu sözü məndən,
Necə məqdur olur məskən gülə xar olmayan yerdə.

Könül dünyada yar istər, olubdur biqərar istər,
Vidadi xəstə var istər, hacan yar olmayan yerdə[253].

Filhəqiqə gözəl sözlərdir: "Vəfadar olmayan yerdə məhəbbət payidar olmaz". Ona binaən hər naəhl və nakəsə bel bağlama, sözünə bavər və əhdinə etibar eləmə. Dar gündə baxarsan ki, səndən üz çevirir, ehtiyacı olmadıqda səni tanımaz, bilməz.

Çün Vidadinin əş'arının çoxunda ahü zar eşidilir, ağlamaqdan, hüznü ələmdən bəhs olunur, ona görə bir qəzəlində gözlərindən axan qanlı yaşın barəsində belə demişdir:

Qan tökər xəstə Vidadi ki, demişdir vazeh,
Könlümün dideyi-giryan kimi fəvvarəsi var.

Əgərçi bu beyt Füzulinin kəlamına bir azacıq bənzəyir, vəli Füzulinin sözləri bundan mühəssənatlıdır:

Güli-rüxsarinə qarşu gözümdən qanlı axar su,
Əzizim, fəsli-güldür bu, axar sular bulanmazmı?

Bu barədə Qarabağın beş sənə bundan müqəddəm cavanlıq halında vəfat etmiş bir şairi – məşədi Əyyub "Baki"[254] təxəllüs daha da gözəl demişdir:

Gülzari-cismim içrə bitibdir bəla güli,
Gözdən axan könüldə çəkilmiş gülabdır.



Bahar mövsümünü və novruzun daxil olmasını şair bu gunə nəzmə çəkmişdir:

Novruzi-bahar oldu, cahan tazətər oldu,
Rəf' oldu ələmlər,
Dağıldı bu şadlıq xəbəri, dərbədər oldu,
Yandı oda qəmlər.
Qırx yeddi qələm sındı zimistan qələmindən,
Fürsət gülə düşdü[255].
Meydani-tərəbdə bu nə türfə hünər oldu,
Sərf oldu kərəmlər.
Göydən yerə yağdı nə gözəl şəbnəmi-rəhmət,
Bitdi gülü lalə.
Xoş nəğmələnib bülbüli-şeyda ötər oldu,
Açıldı irəmlər.
Yüz həmdü sənə mayili-seyri-çəmən oldu,
Şad oldu könüllər.
Bir mövsümi güldür bu ki, həqdən nəzər oldu.
Xoş gəldi bu dəmlər.
Ey xəstə Vidadi, bu gün etməzmi sənə rəhm
Sultani-zəmanə?
Bu eydi-mübarəkdə ki, dünya xəbər oldu,
Dağıldı dirəmlər.

Vidadinin mürəbbeatı da Vaqifinki kimi xeyli açıq və gözəl dildə və lisanımızın şivəsində yazılmışdır. Onlardan bir neçəsi burada zikr olunur:

Seyri-gülşən etsən, ey gül'üzarım,
Bülbül oxur, bağlar sədayə düşər.
Xəttinə baş əyər sünbül, bənəfşə,
Gül xaki-payinə fədayə düşər.

Xurşidim, xavərim, hilalım sənsən,
Şirinim, şərbətim, zülalım sənsən,
Fikrim, zikrim, sözüm, xəyalım sənsən,
Könlüm haçan səndən cüdayə düşər.

Arizunu çəkər sahibdiləklər,
Dolanıb başına dönər fələklər,
Mədhin oxur ərş üzündə mələklər,
Hər biri bir türfə nidayə düşər.

Xəyalındır xəyalımın həyatı,
Dəhanın şəkkəri, ləbin nəbatı,
Cəmalın sədqəsi, hüsnün zəkatı
Mənim tək binəva gədayə düşər.

İntizarın mən çəkərəm peyvəstə*,
Könül pərişandır, xatir şikəstə,
İstər vüsalını Vidadi xəstə,
Üz xakə fərş eylər, duayə düşər.

* * *

Ay ağalar, bir nigarın oduna,
Dəli könlüm yana-yana düşübdür.
Mən ki, düşüb bu odlara yanaram,
Nə səməndər, nə pərvanə düşübdür.

Açılıb cənnət tək camalın gülü,
Ötər çövrəsində şeyda bülbülü,
Bu gülşənin yasəməni, sünbülü,
Nə bir bağə, nə bostanə düşübdür.

Könül dost kuyinə etdikcə güzər
Qanlı qəmzəsindən etməzmi həzər?
Çıxdı gözüm, bir dəm eylədi nəzər,
Gör necə kəsilməz qanə düşübdür.

Qaş və gözü durub qanın almağa,
Zülf tökülüb din-imanın almağa.
Vidadi xəstənin canın almağa,
Xət bir yana, xal bir yana düşübdür.

* * *

Ey həmdəmim, səni qanə qərq elər,
Gəl tərpətmə yaralanmış könlümü.
Ayrı düşmüş vətənindən, elindən,
Həmdərdindən aralanmış könlümü.

Könül verdik hər bivəfa yadlara,
Hayıf oldu ömür, keçdi badlara,
Fələk saldı dürlü-dürlü odlara
Şan-şan olmuş, paralanmış könlümü.

Qanlı yaşım gündən-günə bollandı,
Axdı, axdı sinəm üstə göllendi,
Yenə qəm sinəmi mindi yollandı,
Heç bilməzəm yaralanmış könlümü.

* Başqa bir nüsxədə əvvəlki beyt belə yazılıbdır:
Həsrətin çəkməkdən olmuşam xəstə,
Halı pərişanam, dili şikəstə.



Gözüm yaşı gündən-günə fərq elər,
Eyb eləmək məni qana qərq elər,
Rövşən etməz yüz min günəş – bərq elər –
Bu möhnətdə qaralanmış könlümü.
Vidadiyəm xəstə gözüm mərdümi,
İtirmişəm qoşunumu, ordumu,
Çox təbibə şərh eylədim dərdimi,
Heç görmədim çaralanmış könlümü.

Vidadi xəstənin bu mürəbbeatındakı vəzn və qafiyələrdə bir azacıq rəkakət görünür isə də, onda gözəl və şirin sözlər dəxi çoxdur. Şair öz həmdəminə rücu edib deyir ki, vətənindən və elindən ayrı düşmüş könlümü, rəhm et, tərpətmə. O, yaralıdır. Hər bivəfa yadlara könül bağlayıb əziz ömrümüzü badi-fənaya verdik və başımıza dürlü-dürlü bəlalar gəldi. Fələk bizi odlara saldı və könlümüzü şan-şan, yə'ni parça-parça elədi. Belə müsibətlərə düçar olduqca şairin qanlı yaşı bollanır və sinəsi üstündə göl əmələ gəlir və könlü qəm səməndərinə minib uzaq diyarlara yollanır. "Bollandı", "göllendi", "yollandı" sözləri türk dilinin şivəsinə məxsus əlfazlardır ki, başqa lisana olmaz və sığışmaz!

Göy üzündə qatar ilə uçan durnalara xitabən yazılmışdır:

Qatar-qatar olub qalxıb havaya,
Nə çıxıbsız asimana, durnalar!
Qərib-qərib, qəmgin-qəmgin ötərsiz,
Üz tutubsuz nə məkana, durnalar?!

Təsbih kimi qatarınız düzərsiz,
Havalanıb ərş üzündə süzərsiz,
Gah olur ki, danə-xurə gəzərsiz,
Siz düşərsiz pərişana, durnalar!

Ərz eləyim, bu sözümün sağıdır,
Yollarınız həramidir, yağıdır,
Şahin-şunqar sürbənizi dağıdır,
Boyanarsız qızıl qana, durnalar!

Əzəl başdan Bəsrə, Bağdad eliniz,
Bəylər üçün ərməğandır teliniz,
Oxuduqca şirin-şirin diliniz,
Bağrım olur şana-şana, durnalar!

Bir baş çəkin dərmandənin halinə,
Ərzə yazsın, qələm alsın əlinə,
Vidadi xəstədən Bağdad elinə
Siz yetirin bir nişana, durnalar!

Burada Vaqifin və Qasım bəy Zakirin durnalar barəsində Vidadiyə nəzirə olaraq yazdığı qafiyələri mürəbbe qılmağı münasib gördük.

Kəlami-Vaqif:

Bir zaman havada qanad saxlayın,
Sözüm vardır mənim sizə, durnalar!
Qatarlaşıb nə diyardan gəlirsiz?
Bir xəbər versəniz bizə, durnalar!

Sizə müştaq olub Bağdad elləri,
Gözləyə-gözləyə qalıb yolları,
Asta qanad çalın, qafil telləri,
Heyifdir, salarsız düzə, durnalar!

Xeyli vaxtdır yarın fərağındayam,
Pərvanə tək hüsnün çırağındayam,
Bir ala gözlünün sorağındayam,
Görünürmü, görün gözə, durnalar!

Mən sevmişəm ala gözün sürməsin,
Bədnəzəri kəsib ziya verməsin,
Sağın gəzin, laçın gözü görməsin,
Qorxuram səfiniz poza, durnalar!

Nazənin-nazənin edərsiz avaz,
Ruh tazələnir, olur sərəfraz,
Vaqifin də könlü çox edər pərvaz –
Hər dəm sizin ilə gəzə, durnalar!

Kəlami-Zakir:

Bir saat havada qanad saxlayın,
Rəhm edin didəmdə yaşa, durnalar!
Qatarlaşıb hansı yerdən gəlirsiz,
Qaqqıldaşa-qaqqıldaşa, durnalar!

Bu viladə hər gün tökülür qanlar,
Yavaş-yavaş keçin, səsniz anlar.
Laçın yatağıdır bizim məkanlar,
Qorxuram sürbəniz çaşa, durnalar!

Diyari-qürbətdə müddətdi varam,
Gecə-gündüz vətən deyib ağlaram,
Mən də sizin kimi qəribi-zaram,
Eyləməyin məndən haşa, durnalar!



Mən sevmişəm onun çəmən-düzünü,
Nəsib ola bir də görəm üzünü,
Yoxsa danışırsız vətən sözünü,
Veribsiniz nə baş-başa, durnalar!

Zakirəm, od tutub alışdı cigər,
Var isə canandan sizdə bir xəbər,
Təğafül etməyin, Allahı sevər,
Dönməsin bağrınız daşa, durnalar!

Bu mürəbbeatın hansı birisini qeyrilərinə tərcih etmək müşkül bir əmrdir. Çünki hər bir şairin kəlamının özünəməxsus üslub və şivəsi vardır. Hər bir şair öz qəlbinin və təb'inin iqtizasınca göy üzündə qatar ilə uçan durnalara üz tutub öz hali-dilini onlara ərz qılır. Vidadi xəstə öz hüznü ələmindən və şikəstə-xatirliyindən dəm vurub, elə zənn eləyir ki, durnalar dəxi həmişə qəm və ələmə mübtəla olub, oxuduqları nəğmələri fərəh və şadlıq ucundan olmayıb, qəm və qüssədən nəş'ət edən ahü nalələrdir. Ol səbəbə şair onlara xitabən deyir:

Qərib-qərib, qəmgin-qəmgin ötərsiz,
Üz tutubsuz nə məkana, durnalar?!

Onların şirin dili Vidadinin ürəyini parça-parça eləyir:

Oxuduqca şirin-şirin diliniz,
Bağrım olur şana-şana, durnalar!

Vaqif dəxi həmçinin öz qəlbində olan hissiyyatdan söz açıb durnalardan təmənna eləyir ki, intizarını çəkdiyi və sorağında olduğu alagözlü həmdəmdən görsünlər ona bir xəbər və əsər gətirə bilərlərmi? Onlara belə deyir:

Xeyli vaxtdır yarın fərağındayam,
Pərvanə tək hüsnün çırağındayam,
Bir ala gözlünün sorağındayam.
Görünürmü, görün gözə, durnalar!

Durnaların oxumağı Vaqifə hüzn gətirmir və könlünü pərişan qılmır. Onların avazı şairin ruhunu təzələndirir və onu dövrə qalxmağa, ərş üzündə onlar ilə seyrü səyahət etməyə təhrik qılır:

Nazənin-nazənin edərsiz avaz,
Ruh tazələnir, olur sərəfraz,
Vaqifin də könlü çox edər pərvaz –
Hər dəm sizin ilə gəzə, durnalar!

Qasım bəy Zakirə gəldikdə o da, Molla Pənah kimi, durnalardan xahiş eləyir ki, ondan ehtiyat etməsinlər və onu özlərinə həmsirr, yoldaş və rəfiq hesab etsinlər. Çünki o da onlar kimi qəribdir:

Diyari-qürbətdə müddətdi varam,
Gecə-gündüz vətən deyib ağlaram,
Mən də sizin kimi qəribi-zaram,
Eyləməyin məndən haşa, durnalar!

Çox ehtimal var ki, bu şeirləri Zakir Badkubədə məhbusvar sakin olanda yazıbdır. Bununla belə hər üç şairin durnalara yazığı və rəhmi gəlib. Dostluq və mehribanlıq üzü ilə onlara tapşırırlar ki, bu yerlər xatalı yerlərdir, burada durmasınlar və səslərini çıxartmayıb ahəstə keçib getsinlər və illa şahin və laçın onların sürbəsini dağıdar və qızıl qana boyayar.

Vidadi deyir:

Şahin-şunqar sürbənizi dağıdır,
Boyanarsız qızıl qana, durnalar!

Vaqif deyir:

Sağın gəzin, laçın gözü görməsin,
Qorxuram səfiniz poza, durnalar!

Zakir deyir:

Laçın yatağıdır bizim məkanlar,
Qorxuram sürbəniz çaşa, durnalar!

Mühəssəlül-kəlam, hər bir şairin kəlamında başqa bir məlahət və lətafət var ki, əhli-dil və ərbabi-zövqü kəmal onları oxuduqda dərk eləyir və hər o şey ki, qəlb ilə hiss olunur, bə'zi vaxt yazmaq və söyləmək ilə ifadə olunmaz, təqrir və bəyana gəlməz.

Bu halda Molla Vəli Vidadinin və Vaqifin vəfatından yüz ildən ziyadə vaxt keçibdir. Hər ikisi bizim möhtərəm, milli şairimiz və



ədəbiyyatımızın banisidir. Əşar və kəlamları mövzun, təb'ləri rəvan, dilləri açıq və sadə.

Hərgah Vaqif və Vidadi kimi məşhur şairlər özgə millətlərin arasında zühur etmiş olsa idilər, bişübhə, indiyə kimi onların asar və əş'arı dəfəat ilə çapdan çıxıb əbnayi-millət içində yayılmışdı. Onların qəbirləri üstündə nişangah qoyulmuşdu və vəfatlarının əlli və yüz sənəlik yubileyi – yövmi-alisi artıq cəlal və təntənə ilə yad olunmuşdu.

Amma bizim türklərdə bu hissiyyat və qədirşünaslıq yoxdur. Şan və şərafətimizə, vətən və millətimizin sərəfrazlığına səbəb olan. dilimiz və ədəbiyyatımıza rövnəq verən əziz və möhtərəm vücudların qədir və mənzilətini bilmirik və onların asari-güzidələri ilə iftixar etmirik. Əzbəs ki, avamıq və avamlığımızdan milliyyət hissi bizlərdə ayılmayıbdır, vətə'nimizin, dilimizin və ədəbiyyatımızın qədrini bilmirik.

# FƏTƏLİ XAN "MÜŞTƏRİ" TƏXƏLLÜS

Quba və Salyan hakimi Fətəli xan ibn Hüseynəli xan Molla Pənah Vaqifin və Hüseyn xan Müştaqın müasiri olub. Onun alim, şair və sahibi-tədbir bir vücud olduğu tarixdə yazılıbdır.

Fətəli xan hicrətin 1157-ci sənəsində ki, tarixi-məsihiyyənin 1741-ci ilinə mütabiqdir, atası Hüseynəli xanın vəfatından sonra Quba və Səlyanda xan olub, öz təvabe və rəayasını gözəl vəch ilə idarə edərmiş[256], ürəfa və şüəra silkinə himayət göstərib özü də şeir deyərmiş.

1172-ci[257] tarixdə Dərbənd camaatı Nadir şahın qətlindən sonra özləri intixab və tə'yin etdikləri Məhəmməd Hüseyn xandan narazı olub onu əzl etdilər və Dərbənd xanlığını Fətəli xana təslim elədilər. Fətəli xan durbin, aqibətəndiş və ziyadə cür'ətli bir vücud olduğundan Quba, Səlyan və Dərbənd hakimliyini artıq məharətlə idarə edərmiş.

Hicrətin 1181-ci[258] sənəsində şəkili Hüseyn xan Müştaq ilə dostluq əlaqəsi qoyub, onunla müttəfiq qoşun götürüb Şirvan üstünə hərəkət eləyiblər. Bu niyyətlə ki, onu zəbt edib aralarında təqsim qılsınlar. Vəli bir vaxtdan sonra bunların mabeynində bürudət və ədavət vüqua gəlibdir, əzbəs ki, Fətəli xan Hüseyn xan Müştaqın da hissəsini qəsb etmişdi.

Fətəli xan Müştərinin əş'arından bir şey tapa bilmədik. Xatəmində yazılan şeir onun öz kəlamıdır:

Neveşte bər səfahate-fələk bexəttə-cəli,
Bedəhr şəqqe qoşa şod livaye-Fəthəli[259].

Ömrünün axırında yazdığı mənzumat – ki, burada dərc olunur, – Mirzə Həsən Əlqədari əfəndinin "Asari-Dağıstan" adlı kitabından götürülübdür[260].

Kəlami-Fətəli xan ibn Hüseynəli xan "Müştəri" təxəllüs:

Oldu gözəl ömr sərf, heyf ki, nadanlığa,
Hər nə qalıb sərf olur indi peşimanlığa.

Zülfi-siyəh zövqünə uyma, xətadır, könül,
Fariq ikən sən səni salma pərişanlığa.

Feyzi-əzəl kafili-tərbiyəti-hal ola,
Muri-mühəqqər urar laf süleymanlığa.



Mane'i-ərzi-qəmim heyrəti-didar olur,
Mən nə deyim bilməzəm, ah, bu heyranlığa.

Nəfxeyi-badi-səba ruhə təravət verir,
Çün güzər etmiş səhər sünbülü reyhanlığa.

Müştəriyi-dürri-nəzm kimsə deyil, Haliya,
Dürci-dəhən açma sən kim, köhərəfşanlığa.

# ƏBÜLFƏT XAN "TUTİ" TƏXƏLLÜS

Əbülfət xan Qarabağ valisi İbrahim xanın oğlanlarından rəşid, fəsih və əhli-kamal bir zat imiş. Təb'i-şe'riyyəsi dəxi var imiş. Necə ki, Molla Pənah Vaqifin tərcümeyi-halı babında zikr olunmuşdu, İbrahim xan mərhum general Zubov Gürcüstan valisi İrakli xanın istimdadına gəlib Şamaxı həvalisində ordusu ilə əyləndiyi vaxt oğlu Əbülfət xanı onun hüzuruna sülh və izhari-itaət üçün göndərmişdi. Amma sonradan elə ki, Ağa Məhəmməd şah Şuşa şəhərində qətlə yetişdi və İranda ümuri-səltənət Fətəli şahın əlinə keçdi, İbrahim xanın meyli bir növ şahi-məzkurun tərəfinə əlaqə bağladı. Ağa Məhəmməd şahın nəşini, Fətəli şahın tələb etməsinə görə, e'zaz və ehtiram ilə Tehrana rəvanə eləyib, bir para xoşayəndə peyğamlar dəxi ilqa etdi.

Fətəli şah İbrahim xanın bu gunə rəftarından ziyadə xoşhal oldu və ona xələt və şəmşir göndərib bir çox vədələr verdi və hər iki tərəfə xatircəmilik hasil olmaq üçün qərabət və qohumluq təmənnasını izhar qıldı. İbrahim xan öz kəriməsi Ağabəyim ağanı şaha əqdi-nigah edib, onunla belə oğlu Əbülfət xanı da – ki, o vaxtı ağa idi, – şahın hüzuruna yolladı. Şah Ağabəyim ağanın kamalını və hüsni-camalını görüb, onu cəm'i əhlihərəm üçün böyük və banuyi-hərəm tə'yin elədi.

Bilmək gərəkdir ki, Ağabəyim ağanın da gözəl təb'i var imiş və bir çox əş'ari-lətifə və ədəbiyyati-zərifə inşad qılmışdır. Vəli onlardan ələ düşəni olmadı.

Fətəli şah Əbülfət ağaya da xanlıq verib özünə peyrəvi elədi və həm "Əmirül-üməra" ləqəbilə müləqqəb qılıb öz məclisi-xassına daxil və sahibi-izzət və hörmət elədi.

Əbülfət xan şahın hüzurunda və İran şüəra və üdəbası dairəsində daha da artıq kəsbi-kamal edib, fünuni-şeirdə mahir oldu. Əbülfət xanın xatirini şahzadə Abbas Mirzə nayibüs-səltənə dəxi çox əziz tutarmış və özü ilə çox səfərlərə onu da apararmış.

Vəfat edibdir İranda, hicrətin 1255-ci[261] tarixində. Atidə dərc olunan bir türk və bir fars qəzəlləri ol mərhumun kəlamlarındandır.

Qəzəli-türki:

O gün kim, həsrət ilə ol büti-zibadən ayrıldım,
Qalıb bir surəti-bihiss kimi, mə'nadən ayrıldım.

Çəkib əl xəlqdən Məcnunsifət səhrayə üz qoydum,
Kəsilmiş səbrü tabım, vəsləti-Leyladən ayrıldım.



Mənə şimşadü sərvi, bağban, ərz etmə kim, hərgiz
Yoxumdur meyli-gülşən, qaməti tubadən ayrıldım.

Nolur şamü səhər ney tək sızıldar sineyi-zarım,
Mərizi-bəstəri-hicrəm, dəmi-İsadən ayrıldım.

Fəraqın şiddətindən lal olur bu tutiyi-təb'im,
Məzaqim təlxdir kim, lə'li-şəkkərxadən ayrıldım[262].

Qəzəli-farsi:

Şəbi bexab ke, əkse-cəmale-ruyi-to didəm,
Ze kaenat təəlloq be hər ke bud boridəm.

Qəsəm beruye-to kərdəm ke coz to yar nəcuyəm,
Behuriyane-behişti əgər dəhənd nəvidəm.

Hənuz əz meye-vəslət piyalei nəkeşide
Ze dəstə saqiyi-hecran çe zəhrha ke çeşidəm.

Omide-zendegiyəm bud abe-tiğe-to xordəm,
Həvaye-vəslə-toəm bud ferqəte-to qozidəm.

Rəqib əz mənəş azordeəst mən ze rəqibəş,
Dəriğ ku bemoradəş resido mən nəresidəm.

Becorme-anke məra del beğeyre-dust nəbəstəm,
Koşənd biqonəhira nədidəm, nəşenidəm.

Bəsi ze vəsfe-ləbət qofteənd leyk kəsira
Dər in romuz ço Tuti hərife-hərf nədidəm[263].

# QÖVSİ

Azərbaycan şüərasından "Qövsi" təxəllüs zərif və xoştəb' bir şairin əlyazma divani-əş'ar və qəzəliyyatı əlimizə düşmüşdü[264]. Bu divandan həkim Qövsi kim və hansı yerin adamı olduğu anlaşılmadı, vəli şiveyi-lisanından və üslubi-kəlamından bizim Zaqafqaziya torpağının rayihəsi gəlir, hiss olunur[265]. Belə ki, əgər bə'zi qəzəllərinin axırıncı fərdində Qövsi əvəzinə Qüdsi və ya Zakir və ya Seyid yazılsaydı, onlar Qüdsinin, ya Zakirin və ya Seyidin kəlamı olduğuna kimsə şübhə etməzdi.

Bununla belə nə Şəki və Şirvanda və nə Bakı və Səlyanda və nə Gəncə və Qarabağda və nə Mavərayi-Qafqazın sair mütəməddin mərkəzlərində "Qövsi" təxəllüslü şairin ism və nişanəsi guşumuza erişməyibdir. Onun barəsində salxürdə ədiblərimizə rücu etdiksə də, heç kəsdən cəvabi-kafi almadıq.

Şəmsəddin Sami bəyin "Qamusül-əlam"ına rücu etdik. Onda dəxi "Qövsi" təxəllüslü türk şairindən bir əsər bulmadıq. Onda iki nəfər "Qövsi" təxəllüsü ilə zikr olunmuş şəxsə rast gəldik: onlardan birisi məşahiri-xəttatindən bağdadlı Qövsidir ki, 999-cu[266] tarixində vəfat etmişdir, digəri isə İran şüərasından olub, yazdıqları tamam farsi dilində olduğu göstərilmişdir:

Cai ke toi nist kəsira anca,
Əz mən ke təvanəd ke resanəd xəbər anca?[267]

Qövsinin üslubi-kəlamı Rum şairlərinin üslubi-kəlamına bir azacıq bənzəyir isə də, ona Rum şairi dəxi demək olmaz. Yenə təxminən demək olur ki, Qövsi Azərbaycanın İran dövlətinə mütəəlliq məhəllələrində, xüsusən, Təbrizdə və ya ona qərib şəhərlərin birisində vücuda gəlmişdir. Amma övqatını bizim vilayətdə keçirmişdir.

Buna dəlil olaraq bir qəzəlinin axırıncı beytində Təbriz şəhərini Kə'bəyə təşbih qılıb və ona iqtida etməsini özünə borc bilməsidir. Haman qəzəl bu sayaq başlanır:

Səbr eylə, aqibət mey olur qan dedikləri,
Sübhi-vüsal olur, şəbi-hicran dedikləri.

Ərşi-bərin qubarın onun tutiya qılır,
Hərçənd müşti-xakdır insan dedikləri.

Lə'lində cami-badə kimi cəmdir sənin
Abi-həyatü atəşi-suzan dedikləri.



Qövsi gərəkdi Kə'bə deyib iqtida qıla –
Təbriz qülləsinə Sifahan dedikləri.

Və yenə özgə bir qəzəlində şair Təbriz şəhərini həsrətlə yad edib deyir:

Gər yandıra öz varını pərvanə, rəvadır,
Kimdir ki, qaranlıq gecə cananə yetişməz?!

Təbriz açar könlümü, Qövsi, gər açılsa,
Hərçənd ki, firdovs Sifahanə yetişməz.

Yəqin ki, Sifahan təbrizdə məhəllə adıdır və şair haman məhəllədəndir[268]. Çox ehtimal var ki, Qövsi bu şeirləri qürbətdə olduğu əsnada yazmışdır.

Divanında yazılmış bir tərcibənddən belə mə'lum olur ki, Qövsi Uğurlu xan Ziyad oğlunun əsrində onun təhti-himayəsində mürəffəhhal güzəran edirmiş. Bununla belə vətəni-mə'lufunu unutmayıb, hər dəm onu yad edərmiş. Uğurlu xan isə Gəncə xanlarından Şahverdi xanın qardaşı və məşhur Cavad xanın əmisi olduğu rəvayət olunur ki, hicrətin 1180-1190-cı[269] illərində xanlıq edərmiş. Belə olan surətdə Qövsi Molla Pənah Vaqifin müasiri olub[270] onunla bir yerdə bizim türk – Azərbaycan şairlərinin babası mənzələsindədir.

Məzkur tərcibənd ki, Qövsinin təb'inin ziyadə səlis və mövzun olmağına şəhadət verir, burada dərc olunur.

Kəlami-Qövsi:

Gətir saqi, qədəh kim, novbahari-eyşü işrətdir,
Bu gündən böylə cuşi-eşqü tüğyani-məhəbbətdir.
Bu gün kim, cami-güldən bangi-nuşa-nuş urar bülbül,
Meyi-gülrəngdən hər kim ki, qafil, məsti-qəflətdir.
Verir badi-bahar əmvatə əhya sübhdəm, sən həm
Oyaq ol, fürsəti fövt etmə kim, fürsət qənimətdir.
Nola gər cami-minadən düşərsə aləmə qovğa –
Ki, bu xurşidi-məhşər ol qiyam etmiş qiyamətdir.
Gətir səhba ki, baqidir səlahü tövbənin çağı,
Bu beş gün kim, qələm yoxdur bizə, əyyami-möhlətdir.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında –
Ki, xaki-rəhgüzarı sürmeyi-çeşmi-bəsirətdir.

Bihəmdillah ki, dudi-ahımız əbri-bahar oldu,
Qaradan çıxdı dağü bağü səhra, aləzar oldu.

Gətir, saqi, şərabı ver mənə əmvatə əhya tək,
Ləbi-canbəxşini məndən diriğ etmə Məsiha tək.
Nə xoş güllər düşübdür çeşmimə gülzardan sənsiz,

Əcayib dağlar var lalədən sinəmdə səhra tək.
Məni mə'zur tut, gər olmuşam məst, istərəm səndən
Vəfa kim, adı var, yoxdur özü aləmdə ənqa tək.
Nola gər rəşkdən bülbül töküb göz yaşı, qan ağlar –
Ki, məhv olmuş gülə şəbnəm, bieynih çeşmi-bina tək.
Mənim tək nola gər məstanə söylər bülbülü qumri –
Ki, gül cami-meyi-gülgun kimidir, sərv-mina tək.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında –
Ki, daniş gövhərilə var malamal dərya tək.

Bihəmdillah ki, dudi-ahımız əbri-bahar oldu,
Qaradan çıxdı dağ bağü səhra, taləzar oldu.

Gətir, saqi, qədəh kim, arizu bağrım kəbab etmiş,
Meyi-gülrəng tək qeyri, məni həsrət xərab etmiş.
Mənim göz yaşımı zinhar ğur et, sərgiran baxma –
Ki, suzi-dil onun hər qətrəsin bir lə'li-nab etmiş.
Mənim hər misrəi-ahım vurar divan ilə pəhlu –
Ki, divani-qiyamından məni eşq intixab etmiş.
O günlər kim, keçibdir tövbəvü zöhdü vərə birlə,
Fəğan ki, xameyi-təqdir ömrümdən hesab etmiş.
Bahar əyyamı olma naleyi-məstanədən qafil –
Ki, rəhmət naləsin məstin duayi-müstəcab etmiş.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında –
Ki, hər bir zərrəni şəfqət gözilə afitab etmiş.

Bihəmdillah ki, dudi-ahımız əbri-bahar oldu,
Qaradan çıxdı dağü bağü səhra, taləzar oldu.

Qövsinin bu kəlamından belə anlaşılır ki, mərhum Uğurlu xan ürəfa və şüəra silkinə hörmət və riayət göstərməklə özü dəxi əhli-hal və sahibi-kamal bir şəxs imiş. Necə ki, şair deyir:

Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında –
Ki, daniş gövhərilə var malamal dərya tək.

Şairin dəxi zərif, əhli-hal və sahibi-mə'na bir vücud olduğu öz kəlamından anlaşılır. Necə ki, bir qəzəlində demişdir:

Nüktə tutmaq bülbülə, Qövsi, nə lazımdır sənə,
Hər kimin mənidə miqdarı sözündən bəllidir.

Qövsinin sözündə olan lətafət və mühəssənatı hər bir ərbabi-zövq anlaya bilir. Şair bu babda demişdir:



Gərçi Qövsi xuni-dildən öz sözün rəngin edər,
Söz bilən aşiq bilir göftar onun göftarıdır.

Qövsinin həqiqətdə şirin göftarı, zərif və dilpəsənd əş'arı ilə oxucularımızı tanış etmək üçün bir neçə nümunələr göstərilir.

Qəzəli-Qövsi:

Hərçənd gül lətif olar, ruxsarın özgədir,
Nərgis nə olsa, çeşmi-füsunkarın özgədir.

Mən qönçəyə yaman deməyəm, nüktə tutmaram,
Söz bundadı kim, lə'li-göhərbarın özgədir.

Tubadə var rəunətü əndam sərvdə,
Amma xürami-nəxli-bəlabarın özgədir.

Yox vaizin sözünə sözüm kim, behişt var,
Kuyin bir özgə cənnətü didarın özgədir.

Qövsi, əgərçi var cəfapişə dustlar,
Amma sənin hərifi-sitəmkarın özgədir.

* * *

Heç şəm' ilə ram olmaz pərvanələriz bizlər,
Zəncirə baş endirməz divanələriz bizlər.

Dünya ilə surətdə var ülfətimiz, amma
Mənidə bu aləmdən biganələriz bizlər.

Seylabi-həvadisdən neylər bizə gərdun kim,
Tufani-keşakeşdən viranələriz bizlər.

Hərgiz səsimiz çıxmaz, heç kəs dilimiz bilməz,
Hərçənd ki, dillərdə əfsanələriz bizlər.

Yox taətimiz, amma fariq deyilik, Qövsi,
Ol mah büti-Çindir, bütxanələriz bizlər.

Qövsinin bu qəzəlindən onun movləvilər silkindən və həqiqət əhlindən olduğu zahir oldu. Necə ki, şair deyir: Surətdə bu dünya ilə ülfətimiz var isə də, mənidə bu aləmdən biganələriz. Başqa bir mə'nəviyyat aləmlərinin məxluquyuz. Ona binaən seylabi-həvadisdən bizim bakımız yoxdur, zira birdəfəlik tufan keşakeşindən biz məxrub və viran olmuşuz. Bu aləmi-zahirdə bizim səs və sədamız dillərdə əfsanə olubsa da, özümüzdən bir səs çıxmaz və bir əlamət və nişan görünməz. Zahirdə taat və

ibadətimiz gözə gəlirsə də, batində cümləmiz taət əhliyiz və ol mahi-büti-Çin, yə'ni xudavəndi-aləmeyn bizim mə'bud bərhəqqimizdir.

Özgə bir qəzəlində Qövsi yenə bu mə'nadan danışıb, aləmi vəhdət meyini çeşid edənlər üçün bir meyxanaya təşbih qılıb deyir:

Badeyi-vəhdət içən aləmi meyxanə bilir,
Fələyin gərdişini gərdişi-peymanə bilir.

Tifli-əşkim qərəzin aqil olan fəhm etməz,
Bu uşaqlar dilini aşiqi-divanə bilir.

Doludur bəs ki, nifaq ilə cahan, sahibi-dil,
Aşina surətini mə'niyi-biganə bilir.

Xəttü xal seyrinə, zinhar, könül bağlama kim,
Damdır ol ki, onu əhli-həvəs danə bilir.

Aşağıda yazılan qəzəl həmçinin Qövsinin əhli-həqq və sahibi-dil və mənipərəst olmağına şəhadət edir. Şair dünyanın malü mə'nalına və cahü calalına könül bağlamır. Zahiri hüsnü camal və xəttü xal ilə onun işi yoxdur. Aradığı sahibi-dil və hüsni-mə'nadır:

Aşiqəm mən, dövlətü malü mə'nalı neylərəm,
Bərgü bərdən yummuşam göz, şaxü balı neylərəm?!

Yek gəlir bir qönçeyi-məstur yüz güldən mənə,
Yar sahibdil gərək, sahibcəmalı neylərəm?!

Handa olsam buyi-gül tək rövzeyi-kuyindəyəm,
Naməvü peyğam üçün badi-şimalı neylərəm?!

İstərəm vəslin ki, yarın. aşina olmaz mənə,
Gər xəyalın ram ola, bəzmi-vüsalı neylərəm?!

Sən nəfəs çağ eylə, ey ney, gər usandın nalədən,
Mən həvayi-guyi-eşqəm, e'tidalı neylərəm?!

Gər verirsən, dövləti-didari-canan ver, fələk,
Yoxsa mən mehmani-fəqrəm, mülkü malı neylərəm?!

Tarü pudi aləmin əfsanəvü niyrəng imiş,
Mən bu batil xabü bihasil xəyalı neylərəm?!

Ləzzəti-didardən, Qövsi, mənə heyrət yetər,
Əldə ta ayinə var, abi-zülalı neylərəm?!



Necə ki, zikr olundu, Qövsi dünyanın malına və cah-cəlalına qədrü qiymət qoymayıb, əsl səadət və insaniyyəti istiqamət və sədaqətdə görür. Haqqı tanıyıb insaniyyət dərəcəsinə və mə'nəviyyat aləminə vasil olmaq üçün, Qövsinin əqindəsincə, başqa bir dəlil və rəhbər lazım deyil, beqeyrəz "sidqi-niyyət".

Fəxr etmə malü cahə ki, iqlimi-fəqrdə
Dövlət şikəstəbalü hüma hiçkarədir.

Ta xızri-rahın olmaya öz sidqi-niyyətin,
Qövsi, bu yolda rahnüma hiçkarədir...

Mərd ilə namərd və fürumayə ilə alitəb və dünyayi-dunun qəddar və gəcrəftarlığı babında demişdir:

Nola gər fərq ola naməidlərdən mərd dünyadə,
Əgərçi bəllidir hər mərdü hər naməıd dünyadə.

Edərdim nikü bəd fərqin, bilərdim yaxşılar qədrin,
Fəğan kim, açmadım göz bir nəfəs naməıd dünyadə.

İçərlər xəlqi-aləm sağəri-zərrin ilə səhba,
Mənə qalmışdı əşki-sürxu rəngi-zərd dünyadə?!

Betərdir tiğdən biabrulər surətin görmək –
Ki, olsun tö'meyi-şəmşir hər naməıd dünyadə.

Cahanda buyi-dərdü dağ heç bir kimsədən gəlməz,
Onunçün gün görərlər mərdümi-bidərd dünyadə.

Olar kim, ol təbibin hikmətindən qafil olmuşlar,
Nə bilsinlər ki, eyni-afiyətdir dərd dünyadə.

Necə mən bilməyim, Qövsi, bu viran olmuşun qədrin –
Ki, öz könlümdən ayrı bulmadım həmdərd dünyadə.

Zəmanənin ədəmi-səbatından və daima təğyir və təbdil etməsindən və əhli-zəmanənin bir haldan qeyri bir hala dəyişirilməsindən, fəqirin qəni və qəninin fəqir və bəsirət əhlinin mə'yus və xunincigər olmasından bəhs edib deyir:

Əsasi-tövbeyi-mey üstüvar böylə qalırmı?
Bizə müdam südayi*-xumar böylə qalırmı?

* S ü d a – başağrısı, dərdisər

Gəlir bir özgə zəmanə, dönər fələk, dolanar gün,
Rəqibə bu şərəfi-etibar böylə qalırmı?

Şərab nirxinə, ey bağban ki, sirkə satırsan,
Çəmən həmişə baharü bahar böylə qalırmı?

Dönə-dönə içirirsə bəsirət əhlinə qanlar,
Sipəhrə həm bu qərarü mədar böylə qalırmı?

Keçər təğafül edib yar naz ilə sənə, Qövsi,
Keçər bu bir neçə gün, ruzigar böylə qalırmı?

Həqiqətdə gözəl sözlər və həkimanə suallardır: Ey mal və dövlətə, faxir libas və hüsni-surətə fəxr edən qafillər, bu qədər məğrur olmayın. Bu dövlət və bu hüsni-cəmal əbədi və daimi deyil; beş günlükdür; gəlib keçəsidir və ey əhli-hal və bəsirət, sizə zəmanə dönə-dönə qan içirirsə, ondan siz mə'yus və pərişan olmayın. Sipəhrə həm bu qərarü mədar belə qalmaz və sizin də axırınız xeyrə mübəddəl olar. Və, ey Qövsi, əgər yari-cəfakar təğafül edib, sənin yanından keçib sənə iltifat və e'tina etməzsə, sən də ondan mükəddər olma. Bu bir neçə gün gəlib keçər, nə səndən bir əsər və nə sənə nazü işvə satan yardan bir ələmət qalar.

Əşarın qəzəliyyat növündən maəda Qövsinin xeyli dilpəsənd və mövzun bahariyyatı, saqinaməsi, tərkibbənd və tərcibəndləri və qəsidələri vardır ki, cümləsinin buraya küncayişi yoxdur. Vəli onlardan nümunə üçün bir neçə bəndlər göstərilir.

Tərkibbənddən bir bənd:

Qurbanın olum, Qövsi, məhcur sənindir,
Şirin söz ilə xalqa salan şur sənindir.
Aşiq ki, zəif olsa, onu yazıya salma*,
Hərçənd Süleyman olasan, mur sənindir.
Məst olsamü dursam, dolanıb başına ölsəm,
Təqsirimə qalma, meyi-pürzur sənindir.
Gər öldürər olsan, əgər əhya verər olsan,
Öz istədiyin eylə ki, dəstur sənindir.
Yandırsan əgər cismimi, yandır, nə sözüm var,
Didar sənin, şö'lə sənin, Tur sənindir.
Yadınla gözüm mərdümüdür qətreyi-əşkim,
Gər var çırağımda mənim nur, sənindir.
Ey gənci-rəvan, guşeyi-bituşədən ötmə,
Gəl-gəl ki, bu gəncinəvü gəncur sənindir.

* Belə də demək olar: Aşiq ki, zəif olsa, onu salma nəzərdən.



Hərçənd ki, hər guşədə, hər bağdə, ey gül,
Bülbül mənimü qönçeyi-məstur sənindir.
Mən eyləmənəm ərzi-təmənna, sözüm anla,
Dindirmə məni, dilsizəm, amma sözüm anla!

Qövsinin tərcibəndindən bir bənd:

Üşşaqə vaizin nəfəsindən nə faidə?!
Mənzildə karvan cərəsindən nə faidə?!
İki cahanda vaizə çün mey haram imiş,
Cənnət həvasinin həvəsindən nə faidə?!
Naseh müdam tövbəyə tərğib edər məni,
Ya rəb, ona bu mültəməsindən nə faidə?!
Bikardır bədən dili-pürşur olmasa,
Çün əndəlib yox, qəfəsindən nə faidə?!
Zülfün nə lazım eyləyə zəncir könlümü,
Ol seydi-bəsləmən mərəsindən nə faidə?!
Ey həmsəfər, mənim kimi bir tifli-məşrəbə
Bidərd təbli-köç səsindən nə faidə?!

Aşağıda yazılan müsəddəs-tərcibənd – ki, Füzuli Bağdadinin kəlamına nəzirə səbkində inşad olunubdur, – Qövsinin gözəl və mövzun kəlamlarından birisidir:

Gəlin, ey əhli-vərə, aşiqü xummar olalım!
Hamı bir müğbəçə yanında giriftar olalım!
Ney kimi nalə çəkib, cəng kimi zar olalım!
Necə bir böylə gözəl fəsldə huşyar olalım!
  İçəlim bir neçə gün badəvü sərşar olalım!
  Bizə yar olmasa saqi, biz ona yar olalım!

Camlər zəhr ilə məmlüv şəbi-hicran içdik.
Eylədik tövbə əgər göz görə, pünhan içdik.
Hər nə kim verdi bizə saqiyi-dövran içdik,
Bu fəna dəhrdə bəsdir bu qədər qan içdik!
  İçəlim bir neçə gün badəvü sərşar olalım!
  Bizə yar olmasa saqi, biz ona yar olalım!

Necə bir şamü səhər xabü xəyal ilən ötə,
Necə bir əxtəri-məs'ud zəval ilən ötə,
Yüz nişat ilə gəlib ömr, məlal ilə ötə,
Heyfdir böylə bahar ayı bu hal ilə ötə.
  İçəlim bir neçə gün badəvü sərşar olalım!
  Bizə yar olmasa saqi, biz ona yar olalım!

Xublar vardı çəmən seyrinə zinhar, gəlin,
Cəm olun qönçə kimi, gül kimi bir dəm açılın,
Eşidin bülbülün ahəngini, qədrini bilin,
Dustlar, mövsümi-gül getmədən əldən yığılın –
İçəlim bir neçə gün badəvü sərşar olalım!
Bizə yar olmasa saqi, biz ona yar olalım!

Yarə can eylərik isar, budur niyyətimiz,
Tutanq damənini yar ola gər dövlətimiz.
Biz onun bəndəsiyik, səcdəsidir taətimiz,
Ömr əgər möhlətimiz versə, fələk fürsətimiz,
İçəlim bir neçə gün badəvü sərşar olalım!
Bizə yar olmasa saqi, biz ona yar olalım!

Fariq olmun fələki-mübrimin ibramından*,
Hiç kim sə'y ilə qurtulmaz onun damından,
Dustlar, dövri-zaman gərdişi-əyyamından,
Etməmişkən bizi bihuş əcəl camından,
İçəlim bir neçə gün badəvü sərşar olalım!
Bizə yar olmasa saqi, biz ona yar olalım!

Nola gər çərx ilə yekru qılıram mən, Qövsi!
Dust gər yar ola, neylər mənə düşmən, Qövsi!
Büt ilə xəlvət edən yerdə brəhman, Qövsi,
Gəl ki, bir guşədə saqiyyü mənü sən, Qövsi,
İçəlim bir neçə gün badəvü sərşar olalım!
Bizə yar olmasa saqi, biz ona yar olalım!

Atidə dərc olunan münacat ilə – ki, Qövsinin ən xoşməzmun və səfabəxş kəlamlarından birisidir və mənən Füzulinin kəlamına bənzəyir, – xətmi-kəlam edəlim. Onun əş'ari-lətifələrindən ittixaz olunan nümunələrə iktifa olunur.

Münacati-Qövsi:

İlahi, könlümü qurtar bu aləm macərasından,
Məni döndər onun biganəsindən, aşinasından!
İlahi, könlüm et rövşən, məni göstər mənə, ya rəb,
Onun ayineyi-dəryadili-aləmnümasından!
İlahi, könlümü öz eşqin ilə et ləbaləb kim,
Usandım qədrbilməzlər qəmü dərdü bəlasından!

* **Mübrim-ibram** – yə'ni siqlətverici və məluledici; fələyin cəfa və zülmündən fariq olmayın



İlahi, rövşən eylə çeşmimi öz xaki-rahından –
Ki, yegdir zülfü xəttin sürməsindən, tutiyasından!
Havalandır məni ərbabi-dil övci-məqamında,
Bu duni-fitrətin qurtar səri-kuyi-həvasından!
Mükəddər eylədi ayinəmi qəflət tozu, ya rəb,
Xəbərdar et məni öz Kəbeyi-kuyin səfasından!
İlahi, bir məqam et Qövsiyi-biçarəyə ruzi –
Ki, yek gəlsin ona dərman sənin qeyrin dəvasından.

# AĞAMƏSİH ŞİRVANİ

Ağaməsih Şirvani Mustafa xanın zəmani-hökumətinin ibtidasında Şirvanda olurmuş[271], özü də kamil bir vücud imiş; təb'i-şe'riyyəsi də var imiş. Ağaməsihin nəslindən indi də Şamaxıda vardırlar. Belə ki, möhtərəm ədibimiz Sultan Məcid Qənizadənin[272] mərhum şair dördüncü babası hesab olunur.

Ağaməsih Molla Pənah Vaqifin və Molla Vəli Vidadinin müasiri olduğuna görə, əş'ar və tərzi-kəlamı onlarınkına artıq dərəcədə bənzəyir. Məşhur qövlə görə, Ağaməsih hicrətin on üçüncü əsrinin ibtidasında İranda vəfat etmişdir. Mirzə Yusif Qarabağinin məcmuəsində Ağaməsih Şirvaninin kəlamından bir müxəmməs və bir müəşşər təb' olunmuşdur və bunlardan əlavə Zaqafqaz müftisi Hüseyn əfəndi Qaibov həzrətlərinin "Məcmuə"sində Ağaməsihin bə'zi kəlamı yazılıbdır. Onlardan nümunə üçün bir neçəsi burada zikr olunur.

Müəşşəri-Ağaməsih Şirvani:

Ey türfə nigari-mahruxsar,
Ey huriliqa, firiştəkirdar,
Bu hüsn ilə olmamışkən izhar,
Oldun məni-dilşikəstəyə yar.
Bilmən necə hiylə qıldı əğyar,
Sonra səni məndən etdi bizar.
Bəs indi sözüm budur ki, təkrar
Xəlq eyləsə tə'nə, eyləmə ar,
Qanımı halal qıldım, ey yar,
Bir ad ilə et məni günahkar.
Al dəstinə tiğ, durma, zinhar,
Öldür məni, olsun əllərin var!

Ey hüsni-cəmali mahparə,
Əhvalıma qılma sən nəzarə.
Yar oldu rəqib sən nigarə,
Oldun mənə yağı varə-varə.
Salsan məni ahi-pürşərarə,
Yox məndə rizadən özgə çarə.
Rəhm etsən əgər məni-fikarə,
Salmaz məni qəm bu ruzigarə.
Xəlvət özünü çəkib kənarə,
Bir könlünə eylə istixarə.
Təqsirimi söylə aşikarə,
Öldür məni, olsun əllərin var!



Ey rəngi-üzari şöleyi-nur,
Qılmana misal, nisbəti-hur,
Bir şux ki, oldu hüsnə məğrur, –
Çox olmaz onun ədası mənzur.
Gəl, sən dəxi qılma fitnəvü şur,
Etmə özünü bu tövr məşhur.
Ta vəsldən eylədin məni dur,
Ancaq ki, budur dilimdə məzkur,
Üftadeyi-eşqə eyləmə zur,
Qoyma məni dərd evində rəncur.
Xublərdə əgər bu isə dəstur,
Öldür məni, olsun əllərin var!

Ey şah, dərində bir gədayəm,
Yad etmə məni al, aşinayəm.
Kuyində əgərçi xaki-payəm,
Bil qədrimi, eyni-kimyayəm.
Əfsaneyi-dərdi-bidəvayəm,
Hərçənd ki, eşqə mübtəlayəm,
Sərgəşteyi-möhnətü bəlayəm,
Əhvalı şikəstə, binəvayəm,
Sirrini desəm üzü qarayəm,
Baş ilə ayağına fədayəm,
Bu məsləhətə ki, mən rizayəm:
Öldür məni, olsun əllərin var!

Ey qətlimə eyləyən iradət,
Məqsudinə yet səhih-səlamət!
Açılsa əgər bu babi-rəhmət –
Kim, hasil olur mənə bəşarət,
Qalmam məni-namurad rahət,
Daha haçan eylərəm şikayət?
Səndən bunu istərəm nəhayət,
İqrarına olma bidəyanət.
Can məndə səninkidir əmanət,
Al, sonra ki, çəkməyim xəcalət,
Düşməz ələ daxi böylə fürsət:
Öldür məni, olsun əllərin var!

Ey gül, desələr Məsihə qafil,
Bir özgə nigarə oldu mail,
Təhqiq elə kim, dolansa yüz il,
Səndən dəxi qeyrə verməzəm dil.
Ərzim bu ki, eyləmə təğafil,
Bir gövrə yetiş, günahını bil,
Cəm et neçə əhli-hali-aqil,

Onlardan həqiqət eylə hasil.
Gər şər' həmin budur müqabil,
Mən həm oluram bu əmrə qail.
Gördün iki şahid oldu adil,
Öldür məni, olsun əllərin var[273]!

Müxəmməsi-müstəzadi-naqisi-Ağaməsih:

Ey şux, ruxun gün kimi əşyayə mücəlla,
Üşşaqə təmaşayi-cəmalın fərəhəfza,
Mə'nadə rümuzi-dəhənin elmi-müəmma,
Sən kimi tapılmaz büti-ziba sənəm əsla,
Hər zib sənə sün'i-xuda birlə müheyya,
Daxi nə bəzənmək?!

Məşşatə nə lazım sənə, ey afəti-dövran –
Kim, eyləmisən ayinəni hüsnünə heyran?
Nazik üzünə ğazə nigah etsə, düşər qan,
Təpsin gözünə sürməsini əhli-Sifahan,
Çeşmi-siyəhin kim, ala hər işvədə yüz can,
Daxi nə bəzənmək?!

Bəzm içrə yüzündən götürən dəmdə niqabın,
Qanını ləbin şişəyə tutdu meyi-nabın,
Başına həva gəldi qədəhlərdə hübabın,
Bitab düşüb saqi, nə mümkün verə tabın?
Yıxdın evini mən kimi min xanəxərabın,
Daxi nə bəzənmək?!

Basanda qədəm naz ilə seyr etməyə bağə,
Ruyin gülü səhrayə qovub, laləni dağə,
Gər bərgi-həna düşsə, əcəb yox, əl-əyağə,
Şayəstə deyil al vərəq al yanağə,
Gündüz günə bənzər, gecə məhtabü çirağə,
Daxi nə bəzənmək?!

Ey qaməti sərvü ləbi qönçə, ruxi lalə,
Göz mərdüməki məhv ruxunda xətü xalə,
Zülfi-siyəhin mahi-ruxun dövrünə halə*,
Peyvəstə qaşın göydə urar tə'nə hilalə.
Kim görsə deyər səlli-ə'la böylə cəmalə,
Daxi nə bəzənmək?!

* Halə – ay ətrafında görünən nurani dairəyə deyilir



Ey tazə lətafət çəməni içrə güli-tər,
Olmaz bu nəzakət belə bir şuxə müyəssər,
Təbdili-libas etsə, deyil mən sərasər,
Bilütfdürür qeyri-vəfakar mükərrər,
Nəqqaşi-qəza kim, sənə vermiş belə zivər,
Daxi nə bəzənmək?!

Lütfündə Məsiha dilər asarü məqalat,
Ol Xızr kimi abi-dil ilə rəhi-zülmat,
Səndən aparır feyz bədəni-mürdeyi-mir'at,
Heyhat! Bu növ' ilə nəzirin ola, heyhat!
Məhtab kimi aləmə məqbulluğun isbat,
Daxi nə bəzənmək[274]?!

Ağaməsihin burada zikr olunan hər iki kəlamı onun təb'inin mövzun və güşadə olmağına dəlalət eləyir. Bə'zi əbyatı hüsn və lətafətdə Molla Pənah Vaqifin kəlamına bərabərdir ki, gözəl mədhində onun yazdığı kəlam yuxarıda zikr olundu.

Ağaməsih dəxi bir kəlamında Vaqif kimi həqiqi gözəlliyin nişan və əlamətlərini bir-bir zikr edib, zahiri gözəllik və məlahətlə bərabər, gözəlin əslü nəsəbini dəxi mülahizə edib, onları əvvəlinci şərtlərdən hesab eləyir:

Əvvəla şəkk olmaya zati-əbavü cəddinə,
Deməyə bir kimsə hərfi-namünasib rəddinə,
Yetmiş ondördgecəlik ay tək büluğ həddinə,
Çün şəbi-yelda qərə saçı bərabər qəddinə,
Həm mübarək başı misli-qübbeyi-mina gərək[275].

Özgə bir müxəmməsində Ağaməsih əhli zəmanədən şikayət edib deyir:

Dila, etmə təvəqqe, rastguluq qanda qalmışdır,
Qərinə özgədir, bunlar keçən dövranda qalmışdır,
Nəməkdə qədrü qiymət, nə kəramət nanda qalmışdır,
Bəla çəkməkliyə nə tabü taqət canda qalmışdır,
Nə asari-şəfa bimar üçün dərmanda qalmışdır.

Olubdur qəlb xain, həq bilir bir paktinət yox,
Düşəndə satmayan dünyada dinin heç millət yox,
Zükur əqsamının təb'ində əsla doğru beyət yox,
Ünas əhlində bir zərrə hicabü şərmü ismət yox,
Təriqi-ədəmiyyət yolda, nə ərkanda qalmışdır.

Havalı kimsələr bəhri-hərəmə misli-yelkəndir,
Nə yan olsa, çəkər məllahı, nəfsin kəştisi təndir,
Dolanır qəhrü zülmə sahili-insafdan gendir,
Nə fərq edən həlalı dari-dünyadə müəyyəndir,
Nə xövfi-axirət xəlq içrə nahəq qanda qalmışdır.

Tutan, mə'lum, yox şər'i-rəsuli, əmri-Allahi,
Rəiyyətlər qılır dəstgah hər beş gündə bir şahi,
Cələbdir* şiveyi-ülfət, bu rəmzin kimdir agahi,
Sədaq oxu kimi gəctəblər almış nəzərgahi,
Olar kim, doğrudur əyri qılınc tək yanda qalmışdır.

Məsiha, kəs təəllüq bu cahandan kim, xəsarət var,
Nə tə'siri-dua zahir, ərənlərdə nə himmət var,
Nə alimlərdə şər'iyət, nə bəylərdə ədalət var,
Nə bir doğru sözü xəlqin, nə bir kəsdə dəyanət var,
Həqiqət aşinadə, nə vəfa yaranda qalmışdır[276].

Ağaməsihin bu müxəmməsində müasiri Vaqif kimi öz zamanının xalqından, onların düruğgu, nəməkhəram, qədrbilməz, bivəfa və bidəyanət olmaqlarından şikayət edib, dünyada düzlük və doğruluğun nabud olmağından fəryad eləyir və ziyadə təəssüflə haram ilə halalın mabeynində təfavüt qoyulmadığını, şərm və həyanın və dini-islamın unudulmağını və axirət xövfü xalqın qəlbindən çıxmağını, insaf və mürüvvətin ədəmini izhar edib, öz-özünə xitabən deyir: Məsiha, bu cahandan və onun əhlü naəhlindən əlaqəni kəs; bir yerdə ki, duada tə'sir, ərənlərdə himmət və qeyrət, alimlərdə zöhdü təqva, bəylərdə ədalət, dostlarda sədaqət qalmaya və doğru yerinə əyri işlənə, daha orada nə xeyir və bərəkət və nə zindəganlıq?!..

Bu səbəblərə görə şair vaxtının çoxunu qürbətdə keçirib və axırda qürbətdə dəxi canını can yaradana təslim etmişdir.

* Cələbdir – "cəlb" sözündən ibarətdir – özünə tərəf çəkmək



# NİŞAT ŞİRVANİ

Nişat Şirvani Ağaməsihin müasiri imiş. Şirvan şairlərinin mötə'bərlərindən birisi hesab olunur. Nişat həqiqət əhli olduğu üçün zahiri zöhdü təqvanı və riyai ibadəti sevməz imiş və şeirlərinin çoxunda xudbin vaizlərə və müdəmməq abidlərə dolaşarmış. Heyfa ki, Nişatın tərcümeyi-halına dair mə'lumat cəm edə bilmədik[277].

Ağaməsihlə onun həməsr olduğu əşarından görünür. Mə'lum olduğuna görə, hər iki şair ömürlərinin çoxunu başqa diyar və ölkələrdə səyyahlıqla keçiriblər və səyahət etdikləri vilayətlərin əksəri İran məmləkətində olan vilayətlər olubdur və İran şüəra və ürəfasından təhsili-kəmalat etmişlər. Və lakin Nişat qürbət vilayətlərdə kamal və təcrübə kəsb edibsə də, xeyli məşəqqət və zəhmətlərə dəxi düçar olubdur. Necə ki, bu xüsusda bir qəzəlində yazır:

Qürbətdə rəhi-sə'bdə əsbabi-səfər tək
Asudəliyim olmadı hər mənzilə düşdüm.

Gər misli-hübab özgə həva başıma düşdü,
Bir dəmdə evim tikdimü yıxdım, yola düşdüm.

Üz görmədim əzbəs ki, Nişat, əhli-vətəndən,
Bu vəch ilədir kim, baş alıb hər elə düşdüm[278].

Aşağıda yazılan qəzəl Ağaməsihin diqqətini cəlb edib, ona cavab yazmağa şairi vadar etmişdir.

Qəzəli-Nişat:

Şuri-cünun aşiqin başına rif'ət verir,
Hər kəsə dünyadə həq əqlicə dövlət verir.

Qanım içirkən bulur çeşminə eyni-səfa,
Öylə ki, meyxarələr bəzminə zinət verir.

Handa ki, görsən, könül, yarı, dolan başına,
Sanma ki, dövran sənə bir dəxi fürsət verir.

Surəti-halın demək aşiqə lazım deyil,
Üz verə iqbal əgər, eşq özü surət verir.

Gövhəri-nəzmin, Nişat, eyləmə hər yerdə sərf,
Bir belə bazardə kim ona qiymət verir[279]?

Bunun cavabında Ağaməsih yazmışdır:

Aşiqə tə'limi-yar feyzi-bəşarət verir,
Necə ki, gül bülbülə dərsi-fəsahət verir.

Ol səhiqəd, püstələb gülşənə olsa rəvan,
Qönçəni dilgir edər, sərvə xəcalət verir.

Əmməyə mümkün ola gər ləbi-dildardən,
Çeşmeyi-heyvan kimi gör necə ləzzət verir.

Vaiz özü hurilər vəsfi ilə zövq edər,
Tərki-meyü eşq edin – xəlqə nəsihət verir.

Duzəx özü söylənir şiddəti məşhurdur,
Canda fəraq atəşi özgə hərarət verir.

Çərxə vəfa bağlama, eyş edə gör vəqt ikən,
Vədə irişsə, əcəl sanma ki, fürsət verir.

Gövhəri-nəzmin, Nişat, düşsə Məsih əlinə,
Rayici-bazar edər, aləmə şöhrət verir[280].

Ağaməsihin axırki beyti Nişatın xoştəb' və şirinkəlam bir şair olduğunu göstərir. Nişatın öz əsərləri dəxi onun fününi-şeirdə mahir və qabil olduğunu bildirir. O əsərlərdən bir neçəsi burada yazılır.

Qəzəli-Nişat:

Sənin fərşin ki, zahid, buriyadır,
Həqiqət mənzilində bu riyadır.

Riyadır zahidin gərçi namazı –
Və lakin xəlq içində xoş ə'dadır.

Nigahından ol ahuçeşmin, ey dil,
Özün saxla kim, ol eyni-xətadır.

Düşər güzgüyə daim əksi-canan,
Könül saf olsa, hər mətləb rəvadır.

Əcəb yox, türrəsindən olmuşam şad,
Mənim bəxtim ki, var başdan qaradır.

Nişatın könlünü incitmə, ey şux,
Sənə nifrin edər, əhli-duadır[281].



Yenə qəzəli-Nişat:

Qönçə tək eldən kişi sirrin nihan etmək gərək,
Aşiqi-yekrəng olan bağrını qan etmək gərək.

Müşkül işdir dərdi hər bidərdə izhar eyləmək,
Dərdi bir dərd əhlinə şərhü bəyan etmək gərək.

Xəlqdən qət'i-əlaqə eyləyib ənqa kimi,
Bir qənaət guşəsində aşiyan etmək gərək.

Yaxşı gündə bilmək olmaz kim, dəyanət kimdədir,
Yaxşı yoldaşı yaman gün imtahan etmək gərək.

Ey Nişat, ox tək sözümdən hər kimə səhm* eylənir,
Böylədir, doğru sözü xatirnişan etmək gərək[282].

Nişatın bu qəzəli hikmət və təcrübə üzü ilə deyilmiş şeirlərdir. Şair hər nakəsə sirri-zəmiri açıb söyləməkdən insana ariz olan zərəri təcrübə ilə müşahidə edib nəsihət üzü ilə tövsiyə edir ki, kişi olan gərəkdir qönçə tək sirrini xalqdan pünhan saxlasın, ta ki, öz muradına vasil ola bilsin. Peyğəmbərimiz Məhəmməd əl-Mustafa dəxi buyurmuşdur ki, "hər kəsə sirri ə'yan etmək olmaz". Necə ki, Molla Rumi "Məsnəvi"sində bu babda yazmışdır:

Ta təvani pişe-kəs məgşay raz,
Bər kəsi in dər məkon zinhar baz.
Çon ke əsrarət nehan dər del şəvəd,
An moradət zudtər hasel şəvəd.
Qoft peyğəmbər ke, hər ke ser nəhoft,
Zud gərdəd ba morade-xiş coft.
Dane çon əndər zəmin penhan şəvəd,
Sərе-u sərsəbzeye-bustan şəvəd.
Zərro noğre gər nəbudəndi nehan,
Pərvəreş key yaftəndi zire-kan[283].

Və bu babda yenə əbəs deyilməyibdir ki: "Sər vermək olar, sirri ə'yan eləmək olmaz!" Doğrudan da insanın qəlbi karvansara deyil ki, yol ilə hər ötüb keçən onda özü üçün məqam bulsun və onun içində olan yaxşı-yamanı aləmə faş qılsın.

İnsan gərəkdir sirrlərini və fikirlərini sevsin və cani-dil ilə onları ürəyində bəsləyib həddi-kəmala yetirsin və sonra faş etməyi lazım isə, faş

* Səhm – qorxu, dəhşət; ox və xədəng

eləsin və bundan maəda hər naəhlə və hər bidərdə dərdi-dili izhar etməyin nə faydası? Bir kəs ki, sənin dərd və qəminə şərik olmayacaqdır və sənin xiffət və küdurətini azaltmayacaqdır, ona daha dərdi söyləməkdən nə hasil? Kişi dərdini söyləsə də, gərəkdir dərd əhlinə söyləsin və bilmək istəsin ki, dərd əhli və dusti-həqiqi kimdir. Lazımdır dost adlandırdığı şəxsi yaman günündə, yə'ni sənə bir yas və müsibət üz verən halda imtahan edəsən.

Hərgah dostun yaman günündə dəyanət göstərib öz dostluq və sədaqətində möhkəm və sabitqədəm olsa, o, həqiqi dostdur. Və illa yaxşı gündə, əldə var və dövlət olan zamanı hamı sənə dost və xeyirxah olacaqdır. Odur ki, şair deyir:

Yaxşı gündə bilmək olmaz kim, dəyanət kimdədir,
Yaxşı yoldaşı yaman gün imtəhan etmək gərək.

Amma Nişatın bir arzu və xahişini haqq və savab görə bilmədik. O isə xalqdan qət'i-əlaqə edib ənqa kimi qənaət guşəsində aşiyan etməkdir. Nişatın bir tərəfdən guşənişin abidləri və riyakar zahidləri tə'n və məlamət edib, digər tərəfdən özü guşənişinlik arzu etməsi bir növ qəribə gəlir və bir də islamda röhbaniyyət olmadığı üçün müslüm gərəkdir xalq içində, həmcinsi arasında dolanıb, onlar ilə müaşirət eləsin, xalqa kömək və nəf' yetirsin, xalqa, din və vətənə hüsni-xidmətlər göstərib hər ikisinin tərəqqi və təalisi yolunda sərfi-himmət etsin. Guşənişinlik böyük bir hünər deyil ki, onu arzu edib, əməli qeyrilərə dəxi tövsiyə olunsun.

Nişat Şirvaninin yuxarıda zikr olunan qəzəllərindən başqa daha da bir çox gözəl müxəmməsləri və mürəbbeatları vardır ki, cümləsinə məcmuəmizdə yer yoxdur.



## AĞAHÜSEYN "ARİF" TƏXƏLLÜS

Məhəmməd ağa Müctəhidzadənin "Riyazül-aşiqin" ünvanı ilə tərtib etdiyi "Təzkirətül-şüəra"sında verdiyi mə'lumata görə Arif Molla Pənah dövrünün şüərasındandır[284].

Nişatın və Ağaməsih Şirvaninin müasiri imiş. Əsli və nəsəbi İrana mütəəlliqdir. Təvəllüd edib Təbrizdə, sonraları Qafqaziya torpağına hicrət edib və Şuşa şəhərini məhəlli-iqamət etmişdir. Çox arif, danişmənd və bə'zi elmlərə dara bir şəxs imiş. Təb'i-şe'riyyəsi dəxi var imiş.

Hicrəti-rəsulun 1220-ci[285] sənəsində ömrünün şüşəsi Şuşa şəhərində daşa toxunub sınmışdır.

Aşağıda yazılan qəzəllər onun əsərlərindəndir:

Səba, qəmxarım ol, qəmxarıma dərdi-dil izhar et,
Xəbərdar olmayan qəmxarımı qəmdən xəbərdar et!

Yetişcək sayəvəş toprağə düş, qəmxarıma söylə,
Qəmi-hicrində hali-zarımı izhari-qəmxar et.

Ki, ey peymanşikən, mehrü vəfası olmayan dilbər,
Təğafül eyləmə, bir ləhzə əzmi-kuyi-dildar et!

Əlindən öp, ona şərh eylə əhvali-pərişanı,
Əyağına düşüb öz başın üçün yarə izhar et.

Ki, gəlmiş aşiqi-biçarə yanından səba, söylər –
Ki, ey qəmxar, xabi-nazdən cananı bidar et.

Əcəl verməz aman, can nəqdini almaq dilər səndən,
Bu fərdi naleyi-fəryad ilə hər ləhzə təkrar et.

Ki, həsrət getdi Arif, görmədi yarın bu dünyada,
Rəqibi, bar ilaha, mən kimi məhrumi-didar et!

* * *

Mümkün olmaz yarı görmək bir zaman əğyarsız,
Gülşənin dövründə kim görmüş gül olsun xarsız?!

Dövri dönmüş dövri-dövran bulmadı kamımca seyr,
Çərxi-kəcrəftarı bir dəm görmədim azarsız.

Qədrü qiymətlər tapıb kuyində yarın qeyrlər,
Leyk mən qaldım qəmi-hicran ara qəmxarsız.

Qəm məni pamal qıldı, ey müsəlmanan, haray,
Olmasın kafir də, ya rəb, mən kimi qəmxarsız.

Qəbrimin daşına yaz, ey əhli-dil, bu misrəi:
Verdi Arif canını min həsrət ilə yarsız.

* * *

Günəş nuru deyil pərtöv salıb kövnü məkan üzrə,
Yüzün nurudur ol, ey məh, düşüb əks asiman üzrə.

Rəvan ol canibi-bostanə, ey sərvi-rəvan, ta gör,
Üzün toprağə sərvi-sərkeş busitan üzrə.

Saraldı nərgisi-məstin qəmindən natəvan nərgis,
Üzün gül gördü, xiclətdən qızardı gülsitan üzrə.

Götürgəc pərdə yüzdən şurişü qovğa bülənd oldu,
Qiyam etdi qiyamından qiyamətlər cahan üzrə.

Qədəm bas başına, ta payimal et, sərfəraz olsun,
Qoyub baş xəstə Arif pasiban tək asitan üzrə.

Bu qəzəllərdən Arifin zərif və xoştəb' bir şair olduğu anlaşılır. Heyfa ki, təqazayi-zaman elə imiş ki, Arif kimi şairlərimiz dilbərin vəsfindən, rəqibin sitəmindən, fəraqın ələmindən çərxi-kəcrəftarın cövrü zülmündən başqa bir şey vücuda gətirməyə qadir deyilmişlər. Və necə ki, o vaxtın şairi Nabi əfəndi deyibdir:

Çıxamaz daireyi-dilbərdən,
Qəddü xəddü ləbü çeşmi-tərdən.
Gəh baharə dolaşur, gəh çəmənə,
İlişür sərvə, gülü yasəmənə.
Rəhi-narəftədə cövlan edəməz,
Sapa vadiləri seyran edəməz.

Arifin yuxarıda yazılan qəzəllərindən səva yenə bir çox əsərləri alicənab müfti əfəndi Qaibzadənin "Məcmuə"sində məsturdur[286].



# ACİZ

Molla Pənah Vaqif əsrinin şairlərindən bir neçəsinin adlarını Mirzə Yusif Qarabaği öz məcmuəsində zikr edib, əsərlərindən bə'zi nümunələr göstərmişdir. O cümlədən Acizdən bir neçə nümunələr məzkur məcmuədə dərc olunubdur.

Aciz Azərbaycan şüərasındandır. Divani-əş'arı vardır ki, Təbrizdə 1273-cü[287] sənədə təb' olunubdur və lakin onda şairin əslü nəsəbinə və seyrü sülukuna dair bir əhval yoxdur. Nədənsə bizim türk şüərasından bir çoxu öz əslü nəsəblərindən və hansı zamanü məkanda dünyaya gəlib zindəganlıq etdiklərindən bir əsər və nişan qoymayıblar. Bu barədə heç olmazsa yeddi yüz sənə bundan müqəddəm dünyaya gələn farsların həkimi-danişməndi və şairi-ərcüməndi Şeyx Sə'diyə peyrəvilik edib, öz əsrü zamanlarına da bir işarə etsə idilər, kifayət edərdi. Necə ki, ol fəridül-əsr öz yaşadığı zamanı bu şe'rində bəyan edib, yer üzündə yaşadığından muradı nə olduğunu bildirmişdi:

Dər an moddət ke, məra vəqte-xoş bud,
Ze hecrət şeş sədo pəncaho şeş bud.
Morade-ma nəsihət bud, qoftim,
Həvalət ba xoda kərdimo rəftim[288].

Şeyx Sə'di öz qədrü mənzələtini və əsrinin qədrini anlayıb, kəmalitəəssüflə başqa bir məqamda buyurmuşdu:

Nə Sə'di digər ayəd nə ruzeqar digər[289].

Əlan bizim əlimizdə bir neçə türk – Azərbaycan şairlərinin təb' olunmuş məcmuələri vardır – ki, o cümlədən, Aciz, Dilsuz, Raci, Nəbati, Divani, Seyid, Nigari, Dəxil, Qümri[290] və qeyriləri olsun, – bunların heç birində divan və məcmuə sahiblərinin tərcümeyi-hallarına məxsus bir xəbər yoxdur.

Əlbəttə, bu təklif şairlərin özlərindən maəda – ki, əksəri maddi cəhətincə biçiz və fəqir adamlar olublar, – onların əsərlərini cəm və təb' edən əşxasə dəxi lazım gəlir ki, bir şairin və ədibin əş'arü asarını cəm edib də, onların özlərindən mə'lumat verməmək bir növ işi natamam və yarımçıq qoymaq kimidir. Ol səbəbdəndir ki, bizim məşhur üləma və hükəmanın, üdəba və şüəranın əksəri xatirlərdən unudulub çıxıblar və əbnayi-vətən onlardan bixəbər və bibəhrə qalıblar. Vəli kitab kimin karxanasında, hansı cənabın fərmayişilə və hansı katibin dəstxəttilə yazılıb təb' olunması unudulmur və kəmali-iftixar və təmami-əlqabı ilə kitabın axarında qeyd olu-

nur. Belə ki, Acizin divanının axırında yazılıbdır: "Təmam şod dər darüssəl tə'neye-Təbriz, dər karxaneye-alişane-ezzətneşan Ağa Mirzə Məhəmməd və befərmayeşe-Məşhədi Məhəmməd bin alicənab Mirza Reza betəhrire-həqirolfəqir Yusef Ələləvi Əlmusəvi Təbrizi əlməskəne-Milani əlmovəlled Xorasani ələsle-ibni-mərhum Mirza Məhəmməd ibn Mirza Məhəmməd Əli ibni-Mirza Cəfər Xorasani baniye-mədrəseye-məşhureye-moşərrəf besəhne-mobareke-həzrəte-Məşhəde-əqdəse-pornur və ilə sakenha əlf-əlf saləvatu və səlamu sorur fi ruze-come, dovvome-şəhre-məhərrəme-səneye-1273"[291].

Divani-Acizi başdan-ayağa diqqətlə mütaliə edib, onun ismini də bilməkdə aciz qaldıq[292]. Vəli xəttatın özü ilə və abavü əcdadı ilə tanış olmaq feyzi bizə müsəyyər oldu.

Acizin bir çox qəsidələrindən onun Fətəli şahın və nayibüs-səltənə Abbas Mirzənin zəmani-səltənət və hökumətlərində yaşadığı anlaşılır. Aciz hər iki şahın və bə'zi şahzadələrin məddahı olubdur.

Fətəli şahın şə'nində yazdığı bir qəsidədə onu belə tə'rif eləyir:

Qıldı bünyadımı bu seyli-sirişkim bərbad,
Ah, əgər olmasa ol şahi-cahandan imdad.

Hansı dərgahə qoyum mən üzümü həsrət ilən,
Edəm ol qapıda mən naləvü əfğan bünyad?!

Böylə fəryad çəkim bu fələki-süstnihad
Xanimani-dili-zarım kimi olsun bərbad!

Göstərin siz mənə bu şahdən özgə bir şah,
Dərgəhində edəm ol dadgərin naləvü dad.

Şah bir şahdır ol padşəhi-Hindü Həbəş,
Bir qara quldur oları eləyibsən azad.

Qeysəri-Rumda yoxdur bir elə namü nişan,
Xosrovi-rus nədir bunda ona mən tutum ad?!

Bu keçən şahları piri-xirəddən soruşub,
Oların adını bir-bir elədi bəs tedad:

Nə Kəyumərsü nə Cəmşidü Skəndə, Dara,
Nə Firidunü nə İrəc, nə Mənuçehrü Qubad[293].

Çoxdu bu dərgahi-valadə elə şahlardan,
Eyləyib hər biri bir xidmət ilən könlümü şad.



Nə olur cani-Mənuçöhrə mənuçöhrə qərin,
Nə Firidunda vardır o qədər iste'dad.

Ola bir münşiyi-sərkar Firiduna ədil,
Yığdığı mal onun olmaz ona kilkü midad.

Kim görübdür belə şahı, ola xurşid ona bəxt,
Həm onunçün ola bəhrami-fələkdən cəllad?!

Hansı şahın olub əhdində belə əmnü əman,
Üzə salsın onu bir xəlqi-cahan, etsin yad?!

Belə şahlıq yaraşıb Fəthiəli şahə ki, xəlq –
Sayəsində ola ol zilli-xudanın dilşad.

Kimin əhdində olub gəllə üçün gürg şəban,
Kimin əhdində gəlib şəm' ilə bir məhfilə bad?!

Kimin əhdində olub xəncər müjgani-bütan,
Ola məhbus ona, olmaya bir rah güşad?!

Kimin əhdində olub zülf girehgir tutub,
Dili-üşşaqı edib silsiləsindən azad?!

Kimin əhdində olub naz aça dəsti-niyaz,
Tuta üşşaq ətəyin kim, deyə al kamü murad?!

Hanı bu hüsndə şah, sözdü deyərlər Yusif
Şah imiş Misrdə, amma belə pakizənijad.

Doğmayıb madəri-əyyam, məgər sün'i-xuda
Tazədən eyləyə bir ruyi-zəmində icad.

Bəxşişindən nə deyim, gər verə bir bəhri-gühər,
Buyurur: olmadı bu sailə məndən bir zad.

Qan qoyar bağrına həm lə'li-Bədəxşan ondan,
Axıdıb əşk, eləyər əbri-xüruşan fəryad.

Olur Aciz şəhin hər dil eləsə övsafın,
Ey xuravəndi-kərəmpişə, xudavəndi-ibad!

Hifz qılsın şəhi-Cəmcahivü şahzadələri,
Hər biri şahdı bir şəhrdə baiste'dad.

Şəhriyara, bu duagu ki, yazar xətti-qubar,
Adını əhdi-humayun eləyibdir ustad.

Yaza bilməz belə xoş şivə ilən nəstəliq,
Dirilib bir də yüz il məşq eləyə Mirimad[294].

Lütf qıl xələtü ənamü kəramətü nəzər,
Deyim, ey şahi-cahan, xaneyi-ehsan abad[295].

Özgə bir şe'rində Fətəli şahı şair belə mədh edir:

Gün necə eylər bərabərlik cahanda şah ilən,
Xoş deyil tutsun qərinə kimsə mehrü mah ilən.

Gecə-gün bürci-həməldə əylənib, gör sübhdəm
Şah çıxıbdır təxti-xurşidə cəlalü cah ilən.

Necə mahü əxtərü xurşidi-aləmtab var,
Kimsənin həddi nədir bəhs edə zillüllah ilən.

Eyləyən İskəndəri Fəthiəli şahə qərin,
Filməsəl bənzər ona kim, kuhu bulsun kah ilən.

Hanı keyvanın o həddi lafi-həmtalıq ura,
Baş-başa qoysun bu yerdə bu uca dərgah ilən.

İstəyən bu dövləti olsun cahanda şadkam,
Kəc baxan bu xanimana günü keçsin ah ilən[296].

Başqa bir qəsidəsində Aciz tuli-müqəddimədən sonra beytüllahı ziyarət etmək qəsdinə düşməsini bəyan edib deyir: Vəqti ki, mənim bu niyyətimi əhlü əyalım və qohum-əqrəbam bildilər, cümləsi yekdil olub ahü fəğanlarını göydə Məsihaya yetirdilər və məni hər tərəfdən müttəhim edib bu qəsddən daşınmağa israr etdilər və mənə söylədilər ki, sənin kimi fəqir və biçiz adama Həccə getmək borc deyil; öz əhli-beytini ac və yalavac qoymaq günahdır. Bu əsnada bir dilbəri-şuridədil yetişib mənim hali-dilimi müşahidə edib, könlümün hərəm təvafına müsəmməm və möhkəm olduğunu yəqin edib, öz ə'da və hərəkəti ilə məni heyrət və əndişəyə saldı:

Vurub badi-səba tək əl, açıb bəndi-niqab üzdən,
Dolandı başıma aləm, dedim bəs çərxi-mərhəmdir.

Üzün göstərdi, xalü zülfdən, çahi-zənəxdanın,
Bu Kə'bə, bu həcərdir, bu rəsən, bu çahi-Zəmzəmdir.

Səfa – sinəmdi, Mina – gərdənim, gər var qurbanın,
Dolandır başıma, kəs, qoyma keçsin, yaxşı mövsəmdir.



Özün insaf ver, zalim, görək bu xəlqi-aləmdə –
Atıb öz Kə'bəsin, öz qibləsin ol hansı adəmdir?!

Tutub aram bir ləhzə, təəmmül eyləyib gördüm,
Təsəvvür eyləyib gördüm könül bu sözdə mülzəmdir.

Dedim: ey məh, bu Məkkə, bəs Mədinə tövfini neylim?
Dedi: ol kimsəi kim, sahibi-meraci-xatəmdir.

Mənim cəddimdir axır kim, onun nəsli-humayuni
Cəmii-xəlqi-aləmdə müəzzəzdir, mükərrəmdir.

Məni eylə ziyarət, san Mədinə tövfini etdin,
Səvabın bu təvafın bilməsən, bir özgə aləmdir[297].

Bəd dilbəri-məhpeykər Acizə belə məsləhət görür ki, bu il beytül-həram ziyarətini tərk edib qibleyi-aləm hüzuruna, yə'ni Fətəli şahın yanına azim olsun; əzbəs ki, hacətin ondan rəva olar:

Sənə bir kimsə əl tutmaz, məgər ol şahi-dəryadil,
Kəfi-gövhərfişanından onun həm didə pürnəmdir.

Onunçün kəsrdir hökmən desəm ədl ilə Kəsradır,
Onunçün nəqsdir hətmən desəm bəzl ilə Hatəmdir.

Keyü Cəm kimdi bilməm, tacvər Fəthəli şahın –
Fələk dərgahına üz qoymağa möhtaci-süllәmdir.

Qübari-asitanı kimiya, daşı cəvahirdir,
Cəvahir yığmağa püşti-fələk ol qapıda xəmdir.

Ki, bəlkə fəzli-həq lütfi-şəhənşəh birlə yar olsun,
Gedəsən bir kəs ilən kim, sənə peyvəstə məhrəmdir.

Məh ilə həmsəfər ol, həmgəcavə afitab ilən,
Ziyarət bu ziyarətdir ki, min lütf ilə tövəmdir[298].

Acizin bu dürlü mədh və tə'rifnamələri çoxdur. Nayibüs-səltənə Abbas Mirzənin şə'nində yazıbdır:

Vəliəhdi-şəhənşahi-cahan, şahzadeyi-əzəm,
Vücudi-paki əhli-aləmə bir cudi-üzmadır.

Səmiyi-mahi-ali-haşimi Abbas şahzadə,
Cahangirü cavanbəxtü müini-dinü dünyadır.

Tutar ol zülfi-tərrari, çəkər zəncirə min yerdən,
Pərişanlıq gəlir başına çox şəstinə qərradır.

Zəhi Darayi-dinpərvər, kona* çakərdir İskəndər,
Zəhi sultani-namavər konun** dərbanı Daradır.

İlahi, bu cahanda bu məhü xurşidü əxtər var,
Bu xərgahi-sipəhri-lacivərdi ta ki, bərpadır.

Bu sultani-cahandarın əsasın eylə payəndə,
Müini-aləmü adəm, mədari-pirü bürnadır[299].

Yenə özgə bir qəsidəsində nayibüs-səltənəni belə mədh etmişdir:

Nayibi-sultani-İran, şəhriyari-şirdil,
Xəsməfkən, küfrsuzü şəhneyi-islamiyan,

Afitabi-asimani-səltənət, tabəndənur,
Fəxri-yunan, kamiranü ərşədi-şahzadəgan.

Bülmüzəffər, dadgər Abbas şahi-tacvər,
Münfəildir cudü bəzlü bəxşişindən bəhrü kan.

Günbəgün artsın cəlali, yetməsin dövran əli,
Afitabi-dövlətinə bir zəvalü bir ziyan.

Sayəsində bəhrəvər hər kim olur ixlas ilə,
Dərgəhində xakbusü cəbhəsavü canfişan.

Dərgəhində qan içər ol kəs ki, düşməndir ona,
Gərdəninə tiği-bürran, bağrına tirü kəman[300].

Burada dərc olunan tə'rifnamələrdən masəva Aciz sair şahzadələrin və xanların şə'nində dəxi bir çox qəsidə və qəzəllər inşad edibdir ki, onlardan nümunə göstərməyi artıq bildik.

Abbas Mirzənin ruslar və rumilər ilə etdiyi müharibələrdə göstərdiyi rəşadət və hünəri tövsif və tə'rif etməklə belə iranlıların bə'zi davalarda məğlub olmaları və büruz etdikləri xövf və hərası da gizlətməyibdir və İran ləşkərinin bir müharibədə tarümar, gürizan və pərişan olduğunu belə nəzmə çəkir:

* Ki ona – *red.*
** Ki onun – *red.*



Nə oldu ləşkəri-şahə ki, yeksər tarümar oldu?
Deyən bu ləşkərə gər zəxmi-çeşmi-ruzigar oldu.

Özün Rüstəm deyən bir pərdə dalında qərin tutdu,
Vücudi-rəzm üçün dava günü simürğvar oldu.

Deyən Əfrasiyabəm asiyab içrə özün saldı,
Deyən İsfəndiyarəm saliki-rahi-fərar oldu.

Deyən Kudərzəm axır divar içrə gizləndi,
Fəramərzəm deyən farə, nə farə, susmar oldu.

Fəna çahında olsaydı ölüncə ruyi-qərradə,
Qürur ilə özün Bijən[301] deyən pünhani-ğar oldu.

Sədayi-tupi-xumparə yetən yerdən qaçan kimsə
Sipəhdari-sipahi-xosrovi-Cəmiqtidar oldu.

İki dəstə gedən hər yerdə cəngə ahü zar ilə
Həzimət vəqti qaçmağa ki, şövqü sə'd həzar oldu.

Kimisi nizəsin atdı ki, qəd göstərməsin xəsmə,
Kimi saldı qılınc beldən ki, həngami-fərar oldu.

Edən dilsərd cəngi-rusdən bu ləşkəri-şahi,
Meyi-biğəş, büti-dilkəş, sərayi-zərnigar oldu.

Cəhad etmək nə hacət ol sipah üçün ki, dünyada –
Yeri cənnət, ənisi rəşki-huri bir nigar oldu?

Neçə nəsraniyi-bidin çəkibdir nemsədən ləşkər,
Açıb İranə dəsti-səltənət bədruzigar oldu.

Neçə rübahi-pürhiylə künami-şirə üz qoydu,
Şəğali-bişə cür'ət eyləyib zeyğəm şikar oldu.

Hanı İran üçün qeyrət, bu yolda baş verən kimdir,
Bilinə dəməni-himmət çalıb kim cannisar oldu?

Zərü zuri məgər İran şahının rusdan azdır?!
Bu yolda baş verən hansı əmiri-namdar oldu?

Desinlər bir belə pərxaşü cəngü girü dar içrə
Kim öldü, kim qırıldı, kim bu yolda zəxmdar oldu?

Qalan meydan içində bir neçə tabin olub binam,
Qaçan sərtibü sərhəngü sərani-namdar oldu.

Gərək ölmək, nə dönmək, sər verib sərdarlıq almaq,
Buna iqrar edən yox, hansı düşmənlər şikar oldu.

Güni ki, Gəncədən sındı, sipahi-cəngcu qaçdı,
Haman gün onlara rudi-Ərəs darül-qərar oldu.

Çəkib gər Gəncədə rəncə sipahü şah, şahzadə,
Xətibin qanı ilən xaki-Gəncə lalezər oldu.

Nə təqsiri görək sultani-İranın cahan içrə,
Zərü simi töküb, xələt verib, düşməndə xar oldu?![302]

Bir yandan ehtiyac və yoxsulluq və bir yandan vaxtın təqazası Acizin məddah və vəssaflığına səbəb olmuşsa da, onun gözüaçıq, dindar, qeyrətmənd bir vücud olduğunu inkar edə bilmərik. Xaricilərin və xüsusən, çar dövlətinin İrana dair tutduğu məsləki və siyasi fikirləri Aciz layiqincə anlayıb, gözəl təşbihat və istiarat ilə məramını ifadə edir:

Tutdu küffar səri-zülfi-ruxi-canani,
Örtdü xurşidi-cahantabi şəbi-zülmani.

Düşdü din ayinəsi üzrə bəsi jəngi-zülam,
Kələfi-zülmət ilən qoydu məhi-tabani.

Bir nihan fitnə edib qəmzeyi-xuban kimi rus,
Tutdu dil mülkünü bicəngü cədəl pünhani.

Gətdi* müjgani-xəta başına qəzzax hücum,
Şəhri-bəndi-dilü din içrə salıb talani.

Bir nizam ilə gəlib elçi üçün pişvazə,
Əql qasirdi ki, yox vəsf eləmək imkani.

Məgər ol qəmzeyi-xuban gözədüb üşşaqi,
Səfi-müjganə verib nəzm kim, alsın cani?![303]

Rus politikasını şair qəmzəli bir gözələ bənzədib, ona min cür naz və işvə, ziynət və lətafət nisbət verir. Rus politikası lazım olan məqamda hər kəsin meylü-rəğbətini öz şirin dili ilə və hüsni-vədələri ilə və qisim-qisim bəxşiş və töhfələri ilə ələ gətirməyə qadirdir:

Var bir qaidəsi kafiri-meyxarlərin,
Çox nəvazişlər edərlər görələr mehmani.

* Gətirdi – *red.*



Çayi-rəngini çəkib badə Ərəsdən daşqın
Dəhri gülzar eləyib cami-meyi-reyhani.

Səbhə, zünnardır, həm bangi-müəzzin naqus,
Nə məlahət yeri var munda səlib asani.

Eylədi vəhmi-təvəhhüm qələbə qələyə çox,
Eyləmək hifz çətindir burada im'ani[304].

Bü lutf və nəvazişlərdən sonra şair usanıb, gecə yarısı zarü pərişan zülfi-dilbərdən bir növ dili-nalanı xilas edib İraq mülkünə azim olur və orada məşhur İran ordusunun sərkərdəsi Şıxəli Mirzəni ziyarət edib, dərgəhi-pakına üz sürtüb badili-zar deyir:

Sən osan tiği-kəcü rast sinanın ilə
Eyləyən xəsmdən asudə şəhi-İrani.

Sən osan xiymeyi-zəngarı vuran ərşətdə,
Asiman ulduzu tək ləşkərə verdin sani.

Sən osan qədin sayə Qızılağacə,
Rəşki-Firdovs eləyən Göytəpəvü Muğani.

Bağladıb cisr, keçib rudi-Ərəsdən, Kürdən,
Əvvəli-vəhlə təsərrüf eləyən Səlyani.

Həm alıb rahi-Qarabağü Şəki əmlakın,
Həm varıb şiri-jəyan kimi alan Şirvani.

Həm salan qəl'eyi-Bakuyəni təsxirə tamam,
Həm alan Qübbəni, Quryana yazan fərmani.

Ta dəmir qapuyi-Dərbəndə kimin bircə qapı
Üzünə bağlı ola, bir kəsin olsun cani.

Dağı-həsrət dili-pürkinəvü xəsmə çəkdin,
Yenə sən pak elədin sineyi-Dağıstani.

İndi noldu ki, belə samitü sakit oldun,
Bəs elə dəbdəbəvü şövkətü hişmət hani?!

Bu rəvadır ki, salıb məmləkəti-İranə –
Bu qədər fitnə gör ol xaçpərəst, nəsrani?!

Din gedə, qəbzeyi-islamə düşə zülməti-küfr,
Canü dildən çağıran yox Əliyi-İmrani.

Ola din padşəhi Fəthiəli şahə kömək,
Öylə bidinə müsəllət edə bu sultani[305].

Abbas Mirzənin zəmani-hökumətində Rum səltənəti ilə İran dövlətinin mabeynində vüqua gələn ittihad və sülhü şair təbrik edibən, Rum elçisinin vəsfi-şə'nində gözəl bir qəsidə yazmışdır ki, ondan nümunə göstərməyi münasib bildik:

Rumu İran xəlqi açmış dərgəhi-xəllaqə əl,
Oldu məqruni-icabət bu dua əmma qərib.

Tapdı ülfət iki dövlət, gəldi elçi Rumdən,
Vəh, nə elçi, gövhəri-zatı kimi adı nəcib.

Xosrovi-mülki-bəlağət, mərdi-meydani-süxən,
Xoşədа, şirintəkəllüm, danişamuzu ədib.

Qəsri-dövlətdə əzizü təxti-izzətdə əmir,
Elmi-hikmətdə həkimü elmi-əbdanda təbib.

Müdərris tüllab ara yox bu fəqahətdə fəqih,
Mənbərü mehrabdə yox bu fəsahətdə xətib

Gülşəni-İranə gəlgəc saldı bir şürü nəva,
Gülsitani-Rumdən böylə xoşəlhan əndəlib.

Rizişindən ağlasa gər əbri-neysan zar-zar –
Vər tökə zərrə xəcalətdən ərəq, sanmış əcib.

Mən əfəndim istədim çox vəsf edəm, əqlim dedi:
İstəməz bu sərvi-zibaqamət artıq zibü zib.

Böylə sünbül butası neylər əbirü qaliyə,
Bu, qızılgül dəstəsidir, istəməz ətr ilə tib.

Böylə kim olmuş əzizi-dərgəhi-xundkari-Rum,
Çar yari-Mustəfa olmuş pənahi, ya mücib!

Dari-üqbadə elə Faruqi-əzəmlən belə,
Etgilən Bubəkri-Siddiqin ona vəslin nəsib![306]

**Acizin bir çox şeirlərindən mə'lum olunur ki, Qırxbulaq adlı bir kənd onun məaş və dolanması üçün ona bəzl və ehsan olunubmuş və lakin hər vaxt darğalar və birəhm amillər ona cəfa edib, artıqlıq ilə ondan xərc alırlarmış və bə'zi vaxt kəndi onun əlindən alıb, ümumi padşahlıq dəftərə salmaq istəyirlərmiş. Bu hal isə şairi zəbun və pərişan edib, onun şikvə və naləsinə səbəb olurmuş:**



Bir yanda qılıb amili-birəhmü mürüvvət
Könlüm kimi viranə olan kəndimə əl bənd.

Axır nə olur olmaya kim, gəllədə bir miş,
Axır nə olur olmaya bir ölkədə bir kənd?!

Bir sünbül üzülməklik ilən gülsüz olur bağ?!
Bir xuşa az olmaqlıq ilən xərmən olur bənd?!

Qorxum budu gözdən vura yüz seyli-sirişkim,
Bilmərrə ola Qırxbulağın rişəsi bərkənd.

Yüz nəfs bu dərgahi-müəlladə tapıb həzz,
Olsun görüm ol müshəfi-ruxsarına sövgənd.

Heç kimsə deyil mən kimi müstövcibi-əhsən,
Lütfən məni məslubi-nəzər eyləmiş hərçənd.

Eylə onu bir dadgərin başına sədqə,
Oldur şəhi-Cəmcahə bu gün nurlu fərzənd.

Gəl lütfə, məni eyləgilən xürrəmü xoşhal,
Ver kəndimi, eylə məni bu lütf ilə xürsənd.

Yoxsa tökərəm əşk, aşar Dəcleyi-Bağdad,
Yoxsa çəkərəm ah, yanar səhəti-Dərbənd[307].

Yenə bu babda lisani-şikvə ilə ərz etmişdir:

Təhti-hökmündə olan məmləkəti-məhrusə –
Cümlə mə'murə, tamam el və vilayət xürsənd.

Bir mənəm amili-biürzə əlindən şaki,
Bir mənəm xeyri-mübaşirdən olan pürgiləmənd.

Dili-zarım kimi xun, çeşmi-tərim tək giryan,
Qırxbulaq adına məşhur varımdır bir kənd.

Gah Fəttah qəlir yeddi şahı baqi üçün,
Üç gün əh atlı ilən əyləşir ol köhnə ləvənd.

Bir belə zəhmət ilən səkkiz ədəd köhnə riyal
Həm rüsum istərü minnət qoyar ol hizü həpənd.

Gah gördü ki, yazıb Lütfəliyi-təhvildar
Sərşikən qəlləsini, pir olasan, eyləmə bənd.

Məni bir yol başına eylə təsəddüq, bəsdir,
Ola asudə bu qəmdən bu dili-hacətmənd[308].

Acizin bu sonunku kəlamından görünür ki, Qırxbulağı onun əlindən alıb ümumi dəftərə salıblar və bu xüsusda gözündən qanlı yaş tökə-tökə yazıbdır:

Ey edən vədə, vəfa eyləməyən peymanə,
Məni bu əhdşikənlik yetiribdir canə.

Qoyma azürdəvü avarə məni-nalani,
Ey dönüm başına, yekdir süxəni-mərdanə.

Bir elə dərdimə dərman, məni qurtar qəmdən,
Ya buyur, eyləyim abad özümə qəmxanə.

Neylərəm seyri-gülüstanı, gülü gülzarı,
Gözümün qanlı yaşını tökərəm damanə.

Qırxbulaq adını dəftərdə görən saətdə,
Ağlamaqdan gözümün yaşı dönüb tufanə.

Səndən imdad ona gər olmasa bu aləmdə,
Necə abad olur dəhrdə bu viranə?!

Ya qələmdən məni sal, eylə məni asudə,
Ya əlimdən onu al, üz çevirim bir yanə[309].

Tehranın vəsfində demişdir:

Ey tikən cənnətə göz, meyl eləyən rizvanə.
Bircə təşrif gətir seyr elə sən Tehranə.

Görgilən cənnəti-dünyanı, əgər adəmsən,
Qoyma ol yerdən ayaq dışra, bir özgə yanə.

Hanı cənnətdə belə bağ, behiştdə belə hur,
Zahidin vəsfini bihudə qılan əfsanə.

O diyar içrə qədəm bircə qoya vaizi-şəhr,
Deyəm: ey oğlu ölən, huriyə bax, qılmanə,

Bir təmaşa üzə qıl, zülfə baxıb kakili gör,
Gülü gül üstə qoyub sünbül urar reyhanə.

Adəmin nəslini bu hüsndə gər bulsaydı,
Səcdə iblis necə etməz idi insanə?!

Bu yeri görsə pəri, getsə behiştə deyəcək:
Necə gör tə'ngə salıbdır məni bu viranə.



Nə zəban ilə edim vəsf, bu abad olmuş
Bənzəməz Xəlləxə, Nuşadəvü Gürcüstanə.

Bilməyir böylə gözəllər, belə pakizə məkan,
Gəlməyib, tarı bilir, daireyi-əmkanə.

Belə cənnət, belə rizvan, belə hurü qılman
Verib Allah bu gün padşəhi-İranə.

Bu duanı elə, Aciz, onu sübhani-qədim
Bilmüzaəf eləsin, düşməsin heç nöqsanə[310].

Divani-Acizdə bir çox qəzəliyyat, müxəmməsat və mürəbbeat dərc olunubdur. Atidə məstur nümunələr onun əsərlərindəndir.

Qəzəli-Aciz:

Nə yaxşı lalə qızarmış bənəfşəzarında,
Nə türfə sünbüli-tər açılıb üzarında.

Nelər şərabi-təhuri əmən dodağından,
Nelər behişti-bərini yatan kənarında.

Nə rahü rəsmdir, ey gül, bu bülbüli-bidil
Çəkib xəzanını, bir gəzməsin baharında?!

Həmişə naləvü əfğan, müdam göz yaşı,
Nə görmüsən məgər, ey dil, bu ah-zarında?!

Əcəb ki, yanmadı, Aciz, bu xərgəhi-gərdun,
Əsər ki, yoxdu bu ahi-şərarbarında[311].

Əyzən qəzəli-Aciz:

Hər zəman zülfi-pərişanına kim, şanə dəyər,
Şanə yüz min dili-məcruhi-pərişanə dəyər.

Ağzını heyni-təbəssümdə görüb əql sanar
Bağ ara badi-səba qönçeyi-xəndanə dəyər.

Yandıran şəm'i-şəbistanı deyil atəşi-eşq,
Atəşi-eşq odur kim, pəri-pərvanə dəyər.

Abida, qoy yerə təsbihini, gör xalü xətin,
Billah, ol səbheyi-səddanəyə bir danə dəyər.

Zahid ol türreyi-tərrarə baxıb dad etdi,
Dedi: ol kafiri tut, qoyma ki, Qur'anə dəyər.

Baxıb ol zülfü ruxə Acizi-miskin nə dedi?
Dedi: qurban olum ol küfrə, yüz imanə dəyər[312].

* * *

tə'ni-bicanə yetər ruh dəmi-İsadən,
Yədi-beyza görünür möcüzeyi-Musadən.

Lilləhilhəmd ki, bu dəhrdə hər ikisi var,
Bir belə feyz yetib qadiri-bihəmtadən.

Bəxti-nasazımı gör necə batıb zülmatə,
Cismi-bicanımı gör necə olub dünyadən.

Nə dirilmək üzünü verdi ona lə'li-Məsih,
Nə işıqlıq ona əl verdi yədi-beyzadən[313].

* * *

Mənzur budur ol dili-divanə dağılsın,
Bir şanə çək ol zülfi-pərişanə, dağılsın!

Könlüm quşu, seyd olmağa gər olsa muradın,
Tök tellərini, hər biri bir yanə dağılsın.

Göstər qaşını, aç ləbi-meygunu dəmadəm,
İstərsən əgər məscidü meyxanə dağılsın.

İçdikcə mənim bağrımı qan etdi bu badə,
Bir dövr elə, saqi ki, bu peymanə dağılsın.

Ruxsarə ərəq ya vərəqi-sim elə əfşan,
Ol əxtəri-rəxşan məhi-tabanə dağılsın.

Hər cövr ki, çəkdin şikəni-zülfdən, Aciz,
Sən yaz onu. bu səfheyi-İranə dağılsın[314].

## Zülfün vəsfində yazdığı qəzəldir:

Çəkilməz dövri-ruyindən kənarə bir zaman zülfün,
Məgər gülzari-cənnətdə olubdur bağban zülfün?!

Əcəb ğəmmazdır çeşmin, əcəb xunxardır qaşın,
Əcəb birəhmdir xalın, əcəb namehriban zülfün.



Nə təqsir etmişəm bilməm ki, böylə xəşmnak olmuş,
Çəkər hər dəm cəbinində mənə xatirnişan zülfün.

Olubdur padşahi-zəngü mülki-rumruxsarə,
Çəkibdir fövci-kiysudən sipahi-bikəran zülfün.

Alıb əqlim, yıxıb könlüm, edib divanə Məcnun tək,
Usanmıb indi eylər qəsdi-cani-natəvan zülfün.

Belə birəhm olma kim, nəsimi-sübhə yalvarram,
Qılar bərhəm mənim könlüm kimi evlər yıxan zülfün.

İki simin binaguşun giribanında gizlənmiş,
Sanasan nəqdi-cani-aşiqi etmiş nihan zülfün.

Alıbdır əqlini, Aciz, salıb damə, dəli etmiş.
Olub əqlim kimi hər mürği-əqlə aşiyan zülfün[315].

## Müxəmməsi-Aciz:

Gəldikdə səni görməyə yüz naz ilə canan,
Ey cani-cahan, sal ələ yüz nəqdi-dilü can,
Yalqız nə rəvadır ola bir can sənə qurban,
Yüz mərhəmətü lütfdü ehsan, gələ mehman,
Dərviş sarayını müzəyyən edə sultan.

Nüdrətdə düşər bir belə dövran ələ, ey dil,
Bu külbeyi-əhzanına canan gələ, ey dil,
Hər dərdi-dilin var isə indi sölə, ey dil,
Çox vaxtdı düşmüşdü işin müşkülə, ey dil,
Gör xaliqi-sübhani necə eylədi asan?!

Bənzər şəbi-qədrə desəm ər bu şəbi-firuz,
Doğdu bu siyəh şamdə bir mahi-diləfruz,
Ya rəbb, elə bu şəbi-firuzimi sən ruz,
Çəkmə dəxi, ey zar könül, ahi-cigərsuz,
Etmə bu şəbi-vəsldə əndişeyi-hicran.

Qıl sübhə dəkin arizi-mahinə nəzarə,
Yatma belə məhtabdə, qıl dərdinə çarə,
Qıl şükri-xuda, eyləgilən ömri-dübarə,
Ayrılmış idin yardən, əmma yenə yarə
Lütf ilə yetirdi səni ol xaliqi-sultan.

Gör bəxtimi, açıldı səhər, getdi fəraqət,
Guya ki, tülu' etdi mənə sübhi-qiyamət,
Həngami-fəraq olduvü əyyami-məlamət,
Hardan bu səfər düşdü arayə bu mərarət,
Təlx eylədi övqatımı bu gərdişi dövran.

Ey bəxt, yetir Acizi-nalanı muradə,
Gəl qoyma onu könlü şikəstə bu aradə,
Könlüm eləyibdir səri-kuyinə iradə,
Bəlkə bir işıqlıq ola bu bəxti-qaradə,
Bipərdə mənə göstərə üz ol məhi-taban[316].

Acizin mürəbbeatından birisini burada yazmağa iktifa etdik:

Ey fələk, günündən artıq
Bu gözəlin camalı var.
Sənin bircə yeni ayın,
Bunun iki hilalı var.

Di gəl haqdan keçmə, fələk,
Əgər gələ yüz min mələk,
Gör hansının bu gözəl tək –
Ağ üzdə xəttü xalı var?!

İstərsən eylə imtahan,
De çıxsın xurşidi-taban,
Yar arizin etsin ə'yan,
Gör hansının zəvalı var.

Mən Acizəm, dərdin alım,
Sənə bəyandır əhvalım,
Bu dönüb baxmağın, zalım,
Bir ev yıxan xəyalı var[317].

Aciz öz əsrində Azərbaycanın məşhur şairlərindən birisi hesab olunurmuş. Onun bir çox mətin və abdar şeir və qəzəlləri vardır ki, mə'nadan xali deyil. Vəli mürəbbeat qismi əsərlərində çəndən rəvanlıq və məlahət yoxdur. Xüsusən, Vaqifin kəlamı ilə onları yanaşı qoyduqda onların fərqi görünür. Timsal üçün Vaqif ilə Acizin qafiyələrindən bir-iki bənd götürüb tutuşduraq.

Aciz vəsf qıldığı gözəlin hüsn-cəmalını günə və aya oxşadıb, fələyə tə'nə vurub deyir:



Ey fələk, günündən artıq
Bu gözəlin camalı var.
Sənin bircə yeni ayın,
Bunun iki hilalı var.

Di gəl haqdan keçmə, fələk,
Əgər gələ yüz min mələk,
Gör hansının bu gözəl tək,
Ağ üzdə xəttü xalı var.

Acizin gözəli belə sadə dil ilə tə'rif etməsi nə qədər xoşsa da, çöl aşıqlarının sözlərinə bənzəyir və bə'zi misraların vəzni düz gəlmir. Amma Vaqifin kəlamında bu qüsur görünmür. Vaqifin sözlərində sadəlikdən maəda başqa bir lətafət də vardır və ona səbəb kəlamın həqiqi hissiyyatdan nəş'ət etməsidir ki, oxuyanlara da sirayət eləyir.

Vaqif sevdiyi gözəli bir kəlamında belə tə'rif eləyir:

Ey cananım, sən bəzənib gələndə,
Ay və gün qarşına pişvazə gedər.
Kəbeyi-kuyinə gündə min kərə
Mələklər yığılıb nəmazə gedər.

Ağ günə təşbihdir sənin cəmalın,
Eşqindən salmışam aləmə bir ün,
Səni sevən cavan olur günbəgün,
Qarımaz, qocalmaz, tər-tazə gedər.

Vaqifin axırki sözləri mənən Şeyx Sə'dinin kəlamına bənzəyir:

Bəxte-cəvan darəd an ke ba to qərinəst,
Pir nəgərdəd ke dər beheşte-bərinəst[318].

Nə qədər Sə'dinin bu şe'ri həm ləfzən və həm mənən farslara xoş gəlirsə, bir o qədər də Vaqifin:

Səni sevən cavan olur günbəgün,
Qarımaz, qocalmaz, tər-tazə gedər.

– sözləri əsil Azərbaycan oğlunun xoşuna gəlməyinə şübhə yoxdur.

# AŞIQ ƏLİ KƏLİBƏRİ QARACADAĞLI

Aşıq Əlinin bir neçə kəlamından – ki, Mirzə Yusif Qarabağinin tərtib etdiyi məcmuədə dərc olunmuşdur, – belə mə'lum olur ki, onun çəndan elmə və savadı yox imiş və ona şair deyilməyib aşıq deyilməyi bu qövlümüzə şahiddir. Aşıq Əli Molla Pənah Vaqifin müasiri olduğu Vaqifin mədhində yazdığı kəlamdan anlaşıldı.

Mürəbbeatlarının bə'zində lətafət var isə də, qüsur və rəkakətindən xali deyil. Məsələn, mürəbbeatından birisini bu sayaq başlayır:

Nə saətdə gəldim dünya evinə,
Şum sitarə, bəxti bağlı olmuşam.
Taleim bəd, günüm qara, cəfakeş,
Hicran evli, dərd otaqlı olmuşam.

Burada "şum sitarə", "bəxti bağlı", "hicran evli", "dərd otaqlı" kimi qafiyələrin nə vəznində və nə üslubunda bir yaraşıqlıq və sazişlik var və nə də sözlərin mə'nasında bir lətafət və zərafət...[319]

Bunlar əslən şair sözlərinə bənzəmir, bəlkə Qurdoğlu sözlərinə oxşayır. Bu kəlamın az-çox yenə axırki bəndi xoşayənddir:

Əliyəm, çox çəkdim dərdü bəladən,
Qəm əl götürmədi mən mübtələdən,
Aləmi-ərvahdə qalü bəladən
Xun cigərli Qaradağlı olmuşam.

Aşıq Əlinin qəzəllərindən ən mərğubu aşağıda yazılan qəzəli-müstəzaddır:

Ey sərvi-səhi, sən gələli seyr ilə bağə,
Baş çəkmədi ər-ər,
Çox alinəsəblər özünü saldı ayağə,
Qul oldu sənubər.
Bir xalın üçün zülfünə çoxlar dolaşıbdır,
Ancaq məni bilmə.
Bir danə üçün çox quş özün saldı duzağə,
Dam oldu müsəxxər.
Sünbül özünü zülfünə bənzətdi, nigarım,
Gördü ki, xətadır.
Dağlarda tapar yüzü qarabaşı aşağə,
Qayğılı, mükəddər.
Sən tək pərinin mənzili viranə gərəkdir
Ya çeşmələr üstü,



Könlüm kimi viranə, gözüm kimi bulağə
Gəl, ey pəripeykər!
Dünyada əgər Əli özü ağlıya getsə,
Zülfün həvəsindən,
Rəhmət yağışı torpağının üstünə yağə,
Qəbri ola ənvər.

Bundan əlavə Molla Pənah Vaqifin mədhində yazdığı qafiyələrdir ki, bu sayaq başlanır:

Bu gövhər sözlərin, ey alicənab,
Tamam aşiqlərin səminə gəlmiş...

Molla Pənah Vaqifin tərcümeyi-halına müraciət etməli.

# SABİT ŞƏQAQİ

Bu şairin dəxi Aciz, Qövsi, Nişat və qeyriləri kimi ismi və əsl-nəsəbi mə'lum deyil. "Sabit" şairin təxəllüsüdür. Anadan təvəllüd etdiyi məhəllin ismi də yəqin ki, Şəqaqdır ki, onunla müləqqəb olmuş – Şəqaqi adlanır. Çox ehtimal var ki, onun adı Mehdi olsun. Çünki aşağıda yazılan bir qafiyəsində Sabit əvəzinə Mehdi yazılmışdır[320]. Onun əsərlərindən Mirzə Yusif Qarabağinin məcmuəsinə daxil olan ancaq bir qəzəl ilə bir mürəbbeatıdır ki, hər ikisi burada dərc olunur.

Qəzəli-Sabit:

Ənbərin rayiheyi-türreyi-canan gətirir.
Lütf ilə badi-səba dərdimə dərman gətirir.

Deyirəm qasidə: get nameyi-cananı gətir,
O gedir sürət ilə qətlimə fərman gətirir.

Mən dedim nikhəti-zülfün gətir, ey badi-səba,
O gedir başıma sövdayi-pərişan gətirir.

Zülf düşgəc yüzünə didələrim əşk tökər,
Gün üzün əbr haçan bağlasa, baran gətirir.

Baxıb ol şiveyi-rəftarə, töküb qanlı yaşım,
Mən bilirdim ki, bu göz başıma çox qan gətirir.

Küfri-zülfün ürəfa rəxneyi-iman dedilər,
Bu necə küfrdü kim, hər görən iman gətirir?!

Mərdümi-didələrim hicr günü Nuhasa,
O qədər əşk tökər, axırı tufan gətirir.

Sabita, şükr elə, hər izzət üçün zillət var,
Deməıdin vəsl süruri qəmi-hicran gətirir?!

Qafiyə:

Bürci-nəhsə düşdü kövkəbi-bəxtim,
Fələk zülmü mənə nümayan oldu.
Zövrəqi-taleyim bəhri-ələmdə
Təlatümi-qəmdən binişan oldu.



Soldu gül, pozuldu gülşəni-aləm,
Şeyda bülbül nə'rə çəkər dəmadəm,
Fanusi-ifayə çünki düşdü şəm'
Pərvanə gör necə sərgərdan oldu.

Pəri,..fələk dad əlindən, dad,
Bir dəm eşq əhlini eyləmədin şad.
Bir Şirindən ötrü misali-Fərhad
Mehdi Bisütunda kuhkən oldu.

## RAFEİ

Bu şairin dəxi ismü nəsəbi və məhəllü məkanı mə'lum deyil. Şiveyi-lisanından Qafqaz əhli olduğu anlaşılır[321]. Vaqifin müasirlərindəndir. Mürəbbeatından birisi zeyldə yazılır:

Sən necə həmdəmsən ey badi-səba,
Nə müddətdir xəbərin yox halimdən?
Nuh kimi qərq oldum qəm girdabına,
Dərdməndəm, nolur tutsan əlimdən?

Əfsunçu kar etməz zülfün marına,
Cismim düşdü ənbər telin tarına,
Pərvanə tək yandım eşqin narına,
Bülbül təki əl üzmüşəm gülümdən.

Məndə xəyal vüsalına yetməkdir,
Sənin meylin qeyri həmdəm tutmaqdır,
Mən bülbüləm, işim fəran etməkdir,
Gəl yanıma, qaçma dərdi-dilimdən.

Yusifi Misirdə zindan öldürdü,
Züleyxanı dərdi-pünhan öldürdü,
Rafeini dərdi-hicran öldürdü,
Özün yetir, qurtargilən ölümdən[322].

Söz yoxdur ki, Rafeinin qəsdi bu şeirləri düzməkdən Molla Pənah Vaqifə və Molla Vəli Vidadiyə nəzirə yazmaq imiş və lakin onların kəlamları ilə Rafeinin şeirləri arasında təfavüt yerdən göyəcəndir:

Daneye-felfel siyaho xale-məhruyan siyah,
Hər do del suzənd, əmma in kocavo an koca[323].



## ƏBDÜRRƏHMAN AĞA DİLBAZ OĞLU "ŞAİR" TƏXƏLLÜS

Molla Pənah əsrinin möhtərəm şairlərindən birisi də Mərhum Əbdürrəhman ağa Dilbaz oğlu "Şair" təxəllüsdür ki, əslən Qazax mahalından Xanlıqlar qəryəsindəndir.

Bə'zi müfsidlərin – ki, Əbdürrəhman ağa ilə şəxsi ədavətləri var imiş, – şeytənəti ilə Gürcüstan hakimi İrakli şah şairdən bədgüman olur ki, guya Əbdürrəhman ağa Qazax mahalının Cavad xana tabe olmasına sə'y və kuşiş edir və Cavad xan ilə həmsirdir, onların mabeynində bir para siyasi və mühüm məsələlər barəsində məxfi göftügulər olunur. İrakli şahın qəzəbi cuşa gəlib şairin haqqında böyük zülm və siyasət edib gözlərini çıxartdırır.

Bilmək gərəkdir ki, Əbdürrəhman ağa ziyadə maddəli, fəsih və dilavər bir adam imiş ki, doğru söyləməkdən əsla ehtiyat və xövf etməz imiş və öz eli içində nüfuzlu və möhtərəm və sözü ötgün sayılırmış. Tamami hünər və sə'yini öz elinin və vətəndaşlarının xeyir və səlahı yolunda sərf edərmiş. Vəli mərhumun bədxahı və düşmənləri də çox imiş. Öz işi və səlahını unudub camaat dərdinə yanmaqdan axırı düşmənlərin hiylə və şərarəti ucundan çeşmi-cahanbinindən məhrum qalır.

Bəli, belə qədir və qiyməti bilinməyən millət bahadırlarının haqqında deyirlər ki: "El üçün ağlayan gözsüz qalar!"

Şairi-mərhum gözləri çıxarılandan sonra bu növhəni inşad etmişdir:

Mən qəribəm vətənimdə, qazılar,
İtirmişəm ağır ellər, ağlaram.
Könül həsrət qaldı, can intizarında,
Gözlərəm sübhü şam yollar, ağlaram.

Həşrə qaldı canda el intizarı,
Görərmola*, ya rəb, didar didarı?
Fikr edərəm hər dəm ol aşna, yarı,
Gözlərimdən axar sellər, ağlaram.

Eldən ayrı düşdüm, güzarişim yox,
Sığındım mövlaya, qeyri işim yox,
Munisim, qəmxarım, bir yoldaşım yox,
Sərimdə qovğalar, qallar, ağlaram.

* Görərmi ola – *red.*

Könlümüzdən gedib eşqü həvəslər,
Yığılsın bir yerə könlü şikəstlər,
Qohumdan, qardaşdan yad olan kəslər,
Dolanır bağrımda millər, ağlaram.

Şair, həqdən gərək insana dövlət,
Getməyə üstündən sayeyi-rif'ət,
Xudadan gər bizə olmasa şəfqət,
Aylar ilə gülsəm, illər ağlaram.

Mərhum Əbdürrəhman ağanın əsərlərindən ən əhəmiyyətlisi Gəncə xanı Cavad zan Ziyadoğlunun rus qoşunu ilə 1804-cü səneyi-miladidə etdiyi cəngin və xani-mərhumun göstərdiyi rəşadət və hünərin və filcümlə, onun sərgüzəştinin barəsində yazdığı müxəmməsdir ki, məəttəəssüf, cümləsini burada zikr etmək, bə'zi səbəblərə görə, mümkün olmadı.

Müxəmməsi-Əbdürrəhman ağa Şair dər həqiqi-Cavad xan Ziyadxanov:

Bir rəvayət söylə, ey dil, çərxi-kəcrəftardan,
Ta əbəd ruzi-əzəl bədmehrü bədgirdardan,
Çərxi zalim, dəhri-dun, sahibxəta, biardən –
Kim, Yezidin izzətin gör şahi-diləfkardən,
Gör Cavad xan macərasın möhnəti-məkkardən.

Böylədir dövran, əzəl insanə al eylər cahan,
Bir zaman xürrəm qılır, bir dəm məlal eylər cahan,
Şah ola, istər gəda, aşüftəhal eylər cahan,
Aqibət bir gün gedər himmət, halal eylər cahan,
Naxudanı qərq edər ol kəştiyi-pürbardən.

Hər zaman dövran salıbdır canı canandan cüda,
Adəmi Həvvadan ayrı, baği-rizvandan cüda,
Xatəmi saldı fələk cahi-Süleymandan cüda,
Ah kim, düşdü bu gün dövran Cavad xandan cüda,
Əskik olmaz zari-bülbül, söhbəti-gül xardən.

Şahnamə şərh edən yox ol Cavad xan vəsfini,
Mədəni-cüdu səxavət, ədli-divan vəsfini,
Bilmiş Əflatun səharin əhli-meydan vəsfini,
Hikməti-Loğmandan artıq dərdə dərman vəsfini,
Bir müxəmməs nəzm ilə inşa qılım əş'ardən.

Gəncə şəhrində Cavad xan kim, nə əyyam var idi,
Sahibi-lütfü ədalət, sadiqül-iqrar idi,
Hər işin fe'lində mahir, aqilü huşyar idi,
Müxtəsər, aləmara pürimtəhan sərdar idi,
Gör nələr çəkdi qəzadən, dövri-bədətvardən.



Düşdü davası əzəldən ol Şəki, Şirvan ilə,
İbrahim xan ittifaq oldu ol Ümmə xan ilə,
Gəldi ləşkər üstünə ol cümlə Dağıstan ilə,
Onlar ilə qıldı dava sərbəsər meydan ilə,
Çəkmədi hərgiz zərər bir fitneyi-əğyardən.

Bir də ondan sonra gəldi valiyi-Baqratyan*,
Yığdı Gürcüstan tamamən ləşkərin tavadiyan,
Neçə illər qıldı dava, çəkmədi ondan ziyan,
Vali köçdü çün fənadan, etdi tərk axır cahan,
Gör nə sadir oldu Gurgin xan** kimi əğyardən?!

Padşahi-rusun axır ərz edib əhzarına,
Baxdı ol Gurgin xanın dəftərü tumarına,
Əmr qıldı bir "şpexdor"*** nam olan sərdarına:
Gəncənin al qəl'əsin, fərman buyur əğyarına,
Üstünə gəldi hezaran saldat xunxardən.

Ol Cavad xan vəsfini necə qələm şərh eyləsin?
Şərhə sığmaz, vəsfi-halın necə dillər söyləsin?
Bir belə sərdarü qazi kim görübdür böyləsin?
Düşdü davasın onun kari-qəzadan, neyləsin,
Padşahi-rusi-sahibtac ilən tumardən?

Çəkdi bir il ol Cavad xan eylədi cəngü cidal
Gah sülh etdi arada, gah qıldı rəngi-al,
Gördü kim, olmadı axır, artdı fitnə, qilü qal,
Gəlmədi imdadə, hərçənd eylədi yüz ərzi-hal,
Fətəli şah, sahibi-İran olan xunkardən.

Yığdı ləşkər, girdi meydanə, ədavət qıldılar,
Qırdılar ədayi ol dəmdə fərağət qıldılar,
Xub döyüşdü Gəncə xəlqi, bir rəşadət qıldılar,
Həqq yolunda bə'zi kəs ol dəm şəhadət qıldılar,
Döndü geri, girdilər ol qələyə naçardən.

* Gürcü şahlarının əsil və nəsəbi "Bağrat" adlı məşhur və cəsur bir Kaxet knyazından olmağa görə, onlara "baqratid" və yaxud "baqratyan" deyilir. Burada zikr olunan vali Gürcüstan padşahı İrakliyi-dövvümdən ibarətdir ki, Cavad xan ilə onun mabeynində qədimdən ədavət var imiş.

** Gurgin xan (Qeorqiy) - İrakli şahın oğludur ki, atasının vəfatından sonra onun yerində canişin olub, bir neçə müddət padşahlıq elədi və axırda 1801-ci sənədə rus təbəiyyətini qəbul etdi.

*** İnspektor Sisianovdan ibarətdir

Ərmənistan gördü rusi döndü bir dəm hər nə var,
Şəmsəddinli xəlqi əzəldən çıxıb getdi kənar,
Neyləsin, tənha qalıb ol dəm Cavad xan dilfikar,
Qələni qıldı mühəyya onda möhkəm, üstü var,
Keçdi ol dəm zövqi-dünya, mülki gəncü vardən.

Ta bir ay qırx gün keçincə onda möhkəm durdular,
Sübhü şam dava qılıb kəffara tiği urdular,
Ləşkərani-rusi hər dəm bişümaran qırdılar,
Döndü Şəmkir xəlqi onda rusa iqrar vırdılar,
Ey dəriğa, çərx saldı qəl'əsin pürkardən.

Bir gecə yol buldular, rusilər aşdı qəl'ədən,
Su yerinə ol zaman qanlar axırdı qəl'ədən,
Ol Uğurlu xan ilə xanlar ki, qaçdı qəl'ədən,
Xan görüb onlar salamət çıxdı, keçdi qəl'ədən,
Bildi ayrı düşdigin fərzəndi-xoş dildardən.

Keçdi onlar qəl'ədən, sağü səlamət getdilər,
Çəkdilər hərçənd yüz cövrü məlamət, getdilər,
Çıxdular rusun içindən bir əlamət getdilər,
Üz tutub İran deyü şahi-vilayət getdilər,
İstədi həqdən mədəd, ol Heydəri-Kərrardən.

Qaldı tənha ol Cavad xan, gör necə ad eylədi,
Urdi tiğin sərbəsər kəffarə, bidad eylədi,
İki bürcin soldatın çox qırdı, bərbad eylədi,
Əhli-beytin möhnətin ol dəmdə kim, yad eylədi;
Ya İlahi, saxla sən, çox intizarəm yardən.

Sinəsindən urdılar, olmuşdi ol dəm biqərar,
Bir yanar əl kimsəni ol dəmdə qıldı xaksar,
Yerbəyer həmlə edib, tiğ urdular məcruhü zar,
Yadına düşdi o dəm şahi-Hüseyni-dilfikar,
İstədi feyzi-şəhadət hakimi-Cəbbardən.

Kimləri dövranda beş gün bərqərar etmiş fələk,
Kərbəla dəştində şahi dilfikar etmiş fələk,
Ol Cavad xanı ki, sahib-intizar etmiş fələk,
Ol Hüseynqulu ağanı xaksar etmiş fələk,
Ayinə tək jəng olub gül çöhrəsi xunbardən.

Bunların bildi mələklər həqq ilən ixlasını,
Ərş üzündə ah-vay ilə tutarlar yasını,
İstədi gərdun necə bu çərxi bipərvasını,
Görmiyən görsün buni ol Kərbəla qovqasını,
Bu müsibət məhşər oldi Kərbəla asardən.



Ol Hüseynqulu ağa kim, gəldi xanın yanına,
Layiq idi hər hünərlər şövkətinə, şanına,
İstədi qanın qata ol dəmdə xanın qanına,
Qoymadı xan, göndərib bir qeyri bürc meydanına,
Yə'ni onun vəhşətin mən görməyim didardən.

Qəl'əsin sandı Cavad xan ol zaman viranədən,
Çox çalışdı ta ölüncə dərdinə dərmanədən,
Feyzi-həqdən ta yetincə rəhməti-qüfranədən,
Çıxdı ruhu ol bədəndən, rövzeyi-rizvanədən,
Ey xoşa, buldu şəhadət vahidül-qəhhardən.

Həm Hüseynqulu ağa buldu şəhadət novcəvan,
Xəlq ara bu cümlə möhnətdən yaman oldu, yaman,
Anası ahlar çəkib, şaxsey deyib eylər fəğan,
Üz tutub ol bargahə əlvida eylər aman:
Binəva düşdüm cüda fərzəndi-gülruxsardən.

Gəncəli xalqı şəhadət qıldı həqqa canfəda,
Kimi məzlum, kimi azadə qalıb əndərbəla,
Hər biri bir növ' ilə yüz dərdə oldu mübtəla,
Yadına gəlməz məgər məzlumi-dəşti-Kərbəla,
Ey utanmaz çərxi-zalim, Əhmədi-Muxtardən?

Min iki yüz daxi on səkkizdə tarixi-zaman –
Kim, şəhid oldu Cavad xan, çıxdı əzdari-cahan,
Çox pərişan oldu halı Gəncənin həddən yaman,
Gəl yetiş imdadə, ya həq, Mehdiyi-sahibzəman,
İnciməzmi xatirin bu dərdü ahü zardən?!

Bu müxəmməsin bir neçə bəndləri dəxi vardır ki, fövqdə zikr olunduğu üzrə onların burada yazılması münasib görülmədi. Cavad xanın və oğlu Hüseynqulu ağanın şəhadəti vaqe olubdur hicrətin 1218-ci tarixində ki, miladın 1804-cü ilinə mütabiqdir.

Mərhum Cavad xan ziyadə qəyur və cəsur və sahibi-əql və tədbir bir hakim olduğu təvarixdə yazılmışdır. Şəhadəti zamanı sinni əlliyə kimi var imiş.

Mə'lum ola ki, rus qoşunu əvvəlinci dəfə İran sərhəddinə qədəmgüzar olduqda Cavad xan dava və şavasız onun Gəncəyə daxil olmasına yol verib və rus dövlətinə öz təbəiyyət və ixlasını izhar edibdir.

Kovalenski – ki, rus dövləti tərəfindən Gürcüstanın ümuri-xariciyyəsinə nazir tə'yin olunmuşdu, – yazır ki, hamıdan əvvəl onun yanına elçi göndərib, onu təbrik edən və rus imperatoruna ixlas və sədaqətini izhar qılan Cavad xan olubdur.

Əgərçi Abbas Mirzə öz qoşunu ilə Gəncə sərhəddinə yavuqlaşanda Cavad xan onun tərəfinə bir növ meyl edibdir, vəli Kovalenskinin yazmağına görə, bu meyl və rəğbət zahiri bir politika imiş. Batinən və qəlbən onun meyli rus dövlətinə imiş və Gürcüstan ilə xanın mabeynində vüqua gələn bə'zi inqilab və şurişləri, xüsusən, Şəmsəddin məsələsini qət və həll etmək üçün xani-mərhum İran dövlətinə rücu etməyib rus dövlətinin vasitəsilə dəstaviz edirmiş. Və lakin knyaz Sisianov Qafqaza rəis və inspektor tə'yin olunub gələn günündən Zaqafqaziyada hökumət edən xanlar ilə, xüsusən, mərhum Cavad xan ilə artıq dərəcədə dürüştlük və sərtlik ilə başlayıbdır rəftar və müamilə etməyə. Qafqaz arxoqrafiçeski komisssiyası cəm və tərtib etdiyi aktlardan – ki, bir neçəsini bəndeyi-həqir türk lisanına tərcümə edibdir, – mə'lum olur ki, Cavad xanın rus qoşunu ilə əslən və qətən dava etmək fikri yox imiş. Onu davaya məcbur qılan knyaz Sisianovun ağır təklifləri, xüşunət və dürüştlüyü və bə'zi ittifaqlarda nalayiq föhşləri olubdur*.

* Bax: "Акты Кавказской Археографической Комиссии"[324].



## MUSTAFA AĞA "ARİF" TƏXƏLLÜS

Mustafa ağa təvəllüd edibdir Qazax mahalının Şıxlı adlanan qəryəsində hicrətin 1188-ci[325] ilində. Bir rəvayətə görə, Ağakazım ağa Salikin – ki, xoştəb' bir şair imiş və tərcümeyi-halı aşağıda zikr olunacaqdır, – böyük qardaşı imiş. Amma bir qövl də budur ki, Mustafa ağa Salikin əmizadəsidir. Qazi Səidəddin əfəndinin deməyinə görə, səhih əvvəlki qövldür.

Mərhum Mustafa ağa fars, türk və hətta rus lisanlarını yaxşı bilirmiş, özü də ziyadə dindar, qeyrətkeş və həqiqətdə arif və dana bir şəxs imiş. Vəli bu biçarə dəxi öz qeyrət və millətpərəstliyi ucundan çox bəlalar və müsibətlərə düçar olubdur. Belə ki, mərhum Mustafa ağa Şəmsəddinli Nəsib Sultan ilə dövlət nəzərində müttəhəm olub, zəval təriqi ilə Rusiyaya göndərilir və orada Kazan və bir rəvayətə görə, Xarkov şəhərində sakin olurmuş*.

Binəva Arif Rusiyada çox üsrət və zillət çəkir və axırda vətənimə'lufunun fərağına, dost və əqrəbanın hicranına və düşmənlərin tə'n və şəmatətinə tab gətirə bilməyib, orada vəfat edir. Odur ki, Salik onun şə'nində demişdir:

Biri Arif, kona cövr etdi dövran –
Ki, qürbətdə şəhidü mübtəladır.

Arif Rusiyada məhbusvar zindəganlıq edən vaxtı öz hali-dilini bir neçə şeirlər vasitəsilə yazıb bəyan etmişdir ki, zeyldə dərc olunur:

Fikr elərəm, bir-bir düşər yadıma,
Yarü həmdəm, dost, yaranlar, ağlaram.
Dolar gözlərim əşki-al ilə[326],
Gözlərimdən axar qanlar, ağlaram!

Saldı məni fələk işə bisəbəb,
Sən eylə bir əlac, ya qadir çələb,
Anıb yarü həmdəmləri ruzü şəb,
Gah aşikar, gah nihanlar ağlaram!

* Bir rəvayət də Mustafa ağanın mənfiyyül-vətən olmaq babında budur ki, Rusiya dövləti bu tərəfləri zəbt edəndən sonra şayəd əhali ona tabe olmayıb, dönüklük başlar deyə bətəriqi-əmanət hər mahalın rəis və pişvasını Rusiyanın daxili yerlərinə sürgün edərmiş. O zümrədən Mustafa ağa Arifi də göndəribmiş.

Namə yazdım yarə badi-səbadən,
Dərdi-dilim izhar etdim həvadən,
Düşmüşəm avarə eldən-obadən,
İtirmişəm xanimanlar, ağlaram!

Vədə keçdi, günlərimi sanaram,
Aylar, illər hesabına qanaram,
Hər zaman yadıma düşər, yanaram,
O dövranlar, o zamanlar, ağlaram!

Görüm dönsün belə dövran, zamanlar,
Tərk eləyib bağlarını bağbanlar,
Xəzan deyib, solub gülü reyhanlar,
Saralıbdır gülüstanlar, ağlaram!

Seyr eləyib gəzib getdiyim yerlər,
Ovlağından keçib ötdüyüm yerlər,
Tərlan ilə şikar etdiyim yerlər,
Yadə düşər o məkanlar, ağlaram!

Sərçeşməli, nilufərli bulaqlar,
Süsənli, sünbülli, laləli dağlar,
Dumanlı, çiskinli, qarlı yaylaqlar,
Hanı bizim o meydanlar, ağlaram!

Ellərimiz vardı bəyli-paşalı,
Dağlarımız vardı əlvan meşəli,
Süsənli, sünbüllü, tər bənəfşəli,
Qaldı bağlar, xiyabanlar, ağlaram!

Bilməm noldu bizim Qazax, Şəmsəddin,
Gəlmədi onlardan bir xəbər yəqin,
Qəzayi-ilahi bu imiş həmin,
Getdi əldən o dövranlar, ağlaram!

Dad eylərəm, yetən yoxdur fəryada,
Dərdim olur gündən-günə ziyada,
Ağlaram hər zaman düşəndə yada –
Bizim Qazax-Qaramanlar, ağlaram*.

* Bə'zi rəvayətə görə, Qazax mahalında əvvəlcə yurd və bina salan iki qardaş olublar. Onlardan birinin adı Qazax, o birisinin adı Qaraman, yaxud Qəhrəman imiş. O cəhətə Qazax mahalına Qazax Qaraman deyirlər. Mahalın qərb səmtini tutan Qazax, şərqi-cənubunu tutan Qaraman olubdur.



Qaldı paydar Borçalının bəyləri,
Meydan günü bir-birindən yegləri,
Mehman qarşısına mərd gəlməkləri,
Yadıma düşəndə onlar, ağlaram!

Hanı Qazax? Mehribanlıq gedibdir,
Ağalıq, sultanlıq, xanlıq gedibdir,
Nücəbadan alişanlıq gedibdir,
İtibdir şövkətü şanlar, ağlaram!

Alovlanır, yanır bağrım, sökülür,
Axar gözlərimdən qanlar tökülür,
Düşəndə yadıma qəddim bükülür –
Boyu sərvi-xuramanlar, ağlaram!

Diyari-qürbətdə gözlərim giryan,
Xatirim şikəstə, könlüm pərişan,
Gələr xəyalıma düşər nagəhan –
O gördüyüm novcavanlar, ağlaram!

Bülbülümü qaçırmışam əlimdən,
Ayrılmışam gülşənimdən, gülümdən,
Cüda düşüb ulusumdan, elimdən,
İtirmişəm dudmanlar, ağlaram!

Qərq olur kəştilər əşkim selində,
Yaşılbaşlar oynar çeşmim gölündə,
Əsir oldum bəni-əsfər əlində,
Ağlaram, ey müsəlmanlar, ağlaram!

Hər kimdə ki, namus olur, ar olur,
Əhdü iqrarında bərqərar olur,
Yaxşı yoldaş yaman gündə var olur,
Yaman yoldaş ötər yanlar, ağlaram!

Bu dəmlərdə getmək əgər olmasa,
Vətən sarı əzmi-səfər olmasa,
Arifə bir yaxşı xəbər olmasa,
Gör eylərəm nə tufanlar, ağlaram!

Könlüm qalıb əhli-tufan içində,
Dolanır sərgərdan heyran içində,
Qorxuram ki, ölüm küfran içində,
Bada gedə din-imanlar, ağlaram!

Bu şeirlər dəruni-qəlbdən çıxan atəşli və suzişli nalə və fəryadlardır ki, onları mütaliə edənlərin də bilaixtiyar gözlərindən qanlı yaş tökülür, şair ilə bahəm ağlayırlar. Vətənə məhəbbəti ucundan vətəndən ayrı düşən və əcnəbi ölkələrdə əsir və müztərr qalan biçarə Arif əvvəlcə öz dost və yaranlarını və mehriban həmdəmlərini yada salıb, didələrin əşki-al ilə doldurur və başqa bir qasid bulmayıb badi-səbadan onlara dərdi-dilini və məxfi sirlərini izhar qılıb göndərir.

Şair qürbətdə aylarını və günlərini sanayıb hesab edir ki, onun xilas zamanı nə vaxtı yetişəcəkdir. Sonradan şair dost və aşinaları ilə xoş keçirdiyi zaman və məkanları, yə'ni tərlan ilə şikar etdiyi ovlaqları, sərin və nilufərli bulaqları, süsənli və çiçəkli yaylaqları, dumanlı və çiskinli dağları, vüs'ətli və səfalı meydanları göz yaşı ilə xatirinə gətirib deyir: Axır bizim də bəyli-paşalı ellərimiz, gözəl meşələrimiz, sünbüllü və tər bənəfşəli çəmənlərimiz, bülbüllü və güllü bağlarımız və xiyabanlarımız var idi. İndi onlar necə oldu? Ya qismət, bir də şair o gözəl məkanları görüb ziyarət edəcəkdirmi və onların basəfa və ruhəfza havası ilə ürəyini təzələndirəcəkdirmi?

Sonradan şair öz-özünə sual verib deyir: Ya rəb, mənim dadıma və harayıma yetişən olacaqdırmı? Nə iş vaqe oldu ki, Qazax, Şəmsəddinlidən bir xəbər və əsər gəlmədi? Yoxsa təqdiri-rəbbani belə imiş ki, mən biçarə gərək bəni-əsfər əlində qürbətdə canımı can yaradana təslim edəm?! Arif öz ölümündən xövf və hərasət etmir. Onun əndişə və xövfü din və imanın əcnəbilər içində bada getməsindəndir. Və bu fikir və əndişədə olduqda hali-dili və ənduhi-binəhayəsini elə bir cigərsuz şeirlər ilə izhar edir ki, oxucuların da cigərinə od salıb yandırır:

Alovlanır, yanır bağrım, sökülür,
Axar gözlərimdən qanlar tökülür,
Düşəndə yadıma qəddim bükülür –
Boyu sərvi-xuramanlar, ağlaram!

Mustafa ağanın təb'i də əmizadəsi və ya qardaşı Salikin təb'i kimi rəvan və salim olduğu bir çox əş'arından görünür. Yazdığı şeirlərin əksəri açıq və sadə türk dilindədir. Məsələn, Salikə Rusiyadan yazdığı bir naməyə diqqət yetirməli:

Can zarü tə'nim nizar* sənsiz,
Ömrüm başa yetdi, yar, sənsiz.

* **Nizar** – zəif və lağər deməkdir



Fəryad ki, dövri-namüvafiq
Qoydu məni, ey nigar, sənsiz!

Dil qönçəsi qan olub, açılmaz,
Yüz min gər ola bahar, sənsiz.

Rəngim güli-zəfəranə dönmüş,
Dil qəmdən olub fikar, sənsiz.

Yox məndə qərarü tabü taqət,
Tab etmək olurmu, yar, sənsiz?!

Ey gül, gecə-gündüz Arif ağlar,
Bülbül kimi zar-zar sənsiz.

Mə'lum ola ki, Mustafa ağa bu şeirləri Kazım ağanın zeyldə dərc olunan məktublarına cavab yazmışdır.

Salikin Arifə yazdığı məktublar:

**I**

Dərdim ki, olub ziyadə sənsiz,
Canım üzülür məbadə sənsiz.

Şaha, gələ gör ki, ferz könlüm
Cəngində olub piyadə sənsiz.

Canım çıxar oldu həsrətindən,
Ömrüm gedər oldu badə sənsiz.

Saqi, yetə gör ki, bəzmi-qəmdə
Qan oldu qədəhdə badə sənsiz.

Çəkmiş həvəsin şikəstə Salik,
Nə qövmə baxar, nə yadə sənsiz.

**II**

Gəlməz ələmim hesabə sənsiz,
Sığmaz süxənim kitabə sənsiz.

Mürği-könülüm çıxıb tə'nimdən,
Qılmış vətənin xərabə sənsiz.

Hicranın odunda, ey dilaram,
Dönmüş cigərim kəbabə sənsiz.

Xəlqə görünür vücudim, əmma
Bənzər bədənim sərabə* sənsiz.

Seylabi-bəladə səng könlüm,
Gəl gör ki, dönüb hübabə sənsiz.

Kəsmiş təməin şikəstə Salik,
Nə ianə baxar, nə abə sənsiz.

Bu məktubların hər ikisi həqiqi hiss ilə yazılmış suzişli və müəssir kəlamlardır ki, oxuyanlara hüzn və pərişanlıq yetirir. Yenə mərhum Arif Rusiyadan oğlu Əliağaya təhsili-ülum babında yazmışdır:

Olma tarik dərsdən, ey nuri-cananım Əli!
Pəndimi eylə qəbul, ey xanü xaqanım Əli!

Var ümidim etməyə zaye' əfəndi sə'yini,
Qoymaya dərsində bir kəm-kəsr Osmanım**, Əli!

Mən səninçün eylərəm xeyir-dualər ruzü şəb,
Saxlasın hifzü himayətində sübhanım Əli!

Payimal etsin ədüvvü hasidin lütfi-ilah***
Hər zaman qəmxarın olsun şiri-yəzdanım Əli!

Gərçi, ey dil, mən Əbubəkrü Ömər, Osmaniyəm,
Həqq imamımdır mənim ol şiri-mərdanım Əli!

Könlümün şəhrin fəraqü həsrətin qılmış xərab,
Bir üzün görsəm olur abad viranım, Əli!

Olsun, Arif, həşrdə əvvəl şəf'iin Mustafa,
Sonra Bubəkrü Ömər, Osmanü aslanım Əli!

---

* Sərab – isti günlərdə bərrü biyabanlarda gündüz su kimi görünən buxar. Burada vücudun nəhif olmasına işarədir.

** Molla Vəli Vidadinin oğlu mərhum Osman əfəndiyə işarədir ki, onun alim və fazil bir şəxs olduğu yuxarıda zikr olundu.

*** Bu beytin əvvəlinci misrasında "lütfi-ilah" əvəzində "qəhri-xuda" yazılsa, daha da münasib və məzmunu düzgün olardı.



# KAZIM AĞA "SALİK" TƏXƏLLÜS

Molla Pənah Vaqifdən sonra mərhum Kazım ağa Salik nəinki vahid Qazax mahalında, bəlkə tamami Zaqafqaziyada zühur edən şüəranın müqtədirlərindən birisi hesab olunur. Bu anacan millətimiz içində onun şöhrət və hörmət kəsb etmədiyinə ümdə səbəb asarının mürəttəb bir qayda üzrə təb' və nəşr olmadığıdır. Bu kəme'tinalıq və qədirbilməməzlik tək bir Saliki-mərhumun haqqında olmayıb, çox şüəra və üdəbamızın halına şamildir.

Çox mə'rifət və kamal sahiblərinin ism və əsərlərindən bir əlamət qalmayıbdır. Kazım ağa Salik təvəllüd edibdir Şıxlı qəryəsində 1195 (1781)-ci tarixdə. Tə'lim və tərbiyəsi öz vətənində olubdur. Vəli onun əsil və nəsəbi Şəmkirdəndir.

Anası Dilbaz nücəbalarındandır. Salikin babalarına Şıxzadə deyirlərmiş ki, sabiqdə Qazaxlı qəryəsində sakin olurlarmış. Sonraları Kazım ağanın babalarından birisi Kür çayının yaxasında Şıxlı qəryəsini bina etdiribdir və şair – necə ki, fövqdə zikr olundu, – haman qəryədə vücuda gəlibdir.

Bu halda Şıxlinskilərin bir parası Qazaxlıda və bə'ziləri Şıxlı kəndində sakindirlər. Öz əsil və nəsəbi barəsində şair Tuba adında bir sevgilisinin mədhində yazdığı şeirdə deyibdir:

Zəhi Tuba ki, xurşidə xəcalət göstərir hərgah
Niqabın salsa ruyindən, başından həm sərəndazi.

Nə mətləb istər idim, hasil olurdu o dilbərdən,
Xudavəndə, kəm etmə el içindən ol mühümsazi.

Adım Kazım, vəli "Salik" ləqəb şe'rdə məşhurəm –
Ki, övtanım kənari-Kür, şikargahım Qarayazi.

Binayi-bixi-nəxli-əslimiz Şəmkirdir əmma,
Vəli tifli-vücudumdur məkidə şiri-Dilbazi.

Şeyxzadə deyərlər bizlərə, gəlmiş Qazaxlıdan,
Şıxlı qəryəmizdir, həm biziz ol qəryə e'zazi.

Vəli min iki yüz qırx dördə gəldi tarixi-hicri[327] –
Ki, üç yüzdən keçibdir nəslimiz, odur çoxu azi.

Sənə, Salik, nə xidmət hasil oldusa o dilbərdən,
Yəqinimdir ki, hərgiz etmədin təxirü iğmazi.

Kazım ağa ziyadə qabil, fəhmi iti və zehni güşadə bir vücud imiş ki, hər şeyin əsil və mahiyyətini bilmək onun cibilli xasiyyətindən imiş. Şairin öz vaxtına görə yaxşı elmi var imiş. Türk dilini bildiyi kimi, fars dilini də mükəmməl bilirmiş və o dildə abdar şeir və qəzəlləri mövcuddur.

Türk dilində yazdığı əsərlərin cümləsi nəzm ilədir. Şeiri və qəzəlləri mövzundur. Salik dünyada altmış bir sənə ömr edibdir. Tarixi-vəfatı qəbir daşı üstündə yazılıbdır; 1258 (1842)-ci sənədə dari-bəqaya rehlət edibdir.

Rus şairələrindən Puşkin və Lermantovun[328] müassiri imiş.

Əhibbalarından knyaz Palandova – ki, o vaxtı Qazax mahalının hakimi imiş, – yazdığı bir kəlamında şüərayi-Azərbaycandan bə'zilərini belə tə'rif və tövsif qılmışdır:

Sənə daim işim xeyir-duadır,
Əgərçi saxlayan xəlqi xudadır.

Dəmadəm bülbüli-təbim sədası
Səhərgahan sənə mədhü sənadır.

Oxu şe'rimi, ey Məxdumzadə,
Bilirsən ancaq ixlasım sanadır.

Xudavəndə, Palandovun səxasın
Füzun et kim, mənim dəstim onadır.

Ədalət, həm hidayət ver ona, çün –
Ki, məlcəi-məsakinü gədadır.

Qamu aləm bulub ondan məramın,
Nə tənha şəfqəti ancaq manadır.

Kəmalü rif'əti-Şirvan mə'lum,
Maarif mə'dəni xaki-Qubadır.

Neçə əhli-bəlağət var onda,
Biri Ağabəyü Mirzə Babadır[329].

Biri "Qüdsi" ləqəb Abbasqulu bəy,
Diyari-nəzmü şe'rə padişadır.

Qazax içrə olub şairlər, əmma
Əsami onların biintəhadır.

Biri Vaqif ki, məşhuri-xəlayiq,
Gözəl mədhində mə'lumi-şümadır.



Biri xəstə Vidadi, təb'i mövzun –
Ki, bəhri-nəzmü şe'ri cabəcadır.

İlahi, ol iki məğmun pirin
Günahi dərdinə səndən dəvadır.

Biri "Şair" ləqəb məzlum şair,
Xədimi-padişahi-Kərbəladır.

Biri Arif, kona cövr etdi dövran –
Ki, qürbətdə şəhidü mübtəladır.

Xudavənda, qulundur Əbdürrəhman,
Tərəhhüm qıl biri çün Mustafadır.

Məhali-Borçalıdan şair olmaz,
Çıxan bir Şəmsəddinlidən Cəladır.

Bunun tək Qələlidən gəldi Rizvan,
Kəlamü nüsxəsi behcətnümadır.

Biri Sadiq, biri Kazım, xülasə;
Olanın ismi ismi-övliyadır*.

İki dostun arasında ədavət
Büruz etmək nə rəsmi-aşinadır?

Əbubəkrü Ömər, Osman came,
Dəxi püştü pənahım Mürtəzadır.

Qəzəl söylə ki, olsun yadigarın,
Qəzəl şərh et ki, bu dünya fənadır.

Gəl əl çək, Salika, hərcayi sözdən,
Deyərlər ki, sənə bəy bihəyadır.

Sənə layiq deyil bihudə sözlər,
Sənin təb'in ki, bundan masəvadır.

Kazım ağanın bu kəlamı onun gözəl kəlamlarından birisi olub, məzmunca dəxi bunun bir çox sair əsərlərinə tərcihi vardır. Şair öz əsrinin üdəba və şüərasını kəmali-ehtiram ilə yad edib, hər birisini özünəməxsus

* Tiflis şəhərində Qalalı məhəlləsindən zühur edən şüəranın – ki, ibarət ola Rizvan, Sadiq və Kazımdan, – asar və əş'arından, hərçənd cüstücu etdiksə də, bir nişan tapa bilmədik.

zikr qılır, mərhum Abbasqulu ağa Bakıxanovu diyari-nəzm və şeirə padşah bilir:

Biri "Qüdsi" ləqəb Abbasqulu bəy,
Diyari-nəzmü şe'rə padişadır.

Kəlamın axırında, səbəb nə olubsa, Kazım ağa tövsəni-təb'inin başından cilovu çıxarıb, bir neçə namünasib sözlər söyləyibdir ki, onların məcmuəmizə sığınacağı yoxdur. Şair özü də filfövr peşman olub deyir:

Gəl əl çək, Salika, hərcayi sözdən,
Deyərlər ki, sənə bəy bihəyadır.

Sənə layiq deyil bihudə sözlər,
Sənin təb'in ki, bundan masəvadır.

Knyaz Palandov, Salikin yazmağına görə, bir mürüvvətli və adil divanbəyi imiş ki, onun aqilanə tədbir və binagüzarlığı ilə xeyli bəd və bihesab işlər qət olunub, camaat əmnü asayiş üzrə dolanarmış. Necə ki, şair onun haqqında deyibdir:

Beborid paye-dozdi dər vadiyi-şərarət,
Xun miçekənd dəmadəm əz xəncəre-ədalət[330].

Salikin başqa bir kəlamından belə anlaşılır ki, o vaxtlarda oğurluq, yol kəsməklik və çapovul həddən aşıbmış. Qazax mahalında doğruluq və düzlük bilmərrə yox imiş və oğruların ədədi o qədər çox imiş ki, ölünün kəfənini soyarlarmış. Necə ki, şairin sözü buna dəlalət edir:

Ze besyare-dozdiyee-kəce-rahzən
Ke, bordənd nagəh ze morde kəfən[331].

Bu şuluqluq vaxtları Qasım bəy Zakir Qarabağinin oğrulardan şikayət etdiyi zamana təsadüf edir. Belə ki, Zakir də oğrulardan şikayət edib deyir:

Qarabağda nə day qaldı, nə dana,
Bu gün, sabah hərə qaçar bir yana...

Salikin hər qisim kəlamları vardır. Cümləsi təbii hissiyyatdan doğub zühura gələn kəlamlardır. Onlardan öz vətənimizin, millətimizin və lisanımızın gözəl və canbəsləyən rayihəsi hiss olunur.

Salikin mürəbbeat növündə yazılmış şeirləri lətafət və sadəlikdə Vaqifin və Vidadinin qafiyələrindən əskik deyil. Gözəl vəsfində olan qafiyələrindən bir neçəsi burada nümunə üçün yazılır:



Ey şahin cilvəlim, şunqar şivəlim,
Durna tək tellərin cığalanıbdır.
Xəstə könlüm onu görəndən bəri,
Çıxıb asimana, havalanıbdır.

Ey ləbləri nabat, dəhanı püstə,
Çəkər həsrətini bu dili-xəstə,
Xal deyil görünən ağ sinən üstə,
Bir Qur'an hərfidir, qaralanıbdır.

Deme ki, sevdiyim səni nihandır,
Sənə aşiqliyim xəlqə ayandır,
Deyibsən: busəmin qiyməti candır,
Almaq üçün bir az bahalanıbdır.

Çox da məndən kənar gəzmə, ay pəri,
Sənsən könlüm zövqi, dilim əzbəri,
Guşeyi-kuyini bulandan bəri,
Dərdi-bidərmanım dəvalanıbdır.

Məclislər zivəri gördüyün Salik,
Xaqani, Ənvəri[332] gördüyün Salik,
Şairlər sərvəri gördüyün Salik –
Gəl gör sənsiz necə gədalanıbdır.

Tuba vəsfində:

Ey Tuba, baxışın yıxdı aləmi,
Xumar gözün yenə qiyamət eylər.
Kəbeyi-kuyini görən kimsənə,
Haşa ki, qibləyə ziyarət eylər.

Qırqı başlı, topğun, tərlan cilvəli,
Görməmişəm sən tək nazü qəmzəli,
Sərasər yaxası qızıl düyməli,
Baxdıqca üzünə fəxarət eylər.

Zahid baxsa zülfi-pərişanına,
Tərk edər məscidi, gələr yanına,
Sidqi-dildən canın qatar canına,
Huriyü qılmana məlamət eylər.

Hər kimsə ki, sənə baxarsa gendən,
Bil ki, öyrənibdir o halı məndən,
Özgə təvəqqeyim yox əsla səndən,
Xəstə Salik sənə zarafət eylər.

Bu qafiyələrdə şair gözəl istiarat və təşbihat ilə – ki, məhz türk lisanına məxsusdur, – öz sevgilisi Tubayi-dilfəribi mədh edib, axiri-kəlamda ona güstahlıq ilə deyir ki, sözlərimdən incimə. Özgə təvəqqe və iltimasım yoxdur, ancaq xəstə Salik səninlə zarafat eləyir.

Tubanı bu qisim istiraət ilə şair vəsf qılır: "topğun, tərlan cilvəli", "durna telli", "qırğı başlı", "nazü qəmzəli", "yaxası qızıl düyməli". Söz yoxdur ki, bu sifətlər ilə müttəsif olan dilbər "baxdıqca özünə fəxarət eylər".

Pərizad mədhində demişdir:

Ey pərizad, nədir yenə qaşların
Əyilib ucları, yayə dönübdür?!
Ay qabağın şö'lə verir gün kimi,
Yanaqların bədr ayə dönübdür?!

Kəmər kimi sarmaşaydım belinə,
Hənə kimi üz sürtəydim əlinə,
Məgər nabat tökülübdür dilinə,
Dodaqların tər halvayə dönübdür?!

Sallananda sanasan ki, xan gəlir,
Ayinə əndamlı alişan gəlir,
Danışanda mürdə cismə can gəlir,
Məgər nitqin Məsihayə dönübdür?!

Göydə ayı hər dəm nöqsana saldın,
Sərgərdanlıq çərxi-dövrana saldın,
Yusif kimi məni zindana saldın,
Məh camalın Züleyxayə dönübdür.

Sənsən axır şuxu şəngi Salikin,
Sənsiz qırılıbdır həngi Salikin,
O gördüyün gülgəz rəngi Salikin
Saralıban kəhrəbayə dönübdür.

Cığatay dilində yazdığı kəlamları çoxdur. Onlardan nümunə olaraq bir qəzəli atidə zikr olunur:

Quyaş yüzlü nigarın tələtiğə mübtəlaydurmin,
Dəxi bir mahi-novqaşlu qəmindən incəlaydurmin.

Dü püstanı iki limudurur əmma əlim yetmas,
Dutub şol nəxli-əndamin tibindən silkalaydurmin.



Bəlayi-firqətində köb cəfavü xəstəlik buldum,
Də'vayi-vəslini bulğac bir az şimdi qolaydurmin.

Sana gər yaşü təb'lə dersəm, ey Salik, yeridür kim,
Bürünənsin niçün derdin ana aşiq olaydurmin.

Aşağıda yazılan müxəmməs dəxi Salikin mövzun kəlamlarından birisidir:

Məlahət gülşənində bir güli-həmrayə həsbəndəm,
Fəsahət kişvərində bülbüli-şeydanə həsbəndəm,
lətafət mədənində gövhəri-yektayə həsbəndəm,
Səbahət aləmində bir mələksimayə həsbəndəm.

Budur, xislətdə bir şuxi-qədi-rə'nayə həsbəndəm.

Alıbdır əqlimi məndən, edib Məcnunü divanə.
Salıbdır tazədən rəxnə bu gün həm dinü imanə,
Tərəhhüm eyləməz zalim məni-büsəbrü samanə,
Ləbi-lə'lin həvasindən dönübdür bağrımız qanə,
Əcəb şuxi-qəmərtələt, cahanarayə həsbəndəm.

Tərəhhüm et, məni qılma cahan mülkündə avarə,
Məni Məcnun edən sənsən, kim etsin dərdimə çarə?
Ləbi-nuşin dəvasindən tələttüf eylə bimarə,
Xədəngi-tiri-müjganın edibdir sinəmi parə,
Büluri-safü simin-gərdəni-minayə həsbəndəm.

Qaşın qövsi-qüzehdir, ya hilali-eydi əzhadır,
Dü zülfün türreyi-leyla və ya zülfi-çəlipadır?
Üzün gündür və ya ateş vəya nuri-təcəlladır?
Ləbin yaquti-biqiymət və ya lə'li-Məsihadır?
Mən an çeşmani-məftun, nərgisi-şəhlayə həsbəndəm.

Olubdur mürği-dil məhbus daim zülf damında,
Edər lə'lin təmənnasın həmişə şövqi-canında,
Əgər küstaxlıq etsəm zarafatlıq məqamında,
Hərəc yoxdur mərizə, həq buyurmuş öz kəlamında,
Mərizi-eşqəm əvvəldən, ruxi-zibayə həsbəndəm.

Sərasər cüstücu etsən əgər şövq ilə dünyani,
Tapılmaz mən kimi aşiq sənə, ey Yusifi-sani,
Mənə bihudə cövr etmə ki, tərk etməm bu sövdani,
Olur ya mətləbim hasil və ya ömrüm olur fani,
Riza ver ya ki, cəng eylə ki, mən davayə həsbəndəm.

Qələm divanəyə yoxdur, mənəm məcnuni-bipərva,
Edib əşkim məni aləmdə həm bibakü həm rüsva,
Alıbdır dinü imanı, edibdir ömrümü yəğma,
Bu yolda Salikəm, billah, vurubdur başıma sövda,
Nə bakım var bu aləmdə ki, mən ütbayə həsbəndəm.

Salik qardaşı Mustafa ağa Arifə onun Rusiyada olduğu zamanı yazmışdır:

Agəh et, ey bad, məndən ol vəfalı həmdəmi,
Söylə, gəl gör əşkdən ruyimdə bəhri-ə'zəmi,
Çarə qıl kim, qərqi-ab etmiş məni çeşmi nəmi,
Vaxtdır, ey Nuhi-dövran, gəl ki, gəlmişdir dəmi,
Yoxsa bu tufanə sənsiz çarəsaz olmaz gəmi.

Hanı Rüstəm Zal, yə'ni-pişvayi-pəhlivan?
Hanı ol divi-səfidə vurduğu gürzi-giran?
Hanı ol Əfrasiyab, İsfəndiyar qəhrəman?
Cümləsin qüllabına çəkmiş fəzayi-asiman,
Ləng qılmış sənglax çərx Rəxşiş[333]-Rüstəmi.

Aləmi təsxirə salmış fitnəvü ali-fələk,
Aləmə mə'lumdur kim, böylədir hali-fələk,
Aqilü nadan olubdur cümlə pamali-fələk,
Sərvqədlər qəddini əymişdir ol zal fələk,
Gör necə zal fələk təsxirə salmış aləmi?!

Düşmənidir bu zamanda hər kişi öz canının,
Fərqi yoxdur bir-birindən aqilü nadanının,
Vay, yüz min vay əlindən ədlsiz dövranının,
Dərd üçün heç bir təbibin cudu yox dərmanımın,
Bu zəmanə zəxminin yox bir müvafiq mərhəmi.

Demə bu zəxmin, təbiba, bunda yoxdur çarəsi,
Mərhəmi-vəslət dilər bu tiği-hicran yarəsi,
Qərqi-xun eylər cahanı çeşmimin fəvvarəsi,
Olmuşam dəşti-fənadə Arifin avarəsi,
Gəl ki, pamal eyləmişdir Saliki hicran qəmi.

1246-cı (1830) sənədə İran məmləkətinə vəba naxoşluğu düşmək babında yazdığı müxəmməsdən belə mə'lum olur ki, haman ildə vəbadan külli adamlar tələf olubmuş və təbiblərin cümləsi bu bəlanın əlaci-dəfində aciz və mə'yus qalıb onların müalicəsi və üsuli-tədavisi dəxi də mərəzi şiddətləndirirmiş.



Salik bu dəhşətli mərəzin vüquunu ol əsr və məkanın əhalisinin haqq yolundan çıxıb küfr və zəlalətə düşməyindən və bu cəhətə qəzəbi-ilahiyə giriftar olmağından görüb demişdir:

Min iki yüz çehlü şeşdə düşdü İranə vəba,
Eylədi viranə hər bir şəhri bahökmi-qəza,
Etdilər cümlə ətibbalər əlacında dəva,
Bulmadı bimarı bu dərdin dəvalərdən şəfa,
Sən özün saxla bizi böylə bəladən, ya xuda!

Bu zəmanə bəyləri çün zülmə mail oldular,
Həm qənilər qapısından məni-sail oldular,
Oldular əşrarə bais, xeyrə hail oldular,
Yıxdılar iman evin, həm əqli zail oldular,
Aldılar verdikləri əşyalar üstündən vəba.

İçdilər andü qəsəm hər ləhzədə məhz dürüğ,
Verdilər hər bəzmdə şəm'i-dürüğə min fürüğ,
Satdılar qatıq yerinə dik içində abi-duğ,
Etdilər gərdənkeşanlıq misli-Övc ibni Ənuq[334],
Padşahlıq iddia etdi dəxi hər bir gəda.

Nəfsi-əmmarə üləma qəlbini etmiş xərab,
Mədrəsə içrə müdərris eyləmiş tərki-kitab,
Az qalıbdır parsalar eyləyə meyli-şərab,
Şahidü şeyxin duası hərgiz olmaz müstəcab,
Müxtəsər bu ki, düşüb yömni-icabətdən dua.

Bitəharət gəzdilər; həm tutmayıb sövmü səlat,
Tariki-qurbanü fitrə oldular, həccü zəkat,
İçdilər daim şərabi, sandılar abi-həyat,
Bilməmiş kim, təlx eylər kamını zəhri-məmat,
Hifz qıl mö'minləri ol təlxdən, ya rəbbəna!

Yar-yoldaş bir-birinə kəşfi-əsrar oldular,
Hər nə kim, əvvəl dedilər sonra inkar oldular,
İxtiyar sahibləri həm mərdümazar oldular,
Xabi-qəflətdən sanasan şimdi bidar oldular,
Yıxdılar rəiyyət evin almaq ilə irtişa.

Salik dəxi öz müasirləri kimi bir qəzəlində gərdişi-zəmanədən şikayət edib deyir:

Fəryad ki, dövranın əyyamı xərab olmuş,
Əfsus ki, əyyamın əncamı əzab olmuş.

Sultani-cahan cümlə miskin gədalanmış,
Dəryayi-firavanə gəl bax ki, sərab olmuş.

Pilan şütürlənmiş, üştürlər olub əstər,
Şiran şəğalənmiş, şahin qürab olmuş.

Saqilər olub pamal, mütrüblər olub xamuş,
Xuni-dili-meyxaran bəzm içrə şərab olmuş.

Müftilər olub məğbun, qazilər olub bihökm,
Bilcümlə müdərrislər tariki-kitab olmuş.

Mərdani-nikukaran olmuş həmə bədiqbal,
Əhli-kərami-kamil məhrumi-səvab olmuş.

Alimlər olub cahil, cahillər olub alim,
Salik dəxi cahillər cəmində hesab olmuş.

Zeyldə "Fikr qıl" sərlövhəsilə mərqum qəzəl Saliki-mərhumun dərin məzmunlu əş'arındandır:

## FİKR QIL

Ey xudanı fikr edən, gəl kuhsarın fikr qıl,
Gunə-gunə tər şükufə, taləzarın fikr qıl!

Asimanə qıl tamaşa, mehrü məh seyrinə bax,
Munca kuhun Bisütuni-bərqərarın fikr qıl!

Gah qırağında qərar et, mövc edən dəryanı gör,
Gah dərya içrə əyləş, həmkənarın fikr qıl!

Əbrü badü bərfü baranın qamusun qıl xəyal,
Bu kəmalı qıl təfəkkür, fəsli-çarın fikr qıl!

Gah dərdü qəm verir könlə, gəhi zövqü sürur,
Gündə yüz gunə dolanan ruzigarın fikr qıl!

Dövlətü mal ilə nadan dəstini qılmış fəraq,
Təngdəst etmiş cahanda huşyarın, fikr qıl!

Demə kim, quşlar həvadə pər ilə pərvaz edər,
Yerdə xoş rəftar edən bipay marın fikr qıl!

Kimsə baş açmaz xudanın etdiyi əf'aldən,
Sirrinə yetməz fərasət, ruyi-karın fikr qıl!



Həqq özün ayinəvəş rövşən qılıbdır aləmə,
Leyk anı bilməyə qəlbin qubarın fikr qıl!

Fikr qılma kim, görüm dünyada ol ayinəni,
Hiç kəs görməz bu gün, bəs, ruzi-yarın fikr qıl!

Öylə pünhandır ki, pünhanlıqda olmuşdur ə'yan,
Etmə pünhanın təxəyyül, aşikarın fikr qıl!

Müxtəsər, elmi-lədünni hikmətin bilməz bəşər,
Əmrinə eylə itaət, zicrü narın fikr qıl!

Pənc ruzin, Salika, pəncahə yetmiş, eylə şükr,
Etibar etmə cahana, etibarən fikr qıl!

Bəli, əgərçi bizim bu tərəqqi əsrində çox şeylərin və əlamətlərin ülumi-mütənəvvəə sayəsində künhü mahiyyəti açılıb bilinməkdədir və gün-gündən növbənöv ixtiraat və kəşfiyyat olunmaqdadır və lakin dünyada çox sirrlər və hikmətlər vardır ki, əqli-bəşər onları dərk etməkdə aciz və qasirdir.

Kazım ağa Salikin istəkli və həqiqi dostu Salahlı qəryəsindən Sədəfoğlu Süleyman koxa imiş ki, o da xoşxülq, əhli-zövq səfa bir vücud imiş. Şair xoş günlərini, eyş-işrətini və zövq-səfasını onunla sürərmiş. Bu xüsusda Salikin yazdığı kəlamlar şayani-diqqətdir ki, zeyldə tamamən dərc olunur:

Gəl, ey sədəfoğlu Süleyman koxa,
Bu köhnə gülşənin güllərin dərək,
Olaq müştərək.
Aralıqda mənim-sənin olmasın,
Heç kəs bizi ayrı bilməmək gərək,
İlla bel, kürək.

İlla bel, kürək ki, ayrı olmayaq,
Bir də oruc tutub, namaz qılmayaq,
Ac və susuz saralıban solmayaq,
Badeyi-gülgundan içək bir çərək,
Öylə kef sürək.

Öylə kef sürək ki, zail olmayaq,
Tubadən qeyriyə mail olmayaq,
Qazinin sözünə qail olmayaq,
Saqiyi-sadəyə xidmət göstərək,
Nə istər verək.

Nə ki, istər verək ol sadəruya,
Bəlkə bizdən gələ bir göftükuya,
Biz də bir az düşək bu hayhuya,
Biqafildən nagah qapıdan girək,
Nə söylər görək.

Nə ki, söylər görək Tubayi-sərxoş,
Hər dəm onun ilə olaq həmağuş,
Müdam məclisində olaq badənuş,
Tökün, töküşdürün, bol olsun xörək,
Soğan, duz, çörək.

Soğan, duz, çörəklə içək şərabı,
Qazi xəbər alsa verək cavabı,
Yaxşı olur yemək toyuq kababı,
Əgər onda toyuq tapsaq bir mərək,
Tamam öldürək.

Təmamən öldürək toyuğu, qazı,
Tərk eləyək həm orucu, namazı,
Salik, işə salaq samturu, sazı,
Yıxılmış dünyaya nə vuraq dirək?
Çalaq dünbərək.

Yenə məzkur Süleyman koxaya eyş-işrət və zövq-səfa sürməyə tərğib və təşviq babında yazmışdır:

Gəl, ey Sədəfoğlu Süleyman koxa,
Meyxanə qapısın edək güşadə,
İçək ziyadə.
Sərməst olub sərxoş gəzək sübhü şam,
Dursun yanımızda saqiyi-sadə,
Əlində badə.

Əlində badə kim, dursun həmişə,
Tövbə nədir bizdə? Səng ilə şişə,
Gəl, çox da düşməyək fikrü təşvişə,
Dərdü qəmi gətirməyək heç yadə,
Bu puç dünyadə.

Bu puç dünyanın ki, çoxdu möhnəti,
Unutmayaq hərgiz sazü söhbəti,
Sənin ölmüşünə, bunun ləzzəti –
Əgər yüz il getsən olmaz üqbadə,
Ey Sədəfzadə!



Ey Sədəfzadə, sənsən cəvahir,
Qədir-qiymətindir aləmdə zahir,
İkimiz də olaq bu işdə mahir,
Söylənsin adamız eldə, obadə,
Yetək muradə.

Yetək murada biz, tapaq Tubunu,
Tapmarıq cənnətdə ondan xubunu,
Bu dünyanın ha belə məhbubunu,
O dünyada biz tapmayaq məbada,
Qalaq cəfada.

Qalaq cəfadavü olaq peşiman,
Qaçaq düşə bizdən huriyü qılman
Nə biz kafir olaq, nə də müsəlman,
Məlul-müşkül qalaq, miskin fənadə,
Kim yetə dadə.

Kim yetə dadə, pəs həqdən səvayi,
Ya rəb, özün saxla mən binəvayi,
Salikəm, söylərəm hərzə-hərcayi,
Kimsə bilməz nədir məndə iradə,
Elə ifadə.

Salikin bu müstəzad kəlamları həqiqi hissiyyat ilə təb'i-səlimdən təvəllüd etmiş nadir və bimisl əsərlərdir ki, bu cür kəlamlar bir kəsin qələmindən hənuz vücuda gəlməyibdir. Hər iki kəlamda şair dusti-səmimisi Süleyman koxaya xitab edib, onu kef çəkməyə və eyş-işrət sürməyə də'vət eləyir.

Necə ki, yuxarıda zikr olundu, Süleyman koxa öz əsrinin qanacaqlı, xoşxasiyyət və məclisara adamlarından sayılırmış. Ziyadə çörəkli-duzlu, yeyib-içən və kef sürən bir vücud olduğundan Salik ilə onun xasiyyətləri müvafiq gəlir imiş və aralarında həqiqi bir ülfət və məvəddət var imiş. Əksər övqat günlərini bir yerdə – zövqü səfadə keçirərlərmiş.

Əvvəlinci kəlamda şair dostu Süleyman koxanı köhnə gülşənin güllərini dərməyə, yə'ni Süleyman peyğəmbərdən qalan qoca dünyaya bel bağlamayıb, eyş-işrət sürməyə təklif edib deyir: Biz gərəkdir elə yaxın olaq ki, aralıqda mənim-sənin olmaya. Ancaq bizi bel və kürək ayırmağa müqtədir ola ki, onlar ilə qəbir qazılır. Quru zöhdü taat ilə özümüzü taqətdən salmayaq və oruc tutuban ac və susuz saralıb solmayaq. Badeyi-gülgundan nuş edib kefimizi kök saxlayaq. Amma bir o qədər içməyək ki, bihuş və məsti-layəqəl olaq və Tubayi-xubrunu unudub tərki-ədəblik göstərək. Belə məst olmaq bizə yaramaz!

Biz gərəkdir ancaq qazinin biməzmun sözlərinə qulaq asmayıb, saqiyi-sadəruya xidmət göstərək və Tubayi-sərxoş ilə həmağuş olub məclisində damağımızı saz edək, töküb-töküşdürək, hər nə var xörəyi bol edək və o xörək də ibarət olsun soğandan və duz-çörəkdən və toyuq kababından. Bu nəhv məclisi-eyş saz edib və oruc-namazı tərk qılıb, onların əvəzinə samturu və sazı işə salaq və yıxılmış dünyaya dirək vurub dünbərək çalaq.

İkinci kəlamda bu məzmunda Salik yenə həmpiyaləsi Süleyman koxaya üz tutub meyxanə qapısın güşad etməyə onu təklif eləyir. Şikəstiəhdü peyman babında deyir ki, "Tövbə nədir bizdə? Səng ilə şişə". Yə'ni onu sındırmaq çox asandır. Bunun üçün çox da xövf və təşvişə düşmək yaramaz. Bu puç dünyada ki, onun dərd və möhnəti həddən aşıbdır, övqati-əzizəmizi saz və söhbətdə keçirək. Zira ki, nə qədər zöhdü ibadətə məşğul olsaq da, bunun ləzzətini üqbada bulmayacağıq. Bəs, belə olan surətdə Tubayi-xoşədanı axtarıb tapaq, çünki cənnətdə ondan xubunu bulmaq müyəssər olmayacaqdır. Beş günlük ömrü qənimət bilib, fürsəti fövt etməyək və elə bir kef eləyək ki, adımız eldə-obada həmişə söylənsin.

Üçüncü kəlam və müstəzadında – ki, atidə dərc olunub, – şair meyigülgundan xərab və pərişan olub və dünya ləhvü ləəbindən usanıb dusticani olan Sədəfzadəni başqa bir təriqə də'vət və hidayət eləyib deyir: Ey Sədəfzadə, bu dəhri-duna etibar yoxdur, onda nə badə qalır və nə badəxar, cümləsi fövt və həlak olub gedəsidir: "kullu şeyin halikun illə vəchəhu"[335]. İndi vaxtdır və lazımdır bu qəflətdən ayılmaq; xaliqi-biçuna və xudayi-rəhnumuna səmimi-qəlblə xidmət və itaət eləmək. Tuba kimi bir sərvqaməti gördükdə lazımdır ondan üz çevirmək, badeyi-gülfamdan və ərəq kimi haramzadədən və saqiyi-sadərudan əl götürmək; daha yaramaz bu dəhri-pürəfsuna aldanmaq və dünyayi-dəni və şumə aludə olmaq.

İndi lazımdır eyşü işrəti tərk və saz-samturu şikəst qılıb, əşki-pürxun ilə aləmi qərq eləmək, ta ki, bizlər kimi cürm dəryasına qərq olanlara xudavəndi-rəhim və bəxşəndə lütf və mərhəmət eləsin və sahili-nicatə yetirsin. Şairin öz kəlamına rücu edək:

Gəl, ey Sədəfoğlu Süleyman koxa,
Meyl etməyək daxi meyi-gülguna,
Gənci-Qaruna[336].
Əl götürək dünya ləhv-ləəbindən,
Çün etibar yoxdur çərxi-gərdun,
Bu dəhri-dun.



Bu dəhri-duna çün yoxdur etibar,
Nə bir badə qalır, nə bir badəxar,
Bu xabi-qəflətdən biz olaq bidar,
Qulluq edək bir xaliqi-biçunə,
O rəhnümunə.

O rəhnümunə biz qılaq itaət,
Kəm olmayaq qulluğundan bir saət,
Görəndə Tuba tək bir sərvqamət,
Heç baxmayaq o qaməti-mövzunə,
Olsa nə gunə.

Olsa nə gunə biz keçək badədən,
Dəxi ərəq kimi o haramzadədən,
Əl götürək ol saqiyi-sadədən,
Aldanmayaq bu dəhri-pürəfsunə,
Bu bisükunə.

Bu bisükunə biz sakin olmayaq,
Çox da dünya üçün fikrə qalmayaq,
Qan ağlayaq, sazü samtur çalmayaq,
Qərq edək aləmi əşki-pürxunə,
Abi-Ceyhunə.

Abi-Ceyhunə mən qərqəm, ilahi,
Sənsən qəriblərin püştü pənahi,
Şikəstə Salikin çoxdur günahi,
Bir lütf eylə sən ol cürmi füzunə
Hali zəbunə.

**Dostu Yəhya bəyə hərcayi sözlərdən əl çəkib axirət üçün tədarük mühəyya etmək babında yazmışdır:**

Yəhya, gəl əl götür hərcayi sözdən,
Afitabi-ömrün bulmasın zəval,
Kəsb et bir kəmal.
Öylə sanma böylə keçər dövranın,
Əgər bədr ayısan, eylə bir xəyal,
Olursan hilal.

Olursan hilal, qəddin xəmlənir,
Yaşadıqca didələrin nəmlənir,
Əqlü fəhmin günü-gündən kəmlənir,
Gün dolanır, keçər həftə, məhü sal,
Ağarar saqqal.

Ağarar saqqalın, həm sözün ötməz,
Uşaqlar sözünü hesaba qatmaz,
Öyüd-nəsihətlər beyninə batmaz,
Düşər evin içrə hər həm qilü qal,
Olursan aval.

Olursan aval oğul-uşağa,
Dığırlarlar səni üstdən aşağa,
Adlanıban ta dönərsən məşşağa,
Soyarlar pustunu əyalü ətfal,
Manəndi-çaqqal.

Manəndi-çaqqal ki, oldun kollarda,
Baxa-baxa gözün qalır yollarda,
Günün keçər biyabanda, çöllərdə,
Qalırsan pərişan, pəjmürdə əhval,
Misali-abdal.

Misali-abdal ki, oldun bir sail,
Söylədikcə sözün söylərsən zail,
Ondan sonra canın alır Əzrail,
Münkər-Nəkir eylər islamın sual,
Dilin olur lal.

Dilin olur lal heyvandan betər.
Fəryadına oğul, nə bir qız yetər,
Xəstə Salik onda bülbül tək ötər,
Olur cənnət quşu, açar pərü bal,
Uçar bizəval.

Mə'lum olur ki, bu Yəhya bəy mərhum Molla Vəli Vidadinin fərzəndi Məhəmməd ağanın oğludur ki, əhli-elm və sahibi-təb' olduğu ilə belə, bir az zarafatçı və hərzəgu imiş. Kazım ağa Salik ilə aralarında zarafat olmağa görə, fövqdə zikr olunan mürəbbeyi-müstəzadı həzl təriqi ilə onun şə'nində nəzm qılmışdır. Yəhya bəyin əş'arından ələ düşəni olmadı. Vəfat edibdir hicrətin 1257-ci[337] tarixində. Salik onun maddeyi-tarixini bu tövr rişteyi-nəzmə çəkmişdir:

Bu məzarın sahibi Yəhya bəyi-rövşənzəmir,
Şairi-kani-süxən, hüsni-kəlami-binəzir.

Ol Vidadi xəstənin fərzəndinin fərzəndidir,
Vaqif ol kim, Vaqifin həm bintinin peyvəndidir.

Çünki getdi bu cahandan, buldu rəsmi-məğfirət,
Oldu tarixi-vəfatı, Salika, "nov axərət"[338].



Salikin bu sözlərindən belə mə'lum olur ki, mərhum Yəhya bəy rövşənzəmir və xoştəb' bir şair imiş və özü də iki böyük şairin nəvəsi olduğu üçün babaları Vidadi və Vaqifdən təb'i-şe'riyyəni irsən almışdır.

Yəhya bəyin vəfatından bir il sonra Salik dostunun müfariqətinə və xüsusən, istəkli qızı Xeyransa xanımın vəfatına – ki, ziyadə arifə və aqilə bir nazənin imiş, – tab gətirməyib, özü də bu dari-dünyanı tərk qılıb dari-üqbayə rehlət buyurmuşdur. Xeyransa xanımın maddeyi-tərxinin Salik belə inşad etmişdir:

Bu türbət türbəti-bir nazənindir,
Bihəmdilləh yeri xüldi-bərindir.

Deyil tənha sarayi-mərqəd içrə,
Ənisi dəmbədəm ruhül-əmindir.

Bu, gənci-hüsn idi, Salik, yəqin bil,
Onunçün məskəni ziri-zəmindir.

Vəfatı tarixi Xeyrənnisanın –
Ki, bir "cim" bir "nun", çar "şin" dir[339].

Ömrünün axır çağında dünyayi-dunun bivəfalığından söz açıb özözünə xitabən bu şeirləri inşad qılmışdır:

Cahan, Salik, bizə çünki fənadır,
Duadır xeyrimiz, ancaq fənadır.

Nə simü zər qalıb baqi, nə əmlak,
Təfaxür etməsin hər kim ğinadır.

Başın qovğasıdır taci-mükəlləl,
Əcəl baxmaz, mürəssədir, minadır.

Binayi-axirət tut, ey bəradər,
Təmamı bunların çün bibinadır.

Ağarmış saqqalım gər sürx görsən,
Dü çeşmim qanıdır, sanma hənadır.

Bu vaxtlarda şairin sevgili həmdəmi Tuba dəxi qocalıb əfsürdə pərişanhal olur. Onların hər ikisinin zövq və səfası dərd və ələmə mübəddəl olur və şair Tubayi-şirinhərəkatın dilindən aşağıda yazılan şeirləri inşad eləyir:

Mən Tubuyam, dövran mənə zülm etmiş,
İşvəm əskilibdir, nazım gedibdir.
Dəxi məndən kimsə şadlıq ummasın,
Gördüyün söhbətim, sazım gedibdir.

Əlimdə dairə dövran eylərdim,
Çoxların özümə heyran eylərdim,
Hər dəm gəştə çıxıb seyran eylərdim,
Qışım qayıdıbdır, yazım gedibdir.

Gündən-günə artar nə ahü zarım,
Gülməz üzüm, heç açılmaz güzarım,
Necə əyilməsin meyli-şikarım,
Əlimdən topğunum, bazım gedibdir.

Baş götürüb burdan qaça bilmənəm,
Etdiyim iqrardan keçə bilmənəm,
Dərd budur ki, dərdim aça bilmənəm,
Yar ilə bir gizli razım gedibdir.

Saliki dünyadan kəm etmə, tarı,
Söyləsin məclisdə şirin göftarı,
Bir zaman tapılmaz nəzmü əş'arı,
Deyərlər, dünyadan Kazım gedibdir.

Bu şeirlər insanın qəlbini hüzn ilə ləbaləb edir. Bir vaxtı Sədəfzadə ilə eyş-işrət sürən və dünya qeydini çəkməyən, yıxılmış dünyaya dirək vuran Salik özü yıxılıbdır və xak ilə yeksan olubdur. Məclisdə şirin göftarı söylənməz və nəzmü əş'arı tapılmaz...

Kazım ağanın burada zikr olunan kəlamlarından başqa yenə də gözəl əsərləri çoxdur. Onlar bir qayda üzrə tərtib olunsa, böyük bir cild divan əmələ gələr. Mərhum Kazım ağa öz əsrinin müqtədir şairi olduğunu bilib, təb'i-gövhərbarını belə tə'rif eləyir:

Çini-əş'ar içrə ancaq tək mənəm xaqani-təb'
Nüktədə sübhanvəş, həm təb'də Həssantəb[340].

Buyi-şe'rimdən məşami-əhli-dil pürətr olub,
Gülşəni-nəzm içrə guya ki, mənəm reyhani-təb'.

Qorxma, Salik, tə'neyi-əğyari-biinsafdən,
Zəxmdar etmiş qamusin səndəki peykani-təb'.

Yenə kəlamı barəsində demişdir:



Kəlami-behcətə'ngizin məcalisdə qanan kəslər
Deyərlər Saliki-gövhərfişanə: elmi dəryadır.

Və yenə fars dilində yazdığı bir qəzəlin axırında demişdir:

Ço ğəvvas şəvəd Saleke-nəzmsənc,
Bər arəd qohərha ze bəhre-ğəzəl[341].

Mərhum Salikin haqqında verdiyimiz bu qədər mə'lumat və bəyanata iktifa elədik. Bundan ziyadə nümunələr göstərməyə məcmuəmizdə yer olmadı. Şairin rütbə və məqamını göstərməyə bunlar da kifayət edər.

Kazım ağanın oğlu Yusif ağa dəxi şair imiş. Bə'zi rəvayətə görə, bir neçə abdar kəlamları vardır, amma, məəttəəssüf, onlardan ələ düşəni olmadı.

# MİRZƏ MƏHƏMMƏD QAİB OĞLU "FƏDAİ" TƏXƏLLÜS

Kazım ağa Salikin müasirlərindən birisi də mərhum Mirzə Məhəmməd Qaibzadə "Fədai" təxəllüsdür ki, əslən Salahlı qəryəsindən olub, indiki Qaibovların babalarından birisidir. Onun ilə Kazım ağanın mabeynində ülfət və məvəddət olduğu bir-birinə yazdıqları əş'ardan görünür.

Fədai sinndə Kazım ağadan böyük imiş. Necə ki, onun Kazım ağaya yazdığı bir kağızından mə'lum olur:

Nədəndir, ey bəyim, əş'arıma sizdən cavab olmaz,
Bu gündən böylə daxi şe'riniz gəlsə, hesab olmaz.

Sədayi-qafiyə, ya bir qəzəl yox suyi-dilbərdən,
Necə səbr eyləsin dil, bundan artıq kim, əzab olmaz.

Keçib ol novcəvanlıq, kimsə yad etməz məni hərgiz,
Qocalıq damənim tutmuş, dəxi zövqi-şəbab olmaz.

Gərək yad eyləsin səyyadi-tazə köhnə səyyadı,
Təsəvvür etməsin tərlan kim, üstündə üqab olmaz.

Rəqibi-kəcrəvi gör yar ilə işrət qılır hər dəm,
O yerdə şəbpərə pərvaz edər kim, afitab olmaz.

Tikilmiş bir hədəfdir lövhi-sinəm tiri-müjganə,
Xədəngi-qəmzədən üşşaqlərdə ictinab olmaz.

Fədai gəlsə yarın kuyinə, didarı mən etmin,
Neçün kim, aşiqü mə'şuq arasında hicab olmaz.

Salikin Mirzə Məhəmməd Qaib oğluna yazdığı bir qəzəl:

Olma, ey Mirzə Məhəmməd, zəmmi-şe'rimdən məlul,
Əhli-dil əhli-dilin azarını eylər qəbul.

Naləvü fəryaddır arayişi-bəzmi-cünun,
Şövkətidir şairin həm söyləmək tülu' füzul.

Gərçi istərsən ki, Misri-şe'rə sultan olasan,
Eylə bir yari-əzizə canını, əlbəttə, qul.

Aşiqi-sadiqlik istərsən əgər, ey əhli-hal,
Adına Məcnun desinlər Qeys tək divanə ol.



Ey məcazi eşq ilən kəsbi-həqiqət eyləyən,
Çək qədəm ki, mənzili-məqsudinə getməz bu yol.

Ey ki, bəhri-eşqə düşmək istər isən, qıl həzər,
Eşq dəryasın görüb Məcnun demiş: biərzü tul.

Salika, ol yar yari-qəmküsarın olmasa,
Vərteyi-vəhşətdə qaldın, başına bir çarə bul.

# QUBA

Mərhum Abbasqulu ağa Qüdsinin tərcümeyi-halına şüru' etməzdən müqəddəm Quba şəhərinin barəsində – ki, şairin vətəni məqamındadır, – icmalən mə'lumat verməyi münasib gördük.

Yadigar qalmış vərəqparələrdən və təvarixdə görünən müxtəsər əhvallardan belə mə'lum olunur ki, Quba şəhərini Nadir şah tarixi-hicriyyənin 1147-ci sənəsində – ki, miladın 1734-cü sənəsinə mütabiqdir – bina etdirmişdir. Müşarileyh Şabrandan (Quba uyezdində Dəvəçi mahalıdır) gəlib keçdikdə Dərbənd ilə Şabranın arasında "Gülüstani-İrəm" adında basəfa bağlıqda istirahət üçün sakin olmuşdur.

Buranın abü havası şaha xoş gəldiyindən Mirzə Mehdi xan münşi təvəssütü ilə əmr etmişdir ki, burada şəhər binası qoyulsun. Bu əmri icra etmək üçün neçə nəfər öz qoşunundan – ki, Ərdəbil şəhərindən var imişlər, – o məkanda qoyur. O cəhətə şəhərin əvvəlinci məhəlləsi indilikdə də "Ərdəbil məhəlləsi" adı ilə məşhurdur.

Rəvayət olunur ki, şəhərin adını Nadir şah öz çadırının başındakı qübbəsinin nişanəsinə yad olaraq əmr edir "Qübbə" qoyulsun[342]. Bir rəvayət də budur ki, Qubanın binasını Qudyal çayının sağ tərəfində ibtida qoyan Fətəli xan Müştərinin atası mərhum Hüseynəli xan olubdur. Belə ki, şəhər bu axır vaxtlara kimi o yerin əhalisi arasında "Qudyal qala" adı ilə mə'ruf idi*.

Mərhum Müştərinin əyyami-hökumətindən Abbasqulu ağa Qüdsinin zamanına kimi bu aralıqda nə növ üləma və ürəfa vücuda gəldiyi və onlar kimlər olduğu mə'lum deyildir. Hər halda Qubada bir çox əhli-hal və ürəfa və üləma olublar və onun üçün mərhum Kazım ağa Salik Qubanı (Qübbəni) yad etdikdə demişdir:

Kəmali-rif'əti-Şirvan mə'lum,
Maarif mə'dəni xaki-Qubadır.

Neçə əhli-bəlağət var onda,
Biri Ağabəyü Mirzəbabadır.

Biri "Qüdsi" ləqəb Abbasqulu bəy,
Diyari-nəzmü şe'rə padşadır.

* Bilmək gərəkdir Qubanın adı Nadir şahdan sonra Fətəli xan və Şıxəli xan zamanlarında "Gülüstani-İrəm" adlanmışdır. Məkanın əsl adı bu imiş ki, orada şəhər bina olduqda məhv olmuşdur və sonradan yenə yavaş-yavaş öz sabiqi adına daxil olmuşdur.



# ABBASQULU AĞA BAKIXANOV "QÜDSİ" TƏXƏLLÜS

Mərhum Abbasqulu ağa Qafqaz şüəra və üdəbasının məşhurlarından birisi hesab olunur. Onun pədəri-büzürgvarı Mirzə Məhəmməd xan sani Bakı xanlarının nəslindəndir. Vəqti ki, dövləti-Rusiyyə tərəfindən general mayor Xatuntsevin sərkərdəliyi ilə qoşun gəlib Quba nahiyəsini 1806-cı sənədə Şıxəli xandan istixrac etdi, Abbasqulu ağanın atası Mirzə Məhəmməd xan orada iqamət edirdi.

Məzkur nahiyənin idarəsi ona həvalə olundu və xani-mərhum xeyli müddət orada xanlıq etdi və lakin onun vəfatından sonra vilayət hökumətin rus naçalniklərinə (komendant) təslim olundu və ixtiyari-hökumət və rəyasət müsəlman xanlarının əllərindən biryolluq çıxdı.

Mirzə Məhəmməd xanın övladından neçə nəfərləri rus xidmətində olub hökumət və izzət kəsb etmişdilər. Cümləsindən məşhuru və qabili mərhum Abbasqulu ağa olubdur. Bu zati-şərif ağıl və zəkavəti sayəsində az vaxtın içində bir çox ülum və fünuna dara olub, müasirləri beynində ad və san qazanmışdı və Qafqazın hər yerində adı söylənirdi. Mərhum Salikin müasiri imiş ki, ona "diyari-nəzmü şeirdə padşahlıq" ləqəbi verməklə onu yad etmişdir.

Abbasqulu ağa ülumi-mütənəvvəəni, ərəb və fars dillərini Qubada və Dağıstanın sair mərkəzlərində təhsil etdikdən sonra Rus tərəfindən açılmış divanxanalarda qulluqlar edib, fitri zehn və fərasəti ucundan çox tez rus dilini və o dildə yazıb-oxumağı öyrənmişdir və o vaxtın əkabiri nəzərində mükərrəm və möhtərəm olub polkovnik çininə nail olmuşdur. Amma axırda dünya şöhrətini puç, cahü rəyasət tələbini biməzmun görüb, xidmətdən iste'fa veribdir. İbadətə və axirət sərmayəsini cəm etməyə məşğul olub Həccə – beytüllaha əzimət eləmişdir və tarixi-hicrətin 1261-ci[343] salında ol cənab Məkkeyi-mükərrəmə ilə Mədineyi-münəvvərə arasında "Vadiyi-Fatimə" adlı mənzildə vəfat edib, haman yerdə dəfn olunmuşdur. Rəhmətüllahü əleyhi, rəhmətən vasiətən[344].

Belə rəvayət olunur ki, Abbasqulu ağa Qüdsi Həcc ziyarətinə əzimət etdikdə məşhur Quba qazisi Hacı Molla Abdulla axundu dəxi özü ilə bərabər aparmışdı. Vəqti ki, Qüdsi öz ziyarətini itmama yetirir, üzünü dərgahi-həqqə tutub deyir: "Pərvərdigara! Hər padşahdan mənə nişan verilibdir, səndən də bir nişan təmənna edirəm ki, axır nişanım olsun!"

Hacı Molla Abdulla axund o nişandan murad nə olduğunu soruşur. Hacı Abbasqulu ağa deyir: "O nişan bu müqəddəs məkanda ölməkdir". Necə ki, mərhumun arzusunca iş vaqe olur.

"Gülüstani-İrəm"in axırında mərhum Abbasqulu ağa Qafqaziyada vücuda gələn üləma, üdəba və şüəradan filcümlə mə'lumat verdikdən sonra öz seyrü süluku və tərcümeyi-halı ilə dəxi bizi aşina edir. Abbasqulu ağa yazır: "Mən anadan olmuşam hicrətin 1208-ci ilində ki, tarixi-məsihiyyənin 1794-cü salına mütabiqdir. Anadan olduğum yer Əmirhacıyan (Xilə) qəryəsidir ki, Bakı xanlığında vaqedir.

Təhsilə başladığım vaxt yeddi yaşında idim, fəqət on ilin müddətində e'tinaya layiq bilik və mə'lumat kəsb etməyə müqtədir ola bilmədim. Bunun da səbəbi o zamanlar hər yerdə müharibə və şuriş davam etməyi idi.

Bu müddətin ərzində öyrəndiyim bir şey var isə, o da fars dilinə kifafınca aşina olduğumdur. Siyasət aləmində vücuda gələn qovğalar sakit olcağın bizim ailəmiz Qubaya köçdü. Qubaya köçən zamandan tamam on il ərəb dilinin və bə'zi elmlərin təhsilinə ömür və əmək sərf etmişəm. Maddi və qeyri-səbəblərin mane olmağına baxmayaraq, bu müddətin ərzində ülumda cüz'i bir şöhrət qazanmağa qadir oldum.

Qafqaz nahiyəsinin hərbi sərkərdəsi general Yermolov 1235-ci hicri 1820-ci məsihi tarixində məni hüzuruna Tiflisə də'vət edib, dövləti bir xidmət mənə təklif etdi[345]. Tiflisdə sakin olarkən rus dilini öyrənməyə sə'y və həvəs etdim və bu dilin köməyi ilə Avropa mədəniyyətinə filcümlə bələd oldum.

Daima böyük adamların və sərkərdələrin yanında olduğumdan Dağıstan, Çərkəzistan, Gürcüstan, Anadolu və Azərbaycan vilayətlərini gəzib, kam alınca o yerlərə bələd və aşina oldum.

Hər vilayətə qədəm qoycaq oranın əhval, övza' və məkanına və əhalisinin tərzi-məaşına diqqət yetirdiyim kimi, ürəfa, üqəla və hükəması ilə də görüşüb yaxınlaşmağa müvəffəq oldum.

Türkiyə və İran müharibələrində – ki, hicrətin 1248-ci və miladın 1833-cü tarixində vaqe olmuşdu, – mən knyaz Pskeviçin[346] hüzurunda sahibmənsəblər dairəsinə daxil oldum.

Bütün Qafqaz sərhəddini, Don nəhrinin səvahilini, Malorossiya, Velikorusiya, Liflyandiya, Litfa, Lehistan ölkələrini səyahət etdim. Buralarda həm dövlət başında məqam və mənsəb sahibi olan kəslər ilə və həm elm və mə'rifət sahibləri ilə tanışlıq və dostluq etməklə bəxtiyar olmuşam.

Bu səyahətimdə ağıla və ruha qəza və pərvəriş verici bir çox şeyləri görüb, onları əxz etməyə sə'y və himmət sərf etmişəm. Bəşəriyyətin övza'vü əhvalına dürüst mültəfit olub özümə yəqin etdim ki, bu dünya dari-fənadır. Bir şey yoxdur ki, buna daimi və əbədi olsun. Ad və şöhrət puçdur. Dövlət və mənsəb müdam bir qərar üzrə qalmaz. Nə qədər nəcib



və məşhur bir silsilədən olursan, ol, vəqti ki, özündə layiqi-e'tina bir şey yoxdur, xalq nəzərində qədr və qiymətini itirmiş olursan. Ancaq bir şeyə e'tiqadım dürüst və inanmağım möhkəmdir, o da budur: Ülum və fünun aləmində bir mə'rifət və məharət qazanar isən, lazımınca bilik hasil edib özündən sonra gələnlərə öz elm və biliyindən bir səmər və əsər qoyar isən, ol vaxt özünü xoşbəxt hesab etməyə haqqın olar; dari-üqbaya rehlət edəndən sonra bu dünyada yenə yaşamış kimi olursan. Belə bir əqidədə olduğumdan və bu əqidəni sevdiyimdəndir ki, ona xidmət etməyi özümə vacib bilib bir neçə əsərləri qələmə almağa cəsarət etmişəm"[347].

Haman əsərlərin barəsində aşağıda mə'lumat veriləcəkdir.

Mərhum Abbasqulu ağa qayətdə zirək, sahibi-əql və mə'rifət bir zati-pəsəndidəsifat imiş ki, cümlə müasirlərinin qəlbində onun məhəbbəti var imiş. Elm və biliyindən əlavə onun çox rəvan və zərif təb'i-şe'riyyəsi var imiş.

Türki, farsi və ərəbi dillərində bir neçə təsnifat və rəsaili mövcuddur. Hacı Abbasqulu ağanın ehtimamı ilə Qubada bir ürəfa məclisi tərtib olunmuşdu. Bu işdə ona artıq dərəcədə kömək edən dostu Hacı Molla Abdulla axund olubdur. Bu məclisə Abbasqulu ağanın dost və aşinaları cəm olub ruhani söhbətlər edərlərmiş.

Abbasqulu ağanın vəfatından sonra bir müddət məclis pozulur və şeir bazarı kəsad olur. Amma sonradan Qubada yenə ürəfa məclisi tərtib olunur və o məclisin adı – necə ki, Quba şairlərinin kəlamından görünür, – "Gülüstan" imiş.

Mərhum Abbasqulu ağa bir pakdamən, xoşxülq, xoşkirdar və haqpərəst şəxs olduğu üçün öz halü şə'ninə münasib "Qüdsi" ləqəbini iqtixaz etmişdir.

Əgərçi mərhum özü şieyi-isna əşəri məzhəbində imiş, amma e'tiqad cəhətincə qeyri-müasirlərinə bənzəməz imiş və xüləfayi-səlasəyə, rəfzü səbb kimi nalayiq əməllərə razı olmaz imiş.

Onun məsləki və əqidəsi kəlamlarından vazeh və aşikardır və əf'alülibada dair olan məsələyi-əqidədə "lacəbrə və latəfviz bəlhiyə beynəlomreyni" xüsusunda[348] mənzum olunmuş bu beytlər kəlami-bəlağətnizamındandır:

Hər kəs əməl ze xiş nəbinəd nə moumenəst,
Van həm ke nesbətəş nə behəq dad kafərəst.
Biqovve felra becəhan çon vocud nist,
Dər exteyare-mast əməl həm moqəddərəst.
Qodsi nikust hər çe resəd əz cənabe-dust,
Dər zemnə-hər fəsad səlahi moqərrərəst[349].

Mərhum Qüdsinin mütəəddid əsərlərindən məşhur olanları bunlardır: "Gülüstani-İrəm"*. – fars dilində. Bu kitabın məalı Dağıstan tarixinə, övza'vü əhvalına, onda sükunət edən müxtəlif tayfaların dolanacağına, adatü ayinlərinə və dillərinə dair mə'lumatdan ibarətdir[350].

"Asari-Dağıstan" kitabının müəllifi mərhum Mirzə Həsən əfəndi Əlqədari, – necə ki, özü yazır,– "Gülüstani-İrəm"dən xeyli mə'lumat və mühüm əhvalat öz kitabı üçün əxzü istixrac edib, farsdan türkə tərcümə qılmışdır.

Necə ki, "Gülüstani-İrəm"də təhrir olunubdur, Qüdsinin başqa təsnifatı bunlardır:

1. "Riyazül-qüds" – türk dilində. Bu kitabın mündəricatı əhli-beyti-rəsulullah səlləllahu taala əleyhi və səlləmin vəqayei xüsusundadır.

2. "Qanuni-Qüdsi" – sərfü nəhvi-farsi. Bu kitabdan bir nüsxə həqirdə vardır. Mərhum müsənnif sərfü-nəhvin qəvaid və üsulunu şərh və bəyan etdikdə hər bir qayda və üsul üçün fars dilində bə'zi əbyat, rübaiyyat və misralar timsal gətirir. Onlardan bə'zini fars şairlərinin kəlamlarından iqtibas etmişdir və bə'zini öz təb'i-füsunsazı ilə vücuda gətirmişdir.

3. "Kəşfül-qərayib" – fars dilində. Yeni dünyanın – Amerikanın kəşfi və həvalı xüsusunda.

4. "Təhzibül-əxlaq" – maarifi-əşya babında, fars dilində.

5. "Kitabi-nəsihət" – türk dilində[352].

6. "Eynül-mizan" – ərəb dilində. İki babdan ibarətdir.

7. "Əsrari-mələkut" – fars və ərəb dillərində elmi-nücum və hey'ət babında yazılmış əsərdir. Burada mərhum Abbasqulu ağa elmi-nücumdan verdiyi mə'lumatı Qur'anın ayatı rəsuli-xudanın qövlü ilə tətbiq etmişdir.

8. "Ümumi-coğrafiya" – fars dilində.

9. "Müşkatül-ənvar" – fars dilində əxlaqa dair mənzum əsərdir.

10. "Mir'atül-cəmal" – farsca əş'ar.

11. "Kitabi-Əsgəriyyə". Quba əhlindən Əsgər adlı bir cavanın keyfiyyəti-halı və güzarişi-məalı xüsusunda təsnif olunmuşdur. Bu, xırdaca və baməzə, türk lisanında nəsrən və nəzmən təlif olunmuş bir hekayədir. Mərhum Mirzə Əbülhəsən bəyə Vəzirov "Zöv'i" təxəllüsün "Qəvaidi-Zöv'iyyə"[353] nam məcmuəsində təb' olunmuşdur.

Bunlardan əlavə mərhum Abbasqulu ağanın bir çox təsnifatı və hər qisim əş'ar və kəlamı vardır. Heyfa ki, onlar bu halda çətinlik ilə tapılır. Həqir bu barədə çox çalışsa da ki, onlardan mümkün olan qədəri ələ gətirsin, müyəssər olmadı. Bu xüsusda mərhum Mirzə Həsən əfəndi

* Bu əsəri mərhum Abbasqulu ağa özü ruscaya tərcümə edib imperaturi-Rus Nikolayi-əvvələ təqdim etmişdir və imperatorun əmri ilə təb' olunmuşdur[351].



Əlqədari söz vermişdi, sə'd əfsus ki, ona da əcəldən macal olmadı[354]. Ancaq Mehdi bəy Hacınski[355] vasitəsilə "Nəsihətnamə"dən bir nüsxə əlimizə yetişdi və Quba şairlərinin tərcümeyi-halı, əş'ar və asarı xüsusunda bir çox mə'lumat ol cənabın himmət və sə'yi ilə hasil olundu.

Barı əldə olanlara qane olub, onun qüvveyi-şe'riyyəsini, dərəceyi-kəmal və mə'rifətini və filcümlə hansı bir məslək və rəvişdə olmasını bəyan etmək üçün nümunələr göstərməyi lazım gördük.

"Kitabi-Əsgəriyyə"nin başında mərhum Abbasqulu ağa bu günə lisani-bəlağətsənci ilə göftara gəlib deyir: "Pabəsteyi-səlasili-möhnət və giriftari-zindani-məhəbbət. Bəsteyi-dami-ə'ləm, pamali-ənduhü məlal, Bülbüli-gülzari-möhnət qüdsiyi-şuridəhal.

Bu rəsmi-dilaviz ilə firqeyi-ülul-əlbabə bəyani-mafilbal etmiş kim, riyazi-vücudi-bəşəriyyədə qisim-qisim möhnət və ənduh nihalı yədi-qüdrət ilə əkilibdir və insanın sinəsi beş gün məsrur olsa da, on gün qəm və qüssə ilə malamal olur. Bainhəmə labüdən aləmi-surətdə iqtizayi-təbiəti-bəşəri oldur ki, hər kimsə gərəkdir bir növ mənzur ilə cilabəxşi-didə və dil olub övqati-şərifini zaye' və ömri-əzizini bihudə keçirməsin və bəzmi-həvadisdə cami-qəflətdən təb'i-talibi-huşyarə badeyi-cəhl içirməsin:

Hər dildə ki, yox nişaneyi-eşq,
Arayişi-qəm, fəsaneyi-eşq,
Əlbəttə, deyil kəmalə qabil,
Övqatı keçər, vəli nə hasil?
Bibəhrə qalır bu müddəadən,
Təhsili-ləzayizi-səfadən.
Ey dil, tuta gör xəyal zövqün,
Ta dərk edəsən vüsal zövqün.
Eşq ilə cahanda biniyaz ol,
Amma rəvişində pakbaz ol!
Dəhr etsə əgər cəfa iradə,
Sindan kimi səxtdir vəfadə,
Vər başına çalsa dəsti-matəm –
Çakūç kimi çərx, çəkmə sən qəm.
Ah ilə olur dəhən yolu bənd,
Ləbrizi-şərarə kurə manənd".

Qüdsinin bu kəlami-mövzunu xoşməzmun və layiqi-təhsin kəlamlardan birisidir. Övqatını dünyada bixəbər və biəsər keçirənlər və qəlbləri mehr və məhəbbətdən xali qalanlar, fəraqın cəfasını və vüsalın səfasını görməyənlər, dünyanın keşməkeşinə, bərkinə və boşuna düşməyənlər, ənva'i-zəhmətlərə və əqsami-məşəqqətlərə düçar olmayanlar, murad və

məqsədə vasil olmaq yolunda candan və başdan keçməyənlər, əlbəttə, bi-cövhər, kəsif və qafil kəslərdir ki. onların vücudu ilə ədəmi beynində bir təfavüt yoxdur. Onlar, necə ki, şair deyir:

Bibəhrə qalır bu müddəadən,
Təhsili-ləzayizi-səfadən.

Könül evini eşq zövqü həvası ilə mə'mur edənlər və məhəbbət nuru ilə işıqlandıranlar, rəvişlərində pakbaz və müstəqim olanlar dəhrin cəfası müqabilində gərəkdir zindan kimi səxt dursunlar və dəsti-qəza yas və matəm çəkicini onların başına çaldıqda qəm və ə'ləm çəkməsinlər; hər bir cəhətdə öz qissə və niyyətlərində, rəviş və məsləklərində səbat və dəyanət göstərsinlər.

Qüdsinin atidə dərc olunmuş müxəmməsi dəxi yuxarıda yazdığımız bəyanatı bir növ təsdiq eləyir ki, aşiqi-sadiq dost yolunda sabitqədəm olub, gərəkdir can və başdan keçsin.

## MÜXƏMMƏSİ-QÜDSİ

Dila, əzm eylə sən bülbülsifət gülzarə, bismillah,
Muradın olsa meyl etmək fəğanü zarə, bismillah,
Gər istərsən müdam olmaq cigər sədparə, bismillah,
Qərəz, fikrin tamaşadır əgər dildara, bismillah,
Nəzər qıl lə'li-canbəxşü ruxi-gülnarə, bismillah.

Təmənnasında gün-gündən məni-dilxuni şeyda qıl,
Gərəkməz namü namusum, qəmi-eşq ilə rüsva qıl,
Verib dünyavü din nəqdin məta'i-vəslə sövda qıl,
Əgər yox dəstrəs sövdayə, barı get, tamaşa qıl.
Gəlibdir Yusifi-gülpirəhən bazarə, bismillah.

Çəkərdin arizu daim, deyərdin şövqi-yar ilə –
Ki, düşsün ittifaqi-vəslət ol siminüzar ilə,
Edim canım ona təslim zövqü etibar ilə,
Durubdur ol büti-sərməst tiği-abdar ilə,
Sözün gər doğrudur, ey aşiqi-biçarə, bismillah.

Demişdin, ey büti-tərsanigəh, bərhəmzəni-aləm –
Ki, etməm aşiqimdən mən yaman gün iltifatım kəm,
Alıbdır səbrimi dərdü bəla, can qəsdin eylər həm,
Əgər iqrarı sabitsən, vəfa həngamidir bu dəm,
Tərəhhüm qıl, qədəm bas dideyi-xunbarə, bismillah.



Olubdur qərqi-xunabi-cigər çeşmi-tərin, Qüdsi,
Yanıbdır daği-möhnətdən dili-qəmpərvərin, Qüdsi,
Gətir təqrirə, bir-bir yarə ərz et qəmlərin, Qüdsi,
Əgər bu şivədən dilgir olursa dilbərin, Qüdsi,
Şüru' eylə bir özgə vəch ilə izharə, bismillah.

Qüdsinin bu müxəmməsini Əli bəy Hüseynzadə "Füyuzat" nam jurnalının 28-ci nömrəsində şairin öz təsviri altında dərc etmişdir[356]. "Qəvaidi-Zöv'iyyə"də dəxi bu müxəmməs mətbudur.

Qəzəllərindən bir-ikisini nümunə üçün burada dərc edirik.

## QƏZƏLİ-QÜDSİ

Arizu eylər könül dildar gəlsin, gəlmədi,
Zülfi kafir, gözləri xunxar gəlsin, gəlmədi.

Hər pərivəş cilveyi-hüsn eyləmiş, mən gözlədim
Dilrübalər föveünə sərdar gəlsin, gəlmədi.

Cana gəldim bivəfalər ülfətindən, istərəm
Bir vəfa rəsmində sabit yar gəlsin, gəlmədi.

Dərdü möhnət keçdi həddən, bəs ki, çəkdim intizar,
Gözlədim ol şux gülruxsar gəlsin, gəlmədi.

Ləhceyi-canpərvərindən şur salsın aləmə,
Əndəlibi-sahəti-gülzar gəlsin, gəlmədi.

İstədim, Qüdsi, deyim vəsfi-cəmalın dilbərin,
Kuşiş etdim zinəti-göftar gəlsin, gəlmədi.

Əyzən qəzəli-Qüdsi:

Çox gözdə sürmə, əldə həna, üzdə xal olur,
Nisbət bu qaşü bu gözə bənzər məhal olur.

"Qaf"i-qaşın, o "ta"yi-telin, "lam"i-ləblərin,
Adəmdə əlbir eyləsə, billah, "qital" olur.

Lövhi-xəyalə hər necə tərh eyləsəm qaşın,
Gəlməz xəyalə, axırı məhz xəyal olur.

Sirri-dəhanı sordum o şəkkərdodaqdan,
Pünhan danış bu sirri – dedi – qilü-qal olur.

Görcək o atəşin üzünü nitqim oldu lal,
Qüdsi, cərəs düşəndə oda zəngi lal olur.

Qüdsinin nəzm ilə yazılmış bir naməsi dəxi onun gözəl şeirlərindən birisidir. Haman namə burada eyni ilə dərc olunur:

Sən orda səfa ilə
Dilculər arasında.
Mən qalmışam avarə
Gürcülər arasında.

Dərdü qəmi-hicrandan
Qürbətdə pərişanəm.
Döndü cigərim qanə
Qeyğulər arasında.

Gürcüstan gözəllərini şair tə'rif edib deyir:

Bir yanə əgər baxsam,
Qəm çəkmək olur bica.
Bunlar kimi məhtələt
Xoşxulər arasında.

Hər canibə əzm etsəm,
Əzbəs ki, gözəl çoxdur,
Tutisifətəm heyran
Güzgulər arasında.

Əbr içrə günəş manənd
Pərtov salır afaqə,
Ruxsarəsi hər şuxun
Giysulər arasında.

Yüz işvəvü mehr ilə
Aşiqlərə meyl etmək
Bu şəhrdə adətdir
Məhrulər arasında.

Bunları görüb, Qüdsi,
Hər kimsə ki, aqildir,
Qılmaz özünü rüsva
Bədgulər arasında.

Qüdsinin bu kəlamına nəzirə olaraq Qarabağ şairlərindən bir neçəsi bu misilli şeirlər yazmışlar. Onlardan məşhuru Mirzə Əliəsğər "Novrəs" təxəllüslü şairin qəzəlidir ki, bu sayaq başlanır:



Könlüm elə pünhandır
Giysulər arasında,
Şanə gəzibən tapmaz
Yüz mulər arasında...

Bu mürəbbe öz mövqeində yazılacaqdır.

Rusların ədibi və təmsilnəvisi Krılovun[357] təmsilatından "Eşşək və bülbül" ünvanı ilə yazılmış qissəni mərhum Abbasqulu ağa türkə bu gunə tərcümə etmişdir:

Nəqldir bülbülü görüb eşşək,
Dedi: "Qəlbimdə vardır üqdeyi-şək.

Xəlq edər sövtü ləhcəni tə'rif,
İstərəm mən həm eyləyim tövsif.

Ey olan hüsni-sövtdə mə'ruf,
Eylə bu şəkk üqdəsin məkşuf.

Xəlq əqvalı ta ola mə'lum,
Sidqü kizbini mən edim məfhum.

Et bu dəm bir nəvayi-xoş avaz,
Qıl qəbul iltimasım, eyləmə naz".

Eşşəyin iltimasın ol bülbül
Çün qəbul etdi, eylədi ğülğül.

Guşini tutdu xər ki, çün nasus,
Özü həm durdu sakitü salus.

Eşidib sövtü nəğməsini tamam,
Dedi: "sə'd heyf, heyf, heyf müdam.

Gərçi aləm içindəsən məşhur,
Şöhrəti-kizbə olma sən məğrur!

Nəğmədə nəqs çox və leyk, əfsus,
Sənə tə'lim etməyibdi xorus.

Nə xoşavazdır xorusi-səba,
Qəlbi şad eyləyir qılanda nəva".

Bülbülə sözləri edib tə'sir,
Dedi: "Xoşdur sənə həmişə nəfir.

Ləhni-sövtüm edər cahana əsər,
Sənə tə'sir etmədi, ey xər!"

Bülbül azürdə eylədi pərvaz,
Bu misal ilə çox olur pərdaz.

Ol kəsin halı matdır, heyran,
Özü aqil, mürəccəhi nadan.

Bizə xaliq ola müinü pənah
Cahil hakim edəndə əmri-təbah.

Bu təmsili indiki həyat üzrə olan şairlərimizdən bə'ziləri tə'limi-ətfalə məxsus tərtib olunan kitabçalar üçün rusdan türkə tərcümə etmişlər[358], vəli heç biri belə xoş səbkdə və şairanə tərcümə edə bilməyibdir. Burada Qüdsi təmsili sözbəsöz – təhtəl-ləfz tərcümə etməyibdir. Ancaq onun mə'nasını özü xoşladığı tərzdə nəzmə çəkibdir.

Krılov bülbülün gözəl nəğmələrini və zərif sövtünü tövsif edibdir. Abbasqulu ağa isə eşşəyin halətinə və onun xoruzu mədh etməsinə diqqət yetiribdir. Eşşəyin nə halət üzrə bülbül oxuduğu əsnada durmasını şair artıq məharətlə bir beytdə bəyan edir:

Guşini tutdu xər ki, çün nasus,
Özü həm durdu sakitü salus.

Abbasqulu ağanın bu şairanə tərcüməsi hər bir qiraət kitabçasını zinətləndirə bilər. Vəli, çifayda, hər kəs öz yazdığını sevir; yaxşı-yamana tərcih verən yoxdur!..

Mərhum Abbasqulu ağa həcv yazan və ləğv söyləyən şairlərimizdən deyil idi. Onun yazdıqları ya həqiqi eşqdən, ya ülumi-mütənəvveədən və ya pənd və nəsayihdən ibarətdir. Vəli Təbriz bələdəsinə müsafirət edib orada bir neçə müddət məksu iqamət etdiyi zamanı Təbriz əhlinin şə'nində bir neçə qılıncdan kəskiniraq şeirlər yazmışdır ki, onlardan bə'zini burada dərc edirik:

Əya güruhi-sitəmgər, əhaliyi-Təbriz,
Vəfa yerinə cəfa sizdə bu nə adətdir?!

Nə elmə talib olan var, nə mənidən agah,
Görüm, ilahi, dağılsın, necə vilayətdir?!

Nə rahü rəsmi-nəsara, nə şiveyi-islam,
Nə bütpərəst süluki, bular nə millətdir?!



Nə qədər seyr elədim küçə ilə bazarı,
Adam çox az görünür, izdihami-kəsrətdir.

Vüfuri vardır üç firqənin bu kişvərdə,
Axund ilə xərü xan bihədü nəhayətdir.

Onun əmmaməsi rəngin, bunun yükü səngin,
Xüsusən, ol birinin cübbəsi qiyamətdir.

Xəri çıxart aradan, bunlara şəbahəti yox,
O binəvanın işi rənc ilə riyazətdir.

Axund ilə xana hər tə'nə eyləsən yaraşır,
Bu müftəxorların əndişəsi şərarətdir.

Kimin ki, xülqü müzəyyəndir, istəməz zivər,
Kişi özün bəzəmək cəhldən əlamətdir.

Yetişdi iş o yerə hər kəsin ki, saqqalı –
Hənalı, olsa uzun, hörməti ziyadətdir.

Ha böylə olsa parak, tazı tuladan yekdir,
Sürü içində siyiz sahibi-kəramətdir.

Bu şeirləri mərhum Abbasqulu ağa həştad sənə bundan irəli yazmışdır. Əgər indi "İbrahim bəyin səyahətnamə"sinə[359] diqqət yetirilsə, yəqinlik hasil olar ki, bu müddəti-mütəmadiyyənin ərzində Təbriz əhalisinin əhvali-ictimaiyyəsi, övza'i-məişəti və əxlaqi-rəziləsi sabiqi qərar üzrə davam etməkdədir. Bu uzun müddətlərdə cümlə millətlər ayılıb tərəqqi etdikdə müsəlmanlar yatmaqdan usanmadılar; yatdılar və belə fəna hala düşdülər, məğlub və mə'yus oldular...

Belə rəvayət olunur ki, Qüdsi cənabları Təbrizdə olan zamanı məhərrəmül-həram ayı imiş. Orada vəliəhdin ziyadə şükuhlu və pürzinət təkyəsinə güzəri düşdükdə onun divarında bu şe'ri yazılmış görübdür:

Bu sərbazü əsasi-şahzadə
Olaydı kaş o dəmdə Kərbəladə.

Mərhum Qüdsi bir növ fürsət bulub, onun aşağısında bədahətən bu cavabı qeyd etmişdir:

Büsati-cəng olan saət qaçardı,
Qoyardı sərvəri-dini aradə.

Bu keyfiyyətin haqq və savab olması ravinin öhdəsinə həvalə olunur.
Mərhum Hacı Abbasqulu ağanın fars dilində yazılmış bir çox abdar və dilpəsənd əş'arı vardır ki, onlardan bə'ziləri farsların böyük şairləri yazdığı kəlama bərabərdir. Burada ancaq onun eşqi-həqiqi barəsində yazdığı məsnəvini dərc etməyə iktifa edirik.

## MƏSNƏVİLYİ-ABBASQULU AĞA

Ey xoda xahəm ğəmo rənco bəla,
Ey bəlayəşra tə'no canəm fəda!

Micəhət birun dele-divaneəm,
Mikeşəd bər canebe-meyxaneəm.

Şouğ xod suzist, ma pərvaneim,
Leyk mohtace-yeki pərva neim.

Pak suz in nimsuze-xişra,
Nuşdaru bəxş sine rişra.

Eşqe-Şirin bər sərəm şuri fekənd,
Kuhkənra baz şod tişe bolənd.

Kuhkən mən nistəm, nə Vameqəm,
Mən nə bər Şirino Əzra aşeqəm.

Aşeqəm bər Leyliyi-keşkarvan,
Çon cərəs dər şureşəndo dər fəğan.

Darəd u yek məhmələ-naqe cəhan,
Comle əndər zire-barəş natəvan.

Ey cəhan heyrano sərgərdane-to
Vey tə'no canəm bəla gərdane-to.

Ey to mə'şuq, eyto aşeq, ey to yar,
Ey to qazi, ey to Mənsur, ey to dar.

Mər məra dadi dele-divanei,
Xanesuzo əz xerəd biganei.

Ba məhəbbəthaye-xiş amixti,
Bər dərunəm eşqe-Leyli rixti.

Eşqe-Leyli şolevər Şod dər deləm,
Baz Məcnun gəşt rə'ye-aqeləm.



Pare kərdəm selsele-tədbirra,
Mən nəxahəm bəd əz in zəncirra.

Baz kon in selsele əz gərdənəm,
Xod rəvəm anca ke, xahi bordənəm.

Əz koca mən cuyəmət, ey bineşan,
Mən nədanəm dər koca dari məkan.

Gəh ze Kəbe cuyəmət, gahi ze deyr,
Gəh bəre-xod yabəmət, gəh pişe-ğeyr.

Gəh ço ənqa bineşan kaşanei,
Gəh ço şəməndər dərune-xanei,

Minədanəm əz bərayət mənzeli,
İn qədr danəm ki, saken dər deli.

Afərin bər eşq, bər ğouğaye-eşq,
Baz bixod gəştəm əz soudaye-eşq.

Eşq atəş zəd məra sər ta bepa,
Mərhəba, ey eşqe-xuni, mərhəba!

Eşq bər aləm fekənde ğolğole,
Eşq Şirinra zəde dər selsele.

Eşq sazəd atəş, abo xakra,
Eşq suzəd xərmənе-əflakra.

Eşq bir şahan dahəd əczo niyaz,
Mikonəd Məhmudra bənde-Əyaz.

Ney, xəta şod, mən kocavo aşeqi,
Eşq bərtər kare-hər nalayeqi.

Eşqbazi nist kare-hiç kəs,
Minəyayəd kare-şahin əz məgəs.

Aşeqi kare-Hoseyne-təşneəst,
Ku həmi təşne bezəxme dəşneəst.

Zəxme-tiğo xəncəro tiro kəman
Bər şəhe-din mizədənd an kafəran,

U həmi miqoft ba suze-cegər,
Zende şod canəm, bezən zəxme-degər.

Mər məra, ey kaş, sə'd can mişodi,
Ta həme isare-canan mişodi.

Ey dəriğa, canəm əz yek biş nist,
Tohfeye-zin biş dər dərviş nist.

Minədarəd məğz an aşeq ke, pust,
Çak minətvan dər rahe-dust.

Məğz çe bud, şust çe bud, dust dust,
Aşeqanra eyne-məqsud ust, ust.

Ey qoman darid ke, quya ey qoruh
Kəz atəş mən amadəstəm bər sotuh.

Ab əgər xahəm, zəmin dərya şəvəd,
Xak dər afaq napeyda şəvəd.

Mən nə təşne, səlsəbile-kousərəm,
Abe-heyvanəst əz pa ta sərəm.

Hokməm ər bər əkse-in douran şəvəd,
Aseman saken, zəmin gərdan şəvəd.

Bər dərid, ey kaferan, in pərdera,
Həm nəhid in qalebe-əfsordera.

İn tə'ne-lağər miyane-mast, han,
Bər keşid in pərdera xoş zin miyan.

Ney xəta şod tə'n həm əz canəst can,
Can ze tə'n başəd əgər bini ə'yan.

Minədidi çon sərayəd Mouləvi,
Bolbole-bağe-cinan dər "Məsnəvi":

"Tə'n ze cano can ze tə'n məstur nist,
Leyk kəsra dide-can dəstur nist"[360].

Qüdsinin bu məsnəvisi ustadi-möhtərəmi olan Cəlaləddin Ruminin kəlamına bənzəyir desək, xəta etmiş olmarıq. Məhəbbəti-ilahi və eşqi-həqiqi barəsində yazdığı biri-birindən gözəl və suzişlidir:

Afərin bər eşq, bər ğouğaye-eşq
Baz bixod gəştəm əz soudaye-eşq.



– deyib, şair doğrudan da bixudluq halına düşür və eşqi-həqiqini tə'rif edir, özünə xitabən deyir: Mən hara, eşq hara!.. Eşq mənim kimi üftadə və fürumayələrin şə'nindən bərtərdir. Şahinin hünəri məqsəddən bəid olduğu kimi, aşiqlik hünəri də bizim kimi gədalardan uzaqdır.

Aşiq olmaqlıq məhz Kərbəla şəhidi, dodaqları ətəşdən parçalanmış İmam Hüseyn əleyhissəlamın işidir ki, ona eşq yolunda, din və həqqaniyyət uğrunda nə şədər xəncər, ox və nizə vururdularsa, yenə də o, suzicigərlə deyirdi: Vurun! Sizin zəxminizdən canım zində olur. Kaş yüz canım ola idi ki, canan yolunda onları fəda edəydim.

Mərhum Hacı Abbasqulu ağa təlif etdiyi əsərlərdən "Nəsihətnamə"yə gəldikdə, onların məalından mərhumun fazil, alim və həkim bir şəxs olduğu görünür.

Bu kitab 102 həkimanə nəsihətlərdən ibarətdir[361] ki, mərhum Qüdsi onları tə'limi-ətfal üçün tərqim etmişdir. Ziyadə sadə və açıq dildə olan bu nəsihətləri böyüklər də gərəkdir dərguş edib, onlara əməl etsinlər, ta ki, özləri üçün nicat və səadət yolunu bulsunlar.

"Kitabi-nəsihət"i mərhum Qüdsi cənab həqqə həmdü səna edib və rəsuli-əkrəmimizə səlatü səlam göndərdikdən sonra belə başlayır: "Günahkarlığa və acizliyə iqraredici bəndə Abbasqulu İkinci Mirzə Məhəmməd xanın oğlu Bakui (Allah onların hər ikisinə cənnət ilə nicat versin!) hərçənd uşaqlara tə'lim verməkdən ötrü axtardım, aralıqda bir nüsxə görmədim ki ləfzdə və mə'nada asan olub, onların xülqlərinin göyçəkliyinə dəlalət eləsin.

Danışılmış və yazılmış nüsxələrin bə'zisi ibarətdə və bə'zisi mə'nada bir növ qarışıqdır ki, çox tə'lim edənlər özləri onları anlamırlar və bir parasında dəxi mətləblər elə uzun və pərişandır ki, onu zəbt etmək və anlamaq müşkül görünür. Bu səbəbdən bu sözün mə'nasından ki, "Əlelmü fissuğri kənnəqşi filhəcəri" yə'ni uşaqlıqda elm öyrənmək daşda nəqş salan kimidir, qəflət vaqe olmasın, xülqün göyçəkliyini istəyən gərəkdir uşaqlıqda dərs versin. Çünki sonradan pis olan xasiyyət və adətlər bərqərarlıq səbəbilə təbiətdə qərar tutsa, elmü ədəb insana müşkül əsər eylər. Bəs buna görə, tarixi-islamiyyənin 1252-ci[362] ilində bir müxtəsər kitab – ki, ibarat və mə'nada asan və aşikardır, "Nəsihət" adı ilə adlanmış olsun, – təlif etdim. Belə ki, minnətləri bağışlayan Allahın mərhəmətinə ümid tuturam ki, onun faydası uşaqlara artıqraq olsun.

Uşaqlara xitabdır: "Mənim əzizim, sən insansan. Allah-taala insanı aləmdə hamı şeydən yaxşıraq yaradıbdır. Görmürsən ki, heyvanlar o qədər güc və böyüklük ilə insanın əlində giriftardırlar?! Bu, ancaq işlərin tərzini bilmək səbəbindəndir. Bu insan tayfasının arasında dəxi hər kəs iş

bilən və yaxşı işlidir, həmişə hörmətli olur. Bəs, yaxşı işləməyin və iş bilməyin tərzini öyrənmək lazımdır o adamlardan ki, yaxşı-yamanı təhqiq və təcrübə ilə mə'lum ediblər, onların sözləri bizdən ötrü nəsihətdir". Bundan sonra nəsihətlərin yazmağına şüru' edir ki, cümləsinin buraya küncayişi yoxdur.

Bu müqəddimədən möhtərəm oxucularımız görürlər ki, mərhum Qüdsi nə qədər alim və fazil bir şəxs imişsə də, yazısında sadəliyi və güşadəliyi qəliz və dolaşıq ibarələrə tərcih verirmiş.

Böyük ədiblərin yazısı həmişə belə açıq və sadə olur. Mirzə Fətəli Axundzadənin[363], Qasım bəy Zakirin, Həsən bəy Məlikzadənin[364] asari-qələmiyyələri bizim bu qövlümüzə şahiddir. Rus şüəra və ədiblərindən ən məşhurları – Puşkin, Nekrasov[365], Turgenev[366], Tolstoy[367] və Çexov[368] öz əsərlərini belə açıq, sadə və rəvan dildə yazıblar.

Qəliz, çətin və dolaşıq dildə yazan ədiblərin fikirləri də dolaşıq olur; onların əsərləri çətin və ağır oxunulur və insana fərəh əvəzinə qəm və kədər gətirir.

## "Kitabi-nəsihət"dən bir neçə nəsihətlər

Əxlaq, adab və xəlayiqlə hüsni-müamilə və müaşirət etmək babında yazır:

20. Hər kəsə ki, yetişdin, salam ver. Əgər sənə söz desə, ona ədəb və hörmət ilə cavab ver, ta hamı səni dost və əziz tutsun.

21. Elə kimsələr ilə yoldaşlıq elə ki, böyüklər onlara yaxşı desinlər. Əclaf və hərzəgu adamlardan uzaq ol, ta sən dəxi onlar kimi olmayasan.

22. Çün bir adamı möhtac gördün, hər nə qədər mümkün olsa, ona kömək eləməkdə müzayiqə eləmə, tainki özgələr dəxi ehtiyac vaxtında sənə kömək eləsinlər.

23. Heç kəsin yamanlığını bir şəxsin yanında danışma, çünki o adam əgər dostdur, sənin haqqında bədgüman olar, əgər düşməndir, sənin dediyini o kəsə yetirər.

24. Yalan deməkdən özünü saxla. Çün bir kimsənə bu xasiyyəti səndə bilsə, sənin doğru sözünə dəxi bavər etməz.

25. Bir şəxs ki, gəlib özgənin eybini sənin yanında desə, ondan uzaq ol ki, sənin də eybini özgələrə deyər.

27. Qəzəb vaxtı insanın halı pərişan olur. Özünü o halda hamı şeydən qırağa tut. Bir işi ki, eləmək istədin, qəzəbin sakit olandan sonra elə.

29. Bikarlıqdan qorx ki, hamı eyiblərdən pisdir. Bunu bilməlisən ki, heç bir şey aləmdə bikar deyil.



30. Hamı şeyi Allah-taala öz aləminin nizamından ötrü səbəblər yaradıbdır ki, birisi o birisiz qaim olmaz. Sən də onlardan birisən. Əgər bikar oturarsan, daş və palçıq səndən yaxşıraq olar, çünki onlar tə'mirat işlərinə gərəkdir.

31. Elm və kəmalın təhsilini hamı işlərdən əzizraq say. Ondan ötrü ki, hamı şeylər onların vasitəsilə müyəssər olar.

35. Şuxluğu və zarafatı özünə adət eləmə. Ondan ötrü ki, nəzərlərdə xəfif görünərsən; rişxənd səbəbi ilə özgələr səndən inciyərlər. Hətta ehtimal var ki, yamanlığa dəxi qəsd eləsinlər.

36. Mübahisədə əgər bir kimsəyə qalib oldun, elə etmə ki, onun nadanlığı hazırda olanlara mə'lum olsun, tainki bu səbəbdən sənin ədavətin onun ürəyində məqam tutsun və o şəxs dəxi səndən intiqam almaqdan ötrü fürsət vaxtını gözləsin.

37. Danışıq vaxtı göftügu fürsətini özgələrə ver. Ehtimal vardır ki, hiyləgər şəxs səhv edib müddəanın həqiqətini bəyan eləsin. Əgər sən çox danışsan, xəta və nöqsan sənin tərəfində olur.

40. Çün bir müsibətə giriftar oldun, səbr elə və öz müsibətini xalqın yanında izhar eləmə ki, əgər düşməndirlər, sənin müsibətin onların tə'ninə səbəb və qüvvətlərinin artıq olmağına bais olacaqdır və əgər biganədirlər, onların nəzərində həqir olmuş olarsan və əgər dostdurlar, onların qəmgin olmağına və sənin müsibətinin təzələnməyinə bais olur.

41. Pakdamənliyi, yə'ni təmizxasiyyətliyi özünə adət elə. Hər kəsi ki, fəsad işlərə mürtəkib olar, onun dini və həyası gedər və xalq içində tez biabru və rüsvay olar.

66. Nə qədər ki, yaxşılıq ehtimalı var, özgələri yamanlığa həml eləmə. Bəlkə o yaxşı işdir, ancan sən onun məsləhətini bilmirsən.

68. O şey ki, özünə görə yaman sayırsan, özgənin haqqında rəva görmə, tainki onun cəzası özgədən sənə qayıtmasın.

71. Heç bir kəsin zərərinə razı olma. Alış-verişdə pakhesab ol. Əmanətə xəyanət eləmə, tainki Allah-taalanın qəzəbinə gəlməyəsən və xəlayiqin mərdudu olmayasan.

73. Öz qonşularının və həmşəhr adamlarının yaxşılığına çalış, ta onlar da sənin ilə həmin şivədə rəftar və müraat eləsinlər, sən bir nəfərsən, onlar çoxdur. Bir nəfərin ehtiyacı çoxa olmaq aşikardır.

80. Bir kəsin ədavətinə ürəyində yer vermə ki, sənin dininin və ürəyinin rahatlığını bərhəm edər.

84. Yaman işi ki, edərsən, onun faydası səndən ötrü qalmaz, amma onun günahı və bədnamlığı sənə baqi qalar.

85. Yaxşı əməldən iki dəfə ləzzət apararsan. Birisini o işi edən vaxtda, birisini də işin səmərəsi sənə yetişən zamanda.

87. Çün hamı şey üçün aləmdə zail olmaq ehtimalı vardır, özünü heç zada elə bağlama ki, məbada bir gün o şey zaval tapsa, sənin zindəganlığın müşkül olsun.

89. Fəqirlikdən və bədbəxtlikdən şikayət eləmə ki, aləmdə səndən fəqir və biçarəraq çox vardır. Onlar əgər sənin halında olsa idilər, çox şadlıq edərdilər.

96. Bədbəxt o şəxsdir ki, bir kəsin haqqında yaxşılıq etmək fürsəti olduqda, etmir. Bavücudi-in ki, insan üçün şükr eləmək vacibdir ki, o özü kimi bir adama vəliyyün-nemə olubdur.

Burada bu qədər yazılana iktifa etdik. Cümləsi gözəl nəsihətlərdir ki, onları dərguş edənlər bəxtiyar kimsələrdir. Mümaileyhin yazdığı nəsihətlər bir-birinə bağlıdır və yek-digərini şərhü bəyan edir. Və lakin biz burada yazdığımız insanın müxtəlif hal və xasiyyətlərinə və xəlayiqlə hüsni-müaşirətinə şamil olanlardır.

Bilmək gərəkdir, mərhum Abbasqulu ağanın qızı Tuğra xanım dəxi şairə imiş. Aşağıda yazılan şeir onun kəlamındandır:

Tuğra xanımam, aləm ara çünki əzizəm,
Abbasqulu ağa qızı, Zəhrayə[369] kənizəm.



# MİRZƏ HƏSƏN "MİRZƏ" TƏXƏLLÜS

Qüdsiyi-cənnətməkanın müasirlərindən Qazax şairləri Mustafa ağa Arif və Kazım ağa Salikdən başqa Qarabağ xanlığında dəxi bir neçə xoştəb' şüəra var imiş ki, onların isimləri atidə zikr olunur.

Mirzə Həsən İbrahim xanın müqərriblərindən Əliməhəmməd ağanın nəvəsi və Mirzə Cəfərin oğludur. Mirzə Həsən ziyadə mə'rifətli, xoşxülq və sahibcamal bir zat imiş və təb'i-şe'riyyəsi də var imiş.

Əvaili-sinnində tərki-vətən edib Şəki xanlığına müsafirət edir və orada Nuxa şəhərində yeni açılmış rus dəftərxanasında münşilik əmrinə məşğul olur. Vəli ömrünün hənuz cavan çağında haman sərzəmində daribəqaya rehlət edir. Öz vəsiyyətinə görə, cənazəsi əsl vətəni Şuşa şəhərinə nəql olunur və şəhərin şimali-şərqisində bir verst kənarda dəfn olunur və o mərhumun adı ilə məzarıstan ələn adlanır ki, "Mirzə Həsən qəbristanlığı" deyilir.

Mirzə Həsənin qürbətdə vəfatı öz qohum-əqrəbasına və xüsusən, şüəra və ürəfa silkinə artıq dərəcədə tə'sir eləyir və hər birisi bir növ növhə ilə o mərhumun övsafi-cəmiləsini zikr eləyir. O cümlədən Mirzə Əbülhəsən "Şəhid"[370] təxəllüs bu fərdi onun maddeyi-tarixində demişdir:

Şəhid qoft besale-vəfatəş in mesrə:
Hezar ah əz in qamət hezar əfsus[371].

Bu maddeyi-tarixdən mə'lum olunur ki, Mirzə Həsənin vəfatı hicrətin 1249-cu[372] sənəsində vaqe olubdur.

Mirzeyi-mərhum müasirləri arasında sahibi-kəmal və mə'rifət bir şəxs sayıldığından xatiri artıq dərəcədə əziz tutularmış.

Aşıq Pəri və Aşıq İbn Canı ki, aşağıda tərcümeyi-hallarından bəhs olunacaqdır, onun şə'nində gözəl şeirlər yazmışlar. O cümlədən Aşıq Pərinin Mirzəyə olduğu halda yazdığı namədir ki, burada zikr olunur:

Nə yatıbsan ləhaf bəstər içində,
Bimarmısan, nədir bəs halın sənin?
Eşqin mərizinə mən də təbibəm,
Bəyan eylə mənə əhvalın sənin.

İsmi şərifiniz ada yetişsin,
Mətləb alıb hər murada yetişsin,
Şahlar şahı özü dada yetişsin,
Hifzində saxlasın zəvalın sənin.

Barilaha gülzarına qıymasın,
Xəstə düşüb bimarına qıymasın,
Şirin-şirin göftarına qıymasın,
Bağışlasın qaşı hilalın sənin.

Bir məsəldir: bağban olan bar çəkər,
Əndəlibin meyli gülüzar çəkər,
Allahına bəndə ahü zar çəkər,
Qəm çəkmə, kamildir kəmalın sənin.

Mən Pəriyəm, eşqə zarəm, neyləyim,
Dərdli-dildən xəbərdarəm, neyləyim,
Burda ora intizarəm, neyləyim,
Şəfalansın nuri-vüsalın sənin!

Mirzə Həsən Aşıq Pərinin cavabında yazmışdır:

Bu qəm bəstərində, möhnət içində,
Daim fikrimdədir xəyalın sənin.
Dərmansız dərdimə bulunmaz çarə,
Müyəssər olmasa vüsalın sənin.

Könül adət ahü zarə eyləyir,
Eşq sirri aşikarə eyləyir,
Qoyma, ruzigarım qarə eyləyir –
O zülfün, o xəttin, o xalın sənin.

Qönçə lətafətli, lalə üzlüsən,
Məstanə baxışlı, xumar gözlüsən,
Şirin hərəkətli, şəkər sözlüsən,
Yoxdur yer üzündə misalın sənin.

İltifat eyləyib alıb canımı,
Odlara salıbsan din-imanımı,
Yəqin tirə edər şəbistanımı,
Münəvvər etməsə camalın sənin.

Sən Mirzənin qədrini bil, naz elə,
Səki-rəqiblərdən ehtiraz elə,
Nəcəf bəyə iltifatı az elə,
Həlak elər məni bu halın sənin.

Və yenə Mirzə Həsən Aşıq Pərinin hüsnü camalını belə vəsfü tə'rif qılmışdır:



Lalə yanağında badi-səbadən
Ucu tər cıqqalı tellər oynaşır.
Süzgün baxışında xumar gözlərin
Hiylələr, fitnələr, fe'llər oynaşır.

Cəm olubdur hüsnün, bu vəcahətin,
Yetməsin zəvalə çeşmi-afətin,
Yayınsa bir zaman sərvi-qamətin,
Gözüm içrə qanlı sellər oynaşır.

Boyun yaraşıqda qiyamət eylər,
İşvəni, qəmzəni bu babət eylər,
Ağ məmə köynəyə zərafət eylər,
Kəmər ilə nazik bellər oynaşır.

Mum tək incəlmişəm incə belindən,
Sövdayə düşmüşəm siyəh telindən,
Titrədikcə zülfün səhər yelindən,
Sanasan gülşəndə güllər oynaşır.

Etdikcə vəsfini Mirzə mükərrər,
Təzələnib ruhum olur müəttər,
Gülüstanda zülfün kimi müənbər
Nə susənlər, nə sünbüllər oynaşır.

Vətəni-mə'lufundan diyari-qürbətə hicrət etdiyi əsnada bir dilbəri-şirinməqala xitabən aşağıdakı qəzəli inşad etmişdir:

Əla ey şuxi-şirinkari-bimürvət, xudahafiz,
Qəmi-eşqində bəsdir çəkdiyim zillət, xudahafiz!

Nigara, dövri-ruyində rəqibim şadkam oldu,
Mənəm ancaq olan avareyi-qürbət, xudahafiz!

Könüllər izdihamı, şanə cövrü qoymadı könlüm –
Edə zülfündə bir asayişi-rahət, xudahafiz!

Dərində şad bulsan pasibanın xatiri yetməz
Bu gündən böylə naləmdən ona zəhmət, xudahafiz!

Həsən, bu mahrulərdən vəfavü mehr az istə –
Ki, cövr etmək olur məhvəşlərə adət, xudahafiz!

Məhəmməd bəy "Aşiq"[373] təxəllüs Mirzənin dostu imiş və aralarında dostluq və məvəddət var imiş. Hər ikisi Aşıq Pəriyə bir növ aşiq olub,

onun mədhində şeirlər yazarlarmış. Məhəmməd bəyin bir qəzəlinə cavab olaraq atidəki şeirləri inşad etmişdir:

Yetişdi, Aşiqa, əş'ari-mövzunun bu rüsvayə,
Həmana bəxt saldı başimə guya mənim sayə.

Bu nə əyyami-piridir, yenə nə küştigiridir,
Burax bu şüğlü, ey piran, mənim tək bari bürnayə!

Dolaşma şanə tək sən çox o giysuyi-pərişanə,
İlişsə payinə bir tük, gedər başın bu sövdayə.

Bükülmüş qədd ilə ol sərv baş çəkməz kənarından,
Xədəngi-cansitan müşkül girər böylə pozuq yayə.

Gərək dərd əhli dərdin əhli-dərdə eyləsin hali,
Giriftarəm sənin tək mən də bir sərvi-dilarayə.

Məgər mə'şuqun aşiq qaşını oxşatdı, ey Aşiq,
Yeni ayə və ya yayə, əgər göydən yenə ayə.

Bir ay üzlü, qara gözlü, şəkər sözlü, sözü duzlu,
Beli incə, ağız qönçə, ləbi şəhdi-müsəffayə.

Bu qəzəlin ikinci beytindən belə anlaşılır ki, Məhəmməd bəy sinndə Mirzə Həsəndən böyük imiş. Necə ki, Mirzə ona zərifanə deyir: Sövdayi-eşqi əyyami-piridə boşla və bu şüğlü mənim tək bürnayə – cavana həvalə elə.

Bainhəmə Məhəmməd bəy Mirzə Həsəndən artıq yaşayıbdır.



# KƏRBƏLAYI ABDULLA İBN CANI

Kərbəlayı Abdulla Şuşa şəhərində təvəllüd edibdir. Sahibi-mə'rifət və əhli-hal bir zat olduğu üçün ümumi-ə'yan və əşrafi-vilayət içrə əziz və möhtərəm tutularmış.

Əxlaqı xoş, xasiyyəti gözəl, təb'i-şe'riyyəsi rəvan və səlis İbn Canı məclislər zinəti və məhfillər yaraşığı əziz bir vücud imiş.

Cümlədən artıq onun xatirini mərhum Cəfərqulu xan "Nəva"[374] təxəllüs və Qasım bəy Zakir müraat edərlərmiş. Bədihəguluqda mislü manəndi öz əsrində yox imiş. Güzəranını ticarət ilə keçirərmiş, amma məşğuliyyəti əksər övqat məşşaqlıqda (kimyagərlikdə) keçirmiş. Vəfatı Şuşa şəhərində hicrətin 1255-də[375] 59 sinndə vaqe olubdur[376].

Kərbəlayı Səfi "Valeh"[377] təxəllüs ilə dost imiş və aralarında zarafat var imiş. Bir-birinə lətifə və həzl yolu ilə baməzə şeirlər yazarlarmış. Belə ki, mərhum Valehin Kərbəla ziyarətindən müraciət etdiyi əsnada ona yazmışdır:

Ey Səfi, Şah Nəcəf kuyi sənə məskən ikən,
Niyə ol rövzəni tərk etdin, əgər adam idin?!

Gün kimi olmadı yarın səri-kuyində yerin,
Sən məgər əhli-vəfa bəzminə naməhrəm idin?!

Süst rə'yin səni məhrumi-vüsal etməz idi,
Rəhi-eşq içrə əgər sabitü müstəhkəm idin.

Qürbi-övladi-Əlidir səbəbi-rəhməti-həq,
Sən ki, mənidə məgər cahili-layələm idin?!

Kəhfin əshabını tərk etmədi səg bir saət,
Sən ki, insan idin, əhməq, məgər itdən kəm idin?!

Adəm olsaydın əgər şövq ilə ta şamü səhər
Yar kuyində sədaqətlə gəzən həmdəm idin.

Müstəqim olsa idi eşq ilə təbin daim,
Həlqə tək dərgəhi-mövladə bəsi möhkəm idin.

Dosti-ixlas ilə canan ətəyin tutsa idin,
Şərəfi-rütbədə sultani-qamu aləm idin.

Qənbərə, Valehi mən etmə ki, bəs biqəmdir,
Sən dəxi cahil əgər olsa idin, biqəm idin[378].

Kərbəlayı Səfi Valeh bunun cavabında kuyi-Kərbəladan və dərgəhi-həzrət Əlidən müraciət etməsini bəyan edib Kərbəlayı Abdulla Canızadəyə tə'n etməklə belə bu şeirləri yazmışdır.

## CAVABİ-VALEH

Nə səbəbdən Səfi məhrumi-dəri-Heydərdir,
Kim bilir pərdədəki zişt və ya zivərdir.

Mən əgər feyzü hünər cahiliyəm, lən mənə,
Yoxsa lə'nət sənə gəlsin, bu nə böhtan, şərdir?!

Səfinin ziddi əzazili əzəl Abdulla,
Ona baş əymədi, lə'nət oxuyur, müztərdir.

Ol əbucəhl rəsulun nəyin əksildə bilir,
Daima xübsi-nəbi dildə onun əzbərdir.

Necə kafir də ki, peyğəmbərə əbtər dedilər,
Elmi-təhqiqdə olar şimdi özü əbtərdir.

Arşına əlli güzər and içəni gör ki, mənə,
Elə söylər ki, görən der özü peyğəmbərdir.

Sənin atan ki, tanırsan onu yaxşı məndən,
Siyrəti-zahirə baxma, ürəyi əntərdir.

İbrahim xanın kərimeyi-nəcibəsi Gövhər ağa tə'mir etdirdiyi cameyi-şərifin tarixində inşad etmişdir:

Baniye-məmləkəte-Şişe ke, dər həşməto cah
Tə'ne zəd qobbeye-təxtəş besəra pərdeye-mah,

Yə'ni salare-fələk şoukəte-Ebrahim xan –
Ke, dərəş bər həme xanane-cəhan bud pənah.

Qouhəri daşt derəxşəndevo firuz ke, bud
Pərtove-mahe-roxəş bər sərе-xorşid kolah.

Baniye-məscedo mehrab şod an qouhəre-pak,
Əhle-ferdouse-bərin comle bər in gəşt qovah.

Qələme-əhle-doa zəd rəqəme-tarixəş:
"Bad peyvəste qohər dər sədəfe-lotfe-ilah"[379].



Axırıncı fərdin ikinci misrasından əbcədi-kəbir hesabı ilə belə mə'lum olur ki, Gövhər ağayi-mərhumənin bina etdirdiyi məscidin itmamı tarixi-islamın 1248-ci[380] sənəsinə vaqe olubdur.

Gövhər ağa nə qədər şairin xatirini əziz tutar imişsə də, axırda cüz'i bir əhvalın vüquundan mükəddər olub şairdən incimişdir.

Şair aşıq Qənbər və ya "Riyazül-aşiqin"in müəllifi Məhəmməd ağa Müctəhidzadənin yazdığına görə[381], Kərbəlayı Qəhrəman ismində başqa bir şair Gövhər ağa kimi vəcihə və zərifə bir gözəlin Xankişi bəy kimi elm və mə'rifətdən bibəhrə bir vücuda əqdi-nikah olunmasından rəncidə və mütəğəyyir olub, bu fərdləri Xankişi bəyin haqqında demişdir:

Xərmöhrəyə layiq olmayan xər,
Sə'd heyf, cahanda tapdı Gövhər.

Təqdiri-qəzayə qıl tamaşa,
Axır səni verdi cəhrə başa.

Bu şeirlər Gövhər ağanın səminə yetişdikdə mərhum Kərbəlayı Abdullanı çağırıb ondan qeyz ilə təfəhhüs etmiş ki, nə üçün onun şövhərini belə bədnam edibdir. Şair aşağıda yazılan şeirlər ilə üzrü bəhanə gətirib özünü safa çıxartmışdır:

Ağa, bexodavənde-təalavo yeqane
Əsla xəbərəm nist əz in nəqlo fəsane.

Dirist ke, mən hiç nəquyəm soxən, əmma
Quyənd benaməm soxən əbnaye-zəmane.

Şəhbaz təzərvi ke, beçənqal dər arəd,
Avaz bər arəd həme qonceşke-səmane[382].

Mərhum Mirzə Həsən ona yazdığı bir məktubun cavabında Canızadə onu belə tövsif etmişdir:

Həsəna, sahebe-vəchol-həsəna, simtəna,
Dər qolestane-vəfa taze qolo yasəmənа.

Raqeme-dəftəre-şahi bedəbestane-kəmal,
Məzhəre-dorre-məani benezame-soxəna.

Vəqte-təhrire-romuzate-horufate-xotut
Ənbərəfşan qələmət bər sərе-məşke-xotəna.

Afetaba, qəmərə, dəsteqole-taze-tərə,
Taqəte-tabe-dela, munese-ruhol-bədəna.

Məskənət gəşt Şəki bişəko bişobhevo reyb,
Toi dər şəhre-Şəki mahe-zəmino zəməna.

Nameət vasele-ma, hasele-ma gəşt sorur,
Bemaqalate-ləbe-tutiye-şəkkər şekəna.

Çe rəva Yusefe-ma dur şəvəd əz bəre-ma,
Həmço Yə'qub şəvəm sakene-beytol-həzəna.

Çe rəva del şəvəd əz atəşe-əndişe kəbab,
Mən dər in Şişe konəm gerye, şəvəm nalezəna.

Ey nesare-qədəmət qohəre-dordaneye-əşk,
Vey fədaye-to şəvət cane-cəhan dər bədəna.

Çon səre-zolfe-to soudaye-ğəmət dər səre-ma,
Hale-ma şamo səhər həst pərişanşodəna.

Ya bekoş, ya besərəm saye-fekən bər səre-rah,
Ya bequ aşeqe-sərgəşteye-eşqəm be mə'na.

Yə'ni moştaqe-toəm, hobbo səna mixahəm –
Ke, resi sən be mə'na, ya berasəm mən besəna[383].

Mərhum Cəfərqulu xanın məhbusvar Qarabağdan Tiflisə göndərilməyi babında aşağıda yazılan müxəmməsi inşad qılmışdır:

Ah kim, qalmadı can cismdə canan gedəli,
Oldu hər yerdə ki, canan gedəli, can gedəli,
Tutdu zülmət göz evin şəm'i-şəbistan gedəli,
Oldu viranə könül kişvəri sultan gedəli,
Yə'ni sərdari-cahan, sərvəri-dövran gedəli.

Gül üzün görməyəli olmadı xəndan güllər,
Şəm' odlara yanıb, başına qoydu küllər,
Zülfi sövdasi ilə dərhəm olub sünbüllər,
Necə fəryadü fəğan eyləməsin bülbüllər –
Ki, olub xar ilə həmdəm güli-xəndan gedəli.

Çərx rəhm eyləmədi dideyi-giryanımıza,
Qoydu həsrət bizi ol şəm'i-şəbistanımıza,
Atəşi-hicr ilə od saldı bizim canımıza,
Sancılıb navəki-qəm sineyi-suzanımıza,
Guşeyi-çeşmdən ol kipriyi peykan gedəli.



Çıxdı çün Şişədən ol mahliqa misli-gülab,
Şişə əhlinə bu vəch ilə həram oldu şərab,
Sındı başlarda həva şişəsi manəndi-hübab,
Oldu aləmdə fərəh gülşəni bilmərdə xərab,
Üzü gül, kakili sünbül, xəti reyhan gedəli.

Çəkəli bəzmdən ol ləbləri meygun ətəyin,
Doldurub qan ilə sağər dili-pürxun ətəyin,
Əşk seylabı tutar aşiqi-məhzun ətəyin,
Nola fəryadü fəğanım tuta gərdun ətəyin –
Ki, qara oldu günüm ol məhi-taban gedəli.

Mənəm ol qumrayi-miskin ki, salıb aləmə səs,
Sərv ku-ku deyərəm hüzn ilə ta qət'i-nəfəs,
Abü danəm ələmü qüssə, yerim künci-qəfəs,
Bir zaman eyləməzəm seyri-gülüstanə həvəs
Səhni-gülzardən ol sərvi-xuraman gedəli.

Məqsədim rövzeyi-kuyində budur şamü səhər –
Ki, bula feyzi-vüsalında ziya dideyi-tər,
Ola xaki-qədəmin sürmeyi-ərbabi-bəsər,
Qılasan gülşəni-kuyində olan murə nəzər,
Görəsən kim, necədir halı Süleyman gedəli.

Əyzən müxəmməsi-Kərbəlayı Abdulla İbn Canı:

Ey ki, zülmətgəhi-zülf içrə üzün misli-çiraq,
Məstü sərxoş gözünə qarşı yaman gözlərə ağ,
Olmasın xaki-dərin guşeyi-çeşmindən iraq,
Ləblərindən dəhənim dərdə dəva etdi soraq,
Söylədi: ağzıma innabi-ləbü sibi-buxaq.

Baxdı mərdüm üzünə, saldı nəzərdən ayi,
Qıldı xəm şöhrəti-əbruyi-lətifin yayi,
Qədrü qiymətdə deyil lə'l ləbin həmtayi,
Həvəsi-zülfi-siyahınla olub sövdayi –
Ki, çəkib silsileyi-kakili-tərrarə daraq.

Görünür çöhrələrin laləyə gülgun, gülə al,
Qoymadı al ilə ruyin dili-ayinədə hal,
Sürmeyi-şux gözün fitnəyə saldı filhal,
Qıldı izhari-şərəf Kəbeyi-ruxsardə xal,
Vərəq üz sürtdü qədəmgahına gülgunə yanaq.

Kakilin şanələnir zinəti-duş etmək üçün,
Xoş gəlir xəlqə ləbin hərfi nüyuş etmək üçün,
Dil dilər şərbəti-göftarını nuş etmək üçün,

Xəlqdən vəsfi-bənaguşunu guş etmək üçün,
Bəhr açdırdı sədəfdən düri-qəltanə qulaq.

Gül xitab etsə sənə, qönçə ona eylə itab,
Qönçə kimdir ki, sənə qarşı durub verə cavab,
Baxsa hər dəm üzünə şərmdən olmazmı gülab,
Nədir ayinə görən dəmdə səni eyləyə tab,
Əksi-ruxsarın ona olmasa mə'nada dayaq?!

Dursa ayinə müqabil üzünə, qılsa nəzər,
Ona üz vermə, nəzərdən sal onu şamü səhər,
Fazədən qoyma ola dövri-yənağında əsər,
Vəsməvü sürmə gözü qaşına meyl etsə əgər,
Sürməni seyrə salıb vəsməyə qıl qaş-qabaq!

Hüsnünə aşiq-sadiq demə hər gümrahi,
Aşiq oldur yaxa çərxi dili-atəşgahi,
İmtəhan eylə şəbi-hicrdə Abdulllahi,
Şöleyi-ahına gər yanmasa çərxin mahi,
Tiğ çək, başını kəs, şəm' kimi atəşə yaq.

Əyzən kəlami-İbn Canı:

Ey iki gözüm, qıl belə şahbazə tamaşa,
Mövsümdü, güşad et iki dərvazə tamaşa,
Bu nazü nəzakətdə sərəfrazə tamaşa.
Gör necə gözəldir,
Məhbubi-əzəldir,
Leylayə bədəldir,
Məcmuyə məhəldir.
Xoşbuyə tamaşa,
Ahuyə tamaşa,
Giysuyə tamaşa,
Əbruyə tamaşa.
Xəncər nəkəradır,
Hər yarəsi göyçək,
Hər muyə tamaşa,
Xoşsövt, xoşəlhan, xoşavazə tamaşa,
Könlüm quşu, pərvaz elə, pərvazə tamaşa.

Ey bülbüli-can, çıx belə, rəftarına bir bax!
Qıl seyrü səyahət, gülü gülzarına bir bax!
Yüz can alıcı işveyi-rüxsarına bir bax!
Gör kim necə candır,
Can içrə nihandır,
Mənzuri-cahandır,



Hər qəmzəsi qandır,
Mən öldüm amandır!
Şirin dilə bir bax!
Nazik belə bir bax!
Şümşad ələ bir bax!
Mişkin telə bir bax!
Ənbər nəkəradır,
Kövsər nəkəradır,
Ruxsarəsi göyçək,
Getmə, hələ bir bax!
Heyvasinə, şəmmaməsinə, narinə bir bax!
Qoynunda nə əlvan bəzənib tazə-tamaşa.

Bir gözləri xummar, zənəxdanı əcayib,
Bir dişləri mirvaridi, rəxşanı əcayib,
Bir tə'ngdəhan, qönçeyi-xəndanı əcayib.
Gör bu nə ə'dadır,
Canım nə fədadır,
Bir huriliqadır,
Pürcövrü cəfadır
Ya nuri-xudadır,
Əxlaqı əcayib,
Durmağı əcayib,
Buxağı əcayib,
Dodağı əcayib.
Mərmər nəkəradır,
Gövhər nəkəradır,
Nəzzarəsi göyçək,
O taqi əcayib.
Ey dil, edəsən kəsb bu meydanı əcayib,
Təfsili-bahar oldu, buyur yazə tamaşa.

Bu sərvqədin qaməti-rə'nası da xoşdur,
Şahbazsifət zülfi-mütərrası da xoşdur,
Durna kimi həm gərdəni-minası da xoşdur.
Ya nəcmi-dürərdir,
Ya şəmsü qəmərdir,
İksiri-nəzərdir,
Yandım, nə xəbərdir?!
Baxması da xoşdur,
Sövdası da xoşdur,
Zibası da xoşdur,
Əzası da xoşdur,
Əxgər nəkəradır?
Məcmər nəkəradır?
Həm arəsi göyçək,
Beyzası da xoşdur.
Gəl, indi sən et bu yerişə, nazə tamaşa!

Yüz püstələbü lə'li-Bədəxşan buna peşkəş!
Yüz laləüzar afəti-dövran buna peşkəş!
Cümlə nə qədər var isə xuban, buna peşkəş!
Bu hurü mələkdir,
Qılmanə köməkdir,
Bu simbiləkdir,
Rizvan nə deməkdir?!
Rizvan buna peşkəş!
Bostan buna peşkəş!
Reyhan buna peşkəş!
Cövhər nəkəradır?
Həm zər nəkəradır?
Xunxarəsi göyçək,
Bu can buna peşkəş!
Abdulla kimi neçə qəzəlxan buna peşkəş!
Dur, söhbəti-meyxanəyə gəl, sazə tamaşa!

Kərbəlayı Abdulla Canı oğlunun burada təhrir olunan əş'arından başqa bir çox qəzəliyyat və rübaiyyatı və xüsusən, bədəfal müasirlərinin zişt kirdarlarına dair həcviyyatı və gözəl müxəmməsatı və əş'ari-müstəzadı vardır ki, onların buraya küncayişi yoxdur.

Mərhumun həcv deməkdə manəndi yox imiş. Ol səbəbdəndir ki, Zakir əleyhirrəhmə üləma zimnində tə'nzim qıldığı kəlami-abdarında Baba bəyi və Canı oğlunu təəssüflə yad edib, bu şeirləri haqlarında yazmışdır:

Yaxşı həcv eylər idi bu dəmin adəmlərini,
Sağ gər olsa idi indi ol İbn Canı.
Rişteyi-təbimə yox tab verən, çərx, əfsus
Eyləyib xak ilə yeksan qədi-Babani.
Getdi həmdəmlərim, bisərü saman qaldım,
Bu ribati-kühənim yoxdu sərü samani...



# MEHRİBANLI BABA BƏY

Mehribanlı Baba bəy[384] İbn Canının müasiri olub, cümleyi-ürəfadan və xoştəb' şüəradan birisi sayılırmış. Hər iki şair Zakirin həqiqi dostlarından olub, bir növ ona fününi-şeirdə ustadlıq etmişlər. Vəli onların meyl və rəğbəti həcvguluğa olduğu halda, Zakirin həcv və həzl təriqi ilə söz söyləməyə artıq rəğbəti yox imiş. Əgərçi Zakirin də bir çox həcvə bənzər kəlamı vardır, amma onların əksəri ədibanə yazılmış kəlamlardır ki, öz mövqeində onlardan bəhs olunacaqdır. İbn Canının və Baba bəyin və başqalarının ədəbiyyatın həcv növünə göstərdiyi meyl və həvəs, əlbəttə, bir illət və səbəbdən xali deyil.

Çox ehtimal var ki, o zamanın şairləri qəzetə və jurnalın ədəmindən naşi öz müasirlərinin əxlaqını həcv demək ilə islah edərlərmiş. Hər halda çox təəssüflər olsun ki, Baba bəy və İbn Canı kimi müqtədir şairlər dünyadan bixəbər və Avropa ülumundan bisəmər olub gözəl təblərini həcvguluğa və latayil söyləməyə sərf ediblər. Baba bəyin vəfatı Zakirə ziyadə tə'sir edib onu pərişanhal etmişdir və Zakir ustadının maddeyi-tarixini aşağıda dərc olunan cigərsuz şeirlərlə izhar qılmışdır:

Dəriğa, getdi bir-bir dərdbilənlər, fərd mən qaldım,
Cahanda xatiri qəmgin, dili pürdərd mən qaldım.

Ənisü mehribanım Mehribanda vasili-rəhmət –
Olub, dari-fənada zarü səhragərd mən qaldım.

Məta'i-can xirid etdi rəfiqan gərm ikən bazar,
Pozuldu rövnəq, ancaq qaldı ahi-sərdü mən qaldım.

Xəyalat əhli xaki-kimya tək napədid oldu,
Tutub rahi-ədəm iksirtəban, gərd mən qaldım.

Görüb dəhrin vəfasız çəkdilər əl eyşi-aləmdən,
Bu viran mülkdə, sə'd heyf, tə'npərvərd mən qaldım.

Həqiqət məzilinə yetdilər mərdi-rəhi-aləm,
Mənə bu ar yetməzmi, həmin namərd mən qaldım.

Edər seyri-gülüstani-bəqa ağgünlülər hər yan,
Qara gün içrə gülbərgi-xəzan tək zərd mən qaldım.

Vəzirü şah rux tutdu piyada xaneyi-ferzə,
Səməndü fil ləng oldu, dağıldı nərd, mən qaldım.

Müsibət salının tarixi amma oldu "tarixim"[385],
Köçüb ustad, Zakir, bihünər şagird mən qaldım.

Bu təəssüfamiz şeirlərdə Zakir mərhum Baba bəyi ürəfa zümrəsinə daxil qılıb, onun xəyalat əhlindən olmasını və iksirtəblər kimi rahi-ədəm ixtiyar etməsini bəyan edib kəmali-təəssüflə bu viran mülkdə özünün tə'npərvər olmasını izhar qılır.

Ağgünlülər dəhrin vəfasızlığını görüb, eyşi-dünyadan əl çəkib Həqiqət mənzilinə vasil olduqları və bəqa gülüstanında hər yanı seyr etdikləri halda, şair qara gün içrə gülbərgi-xəzan tək sarala-sarala qalmışdır.

Zakir Baba bəyi mürşid və ustadi-kamil məqamında qoyub özünü bihünər şagirdlərdən hesab edir. Heyfa ki, Baba bəyin kəlamından həcvdən səva bir başqa növ ələ düşmədi ki, onu nümunə göstərək[386].

Nəmirli Əmiraslan bəyin şə'nində – ki, fasiq və mərdümazar bir şəxs imiş, – yazdığı həcvi bu sayaq başlayır:

Ağlayın qan, Cavanşir Əmiraslan gəlir,
Mərdü mərdanə olub azimi-meydan gəlir,
Taxıban şişə sizi etməyə büryan gəlir,
Mə'dəni-lafü gəzaf hərzəvü hədyan gəlir,
Mələkül-mövt kimi almaq üçün can gəlir...



# KƏRBƏLAYI SƏFİ "VALEH" TƏXƏLLÜS

Necə ki, fövqdə zikr olundu, Kərbəlayı Səfi "Valeh" Canıoğlu Kərbəlayı Abdullanın və Baba bəyin müasiri imiş. O zamanın ürəfasından sayılan əhli-zövq və sahibi-təb' bir vücud imiş. Məhəlli-təvəllüdü Gülablı qəryəsidir ki, ata-babasının əsl vətənidir.

Gülablı kəndi Şuşa uyezdində dağ ətəyində basəfa və xoş mənzərəli bir yerdə tə'mir olunubdur. Əhalisi səlamət, əhli-keyfü damağ olub, günlərini eyşü-işrətdə keçirməyə mö'tad olmuşlar. Qarabağın aşıqları, neyçi və balabançıları, xanəndə və nəvazəndələri əksəriyyən Gülablıdan çıxıb, onun abü həvası ilə pərvəriş tapmışlar.

Bu yerin ünas əhlinə gəldikdə, onlar dəxi xeyli gözəl, ismətli və cismən səlamət arvadlar olub, dayəlik peşəsi ilə iştihar bulmuşlar. Belə ki, Şuşa qalasının nücəba, xanzadə və şahzadələrinin çoxu Gülablı arvadlarının döşündən süd əmib, onların ağuşunda nəşvü nüma tapmışlar. Kim bilir, bəlkə onların südlərinin tə'sirindən Pənah xanın yapdığı Şuşa qalasında – ki, sabiqdə qaraquşlar məskəni imiş, – bu qədər şüəra və zürəfa, bu qədər xoşəlhan xanəndə və bimisal sazəndələr hasilə gəlmişdir?!

Heyfa ki, belə gözəl bağlı-meyvəli və xoşsəfa kənd 1905-ci sənədə vüqua gələn erməni-müsəlman davasında talan və viran olmuşdu.

Əhalisindən bir çoxu, xüsusən arvad-uşaq tələf olub, sağ və salamat qalanı yuvaları dağılmış quşlar kimi ətrafü əknafa qaçıb pənah aparmışlar. İndi Gülablı kəndi yavaş-yavaş tə'mir olunub, yenə sabiqi halına düşməkdədir.

Həmin bu Gülabla qəryəsində hicrətin XII əsrinin axırlarında – yə'ni 1180-cı[387] və yainki 1190-cı[388] illərdə Valeh təvəllüd etmişdir. 60-70 iləcən ömür etmişdir. Belə ki, 1250-ci[389] tarixdə hali-həyatda imiş. Oxuyub-yazmağı Şuşa qalasında kəsb etmişdir. Ülumi-maarifə və xüsusən, şeir deməyə artıq dərəcədə meylü həvəsi var imiş. O cəhətə vaxtının çoxunu ürəfa məclisində və şüəra dairəsində keçirərmiş.

Mərhum Valeh dindar, mö'min və müttəqi bir şəxs olduğu ilə belə xoşsöhbət, danışıb-gülən və baməzə bir adam imiş. Onun ilə Baba bəyin, İbn Canının və Aşıq Qənbərin beynlərində zərafət olduğu üçün bir-birinə həzl təriqi ilə sözlər deyərlərmiş. Belə ki, mərhum Baba bəy Valehin qocalığını həcv edib, dişlərinin tökülüb övraq olmağını və ağzı köhnə xərabənin uçuq damına bənzəməyini və saçı-saqqalı ağarıb, sümük kimi düm ağ olmağını zərifanə zikr edib deyir ki, sənin başından şurü həvəs gedibdir. İndi sənin meylin axirət dünyası ilədir. Ona görə Xulxunsayını çağır gəlsin, aləmi-bəqadan vəz eləsin:

Hər kimsə axtarar tapar tayını,
Sən də çağır gəlsin Xulxunsayını.
Söhbəti-üqba eləsin, guş qıl,
Ləzzəti-dünyanı fəramuş qıl...

Kərbəlayı Səfi onun cavabında Baba bəyə bir neçə duzlu şeirlər yazıb, onların bə'zi bəndlərində Baba bəyə bərk toxunur. Haman şeirləri belə başlayır:

Ey Baba bəy, sən bir yaxşı babasan,
Heyf ola kim, bir az ağzıyavasan.

Bundan əzəl sən ki, şair deyildin,
Fəzayi-eşqdə tair deyildin.

Məndən öyrənibsən, düşübsən tərzə,
Mənim ilə danışma, hərzə-hərzə!

Divanə, biqəmsən, gəzərsən işsiz,
Elə hər yetənə deyərsən dişsiz.

Nə qandırım sənin kimi çobana,
Adəm təşbihatdır novrəs xəzana.

Novrəs olan xəzan olur, diş düşər,
Nə qism kim, bahar ötər, qış düşər.

O dəndani-mübarəki-peyğəmbər
Şahid oldu fəthi-qəl'eyi-Xeybər[390].

Xaliqin məxluqa göstərməsidir,
Rehlət səfərinin rəhnümasıdır...

Bu şeirlərdən sonra Valeh Baba bəyin şə'nində bir neçə baməzə həcvlər söyləyir ki, onları burada zikr etmək münasib görülmədi. Necə ki, yuxarıda zikr olundu, bu qisim həzl və lətifəguluq vaxtın təqazasına görə Vaqif ilə Vidadinin arasında dəxi var imiş.

Mərhum Valeh Kərbəlayı Səfiyə göz ağrısı ariz olduğunu müasiri Aşıq Qənbər eşidib, həzl təriqi ilə bu barədə bir müxəmməs müstəzad tərtib edib ona göndərmişdi və o müxəmməsdə hansı dərmanlar ilə nə sayaq tədavi etməsini və hansı xörəkdən pəhriz saxlamağını və qizası nə olduğunu belə şərhü bəyan qılıbdır:



Göy daş ilə duz qoy, ona zəg bağla, qurum qat,
Ey Valehi-məşhur!
Zərnixi, kükürdü götürüb ab ilə isdat,
Civə ilə məqdur.
Nuşadiri tənbakiyə qat, andızı qaynat,
Həm sirkeyi-əngur.
Şurabü şərab ilə piyaz, qədr də bat-bat,
Bir qədr də nil ur.
Bağla gözünün nuruna, çəkmə dəxi heyhat,
Qoyma ki, ola kur.

Tiryak iki misqal yarım suddikan* ilə
Ayran, qara ot,
Cırtdaquşu az su ilə onlara tə'n eylə,
Qətran ilə barut.
Mərgəmuşu əz narın, ələt həm kətan ilə,
Əzvay ilə isdot,
Malin odunu rövğəni-qaratikan ilə
Mülhəq elə məzbut,
Məcmunni yığ, cəm elə, bir kasədə qaynat,
Qoyma daşa, savur!

Qəvvamə gəlib qaynasın o yeddi müdava,
Düşür yerə ol dəm.
Çəkmə dəxi göz qəmini, xövf eləmə əsla.
Dürüst elə mərhəm.
Xam bezə yaxıb, qədri də pənbə elə peyda,
Bağla onu möhkəm.
Görməz gözün azar, qiyamət ola bərpa,
Heç gəlməz ona nəm.
Görsə gözüyün görməyin aləm qalı həm mat,
Olmaz belə pürnur.

Qizanı deyir: sübhə nahar ilə çox eyran,
Arpa çörəgilən,
Narın şərabın içgilən üstən iki fincan,
Yaz, nüsxəsin öyrən!
Çaşta yegilən cadü qatıq, turp ilə soğan,
Səhhət tapa bədən.
Şamə yegilən balığı-qecvinü darağan,
Ey arifi-pürhən!
Ömrün nə qədər var isə, böylə keçir övqat,
Olma dəxi rəncur!

* Suddikan, qara ot, cırtdaquş, bat-bat, qaratikan – cümləsi təlx şirəli nəbat növündəndirlər ki, iste'malı göz ağrısına müzirrdir.

Dünyada dəxi sən yemə ət, bal ilə yağı,
Pəhriz elə, pəhriz!
Ənari-şirin, armud ilə meyveyi-bağı,
Nə yaz, nə payız!
Qavun yemə, gər yandıra gözündə çırağı,
Gecən ola gündüz.
Məcmu'i-şirin şey qıla gər ömrünü baqi,
Ölsən, yemə hərgiz!
Göndərdi könül mürşidinə bir belə sövqat,
Bir nüsxeyi-məzbur.

Sən tək təbibin gözləri azarə düşərmi
Yazdan bir ay ötmüş?!
Bir göz ki, qaru* olmaya, göz qarə düşərmi?
Azardı bu batmış!
Korluq sənə bu vaxtda, biçarə, düşərmi –
Sinnin ola yetmiş?
Qənbər kimi gözün aya pərgarə düşərmi?
Söz yerini tutmuş.
Öz nüsxən olub indi sənin özünə isbat,
Tut sən məni mə'zur.

Valeh həzl təriqi ilə yazılmış bu kəlamın müqabilində Aşıq Qənbərə aşağıdakı cavabı yazmışdır:

Bu təb'i-təbabətliyi bir kəs bilə haşa,
Ey Qənbəri-məcnun!
Dərmanlarını görsə, qalır məhv müqəvva
Loğmanü Fəlatun.
Gözdən və nəzərdən səni hifz eyləyə mövla,
Danayi-pürəfsun.
Bir sən kimi kəhhal dəxi xəlq etməyib əsla
Ol qadiri-biçun.
Qırx yeddi rəqəm göz davasın eyləyə peyda
Gözdən özü məğbun.

Allaha şükür gözlərimin yoxdur azarı,
Axmaz piçalağı.
Bir güzgü alıb bax gözünə sən, səni tarı,
Gör görcə balağı.
Həcvinə görə gözləri kor olmaya barı,
Həm kardı qulağı.
Adətdi ki, sağlar kora gülməkdi mədarı,
Verməkdi qənağı.

---
* **Qaru** – bir dürlü göz ağrısıdır ki, sahibi tor görür



Sağ gözlünü həcv edibsən eylədi rüsva,
Düşdü təzə qanun.

Bir gün gözümüz qarə düşəndə nə gülürsən,
Könlün nə olur şad?
İllər uzunu burnunu bəs niyə silirsən?
Olmuş sənə mö'tad.
Göz ağrısına pəhrizü qiza bilirsən,
Ey kamil ustad!
Bəs niyə qarumal* kimi hər dəm yıxılırsan?
Gər olmasa irşad.
Öz eybinə kor ol, dəxi çox, söyləmə bica,
Danışma bu məzmun!

Bircə dava var, saxlamışam onu nihan mən,
İndi deyirmə, qan!
Şagirdsən əgər, məndən eşit, onu da öyrən,
Olsun sənə dərman.
Çox korları da sağ elə korluq ələmindən,
Qıl özünə ehsan.
Gizlincə deyim, cırtdaquşun suyun əzərsən,
Doldur iki fincan.
Tök gözlərinə, gözlərin olsun yenə bina,
Gəzmə dəxi məhzun.

Valeh o zamandan ki, olubdur sənə yoldaş,
Ol xoş qədəmindən,
Yuxmadan olub gözləri manəndeyi-xəffaş,
Gərək qaça gündən.
Bizdə yenə sağ gözdü, görər, qədr gedər yaş –
Həqqin kərəmindən.
Sənin başına çünki düşübdür elə bir daş
Dövran sitəmindən,
Görmək sənə olmaz dəxi minbə'd mühəyya.
sə'd dövr edə giryan.

Yuxarıda tərqim olunan hər iki müxəmməsi-müstəzadı tutuşdurduqda Aşıq Qənbərin lətifəguluqda daha da artıq məharəti olduğu anlaşılır. Filhəqiqə müşarileyh artıq məharətlə göz ağrısına müzürr olan əşya və əczanı tərkib tərtib qılıb nəzmə çəkmişdir və öz mürşidi olan Kərbəlayı Səfiyə məzkur davacat ilə müalicə etməyi duzlu və mövzun şeirlərlə tövsiyə edir; qiza göstərməkdə dəxi bir qüsur qoymayır.

---
* **Qarumal** – gözləri tor görən sığır

Valehin cavabı dəxi xoşayənd kəlamlardır. Vəli Aşıq Qənbərin şeirlərində hiss olunan lətafət və həlavət Valehinkində hiss olunmur.

Müxəmməsi-Valeh:

Şəfabəxş dəmin ol həzrəti-İsadən öyrənmiş,
Həyati-cavidani ləblərin Xızradən öyrənmiş,
Gəhi xoşxəndə eylər bəzmərə, minadən öyrənmiş,
Səvadi-kakilin tərhin şəbi-yeldadən öyrənmiş,
Cəbinin pərtövəfkənlik yədi-beyzadən öyrənmiş.

Qalıb əyyami-sabiq qəmzeyi-xunrizdən qanun,
Müdam məcruh edər eşq əhlinin bağrın, qılar pürxun,
Dili-sədparəni əşk ilə çeşmimdən edər Ceyhun[391],
İçibdir cami-məxmuri, edər aşiqlərə əfsun,
Bu dəva çeşmi-məstin nərgisi-şəhladən öyrənmiş.

Qaşın tərhin görüb mehrabü mənbərlər çəkər xiclət,
Buyindən nafeyi-Çin, mişkü-ənbərlər çəkər xiclət,
Siyəh zülfün qəmindən sünbüli-tərlər çəkər xiclət,
Görəndə qəddini sərvü sənubərlər çəkər xiclət,
Bu rəftarı nihali-qamətin Tubadən öyrənmiş.

Xəyali-cami-vəslin çoxları məst eyləyib bibak,
Qürubi-hüsnünə şəblər siyəhpuş əyləşib qəmnak,
Görəndə vəslini hər sübhi-sadiq sinə eylər çak,
Ruxundan infial eylər məhi-tabanü nöh əflak,
Üzün rəxşəndəlik şəmsi-cahanaradən öyrənmiş.

Gəl, ey zahid, sən etmə Valehi-divanəni mülzəm,
Deyil təğyirə qail kim, təriqi-eşqədir möhkəm,
Haçan olmuş cahanda eşq dərdi qabili-mərhəm,
Sevəndə Leylini Məcnun, olanda dərdinə məhrəm,
Cünunluq rəsmini bu qafili-şeydadən öyrənmiş.

Əyzən müxəmməsi-Valeh dər mədhi-Rəsuli-xuda:

Ta həvayi-eşqə məmlüvvəm ki, qıllam zarlıq,
Qamətim çəngimdir, eylər rəglərim həm tarlıq,
Cismimi incitdi nalə, çeşmimi bidarlıq,
Ey şəhi-taxti-ədalət, böylə olmaz yarlıq,
Rəhm qıl, mə'şuqə, sən qıl aşiqə qəmxarlıq.

Mahi-novdur taqi-əbruyi-lətifin məzhəri,
Babi-elmi-dürrdür nitqi-zərifin məzhəri,
Olmayıbdır dəhrdə, olmaz hərifin məzhəri,



Ayeyi "lövlak"[392] olub şə'ni-şərifin məzhəri,
Olmasan, olmazdı bu aləmdə yoxdan varlıq.

Valehi-divanəyə məhşər günü səndən pənah,
Sənsən ol darülfəna, darülbəqadə padşah,
Zülfünə ənbər dedim, oldu xəta, etdim günah,
Tapmadı nərgis gözün tərhin, qaşın şəklini mah,
Mahə incəlmək qalıbdır, nərgisə bimarlıq.

Mərhum Valeh Kərbəlayi-müəlladan müraciət etdiyi əsnada Aşıq Qənbər ona bir məktub yazıb, aşağıda zikr olunan sualları etmişdir.

Kəlami-Aşıq Qənbər:

Tapdınmı səadət, Valehi-dövran,
Gözəl yeri, xoş məkanı gördünmü?
Ziyarət etdinmi Nəcəf-Əşrəfi,
Kərbəlayi-müəllanı gördünmü?

Musiyi-Kazimü Məhəmməd Təqi,
Həsənəl-Əsgəri, Əliyyən-Nəqi,
Sahibəzzəmandır əsrin rövnəqi,
Ol zinəti-asimanı gördünmü?

Yenə varmı onda xeyməvü xərgah,
Təşnələb əhli-beyt, tamam bipənah,
Qan ağlayıb axıdırmı Zülcinah[393],
Dolanırmı o meydanı, gördünmü?

Təşnə cigər, hal pərişan, dil kəbab,
Zeynəb, həm Səkinə çağırırmı "ab"?
Edən toy hənasın qan ilə xizab
Yadigari-müctəbanı gördünmü?

Varmı əhli-beytə yavərü qəmxar,
Yoxsa o, çöllərdə "su" deyib ağlar?!
Yetimlər pənahı abidi-bimar,
Ol xəsteyi-natəvanı gördünmü?

Gördünmü Hüseynin məzlum Əsğərin,
Abbasi ələmdarın cavan Əkbərin?
Həm göyün sütunu, yerin ləngərin,
Ol zivəri-rizvanı gördünmü?

Alıbdır əlimdən gərdişi dövran,
Yaş yerinə gözlərimdən axar qan,
Şühəda səfində xak ilə yeksan,
O İbrahimxəlil xanı gördünmü?

Bağlandımı ali-Əliyə ixlas?
Olan günahına etdin iltimas?
Tarixi-vəfadə birun əz qiyas
Bu Qənbəri-binəvanı gördünmü?

Valehin cavabı:

Ey Qənbər, qulami-şahi-vilayət,
Təvafi-şiri-yəzdanə yetişdim.
Cayi-həmə yaranü əzizan xali,
Könlümdəki arzumanə* yetişdim.

İbtida ki, varid olduq Bağdadə,
Tamam əhli-zünub oldu azadə,
Musiyi-Kazimə qıldıq iradə,
Dərgahdə lütf-ehsanə yetişdim.

Üç gün məskənimiz oldu Kazimeyn,
Sürtdük xaki-payə, ziyalandı eyn,
Vacib oldu tövfi-həzrəti-Hüseyn,
Arizu əlindən canə yetişdim.

Ol gün ki, yetişdik Təlli-Səlamə,
Xoş sövtlə oxundu ziyarətnamə,
Tamam zəvvar yetdi mətləbü kamə,
Xüsusən ki, mən divanə yetişdim.

Yetişdik Hüseynin bargahinə,
Səhrayi-Kərbəla padişahinə,
Həzrəti-rəsulun busəgahinə,
Xəncər vurulan məkanə yetişdim.

Gördük bir yanında Əsğəri-nalan
Qızıl qan içində, həlqində peykan,
Əkbəri-şahzadə doğranıb şan-şan,
Zülm olunan o meydanə yetişdim.

Ondan sonra getdik Əli-Abbasə,
Tamam səhni-rövzə batıbdır yasə,

* Arzuman – arzu deməkdir



Yenə şivən düşdü zükur-ünasə,
Yenə şəmə mən pərvanə yetişdim.

Övsafi-Kərbəla yetdi payanə,
Ondan üz çevirdi Şahimərdanə,
İrişdik səhrayi-Ərəbistanə,
Təvafi-ali-imranə yetişdim.

Günbədi-təladan açıldı bir nur,
Şö'ləsi aləmə olundu məşhur,
Manəndi-əhqəri-mühəqqəri-mur
Bargəhi-Süleymanə yetişdim.

Düşdüm xaki-payə, eylədim sücud,
Axır sövdam idi, onda tapdım sud,
Günahım əfv etdi qadirü mə'bud,
Sanasan ədəmdən canə yetişdim.

Onda Kəlbi-Əli qoydum namımı,
Şərbəti-eşqdən içdim camımı,
Nəcəfi-Əşrəfdən aldım kamımı,
Həzrəti-Sahibzəmana yetişdim.

Onda nəql eylədi bizə bir mürid,
Dini-Mehdi xana kəsmə sən ümid,
Yetmiş üçdür tarixində şəhid,
Böylə əsrari-nihanə yetişdim.

Məhəmməd Təqidir dilim əzbəri,
Əliyyən-Nəqidir, Həsən Əsgəri,
Kərbəla Valehə oldun Heydəri,
Qətrə idim, bir imanə yetişdim.

Valehi-mərhumun bu kəlamında bə'zi şeirlərin vəzni ya səqil və xəfif gəlir. Məsələn, "həzrəti-Sahibzəmanə yetişdim", "Təvafi-aliimranə yetişdim" və habelə.

Bu kəlamın axırıncı bir bəndindən mə'na çıxarmaqda dəxi müşkülə düşdük və şairin işarə və eyhamı nə olduğunu anlaya bilmədik. Haman bənd budur:

Onda nəql eylədi bizə bir mürid,
Dini-Mehdi xana kəsmə sən ümid,
Yetmiş üçdür tarixində şəhid,
Böylə əsrari-nihanə yetişdim.

Bu şeirlərin mə'nası dolaşıq və müəmmalı olduğundan maəda vəzn və bəhrində dəxi qüsur çoxdur. Belə ki, bunlar tamami kəlama xələl yetirib, onları əhəmiyyətsiz və ziyasız eləyir.

Atidə yazılan bədiəni – ki, ondan ancaq bir-iki bənd nümunə üçün burada zikr olunur, – bə'zi rəvayətə görə, Valeh cavanlığı vaxtında Molla Pənah Vaqifin buyurmağı ilə təzə səbkdə özündən ixtira edərək inşa qılmışdır:

Ləbinə nazlı yarın badeyi-gülfam dedim,
Tündü təlx oldu ki, ey məst, cünun olma – dedi.
Ləzzəti-şəhdü şəkər tək ləbi-xəndandır bu,
Qiyməti gənci-gühər, lə'li-Bədəxşandır bu,
O nədir, qiyməti kəm, əsli haram, təlxməzac,
Bir qaşıq acı su qəndabə qatıb çalma – dedi.

Qəddinə nazlı yarın ər-ərü şümşad dedim,
Yenə tünd oldu, mənə dəxi bizə gəlmə – dedi.
Gözlərin var, belə şivədə rəftarıma bax!
Geymişəm al, yaşıl, zinətü paltarıma bax!
Müxtəsər, bir qədi-üryan ola, ondan nə səmər?
Əl-ayaqsızlara həmta məni sən qıyma – dedi...

Valehin bu gözəl bədiələrinə nəzirə olaraq Qasım bəy Zakir dəxi də zərifanə və ədibanə bir kəlam yazmışdır ki, ondan dəxi bir neçə bəndlər müqalibə və nümunə üçün burada dərc qıldıq:

Gözləyən kimsə, gözüm haqqı, deməz ay sana,
Nəçidir ay vəcahətdə ola tay sana?
Sən kimi görüm onun çöhreyi-tabanımı var?
Xali-hindusumu var, zülfi-pərişanımı var?
Bir sarı rənglicədir əvvəli əyri nun tək,
Elə ki, keçdi iki-üç gün olu bir parə çörək.

Bə'zi məclisdə qədin qərvü sənubər oxunur.
Tanrı bilsin ki, bu saf qamətinə şər' oxunur.
Qamətin kimi onun seyri-xuramanımı var?
Əzmi-cövlanımı var, afəti-dövranımı var?
Bağ-bostanda əkər bağban onu tək-tək,
Bundan ötrü ki, kümə məsrəf olur tirü dirək.

Müddəilər gözünə nərgisi-fəttan desələr,
Kim inanır bu sözə göz görə böhtan desələr.
Nərgisin çeşmi-xumarın kimi məstanımı var?
Tiği-bürranımı var, nəvəki-müjganımı var?



Yaz olur, həqdi bitər, bir şeyə olmaz o gərək,
Əqli zad kəsməz uşaqlar yığar anı görcək.

Ağzını duş biri qönçəyə nisbət söləmiş,
Heyf mən olmamışam, bu sözü xəlvət söləmiş.
Qönçənin ağzı nədir, ləfzi-dürəfşanımı var?
Lə'li-meygunumu var, gövhəri-qəltanımı var?
Həmdəmi xar, özü bibəhrəvü həm ömrü gödək,
Dağılır hər vərəqi bir tərəfə bad əscək.

Və sonra şair məhbubi-dilgüşasının ləbi-lə'lindən və zülfi-tərindən və zinəti-kuyindən bir-bir söhbət açıb, onlara oxşayan şeylərin cümləsini biçiz, yaramaz, qədrü qiymətsiz olduğunu şairanə təşbihat ilə sübuta yetirir və bəd məhbubəsini müəttər bir gülə bənzədib, ona tənbeh və tövsiyə edir ki, səri-kuyində aşiqi-sadiqin yerini qoymagilən bülbüli-şeyda tutsun, çünki o sənin Zakirinə bərabər ola bilməz. Şairin öz dili ilə söyləsək, daha da yaxşı olar:

Qoyma əğyarı səri-kuydə mə'va tutsun,
Aşiqi-sadiqini bülbüli-şeyda tutsun.
Zakirin kimi onun sövti'-qəzəlxanımı var?
Təb'i-mövzunumu var, şe'ri-nümayanımı var?
Eşidən incir onun tərzi-nəvasın, bişək,
Şivəsi cəngü cədəl, naləvü əfğanı kələk.

Kərbəlayı Səfi mərhumun əş'ari-müxtəlifələrindən birisi də insanın mə'budu ana bətnində bir qətrə uyuşmuş qandan maya bağlayıb, müruri-əyyam ilə dünyaya gəlməsini və yer üzündə nəşvü nüma tapıb körpəlik, uşaqlıq, cavanlıq, kişilik və qocalıq həddlərinə yetişməsini və hər sinnü salın öz halü təbiətinə məxsus müxtəlif övza'vü əhvalını, şüğlü karını və əhvali-ruhiyyəsini və sonradan ruhun cəsəddən pərvaz edib məqami-əslisinə getməsini və qəbir içində Nəkirü Münkər sorğu-sualını və qiyamət əhvalını təfsilən rişteyi-nəzmə çəkdiyi kəlamdır ki, necə ki, var, burada təb' olunur:

Çəhar ənasürdən, şeş cəhatdən,
Bir qətrə mənidən olmuşuz peyda.
Ədəm dəryasında qaldım altı ay,
Qüdrəti-qadirü xaliqül-əşya.

Rəhm içində əvvəl bünyad oldu dil,
İki nöqtə gözüm oldu müqabil,
Bir damaq, bir cigər olundu hasil,
Doqquz gündə tamam oldu bu ə'za.

Doqquzdan qırxa dək cismim oldu qan,
İki qırxda ruhum tutdu aşiyan,
Üç qırxda dirilib, tərpəndim hər yan,
Lərzə verdi cismim hər tərəf, hər ca.

Bir mələkə qadir eylədi təqdir,
Üç yüz altmış damar olundu təzhir,
Dörd yüz qırx dörd sümük eylədi tə'mir,
Mə'vayi-tarikdə me'mari-qəza.

Doqquz ay bətndə mən tutdum qərar,
Doqquz gün nöh saət çəkdim intizar,
Doqquz dəqiqədə gəldim aşikar,
Bildim ki, qadirdir vahidü yekta.

Düşdüm din üstünə imanda möhkəm,
Neçə əhli-ünas oldu onda cəm,
Cismim nəməkləndi, mən oldum adəm,
Adımı qoydular Səfi hüveyda.

Bir yaşında oldum beşikdə səvar,
Ana südün əmmək eylədim şüar,
İki yaşda süddən kəsildi mədar,
Üç yaşında əkl qıldım ibtida.

Dörd yaşa yetəndə gəzdim biüsul,
Beş yaşda çalındı sünnəti-rəsul,
Altı yaşda başa əql oldu düxul,
Yeddidə oxumaq eylədim bina.

Səkkizdə höccəmi oxudum səvad,
Doqquzda rəvanə eylədim mö'tad,
On yaşa yetəndə şamü bamdad,
Zikr oldu dilimdə övsafi-mövla.

On birdə dərsimi eylədim tamam,
Dildə əzbər oldu peyğəmbər, imam,
On iki yaşında oldum xoşkəlam,
Söylədim hər tərəf, oldum dilgüşa.

On üç yaşda oldum laleyi-həmra,
On dörd yaşda oldum misli-mahi-pürziya,
On beş yaşda oldum bəndeyi-xuda,
Fərzü sünnətimi eylədim ə'da.

On altıda oldum xoşqamətü qəd,
Səfheyi-ruxsardə mehman oldu xəd[394].



On yeddi yaşında buldum namizəd,
Əlqissə, ixtiyar etdim kədxuda.

On səkkizdə işrət eylədim tamam,
On doqquzda gördüm hər mətləbü kam,
İyirmidə mən xoş keçdi əyyam,
Neçə övlad mənə həq gördü rəva.

Otuz yaşda oldum bir seyri-bahar,
Başda eşq əsəri həm leylü nəhar,
Qırx yaşında oldum aşiqi-didar,
Dağıldı başımdan o eşqü sövda.

Bir özgə xəyala düşdüm ol zaman,
Gördüm ki, sövdada qılmışam ziyan,
Bivəfa dünyaya sərf etmişəm can,
Bir məta'imm yoxdur əz-bəhri-üqba.

Ondan sonra zikr elədim ruzü şəb,
Şirin cana verdim çox rəncü təəb,
Mö'minlər arasında oldum müntəxəb,
Ülüqi-dəhrdən pakü müərra.

Əlli yaşda san bir gədikdən* aşdım,
Altmış yaşda əhlü əyaldan qaçdım,
Yetmiş yaşa çatdım, taqətdən düşdüm,
Oldum bir suyu solmuş asiya.

Səksən yaşa yetdim, qalmadı imdad,
Doxsan yaşda tutdu əlimdən irşad,
Yüz yaşa yetəndə gəldi bir cəllad
Dedi: haza, yövmül-axərid-dünya[395].

Çəkdi çəngəlini, saldı əzayə,
Təmamən cəsədim düşdü lərzəyə,
Aldı mürği-ruhum, çəkdi səmayə,
Cismim qəfəs kimi qaldı müqəvva.

El yığılıb ağladılar bir zaman,
Məni bir taxt üstə qoydular haman,
Mürdəşular mənə verməzlər aman,
Rəxti-vücudumu qıldılar yəğma.

* Gədik – dağ beli, yal mə'nasındadır

Verdilər qüslümü, pak oldu bədən,
Tə'ni-üryanıma tutdular kəfən,
Qıldılar namazım növrəsü kühən,
Məni qəbr içində qoydular tənha.

Məni ki, qəbr içində qoydular əfrad,
Hər kəs öz məqamın eylədilər yad,
Dünya cifəsindən əlimdə bir zad,
Əmalımdan qeyri qalmadı əsla.

Münkər-Nəkir məndən aldılar xəbər,
Çəkdilər üstümə həm tiğü təbər,
Nitqim batdı, dilim tutmadı əzbər,
Mənə qəbr içində verdilər cəza.

Çağırdım: Ya Əli, həllali-müşkil,
Ürək qüvvət tapdı, güşad oldu dil,
Cavabım suala oldu müqabil,
Müraciət etdi mərsuli-xuda.

Neçə min il tutdum qəbr içrə qərar,
Qiyamət qopmağa çəkdim intizar,
Bir gün əmr eylədi vahidül-qəhhar:
Ruzi-qiyamətdir, yövmül-intəha.

Əmr oldu İsrafilə, çaldı sur,
Xəbərdar eylədi: ey əhli-qübur,
Qum, biiznillahi vədən-nüşur[396],
Tamamən əmvatı eylədi əhya.

Məqribdən məşriqə üz tutduq Şamə,
Hər kəsin ə'malı əlində namə,
Adil divan orda yetdi təmamə,
Onda fərq olmadı sultandan gəda.

Bir həşr-nəşr qopdu onda, ey xuda,
Gün təpədən yaxdı, yer döndü oda,
Oğul atadan, qız anadan cüda,
Tamam məhşər əhli dedi: va nəfsa.

Tamam məhşər əhli səf-səf durdular,
Həq buyurdu onda mizan qurdular,
Cəhənnəmin atəşini gördülər,
Düşdü bu aləmə şurişü qövğa.

Va ümmətа – dedi həzrəti-rəsul,
Onun iltimasın həqq etdi qəbul,



Çün keçdik siratı, olmadıq məlul,
Cümlə xətalərdən biz olduq rəha.

Həqdir, ə'malımız deyildi saleh,
İslam barəsində işlədi taleh,
Bir neçə həmdəmlə, şikəstə Valeh,
Məskənimiz oldu cənnətül-mə'va.

Kərbəlayı Səfinin bu "Vücudnamə"si bizim zindəganlığımızın cümlə övza'vü keyfiyyətini və nə növ icra etməsini və adabü ayinini bəyan edir.

Bu kəlamdan mə'lum olur ki, uşaq ana bətnindən yerə düşən kimi onu duzlayırlar və iki yaşına kimi o, ana südü ilə müdara eləyir. Ancaq üçüncü sənə vasil olduqda qeyri şeylərin əklinə mübaşirət edir. Beş yaşında ona xütnə olunur. Yeddi yaşa yetdikdə uşağı məktəbə qoyurlar və bir ilin müddətində ancaq oxuduğunu hürufi-müsəvvətə və hərəkələr vasitəsi ilə heca edə bilir. Doqquz-on yaşında hecadan rəvana keçir və on yaşına daxil olduqda gecə və gündüz ənbiya və övliyaların zikri ilə məşğul olur. On birində dərsini və tə'limini tamam eləyir.

On beş sinnində həddi-kəmala yetib, fərzü sünnətini başlayır ə'da etməyə. On yeddi və on səkkizdə namizəd olub arvad alır və iyirmi yaşında övlad sahibi olur.

Necə ki, oğlan uşağı cavan sinnində evlənib əhlü əyal sahibi olur, habelə qız uşağı dəxi də səbi ikən vaxtsız və mövsümsüz ərə verilib, cavanlıq mövsümünə daxil və həddi-kəmala vasil olmamış analıq halına düşür və saplağından vaxtsız üzülmüş çiçək kimi hənuz açılmamış soluxur və tezcə qocalıb qüvvət və təravətdən düşür. Müddəti-tə'lim dəxi çox çəkmir. Yeddi sinnindən oxumağa iqdam edib, on birində elmini tamam edir. Bu müddətin ərzində uşaq ancaq bacarır ki, Qur'anı oxusun, peyğəmbərlərin və imamların adlarını əzbərləyib təkalifi-şər'iyyəsini filcümlə öyrənsin. Bununla onun elmi qurtarır. Bu sayaq bizim məktəblərdə tə'lim olunurdu.

Altmış, yetmiş və yüz il bundan müqəddəm həmçinin bu qərar üzrə onlarda dərs və adab öyrənilirdi; bu yavuq vaxtlara kimi. Ancaq bu axır vaxtlarda təzə üsul ilə yeni qayda üzrə təsis olunmuş məktəblərdə bizim balalara tə'lim verilir.

Yuxarıda yazılan əş'ardan başqa Valehi-mərhumun daha da çox əsərləri vardır. Bunlardan artıq əhəmiyyətlisi keçmiş səlatinin əhvalına və Qarabağ xanlığının tarixinə dair yazdığı mənzumatdır ki, məətəəssüf, ələ gətirə bilmədik. Onun övladından Aşıq Abbasqulu bizə söz vermişdi ki, Kərbəlayı Səfinin tamami əş'arü asarını bizə göndərsin, vəli əhdinə vəfa etmədi.

# AĞABAĞIR

Yusif Qarabağinin məcmuəsində Ağabağır ismində bir şairin əsərlərindən nümunə olaraq bir müəşşər-tərcibənd dərc olunmuşdur. Bu kəlamda bahar fəslinin əlamətlərini şair tədriclə zikr edib, güldən, bülbüldən və yasəmən, sünbüldən söz açıb, axırda təəssüflə fəryad edib deyir ki, heyif deyilmi ki, belə gözəl çağda baş qala torpaqda:

Bir belə mövsümdə, bahar çağdə
Heyf deyil baş qala torpaqdə?!

Yə'ni insanın ömrü qəflətdə və zillətdə keçir. Şair Adəm övladına xitabən deyir:

Keçir günün eyş ilə işrətdə sən,
Zövqü səfa eylə bu vəhdətdə sən!
Nə qədr ki, bu ömri-dövlətdəsən,
Çərxə vəfa bağlama, əlbəttə, sən!
Seyran elə bağı-nəzakətdə sən,
Barvər ol nəxli-şərafətdə sən!
Təlx etmə övqatını möhnətdə sən,
Eylə məqam övci-səadətdə sən!
Uyma, könül, bu xabi-qəflətdə sən,
Aç gözünü bir nəzər afaqdə!

Bundan sonra şair ulduzlardan, sabit səyyarələrdən – Mərrix və Ütariddən, Müştəri və Zöhrədən[397] söz açıb və bunun dalısınca bürcləri bir-bir zikr eləyib, ərşdən, şəmsdən, qövsi-qüzehdən və tiri-şəhabın ləməsindən söyləyib, hər məxluqda qüdrəti-xaliqin əlamətlərini və nişanələrini göstərir. Şairin kəlamında mə'rifət əsəri və zövqşövq hissləri müşahidə olunursa da, kəlamın özündə lətafət və çəndan rəvanlıq və mövzunluq görünmür.

Ağabağırın dəxi əslü nəsəbi və məhəllü məkanı mə'lum deyil[398].



# AŞIQ PƏRİ

Aşıq Pəri öz müasirləri beynində ən istəkli, əzizə və möhtərəmə bir övrət imiş. Onun vətəni-əslisi Qarabağ xanlığına mütəəlliq Cəbrayıl uyezdində Dızaq mahalında Maralyan qəryəsidir. Zəmani-təvəllüdü və tarixi-vəfatı mə'lum deyil. Mirzə Həsənin, Kərbəlayı Abdulla Canızadənin, Məhəmməd bəy "Aşiq" təxəllüsün, Cəfərqulu xan "Nəva" təxəllüsün müasiri imiş. İbtidayi-tə'limini öz qəryəsində alıbdır və əyyami-tüfuliyyətdən şeir və qəzəl söyləməyə meyli olduğundan, hənuz elm kəsb etməmiş sinədən şeirlər deyərmiş.

Zəmani ki, onun namü şöhrəti artıb hər yana dağılır, talibi-didarı çox olur. Aşıq Pəri Maralyandan göçüb Şuşa şəhərinə gəlir və burada onun hörməti və izzəti şüəra və əyani-dövlət arasında daha da çoxalır, hər bir əhli-təb' onun şə'nində gözəl şeirlər yazıb izhari-məhəbbət edərlərmiş; bir halda ki, şairə özü də əhli-hal, sahibcəmal, xoşməqal, işvəli bir nazənin imiş. Onun hüsni-cəmalını tə'rif edən şairlərdən birisi də Əsəd bəy Vəzirov[399] imiş ki, haqqında bu şeirləri yazmışdır:

O gündən ki, didarını görmüşəm,
Həsrətindən yanar cismü can, Pəri!
Dolanıb başına səri-zülfündə
Könül mürği tutub aşiyan, Pəri!

İştiyaqın çəkər neçə kimsənə,
Amma heç birisi bənzəməz mənə.
Canü dildən mübtəlayam mən sənə,
İnanmırsan, eylə imtahan, Pəri!

Arizindir günəş, camalındır ay,
Heç nazənin ola bilməz sənə tay!
Qəmzən qatil, kipriyin ox, qaşın yay,
Qamətindir sərvi-xuraman, Pəri!

Nə qədər var idi canda ixtiyar,
Bir xatirə səndən dolandım kənar,
Axır gizlin dərdim qıldım aşikar,
Qoy bilsə də, bilsin Mirzəcan, Pəri!

Gəl gör fərağında mən natəvanam,
Əfsürdəxatirəm, şikəstəcanam,
Əsəd deyər sənə bəndə fərmanam,
Sənsən mənə sultan, Pəri, xan, Pəri!

Mirzə Həsən "Mirzə" təxəllüs, – necə ki, sabiqdə zikr olundu, – Aşıq Pərinin gözəlliyini bu gunə tə'rif etmişdir:

Qönçə lətafətli, lalə üzlüsən,
Məstanə baxışlı, xumar gözlüsən,
Şirin hərəkətli, şəkər sözlüsən,
Yoxdur yer üzündə misalın sənin.

Və yenə onun vəsfində Mirzə yazmışdır:

Etdikcə vəsfini Mirzə mükərrər,
Tazələnib ruhum olur müəttər,
Gülüstanda zülfün kimi müənbər
Nə susənlər, nə sünbüllər oynaşır.

Bu şairlərdən qeyri Aşıq Pərinin hüsnü camalını və əqlü kəmalını vəsf qılanlar çoxdur. Onlardan məşhuru Məhəmməd bəy "Aşiq" təxəllüsdür. Atidə onun şərhi-halı zikr olunacaqdır.

Aşıq Pərinin mütəəddid şeirləri pərişan övraqda yazılmış və bizim düşənlərində çox səhv və qələtlər vardır ki, onları təshih etmək dəxi bir növ müşküldür. Xüsusən, onun bağlamaları və bə'zi mürəbbeatı ki, Molla Pənah Vaqifə nəzirə olaraq yazılıbdır və bir bisavad mollanın vasitəsilə bizə göndərilibdir, elə imlasız və dolaşıq xətt ilə təhrir olunubdur ki, onları məzkur mollanın özündən başqa bir kəs düz oxuyub mə'na çıxarda bilməz. Ona binaən burada ancaq onun müasirlərindən bə'zilərinə yazdığı məktubatı zikr etməklə iktifa elədik.

Mirzə Həsən "Mirzə" təxəllüsə cavabi-namə olaraq yazmışdır:

Katiblərin şahı dəftər içində
Qələm ilə nazik əllər oynaşır.
Fitnəli, fe'llisən, nazlı, qəmzəli,
Dəhanında şirin dillər oynaşır.

Eşqin əlindən gedərəm mən dada,
Dərdim olur günü-gündən ziyada,
Şiveyi-rəftarın düşəndə yada
Bağrımın başında millər oynaşır.

Dad eylərəm: haray naşı əlindən,
Yandı cigər eşq atəşi əlindən,
Mən nə deyim gözüm yaşı əlindən,
Üzüşür sonalar, göllər oynaşır.



Adam var dolanır məkrin içində,
Adam var dolanır zikrin içində,
Sənin kəmalın da fikrin içində
Əcayib, qərayib hallar oynaşır.

Pəriyəm, xəlqara olmuşam bacı,
Kimsənin kimsəyə nə ehtiyacı,
Bəlxü Buxaranın, Hindin xəracı
Zənəxdanda siyah xallar oynaşır.

# MƏHƏMMƏD BƏY CAVANŞİR "AŞİQ" TƏXƏLLÜS

Məhəmməd bəy vələdi-Behbud bəy Zəngilani "Aşiq" təxəllüs Aşıq Pərinin aşiqlərindən birisidir. Ziyadə qeyrətli, vəfadar və sahibi-kəmal bir vücud imiş. Dindar və həqq tərəfdarı olduğu üçün müasirləri arasında hörmət və izzəti çox imiş. Bununla belə düşmənləri də az deyilmiş. Belə ki, Rus dövləti Qarabağ xanlığının bir çox nöqtələrini təhti-təsərrüfünə götürdükdən sonra Zəngəzur mahalını dəxi zəbt etdi. Bu əsnada bə'zi şurişlər o mahalda vüqua gəldi. Məhəmməd bəyin düşmənləri bu hadisədən nəf'bərdar olub, onu dövlət nəzərində müttəhim qıldılar və ricali-dövlət dəxi onun haqqında söylənilən iftira və böhtanları təhqiq etməmiş, onu vətənindən çıxarıb Ordubad şəhərinə göndərilməsinə əmr verdi və o məkanda miladın 1861-ci sənəsində vəfat etmişdir.

Hər qisim əş'arı var isə də, mürəttəb divanı yoxdur. Əşarından nümunə üçün bə'ziləri burada zikr olunur. Mirzə Həsən Mirzəyə bəhri-təvil səbkdə yazdığı bir qəzəl:

Yenə asudə ikən uğradım bir şux zibayə,
Üzü gül, arizi mül, zülfü sünbül, çəşmi şəhlayə.

Üzü sahir, özü zahir, gözü can almağa mahir,
Görən bir baxışın verməz onun dünyavü üqbayə.

Dəhanın var-yox sirrini bilmək xeyli müşküldür,
Əcəb mahirdir ol əyyar hər elmi-müəmmayə.

Baxanlar qamətindən rəmzlər anlar qiyamətdən,
Görənlər şəkli-əbrusin dəxi baxmaz yeni ayə.

Yer üzrə durmadı, getdi, səmavatı məqam etdi,
Ləbi e'caz rəmzin göstərən dəmdə Məsihayə.

Götürsə gün cəmalından bulud kimi qara zülfün,
Sərasimə Züleyxa tək çıxar Yusif təmaşayə.

Dodağından soruşdum ağzının mən var-yox sirrin,
Bu nazik nöqtəni sorma, düşər qan, – dedi – ortayə,

Alır feyzi-nəzər bəhrini Aşiq tutsa damanın,
Tapar sərriştəsin, yetsə əli zülfi-çəlipayə.

Bu qəzəlin cavabını Mirzə Həsən yazmışdı ki, onun tərcümeyi-halı təhtində dərc olunubdur. Aşıq Pəriyə aşinalıq tərhində yazdığı bir müxəmməs:



Ey Pəri, dəhrdə yox sən kimi bir canana,
Tə'n edər mehri-rüxün göydə məhi-tabanə,
Gərçi bihəd görürəm lütfünü hər insanə,
Piri-biqaidədir, uyma Məlik Aslanə*,
Olgilən yar yenə mən təki bir oğlanə.

Həm sənin qədrini Fərhad ilə Şirin bilməz,
Mirzəcan bilsə də yüzdən o da birin bilməz,
Mirzə Məmməd dəxi o fəthəvü zirin bilməz,
Kim ki, mə'şuq ola, o, zülfi-əsirin bilməz,
Rəng ilə salmagilən sən buları böhtanə.

Mən sənə hər nə desəm mehrü məhəbbət sözüdür,
Sən mənə yazdığın əfsanəvü möhnət sözüdür,
Gər desəm həmdəm olaq, bil ki, məvəddət sözüdür,
Bir zaman ərzim eşit, gör necə ülfət sözüdür,
Tövsəni-əqlini fikr ilə gətir cövlanə.

Sən təki şux munasibdi ki, məstanə gələ,
Əldə sazü məzəvü sağərü peymanə gələ,
Aşiqi-məst görüb din ilə imanə gələ –
Kim, gərək doqquz ola başı bu meydanə gələ,
Özünə qürrələnib girmə bizim meydanə!

Sənə şayəstə odur kim, tapasan əhli-vəfa,
Canü dildən edəsən eşq təriqini rifa,
Olasan yar ona, etməyəsən cövrü cəfa,
Dövri-fanidə sürüb bir neçə gün zövqü səfa,
Əhli-haldan özünü tutmayasan biganə.

Yenə Aşıq Pəriyə yazmışdır:

Təxəllüs nə lazım, ey Aşıq Pəri,
Bir kəs ki, mehrdən xəbərdar ola?
Könüldən könülə yollar görünür,
Əlavə, nə hacət, aşikar ola?

Xoş yaradıb səni ustadi-əzəl,
Hüsnü vəcahətdə yekta, bibədəl,
Dızaq mahalında sənin tək gözəl –
Həqdən istəmişəm bərqərar ola.

---

*Məlik Aslan – məşhur Tuğlu Məlik Aslan bəydən ibarətdir ki, əhli-hal bir vücud imiş

Əhli-halı görmək istər əhli-hal,
Müzayiqə etmə, gər olsa macal.
Sənin tək dərdmənd olmayan mahal,
Görüm ki, dağalıb tarümar ola.

Belə işin nə ləzzəti, nə dadı,
Xublar bilə görək aşnanı-yadı,
Çəkəsən ağuşa bala Fərhadı,
Şirin didarına intizar ola.

Ağlını cəm eylə, olma sərsəri,
Səndə yoxdur eşqbazlıq əsəri,
Fəhmü fərasətdə yüz sən tək Pəri
Gərəkdir Məmmədə xidmətkar ola.

Aşıq Pərinin Məhəmməd bəyə cavabı:

Şayəstədir, ey mürşidi-kamilim,
Dostlar arasında etibar ola.
Şair odur ustadından dərs ala,
Ziddü cinsi rədifi-pərgar ola.

Cəvabi-xəttindən olmuşam xoşhal,
Ərz edərəm qulluğunda vəsfi-hal,
Şan ilə şövkətin olsun bizəval,
Gərək xidmətində xidmətkar ola.

Mailəm hüsnünün xoşca rənginə,
Yetə bilməz təcnisinin dənginə,
Səni sallam müəşşərin çənginə,
Arif bu yerlərdən xəbərdar ola.

Pəri idim eşq içində aşikar,
Aralıqda yaxşı olur səbəbkar,
Bu cəng meydanında eylərəm şikar,
Əgər Məhəmməd tək sə'd həzar ola.

Məhəmməd bəyin Aşıq Pəriyə cavabı:

Ustadi-əzəldən dərsim almışam,
Mailəm hər yerdə qövğayə, Pəri!
Ziddü cinsi-rədif sözün danışma,
Mən desəm, düşərsən ah-vayə, Pəri!



Əlindəki badə olsun, saz olsun,
Hərəkətin işvə olsun, naz olsun,
Yekə yerdən danışmağın az olsun,
Düşərsən bir dərin dəryayə, Pəri!

Müəşşərin hər bəndində naçarsan,
Mən açmaram, yenə özün açarsan,
Bu işindən yəqinimdir qaçarsan,
Axırda Məlikə, Mirzayə*, Pəri!

Qafiyə gərəkdir ola dilpəsənd,
Nə ki, belə məğşuş ola dərdmənd.
Bilmirəm ki, sənə eləyim rişxənd,
Yoxsa onu yazan mollayə, Pəri!

Ləblərin müsəffası Aşiqi,
Dəhanının müəmması Aşiqi,
Siyəh zülfün təmənnası Aşiqi
Salıbdır bir uzun sövdayə, Pəri!

Vəsfi-dilbər babında Molla Pənah Vaqif səbkində yazdığı mürəbbeatdır:

Səni tarı, məndən olma mükəddər,
İncimə, bu dilin viranı sənsən!
Neylərəm dünyanı, əzizim, sənsiz,
Bilirəm dərdimin dərmanı sənsən!

Gözəldir camalın, hüsnündür cəmil,
Ölmədim hicrində, qalmışam xəcil,
Başın üçün, ey gül, dolanım yüz il,
Könlümün mülkünün sultanı sənsən.

Vamiqin Əzrayə var idi meyli,
Onunçün axardı gözündən seyli,
Yusifin Züleyxa, Məcnunun Leyli,
Mənim də canımın cananı sənsən.

Hər nə ki, ərz etdim, ona yetmədin,
Şad eləyib bizi gəlib-getmədin,
Könlüm alıb bir yol qəbul etmədin,
Bu qədər çəkdiyim amanı sənsən.

---

* Məlik və Mirzə – Məlik Aslan bəydən və Mirzəcan bəydən ibarətdir

Pünhanı baxışın alıbdır canı,
Cadu qəmzələrin verməz amanı,
Tarı hifz eləsin nuki-müjganı,
Aşiqin qatili-pünhanı sənsən!

Yenə Aşiqin vəsfi-dilbər barəsində yazdığı kəlam:

Səndən ayrı işim mənim, ay dilbər,
Gecə-gündüz ahü fəğan olubdur.
Təğafül rəhmindən zülmü sitəmin
Bizim barəmizdə ehsan olubdur.

Ləhzə-ləhzə halın sorduğun könlüm,
Gündə min təsəlli verdiyin könlüm,
Daim şadü xürrəm gördüyün könlüm
İndi dərd əlindən viran olubdur.

Haçan almamışdın ağlımı sərdən,
Oxurdum müshəfü-hüsnün əzbərdən,
O gündən ki, saldın gözdən, nəzərdən,
Mənim halım çox-çox yaman olubdur.

Heç yada salmazsan mən dilfikarı,
Səni bimürüvvət yaradıb tarı,
Dəhanın şövqündən Aşiqi-zarı
Öldürən bir daği-pünhan olubdur.

Cəfərqulu xan "Nəva" təxəllüsün Məhəmməd bəyə ənam etdiyi qızılquş barəsində tərtib etdiyi qafiyələr:

Başın üçün, sizin bazi-ənami
On beş gündə alıb iki şikari.
Birisi yüz ovla üç qanad uçmuş,
Birisi bir yelpək kəbki-yəs'ari.

Olmaz belə şəfqət, belə mərhəmət,
Canü dildən gərək ha çəkək minnət,
Sərkari-alidə tapıb tərbiyət,
Onunçün bu qədər çoxdu vüqarı.

Səhər gəmişərəm, axşam tutaram,
Vaxt olur ki, meşələrdə yataram,
Börkümü götürüb önnük* ataram,
Yad elərəm tez-tez pərvərdigarı.

*Önnük – tərlan və qızılquşu ələ çağırmaq üçün saxlanılan ət parçası və ya ölmüş toyuq və ya şikar



Belə xana nüzul olmaz belə qəm,
Çarə olmaz buna, neyləsə aləm.
Uçmadığı, almadığı cəhənnəm,
Çağıranda ələ gələydi barı.

Burada yazılan qafiyələrdən başqa Məhəmməd bəy Aşiqin bir çox qəzəliyyatı və mərhum Qasım bəy Zakir ilə deyişmələri vardır ki, onları bə'zi səbəblərə görə, zikr etməyi münasib görmədik; ancaq ömrünün axır çağında tərcibənd təriqində yazdığı "Tövbənamə"ni yazmaqla iktifa etdik:

## TÖVBƏNAMƏ

Ey xuda, sənə ə'yandır ki, vəfadaram mən,
Tutduğum işləri yad eyləyib ağlaram mən.
Leyk bu nəfsin əlindən həməvəqt zaram mən,
Əliboş, üzüqara, bəndeyi-biaram mən.
Hər nə tənbeh edəsən, ona səzavaram mən,
Gəlmişəm dərgəhinə, labüdü naçaram mən.
Rəhm qıl, bari-xudaya ki, günahkaram mən,
Asiyü bədəməlü-rusiyəhü xaram mən.

Gərçi dünyayə gəlib gəzdimü getdim biçiz,
Vermədim xeyrü şərə zərrəcə təşxisü təmiz[400].
Artdı hirsim mərəzi, etmədim əsla pərhiz,
Dəxi bundan sora yoxdur mənə bir rahi-güriz.
Nə əməl riştəsi var əldə, nə bir dəstaviz,
Eylədim xəlq ilə nahaq yerə pərxaşü sitiz.
Rəhm qıl, bari-xudaya ki, günəhkaram mən,
Asiyü bədəməlü rusiyəhü xaram mən.

Hər nə iş tutdum isə, cümlə bədü bədhərəkat,
Etmədim şükri-həyat, eyləmədim fikri-məmat,
Bu dəni dəhrdə bihudə keçirdim övqat,
Şimdi rehlət dəmidir, qalmışam avarəvü mat,
Şərmsari-günəhəm, ah, əlim bisövqat,
Yetməyim məqsədə bu vəch ilə heyhat, heyhat!
Rəhm qıl, bari-xudaya ki, günəhkaram mən,
Asiyü bədəməlü rusiyəhü xaram mən.

Ya rəb, indi mən öz əhvalıma heyranam çox,
Qəzəbü qəhrin edib fikir, hərasanam çox,
Bilib etdiklərim əf'alə peşimanam çox,
Bilməyib səhvü qələt işlərə giryanam çox.

Kərəmü lütfünü çox izz ilə cuyanam, çox,
Qüssədən şamü səhər zarü pərişanam çox,
Rəhm qıl, bari-xudaya ki, günəhkaram mən,
Asiyü bədəməlü rusiyəhü xaram mən.

Tövbə, ya rəbb, bu qədər bəd əməlimdən tövbə!
Mə'siyət rahinə həm get və gəlimdən tövbə!
Hər xilaf olmuş isə sınmış əlimdən, tövbə!
Dəxi bundan sora məkrü dəğəlimdən tövbə!
Eylərəm sidq ilə mən piş əz-ölümdən tövbə!
Hər xəta çıxmış isə bir də dilimdən, tövbə!
Rəhm qıl, bari-xudaya ki, günəhkaram mən,
Asiyü bədəməlü rusiyəhü xaram mən.

Bilməz idim ki, bu aləmdə olur zar olmaq,
Nə ölüm var, nə qocalıq, nə də bimar olmaq.
Adətim hər xəmi-gisuyə nigunsar olmaq,
Mayili-lə'li-ləbu aşiqi-ruxsar olmaq,
Valehi-xalü xətü heyrəti-didar olmaq,
Yar əğyar olub, əğyarım ilə yar olmaq,
Rəhm qıl, bari-xudaya ki, günəhkaram mən,
Asiyü bədəməlü rusiyəhü xaram mən.

Bəli, məsdud olub şimdi mənə rahi-xilas,
Çünki lazım düşüb üsyanə şəriətdə qisas.
Qüdrətü hikməti-həqdən görünür böylə xəvas –
Kim, görə ruzi-cəza hər kişi fe'linə xilas,
Sən özün dadə yet ol gündə ki, nə amü, nə xas,
Nə kərəm əhli yetər dadə, nə əhli-ixlas.
Rəhm qıl, bari-xudaya ki, günəhkaram mən,
Asiyü bədəməlü rusiyəhü xaram mən.

Nəfsi-əmmareyi-sərkeş gətirib əqlimə zur,
Cism ilə canı tutub mərtəbeyi-kibrü qürur.
Əməlim ləğv, işim məzləmə, şüğlüm şərü şur,
Gəlmişəm dərgahə bainhəmeyi-eybü qüsur,
Dəxi, ya rəb, dərindən məni sən eyləmə dur.
Qoymadı hirs, tamah gəldi dəxi didədə nur,
Rəhm qıl, bari-xudaya ki, günəhkaram mən,
Asiyü bədəməlü rusiyəhü xaram mən.

Müxtəsər, hər nə əməl eylədim oldum nadim,
Hirs qıldı məni hər nakəsi-duna xadim.
Nəfs ucundan nə bəla çəkdi dili-pürbadim,
Şimdi nə bir əməlim əldə, nə var bir zadim,



Tapmadım bir kərəm əhli ki, edə imdadim,
Sən özün dadimə yet, barı eşit fəryadim.
Rəhm qıl, bari-xudaya ki, günəhkaram mən,
Asiyü bədəməlü rusiyəhü xaram mən.

Nə dilim var ki, səni cür'ət edib yad qılım,
Nə üzüm var sənə sarı tutuban dad qılım.
Nə sözüm var özümü ol söz ilə şad qılım,
Dili-bərbadı nə ümmid ilə abad qılım?
Nə edim canımı bu vərtədən azad qılım,
Çarə oldur ki, yenə bu sözü övrad qılım,
Rəhm qıl, bari-xudaya ki, günəhkaram mən,
Asiyü bədəməlü rusiyəhü xaram mən.

Bir neçə il özümü eşqə müqəyyəd qıldım,
Gahi Aşiq adımı, gah Məhəmməd qıldım,
Məşqi-əbruyi-xətü xal ilə mürtəd qıldım,
Şiveyi-mehrü məhəbbətlə böyük sə'd qıldım,
Rövşəni-eşqdə Məcnunə dəxi rəd qıldım,
Hər nə iş tutdum isə, cümləsini bəd qıldım.
Rəhm qıl, bari-xudaya ki, günəhkaram mən,
Asiyü bədəməlü rusiyəhü xaram mən.

Mərhum Məhəmməd bəyin bu "Tövbənamə"si onun bərguzidə əsərlərindən birisidir. Şair ömrünün tükənəcəyində – rehlət dəmində dərgahi-ilahiyə üz çevirib, kəmali-əczü inkisar ilə tövbə və istiğfar eləyir və etdiyi günah əməlləri bir-bir tedad qılıb zarü pərişan halda rəhmi çox olan həqqdən məğfirət diləyir.

Bəli! Əyyami-cavanlıqda az adam tapılır ki, həyatın qədrini bilib, onu bihudə sərf eləməsin və şairin zəbunü pərişan halını pirlik mövsümündə öz vücudunda hiss eləməsin, hirs, tamah, hübbi-cahü mərtəbə, hübbi-malü miknət, ləhvü ləəb, büğzü ədavət, məniyyət, sərkeşlik, büxlü həsəd və zülmü sitəmə adət və sair övsafi-zəmimə və əxlaqi-rəzilə ki, cümləsi avamlıq və cəhalət nəticələridir, cismü ruhumuzu bir növ zəbtü təsərrüf edibdir ki, həqqü həqqaniyyətdən, insafü mürüvvətdən və əsl bəşəriyyət və insaniyyət nə olduğundan bilkülliyyə qafil və bixəbərlik.

Ancaq axır nəfəsimizdə qəflətdən gözümüzü açıb, ölümü önümüzdə görüb xövfü əndişəyə düşürük və şairin dili ilə bu günə tövbə və istiğfar eləyirik. Əgərçi axırki peşmanlıq fayda verməz, vəli tövbə və inabədən başqa bir çarəmiz yoxdur.

# CƏFƏRQULU XAN "NƏVA" TƏXƏLLÜS

Mərhum Cəfərqulu xan İbrahim xanın böyük fərzəndi Məhəmmədhəsən ağanın oğludur. Məhəmmədhəsən ağa isə ziyadə nəcib, fərasətli və ləyaqətli bir şəxs imiş. İbrahim xan onun xatirini əziz tutarmış və özünə onu vəliəhd tə'yin edibmiş. Vəli İbrahim xan hənuz sağ ikən oğlu Məhəmmədhəsən ağa dari-üqbayə rehlət buyurdu və İbrahim xan general Tesvidayevin vasitəsilə Rus imperatoruna yazıb, kiçik oğlu Mehdiqulu xanı ondan sonra varis təsdiq etmək fərmanını xahişmənd olmuşdu və tarixi-islamiyyənin 1221-ci sənəsində – ki, tarixi-məsihiyyənin 1806-cı sənəsinə mütabiqdir, – Mehdiqulu xan imperator fərmanı ilə külli-Qarabağ xanlığına İbrahim xandan sonra hakim tə'yin olundu.

Mə'lum olsun ki, Cəfərqulu xan babası İbrahim xanın hali-həyatında aşikarən varislik iddiası etmirdisə də, amma qəlbində bu arzu və başında Qarabağa hakim olmaq fikri var idi. Zəmani ki, imperatorun fövqdə zikr olunan fərmanı yetişdi, Cəfərqulu xan mə'yus və mükəddər oldu və o vaxtdan sonra onunla əmisi Mehdiqulu xanın arasında həmişəlik bir küdurət və ədavət vüqua gəldi və Cəfərqulu xan çox hiylə və dəsisələr və pürfəsad tədbirlər işlətdisə də, nəticəbəxş olmadı və bəlkə özü müttəhim olub "gözdustağı" halında Petroqrada aparıldı və orada bir müddət qalandan sonra generallıq çini alıb Qarabağa müraciət elədi.

Cəfərqulu xan babası İbrahim xan kimi dilir, rəşid, qəviheykəl və pürhünər bir zat imiş. Əhli-zövqü şövq olduğu üçün vaxtını işrətdə keçirərmiş, tar-tənburu, çəng-çağanı, mütrib və müğənnini dost tutarmış. Qapısında İran padşahları kimi pəhlivan və nər güləşdirmək, qoç döyüşdürmək, kəndirbaz oynatmaq, hoqqabaz saxlamaq adəti və xoşagələn işlərdən hesab olunarmış. Vəli o sifətləri ki, "Riyazül-aşiqin" sahibi möhtərəm Məhəmməd ağa Müctəhidzadə xani-mərhumun haqqında yazıblar, dürüst deyil. Belə ki, Müctəhidzadə cənabları yazır: "Bu mənbəicüdü səxa və mə'dəni-feyzü əta ki, xani-nəvali və süfreyi-ehsani ğədü işa və sübhü məsa məcmə'i-füqəra və mövqeyi-məsagin və züəfadır, təlli-xakistəri mətbəxi-cudindən atılan xakistər və əncümü əxtər onun ad qazanan olan qüduri-rasyatının zirindən çıxan şərarə və əxkərdir. Naminami və ismi-giramisi cənnətməkan və xüldaşiyan Cəfərqulu xani-mərhum ki, Məhəmmədhəsən ağa Cavanşirin şiblidir"... i.a.[401]

Bu müqəddimə xilafi-haqqü savab və bir növ bimərzmun ibarələrdir ki, bunları yazmaqdan müəllifin əsl muradı nə olduğunu anlaya bilmədik. Bu qədər tə'rif və tövsifə nə hacət?! Bu qədər mübaliğə və ifrat nə lazım?! Bu boş ibarələr ancaq kəlamı etibardan salır. Hər şəxsi öz sifəti ilə yazmaq, bildirmək yaxşı deyilmi?!



Xani-məzkuru görüb-eşidənlərin rəvayətinə görə, onun süfreyi-ehsanı məcmə'i-füqəra və mövqeyi-məsakinü züəfa olmayıb, bəlkə lotu-potu yığıncağı, oyunbaz, quşbaz və şəbədəsazi-məhəlli olubdur. Onun "mənbəi-cudü səxa və mə'dəni-feyzü əta" olduğuna dəxi şübhə çoxdur. Necə ki, onun şə'nində mərhum Qasım bəy Zakir Mirzə Fətəli Axundzadəyə yazmışdı, onun vücudu yuxarıda yazılan sifətlərdən ari və bəri imiş. Budur Zakirin yazdığı şeirlər:

Çoxların qılıbsan çörəyə möhtac,
Axtarır, tapılmaz dərdinə əlac;
Fir'onü Hamanü Zöhhakü Həccac[402]
Ola bilməz ola sitəmkar səndən.

Bəd'ətin yandırıb qövmü əshabi,
Müşküldü gətirək bu zülmə tabi,
Düşüb Cəbrəilli, Maralyan, Babi,
Horadiz, Qoyucaq* dərbədər səndən.

Zülmü sitəminlə aləm dolubdur,
Əhli-beytin rəngi-ruyi solubdur,
Neçə rövşən xanimanlar olubdur
Şəbi-yelda kimi tirətər səndən...

Çox ehtimal var ki, Zakir dəxi xani-mərhumu təzmim etməkdə mübaliğə etmiş olsun və bir növ qərəzi-şəxsi ucundan həddi-e'tidaldan çıxsın, amma bilmərrə bu sözlərin doğru tərəfini də inkar etmək olmaz, bir halda ki, əvvəl vaxtlarda Zakir Cəfərqulu xana yavuq imiş və onun əxlaqü ətvarına dürüst bələd imiş.

Cəfərqulu xan həştad ildən artıq yaşayıbdır və hicrətin min iki yüz həştadıncı[403] illərində vəfat edibdir. Təb'i-şe'riyyəsi dəxi var imiş. Fars və türk lisanında bir neçə əsərləri vardır.

Tamahkar və halvaxor bir mollanın barəsində bu şeirləri yazmışdır:

Ey oştore-kəcgərdəna danəm çe xahi kərdəna,
Gərdənderazi mikoni əz bəhre-həlvaxordəna.

Çon sobh xizi, quş kon çon morde bini cuş kon,
Xurcinra bər duş kon əz bəhre-həlvaxordəna.

Bər xane-rəbbol-nasra əz sər məbər vəsvasra,
Por kon çənaqo tasra əz bəhre-həlvaxordəna[404].

---

*Maralyan, Horadiz, Qoyucaq – Qarabağda Cəbrayıllı mahalında xani-məzkura mütəəlliq kəndlərin adlarıdır

Bə'ziləri bu şeirləri Cəfərqulu xana isnad verirlərsə də, biz yəqinən təsdiq edə bilmərik. Xanın Aşıq Pəri ilə dəxi bir neçə mükalimələri və məktubati-mənzumələri vardır və lakin onların çəndan əhəmiyyəti yoxdur ki, burada yazılsın.

Kəlamından məşhuru Şuşa qazisi Mirzə Əbdülqasımın haqqında yazdığı qəsidədir ki, eynilə burada dərc olunur:

Matəmi böylə tutarmış məgər adəm, qazi,
Edə lə'nət ona bəs sahibi-matəm, qazi.

Sən necə zamin olurdun, kişi, dava olmaz,
Bu sözü rus yanında dediniz həm, qazi.

Siz məgər halını öz əhlinizin bilməzsiz,
Zərrəcə bəd əməlindən eləməz qəm, qazi.

Özgə davada olan kəslər alır simü zəri,
Qırdırır şişəlini müftü müsəlləm qazi.

Zahirən qələlinin qətlə gedərdi nisfi,
Olmasaydı aralıqda yenə Rüstəm, qazi.

Daima vəz eləyir xalqa ki, ehsan eləyin,
Özü heç dışqarı verməz ola gər nəm qazi.

Daş daş üstə belə Şişədə durmaz hərgiz,
Bə'zi işlərdə əgər olmasa ə'ləm qazi.

Adını molla qoyan xalqa deməz rast yolu?
Onların dərdi edibdir qədimi xəm, qazi.

Unudurlar hamısı tarı, peyəmbər əmrin,
Gər aralıqda ola söhbəti-dirhəm, qazi.

Bir para vaxt danışmaq bizə lazımdır, leyk
Bir para vaxtda yekdir ola əbkəm qazi.

Demişəm mən sənə heç vəqt inanma xalqa,
Bə'zi övqat eşit pəndimi kəm-kəm, qazi.

Bundan artıq nə yazım dərdi-dili, mövlana,
Deyərəm baqi sözümü səni görsəm, qazi.

Cəfərqulu xanın qaziyə xitabən yazdığı bu kəlamına səbəb mahi-məhərrəmdə qalalıların arasında dəstəbaşı olmaqlıq və yainki cüz'i bir şeyin



üstündə vüqua gələn dava və çırpışma olubdur ki, neçə adamlar nahaq yerə qətlə yetişibdir. Yəqin ki, qaziyi-şəhr divan əməlacatına söz verib zamin olubdur ki, dava-şava düşməz, vəli öz əhlinin öhdəsindən gələ bilməyib, rəfi-mücadilə və mübahisədə aciz qalıbdır və yanki kəsrəti-təmədən tərəfgirlik edib, mücadiləyə bir növ özü səbəb olubdur. Necə ki, xanın kəlamı buna şəhadət verir:

Sən necə zamin olurdun, kişi, dava olmaz,
Bu sözü rus yanında dediniz həm, qazi.

Siz məgər halını öz əhlinizin bilməzsiz,
Zərrəcə bəd əməlindən eləməz qəm, qazi.

Özgə davada olan kəslər alır simü zəri,
Qırdırır şişəlini müftü müsəlləm qazi.

Cəfərqulu xanın bu kəlamı müasiri olan Qasım bəy Zakirə – ki, Qarabağın ən müqdətir şairi hesab olunur və onun haqqında atidə zikr olunacaqdır, – tə'sir eləyir və övsafi-qazini ol mərhum dəxi də mükəmməl vəchdə və istehza səbkində nəzmə çəkir.

Kəlami-Zakir:

Eləyibdir nə günəh heç nə bilməm qazi.
Xəlq arasında olubdur belə mülzəm qazi.

Yaradıbdır onu ol xaliqi-əşya bieyb,
Dari-dünyada bu surət tapılır kəm qazi.

Qazi hər yerdə olur biməzəvü bədhərəkat,
Şükrillah ki, bu həm baməzədir, ham qazi.

Qələmi tiği-düsərdir, özü mərdi-rəhi-din,
Daima Şeyxi[405] ilə cəngə müsəmməm qazi.

Səri-ə'dadə fırıldar çomağı bərqasa,
Necə ki, mərəkədə şeşpəri-Rüstəm qazi.

Nari-qəhri əridir mum kimi fuladi,
Küreyi-nəfsi-dərunə verə gər dəm qazi.

Kimdi yanında onun Əliqulu, Əbdürrəhim[406],
Kuhi-Əlbürsü yıxar çün toxunan dəm qazi.

Dəhrdə Şişə olur səngi-cəfadən eymən,
Ola bir şəhrdə bu tərzlə möhkəm qazi.

Mə'dəni-cudü kərəm, caygəhi-əmnü əman,
Ədldə Nuşirəvan, bəzldə Hatəm qazi.

Füqəra dövri-sərayində bəsani-halə*,
Nəqdi-ehsani Qarabağə çü şəbnəm qazi.

Qələt etdim, bu sözün yoxdu vüqun hərgiz,
Qorxuram cəmdəyimə tüf deyə aləm, qazi.

Şişənin simü zərin doldurasan xanəsinə,
Şişəvəş dışraya verməz yenə bir nəm qazi.

Qazi oldur ki, qala əhli-vilayət qəminə,
Nə ki, aləm həmə qəmgin ola, xürrəm qazi.

Onda mən gördüyümü görmüşəm, indən beylə –
Etməzəm taət ona gər ola qibləm qazi.

Haradan gəldi bular, eylədilər xəlqi xərab,
Biri der müctəhidəm, biri müsəlləm qazi.

Atlanıb biri çapar Təkləyə day, danə üçün,
Biri də şamü səhər talibi-dirhəm qazi.

Yay gedər Fingiyə zövq etməyə, qış Qaynağə**,
Bir deməz hiç gəlir mahi-məhərrəm qazi.

Qazi lazımdı deyə məhkəmədə şər'i-nəbi,
Nə ki gəşt edə cahanı, minib ədhəm qazi.

Təbrizin ağı ucuz, miri-vilayət qafil,
Hər əlif-bey deyəni qıldı müəmməm qazi.

Dəxi divani-rəiyyət belə getsə, qalmaz,
Bu Qarabığı edər cümlə mükərrəm qazi.

Xişü əqvamına mu qədri tərəhhüm qılmaz,
Dəmbədəm xalqa oxur sileyi-ərhəm qazi.

Sabiqən böylə deyildi, olub indi birəhm,
Həzrəti-xanə olandan bəri məhrəm qazi.

Çox adam var idi nəzm ilə ə'da eyləməli,
Xahişi-xanə görə düşdü müqəddəm qazi.

* H a l ə – bə'zi vaxtı ay ətrafında zühur olan nurani dairəyə deyilir
** F i n g i və Q a y n a q – yer adlarıdır



Çünki divanəyə yoxdur qələm, ümmidim var
Əfv edər cürmümü, gər üzünə söysəm qazi.

Dastani-Əmiraslanı bu gündən böylə –
Başlaram, fikrim əgər olsa fərahəm, qazi!

Hər iki kəlamdan mə'lum olunur ki, ruhanilərimizin qüsur və nöqsanı hər bir əsrü zamanda əhli-mə'rifətlərimizin nifrət və tənqidlərinə bais olub, onları təzmim və təsyib qılıbdar. Xüsusən, məsnədi-qəzavətdə əyləşən alicənabların hirsü tamahı, dünyagir və biəməl olmaqları cümlədən artıq üdəba və şüəra zümrəsinə tə'sir edibdir. Necə ki, Cəfərqulu xan buyurur:

Daima vəz eləyir xalqa ki, ehsan eləyin,
Özü heç dışqarı verməz ola gər nəm qazi.

Zakirin bu mətləbə dair yazdığı şeir bundan da gözəl və pürməzmundur:

Şişənin simü zərin doldurasan xanəsinə,
Şişəvəş dışraya verməz yenə bir nəm qazi.

Bu kəlamda cinas vardır. Əvvəlki misrada "Şişə" Şuşa qalasından ibarətdir ki, sabiqdə Qarabağ xanlarının paytaxtı hesab olunurdu. İkinci misrada yazılan "şişə" məhz şişənin özündən – sürahidən ibarətdir ki, onun içinə hər nə töksən yenə dışqarıya nəm verməz.

Cənab qazi dəxi nə qədər öz xanəsinə Şişə xalqının simü zərini və sair əmvalını doldurur isə, yenə də doydum deməyib, xaricə və ətrafında olan füqəra və məsakinə zərrəcə rəhm eləmir və bir möhtacın ehtiyac və zərurətini rəva qılmır. Necə ki, bu barədə mərhum Qasım bəy başqa bir kəlamında buyurmuş:

Molla nə molla, əsiri-şikəmi-əndər piç,
Qazi nə qazi ki, sir olmaz içə ümmani.

Bəli! Dəryalar kamına çəkib sir olmayan və heç bir şeydən gözləri doymayan ruhanilərdən milləti soymaqdan qeyri daha bir təmənna və çeşmdaştlıq ola bilməz!..

Necə ki, yuxarıda zikr olundu, sabiqdə Zakirin xatiri Cəfərqulu xanın yanında əziz imiş və aralarında zərafət var imiş. Bir dəfə Zakir xanın hüzuruna gedir və nə tövr olursa, onun başmaqları xanın sarayında oğurlanır. Şair mə'yusanə evinə qayıdıb bu həcvləri xidmətkarlar böyüyü Bəylər bəyə yazır:

Bəylər, nə layiqdi xan qulluğuna
Bir kəs atlı gedə, piyadə gələ?
İldə bir yol düşür mənim güzarım,
Vay onun halına ziyadə gələ.

Böyüyün dərində lazımdı dərman,
Axşama dək ola bəndeyi-fərman,
Təmənnasız gələn olur peşiman,
Gələ gör bir adəm murada gələ!

Oğruluğa əcəb olubsuz mö'tad,
Həmrahi-birahın dad əlindən, dad!
Gedəndə şad gedər, gələndə naşad,
Hər kimsə ki, sizin bərbada gələ.

Gəlməyən adama deyirsiz: gəlin!
Müşküldür qayıtmaq ayağı yalın,
Mən yenə qıvrağam, Adıgözəlin[407]
Gərək dalısınca ərradə gələ.

Məsəli-məşhurdur: "Quş dənə gedər",
Sizdə bir nəf' yox səvayi-zərər,
Gəlməz o qapıya heç kimsə məgər
Horadiz, Qoyucaq fəryadə gələ.

Bundan sonra girən xanın evinə
Gərək başmaqların soxa cibinə,
Ya keçirə saf otağın dibinə,
Nə isə, mühəyya, amadə gələ.

Lazımdır tərəddüd xeyirdə, şərdə,
Ədalət üzünə çəkibsiz pərdə,
Bir təziyə olsa, xudanəkərdə,
Gümanım yoxdur ki, molla da gələ.

Bir adam tə'yin et asitanaya,
Yaxşını-yamanı gerçək tanıya,
Nə eşiyə, nə də qəhvəxanaya
Qoyma hər yetən ... gələ.

Onun bu cavabında Cəfərqulu xan Zakirə yazmışdır:

Qasım bəy, adətdir, xan qulluğuna
Bir kəs atlı gəlsə, piyada gedər,
Mən deyiləm, aləmdə var, eldə var,
Belə cüz'i işlər arada gedər.



Burada bir başmaq olub zərərin,
qələm alıb yazdın zəmmin bu dərin,
Zalım, yoxdur məgər sənin xəbərin,
O dərdən kim, aləm fəsada gedər*?

İndi belə görmə Adıgözəli,
Səndən qıvraq idi onun əzəli.
Hər zaman ki, durub yola düzəli,
Yenə bədov atdan ziyada gedər.

Gədə, saf azıbdır əməlin sənin,
Mədənisən təqəllübün, fitnənin.
Sən neçün bilməzsən, bağlı gələnin
Ayağı açılıb piyada gedər?!

Oğlan, lap çıxıbsan sən əndazədən,
Neylər, hələ gedəcəksən yazədən,
Köhnə oğurlandı, tikər tazədən,
Bir adam yollaram ustadə, gedər.

Necə ki, sabiqdə bu barədə mə'lumat verildi, Mehdiqulu xan ilə Cəfərqulu xanın mabeynində büğzü ədavət var imiş.

Cəfərqulu xanın Mirzə Fətəli Axundzadə ilə dəxi ülfət və aşinalığı var imiş və aralarında zərifanə irsalü mərsulları olubdur. Bunlardan bir namə ki, Axundzadə xani-müşarileyhə yazıb, Adolf Berjenin Leypsiq məcmuəsinə daxil olubdur. Haman namə belə başlanır:

Hacıqulu səndən, ey taci-sərim,
Ziyadə-ziyadə xürrəm olubdur.
Söz veribdir sizə Kruzenştern[408],
Poçotniklik işi möhkəm olubdur.

Bu məktubu eyni ilə Mirzə Fətəli Axundzadənin tərcümeyi-halı babında dərc etməyi münasib gördük[409].

Fars dilində yazılmış əsərlərdən bir məktub Mirzə Haqverdi "Səfa"[410] təxəllüsə və mahi-məhərrəmin yetişməsi münasibəti ilə inşad etdiyi tərcibənddən bir bənd "Riyazül-aşiqin"dən iqtibasən burada dərc olunur.

Cəvabi-Mirzə Haqverdi Səfa:

* Aləm fəsada gedən dər – yəqin ki, Mehdiqulu xanın dərinə işarədir

Suye-yarane-vəfa bişe səlami darəm,
Qəllü dəllə əcəb torfe kəlami darəm,

Rox nemipuşəm əz in ərz konəm fərzol-eyn
Çon ke, dər pişe-şoma şohrəte-tami darəm.

Gərçe matimo piyade ze çenin gərdeşe-çərx,
Əsb dozd bordeve dər dəst locami darəm.

Nist dər Şişeye-ma fərq həlali ze həram,
Gər qəbuləş bekoni, Rəxşe-xorami darəm.

Ğərəze-mən həme şuxisto nə sedq, səfa,
Bər mətərsid ke, əz kəlmeye-la midarəm.

Ey Nəva, gər nəkoni razi bedan qazira,
Ba to ta ruze-cəza bəhse-modami darəm[411].

* * *

Mahe-məhərrəm amado por şod deləm ze ah,
Dude-deləm gereft roxe-çərxo mehro mah.

Çon əbre-noubəhar fələkra əhate kərd,
Çəndan ke, dər fələk bemələk minədarəd rah.

Cəbrail əz tərəddode-əflak baz mand,
Qofta biheyrəti ke, xodara, tora pənah.

Aya çe şod ke, çake-kəriban nəmud sobh,
Puşide şəb lebase-əzara be bər siyah.

Aməd neda ze hatefe-ğeybi ke, ya əmin,
Bengər bedəşte Kərbəla, suye-qətlgah.

Emruz ruze-qətle-Hoseyne-ibn Mortəzast,
Emruz ruze-matəme-məcmue-ənbiyast[412].

Mərhum xanın yuxarıda dərc olunan nümuneyi-asarından, – xah türki olsun və xah farsi, – onun xoştəb' bir şair olduğu görünür.



## QASIM BƏY "ZAKİR" TƏXƏLLÜS

Qasım bəy Zakir Qarabağın mümtaz nücəbalarındandır. Onun atası Əli bəy, Əli bəyin atası Şahverən bəy və onun atası Kazım ağadır ki, Şuşa şəhərinin banisi məşhur Pənah xanın doğma qardaşı Hüseynəli ağanın oğludur.

Qasım bəy təvəllüd edibdir hicrətin 1199 cu tarixində – ki, tarixi-məsahiyyənin 1784-cü sənəsinə mütabiqdir, – Şuşa şəhərində. Tə'lim və tərbiyəsi haman şəhərdə olubdur. Öz əsr və zamanının övsafü əhvalına görə çəndan elmü kəmal əxz etməyə müvəffəq olmayıbsa da, türk və fars dillərini layiqincə təhsil edibdir.

Məhəlli-süknası yay fəslində tanyaq və ya Şuşa qalası olarmış. İlin sair fəsillərini özünə mütəəlliq Xızırıstan[413] qəryəsində keçirərmiş. Qasım bəyi görənlərin, o cümlədən mən fəqirin atası mərhum Əhməd bəy Köçərlinin rəvayətinə görə, o zati-şərif xoşsurət və xoşsima, ağ bədənli, uca qamətli, zəifülbünyə bir vücud imiş. Göyçək, ağıllı və göy rəngə mail gözləri var imiş. Simasından, hərəkət və süknasından asari-nəcabət və rəşadət görünərmiş. Danışığı fəsih və sövtü dilkəş olmağa görə, çoxlarını özünə mail edərmiş və o danışanda qulaq asmamaq olmazmış. Bir az tündməzac olduğu üçün tərpənişində dəxi çapüklük görünərmiş. İnsaf və mürüvvədtən xaric sözlər və işlər şairi təbii halından çıxarıb, onun qeyzü hiddətinə səbəb olarmış. Amma acığı tez sönüb tövbə və istiğfar edərmiş. Adəti halında ziyadə xoşxülq, həlim, rəhimli və mürüvvətli bir adam imiş, sahibi-əqlü tədbir. Buna şahid şairin öz kəlamı da ola bilər:

Tanır məni məcmuyi-otuz iki Cavanşir,
Bir mərdi-xoşəxlaqəmü həm sahibi-tədbir.

Rövşəndi qamu aləmə zatımda xudavənd
Xəlq eyləməyib mu qədəri hiyləvü təzvir.

Eymənədilər əzbəs ki, olub ram, rəm etməz
Gördükdə məni badiyədə ahuyü nəxcir[414].

Əl vurmazam əsla sipəri-dəfi-bəlayə,
Yağdırsa kamandar fələk qəsdimə sə'd tir.

Və lakin belə gözəl xülqü və xoş rəftarı və təbiətində olan mülayimət və təvazö və həmçinin onun əqli-səlimi və hüsni-tədbiri onu xəta və bəladan eymən saxlaya bilmədi.

Şair bir işdə müttəhəm olub – ki, təfsili aşağıda zikr olunacaqdır, – çox böyük bəlalara və cəfalara giriftar oldu və əgər bə'zi alinəsəb və alihimmət və qədirşünas möhtərəm şəxslər Zakirə lazımi kömək göstərməsə idilər, yəqin ki, şair dəxi də ziyadə fəna hala düçar olub, Qazax şairi Mustafa ağa Arif kimi cani-əzizini Rusiyanın soyuq və qarlı çöllərində puç və zay edəcək idi.

Əhvalat bu üzrədir ki, Qasım bəyin qardaşı oğlanlarından bir nəfəri – Behbud bəy ismində qaçaqlığa və quldurluğa qurşanıb, Qarabağ vilayətində bir çox şuluqluq və binizamlıq və fəsad törədir. Bir neçə həsud və bədxahların təhrik və iğvası ilə ol vaxtın divanbəyisi Qasım bəydən müştəbeh olub, ondan şaki və mütalibəçi olur və Behbud bəyin qətl və qarətində Zakirin uşaqları da müttəhəm olunur[415].

Ol vaxtın divanbəyisi knyaz Tərxanov[416] xeyli kuşiş və tədbirdən sonra Behbudu həlak etdirir; evini və malını dağıdıb tar-mar elədir və Mustafa bəyi – ki, Behbud bəyin qardaşı idi, – bir neçə adamlar ilə əsir edib Şuşa qalasına göndərir (sonradan haman Mustafa bəyi Tərxanov işqola qoyub, ona tə'lim və tərbiyə verdiribdir).

O neçə adamlar ki, müttəhəm olunmuşdular, onların içində mərhum Qasım bəy dəxi var imiş. O pişnəhad etdiyi sübut və dəlayilə ümənayidövlət mültəfit olmayıb və onun haqqında bədgüman olub, özünü və oğlu Nəcəfqulu bəyi və qardaşı oğlu İskəndər bəyi Sibiryaya göndərməyə qət'i surətdə hökm verir, əyalü ətfalını Şuşa məhbəsxanasında dustaq, malü əmvalını tarac etdirir, Xızırıstan kəndini dağıdıb zir-zəbər qılırlar.

Bu zülmü şərarət və xilafi-qanun işlər Zakirə həddən ziyadə tə'sir edib, onu pərişan və digərgun eləyir. Bir tərəfdən illər ilə cəm qıldığı mal və dövlətinin tarümar olmağı, digər tərəfdən əbəs yerə hörmət və abrunun getməsi, düşmənin tə'nü şəmatəti yazıq kişinin yüz illiyini geri salır.

Bu böyük müsibət Zakirə üz veribdir məhərrəm ayında hicrətin 1272-ci[417] tarixində. Ol vaxt şair müsinn halında imiş, ömründən altmış yeddi il keçir imiş. Cənab Nəvvab öz "Təzkirə"sində və cənab Məhəmməd ağa Müctəhidzadə "Riyazül-aşiqin"də sinnü salı tə'yinində bir növ səhv etmişlər[418]. Hər halda Zakir altmış beş sinnində vəfat etməyibdir və tarixi-vəfatı 1271-ci[419] sənədə olmayıbdır, ondan çox sonra vaqe olubdur[420]. Buna şahid Zakirin öz kəlamıdır. Başına gələn müsibəti gözəl bir tərkibbənddə bu minval nəzmə çəkib zalimlərdən şikayət eləyir:

Bu mahi-məhərrəmdə dü si həft mana sal,
Müddətdi ki, pərqu kimi əbyəzdi pərü bal.

Şahiddi xudavəndi-təalavü təbarək,
Tərpətməmişəm mən süxəni-nahəqə saqqal.



Haşa yetirəm bir kəsə asibü məzərrət,
Gər eyləməsin bu sözümə bavər, o jurnal!

Ta gördüm o bədbəxt* olub həmrə'yi-gümrah,
Halatı müfəssəl yazıban eylədim irsal.

Labüd qalıb ondan sora dönə-dönə etdim
Tərğib onun dəfinə bu zalımı filhal.

Guş eyləməyib pəndi-xirədməndi o nakəs,
Axır qoşulub bir-birinə bir neçə cübhal.

Hər kimə düçar oldu, tutub basdıvü kəsdi,
Verdi özünü küncə tamam murovi-mahal.

Beş-altı kəm-alat cavan ilə olurmu
Hifz edə vilayatı məni-piri-bədiqbal?!

Düşmən sipəhi tək bir obanın yoxu varın,
Bir həftə qalıb eylədi məcmuunu pamal.

Ərradəyə yığdırdı qamu əhlü-əyalı,
Səqfi-fələyə çıxdı o gün naleyi-ətfal.

Həccacü Ömər-sə'd deyildi belə birəhm,
Ol ... bicliyinə hiç yox işgal.

Bəd kar həramtuşədən əsla iraq olmaz,
Bic olmayanın zülmü olur, bu sayaq olmaz!

Şairin sözlərindən belə anlaşılır ki, biçarə öz bədbəxt bəradərzadəsini – yə'ni Behbud bəyi düzlüyə irşad edib, nə qədər ona öyüd və nəsihət veribsə də ki, pis yoldan daşınsın, mərdüməzarlıq etməsin və xalqa zülmü və sitəmi rəva görməsin, amma mərhumun nəsihəti xudsər və bişərm Behbuda əsər etməyibdir və axırda Zakir naəlac qalıb, əhvalatı müfəssəl yazıb lazım olan yerə göndəribdir.

Və lakin divan əmələsi Behbudun qorxusundan murovi-mahal ilə qaçıb özlərini küncə verirlərmiş. Bu tamahı çox, hünər və cür'əti yox olan divan qulluqçularının barəsində haman tərkibbəndində belə yazıbdır:

Gün kimi tutub aləmi bu şöhrəti-bica,
Divan əmələcatına yox ədldə həmta.

* Bədbəxt – Bebud bəyə işarədir

Vallah, yalandır, dəxi billah, yalandır,
Şol söylənən əhval quru ismdir əmma.

Keyfiyyəti-mə'lumdən ötrü mən özüm də
Bir neçə biladi elədim seyrü təmaşa.

Yüz təşnələbi-qəhr olasan, xadimi-dövlət
Verməz bir içim su sənə ta almaya dərya.

Simü zər ilə doldurasan ta gərək ovcun,
Ondan sora zahir qıla şayəd yədi-beyza.

Suzü təbişi-nari-səqər gərçi yamandır,
Əhli-qələmin gəl-gedinə bənzəyə haşa!

Yeksər həmə təmmavü bədətvarü dilazar,
Bunlar kimi məxluq cahan içrə yox əsla,

Hər kimsə ki, düşdü tora, müşküldü xilası,
Çəkməzlər əl ondan, şirəsin sormayalar ta.

Hər nəfsə nüzuli-mələkül-mövt nə hacət,
Bəs ariz üçün vədeyi-fərda, pəsi-fərda.

Düşməz buların səmtinə ta ruzi-qiyamət
Təklə Hacı Qurbani görən kəs dəxi qəta.

Tutmuşdu Qarabağı zərü simü dəvabı,
Tapmaz minə bir yabı gedə qonşuya hala.

Divan demə, hərgiz buna kim, afəti-candır,
Mən söyləmədim, nola ki, məşhuri-cahandır.

Tərkibbəndin bu bəndində Zakir divan əmələcatının qüsurunu şairanə zikr edib, onların əvamün-nasə etdiyi zülm və sitəmi göstərir. Burada cayi-təəssüf və heyrət budur ki, altmış-yetmiş sənə bundan irəli divan xidmətçiləri xəlayiq ilə nə növ rəftar edirmişlərsə, indi o gunə rəftar etməkdədirlər. Bu müddəti-mütəmadiyədə – ki, az qalıbdır tamam bir əsr etsin, – onların əxlaq və adabında bir təbəddülat, bir tərəqqi əsəri müayinə olunmur.

Zahirdə ədalət və sədaqət mə'murları və zakon tərəfdarları adlanırdılarsa da, əsl həqiqətdə əhli-zələmədirlər. Şüğl və sən'ətləri şərarət və fəsad törətməkdir, xilafi-qanun və ədalət işlər etməkdir. Hər qism fənn və fürcələri xalqın malını yemək və özünü avamlıqda saxlamaq dairəsində işlənir. Dəryalarca verməsən, bir içim su almaq sənə müyəssər olmaz; qızıl və gümüş ilə ciblərini doldurmasan, işin yeriməz və muradına çatmazsan. Onların tamahı həzrət Əli-Zülfüqarından kəskinraqdır. Bədbəxt o kimsənədir ki, onların toruna düşə. Onun tamam şirəsini çəkməmiş, onu xilas etməzlər. Təkləli Hacı Qurbanın gününə salmayınca yaxasından əl çəkməzlər. Necə ki, bir vaxt onun mal və dövləti bütün Qarabağı tutmuşdu, amma indi divan toruna düşəndən bəri bir yabı da tapmır ki, minib qonşuy getsin.



Hər şeydən bədtəri və ürək sıxıntısı verəni əhli-qələmin get-gəli fərda pəsfərdasıdır. Ərizəsi üçün bu get-gəl nüzuli-məlakül-mövtdən bədtərdir. Odur ki, şair dəruni-qəlbdən onların haqqında deyibdir:

Divan demə, hərgiz buna kim, afəti-candır,
Mən söyləmədim, nola ki, məşhuri-cahandır.

Divan əmələcatının hücumundan sonra Zakir keçir o şəxslərin zəmminə ki, onun bu bəlalara düçar olmasına öz səltənətləri ilə filcümlə bais olublar və onlardan, xüsusən, birisinin ki, fəsadçılar babasıdır və şair ilə onun şəxsi ədavəti var imiş, belə nəzmə çəkir:

Bir kəs yüz ola arifü danavü xirədmənd,
Hər ləhzədə təsnif qıla qafiyeyi-çənd.

Çün dövr qarışdırdı, dəxi yadına düşməz
Ətfalü əyalinin adı, fikr edə hərçənd.

Bir neçə zamandır ki, məni dami-bəlası
Ol zalimi-birəhmin edib Bakidə pabənd.

Seyr eylədim əlminnətü-lillah neçə şəhri,
Qalıbdı həmin Tabasaran, Ağqoşa*, Dərbənd.

Heyhat, ədavətdə deyəm bir kəsə böhtan,
Yox məndə kəlambaz süxən, tariyə sövgənd.

Bu ... xəlqi-cahan içrə tapılmaz,
Cəhlü həsədü büxldə nə mislü nə manənd.

Bişübhəvü şək töxmi-dəlü divdürür bu,
Haşa ki, doğa növ'i-bəşərdən belə fərzənd.

---

* Tabasaran və Ağqoşa – Şimali Qafqazda yer adlarıdır

Göndərmək ilə iki uşağı, səni tarı,
Qüttai-təriqə bu nə ibrətdi, bu nə pənd?!

Xətm oldu bizə, düzdi-vilayət kefə baxsın,
İymirli, Dirağırdə, Səfikürdi, Şıxavənd.

Həqqa, əvəzi-çaqqala baqqalı boğarlar,
Doyranbasanın* yerinə dağıldı bizim kənd.

Məşhur məsəldir ki, düşər qarə gəzən kəs,
Ev yıxanın evin yıxar, əlbəttə, xudavənd.

Çox zarü təzərrö' eləmə, eybdi, Zakir,
Təqdiri-qəzayə gərək adəm ola şakir!

Hər şeydən artıq şairin halını mütəğəyyir edən, onu qeyzü cuşa gətirən, onun nazik təb'inə təhrik verən düşmənlərin bəşaşəti və əğniyanın şəmatəti olur. Cümlənin günahı, qüttai-təriqin törətdiyi fəsad və şərarət şairin övladına isnad, əqrəbasına xətm olunur. Bundan sonra daha əhli-zələmə keyfə baxsın, yolkəsənlər şad olsunlar:

Həqqa, əvəzi-çaqqala baqqalı boğarlar,
Doyranbasanın yerinə dağıldı bizim kənd.

Oğrular safa çıxdı, doğrular fəlakətə düçar oldu. Atalar sözünün misdaqınca: Oğru elə bağırdı, doğru bucağa girdi".

Bu hüzngətirici hal və keyfiyyət indi də bizim bu nizamsız və əsassız zəmanəmizdə kəsrət il ittifaq düşməkdədir.

Zakir müttəqi və müt'ədəyyin bir şəxs olduğu üçün özünə xitabən deyir:

Çox zarü təzərrö' eləmə, eybdi, Zakir,
Təqdiri-qəzayə gərək adəm ola şakir!

Ol vaxtın hakimi Tarxan-Mouravov haqqında ki, onun hökmü binagüzarlığı ilə şairin kənd-kəsəyi və mal-dövləti tarac və özü və əhlü-əyalı ilə əsir və məhbus olunmuşdu, – Zakir fars dilində suzişli və xeyli mövzun bir tərkibbənd inşad qılmışdı. Bu tərkibbəndin bir yerində şair Qarabağ əhlinə dəxi filcümlə bir niş vurubdur və əhli-vətənin bivəfa və

* İymirli, Dirağırdı (Diylağırd), Səfikürd, Şıxavənd və Doyranbasan Qarabağda Şuşa uyezdində kənd adlarıdır. Bunların əhalisi sabiqdə oğurluqla iştihar bulmuş nadinc bir məxluq imişlər. İndi bir növ halal kəsbə məşğul olmaqla güzəran edirlər. Amma yenə də içlərinin oğrusu və əyrisi tükənməyibdir.



bietibar olmaqlarını göstəribdir. Öz əhli-vilayətindən şair həmişə şaki olub, dostu Mirzə Mehdiyə göndərdiyi bir namədə bu sayaq yazır:

Bizim kimi bir-birinin bədxahi
Tapılmaz, gəzəsən aləmi dahi.
Onun üçün qəzəb edib ilahi,
Xainik aşnaya, yada, əzizim!

Tarxanovun şə'nində yazdığı kəlamın bir bəndində Zakir əvvəlcə ona və zatına lən oxuyub, sonra qarabağlılara keçir:

Bedin zəşt əxlaqo tof!
Bedin rəsme-aino rəftar tof!
Bozorgi ke, başəd setəmpişe lən,
Əmiri ke, başəd cəfagər tof!
Əgər həmçenanəst Tərxaniyan,
Bər an qoume-nacenso mordar tof!
Zəhi pure-ərşəd ke, bər valideyn
Konəd kəsb xərvar-xərvar tof.
Bezat, beolulade-an naxələf
Konənd aqelan ləno hoşyar tof.
Əgər rast quyəm, bər u eyb nist,
Beəhle-Qərabağe-biar tof!
Bezaher əniso bebaten xəbis,
Həme bəd del aşena yar, tof!
Ze ğəmmaz in raz bayəd nəhoft,
Betərsom resanənd əxbar, tof!
Kəsi ke, nəhəd dəste-xod bər zəmin
Ze vey sər zənəd fetnehaye-çenin[421].

Əgərçi Mouravov-Tarxanovun hökmü və qətnaməsi mucibincə Qasım bəy Zakir və onun oğlu Nəcəfqulu bəy və qardaşı oğlu İskəndər bəy gərək Sibiryaya gedə idilər, vəli bə'zi sahibmənsəblərin və Gürcüstan nücəbalarının vasitəsi ilə, xüsusən sərdarın mütərcimi mərhum Mirzə Fətəli Axundzadəun köməkliyi ilə Zakir Sibiryaya göndərilmədi. Ancaq o, Bakıda üç-dörd ay gözdustağı halında qalıb sonradan vətəninə müraciət elədi.

Nəcəfqulu bəy və İskəndər bəy dəxi Sibiryada çox müddət qalmadılar. Onlar da bir az vaxtdan sonra vətənlərinə qayıtdılar. Əxşəsi ki, Qasım bəyin vətəndən sürgün olunmağına səbəb olmuşdular, onun həcvinə layiq olub, qiyamətə kimi töhmət altında qaldılar:

Ço şaer berənced bequyəd heca,
Bemanəd heca ta qiyamət beca[422].

O həcvlərin bə'ziləri haqq isə də, burada zikr oluna bilməz, əzbəs ki, onlarda namərğub sözlər dəxi iste'mal olunubdur. Amma bir neçəsi keyfiyyəti-halı bəyan etmək üçün öz məqamında zikr olunacaqdır. Zakirin hər qisim əş'arü kəlamı mövcuddur – qəzəliyyat, mürəbbeat, müxəmməsat, şe'ri-müstəzad, tərkibbənd, tərcibənd və sairə. Fars dilini dəxi mükəmməl surətdə bilirmiş və bu dildə bir çox abdar şeir və qəzəlləri vardır.

Türk qəzəlləri var ki, Füzulinin qəzəllərinə bərabərdir. Müxəmməs və qafiyələri Vaqifinkindən əskik deyil. Amma asarü əş'arının cümləsindən artıq əhəmiyyətlisi və məişətimizə münasibətlisi Mirzə Fətəli Axundzadəyə, Qutqaşınlı general İsmayıl bəyə[423], qubernator Mixail Petroviç Kolyubakina[424], Rəhim bəy Uğurlubəyova[425], Cəfərqulu xana, Baharlı Mirzə İsmayıla[426], Zəngilanlı Məhəmməd bəy Aşiqə, Mirzə Mehdiyə və qeyri müasiri olan dost-aşnalarına yazdığı məktublardır ki, cümləsi nəzm ilə açıq və sadə dildə yazılmışdır. Bu məktubatda dürlü məsəllər, zərif kinəyələr və müəmmalı kəlmələr vardır ki, azdan çox və nazikdən yoğun mə'nalar anlamaq gərəkdir.

Şair Bakıda əsirvar zindəganlıq edən vaxtı öz hali-dilini və başına gələn qəzavü qədəri Kolyubakinə yazıb, bicürmü günah iki nəfər zalım, bimürüvvətin hiylə və şərafəti ilə vətəndən dərbədər düşməsini bəyan edir.

Bilmək gərəkdir ki, ol vaxtları Kolyubakinin Bakıya qubernator olmaq sədası dəxi söylənilirdi. Və bu xəbər şairi bir növ xatircəm və təskinül-qəlb etmişdi. Budur Kolyubakinə yazdığı namə:

Səndən sora, ey taci-sər, başıma
Gərdişi-zəmanə nələr gətirdi!
İki bimürüvvət ittifaq edib,
Vilayətə yüz şurü şər' gətirdi.

Qaçaqlıq binası edən tək Behbud,
Pişnəhad eylədim öz ərzəmi zud,
Tərəfgirlik oldu axırda, nə sud,
Mənim doğruluğum zərər gətirdi.

Yüz ilin ocağın bicürmü günah
Eylədilər viran, vallahü billah!
Bu taleyi-zəbun, bu bəxti-siyah
Daim mənə xövfü xətər gətirdi.

Həştadə yetişdi sinnü salımız,
Bu dövlətdə ağarmışdı yalımız;
Getdi dövlətimiz, mülkü malımız,
Nəxli-təmənnamız kədər gətirdi.



Nücəba hörmətin gözlər nücəba,
Nasəza yaraşmaz böyüyə əsla;
Pədərindən deyil yəqin bil, amma
Hər kimsə ki, nami-pədər gətirdi.

Ədalət var idi bundan əzələ,
Yaman yerə yetib iş gələ-gələ;
Dirəxti-bəxtimiz, əfsus ki, belə
Varə-varə acı səmər gətirdi.

O kəslər ki, eyləmişdi xəyanət,
Əyləşib evində rahət, fəraqət;
Mənim uşaqlarım bivəchü cəhət
Gözlərindən xuni-cigər gətirdi.

Bundan əqdəm kimin olsa üsyanı,
Derlərdi vayenin sud kəssin anı;
Bilmirəm necoldu, o zakon hanı?
Naçalnik zakuni-digər gətirdi.

Məzərrəti əfzun ədaləti yox,
Görünməyib əsla belə ...
Öz gəlməyinə məmnun idik çox,
Dalısınca keçəl Nəzər gətirdi.

Tutubdu aləmi zülmi-bihesab,
Müşküldür gətirmək bu möhnətə tab;
Köynük, Biləcəyi* etmişdi xərab,
Bizim kəndə ondan betər gətirdi.

Aşura günü tək bir səhər çağı,
Yığdı ərabəyə övrət-uşağı,
Şamə rəvan etdi bimürvət yağı,
Görən yaxa yırtıb, həzər gətirdi.

Əcəb əyyam imiş əyyami-sələf,
Gərək o günlərdə olaydıq tələf;
Çəyirtgə bir tərəf, dolu bir tərəf,
Şum qədəmi gəldi, şərər gətirdi.

İki namərd uyub biri-birinə,
Yetmək olmaz heç birinin sirrinə;
Lə'nət gəlsin ... pirinə,
Bəd binanı ... gətirdi.

* Köynük, Biləcək – yer adıdır

Adamda insafü mürüvvət gərək,
Quyruğun kəsməklə tula olmaz köpək;
İlan əti yeyib yerikdə bişək,
O madər ki, belə pəsər gətirdi.

Neçə gün söyləndi bu yerdə əhval,
Qubernator olur ol nikuxisal;
Malımız, mülkümüz müjdədir əlhal,
Hər kim gəlib doğru xəbər gətirdi.

Ey sahibi-şövkət, ey mə'dəni-şan,
Dadxahəm sizə, aman, əlaman!
Bu zülmü insana eyləməz insan,
Məgər ki, qəzavü qədər gətirdi.

Həmin bu məzmunda mərhum Zakir çərxi-kəcrəftardan şikvə və nalə qılıb, piranəsərlikdə vətəndən dərbədər düşməsini, şan və rütbəsinin puç olmasını, mal və dövlətinin badi-fənaya getməsini, oğrulara və quldurlara tay-tuş olmasını ürəkyandırıcı dil ilə dostu Mirzə Fətəli Axundzadəyə yazır. Bu məktub qarelərə dəxi də ziyadə tə'sir edir:

Piranəsərlikdə çərxi-kəcrəftar
Eylədi vətəndən dərbədər məni;
Neyləmişəm. bilməm, dövri-zalimə,
İncidir düşəndə* bu qədər məni.

Qarabağ mülkündə mən bəxtisiyah
Bir ağ gün görmədim, Allaha pənah;
Saldı bəlalərə bicürmü günah
Bir neçə müfsidü töxmixər məni.

Mən bir piri-tənha, zülm bihesab,
Müşküldür gətirmək bu möhnətə tab
Yaman deyə-deyə eylədi xərab
Hamıdan ziyadə üç nəfər məni**.

* Bu sözü iki cürə oxumaq olur, bir "düşəndə" – yə'ni gahda bir, gah-gah və bir də "döşündə" – yə'ni sinəsində məni bu qədər incidir.

** Bu üç nəfərin biri Mirzə Adıgözəl oğlu Hüseyn bəydən və digəri Nəmirli Əmiraslan bəydən ibarətdir. Üçüncüsü, çox ehtimal var ki, Cəfərqulu xana işarə olsun. Şair xanın adını açıq yazmayıb "Yekəpər" ismi ilə bir neçə məqamlarda onu müttəsəf qılmışdır. Əzbəs ki, Cəfərqulu xan böyük cüssəli və qəviheykəl bir vücud imiş.



Biri fasiq, facir, hədsiz zinakar,
Biri əyri-üyrü, xeyli nahəmvar,
Biri danışanda baş-ayaq atar,
Bir neçə it tutdu bixəbər məni.

Adəm idim, əbəs yerə zay oldum,
Vilayət içində mən rüsvay oldum,
Oğrulara, quldurlara tay oldum,
Sanırdı xəlayiq peyğəmbər məni.

Dövlətlidən dövlət, kordan məzərrət,
Harda bihəya var, zatına lə'nət!
Süxənçin sözilə etdi aqibət
Pəsərimdən cüda bipədər məni.

Dövləti-alidə ağarıb saqqal,
Bir xilafım yoxdu, bu mən, o jurnal;
Bir zaman gördüm ki, yazıbdı filhal
Qüttaüttəriqə bərabər məni.

Yetmişində zurna çalmaq öyrənən
Gərək axirətdə çala ...;
Az qalıb həştadı tamam edim mən,
Sən indi yazırsan əhli-şər' məni.

Yetmək olmaz hərcayinin sirrinə,
Yalanı yeridir doğru yerinə;
Lə'nət oxur şərirlərin pirinə
Diyari-qürbətdə kim görər məni.

Hər kimin vilayətdə simü zəri var,
Yüz adam öldürə, həbsdən çıxar;
Yegənsiz* danışmaq nə yanə çatar,
Bihörmət eylədi simü zər məni.

Dərdbilməzə dərdi-dili açınca,
Ruzigarın cəfasından qaçınca,
Namərd körpüsündən rahət keçincə –
Razıyam apara o sellər məni.

Kişi yoxdu, baxma çula-çuxaya,
Adam gərək dağa-daşa toxuya;
Getmə-getmə – deyib qoydu yuxuya
Axırda itirdi Yekəpər məni.

* Yegən – pul mə'nasındadır

Dalınca deyiləm bir şüğlü karın,
Bilmənəm dövrünü leylü neharın;
Həvəsi-vüsalın, zövqi-didarın
Qoymaz yuxu yatam ta səhər məni.

Rəhi-müsibətdə keçmişəm candan,
Müxənnəsdir qorxan bir qaşıq qandan;
Ehtiyatım yoxdur paşadan, xandan,
Analar doğubdur şiri-nər məni!

Olmuşam Bakıda sakin, fəğarət,
Zövqi-təmaşası misali-cənnət;
Ziyadə dərdisər, dəxi nə hacət,
Fəramuş eyləmə, müxtəsər, məni.

Bu məktubda şair öz təbii istiqamət və dəyanətindən söz açıb, hər qisim dərd və bəlalara tab gətirməyini bəyan edir. Əgərçi şairin simü zəri yoxdur ki, onların köməyi ilə özünü safa çıxartsın, vəli o, təb'ən ğənidir və heç bir vəch ilə özünə qəbul etməz ki, əksilib, dərdbilməzlərə dərdi-dilini söyləsin.

Şair sinəsini ruzigari-cəfakarın oxlarına sipər edib, namərdlərdən yetən köməyə əsla e'tina etməz:

Namərd körpüsündən rahət keçincə –
Razıyam apara o sellər məni.

Çul və çuxaya bəzənib zahirlərinə zinət və sığal verənlərə kişi demək şayəstə deyil. Həqiqətdə mərd igid o kəsdir ki, özünü dağa-daşa toxuyub haqq yolunda mərdanə dava eləsin.

Şairə ariz olan bəla onu məğmun və pərişan etmir. Şair rahi-müsibətdə candan və başdan keçibdir. Bir qaşıq qandan qorxan, şairin əqidəsincə, adam deyil və paşadan, xandan dəxi onun bakı və ehtiyatı yoxdur.

O adamlar ki, düşmənçilik üzündən onu bəlalara və əziyyətlərə giriftar ediblər, belə güman etməsinlər ki, onu məğlub qılıbdar. Xeyr! Bu, böyük səhvdir!

Şair necə ki, ölməyibdir öz ali məqamında durub büxlü həsədlə iştihar bulan dənitəblərə – ki, əqrəb misal yer üzündə qeyrilərə niş vurmaq üçün sürünürlər, yuxarıdan aşağa həqarət nəzərilə baxır. O dənitəb'lər şairin müqabilində qorxaq tülkü və çaqqal misalında bir məxluqdurlar, şair isə xövfü hərasdan uzaq və kənar "şiri-nər" kimi bir vücuddur:

Ehtiyatım yoxdur paşadan, xandan,
Analar doğubdur şiri-nər məni!



Ancaq şairi məhzunü məlul edən dusti-həqiqisinin, yə'ni mərhum Mirzə Fətəli fəraqıdır ki, ona dair yazmışdır:

Həvəsi-vüsalın, zövqi-didarın
Qoymaz yuxu yatam ta səhər məni.

Dusti-cani və rəfiqi-mehribanı olan Mirzəyə göndərdiyi namələrə bir müddət cavab almayıb və uşaqlarının Sibiryaya getməyindən dilgir və mə'yus olub, atidə zikr olunan naməni ona göndərir.

Gözüm yolda qaldı, könül intizar,
Gəlmədi cavabi-namələr səndən.
Bir aydan artıqdır gedib uşaqlar,
Yetişmədi bizə bir xəbər səndən.

Aşina, müsahib, yarü həmsayə
Lazımdır yetişə qövrə, hərayə;
Kitabətin dəyər mali-dünyayə,
Nə hacət istəmək simü zər səndən?

Tək yaradıb səni vahidü yekta,
Əxlaqına, ətvarına mərhəba!
Neyləmisən Molla Səfi, Bəybaba[427] –
Məmnundu, əzizim, bu qədər səndən?

O vilanın yoxdu bu yer tək pisi,
Təqəllübü, hərzəkarı, xəbisi;
Yaxşı gördüm tamam əhli-Tiflisi,
Razıyam nəhayət biştər səndən.

Olan dəmdə mənə mənzil Şadno,
Hər tərəf eylər idim təküdo;
İvana bəy, Kolyubakin, İliko*
Çalışırdı, əlhəq, bərabər səndən.

Həsən bəyə** söylə əmri-mə'lumi,
Qəziyyə mə'lumdur deyəndə Rumi,
Sərəfraz eylərsən yüz bəxtişumi,
Zahir olsa əgər bu hünər səndən.

---

* **İvana bəy, Kolyubakin, İliko** – Qasım bəyin tanışları gürcü nücəbası imiş ki, onun özünün və övladının təmizə çıxması və xilası yolunda sə'yü təlaş edirlərmiş.

** **Həsən bəy** – məşhur general Həsən bəy Ağalarovdur ki, o da Zakirin qurtarmağı üçün çox çalışmışdır.

Tutub damənini sən tək əmirin,
Təvəqqein eylər iki əsirin*,
Qarabağ mülkündə bir mərdi-pirin
Təmənnası budur, taci-sər, səndən!

Qoyma ki, qürbətdə gedələr zayə,
Sayə salmaq təqazadır hümayə;
Laçın balasıdı gəmiş sonayə,
Seyd etmək olardan, balü pər səndən.

Salıbdır bəlayə dənəbgan ali**,
Dağılıb əmlaki, dövlətü mali;
Sakit eyləməyə bu qilü qali –
İstər o xoştəb'ü süxənvər səndən.

Tutuşub mənimlə çərxi-bədəfal,
Yerə girsin görüm ha belə iqbal!
Bizim üstümüzə, ey nikuxisal,
Eşitdim incinib Yekəpər*** səndən.

Baş verən zamanda bu əmri-əbəs,
Gərək ona sən deyəydin: "Ey tərəs,
Sən bir ağacsan ki, ömründə heç kəs
Nə sayə görübdür, nə səmər səndən".

Çoxların qılıbsan çörəyə möhtac,
Axtarır, tapılmaz dərdinə əlac
Fir'onü Hamanü Zöhhakü Həccac
Ola bilməz ola sitəmkar səndən.

Bəd'ətin yandırıb qövmü əshabi,
Müşküldü gətirmək bu zülmə tabi.
Düşüb Cəbrəilli, Maralyan, Babi,
Horadiz, Qoyucaq dərbədər səndən.

Zülmü sitəminlə aləm dolubdur,
Əhli-beytin rəngi-ruyi solubdur,
Neçə rövşən xanimanlar olubdur –
Şəbi-yelda kimi tirətər səndən.

* Bu iki əsirdən birisi Zakirin oğlu Nəcəfqulu bəy və o birisi bəradərzadəsi İskəndər bəydir.

** "Dənəbgan ali" kəlməsini lazımdır "bəndəgan ali" məzmununda anlamaq. Bu sayaq Cəfərqulu xan öz nökərlərin və müqərriblərin öyrətmişdi ki, sözləri tərsinə söyləsinlər, tainki lazım olan məqamda hüzzar onların danışmaqlarını anlamasınlar.

*** Y e k ə p ə r – necə ki, sabiqdə zikr olundu, – Cəfərqulu xana işarədir.



Böyük oğlun gəzər payi-piyadə,
Şol biri də tələf oldu aradə;
Xah kədxuda, xah büzürgzadə,
O kimdi çəkməyə yüz həzər səndən?

Sikkə olmaz övladının cibində,
Rizqləri yırtıq çuval dibində;
Can verdi madərin özgə evində,
Nə düxtər yarıyıb, nə pəsər səndən.

Ömri-təvillinə budur ki, dəlil,
İstəməz üzünü görə Əzrail;
Bundan sonra hələ yaşarsan yüz il,
Vəchi budur, əcəl yan gəzər səndən.

Üləmayə dersən föhşü latayil,
Təriqi-islamə deyilsən qail;
Bu hal ilə yenə çox əqli zail –
Gəlib eşiyinə zad istər səndən...

Təsəllütün yetsə şeyxülislamə,
Anı bizdən betər salırsan damə;
Əbəs yerə düşmə xəyali-xamə,
Nifrət eylər, billah, kim görər, səndən.

Mən səni tanırdım, işlərin qandır,
Yüz deyələr, elə haman-hamandır,
Elə bilsin padşahi-zamandır –
Hər kim iraq olur, müxtəsər, səndən.

Təğəllübdə, təfənnündə ustadsan,
Doğru sözün yoxdu, kizbə mö'tadsan;
Qatili-imamsan, İbni-Ziyadsan[428],
Lazımdır eyləmək əlhəzər səndən.

Vəsfi-sifatından danışdım xeyli,
Eşitsin hər kimin var isə meyli;
Elə yalqız Zakir deyil gileyli,
Azürdədir aləm sərasər səndən.

Əgərçi sabiqdə şairin Cəfərqulu xan ilə ülfət və mürafiqəti var imiş və yek-digərinə bir neçə zərifanə məktubat yazıblar ki, onların barəsində aşağıda filcümlə mə'lumat veriləcəkdir, vəli sonradan səbəb nə olubsa bunların mabeynində soyuqluq bəhmə gəlibdir və yuxarıda zikr olunan kəlamdan mə'lum olunur ki, Cəfərqulu xan Zakirin haqqında böyük pis-

lik və bədguluq edibdir və hətta Mirzə Fətəli Axundzadə Zakirin xilasına və safa çıxmağına divan hüzurunda çalışdığı zamanda xani-məzkur ona mümaniət göstərib və bir növ Mirzeyi-mərhumdan rəncidə olubdur. Necə ki, bu hala şairin öz sözləri şəhadət verir:

Tutuşub mənimlə çərxi-bədəfal,
Yerə girsin görüm ha belə iqbal!
Bizim üstümüzə, ey nikuxisal,
Eşitdim incinib Yekəpər səndən.

Qasım bəyə üz verən qəzada və pürxəta əmrdə köməkçi olanların birisi də qutqaşınlı Nəsrulla Sultanın xələfi-ərcüməndi general İsmayıl bəy imiş. Şairin ona yazdığı bir neçə məktubati-mənzuməsindən mə'lum olunur ki, ona artıq bəndəçiliyi və ixlası var imiş.

Zakir öz əhli-vilayətindən şikayət edib, onların bihimmət, birəhm və bir-birinə yağı olmaqlarını zikr qılıb, İsmayıl bəyi "Qutqaşın tərlanı" və "Şəki şahbazı" əlqabı ilə sifətləndirir və ondan bu sayaq kömək və mədəd diləyir:

Bu əhldən mehribanlıq görmədim,
Məgər bizə ola o yandan mədəd.
Qutqaşın tərlanı, Şəki şahbazı,
Sakini-biladi-Şirvandan mədəd.

Qarabağ əşxası yeksər yağıdır,
Əvvəldən axıra zülm ortağıdır;
Bir gecədə canavarlar dağıdır,
Olmasa gəlləyə çobandan mədəd.

Nücəbalar qədrin bilir nücəba,
Əxlaqına, ətvarına mərhəba!
Daş-daş üstə durmaz aləmdə əsla,
Dəyməsə insana insandan mədəd.

Qəzayi-möhnətdə qalmışam möhtac,
Uşaqlarım olub vətəndən ixrac;
Təbibi-hazirsən, eylə bir əlac,
Yoxdur mənə özgə dərmandan mədəd.

Yığılsa bir yerə yüz alinəsəb,
Danışığın mə'nat, sözün müntəxəb;
Aləm bilir bivasitə, bisəbəb
Müşküldür arizə divandan mədəd.



Həzrəti İsmayıl olsun dəlilin,
Yetiş imdadına piri-əlilin!
Necə fərzəndinə ol dəm Xəlilin –
Cəbrail gətirdi qurbandan mədəd.

Əsasi-qiyamət olanda bərpa,
Kimdir qövrə yetən ondan masəva;
Sərdəftəri-rəsul, xətmi-ənbiya
Tənzili-ayeyi-Qur'andan mədəd.

Çərxi-fələk salmış məni bu halə,
Malü mülküm tamam getdi zəvalə,
Qaidədir şərməndeyi-əyalə –
Yetişir sahibi-ehsandan mədəd.

Gəlməyibdir mütləq ruyi-zəminə
Tab edən mənim tək qəza qəminə;
Zövrəqi-əltafın dili-həzinə,
Gümanım var, verə tufandan mədəd.

Namərd ətəyindən tutasan yüz il,
Etibarım yoxdur həll ola müşkil;
Olsa, olacaqdır dərdinə, ey dil,
Xələfi-Nəsrullah Sultandan mədəd.

Zakirəm həmişə sən tək sərvərə,
Xoş göstərsin səni xaliq nəzərə
Eyb etməz alişan ümaralərə –
İstəmək duayi-pirandan mədəd.

Başqa bir məktubunda Qasım bəy yenə Qutqaşınlı İsmayıl bəyi tə'rif və tövsif qılıb, başına gələn qəzavü qədəri təhrir edir, vəli öz halından şikayət etmir.

Şair özünü aşiqlər sinfinə daxil qılıb, qiylü qala düşməsini təbii və adi işlər cümləsinə nisbət edir, zira ki, insanın başına qisim-qisim bəlalar gəlməsə və o, cürbəcür bəlalara və müsibətlərə mübtəla olmasa, ənva'i-təcrübə və imtahanlar sınaq olunmasa, ruzigarın kürəsində əriyib dəsti-qəza ilə vurulan çəkiclər altında döyülməsə, qəllü qəşdən hərgiz pak ola bilməz və dərəceyi-kəmala irişməz.

Şairin könlü pərvaz edib biladi-Misri və Nil çayının kənarlarını seyrü tamaşa etmək istəyir, taki çox səfərlərdən və təcrübələrdən sonra lazımi ittilaat və kəmalat əxz edə bilsin:

Kəmala yetmək olmaz bisəyahət, haliya könlüm –
Təmaşayi-biladi-Misrü seyri-rudi-Nil istər.

Şair özünü ənbiya zümrəsinə daxil edib, ruzigarın cəfasından azürdə-dil olmağı eyni-səfahət və həmaqət hesab edir, çünki ruzigardan yetişən cəfalar pis olsa idi, onları ənduhpərvər və bəlakeş İdris, İbrahimxəlil və Əyyubi-səbur özləri üçün eyni-səlah və rahatlıq bilməzdilər, şaki olardılar.

Şair özünü həzrət Yaquba varis bilib, o dəxi fərzəndi-əzizinin qürbətdən gələn buyi-fərəhafzası ilə xatirini şad və könlünü qəmdən azad eləyir:

Cəfayi-dəhrdən azürdəlik eyni-həmaqətdir,
Bəlanı xoş tutar İdrisü Əyyubü Xəlil istər.

Mənəm varis bu gün Yə'qubə, fərzəndi-əzizimdən –
Gələr buyi-fərəh gəh-gəh, əgər rəbbi-cəlil istər.

Bu sözlərdən sonra şair yenə Qarabağın şərir biqərəzlərinə rücu edib, təqazayi-təbiətlərindən naşi zülmü fəsadı zikr qılıb və şeytənətlərinin ucundan vətəni-mə'lufundan xaric olmağını suzişli sözlərlə bəyan edir. Yenə şairin könlü əziz vətəninin gülüstanında seyr eləməyi arzu edir. Vəli onun əl-ayağı qürbət vilayətdə dar qəfəs içində bağlıdır və qəfəs qeydindən azad olmağa dəlil istəyir:

Edər yadi-gülüstani-vətən qürbətdə dil mürğü,
Qəfəs qeydindən azad olmağa daim dəlil istər.

Vəli şair təvəkkül əhlidir. Hər yetən namərdə şərhi-hal etməyi özünə ar bilir. Uzun illər boyu girdabi-bəla və müsibətdə zarü zəbun qalsa da, əlini xakü xaşakə uzadası deyil və dənitəblərə hərgiz pənah aparmaz. Həngami-zərurətdə də olsa, şair nanəcib və namərd kimsələrə əl uzadıb kömək diləməyi özü üçün böyük qəbahət bilib, birkərəlik ölüb qurtarmağı ona tərcih verir. Necə ki, bu barədə özgə bir kəlamında demişdir:

Namərd ətəyindən kişi həngami-zərurət –
Tutmaqdan isə yaxşıdır ölmək, a filani!

Namənin axırında Zakir zarafatyana İsmayıl bəydən təvəqqe edir ki, Mirzə Fətəliyə yazsın ki, ona – yə'ni Zakirə bir döpü pərvərdə zəncəbil və özü də bir sarı kürki-Ərdəbil göndərsin, çünki Bakının sazaqlı küləyinin əlacı isti Ərdəbil kürküdür. Məzkur naməni eynilə aşağıda yazırıq:

Səni aləmdə, ey arami-can, hər kim zəlil istər, –
Anı zillətdə bu qəmdar könlüm ayü il istər.



Şərabi-cami-bəzmi-iltifatın nuş edən hərgiz
Nə kövsər arizu eylər, nə abi-səlsəbil istər.

Məni qövğayi-şəhri-bəhri-Baki təlxkam etməz,
Nədən kim, aşiqi-şeyda olanlar qalü qil istər.

Kəmalə yetmək olmaz bisəyahət, haliya könlüm –
Təmaşayi-biladi-Misrü seyri-rudi-Nil istər.

Mənə derlər ki, sən "peyğəmbərəm" – derdin, nə işdir bu?
Deməzlər mərdi-mö'min möhnətə əcri-cəzil istər.

Cəfayi-dəhrdən azürdəlik-həmaqətdir,
Bəlanı xoş tutar İdrisü Əyyübü Xəlil istər.

Mənəm varis bu gün Yə'qubə, fərzəndi-əzizimdən –
Gəlir buyi-fərəh gəh-gəh, əgər rəbbi-cəlil istər.

Məni-piri-süxəndanın nədir cürmü, xudavənda, –
Üqubətdə o bişərmü cəfakarü mühil* istər?

Tapılmaz böylə bir bədhal zalim hiç millətdə,
Yığılsa bir yerə Əndi, Kumık, Axtı, Rutil istər**.

Məsəldir ki, xəta bir böylə adəmdən iraq olmaz,
Bu bir əmri-müşəxxəsdir, nə vəhyi-Cəbrəil istər.

Qarabağ içrə ağ gün görmədim mən, tirəbəxt oldum,
Onunçün xatirim ol qövmi-birəhmi qətil istər.

Şəriri-biqərəz olmaq təqazayi-təbiətdir,
İnanma bir kəsi xoşnud aləmdə bəxil istər.

Bizim mərdümləri, zinhar, pənd əfsari bənd etməz,
Olanın, Naqeyi-Kalmık kimi, burnu qəzil*** istər.

Edər yadi-gülüstani-vətən qürbətdə dil mürğü,
Qəfəs qeydindən azad olmağa daim dəlil istər.

Nəhayət, şərhi-hal etmək yetən namərdə müşküldür,
Sənin tək bir əmiri-pakzadü bədil istər.

---

* Tərxan – Mouravova işarədir

** Əndi, Kumık, Axtı, Rutil – Dağıstanda olan mahalların və kəndlərin adlarıdır

*** Qəzil – qıldan hörülmüş ipə deyirlər

Təvəkkül əhliyəm mütləq, yapışmam xarü xaşakə,
Füsurdə cismim salha qərq abi-sil istər.

Səxavət, ya vəsatət zat iləndir mərdi-biəslə
Muradı hasil olmaz yüz düşə bir kəs dəxil istər.

Nihadi-məqsədi sərsəbz olub əflakə yetməzmi,
O kəslər ki, rizayi-xatiri-piri-əlil istər?

Süxən meydanı, qibləm, təng idi, söz müxtəsər keçdi,
Sənin övsafını nəzm etməyə bəhri-təvil istər.

Yetən tək şəhrə hacı bəndəyə bir təxt bəxş etdi,
Bilir ki, bazdəsti olsa, hər yerdə tüfil* istər.

O yerdən azimi-Tiflis çoxdur, yaz ki, Mirzayə,
Filani bir döpü pərvərdə sizdən zəncəbil istər.

Əgərçi var Dağistani kürkü Zakirin, əmma
Cənabında dəxi bir sarı kürki-Ərdəbil istər.

Deyildi sabiqən əhli-təvəqqe, şimdi Bakudə
Əlaci-kəsrəti-sərma üçün çizi-qəlil istər.

Dağılmış xanimanı, incimin əxzü süalından,
Tikəndə quş yuva çör-çöp yığıban, zir-zibil istər.

Qasım bəy Zakir həqiqi bir milli şair imiş. Öz əsrinin aynası olubdur və məişəti-milliyyəsini – necə ki, var imiş, – eyni ilə yazıb, bizim üçün böyük bir yadigar qoyubdur. Öz əsrində şayani-diqqət olmuş olan bir şey qoymayıbdır ki, ona əl aparmamış olsun.

O vaxtın adamlarının adabü əxlaqını və dolanacaqlarının övza'vü əsasını mahir nəqqaş kimi özlərinə məxsus rənglərlə çəkib bizə göstərir. Məişətin hər bir sinif və təbəqatına ətraflı nəzər yetirib, sairlərin gözlərinə görsənməyən şeyləri görüb, təftiş və tənqid edibdir.

Dusti-həqiqisi Mirzə Fətəli Axundzadəyə vilayətin şuluqluğundan, oğruların vüfurundan, yolkəsənlərin əndazədən çıxıb tüğyan etməklərindən, hakimi-vilayətin və divan qulluqçularının onlar ilə yekdil və yekcəhət olmaqlarından, hacı və məşhədilərin bəd əməllərindən, ailələrdə həyavü hicabın götürülməyindən və filcümlə, müasirlərinin əxlaqi-zəmimələrindən və çirkin işlərindən və bununla bahəm ata-babadan qalan gözəl adət və ayinlərin məhvü nabud olmağından şikayət edib deyir:

* Tüfil – tərlan və qızılquş üstündə oturmaq üçün qayrılan kürsü



Çəkilib köksümə dağlar, düyünlər,
Kafirə olmasın nəsib bu günlər!
Qınamasın məni könlübütünlər,
Fikrim dağınıqdır, xatirim övraq.

Demək olar ki, Zakirin əsrindən biz yaşadığımız zamana kimi müsəlmanların məişətində çəndan təfavüt vüqua gəlməyibdir. İndi də sabiqi adət üzrə ömür keçirməkdədirlər. Zahirdə guya bir az tərəqqi əsəri görünür, amma həqiqəti-hala diqqət yetirdikdə yəqinlik hasil olur ki, müsəlmanlar mə'nəvi və həqiqi tərəqqidən yenə də çox uzaqdırlar. Hətta təqəllübdə, xəyanətkarlıqda, büxlü həsəddə və biri-birinin canına və malına düşmən olmaqda irəlikindən bir az da artıcıq qabağa gediblər.

Şairin yetmiş sənə bundan əqdəm yazdığı fəna hal indi də müşahidə olunmaqdadır:

Həddən aşıb büxlü həsəd, şərarət,
Yoldaş yoldaşına eylər xəyanət;
Alimdə əməl yox, bəydə ədalət,
İşlərimiz olub saf gərdən-bucaq.

O ki, qaldı insana zinət verən gözəl sifətlərə – ki, ibarət olsun sədaqət və istiqamətdən, dəyanət və qeyrətdən, ittihad və ittifaqdan, ədl və mürüvvətdən, cür'ət və həmiyyətdən – bu qisim sifətlərdən din qardaşlarımız daha da ziyadə kənar düşüblər və nə vaxtı millətimiz nicat və səadət yolunu arayıb tapacaqlar, Allah bilir.

Bu tərəqqi əsrində bizim belə geridə qalmağımız və qəflətdə yaşamağımız tezliklə məhvü nabud olmağımıza şəhadət verir.

Axundzadəyə yazdığı naməni Zakir bu sayaq başlayır:

Xəbər alsan bu vilanın əhvalın,
Bir özgədir keyfiyyəti-Qarabağ.
Həqdi bundan əqdəm görübsən sən də,
Hanı o qaidə, o qanun, səyaq?

Qüttaüqtəriqin vüfuru vardır,
Yaylaqda, aranda qatar-qatardır;
Yenə vurhavurdur, apar-apardır,
Bizim başımızda çatdadı çanaq.

Bu şeirlərdən sonra şair Qarabağda oğurluğa və quldurluğa məşğul el-obanın adlarını bir-bir sadalayıb, "Zərgər Drağard" adamlarının haqqında deyir:

Zərgər Drağarda aləm-aşikar –
Bir ucdan oğurlar, bir ucdan satar;
Vay odur sahibi at başı tutar,
Yüz yerdən tökülür üstünə çomaq.

Sonra Qarabaldır və Ərəblər xalqına və Ərəs qırağında olan kəndlərin əhalisinə və bilümum vilayətdə müşahidə olunan qaydasızlığa keçib yazır:

Qarabaldır xalqı, xüsus Ərəblər,
Qarınca dəməyə necə dən çəkər,
İşdədir sübhədək, ta ki, gecələr,
Döyürlər, kim gəlib eyləsə soraq.

Belə vilayəti dağıtsın tarı,
Ziyadə məğşuşdu Ərəs kənarı;
Xurda, Parababi, Qarğabazarı,
Maralyan, Horadiz, Nüzyar, Qoyucaq.

Hər obadan çıxar otuz ya əlli.
Özü cələkəsən, adları bəlli;
Yenə şorta-şortdu Adıgözəlli,
Min evdən artıqdır yığıntı kazak.

Əgər xəbər alsan Molla Səfini,
Oğru, dürüst qarışdırıb kefini;
O, qələdə biçər ölü kəfəni,
Çöldə üç atlını soyublar çılpaq.

Qarabağda nə day qaldı, nə dana,
Bu gün-sabah qaçar hərə bir yana
Tənbih etmək ilə Xınzırıstana,
Xub saldı nizamə ölkəni qoçaq.

Ədalətdə yoxdur bir kəsrü kəmi,
Mundan sonra vilayətin nə qəmi;
Əlbət, dağıdarmış külli-aləmi
Ağzından süd iysi gələn iki uşaq.

Birindən şikayət edəsən əgər,
Danışmağa qoymaz, sözünü kəsər,
Qardaş malı kimi ortadan bölər,
Murovlar* olublar oğruya ortaq.

* Murov – Zakirin əsrində dövlət tərəfindən tə'yin olunmuş mahal böyüklərinə deyirlərmiş ki, rusca "uçastkovı zasedatel" adlanırmış



Görsən tanımazsan Yarımsaqqalı*,
Çıxıb əndazədən dövləti malı;
Xandəmirov[429] çaldı, çapdı mahalı,
O ki, tutub özün keçəl qurumsaq.

Gədə-güdə olub sahibməsləhət,
Gündüz axşamadək danışır xəlvət,
İşlərimiz belə keçsə bir müddət,
Qədimilər olur tamam şil, axsaq.

Gündə bir gətirir zakoni-tazə,
Fikri budu xəlqi verə güdazə;
Bizdən də məhrəmdir biri knyazə,
Nə məhrəm, füzulü heyvərə, yanşaq.

Həddən aşıb büxlü həsəd, şərarət,
Yoldaş yoldaşına eylər xəyanət;
Alimdə əməl yox, bəydə ədalət,
İşlərimiz olub saf gərdən-bucaq.

Üləmalər üz döndərib xudadan,
Usanmaz bir ləhzə cövrü cəfadan,
Başı əmmaməli seyid-molladan –
Taətdə övladır o qatmaqurşaq.

Həq bilir ki, beli şallı hacılar
Zəhrimar tək xəlqin ağzın acılar;
Düşəndə gözləməz ...
Bu əhldən sinədağəm, sinədağ!

Adın qoyub Kərbəlayi, Məşədi,
Neylim, peşələri yaman peşədi;
Çoxun gördüm ...
Belə millət olmaz, qoyun oturaq!

Gərək bu aləmdən eyləmək həzər,
Öz yerində deyil çünki xeyrü şər',
Bihörmət olubdur pədərə pəsər,
Yüzdə biri yaxşı olur ittifaq.

Kəmali-cür'ət ilə demək olar ki, millətimizin əxlaqü ətvarında dəxi bu müddəti-mütəmadi ərzində artıq bir tərəqqi və islahat vüqua gəlmə-

* Yarımsaqqal – Şuşa şəhərinin polisa rəisi Əmircanovdan ibarətdir ki, saqqalının ortasını qırxdırarmış

yibdir. Xah nücəbalarımız, xah ruhani sinfi və xah mötə'bər hacılarımız və məşhədilərimiz haman Zakir dövrünün adamlarıdır. Zahirdə geyimləri və libasları modaya müvafiq dəyişilibsə də, kəmalü mə'rifətdə, azacıq da olsa tərəqqi etməyiblər. Necə ki, bu barədə şair deyibdir:

Gəldim ki, görüm bu necə xandır,
Gördüm ki, elə haman hamandır.

Namənin axırında Zakir şəmmə'i öz halından yazıb, Mirzeyi-mərhumdan təvəqqe eləyir ki, onun uşaqlarının xilası barəsində bə'zi möhtərəm şəxslərin vasitəçi eləsin və onu unutmasın və sonra Mirzənin fərağında çəkdiyi möhnəti izhar qılmaqla oxucuları dəxi də artıq mütəəssir, məhzun qılır:

Cəmşid bəyə yetir səlami-əfzun,
Knyaz Behbudova ərz etsin əknun;
Nə rəvadır bisilisit, bizakun
Viran ola nahəq yerə bir ocaq.

İki nəfər sadə cəvanü novrəs,
Heç birindən yoxdur rəncidə bir kəs,
Bir yanı Kolbasan, bir yanı Ərəs,
Kim görüb onları həmkari-qaçaq?

Böyüklük əmirə xoş səadətdir
Və lakin rəvişi ədl-ədalətdir;
Yıxılana, qaidədir, adətdir,
Dayaq olan kəsə həqq olur dayaq.

Fəraqət oturub hər kəs bir işdə,
Nə yazda yarıdıq, nə də ki, qışda;
Ya rəb, neyləmişik bu dağılmışda
Həram oldu bizə bir qarış torpaq?!

Çəkilib köksümə dağlar, dügünlər,
Kafirə olmasın nəsib bu günlər!
Qınamasın məni könlübütünlər,
Fikrim dağınıqdır, xatirim övraq.

Məqsudimiz hasil olmadı bizim,
Yeksandı hicrində gecə-gündüzüm;
Bu bədbəxtin halətindən, əzizim,
Barı o viladə olgil göz-qulaq.



Gərçi vilayətdə çox idi əhval,
Müyəssər olmadı şərh edim əlhal,
Bir parasın yazdım, elədim irsal,
Bu şərt ilə: nə diş bilsin, nə dodaq.

Ziyarət eləyib şeyxülislami,
Zakiri-həzindən yetir səlami;
Hacı Yusif, Molla Əhməd təmami,
Haçan ola bir də deyək, danışaq.

Belə açıq və sadə dildə heç bir şair öz vilayətinin övza'vü əhvalını və müasirlərinin dolanacağını bu sayaq doğruluqla aydın və aşkar yazmayıbdır.

Bu kəlam nəzmlənmiş nəsrdir. Bunda olan rədif və qafiyələr elm zoru ilə və savad gücü ilə icad olunmayıbdır. Bunlar camaatımızın ağzında müdam işlənən sözlərdir. Şair özü də el içində nəşvü nüma tapmış eloğlu olduğu üçün asanlıqla o sözləri öz məxsusi malı kimi sərf edir. Hansı bir şeirdə belə bir sadə misra və qafiyələrə rast gəlmək olar: "Bizim başımızda çatdadı çanaq", "qoyun oturaq", "Qurdu badalaq", "Hamıdan qıvraq", "bir qarış torpaq", "dayaq olan kəsə həqq olar dayaq", "bir qədim ocaq", "olgil göz-qulaq", "nə diş bilsin, nə dodaq", "deyək, danışaq" və habelə.

Bu sözlərin təmami zərbül-misal məqamında müttəsil dilimizdə cari olan sözlərdir. Necə ki, millətimiz diridir, bu sadə sözlər onun dilində işlənəcəkdir və nə qədər ki, bu sözlər iste'maldan düşməyəcəkdir, yə'ni əcnəbi lisanlardan əxz olunmuş qəliz ibarələrin hücumu altında boğulub tərk olmayacaqdır, millətimiz dəxi ölməyib, diri və salamat qalacaqdır. Necə ki, bir millətin danışdığı dil itib-batmayıbdır, o millət özü dəxi itib-batmayacaqdır və həyat üzrə baqi qalacaqdır. Elə ki, dil unudulub iste'maldan düşdü, dilin sahibi dəxi çox yaşamayacaqdır və onun fövt olmasına şəkk qalmayacaqdır. Bu barədə rusların mürəbbisi və ədibi Uşinski[430] "Ana dili" sərlövhəsilə yazdığı məqaləsində deyir: "Madam ki, bir millətin özünə məxsus ana dilisi xarici dillərin təqəllüb və təsəllütündən salamat qalıbdır, o millət özü də salamatdır. Əgər onun cəm'i maddi və mə'nəvi dövlətini əlindən alasan, vəli ana dilinə toxunmayasan, o millət fövt olmaz və az müddətin zərfində yenə özünə mal və dövlət cəm edər. Və biləks heç bir mal və dövlət ilə bir milləti əhya etmək olmaz, zəmani ki, onun ana dilisi və milli lisanı olmaya".

Mərhum Zakirin öz milli dilinin şivəsi və ruhunu nə dərəcədə bilməyi onun nəzm ilə tərtib qıldığı bir çox nağıl və hekayələrindən görünür. Onlardan bir neçəsini "Balalara hədiyyə" nam adlı kitabçamızda dərc etdirmişik. Tanış olmaq istəyənlər o kitaba rücu etsinlər.

Mirzə Fətəli Axundzadəyə yazdığı başqa bir naməsində Zakir yenə Qarabağın əhvalından filcümlə mə'lumat verib, Hər bir sinfin şüğlü karını və ə'mali-şəniəsini Mirzəyə kəşf qılır. Bu namə daha da ziyadə şairanə yazılmışdır. Namənin ibtidasında şair öz könlünə üz tutub bir növ qəflətdən bidar etmək qəsdilə baharın yetişməyini xəbər verir və ona xitabən deyir: "Ey könül, dünyanın qəmi sənə ha qalmayıbdır?! Beş günlük ömrün var, ye, iç; eyş-işrətlə vaxtını keçirib, zövq-səfaya məşğul ol! Gərdişi-dövranın möhnət və cəfasını ancaq gərdişi-şərab apara bilər. Əgər özün sufilik biruz edib, şəraba meyl etməsən də, barı qeyrilərin eyş-nuşuna tamaşa qıl və bahar fəslinin ruhpərvər havası ilə qəlbini təzələndir. Bax gör qadirü rəhman sənin könlünü açmaqdan ötrü nə türfə şeylər yaradıbdır, nə gözəl ne'mətlər əta buyurubdur.

Sonra şair keçmiş əsrlərdə olan böyük padşahları, bimurad aşiqləri və namdar pəhlivanları bir-bir yad edib deyir ki, onlara qalmayan dünya sənəmi qalacaqdır? Bəs, vaxtı fövt edib möhnətdə keçirmək yaramaz!

Bu tənbih və tövsiyədən sonra şair Mirzə Fətəlinin özünə rücu edib zərifanə deyir ki, sən mənim kimi deyilsən. Tiflisin içində olursan; məskənin də yol üstündədir; gəlib-gedənə tamaşa edib, kef və ləzzət aparırsan. Xüsusən, bazar günləri Hallavarın[431] gözəlləri bəzənib, dəstə-dəstə kəlisaya cəm olurlar. Onlara baxdıqca sənin ruhun təzələnir. Şair ona məsləhət görür ki, axunddan* xəlvət, mümkün olsa, düşəndə bir Balaəhmədi də yanına alıb, gedib mələksimaya baxsın. Belə zarafatdan sonra şair keçir öz vilayətinin övza'vü əhvalını şərh qılmağa. Onun öz kəlamına rücu edək:

Nə xabi-qəflətdir, divanə könül,
Aç gözünü, sün'i-xudayə bir bax!
Sənə ki, qalmayıb qəmi aləmin,
Seyri-bağı-zövqü səfayə bir bax!

Qıl tamaşə novərusi-baharə,
Qənimətdi beş gün ömri-dübarə;
Səhni-çəmənlərdə qümri, həzarə
Nə xoş verib səda-sədayə, bir bax!

Gərdişi-dövranın, ey xanəxərab,
Aparır möhnətin gərdişi-şərab;
İçməsən də içmə özün meyi-nab,
Eyşü nuşi-bayü gədayə bir bax!

* A x u n d – yəqin ki, burada şeyxülislama işarədir



Yasəmənin ətri çöküb jaləyə,
Gəlir gülüstandan buyi-qaliyə;
Gahi bənəfşəyə, gahi laləyə,
Gahi də nərgisi-şəhlayə bir bax!

Sərvü sənubərin afəti-xəzan
Soyub libasını qoymuşdu üryan;
Gəlib tərəhhümə sərvəri-rəhman,
Verdiyi xələti-zibayə bir bax!

Əgərçi xəstəsən, dur bir ayağə,
Ahəstə-ahəstə güzər qıl bağə;
Qəh-qəhi-minayə, rəqsi-üşşaqə,
Cəh-cəhi-bülbüli-şeydayə bir bax!

Seyrə çıxıb dəstə-dəstə gözəllər,
Çiçək dərib tər buxağə düzərlər,
Qaqqıldaşa-qaqqıldaşa gülərlər,
Canlar alan sövtü sədayə bir bax!

Şəqayiq, qərənfil, süsən, nəstərən
Zəbani-hal ilə oxur müstəhsən;
Həvayi-kuhsar, səfayi-çəmən
Tə'n edər cənnətül-mə'vayə, bir bax!

Necə oldu Cəmşid, Firidun, Kavus,
Söhrabi-namvər, Fəramərzü Tus,
Əsasi-İskəndər, gənci-Dəqyanus[432]
Tamam getdi badi-fənayə, bir bax!

Bu dari-dünyanın yox etimadı,
Sənin də rehlətin bugün-fərdadı;
Sal yadına nəqli-Şirin-Fərhadı,
Sərgüzəşti-Məcnun-Leylayə bir bax!

Mənim tək deyilsən, əzizim, sənin
Kür kənarı, yol üstüdür məskənin;
Ləzzətini apar gəlib-gedənin,
Nazənini-fərdi-əlayə bir bax!

Hallavarın bu səmtinin gözəli,
Bazar günü kəlisaya çox gəli;
Laçın tumağəli, tərlan cilvəli,
Səri tər cığalı sonayə bir bax!

Duyuq düşsə əgər verməzlər rüxsət,
Unutma, gah-gah düşəndə fürsət
Molla Əhmədi də axunddan xəlvət
Al yanına, mələksimayə bir bax!

Fisqü fücur həddən aşıb Şişədə,
Erkəyi, dişisi yaman peşədə;
Mənəm qalan həmin bu əndişədə,
Zəmanə dönübdür, qovqayə bir bax!

Sürahi solunda, badə sağında,
Məzə qabağında, mey dodağında,
Çeşmə kənarında, çay qırağında
Əmmameyi-seyyid, mollayə bir bax!

Vaiz bizə oxur şərhi-Mustafa,
Hərамə mürtəkib olmayın əsla!
Özü lüm-lüm udar batində, əmma
Zahirdə dediyi mə'nayə bir bax!

Kimdi baxan peyğəmbərə, imamə,
Bu dağılmış düşən deyil nizamə.
Orucluqda şürbi-meyi-gülfamə,
Mahi-məhərrəmdə zinayə bir bax!

Səhra mərdümini şəhr əhli görcək
Yalvarıb, yapışıb oturdar çömlək;
Beş arşında sürüşdürür üç çərək,
Tacirə seyr eylə, sövdayə bir bax!

Baqqal qoyar tərəziyə imanın,
Əsəl qiymətinə satar ayranın,
Qudurmuş it kimi dolar dörd yanın,
Deyən yoxdur Ali-Əbayə bir bax!

Pinəçilər bafta taxar boynuna,
İmperial tökər vərəq oynuna,
Qovurmaçı saat qoyub qoynuna,
İddiayi-ə'la, ədnayə bir bax!

Həramilər kimi yol üstdə yatar,
Tamojnaya çakər olub, mal tutar,
Dünbək çalar, şərab içər, baş atar,
Qövli-bəyzadəyə, tərsayə bir bax!



Dolanır bazarı darğa, kvartal,
Döyülür sifətlər, yolunur saqqal;
Gecə get cibinə beş-on manat sal,
Gündüz gəlib nırxa, bahayə bir bax!

Həddən aşıb bu vilade şərarət,
Hər kim bir iş görə, puluna minnət;
Mu qədəri yoxdur ədlü ədalət
Və lakin şöhrəti-bicayə bir bax!

Böyüklərin işi deyil deməli,
Dənidən betərdir fe'li, əməli;
Böylə görməmişdik bundan əzəli,
İndi karü bari-rüsvayə bir bax!

Xanzadələr şişə taxır rəyəti,
Özlərinin deyil malü dövləti,
Orda təpər, harda düşsə fürsəti,
Mujikə seyr elə, ağayə bir bax!

Palajenya nəqli ta olub möhkəm,
Gərək bəy azalda zülmün dəmadəm;
Dəxi də artırır bu əhli-biqəm,
Yanında çalınan zurnayə bir bax!

Piranəsərlikdə mən oldum rüsva,
Düzəlmədi işlər, cana yetdim ta;
Gör nə oyun tutdu, əzizim Mirza,
Zakirə, təqdiri-qəzayə bir bax!

1848-ci sənədə çıxan zakonun[433] hökmüncə xanzadə və bəyzadələrin ixtiyarı azalır və rəiyyət tayfasına bə'zi ixtiyarat və əmniyyət vədə olunur. Vəli qanun və qaydaya adət etməmiş xanzadələr çəndan təzə zakona mültəfit olmayıb, irəlikindən də ziyadə bacardıqları zülmü rəiyyətlərin haqqında əsirgəməzlərmiş.

Burada Zakir xanzadələrin avamlığını və vəhşiyanə hərəkətlərini təyib və təzmim edib deyir: Bu əhli-biqəmin halına heç bir şey təfavüt etməz; yanlarında çalınan zurnaya bax ki, onları bidar və huşyar qılmaz.

Əgərçi burada şair xanların və bəylərin avamlığını, zülm və istibdad tərəfdarı olmaqlarını zəmm eləyir, vəli bu palajeniyanın (qərardadın hökmü – ki, xanzadə və bəyzadələr ilə rəiyyət tayfasının arasında gərəkdir bir növ müsavat olsun, – onun özünü də müztərib və pərişanhal eləyir və buna səbəb şairin özünün nücəba və xanzadə silkinə daxil və mənsub olmasıdır.

Həmin bu məzmunda ikinci dəfə olaraq təzə bir zakonun e'lan olunması Zakiri daha da artıq məğmun və digərgun edib, aşağıda təhrir olunan nalə və şikvələrin inşadına səbəb olur:

Çıxmadı, qurtulaq dərdü bəladan,
Gündə bir zakuni görən canımız.
Hər ayın başında bir yol dəyşilən
Adətü qanuni görən canımız.

Təfavüt qalmadı gədayə, bəyə,
Barkeşlər indi keçib yedəyə*,
Qənaət eyləsin bezə, qədəyə
Cameyi-gülguni görən canımız.

Bundan isə yekdir diyari-qürbət,
Al başını, dur get, əlbət, sə'd əlbət;
Yalavac əyaldan çəksin xəcalət
Bəzəkli xatuni görən canımız.

Yazü qış həmişə sevgili canan
Geyərdi əyninə libasi-əlvan;
Olmasınmı indi sərv tək üryan
Qaməti-mövzuni görən canımız?!

Fətulə-fətulə səfheyi-rudə,
Gəh tərfi-zənəxdə, gahi əbrudə,
Pərişan olmazmı qubaraludə
Müəttər gisuni görən canımız?!

Mübarəkdir bu dünyanın nizamı,
Nəhayət, müşküldür öyrətmək xamı;
Yad edib ağlayın keçən əyyamı,
Möhnəti-əfzuni görən canımız!

Ac qaldıqca rəxtixabi satacaq,
Gələ-gələ quru yerdə yatacaq;
Uzaqdan sikkəyə güllə atacaq
Min tümən altuni görən canımız.

Saldıq başımıza nə növ'i daşı,
Harda biz görmüşük belə pərxaşı?
Rəiyyətlə boyunduruq yoldaşı –
Çakəri-dilxuni görən canımız.

* **Barkeşlər** – yə'ni yük heyvanları indi yedəyə keçiblər. Rəiyyət tayfasının layiqi-hörmət və e'tina olmasına işarədir.



Nə gündə yaradıb xudavənd bizi,
Bir yana apara bilmədik izi.
Gahi Avanesi, gahi Sərkisi,
Gahi də Semyonu görən canımız.

Bəy ikən adımız oldu mülkədar,
Daxi bundan belə bizimçün nə var?
Mükəddər olmazmı sahib ixtiyar –
Əvəki, Ərtuni görən canımız.

Satarıq, sovarıq olub qalanı,
Həq bilir sözümün yoxdu yalanı,
Salsın alta indi öküz palanı
Balışi-pərquni görən canımız.

Sərxeyl ikən yeksər qaldıq ayaqda,
İşlərimiz keçir yaman sayaqda,
Nə tirəbəxt oldu bu Qarabağda
Taleyi-meymuni görən canımız.

Tağar-tağar arpa, buğda əkilən,
Biçilib, döyülüb dama tökülən;
Qan axıt gözündən, ipək çəkilən –
Xali tərazuni görən canımız.

Bu tövr ilə getmək müşküldür yola,
Nə sağa mümkündür qaçmaq, nə sola;
Gərək indən belə digərgun ola
Kari-digərguni görən canımız.

Aparılır qaravula, keşiyə,
Qəht olub bir deşik, girək deşiyə
Buriya döşəsin evə, eşiyə,
Qalini, bahuni görən canımız.

Bu zülmü insana eyləməz insan,
Saf cana yetişdik, aman, əlaman!
Bir neçə laməzhəb, adı müsəlman
Mürtədü məl'uni görən canımız.

Gəldi, getdi,heyif, əmiri-nəcib,
Feyzi-nəzərindən olduq binəsib;
Necə qəbul eylər naəhl təbib
Haziq Ərəstuni görən canımız.

Lazımdır ki, edək belə qonağa
Ellik ilə malü mülki sadağa;
Özgə əmir ilə tutmaz əlaqə
Ta doyunca muni görən canımız.

Ədalətli, mürüvvətli canişin,
Təkyəmiz onadır küllühüm həmin;
Sənaxandır ona ta ruzi-pəsin,
Xəlqə rəhnümuni görən canımız.

Məlcə'i-füqəra, mö'mini-zəlil,
Hamiyi-züəfa, mürşidi-dəlil,
Kərəmi abi-Kür, ətasi Edil,
Səxası Ceyhuni görən canımız!

Qasım bəyin bərgüzidə əsərlərindən birisi də mollaların şə'nində və üsuli, şeyxi-məzhəblərin əqaidinə dair yazdığı həcvasa kəlamıdır ki, onun mislini bu vaxta kimi Azərbaycan şüərasının asarü əş'arında görməmişik. Bu kəlamda Zakirin ən müqtədir və rəvantəb' bir şair olması yəqin olunur.

Ondan sonra gələn şairlərdən bir çoxu bu kəlama nəzirələr yazıblarsa da, heç birisi belə fəsahət və bəlağətdə mətləbi yetirə bilməyibdir. Onunla oxucuları aşina etməyi özümüzə borc bilib, burada onu dərc edirik.

Şuşa qalasının ruhaniləri və xüsusən, şeyxi və üsuli-məzhəb mollaların əqaid və ətvarı babında yazılmış həcvasa kəlamdır ki, Qasım bəy Zakirin təb'i-səlimindən nəş'ət etəmişdir:

Neçələr silsileyi-təb'imə təhrik verir,
Rişteyi-nəzmə çəkəm yə'ni düri-qəltani.

Budu xahişləri kim, baxmayıb ağü bozuna,
Eləyim həcv tamam bayü gədavü xani.

Neyləyim, ölkə bulaşıb nəcisə bir günə,
Pak qılmaz onu gər bağlayasan ümmani.

Verməsən vüs'ət əgər nəzmə, olur namərğub,
Eləsəm cümləsini şərh, düşər tulani.

Çarə odur ki, yenə hər biridən bir şəmmə
Söyləyib, ta ki, qılam həcv Əmiraslani.

Çünki ol fasiqü facir kimi həcvə layiq –
Tapmaq olmaz, gəzəsən Gəncə, Şəki, Şirvani.



Qalsın, axırda onunla olunur xətmi-kəlam,
Fəsli-əvvəl danışaq məzləmeyi-mollani.

Ah, bu müftəxorun dad əlindən, sə'd dad –
Ki, salıbdır necə gör məmləkətə qövğani!

Hərcü mərc eylədilər məzhəbi-isna-əşəri.
Etdilər zirü zəbər bargəhi-im'ani.

Hər əlifba oxuyan adını ruhani qoyub,
Bilməz öz əbcədini, ruha çəkər suhani.

Alimü fazilü ustad, müridü mürşid,
Nə qədər ki, görəsən dövrdə sərgərdani.

Həmə qövğaləri bəhri-dirəmü əqmişədir,
Həmə təqvaləri şali-əməli-Kirmani.

Verməərəm mən oların taəti-bibəhrəsinə –
Tarı şahiddir özü, mə'siyəti-düzdani.

Yenə filcümlə üsul ilə üsuli danışır,
O ki, şeyxi lap elə dibdən urur baltani.

Etməyib şərmü həya göz görə Əbdüllahə
Eylər isbat sərasər sifəti-yəzdani.

Bişü kəm xaliqü məxluqdə bir fərq gərək,
Eləsən nik nəzər, bunda təfavüt hani?

Bir quru ismdən özgə dəxi həqqə nə qalır,
Lə'nət olsun sənə, ey münkiri-həq ruhani!

Bəs deyilmi olalar, vasiteyi-külli-vücud,
Bəs deyil məzhəri-feyzü kərəmi-rəbbəni?

Bəs deyilmi olalar şafeyi-ruzi-ərəsat,
Bəs deyilmi səbəbi-fəthi-dəri rizvani?

İki tarı yenə mümkündü süluk eyləyələr,
Gərək on dörd yerə bunlar bölələr dünyani.

Qasimi-rizq demək gər bu isə, şamü səhər
Şiri-yəzdan götürüb dəstinə paylar nani.

Bu dənirütbə nə layiq o şəhi-kövneynə,
Haşa-lillah götürə mənsəbi-fərraşani.

Yoxsa qəsdin budu ki, ruzirəsan onlardır,
Sən'əti-sanei müşküldü tapa insani.

Yoxdu bir ruzirəsan bari-xudadan qeyri,
Odu murü mələxə rizq verən asani.

Mahiyi-bəhrə qılır qətreyi-barani qəza,
Seyd edir bipərü balə məgəsi-pərrani.

Müşrikü mürtədü mərdud, nəsaravü yəhud,
Vəqfdir cümləyə xani-kərəmü ehsani.

Doğrudur, raziqü mühyiyyü mümitdən qeyri
Hər sifət kim, deyələr var sifəti-imkani.

Bir deyən yoxdu ki, ey asiyi-dərgahi-ilah,
Bir xəyal eylə ki, kimdir dediyin böhtani.

Gedəcək duzəxə, bişübhə, o mövla həqqi,
Xaliqi-mövtü həyat kim bilə ol mövlani.

Həm dəxi bir də deyirlər ki, Rəsulun Cibril
Batinindən gətirir zahirinə Qur'ani.

Belə gər olsa, cəmin-şüəra mürsəldir –
Ki, yazıb hər biri bir cild, iki cild inşani.

Onların da yenə vardır neçə ülul-əzmi –
Hafizü Sə'diyü Cami dəxi həm Xaqani.

Mən də peyğəmbəri-namürsəliyəm Kolbasanın,
Ümmətim Tanyaqü Külqışlaqü Xızrıstani.

Tutuban rahi-digər xarici olmaq yekdir, –
Bu isə tövrü təriqü rəhi-müslimani.

Bilməzəm hiç nə vəch ilə bu laməzhəblər
Bəhs edirlər ki, mükəlləfdi qamu əşyani.

Əqldir rəhbəri-nikü bədü həqqü batil,
Şeyə ki, verməyib ani, necə tapsın ani?

Tifl ta baliğ olunca ona yoxdur təklif,
Nə dəlil ilə mükəlləf biləsən heyvani?!

Tanımaz ana-bacı, bir-birinə cift olur,
Nə nikahi, nə təlaqi, nə də siğəxani.



Gəllədən gər xəbər alsan ki, de rəbbin kimdir?
Göstərər ciddü yəqin ilə sənə çubani...

Küfrdür qabili-təsbihi-təala bilmək –
Füzleyi-xəlqi yeyən sağsağani, qarğani.

Aşiqin taəti mə'şuqə səzavər gərək,
Bixirədlər nə bilir rəsmü rəhi-fərmani?

Zihəyata, tutalım, cəhl ilə isbat etdin,
Var oların da dedin hissü şüurü cani.

Elə insaf, nəbatat, cəmadat, gözüm,
Kim inanır ki, tapa mə'rifəti-yəzdani?

Bu nə qövğa, bu nə kavuş, məgər görməmisən
Oxunan vəqtdə sən sureyi-"Ərrəhmani"?

Cümləsin bari-xuda növ'i-bəşərdən ötrü
Xəlq edib, hər biri bir dərdin ola dərmani.

İns ilə cinnədi təklifi-xudavəndi-cəlil,
Üləma böylə ki, təfsir edər Qur'ani.

Şeyxi şəyyaddı hərçənd, üsulidə dəxi
Yoxdu bir su qədəri mə'rifəti-insani.

Cümlə bədkarü dilazarü mühilü kəzzab,
Cümlə bidinü süxənçinü şərarət kani.

Əllərində hamının səbheyi-səddanələri,
Dillərində hamının şamü səhər yalani.

Birisi bihəmə çiz biri ilə başlar cəng,
Hakimi-şərə çəkər, şahid olur qalani.

Bilə, ya bilməyə bir yaxşı ziyafət eylə,
Sal səmavarə odu, dövrə gətir fincani!

Bir içim çay ilə yüz şahidi-bidin tapılır,
Necə kim, Əli bəyin çıxdı göyə əfğani*.

* Bu şeirlər Əli bəy ilə məşhur hiyləsaz Kərbəlayı Allahverdinin arasında vüqua gələn mürafiəyə dairdir. Əli bəy Kərbəlayı Allahverdiyə 22 tümənin vəchində verdiyi sənədi Kərbəlayı Allahverdi həkki-islah edib, 22 sıfrayı çöndərib 1200 edibdir və bir para bidin şahidlərin köməyi ilə hakimi-şərin tərəfdarlığı ilə 22 tümənin əvəzində Əli bəydən 1200 tümən alıbdır.

Cəfəri-kar ki, eşitməz, çalalar zurna səsin –
Der imiş mən hamıdan yaxşı eşitdim ani.

Yeddi gündən sora bir şəxs Dızaqdan yetişib,
Qaziyi-şəhr yazıbdır biri də filani.

Eşidiblər ki, olur şahidi-şiə məqbul,
Bağlayıb uzun Hüseynəli dəri-dükkani.

Həzrəti-qazi və yanındakı Ağanovruz
Eyləyib hər biri bir tərz münasibxani.

Biri bəqqali-bədəf'alü kəlambazü füzul,
Biri əhli-zələmə zadeyi-Şəkkərbani*.

Belə şahidlər ilə bir kəsə din olsa sübut,
Kişi neylər dəxi rəncü təəbi-kimyani?

Hər kimin var isə həmmamı, edər borcun ə'da,
Bari bizlər kimiyə atmayalar böhtani.

Tümən oğlu Nuru** netsin ona, ya özgə vəkil,
Əhli-Təbriz təfənündə ötüb şeytani.

Yox məzəmmət yeri bu babdə hərgiz Əlidə,
Rindi-şəhr ola özü, əsli ola Məmqani***,

Hər nə oldusa ona, qazidən oldu, əlhəq,
Var idi çünki onunla kədəri-pünhani.

Pəmbeyi-eyşini verdi yelə ol bədbəxtin,
Saldı bir dərdə ki, heç nüsxədə yox dərmani.

Yazdı biməksü təvəqqüf iki saətdə həmin
Surəti-şər'i həzarü dü sə'd tumani.

Şərtdi şər' hüzurunda rəhü rəsmi-ədəb,
Nə ki, sərkub oluna bir tərəfin əqrani.

Molla, nə molla, əsiri-şikəmi-əndər piç,
Qazi, nə qazi ki, sir olmaz içə ümmani.

* Şəkkərbani – şairin əsrində pis yola qurşanan bir arvadın adıdır

** Nuru Tümən oğlu Əli bəyə vəkil imiş. Vəli Kərbəlayı Allahverdi onu da aldadıbdır və o, işi uduzubdur.

*** Kərbəlayı Allahverdi Təbrizdə anadan olmuşsa da, əslən Məməqanlı imiş.



Filhəqiqə, mən onun müxlisi-dirinəsiyəm,
Leyk doğru deməyin şərdə yox üsyani.

Doğruluq qalmayıb əsla bu fəna aləmdə,
Sərnigun ola, görüm böylə yaman dövrani.

İstər idim dəxi də nəzmə verim tul, vəli
Dil dedi: – Ömr keçib, qət elə bu hədyani.

Əmiraslanə gərək dəftəri-digər yazıla,
Çünki ol bədəməlin qeyr gərək dastani.

Yaxşı həcv eylər idi bu dəmin adəmlərini,
Sağ gər olsa idi indi ol İbni-Cani*.

Rişteyi-təb'imə yox tab verən, çərx əfsus
Eləyib xak ilə yeksan qədi-Babani**.

Getdi həmdərdlərim, bisərü saman qaldım,
Bu ribati-kühənin yoxdu sərü samani.

Dəmi-rehlətdi, könül, bari iqamət açma,
Mizban xar tutar dir köçən mehmani.

Keçdi hədyan ilə övqat, bağışla, ya rəb,
Behəqi-ali-Əli cürmi-məni-pirani.

Nəçidir maliki-rizvan üzünə açmaya dər,
Ola hər kimsənənin əldə onun fərmani.

Zakiri-rusiyəhəm, gərçi günahım çoxdur,
Var dəstimdə vəli Ali-Nəbi damani.

Kəlamın axırında Qasım bəy haqq və doğruluğun bu puç dünyada məhvü nabud olmasını kəmali-təəssüflə izhar edib, belə yaman dövranın sərnigun olmasını arzu edir və etməmək də olmaz.

Bir yerdə ki, "bir içim çay ilə yüz şahidi-bidin" tapılsın və səbheyi-səddanə əldə ola-ola dillərdə yalan söylənsin və hakimi-şər dəryalarca kamına çəkib yenə sir olmasın, daha belə bir vilayətdə doğruluq qala bilərmi və belə dövranın abad olmasını arzu etmək rəvadırmı?

* İbn Cani – Kərbəlayı Abdulla Canı oğludur ki, onun barəsində yuxarıda yazılmışdır

** Qədi-Babani – yəni mərhum Mehribanlı Baba bəy ki, onun haqqında da filcümlə məlumat verilmişdir

Şair özü dəxi dünya zindəganlığından bizar olub, onda artıq yaşamağı istəmir, rehlət zamanı yaxınlaşmağını dərk edib axirət mənzilinə köçməyə hazırlaşır.

Bir tərəfdən dəxi şairi dünyadan soyudan mehriban rəfiqlərinin təmamən getməsi olubdur; "rişteyi-təb'inə təhri verən" yoxdur; ruzigari-qəddar İbn Canını fövt edibdir və çərx də "qəddi-Babanı xak ilə yeksan qılıbdır"; "bu ribati-kühənin yoxdu sərü samani". Digər tərəfdən də sahibxanə dir köçən qonağı dost tutmaz. Ona binaən lazımdır dünyadan bir az üzüsulu getmək.

Bu hal ona şəhadət verir ki, Zakir dünyada xeyli vaxt ömür sürübdür. Necə ki, özü iki-üç yerdə öz sinnü salına işarə edibdir. Şair həştad sənəyə kimi yaşayıbdır[434].

Kolyubakinə yazdığı kağızda deyir:

Həştada yetişdi sinnü salımız,
Bu dövlətdə ağarmışdı yalımız;
Getdi dövlətimiz, mülkü malımız,
Nəxli-təmənnamız kədər gətirdi.

Mərhum Mirzə Fətəliyə yazdığı kağızda yenə öz sinnindən söz açıb deyir:

Az qalıb həştadı tamam edəm mən,
Sən indi yazırsan əhli-şər' məni.

Və bunlardan əlavə şairin bir neçə məqamlarda qocalıqdan şikayət etməsi onun xeyli əlil və düşgün olmasına dəlalət edir, məsələn, bir yerdə yazır:

Ağzımda uçuq qəbrə dönüb otuz iki diş,
Üç-dördü qalıbdır.
Bir-birini tutmaz dəxi onlar görə bir iş,
Kökdən boşalıbdır...

Və yenə bu şikayətnaməsinin axırında yazır:

Saqqal dönüb ağ sümüyə, söyləmə, Zakir,
Qəflətdən ayıl sən!
Sövdayi-qiyamətdə gərək ər ola mahir,
Dur, düş yola, tərpən!
Köçmək dəmidir, yatma, kişi, çapükü şakir
Taət yolun öyrən!
Bahörmət ikən çarə odur mərgi arayım,
Şayəd ola qismət?!



Yenə qocalıqdan şikayət edib, bir şe'rinin axırında yazır:

İltimasım budu kim oldu, xilas eylə məni,
Oğul-uşaq əlinə vermə saqqalım, qocalıq!

Hər halda altmış sinnində olan şəxsdən bu qisim şikayət sadir olması təbii deyil...

Şair səyahət qəsdilə Tərtərbasana – ki, Cavanşir mahalından ibarətdir, – azim olur ki, o yerləri seyr edib, könlü açılsın və şayəd Bərdə şəhərinin keçmişdəki şenlik və abadanlığından bir əsər bulsun və bir müddət şurişi-zəmanədən fariğ və asudə olsun. Tərtərbasana nə təmənna ilə azim olduğunu Zakir bu sayaq nəzmə çəkir:

O viladə mehribanlıq görmədim,
Gəlmişəm indi də Mehriban* gəzəm;
Seyr eləyim tamam Tərtərbasanı,
Varmı aşiqinə can qıyan gəzəm.

Tülək tərlan ovlağıydı bu yerlər,
Bərdə torpağına eyləyim güzər;
Görüm qalıbdırmı Şirindən əsər,
Baxam hər tərəfə nigaran gəzəm.

Xosrovi-Pərvizin şə'nü şövkətin,
Fərhadın ələmü qəmi möhnətin,
Şapurun[435] çəkdiyi nəqşü surətin
Arayıb, axtarıb bir zaman gəzəm.

Dolanıb sərasər çarsu bazarı,
Gətirəm nəzərə səmti-minarı,
Görsəm, xəbər alım bülbüli-zarı,
Necoldu ol gülü gülüstan, gəzəm.

Deyim hanı munda gəzən gözəllər?
Teyhulu meşələr, sonalı göllər?
Çayın kənarında tikilən ellər?
Yoxdu heç birindən bir nişan gəzəm.

Ol baş-başa verən sərvi-rə'nalər,
Hər guşədən gələn sövtü sədalər,
Zərrin piyalələr, meyi-səhbalər,
Gərdişi-badeyi-ərğəvan gəzəm.

* "O viladə" deməklə yəqin ki, şair Şuşa uyezdinə işarə edir; "Mehriban gəzəm" – şairin dostu Baba bəyin vətəni və vəfat etdiyi "Mehriban" kəndinə işarədir ki, Cavanşir mahalındadır.

Bu minval ilə şikəstə Zakir bülbüli-zardan əhval cəm edib deyir: Bu diyarın adət və qanununu mən təvarixdə oxumuşam. Onları xeyli müstəhsən surətdə təhrir qılıblar. Bayram gecələrini sübhə kimi bu şəhərin əhalisi çirağan edib, eyşü işrətdə keçirirlərmiş. Bəyzadə və əmirzadələr boynu qəlladəli səgi-şikar ilə övqatını seydgahlarda sürərlərmiş. Böyüklər astanasında pəhlivanlar və qızmış nərlər küşti tutarlarmış. Bir yandan cəvahirfüruşlar, bir tərəfdən zərgərlər gözəl nazəninlərə bəzək və zinət əsbabı mühəyya edərlərmiş. Karvansaralarda qələndərlər qəsidə oxuyub, tacirlər və səyyahlar və hər qisim qəribü qürəba sübhə kimi şirin nağıl və hekayətlər söylərmiş. İndi onlardan bir əsər və bir nişanə varmı? Şairin öz kəlamına rücu edək:

Aşiqə söylərmi qasid ənqərib,
Qəm yemə, dilrüba sənədir nəsib?
Zimistan qeydindən çıxan əndəlib
Axtarırmı təzə aşiyan, gəzəm?

Cəvahirfüruşlar satırmı gövhər?
Xublar yaraşığı görürmü zərgər?
Karvansaralarda tacir, qələndər,
Necə keçər şami-qəriban, gəzəm.

Gecə-gündüz daim bangi-cərəsdən,
Qulaq tutulurmu sədavü səsdən
Bakıdan, Dərbənddən, Krım, Çərkəsdən
Gəlirmi məta'i-bipayan, gəzəm.

Sayeyi-sərvdə məcmə'i-xuban
Yenə əyləşirmi xoşdilü xəndan?
Yoxsa ki, onlara saqiyi-dövran
İçiribdir mey yerinə qan, gəzəm?

Nazəninlər ta tului-afitab
Oturub gecələr çəkirmi gülab?
Çeşmi-aşiq kimi fəvvarədən ab
Tökülürmü hovza nümayan, gəzəm?

Sonra şair yenə bülbüldən soruşur ki, müzəyyən məhəllələr və münəqqəş otaqlar yenə irəliki halında durumu və yenə otların içində xanəndə və nəvazəndələr gözəl nəğmələr oxuyurlarmı? Tövlələrdə köhlən atlar kişnəşirmi? Hamamlar yenə əzəlki kimi rövnəqlidirmi və onlara külli ağçalar sərf olunurmu? Bağlarda və bağçalarda seyr edənlər və nazənin cananlar yenə qaqqıldaşa-qaqqıldaşa gəzirlərmi?



Amma çox əfsus ki, şair burada zikr qıldığı şənlikdən, tərəqqi və təməddündən bir əsər görməyib, mə'yus və pərişan olur və bülbüli-biçarə ona belə xəbər yetirir:

Bülbüli-biçarə verdi xəbəri,
Dedi ki, qalmayıb şənlik əsəri,
Mən Zakirəm, onu görəndən bəri
Gərək Məcnun olub, biyaban gəzəm.

Şair özü guya bülbüli-əfsürdədilin belə hüznavər xəbərini pişəzvəqt dərk edib deyir: Bu puç dünyaya etibar yoxdur; bunun bir səfası müqabilində yüz cəfası var. Ona binaən yəqindir ki, keçmiş şövkətü cəlaldan, sərvətü maldan və namdar şəxslərdən bir əsər yoxdur. Tamamını "qara yel" öz kamına çəkibdir. İndi əlac ona qalıbdır ki, mən də özümü qibleyihacət olan imamzadəyə yıxıb, onun mübarək səhnində döşənən tə'nlərə huşü diqqətlə nəzər edib, öz sağlığımdan peşman olam:

Qibleyi hacətə yıxıb özümü,
İmamzadəyə sürtüb üzümü,
Xak olan tə'nlərə dikib gözümü,
Olam sağlığıma peşiman, gəzəm.

Hərgiz bu cahanə yoxdur etibar,
Səfası bir isə, yüz cəfası var.
Baş götürüb gedim diyarbədiyar,
Eləyim aləmi imtahan, gəzəm.

Hər kəs Zakirin bu kəlamını başdan-ayağa diqqəti-tamam ilə oxuyub, onda şair yad etdiyi məqamları seyrü təfərrüc qılsa və əzəlki hal ilə indiki övza'vü əhvalı tətbiq etsə, bilaşübhə, onun də ürəyi qan ilə tutulub, gözlərindən bilaixtiyar yaş tökülər. Odur ki, biçarə bülbülün verdiyi xəbər şairin keyfini pozub, halını pərişan eləyir və Məcnunsifət onu kuhü biyabana salır:

Mən Zakirəm, onu görəndən bəri
Gərək Məcnun olub biyaban gəzəm.

Necə ki, yuxarıda zikr olundu, sabiqdə Cəfərqulu xan ilə Zakirin mabeynində ülfət və zarafat var imiş. Onun xana yazdığı namələrdən bir neçəsi başdan-ayağa lətifəli və zərifanə yazılmış şeirlərdir. Xanın Cəbrayıla getməyi barəsində şair istehza təriqi ilə yazıb izhar edir ki, iki gündən ziyadə orada qalmasın; əvvəla, özünə xan deyən kəs gərəkdir xalqı incit-

məsin və saniyən, o yerin adamlarında nə mə'rifət var ki, xan onların söhbətindən və ülfətindən bir feyz kəsb edə bilsin:

O babili Vəli Məmməd deyil mütləq sənin babın,
Nə layiq şahbazın həmnişini bir qürab olsun.
Qoyucaq, Daşkəsənlidən güzər qıl badi-sərsər tək,
Əli-allahidən[436] daim gərəkdir ictinab olsun.

Şairin əqidəsincə adamın malı və dövləti olmasa da, yola gedər, ta ki, həmnişini və yoldaşı əhli-zövqü kəmal olsun. Şuşa şəhərində şair hər qisim əziyyət və cəfanı ancaq müsahib dərdindən qəbul edir:

Bu şəhri-Şişədə gör bizi şişə taxsalar xoşdur –
Ki, həmsöhbət bizə ol növ'i-qövmi-bihesab olsun.

Nə hasil-əhli-səhra söhbətindən, abi-əngurun
Gərəkdir neçə müddət şişədə qalsın, şərab olsun.

Yenə Zakir başqa bir naməsində məsləhət üzü ilə Cəfərqulu xana yazır:

Özün bil, xani-valaşan, sözüm budur sənə əvvəl,
Sənin həmsöhbətin daim gərəkdir xoşdamaq olsun.

Əbusiqəmtərir, karü kurü lar yoldaşından
Gərək adəm həzar etsin, gərək çox-çox iraq olsun.

Xanın təb'i-şe'riyyəsinə rişxənd edib deyir:

İyirmi gündə bir şe'ri deyincə "ya Əli" dersən,
Gərək şair bizim Zakir kimi hazırcavab olsun.

Yenə həzl təriqincə şair Cəfərqulu xana yazdığı bir kağızında xanın əxlaqü ətvarını və əhli-əyalı ilə və qohum-əqrəbası ilə nə növ rəftar etməsini filcümlə bəyan etmişdir. Haman kağızı xan Şuşa qalasında qaçaq olduğu əsnada yazmışdır ki, belə başlanır:

Vücudi-lətifin, ey taci-sərim,
Eşitdim Qələdə bərhəm olubdur;
İztirabə düşüb bu macəradən,
Tamam əhli-Şişə, pürqəm olubdur.

Bu namənin axırından belə anlaşılır ki, xani-mərhum neçə vaxt imiş ki, öz əhli-əyalını və qohum-əqrəbasını nəzərdən salıb, onlara iltifat etməz imiş. Amma indi mərəzin şiddətindənmi və ya başqa bir illətin vüquundanmı tərəhhümə gəlib, onları başına cəm edib, haqlarında mehribanlıq göstərir:



Qış günü Doyranda qalan əhli-beyt,
Yay Əylisə məskən salan əhli-beyt.
Didarına müştaq olan əhli-beyt
Üzün görüb şadü xürrəm olubdur.

Təəccüb eylərəm, Allahü əkbər,
Boyaqçının küpü azıbdır məgər?
Yüz ildi nəzərdən saldığın Yetər[437]
Tazədən sizinlə həmdəm olubdur.

Qövmü qardaş düzülübdür yanına,
Duagudur dövlətinə, şanına;
Neyləsin, qarışıb qanı qanına,
Fəqirlər sileyi-ərhəm olubdur.

Otaqda qatıban qurunu yaşa,
Yeyərlər, içərlər verib baş-başa;
Biz görən tək deyil Abdulla paşa[438],
Cür'ət bahəm edib, ötkəm olubdur.

Düşmüşdü nəzərdən müddət binəva,
Çıxmalı deyildi üzə mütləqa;
Neçə gündü saçı, saqqalı guya –
Külahi-Buxara tək püf-nəm olubdur.

Öz xələfin gərək gözləyə kişi,
Sağlığında ola alış-verişi;
Hidayət ağanın[439] düzəlib işi,
Vəliəhdliyi möhkəm olubdur.

Xan varisi lazımədir ola xan,
İşləyə bəratı hər tərəf, hər yan;
Gurginə dönmüşdü biçarə oğlan,
Zahirən ki, indi Rüstəm olubdur.

Mehrü məhəbbətin keçsə bu minval,
Çıxar aralıqda olan qilü qal;
Basqın qoşun kimi dağılan ətfal –
Yığılıb üstünə, sərcəm olubdur.

Bu minval yenə bir neçə baməzə qafiyələr yazıb, axəri-kəlamda deyir:

Yanmayıb bir kəs ömründə səndən,
Mükəddər qayıdıb qapına gələn.
Əsirgəmə feyzin, ey qibleyi-mən, –
Düşəndə Zakirə kəm-kəm olubdur.

Yuxarıda isimləri zikr olunan möhtərəm şəxslərdən əlavə, mərhum Zakirin sair dost və aşinalarına bir çox əhəmiyyətli məktubati-mənzuməsi vardır ki, cümləsinin buraya küncayişi yoxdur. O məktublardan məşhuru Baharla Mirzə İsmayıla, Zəngilanlı Məhəmməd bəy Behbud bəy oğluna, Sarıcalı Mirzə Mehdiyə, Quyular Əli bəyə, Böyük bəyə yazdığı namələrdir və bunlardan maəda mərhum Baba bəyə yazdığı "Car müqəddiməsi"dir və "Təbiblərin həcvi"dir. Bu iki axırki əsərlərin barəsində müxtəsərən mə'lumat verməyi faydadan xali görmədik.

Baba bəyə yazdığı "Car müqəddiməsi"ndən belə anlaşılır ki, Dağıstanda şuriş olan zamanı – ki, qazi Məhəmməd əfəndi ilə Həmzə bəyin təhrik və iğvası ilə başlanmışdı, – Car mahalında ləzgilər arasında dönüklük və üsyan büruz etmişdi. Onların müqabilinə rus qoşunundan maəda Şəki, Gəncə və Qarabağ xanlıqlarından dəxi atlı qoşun mühəyya olunub göndərilmişdi. Qarabağdan gedən nücəba sinfində Qasım bəy dəxi var imiş. Bunların sərkərdəsi Miklaçevski[440] imiş ki, o davada çox hünər göstəribdir. Şair özü də bir gün davaya çıxıb ləzgi tutub:

Mən özüm də bir gün çıxdım cövlana,
Görməyibsən, yolum düşdü bu yana;
Bir tüfəngli ləzgi mərd-mərdana
Tutulub əlimdə giriftar oldu.

O yerin meyvəcat və məhsulatını şair tə'rif edib deyir:

Yer-yemiş babında misali-cənnət,
Eşidibsən gendən özün də, əlbət.
Alma, şabalıtı yeyənə minnət,
Hər çadıra girsən bir tağar oldu.

Dımıq qoyun əti manəndi-şəkər,
Basdırma, qovurma hər şamü səhər;
Bala barmaq batırmayır gədələr,
İnək ayranından bimiqdar oldu.

Sərasər əhvalı şərh etdim sizə,
Qənimətü yəğma çıxıbdır dizə;
Tarının bir lütfü budur ki, bizə,
Nə bir yağış yağdı, nə də qar oldu.



Bu "Müqəddimə"də lətifəli şeir Qarabağ atlılarının bir parasının haqqında yazdığı sözlərdir ki, qoçaqlar döyüş və davaya çəndan həris olmayıb və ad-san qazanmaq fikrinə düşməyib, əsnayi-cəngdə ancaq öz canlarının qeydinə qalıblar:

O ki, bizim atlılardan bir para
Vermişdi özünü püşti-divara,
Nə dəğdəğə çəkdi, nə düşdü dara,
Bir az yoldaşından intizar oldu.

Bu məktub və bundan başqa bir çoxları Adolf Berjenin məcmuəsinə daxil olmayıbdır.

Qasım bəyin əsrində universitetdə təhsil edən və darülfünunun tibb şö'bəsində mə'lumat kəsb edən təbiblər olmadığından, İrandan gələn və öz vətənimizdə nəşvü nüma tapan Əzrail ortaqları çox imiş. Şair bunların həcvində dostlarından birisinə yazır:

Mənə buyurmuşdun Qələyə gəlsin,
Yenə cuşə gəlib bəhri-iltifat.
Sənin mərhəmətin, mənim ixlasım
Mehri-münəvvər tək aləmə isbat.

Qalmışam aranda müddəti-mürur,
Təbiətə səfra eyləyibdir zur;
İstər idim olam azimü-hüzur,
Naxoşam, hərəkət eyləyib ixlat.

Bağır oğlu Məmməd, Məşədi Hacı,
Əliqulu, Müqim[441] sərimin tacı,
Hər mərizə eyləsələr əlacı,
Ehtiyatın görün, tez olur məmat.

Tiryək yedirirlər hər kim olsa diqq,
Heyzədən aldırar xuni-basəliq.
Yenə bu hal ilə o qövmi-zindiq –
Özlərin sanırlar Ərəstu, Bokrat[442].

Falicə verirlər qürsi-təbaşir,
Müstəsqayə abi-kasni-maşəir;
Mərizin mərəzi yə'ni çəkə dir,
Sahibin çaparlar üç qatü dörd qat.

Nüsxeyi-tibbdə "şeş" oxur "şiş"i,
Məlamətdən yoxdur qəmü təşvişi;
Təşxisi-mərəzdə həmin danişi
Budur ki, canı var, tərləsə mir'at.

Təbiəti-harrə xalis əngəbin,
Qabizə süfufü yəhuda darçin,
Bəlğəmi-mizacə tüxmi-xiyarin –
Münasib bilirlər daimül-övqat.

Mərizin üstünə yetişən məhəl,
Dərviş Kəlbi hazır olur əlbəəl,
Qədəmlərin guya katibi-əcəl
Yazıbdır baisi-mövtü münacat.

Fisqləri zahir manəndi-günəş,
Həq bilir sözümdə yoxdu qəllü qəş;
Yolları hər yerə düşsə, sayəvəş –
Yanlarınca gedər "əyyühəssəlat".

Gah görürsən bir-birilə tapışır,
Gah atlanıb hər tərəfə çapışır
Lə'nü tə'n bunlar ilə yapışır,
Necə Ali-Məhəmmədə səlavat.

Qələnin adamı yetdi yarıya,
Necə ki, qoyuna ac qurd darıya;
Az çəkər ki, məzar dəyər yarıya,
Bu növ ilə eyləsələr hərəkat.

Vilayətə salıbdılar şurü şeyn,
Şərbət tək içirlər dəmül-əxeveyn;
Bunların yanında qatili-Hüseyn
Zimmədən bəridir ruzi-ərəsat.

Bir kimsəyə ariz ola sədəmə,
Baxmazlar fəqirə, yoxsula, kəmə,
Qədəm götürməzlər həqqül-qədəmə,
Ya on tümən pul gərəkdir, ya bir at.

İmalədə yədi-beyzaləri var,
Həqq üçün bir ondan başları çıxar;
Mərəzi-digərdə, inanma, zinhar,
Vüqufları ola, heyhat, heyhat!..

Otuz il layəqəl gedib qoyuna,
Bilfel çobandı, baxsan boyuna;
Dağılmışda xub düşmüşük oyuna,
Yetən olmadımı əhli-kəramət.



Sən gör necə xərab olub zəmanə,
Çəmənli Cəfər də mərdü mərdanə,
O da təbib olub girib meydanə,
Çölün çəngəlindən yığıbdı qat-qat.

O ki, İsmailin saf azıb vazı,
Gahi yerdə qılar ölü namazı,
Gah tapıb özü tək bir annamazı
İşə qoyar xah türkü, xah tat.

Gərək bu cahandan eyləmək həzər,
Öz yerində deyil çünki xeyrü şər'.
Nə təbib, nə alim, Zakir, müxtəsər,
Axtarasan yoxdu bir niksifat.

Təsəllütü yoxdur "Töhfə"yə[443] əsla,
Bilməz nədir "Qarabadın"[444] mütləqa;
Ağızdan-ağıza öyrənib əmma
"Tibbi-Yusifi"dən bir neçə əbyat.

Zakirin əsrindən bu haladək az qalıbdır yüz sənə tamam olsun, amma, məətəəssüf, yenə də bizim biçarə "qara camaat" və avam xalq bu qisim tamahkar və avam təbiblərin çəngindən xilas olmayıblar. Bunlar əksər övqat mərəzi bilməkdə, yatalağı zatül-cənbdən təmyiz etməkdə aciz qalıb, bir mərəzin əlac və dərmanını başqasının haqqında iste'mal edirlər və yatalağı müsri mərəzlərdən hesab etməyib, mərizin qab-qacağını, rəxtixabını və yatacaq mənzilini ayırmırlar. Ol səbəbdən mərəz sağlara da sirayət edir.

Bu qisim avam və zülmkar təbiblərin haqqında həqir sabiqdə Bakıda nəşr olunan "İrşad" ruznaməsinin 1906-cı sənəsində çıxan 108-ci nömrəsində "Əcəlsiz ölənlərimiz" sərlövhəsi ilə uzun bir məqalə yazmışdıq. Haman məqalədə mərhum Zakirin burada dərc olunan əbyatından bir neçəsini yazıb, şərhi babında bunu da əlavə etmişdik ki, bizim mayeyi-həyatımız olan dəhat əhli indi də sahibsiz və qeydkeşsiz cəhalət aləmində mütəhəyyir və sərgərdan qalmaqdadırlar, sadəlikləri və avamlıqları ucundan hər qisim bəlalara düçar olmaqdadırlar.

Cümlə elm və mə'rifət kəsb etmişlərimizə borcdur ki, onların qeydinə qalıb, cəhl qaranlığından onları xilas etsinlər; nicatü səadətə çıxmaqlarına yol göstərsinlər. Vəli çox əfsus ki, darülfünunlarda təbabət elmini kəsb etmiş olan müsəlman təbiblərindən çox azı tapılar ki, kəndə getməyi özünə qəbul eləsin. Əksəri şəhərlərdə qulluq edirlər; o yerlərdə ki, onlarsız da təcrübəli və haziq təbiblər az deyil.

Qara camaatımız yenə irəliki kimi bilkülliyyə elmsiz və təcrübəsiz tat ilə türk əlindən – ki, əlhəqq əcəl saqiləridirlər, – badə nuş etməkdədirlər. Camaat pulu ilə ali məktəblərdə elm və bilik təhsil edənlərimizin müqəddəs borclarıdır ki, avam xalqın imdadına yetişsinlər və əcəlsiz fövt olmaqlarına mane olsunlar.

Bundan əlavə, gərəkdir əhli-qələmimiz təbabətə dair kitabçalar rusdan tərcümə edib və risalələr tərtib qılıb, tavanalı şəxslərin həmiyyəti ilə çap etdirsinlər və məccanən xalq içində intişar eləsinlər. Bizim zənnimizə görə, biməzmun komediyalar və məişətimizə əsla münasibəti olmayan kitabçalar yazmaqdan belə risalələr artıq faydalıdır. Belə kəndlərdə və müsəlman mərkəzlərində əczaxanalar və xəstəxanalar açmaq da himmət və mə'rifət sahiblərinin baş vəzifələrindəndir.

Zakirin şüğlü və sən'əti mülkədarlıq və maldarlıq olduğuna görə, övqatını özünə mütəəlliq Xıznıstan kəndində əkinçilər və köçərilər ilə bir yerdə keçirərmiş. Onlar ilə yaz və qış müaşirət və müamilət edib, bir havada, bir övza'i-mühit içrə dolanıb, özü dəxi bir növ tərəkəmələnmiş imiş. Onların ehtiyacını öz ehtiyacı və onların şadlığını öz şadlığı, onların qara gününü öz qara günü hesab edərmiş. Bu axır vaxta kimi bizim çöl bəylərinin əksəri bu növ güzəran edirlərdi. İndi bəylər və mülkədarlar başqa sayaqda başlayıblar dolanmağı. Öz halal kəsblərini və gözəl şüğüllərini darğalara və nökərlərə vagüzar edib və kəndlərini buraxıb şəhərə köçüblər; günlərini bazarlarda, meydanlarda, qəhvəxanalarda və klublarda boş və bikar keçirməkdədirlər.

Bəs, Zakir çox müddət milləti arasında yaşadığı üçün onun dilini dəxi mükəmməl surətdə bilirmiş və hər nə ki, hissiyyat və xəyalatından vücuda gəlibdir, təmamisini öz camaatının məişətindən götürübdür. Məsələn, şair ömrünün sinnə dolmuş çağında qocalığından şikayət edib, gözəl günlərinin bihudə sərf olmasından və daim şər'ü şur ilə keçməsindən təəssüf və nalə edib deyir:

Əfsus, günüm keçdi şər'ü şur ilə daim,
Gəldi dəmi-rehlət.
Tutmuş hələ dünyanı könül hirs ilə qaim,
Tədbirinə lə'nət!
Getdi hamı həmdərdi-xoşəxlaqü mülayim,
Qaldım məni-həsrət.
Çöldə Əli bəy, Təhdilidir Qələdə tayım,
Onlar da kəmülfət.
Çoxdur ədədi fövt olanın, hansını sayım?
Məcmuuna rəhmət.



Şairin xoş əxlaq və mülayim dostları bəqa gülşənində seyr etdikləri halda, özü dünyayi-dunu hirsü təmah ilə bərk tutubdur, ondan əsla əl götürmək istəmir. Dünyaya bu qədər aludə olmağı və onun yaxasından iki əl ilə yapışmağı şair böyük bir qüsur və nəfsin dəğdəğəsindən zühura gələn alçaq bir sifət bilib, onun tədbirinə lə'nət oxuyur.

Şair çox qocalıbdır. Ağzında otuz iki dişdən ancaq üç-dördü qalıbdır, onlar da laxlayır və bir-birini tutmaz ki, bir şey çeynəyib uda bilsin. Hətta öz arvadı da ona məhəlgüzar olmur:

Müddətdi düşüb diki-dərunum saf əməldən,
Əfsürdəçirağəm.
Bir loğmadan əfzun yeməzəm xövfü xələldən,
Bu barədə dağəm.
Birəğbət olub xahişim ət'ami-gözəldən,
Guya ki, naçağəm.
Fərq etməz idim bir zaman ayranı əsəldən,
İndi bu sayağəm.
Vay oldu ki, bir gün tükənə qənd ilə çayım,
Alır məni xiffət.

Çün qocaların, xüsusən, Zakirin əsrində zindəganlıq edən laqeyd və tənpərvər ağaların və mülkədarların ümdə fikir və xəyalları yemək və içmək olub, ol səbəbə şair münasibi-hal deyir:

Batmış şikəmin adlı bizi heyvərə fikri,
Doymalı deyil bu.
Qış aş, plov dəğdəğəsi, yaz kərə fikri
Bağrımız edər su.
Köç vaxtı ulaq kəmliyi, dağü dərə fikri,
Olmaz belə qiyqu.
Ta çənd otaq dərdisəri, pəncərə fikri,
Əndişeyi-bahu.
Yegdir ki, ləhəd küncü ola köşkü sərayım,
Sərmənzili-xəlvət.

Çöl bəylərinin və ümumən kənd əhlinin işləri artıcaq çətinə düşür qış fəsli bərk gələndə. Çovqunlu və qarlı ruzigar əsəndə bir yandan azuqə azalır, bir yandan ot-ələf tükənib çarpa arıq düşür, bir yandan da odun tapılmır. Hər adam örkən və çatı götürüb, odun dalısınca kola-kosa tərəf yüyürürlər. Bir növ şuriş və vəlvələ düşür ki, guya qiyamət bərpa olubdur.

Çöl xalqının belə pərişan halını şair ziyadə məharət ilə nəzmə çəkir, sanki onlar göz önündə durublar. Şairin öz kəlamına rücu edək:

Çöl xəlqinə bir il gələ gər qış gələ qatı,
Lağər düşə çarpa,
Yeksər qarışar bir-birinə türk ilə tatı,
Aşuradı guya.
Hər kəs götürür dəstinə bir örkənü çatı,
Hiyzüm qıla peyda.
Gözlər ki, bitib ot, kökələ camışü atı,
Arxayın olub ta.
Gəh-gəh deyə, ey ilxıçı, qırxıldımı dayım?
Nə eyş, nə rahət?

Qasım bəyin başqa qisim əş'arü asarına gələndə kəmali-cür'ət ilə demək olar ki, bunların dəxi təmamisi eybü nöqsandan xali, ziyadə mövzun və həqiqi hissiyyatdan nəş'ət etmiş kəlamlardır. Onlardan nümunə olaraq bir neçəsi burada dərc olunur.

## MÜXƏMMƏSİ-ZAKİR

Görün bu çərxi-dunpərvər nə babət ruzigar eylər,
Çəkib ağuşuna hər nakəsi kamil əyar eylər,
Xilaf əhlin sərəfraz, əhli-sidqi xaksar eylər,
Mənim könlüm rəqibin tə'nəsindən çox qübar eylər,
Açıb dərdi-dili-pünhani xəlqə aşikar eylər.

Açıb ibrət gözilə bir nəzər qılsan bu dövranə,
Hücumi-mə'siyət rəxnə salıbdır mülki-imanə,
Olub ifritəpərvərlik dəxi yaği Süleymanə,
Pərilər taət eylər sidq ilə quli-biyabanə,
Görən fərzanəvü aqil necə səbrü qərar eylər.

Olubdur xəlq zalım, qəlb xain, qəflət əyyami,
Edirlər fisq zahir, kimsə çəkməz xövfi-bədnami,
Deyərlər qaziyə böhtan, bəzərlər şeyxülislami,
Soran yoxdur münəccimdən: nədir bu əmrin əncami –
Ki, hər mahi-məhərrəmdə bular bir səngsar eylər?

Oturmuş makiyan indi xorusun xanədanında,
Şükuhi-səltənət etmiş dəxi xan xanimanında,
Qərəz, bir xarü xəscə sayə yoxdur asitanında,
Qəza bu növ ilə şahbazı axır aşiyanında –
Salıb dami-bəlayə, aşiyanın tar-mar eylər.

İlahi, görməsin gözlər bu əhvalı ki, mən gördüm!
Süleyman barigahın payimali-Əhriman gördüm,
Mə'valilər müsəllasın kinişti-bərhimən gördüm,



Nişiməngahi-tərlanda, xudavəndə, dünən gördüm –
Yığılmış bir neçə zağü zəğən hər yan şikar eylər.

Dönüb vəzi-zəmanə, fərq edən yox ziştü zibani,
Seçən yoxdur müsəlmandan yəhudi kəbrü tərsani.
Zühur et, ey şəriət təxtinin şayəstə sultani,
Götür bürğə cəmalından, münəvvər eylə dünyani,
Qalıb zülmətdə aləm, göz yolunda intizar eylər.

Səmumi-sərsəri-dövran pozubdur bağ növrağın,
Çəməndə dağıdıb bərqi-həvadis səbzə yığnağın,
Edib viranə takın bağ içində zərnişan tağın,
Gülün fərş eyləyib badi-xəzan səhrayə övrağın,
Görüb biçarə bülbül arizuyi-novbəhar eylər.

Tərəhhüm görmədim munda mən ol bimehr canandan,
Dəyəndə sinəmə yüz min xədəngü tir müjgandan,
Pərivəşlər məgər sormaz xəbər hali-pərişandan,
Görünməz xiyməyi-Leyli, köçüb getmiş biyabandan,
Qalıb Məcnuni-sərgəştə, qan ağlar, ahü zar eylər.

Təriqi-eşqdə mən olmuşam Fərhadə həmpəhlu,
Deyil vaqif mənim halımdan ol Şirin-rəhi-bədxu,
Rəqibi-bimürüvvətdən, bilir həq, çəkməzəm qayğu,
Deyirlər əhli-eşqə cövr olur, əğyardəndir bu,
Yalandır, aşiqə hər zülm olursa, bil ki, yar eylər.

Təğafül bilməzəm mən xubrulərdə nə adətdir –
Ki, çəkməzlər qəmi-üşşağı bir dəm, bu nə söhbətdir?
Qərəz, bir guşeyi-çeşm ilə baxmaq eyni-dövlətdir,
Bəlalı başlar üzrə sayə salmaq çox səadətdir,
Məhəbbət görsə aşiq, yar yolunda can nisar eylər.

Həzər qılsın görən kəslər, bu nə məğşuş dövrandır,
Bu dövranda onunçün kim, gədavü şah yeksandır,
Əgər künci-fəraqət istəsən, bir gənci-pünhandır,
Şikəstə Zakirəm, könlüm mərizi-dərdi-hicrandır,
Əlaci-dərdimi axır mənim ol həştü çar eylər.

Qasım bəyin bu kəlamı Molla Pənah Vaqifin "Mən cahan mülkündə mütləq doğru halət görmədim" şe'rilə başlanın müxəmməsinə mənən çox oxşayır. Hər iki şair ruzigari-kəcrəftarın və dövrani-dünpərvərin qəddarənə gərdişindən ahü nalə edib, öz əsrlərinin keyfiyyəti-halını bəyan qılırlar. Hər iki şair batilin haqqa, əyrinin doğruya, mə'siyət və şərarətin zöhdü təqvayə, zülmati-cəhalətin nuri-hidayətə, büxl və həsədin mürüvvət və ədalətə, çirkinliyin hüsn və lətafətə qalib gəlməsini müşahidə və müayinə

edib, alitəbləri dənilər və şəyyadlar pəncəsində dəstgir məğlub və pərişanhal görürlər. Sahibi-şəriətə və hadiyi-hidayətə üz çöndərib, ondan kömək diləyirlər.

Vaqif deyir:

Ya imam-əl-ins vəl-cinnü şəhənşahi-ümur,
Getdi din əldən, bu gündən böylə sən eylə zühur,
Qoyma kim, şeytani-məl'un eyləyə imanə zur,
Şöleyi-hüsnünlə bəxş et tazədən dünyayə nur –
Kim, şəriət məşəlində istiqamət görmədim.

Zakir deyir:

Dönüb vəzi-zəmanə, fərq edən yox ziştü zibanı,
Seçən yoxdur müsəlmandan yəhudi kəbrü tərsanı.
Zühur et, ey şəriət təxtinin şayəstə sultanı,
Götür bürqə cəmalından, münəvvər eylə dünyanı,
Qalıb zülmətdə aləm, göz yolunda intizar eylər.

Vaqifin şikayəti məhz Adəm atanın çiy süd ilə pərvəriş tapmış övladındandır. Zəmanə onları bietibar və bimürüvvəm edibdir. Xeyir əvəzinə şər', yaxşılıq əvəzinə pislik, düzlük yerinə əyrilik etməyi özlərinə şüar ediblər. Vaqif dünyayi-dundan sair məxluqa yetişən afət və bəladan bir növ im'ani-nəzər qılıbdır. Amma Zakir öz fənə halı ilə məən gülüstanın solmuş bağ və bağçasına və səhra-çəmənin pozğun halına və pərişan övza'ına diqqət yetirib, öz hüzn və ələminə onları da şərik edir. Necə ki, şair hali-dilini xeyrü sürura təbdil etmək üçün "şəriət təxtinin şayəstə sultanı"nı arzu edir, habelə də gülüstan və çəmən qəzəlnəvası bülbülün dilindən bahari-aləmaranın tez yetişməsini ilhahü təmənna eləyir. Əzbəs ki, səmumi-sərsəri-dövran bağü səhranın nizamü növrağını pozubdur.

Səmumi-sərsəri-dövran pozubdur bağ növrağın,
Çəməndə dağıdıb bərqi-həvadis səbzə yığnağın,
Edib viranə təkın bağ içində zərnişan tağın,
Gülün fərş eyləyib badi-xəzan səhrayə övrağın,
Görüb biçarə bülbül ərizuyi-novbahar eylər.

Yenə müxəmməsi-Zakir:

Nə xoşdur dövri-ruyində müsəlsəl ol qara zülfün,
Sərasər hər biri üşşaqə bir dami-bəla zülfün,
İki şəhmarə bənzər gənci-hüsnündə düta zülfün,
Bulanır hər tərəf, qovalar məni əfinümə zülfün,
Nədəndir, bilməzəm, əfsunə gəlməz mütləqa zülfün.



Tutubdur səhni-duşində arasın həm solü sağın,
Enib payində övsafın edər təqrir yaylağın,
Pərişan etmisən cəmiyyətin düzmək bu yığnağın,
Əcəbdirmi çəkəndə rövşən eylər çeşmin üşşaqın,
Dəmadəm xaki-payindən götürmüş tutiya zülfün.

Sürahi gərdənin, əmma miyanın özgə babətdir,
Qiyamətdir qədin, əmma bəsi biistiqamətdir,
Həzər qıl bədnəzərdən, gəzmə biпərva, əmanətdir,
Soruşdum şanədən: zülfə pərişanlıq nə adətdir?
Dedi ki, xoş bilir məndən işin badi-səba zülfün.

Uca şanlılara, ey dil, yaraşır kəmtərin olmaq,
Səadətdir həmişə sahibi-caha qərin olmaq,
Deyil, söyləşmək ilə mümkün əsla nazənin olmaq,
Bilib üftadəlikdəndir cahanda sərnişin olmaq,
Budur vəchi düşər pabusuna misli-gəda zülfün.

Nəsimi-sübhdən rüxsari-al üzrə siyəh tellər
Sanasan pər açıb, zağü zəğən gülşəndə seyr eylər,
Özü pür-piç, ucları dümi-əqrəb kimi çənbər,
Uzandıqca uzanır ömrü, yoxsa, ey pəripeykər,
İçib lə'li-ləbindən Xızrvəş maül-bəqa zülfün?

Dolanam başına şamü səhər manəndi-pərvanə,
Deməzsən bir görün necə keçir əhvali-divanə,
Bu qədr cövrü zülm insan edərmi, zalım, insanə?
Nə müddətdir düşübdür dəlvi-dil çahi-zənəxdanə,
Nola çəngal ilə bir dəm çəkə müşgülgüşa zülfün.

Kəmali-hüsndür gisuyi-mişkin səfheyi-rudə,
Ziyası əncümün əfzun olur şami-qaranqudə,
Su içrə bir siyəhgun marə bənzər əksi güzgüdə,
Cəfasından deyil hindü həbəş bir ləhzə asudə,
Xətasından deyil eymən dəxi Çinü Xəta zülfün.

Cahan içrə sənin tək dilbəri-xoşxəttü xal olmaz,
Səmənbu, mahru, şəkkərşikən, şirinməqal olmaz,
Süxənçin olmayan aləmdə, mütləq, payimal olmaz,
Arasında belin mucə kəmərlə qilü qal olmaz,
Miyanzənlik təriqin ortaya ta salmaya zülfün.

Şikəstə Zakirəm, nəsri bilirdim cümlədən əfzun,
Düşəndə rişteyi-nəzmə çəkərdim bəs düri-məknun,
Künun sövdayi-eşqi bir məhin etmiş məni Məcnun,
Dəxi məndən təvəqqe etməsin əş'ari-xoşməzmun,
Edər əhvalımı dərhəm qəmi sübhü məsa zülfün.

Müəşşərat növ'i kəlamından birisinin iki əvvəlinci və bir axırıncı bəndlərini burada yazmaqla iktifa edirik. Ortadakı iki bəndləri bə'zi səbəblərə görə buraxırıq. Şair özü də əndazədən çıxmağa müqirr olub deyir:

Dilbərin seyrə sıxmaq babında:

Küstaxlıq oldu, mənə düşməzdi bu əsla,
Endim çox aşağə...

Zakirin müəşşəri-müstəzad kəlamı:

Əzm etdi səhər naz ilən ol sərvi-dilara
Seyr etməyə bağə,
Ta yetdi xəbər, əhli-çəmən oldu mühəyya
Yeksər bu sorağə.
Şəbnəm birlə yüz göz açıb hər çiçək əmda
Keçdi solu sağə.
Ruxsarına əvvəlcə edim deyü təmaşa
Gül çıxdı budağə.
Payinə nisar etmək üçün laleyi-həmra
Dürr tökdü tabağə.
Sərməst gözün görgəc özün nərgisi-şəhla
Bənzətdi naçağə.
Pişvazına şümşadü sənubər, dəxi tuba
Dik durdu ayağə.
Tutdular o şahi-şərəfin cümlə sərapa
Yolunu çirağə.
Hər birisi bir töhfə ilə yeksərü yekca
Daşlandı qabağə.
Kimdir ki, nisar eyləməyə varını aya,
Ha böylə qonağə?!

Xacə, belə sövda, belə bazar ələ düşməz,
Fərş eylə dükanı.
Bu sayiqi-sadə, meyi-gülnar ələ düşməz
Novruz zamanı.
Həm mütribü ney, çəngü dəf'ü tar ələ düşməz,
Sür eyşi-cəvanı.
Çün dövr müxalifdi digər yar ələ düşməz,
Çaldır aşuranı.
Ver şüğlünü Şəhnazə ki, zinhar ələ düşməz,
Çək övcə sədanı –
Dügahü Segah, iç meyi, təkrar ələ düşməz
Gərm eylə həvanı.
Ahəngi-səfabəxşü xoşətvar ələ düşməz,
Çün əhli-İranı –



Axtarmaq ilə mövsümi-gülzar ələ düşməz
Azərbaycanı.
Hicazə, Nişaburə onu eyləmə həmta,
Həm mülki-İraqə.

Zakir, tələbi-rif'ət ilə olma cigərxun,
Ver halına təğyir.
Hər vəqt qəmi-dəhr səni etsə digərgun,
Aşüftəvü dilgir,
İç saqiyi-gülçöhrə əlindən meyi-gülgun,
Heç eyləmə təqsir.
Bir vasitədir dəf'i-qəmi-dəhrə bu mə'cun,
Lazımdımı təqrir?
Ol vəchdən eylərlər ona rəğbəti-əfzun,
Həm növrəsü, həm pir –
Kim, birdir onun bəzmi ara müflisü Qarun,
Nə fərq, nə tövfir.
Gördüm yazılıbdır qədəh üstündə bu məzmun –
Kim, badədir iksir.
Feyzindən olur zar gəda, sahibi-milyon,
Həm şahi-cahangir.
Gər cəm oluban eyləyə Loğmanü Fəlatun –
Yüz fikr ilə tədbir,
Bir çarə meyi-nabdən özgə dəxi qət'a –
Yox dərdi-fəraqə.

Bu müəşşəri-müstəzadında Zakir muğamatların bir çoxunu cinas səbkində zikr qılıbdır. Bu qisim şeir deməkdə onun artıq məharəti var imiş. Onun təcnislərindən bir neçəsi aşağıda yazılacaqdır.

Qəzəliyyata gəldikdə, demək olar ki, Qövsidən sonra Zaqafqaziya şüərası arasında Zakirdən gözəl və xoşməzmun qəzəl yazanı olmayıbdır. Qəzəl yazmaqda mərhumun yədi-beyzası var imiş. Onlardan bir neçəsini oxucuların nəzəri-mərhəmətlərinə təqdim edirik ki, özləri mütaliə buyurub və qeyrilərin bu növ kəlamları ilə tutuşdurub, təşxis və təmyiz etsinlər.

Qəzəli-Zakir:

Hüsni-nigar əhli-nəzər afitabıdır,
Qoymaz, nə sud, görməyə, gisu səhabıdır.

Təbxi-qəza üçün müjəmi yandırın – dedim,
Təbbaxi-yar tulladı kim, çubi-abıdır.

Badi-səhərlə nikhəti-zülf üstə şanənin –
Ömri-dirazdır arada inqilabıdır.

Pamal olursan, etmə sərazir, çox dedim,
Tutmadı zülf pəndimi, çəksin əzabıdır.

Qəmzən xədənginə çəkib üşşaq bağrını,
Guya həlal mürci-şikarı kəbabıdır.

Ləb şəhdi-əngəbin, xəti-novdur sipahi-mur,
Qəd sərvi-bağ, kakili-mişkin qürabıdır.

Püstani-yardır görünən çaki-sinədən,
Ya cənnət içrə çeşmeyi-Kövsər hübabıdır?

Dün sübh şanə səxt dəyib tari-zülfünə,
Dildə hənuz şol əsərin piç-tabıdır.

Buyi-vəfa verir, necə mən ondan əl çəkim?
Gülgun sirişk bərgi-məhəbbət gülabıdır.

Gər qətli-am istəsə müjgani-çeşmi-məst,
Qövsi-qüzeh qaşın ona tiri-şəhabıdır.

Gül dəftərin tökübdü səba, zahirən bu gün
Biçarə bülbülün yenə baqi hesabıdır.

Övraqi-lə'lin açmağa etdim həvəs, dedi:
Bilməzsən onu, elmi-müəmma kitabıdır.

Saqi, şərabi-nabını get qeyrə ərz qıl!
Zakir o şux nərgisi-məstin xərabıdır.

Qəzəli-Zakir:

Dün hökm qıldı qətlimə ol şəh itab ilə,
Şad eylədi gədasını bu xoş cəvab ilə.

Olsun qara günü görəlim qanlı qəmzənin,
Öldürmədi məni, yenə qoydu əzab ilə.

Zülfi siyahlər qəmini şam ta səhər –
Ömri-dirazdır çəkirəm piçü tab ilə.

Gündüz üzün qəmi, gecə zülfün keşakeşi,
Asayişim nə xurd ilə hasil, nə xab ilə.

Öldürməsən, nə sud mənə bərqi-tiğdən,
Mümkün deyil ki, sir ola təşnə sirab ilə.



Ol gül üzardə ərəqin xoş səfası var,
Türfə budur ki, saziş edər atəş ab ilə.

Zakir o şux nərgisi-məstin xərabıdır,
Ha böylə sərxoş olmaq olurmu şərab ilə?

* * *

Cahan içrə mənim bir səngdil, bimehr mahım var,
Büti-peymanşikən, bir şuxçeşmi-kəcnigahım var.

Yolunda dürrlər sərf eləyibdir mərdümi-çeşmim,
Olurmu göz-gözə danmaq, iki adil küvahım var.

Nigarım zülf tək qoymaz düşəm pabusuna bir dəm,
Pərişan halım ondandır, əcəb bəxti-siyahım var!

Mənə mehrabu mənbər vəsfini təkrar edən vaiz
Utanmazmı, baxıb görsə bu surət qibləgahım var?

Könül şəhrin çapıb yəğmaladı qəm ləşkəri, Zakir,
Neçün imdad qılmaz, bəs deyirdin padşahım var?

* * *

Dün eylədim nəzarə bəsi lalə dağına,
Gəlməz o dağ daği-dərunum ayağına.

Gəlmişdi bəhsə teyyi-mərahil edib günəş,
Qoydu rüxün yetən kimi eynin bucağına.

Bir pakzadi-nadirəsən, almayıb hənuz
Sən kimi tifli madəri-giti qucağına.

Ver guşmal möhrə ki, çox xudnümalənir,
Əzbəs ki, bir pul adı dəyibdir qulağına.

Əzmi-çəmən qılıb bu gün ol sərv, qorxuram
Bərgi-hənavü gül dolaşa əl-ayağına.

Ömri-dirazdır çəkirəm zülf rəncəsin,
Bir tari-muyi keçmədi könlüm darağına.

Əksi-ləbin səadətini bulmasaydı mey,
Meyl eyləməzdi hiç kəs ol qan çanağına.

Versin, nə növ hadisə üz versə Zakirə,
Müşküldü səbr yari-əzizin fərağına.

* * *

Can cilvələnir qaməti-mövzunu görəndə,
Dil tazələnir arizi-dilcunu görəndə.

Zənciri-cünunə birə yüz rəğbətim artar,
Ruxsarı üzə zülfi-pürəfsunu görəndə.

Pürpiç oluram hər dəm oda düşmüş ilan tək
Ol arizi-gülnardə gisunu görəndə.

Dağıldı xiridari-qəmi-eşqin olanlar,
Bu mərdümi-çeşmim tökən altunu görəndə.

Gəlmişdim edəm mərdümi-çeşminlə müdara,
Bildim ki, düzəlməz bu iş əbrunu görəndə.

Xunxarəliyi eyb deyil nərgisi-məstin,
Hər kim ola, qaynar qanı gülgunu görəndə.

Ey əhli-hünər, cəm deyil Zakir həvası,
Eyb eyləmə şe'rindəki məzmunu görəndə.

* * *

Fəsli-bahar gəldi, könül, künci-bağ tut.
Möhnət bizi ayaqladı, bir dəm əyağ tut.

Təsbih tarını neçə gün alma dəstinə,
Dəsti-lətifi-saqiyi-simin sağ tut.

Tök cami-zərnigarə şəfəqgun badəni,
Yə'ni fəraq şamına rövşən çirağ tut.

Zar eyləmişdi xalqı fəğanü nəvalərin,
Bir gəz özün də nayü nəvayə qulaq tut.

Öz adətincə hər kəsə versən şərabi-nab,
Növbət mənə yetəndə, əzizim, çanağ tut.

Çək yanına təmamiyi-təqvavü taəti,
Şəbanın axirinəcən bizdən qıraq tut.

Zakir, köç eylə, mənzili-məqsudə vasil ol,
Dünyanı bir ribat, özünü bir qonaq tut.

Zakirin vəsfi-dilbər və mədhi-gözəl babında yazdığı mürəbbeat və qafiyələr Molla Pənah Vaqifin əş'arı kimi açıq və sadə dildə yazılmış,



təbii hissiyyatdan və dəruni zövqdən vücuda gəlmiş kəlamlardır. Onlardan bir neçəsi nümunə üçün aşağıda yazılır.

Qarabağ hakimi Mehdiqulu xanın kərimeyi-aliyəsi Xurşidbanu Bəyimin naxoşluğu halında yazdığı kəlam:

Ey bürci-səltənət mahi-ənvəri,
Düşməyəsən görüm ziyadən səni!
Gecə-gündüz həqdən budur diləyim
Hifz eləsin yaman bəladən səni!

Sipehri-bərinin hilalı sənsən,
Şərafətdə mələk misalı sənsən,
Gülşəni-Xəlilin nihalı sənsən,
Barvər istərəm xudadən səni.

Məsihi çıxardan övci-ələyə,
Salan üftadələr başına sayə,
Yetmişdə İshaqı verən Sarayə,
Qurtarsın bu rəncü inadən səni.

Bəstəri-möhnətdə bixürdü bixab,
Kimdir, aya, razı çəkəsən əzab,
Ol saqiyi-Kövsər eyləsin sirab,
Əzizim, daruyi-şəfadən səni.

Çubi-Çini nədir, qibləsən, nəsən,
Təəccüb eylərəm bu əhvalə mən;
Dəstgirin olsan Hüseynü Həsən,
Fərağət olasan cəfadən səni.

Səqfi-sərayını, ey güli-novrəs,
Həddi nədir edə nişimən məgəs?
Tərcih verə gərək aqil olan kəs
İsmətdə yüz huriliqədən səni.

Tikilən evlərə atandır səbəb,
Payəndazın olsa canlar nə əcəb!
Cami-bəzmi-eyşin daim ləbaləb,
Qalmayasan zövqü-səfadən səni!

Bu nə keyfiyyətdir, bu nə macəra,
Rə'yincə dolanmaz təqdiri-qəza?
Pədəri-mərhumun hər sübhü məsa
Günilərdi badi-səbadan səni.

Şikəstə Zakirə veribsiz əmək,
Əmək bilməyəni kor etsin nəmək!
Necə ki, baqidir həyatı, gərək
Unutmaya xeyir-duadən səni.

Bu kəlamdan anlaşılır ki, şairin Xurşidbanuya artıq ixlas və iradəti var imiş ki, belə xoşməzmun və gözəl şeirlər ilə ol səltənət bürcünün mahi-münəvvərini tə'rif və tövsif qılıbdır. Xurşidbanu bəyim isə həqiqətdə nəcabət və hüsni-məlahətdən maəda elmə və kəmalı ilə dəxi öz zamanının bərgüzidəsi olub, hər qisim tə'rifü təhsinə layiq bir vücud idi və özünün də təb'i-şe'riyyəsi var idi. Bir çox gözəl qəzəlləri vardır ki, öz mövqeyində onlardan bəhs olunacaqdır.

Zəmanə Zakirin yarını pərişan və digərgun etməyi barəsində:

Dün düşdü gülzarım yarın kuyinə,
Dərdü qəm çevrəsin alıbdı gördüm.
Soruşdum əhvalın, cavab vermədi,
Gözləri yaş ilə dolubdu gördüm.

Ahü zar çəkməkdən yox olub varı,
Ayinəsin tutmuş möhnət qubarı;
Əyyami-xəzana dönüb baharı,
Saralıb gül rəngi, solubdu gördüm.

Kamana dönübdü qaməti-mövzun,
Əhvalını fələk edib digərgun;
Gecə-gündüz ağlamaqdan əşki-xun
Almas kiprikləri yolubdu gördüm.

Hanı ol mən görən əhmər yanaqlar,
Müsəlsəl giysular, nərmin buxaqlar?
Təravətdən düşüb qönçə dodaqlar,
Deyib-danışmaqdan qalıbdı gördüm.

Zakir, xarab olsun belə zəmanə,
Həmişə yaxşılıq verir yamanə;
Yar ilə qol-boyun gəzdiyim xanə –
Dağılıbdı, bərbad olubdu, gördüm.

Yarın fəraqü həsrətində yazdığı qafiyələr:

Qadir Allah bir də səbəb salaydı,
Bəyaz cəbinində tağı görəydim.
Sürtəydim üzümü gülgəz yanağə,
Siyah zülfü, tər buxağı görəydim.



Səs-səsə verəydi həzarə bülbül,
Düşəydi payinə bənəfşə, sünbül;
Xuraman-xuraman, əllərində gül
Gəzəydik hər tərəf, bağı görəydim.

Bu dövran dolanıb, zəmanə dönə,
Tarının kərəmi olaydı mənə;
Oturub səninlə dizbədiz yenə –
Deyib, gülüb, danışmağı görəydim.

Dərdü qəm çəkməkdən qan olub cigər,
Gətirən yox nazlı yardan bir xəbər;
O qədərə ölməyəydim, müxtəsər,
Yenə o gördüyüm çağı görəydim.

Zakirəm, çəkərəm cövrü cəfanı,
Yadlar ilə sürər zövqü səfanı;
Nə gərək sevəydim ol bivəfanı,
Nə də belə hicran dağı görəydim.

Vəsfi-dilbər babında yazılmış qafiyələr:

A ləbləri badə, ağzı piyalə,
Bir söz desəm olma bidəmağ, sana!
Dolanım başına, daha yaraşmaz
Yadlar ilə deyib-danışmaq sana.

Əcəb bihəyadır çərxi-kəcrəftar,
Hər ayda bir hilal eylər aşikar;
Şəksiz sənin ilə ədavəti var,
Onunçün göstərir qaş-qabaq sana.

Mədənisən fe'lin, nazü qəmzənin,
Bərabərin yoxdur aləmdə sənin.
Təhrik eyləməsə səba, qönçənin –
Ağzı nədir aça dil-dodaq sana?!

Cəvahir qolbaqlar bəyaz biləyi –
Gahi qucar, gahi eylər hənəyi;
Behiştin hurisi, göyün mələyi –
Yetişməz, yüz çala əl-ayaq, sana.

Zakirəm, eylədin əqlimi zail,
Olmaz belə surət, belə şəmayil;
Elə mən deyiləm hüsnünə mail,
Göz dikibdir tamam Qarabağ sana.

Təcnisi-Zakir:

Ömürlər sərf edib, canlar üzməmiş
Həmdəm olmaz, ey dil, oturan sana.
Mənzili-məqsudə yetmək istəyən
Həzrəti-Musa tək o Turan sana.

Cigər yandı hərarətdən yax arac,
Şirin canım qəm oduna yaxar ac;
Zülfün alır Hindü Çindən ya xərac,
Bəndeyi-fərmandır o Turan sana.

Sən ağasan, mənəm sənin öz gədən,
Dil mürğünə verə bilməz özgə dən;
Dəli könül, umub-küsmə özgədən,
Aləm bilir odur ot uran sana.

Uca dağlar dərdim ilə yar olmaz,
Bir sinəyə ox dəyməsə, yarılmaz;
Əbəs yerə cəfa çəkmə, yar olmaz –
Rəqib ilə durub-oturan sana.

Görməmişəm zülfün kimi tərlanı,
Xəstə cismim şəfa tapar tərlanı,
Zakir, qəsdin tutmaq isə tərlanı,
Çəkilib bir küncə otur, an sana.

Zakirin bu qisim təcnisləri az deyil. Biz ancaq birini yazmağa iktifa etdik. Təcnislərdə mə'na ləfzən gözəl mədhində tərtib olunmuş qafəyədirlər və lakin bə'zi ləfzlərin tələffüzündə bir-birinə şəbahəti və oxşayışı çox isə də, mə'naları ayrıdır və bir parası çox çətinlik ilə fəhm olunur. Bu cür kəlamlar şairin vətən dilini yaxşı bilməyinə şəhadət verir. Farsların Sə'disi və rusların Puşkini öz ana dillərinin ustadı və xaliqi mənzələsində olduğu kimi, Zakir də Azərbaycan türklərinin ustadi-lisanı olmağa haqlıdır. Dilimizin hər qisim üslub və şivəsinə və tərzi-mükaliməsinə bələd və aşina olduğu mütəəddid əsərlərindən görünür.

Əgərçi Zakirin nəsr ilə yazdığı bir əsər də olsa, biz təsadüf etmədik, vəli bə'zi şəxslərin rəvayətinə görə, Mirzə Fətəli Axundzadə tərtib qıldığı "Hacı Qara" komediyası Qasım bəyin nəticeyi-xəyalatıdır ki, nəsr ilə yazıb mirzeyi-mərhuma təqdim edibdir. O dəxi məzkur vaqeəni "Sərgüzəşti-mərdi-xəsis" ünvanı ilə indiki dona salıbdır. Bu qövlün haqq və batil olmasını ravinin öhdəsinə həvalə edirik[445]. Amma şair özü də nəsrə mahir olmasını bir kəlamında yad edir:



Şikəstə Zakirəm, nəsri bilirdim cümlədən əfzun,
Düşəndə rişteyi-nəzmə çəkərdim bəs düri-məknun,
Künun sövdayi-eşqi bir sayaq etmiş məni məğmun,
Dəxi məndən təvəqqe etməyin əş'ari-xoşməzmun,
Edər əhvalımı dərhəm qəmi sübhü məsa zülfün.

Başqa bir şe'rində Zakir öz təbiəti-şe'riyyəsinin vəsfində mə'şuqəsinə xitabən deyir:

Qoyma əğyarı səri-kuydə mə'va tutsun,
Aşiqi-sadiqini bülbüli-şeyda tutsun.
Zakirin kimi onun sövti'-qəzəlxanımı var?
Təb'i-mövzunumu var, şe'ri-nümayanımı var?
Eşidən incir onun tərzi-nəvasın görcək,
Şivəsi cəngü cədəl, naləvü əfğanı kələk.

Bununla belə Zakir sair şüəra kimi özünü çox öyüb tə'rif edən və təbiəti-şe'riyyəsi ilə iftixar edən şairlərdən deyil və biləks özünün üftadə və şikəstənəfs və əhli-təvazö olduğunu bir çox asarında zikr qılır və əksəriyyətən qəzəllərinin axırını "şikəstə Zakir" deməklə xətm edir:

Qəmü möhnət yükün aləmdə yoxdur çəkməyən, əmma –
Şikəstə Zakirin çərxi-fələk barın giran tutmuş.

Matəmi-seyidüş-şühəda və əhvalati-cansuzi-Kərbəla Zakirə, müttəqi və övladi-rəsul olduğu üçün, ziyadə tə'sir edərmiş. Bu cəhətə ol mərhum bir neçə növhələr bu qissəyə dair inşad qılıbdır. Onlardan birisini – ki, imam Hüseyn əleyhissəlamın həmşireyi-möhtərəməsi Zeynəbi-ələmpərvərin hali-pərişanına şamildir, – burada yazmağı lazım gördük.

Növheyi-Zakir:

Bu nə mahdır ki, həddən keçib iztirabi-Zeynəb?
Fələk üzrə mahü mehri elədi kəbab Zeynəb.

Yox ümidi-sübh hərgiz üsərayi-qeydi-şamə,
Nə yaman qirani-nəhsə düşüb afitabi-Zeynəb?

Dedim əndəlibi-zarə ki, nə ahü-zardır bu?
Dedi: bu fəğanə bais ələmi-cənabi-Zeynəb.

Dəxi lalədən soruşdum: niyə dağıdar olubsan?
Dedi: yandırıbdı bağrım o evi xərab Zeynəb.

Gülü, sünbülü çəməndə bu gün əşkbar gördüm,
Oları edib pərişan yəqin inqilabi-Zeynəb.

Bu bəlalı çöldə qönçə necə bürqəvar olsun –
Kim, əsir Şami-şumə gedə biniqab Zeynəb.

Özün etsə qərqeyi-xun, nə əcəb, o qətlgahda
Bədəni-Hüseyni göz-göz görə çün cənab Zeynəb.

Deyil özgə ğazə hacət bunun əllərin haman dəm
Dəmi-Qasim ilə eylər necə gör xizab Zeynəb.

Götür zivəri aradan ki, fəğani-şanə qoymaz
Səri-zülfi-novərusə verə piçü-tab Zeynəb.

Yetişibdi bir məqamə işi sərbürəhnə Şamə
Gedər, üz tutub məgəsdən eləyən hicab Zeynəb.

Nə rəvadı küçə-küçə gəzə rugüşadə, ey çərx,
O öz əksi-qamətindən edən ictinab Zeynəb?!

Nə həyadı səndə, ey göy, nə vəfadı səndə, ey yer,
Neçə gündü Kərbəlada nə xurü, nə xab Zeynəb.

Qəmu şiənin günahın sən özün bağışla, ya rəb,
Bedili-qəmini-Gülsüm, beruxi-pürabi-Zeynəb.

Dəxi Zakiri hesab et səgi-kuyi-Kərbəladən
Behəqi-fəğani-Zəhra, behəqi-əzabi-Zeynəb.

Bu vaxta kimi nə qədər ki, dəşti-Ninəvada vüqua gələn faciə barəsində və xüsusən əhli-beyti-seyyidüşşühədə haqqında növhələr deyilibsə, heç bir şairə bu zəriflikdə, bu dərəcədə nazik istiarə və şirin ibarələr ilə növhə demək müyəssər olmayıbdır. Əndəlibi-zarın ahü naləsini, lalənin dağdar olmasını, gülün və sünbülün çəməndə pərişan və əşkbar olmasını, qönçənin boynubükülü və ağzıyumulu qalmasını şair bir-bir sual edib, illət və baisini xəbər aldıqda hər birisi zəbani-hal ilə cavab verirlər ki, onları bu fəğana gətirən, belə dağdar qılan, pərişan hala salan Şamüşümə əsirvar, biniqab gedən cənab Zeynəbin qəm və ələmi olmuşdur.

Sonradan şair çərxi-cəfapişiyə xitab edib deyir: Nə rəvadır səndə, ey çərx, öz qamətinin əksindən hicab edən Zeynəb rugüşadə küçələrdə gəzsin? Zəmin və asimana üz tutub deyir:



Nə həyadı səndə, ey göy, nə vəfadı səndə, ey yer,
Neçə gündü Kərbəlada nə xurü nə xab Zeynəb.

Mərhum Qasım bəy Zakirin əsərlərindən və sərgüzəştindən bu qədər yazdığımıza burada iktifa edirik. Bununla belə çox arzu edirik o mərhumun dostu Axundzadə Mirzə Fətəliyə yazdığı divani-əş'arı çap oluna idi, haman səbkü qayda üzrə ki, şair onu tərtib qılıbdır. Məzkur divanda çox türfə qəzəllər və gözəl əsərlər vardır ki, cümləsini burada dərc etməyə imkan yoxdur. Zakirin divani-əş'arı ədəbiyyat xəzinəmizin ziqiymət bir daşı mənzələsində ola bilər.

# MİRZƏ FƏTƏLİ AXUNDZADƏ

Mərhum Mirzə Fətəlinin tərcümeyi-halına və mütəəddid əsərlərinə şüru' etməkdən müqəddəm onun məsqətürrəsi olan Nuxa şəhərinin və Şəki xanlığının keçmiş əhvalatına və əhalisinin dolanacağına dair filcümlə mə'lumat verməyi burada lazım gördük.

Nuxa şəhəri Qafqaz dağlarının cənubi-şərqində dağ ətəyində tə'mir olunmuş gözəl bir şəhərdir ki, sabiqdə Şəki xanlarının paytaxtı hesab olunurmuş. On səkkizinci əsri-miladın əvasitinə kimi indiki Nuxa bir qəryə halında imiş. Şəki xanlığı bina tutduqdan sonra Nuxa qəryəsi şəhərə mübəddəl olub, sürət ilə mə'mura və abadanlığa üz qoyur.

Şəki xanlığı baş tutubdur Nadir şahın Zaqafqaziyaya ləşkərkeşliyi zamanında – miladın 1734-1740-cı sənələrində. Şəki xanlarının zəmani-hökuməti yüz sənəyə kimi çəkibdir. Tarixi-məsihiyyənin 1819-cu sənəsində Fətəli xanın əyyami-hökumətində Şəki xanlığı bilkülliyyə Rus dövlətinin təhti-idarəsinə keçmişdir. Xanların əvəzinə onda rus çinovnikləri başlayır hökmranlıq etməyə.

1846-cı sənədə Nuxa şəhəri və Şəki mahalı əvvəlcə Şamaxı quberniyasının, sonradan Bakı və axırda Gəncə quberniyasının uyezdlərindən birisi hesab olunur. Bu halda Şəki mahalı Gəncə quberniyasının uyezdidir.

Arxeoqrafiçeski komissiyanın tərtib qıldığı aktlardan belə mə'lum olunur ki, Kovalenskinin Gürcüstana nazir tə'yin olunduğu vaxtda Şəki hakimi Məhəmmədhəsən xan imiş. Əgərçi Kovalenski onu müfəttin, hiyləgər və qəzəbnak xanlardan birisi hesab edir, vəli "Asari-Dağıstan"da təhrir olunduğuna binaən, xanın işbilən və aqibəti gözləyən müdəbbir bir vücud olduğu görünür[446]. Ağaməhəmməd şah onun əmlakını qəsb edib, gözlərini də çıxartdırmış idi. Ağaməhəmməd şahın qətlindən sonra yenə öz əmlakına sahiblənmiş idi. Gürcüstan ilə kor xanın əlaqəsi ancaq ticarət işlərində imiş. Zahirdə özünü Gürcüstana dost göstərərmiş isə də, batində onun dostluğuna və dəyanətinə etibar etməz imiş. Gürcüstan padşahlarını sevməz imiş. Məhəmmədhəsən xanın hərəmlərinin içində Tiflis knyazlarının birisinin qızı var imiş. O qızın atası bə'zi vaxtlar qızını görmək niyyəti ilə Nuxaya gəlib, orada vaqe olan siyasi işlərə dair bə'zi mə'lumat cəm edib apararmış.

Sabiqdə Şəki əhli öz xanlarına tabe və çox zirək tayfa imiş. Belə cəld və qoçaq camaatın vasitə və köməyi ilə Şəki xanı çox işlər görə bilərmiş. Çifayda, Məhəmmədhəsən xan gözsüz olduğuna görə, ancaq öz başını hər



tərəfdən hücum edən düşmənlərdən qorurmuş. Xani-mərhum vəfat edibdir miladın 1804-cü ilində.

Şəhərin içində şayani-diqqət tikililərdən Nuxa xanlarının sarayıdır ki, 1765-ci sənədə İran padşahlarının qəsri səbkində tə'mir olunubdur[447] və bundan əlavə şəhərin yuxarı səmtində çəkilmiş hasardır ki, bunun içində olan rus qoşunu sakin olmaq üçün kazarmalar tikilibdir. Hasar bir şəkildə tə'mir olunubdur ki, ona diqqət olunsa, "Məhəmməd" kəlməsi oxunar.

Şəhərin abü havası mötədil və səlamətdir. Çahar fəsli çox düz və hər fəsil öz iqtizasına müvafiq gəlib keçir. Şəhərin içində hər tərəfə sular və çeşmələr axır; hər evin özünə məxsus məhəlləsi və bağçası olduğundan şəhər yaşıl yarpaqlar ilə əhatə olunubdur.

Ətrafda olan dağ ətəyindən Nuxaya tamaşa etdikdə gözün qabağında gözəl bir mənzərə açılır, ruh təzələnir. Uca və böyük ağacların arasından minarələr dəxi göy tərəfinə sərkeşlik edib, guya zəbani-hal ilə onlara deyir: Nə qədər siz uca olsanız da, bizim rütbəmiz və hörmətimiz sizinkindən əladır; bizim başımızdan "Allahü əkbər" sədası, sizin üstünüzdən qarğa və dolaşalar qaqqıltısı eşidilir.

Şəki mahalında qədimdən barama qurdu saxlamaq adəti olmağa görə, burada Zaqafqaziyanın sair yerlərindən artıq barama becərilir və Nuxa tacirlərinin ümdə alış-verişi barama və ipək ilədir. Bu halda Nuxada işləyən ipək zavodlarının ədədi ildən-ilə artmaqdadır. Zavodların artmağı bir tərəfdən şəhərin fəqir-füqərasına məaş verirsə də, digər tərəfdən havanı pozğun və xarab edir və fəhlələrin bədənlərinə böyük zərər toxuyur. Biçarələr dar və rütubətli zavodlarda səhərdən axşamadək işləməkdən və mütəəffin hava ilə nəfəs almaqdan vaxtsız-vədəsiz solub, qisim-qisim mərəzlərə mübtəla olurlar.

Nuxa əhli sabiqdə nə qədər elmü mə'rifət və kəsbi-kəmal və sərvət cəhətincə geridə imişlərsə də, bu axır vaxtlarda qəflətdən ayılıb kəmali-ciddiyyət və sürət ilə irəli getməkdədirlər. Ülum və maarif təhsilinə canü dildən qurşanıblar.

Nuxa şəhərində hicrətin 1227-ci sənəsində – ki, miladın 1812-ci ili mütabiqdir, – bizim böyük və möhtərəm ədibimiz və əvvəlinci daramayazanımız və müqtədir mütəfəkkirimiz Mirzə Fətəli Axundzadə təvəllüd edibdir.

Mirzə Fətəlinin özü fars dilində yazdığı tərcümeyi-halı 1887-ci sənədə "Kəşkül" qəzetinin 43, 44, 45-ci nömrələrində dərc olunubdur. İşbu təfsilatı ən möhkəm və doğru bir mənbə hesab edib, burada onu eyni ilə türkə tərcümə edirik.

Tərcümeyi-halını Mirzə Fətəli bu sayaq başlayır: "Mənim atam Mirzə Məhəmmədtağı Hacı Əhmədin oğludur. Onun babaları fars tayfasındandır. Atam cavanlığında Təbriz həvalisində Xamnə qəsəbəsinin kəndxudası olubdur. Bu mənsəbdən mə'zul olandan sonra 1811-ci sənədə ticarət əzmi ilə Şəki vilayətinə gəlib, Nuxa şəhərində sakin olubdur və burada məşhur Axund Hacı Ələsgərin qardaşı qızını nikah edibdir. Bu mənkuhədən mən tarixi-məsihiyyənin 1812-ci sənəsində vücuda gəlmişəm.

Bu tarixdən iki il keçmiş Şəki vilayətinin hakimi Cəfərqulu xan vəfat edir. Bu səbəbə görə, İran qəribləri – ki, Cəfərqulu xanın himayəti altında zindəganlıq edirlərmiş, – onun vəfatından sonra öz vətənlərinə qayıtmaq qəsdinə düşürlər. Mənim atam da onun silkində arvadı və oğlu ilə Xamnə qəsəbəsinə müraciət edir. Dörd sənə burada qalandan sonra mənim anam atamın o biri arvadı ilə – ki, Xamnə əhlindən idi, – yola getmir və ərindən xahiş edir ki, onu mənimlə bir yerdə əmisi Axund Hacı Ələsgərin yanına göndərsin.

O əsnada Axund Hacı Ələsgər də Ərdəbildə Şəkinin sabiq hakimi Səlim xanın müsahibətində zindəganlıq edirmiş. Atam anamın xahişini qəbul edib, onu mənimlə əmisinin yanına göndərdi. Bu tarixdən mən atamdan ayrılıb bir də onu görmədim; anamın əmisinin yanında oldum – Horand qəryəsində ki, Qaradağ kəndlərindən birisidir.

Bir ildən sonra Axund Hacı Ələsgər tə'lim və tərbiyəmə şüru' edib, əvvəl Qur'anı mənə oxutdurdu. Qur'anı tamam edəndən sonra yavaş-yavaş fars və ərəb kitablarından başladı mənə dərs verməyi.

Axund Hacı Ələsgər mümtaz bir fazil idi və cəm'i ümumi-islamiyyədən, – xahi farsi olsun, – xahi ərəbi, – kamil ittila'ı var idi. Mərhum məni oğulluğa qəbul elədi və xalq arasında "Hacı Ələsgər oğlu" adı ilə məşhur oldum.

İki ildən sonra Horand qəryəsindən Ənkut qışlağına köçüb Vəlibəyli obasının içində sakin olduq. Bu vaxtlarda Mustafa xan Şirvani El-Ənkut qışlağında Şəkərli adlanan bir mahalda sakin olurdu. Bu gözəl xasiyyətli və nəcib xandan mənim ikinci atam* – yə'ni Axund Hacı Ələsgər xeyli himayətlər və vəsfdən ziyadə yaxşılıqlar gördü.

Bu əsnada – ki, tarixi-məsihiyyənin 1825-ci ili idi, – Axund Hacı Ələsgərin böyük qardaşı Məhəmmədhüseyn Şəki vilayətindən Ənkut mahalına gəlib, qardaşını, məni və anamı vətəni-mə'lufa apardı.

* Mərhum Mirzə hər yerdə Axund Hacı Ələsgəri "ikinci ata" ləqəbi ilə zikr edir.



Axund Hacı Ələsgər əvvəl ili Gəncə şəhərində məskənət elədi. Bir ildən sonra İran dövləti ilə rusların davası başlandı. O müsibətlər – ki, bu müharibədən Axund Hacı Ələsgərə və onun əyalına üz verdi və o bəlalar ki, ona düçar oldular və cəm'i əmvalü əcnasdən əlləri boş qaldı, – Gəncə qalasında tarac oldu və özləri müflis halına düşdülər, – onların cümləsini yazmağa yer yoxdur; kitab və dəftərə sığınmaz.

Əlqissə, İran qoşunu şikəst tapandan sonra Axund Hacı Ələsgər öz əyalı ilə Nuxa şəhərinə gəlib burada aram oldu və burada mənim tə'lim və tərbiyəmə kəmali-ehtimam ilə əmək sərf elədi; fars və ərəb dillərini özü mənə öyrətdi. Hətta məni Dağıstan ləzgilərinin tələbələri kimi fars və ərəb dillərində mükalimə etməyə mö'tad qıldı.

1832-ci ilin əvvəllərində Axund Hacı Ələsgərin Həcc səfəri lazım oldu. Özü ilə məni Gəncəyə gətirib Axund Molla Hüseyn adlı alim bir şəxsin yanında qoydu və ona tapşırdı ki, mənə məntiq və fiqh kitablarından dərs versin; özü azimi-Məkkə oldu.

Bu vaxta kimi mən fars və ərəb dillərini oxumaqdan başqa bir şey bilməzdim və dünyadan bixəbər idim və ikinci atamın muradı bu idi ki, mən ülumi-ədəbiyyəni təhsil edib ruhanilər silkinə daxil olam və mollalıq ilə başımı dolandıram. Amma başqa bir qəziyyə üz verdi və bu, niyyətimin fəsxinə bais oldu.

Əlqissə, ikinci atam Axund Hacı Ələsgər Həccdən qayıdandan sonra mən də Nuxaya gəldim və burada bir neçə vaxt ərəb dilində yazılmış kitabların, o cümlədən Şeyx Bəhai əleyhirrəhmənin "Xülasətül-hesab" adında yazılmış kitabının mütaliəsinə məşğul oldum. Bu əsnada Nuxa şəhərində rus məktəbi açıldı. İkinci atamın icazəsi ilə rus dilini öyrənmək üçün bu məktəbə girib, bir il burada tə'lim alıb çıxdım. Çünki yaşım artıq idi və bir ildən ziyadə burada oxumağa qadir deyil idim.

Bir ildən sonra 1834-cü tarixdə ikinci atam özü ilə bahəm məni götürüb Tiflisə apardı və burada sərdar Baron Rozenə[448] ərizə verib təvəqqe elədi ki, məni öz dəftərxanasında Şərq dillərinin mütərcimi mənsəbinə qəbul eləsin və rus yazıçılarından bir nəfəri mənim üçün köməkçi tə'yin etsin, ta ki, rus dilində biliyim artsın, qüvvət tapsın.

Bilmirəm hansı bir dil ilə bu sərdarın, yə'ni Baron Rozenin yaxşılıqlarını zikr edib şükrgüzarını yerinə yetirim. Mələk xisallı bu əmir ikinci atamın iltimasını fourən qəbul edib, iltifat və mərhəmətlərini mənim haqqımda zahir qıldı ki, təmamisini vəsf etməkdə acizəm.

Ol vaxtdan bu günə kimi mən Qafqaziya sərdarlarının nəzdində əlsineyi-Şərqiyyə mütərcimi olub, hər birindən ənva'i-iltifat və mərhə-

mətlər görmüşəm. Xüsusən, mütəvəffa general feldmarşal knyaz Vorontsovdan[449] razı və şakirəm ki, Baron Rozendən sonra mənim ikinci vəliyyün-neməm olubdur və bu əmiri-kardan və rövşənzəmirin iltifatının vasitəsilə məndə müsənniflik qabiliyyəti büruz edibdir.

Altı komediya – yə'ni təmsil türk-Azərbaycan dilində təlif edib Hüzuri-alilərinə təqdim etmişəm. Cümləsi məqbul və təhsin olunub; əvəzində bir çox ənamlara nail olmuşam. Təmsilatımı Tiflis teatrında – ki, onun da banisi knyaz Vorontsov olubdur, – səhneyi-tamaşaya qoydular[450]. Hüzzari-məclisdən çox tə'riflər və afərinlər eşitdim. Ondan sonra "Yusif şahın hekayəti"*ni yenə türk dilində yazdım. Bu yeddi təsniflərim rus dilinə tərcümə olunub çapa verildi və onların haqqında Berlin və Peterburq jurnallarında xeyli tə'rifnamələr yazılıbdır[451].

1857-ci tarixi-məsihiyyədə islam əlifbasının təğyiri babında bir kitabça fars dilində yazmışam. Məzkur əlifbanın təğyiri vacib və mühüm əmrlərdən olmağını xeyli mətin dəlillər vasitəsilə sübuta yetirmişəm.

1863-cü tarixdə Qafqaz canişini imperatorzadeyi-əfxəm veliki knyaz Mixail Nikolayeviçin[452] icazəsi ilə bu xəyalımı e'lan etmək üçün İstanbula azim oldum. Cəm'i səfər xərcimi veliki knyaz öz xəzinəsindən mərhəmət elədi və vəziri Krunzenştern İstanbulda olan rus səfirinə bir kağız yazdı ki, mənim mətləbimin əncama yetməyi üçün Osmanlı dövlətinin övliyavü ərkanından təvəqqe eləsin, ta ki, lazimeyi-təqviyət və müavinəti müzayiqə etməsinlər.

Əlifbanın təğyiri babında tərtib qıldığım kitabçanı rus elçisinin draqomanı müərrifliyi ilə sədri-əzəm Fuad paşanın[453] hüzuruna pişnəhad etdim və yazdığım təmsilatı və "Yusif şahın hekayəti"ni də nişan verdim. Kitabçamı sədri-əzəm həzrətlərinin əmri ilə Osmaniyyənin Cəmiyyəti-elmiyyəsində mülahizə edib hər bir xüsusda məqbul və müstəhsən gördülər və lakin icrasına icazə vermədilər. Bu səbəbə ki, kitabçada qərari-sabiqi üzrə hürüflar bir-birinə culaşır və kəlmələrin tərtibində çətinlik müşahidə olunur.

Bu irada cavabım bu oldu ki, belə olan surətdə lazımdır islam əlifbasını bilkülliyə tərk edib, avropalıların üsuli-xəttini götürmək və yazını soldan-sağa yazıb oxumaq və nöqtələri bilmərrə saqit etmək və hürufların şəklini latın hüruflarından intixab edib, təzə bir əlifba tərtib eləmək və

* "Yusif şahın hekayəti"ni – ki, "Aldanmış kəvakib" adı ilə məşhurdur, – ikinci dəfə olaraq türk dilindən rusa biz tərcümə edib "Вестник Кавказа" adlı jurnalın 5-ci nömrəsində 1901-ci sənədə çap etdirmişik. Bu hekayənin əvvəlki tərcüməsindən bizim xəbərimiz yoxdur və mütərcimi kim olubsa, o da bizə məlum deyil[454].



hürufi-müsəvvətəni hürufi-samitənin yanınca yazmaq. Xülasə, sillabi əlifbanı alfabiti əlifbaya mübəddəl etmək.

Həqirin bu rə'yini də İstanbul üləma və vüzərası öz fəhmü qanacaqlarına müvafiq görmədilər və qəbul etmədilər və orada ona İran vəziri-muxtarı Mirzə Hüseyn xanın[455] mənim barəmdə olan qədimi ədavəti büruz edib İstanbul vəzirlərinin ədəmi-müvafiqətinə səbəb oldu. Xülasə, məramü arzuma çatmayıb İstanbuldan geri qayıtdım. Əgərçi Osmaniyyə dövlətində müsəlman əlifbasının təğyiri babında etdiyim fikir və xəyal nəticə vermədi və qəbula keçmədi, amma bu zəhmətin əvəzində bəndəyə "Məcidiyyə" nişanı fərmani-təhsin ilə ənam olundu. Mirzə Hüseyn xandan İstanbulda xeyli mərarət və küdurətlər çəkdim ki, onların hamısını zikr etsəm, başağrısı olar. Müşarileyh sabiqdə Tiflis şəhərində öz dövlətinin konsulu idi və mə'lum oldu ki, batində mənimlə böyük ədavəti var imiş. Vəli onun ədavətindən mən qafil imişəm və onu özümə dost hesab edib evində mənzil etdim. Axırda ədavətini büruz edib, məni cəm'i Osmaniyyə vəzirlərinin nəzərində islam dininin və müsəlman dövlətlərinin bədxahı nişan verdi.

Necə ki, mə'lum oldu, onun ədavətinin səbəbi bu imiş ki, guya mən öz təmsilatımda iranlıların əxlaqi-zəmimələrini həcv qılmışam və halanki dramaya dair əsərləri şərti və xüsusən, komediyanın təqazası xəlayiqin eyiblərini və əxlaqi-zəmimələrini eyni ilə göstərməkdir.

Çun müşarileyh drama fənnini, onun şərtlərini anlamır və ülumi-dünyəviyyədən bilkülliyyə bibəhrədir və hiyləvü təzvirdən və büxlü həsəddən və hirsü tamahdan başqa bir şeyə qabiliyyəti yoxdur, ona binaən belə qiyas eləyir ki, mənim bu hərəkətim iranlılara nisbət büğzü ədavətimdən naşidir. Onun belə ədavəti zahir olandan sonra evindən çıxıb, özgə bir yerdə mənzil etdim.

Tiflisə qayıdandan sonra əlifbamızın qüsuru və təğyiri barəsində təzədən yenə bir kitabça yazıb Tehrana göndərdim. Bu kitabçada hürufi-müqəttəəni hürufi-müttəsiləyə tərcih etdimsə də, yenə üləmanın qorxusundan rəsmi-xətti sabiqi qərar üzrə sağdan-sola yazmağı nişan verdim. Tehranda da həmçinin mənim bu fikrü təsəvvürümə mültəfit olmadılar və bu məsələ olan tərəqqipərvərlər ilə mühafizəkarlar arasında İstanbulda mayeyi-mübahisə olub bir məqamda qərar tutmayıbdır. Digər öz dövlətimin ərkanü böyüklərinin icazəsi ilə Osmanlı dövlətinin sədri-ə'zəmi olan Əli paşaya əlifba məsələsinə dair bir kitabça yazıb Tiflisdən göndərdim. Bu kitabçaya əlavə olaraq Osmanlı danişməndlərindən Süavi əfəndinin əlifbamız barəsində yazdığı tənqidi (kritikanı) dəxi qoşdum[456]. Vəli bu kitabça da bisəmər qaldı.

Əlifbanın tədbili xüsusunda bu qədər sə'y və tələşımın nəticəsiz qaldığını və bu əhvalın güzarişini fars dilində yazılmış bir mənzumədə bəyan etmişəm*.

Bu macəradan sonra Rzaqulu xan "Hidayət" təxəllüsün "Rövzətüssəfa"ya mülhəqat tərzində yazdığı tarixə müxtəsər bir tənqid (kritika) yazıb Tehrana göndərmişəm və bundan bir sənə keçmiş "Süruş" təxəllüslü Tehran şairinin ki, "Məlikü̈şşüəra" ləqəbi ilə şöhrətlənmiş idi, yazdığı bir qəsidəyə tənqid yazıb öz aşinalarıma Tehrana göndərmişəm.

Əlan – ki, tarixi-miladiyyənin 1878-ci ilidir, – ömrüm altmışdan keçibdir. Rus dövlətinin mərhəmətindən irəliki xidmətimdə qalıb, onun lütfü himayəsində bəhrəməndəm"[457].

Mərhum Mirzə Fətəlinin öz yazdığı seyr-sülukundan maəda bir para mə'lumat onun oğlu mərhum Rəşid bəy cəm edib bizə göndərmişdi ki, məqamı gəldikcə onlardan bəhs olunacaqdır.

Necə ki, öz yazdığı tərcümeyi-halından görünür, Mirzə uşaqlıqdan yetim qalır. Bu yetimlikdə böyük əlamət var. Tarixdən xəbərdarlığı olanlara mə'lumdur neçə-neçə böyük şəxslər – ki, ibarət olsun hükəma və üləmadan, məşhur reformatorlardan, din və şəriət sahiblərindən, – uşaqlıqdan yetim qalıblar. Vəli heç bir yetimi Allah-taala sahibsiz və hamisiz qoymayıbdır. Mirzə Fətəli də körpə vaxtından yetim qalıbsa da, artıq üsrət və zəhmət çəkməyibdir.

Axund Hacı Mirzə Ələsgər atalıq və analıq vəzifəsini öhdəsinə götürüb, nəvəsi mənzələsində olan balaca Fətəliyə lütf və nəvazişlərini əsirgəməyibdir və öz istəkli övladı kimi onun tə'lim və tərbiyəsinə məşğul olubdur. Balaca Fətəli dəxi onu atası kimi istərmiş və ömrünün axırına kimi zikri-xeyir ilə yad edərmiş.

Mirzeyi-mərhum Gəncədə Axund Molla Hüseyn Gəncəvidən tə'lim almağı filcümlə yad edirsə də və mollalığa hazırlaşdığı əsnada onun fikirlərinin dəyişirilməsini və başqa bir qəziyyənin üz verməsinə ötəri işarə edirsə də, amma həqiqəti-halı bəyan etmir.

Mərhum Rəşid bəyin bizə verdiyi mə'lumatdan belə zahir olunur ki, möhtərəm atası Gəncədə olan zamanı məşhur Mirzə Şəfi ilə görüşüb tanış olur. Səhih rəvayətə görə, Mirzə Şəfi İrandan gəlib Gəncədə müvəqqəti olarmış[458], özü də alim və fəlməfəməslək bir vücud imiş ki, hər bir şeydən xəbərdarlığı var imiş. Əfqanlı Şeyx Cəmaləddinin və Mirzə Mülküm xanın[459] və İranın bir neçə təzə fikirli adamları ilə ülfət və əlaqəsi var imiş. Bununla belə gözəl və mövzun təb'i var imiş.

* Bu mənzumə aşağıda yazılacaqdır



Mirzə Şəfinin bir çox əş'ari-nəfisəsi və asari-fəlsəfiyyəsi Avropada və xüsusən Almaniyada iştihar bulmuşdu. Almaniyada Mirzə Şəfinin məcmuəsi Bodenştedt* adlı alim bir şəxsin ehtimamı ilə nemsə dilinə tərcümə olunubdur.

Bəli, Mirzə Şəfi cavan Fətəlinin ağlını, fitri zəkavət və fərasətini müşahidə edib və gözlərindən yağan anlaq və mə'rifət nurunu dərk edib, gələcəkdə ondan böyük xidmətlər vüqua gelməsini Mirzəyə bəşarət verir və onunla bir neçə müddət görüşüb danışandan sonra filosof Mirzə Şəfi cavan Fətəlinin fikir və xəyalatını başqa bir səmtə çevirir. Bundan sonra cavan Fətəli ruhani olmaq fikrindən bilmərrə daşınıb, Avropa mədəniyyəti ilə aşina olmaq niyyətinə düşür və dövləti xidmətlərdən birisinə daxil olmağa meyl edir. Bu əsnada mərhum Axund Hacı Mirzə Ələsgər Həccdən müraciət edir və – necə ki, zikr olundu, – öz nəvəsinin əvvəlcə rus dili öyrənməyinə və sonra qulluğa girməyinə səbəb olur. Bu qulluqda (Qafqaz canişinlərinin mütərcimliyi mənsəbində) Mirzə Fətəli ömrünün axırına kimi qalıb, sədaqət və ixlasla öz vəzifəsini əda eləyir və hüsni-xidmətləri əvəzində neçə-neçə nişanlar və polkovnik çini alır.

Qulluq işlərindən fariq olduqda asudə vaxtlarını Mirzə rus kitablarının mütaliəsinə sərf qılıb, bir çox mə'lumatlar kəsb edir. Onun artıq sevdiyi fəlsəfəyə dair, siyasi və iqtisadi elmlərinə məxsus kitablar imiş.

* Bilmək gərəkdir ki, Bodenştedt nemsə ədib və şairlərinin məşhurlarından birisi hesab olunur. Bu axır vaxtlara kimi sağ imiş. Bodenştedt 1840-cı səneyi-miladidə Moskva şəhərinə gəlib, orada knyaz Qalitsinlərdən birisinin mürəbbisi olur. 1844-cü sənədə Qafqaz canişini general Neydqardtın təklifi ilə Tiflisə gəlib, indiki şəhər müəllimləri hazırlaşdıran məktəbə (Aleksandrovski instituta) müdir olur. Bodenştedt bu mənsəbində bir ildən ziyadə qalmayıb iste'fa verir və sonra Qafqazın çox yerlərini və Krım vilayətini seyrü səyahət edib bir çox mə'lumat və təcrübələr kəsb qılır. Gəncə şəhərində olan vaxtı Mirzə Şəfidən fars dilini öyrənir. Sonra Bodenştedt vətəninə müraciət edib, Berlin şəhərində "Qəzəliyyati-Mirzə Şəfi" ünvanında öz əş'arını çapa verir. "Qəzəliyyati-Mirzə Şəfi"də olan mühəssənat və lətafət bir dərəcədə nemsələrə xoş gəlir ki, 123 dəfə peydərpey çap olunur[460].

Bə'zi rəvayətə görə, "Qəzəliyyati-Mirzə Şəfi" mərhum Mirzə Şəfinin öz kəlamıdır ki, onu Bodenştedt farsdan nemsəyə artıq məharətlə rəvan dildə tərcümə edibdir. Bə'ziləri dəxi bu qövlə şərikdirlər ki, Mirzə Şəfi xud Bodenştedt özüdür ki, "Mirzə Şəfi" ləqəbini özü üçün intixab etmişdir. Amma bu qövl səhih deyil. Səhihi budur ki, Mirzə Şəfi əslən İran əhlidir. Gəncədə sakin olduğu əsnada Bodenştedtin oraya səfəri düşübdür və onunla tanış olub bir müddət məclisində iqamət edib, fars dilini ondan təhsil etmişdir. Bodenştedt öz əsərlərində Mirzə Şəfini "ustad" ləqəbi ilə yad edir[461].

Mirzə Fətəli vəfat edibdir Tiflis şəhərində tarixi-məsihiyyənin 1878-ci ilində may ayının 28-də ki, tarixi-hicrətin 1294-cü sənəsinə və cəmadiyül-əvvəlin 27-ci gününə təsadüf edir*. Dəfn olunubdur Tiflis qəbristanlığında.

Axundzadənin tərcümeyi-halına dair yazdığımız bu qədər mə'lumata iktifa edib, onun əsərlərindən və millətə göstərdiyi hüsni-xidmətlərindən filcümlə danışmağı burada lazım görürük.

Mirzə Fətəli Axundzadə, demək olur ki, müsəlmanların əvvəlinci reformatoru olubdur. Müsəlman məişətinin köhnə və çürümüş əsaslarını pozan və islam tərəqqisinə mane olan üsulu qəvaidin təğyirü təbdili yolunda ən əvvəl sərfi-himmət edən bu zati-ali olubdur.

İyirmi sənədən ziyadə Mirzə müsəlman kitablarının mütaliəsi ilə məşğul olub, yenə onları rəvan oxumaqda özünü aciz görür[463]. Amma rus əlifbasının vasitəsilə bir az vaxtda çox şeylər öyrənir və rus həfləri ilə yazılmış kitabların kaffəsini asanlıq ilə oxuyur. Bu hal Mirzəni mütəhəyyir edir və onun diqqətini cəlb edir. Bu qədər məktəblər küncündə ömürlər sərf edib axırda yenə bisavad və elmdən bibəhrə qalmağımızı Mirzə əlifbamızın qüsurundan görür. Bu qüsuru rəf' və dəf' etmək üçün, oxumaq və yazmaq məsələsini asanlandırmaq üçün özü təzə bir əlifba tərtib edir.

Bu əlifbada Mirzə nöqtələri götürüb, yazıda nişanı və asanı olmayan hürufi-müsəvvətə üçün və hərəkələr əvəzinə müəyyən nişanlar icad edir. Bununla oxumaq və yazmaq məsələsini bir növ yüngülləşdirir. Vəli avam xalqın qorxusundan və mütəəssib və fanatik ruhaniləri ürkütməməkdən ötrü Mirzə Fətəli müsəlman hərflərini bilmərrə dəyişməyib, onların ibtidasına və ya axırına bə'zi nişanlar qoşur və bu vəch ilə yazılmış kəlmələrin düzgün olunmağını qaydaya salır**.

Filhəqiqə, ərəbdən götürdüyümüz sillabi xəttdə o qədər qüsur və nöqsanat vardır ki, təhrirə sığası və təqrirə gələsi deyil. Ümum müsəlman tayfalarının tərəqqi və təali yolunda Avropa əhalisindən bu qədər dalda qalmaqlarının böyük səbəblərindən birisi də həmin mayeyi-səadətimiz və məbdeyi-tərəqqimiz olan oxumaq və yazmaq alat və əsbabının qüsur ilə dolu olmağıdır. Bir əlifbanın ki, irabü hərəkəsi və qədri-kifafınca hürufi-müsəvvəttəsi və müəyyən bir şəkildə hürufatı olmasın və qədim misirlilərin heroqlifinə bənzəyib, bir kəlmənin neçə tərzdə oxunmağına yol versin, onun bu tərəqqi əsrində bəqası səlah deyil və nə qədər təbdil və

* "Kəşkül" qəzetinin verdiyi xəbərə görə, mərhum Mirzə Fətəlinin vəfatı ittifaq düşübdür haman ildə fevral ayının 28-ci yövmündə[462].

** Əlifbamızın qüsuru babında öz fikir və rə'yimizi 1898-ci ildə "Кавказ"[464] qəzetinin 230, 238, 264-cü nömrələrində müfəssələn yazmışıq[465].



təshihinə tez çarələr bulunsa, bir o qədər də irəli düşərik və sürətlə qabağa gedərik; dünya və axirət işlərimiz qaydaya düşüb öz yolu ilə rast və rahat gedər.

Ülumü fünundan – ki, bu qədər bəhs edib, məclislərdə və məhfillərdə danışırıq, qəzetə və jurnallarda yazırıq, – heç biri bizim üçün müyəssər olmur. Hürufumuz təbdil olduqda qilü qalsız asan vəch ilə cümləsindən bəhrəmənd və mənfəətbərdar olarıq.

Xətti-alfabiti* – ki, Avropa millətləri arasında icrav və iste'mal olunur, – dillərdə eşidilən cəm'i sövtləri əksiyi otuz, artığı otuz beş ədəd hərflərin vasitəsilə ə'da edilir.

Az-çox tərbiyəli və ağlı salamat adam əcnəbi millətin xətti-alfabitisi ilə tərtib olunmuş əlifbasını üç-dörd saatın ərzində öyrənib oxumağa başlar. Bisavad uşaq iki ayın müddətində oxuyub-yazmağa qadir olur. Bir adam xətti-alfabiti ilə yazılmış bir səhifəni oxuya bilsə, haman xətt ilə təb' olunmuş kitabların hamısını düz və asan oxuya bilər. Amma bizim çox dərin oxumuş mollalarımız aşina olmadığı kitabı oxumaqda aciz qalırlar. İki sətir güc ilə oxuyub duruxurlar; eşitmədikləri bir sözü düz oxuya bilmirlər. Bunda təqsir, əlbəttə, mollalarımızda deyil, təqsir bu sillabi xətt ilə tərtib olunmuş əlifbamızdadır. Burada həqiqət gün kimi aydın və rövşəndir.

Əqli-səlim sahibi hərgiz bu doğrunu inkar edə bilməz. Amma avamlığın zoru, adət və ayininin gücü bizim canımıza bir dərəcədə sirişt edibdir ki, həqiqəti görüb, təsdiq və qəbul etməkdə aciz olmuşuq; çətini dərk edib, asanı götürməyə cür'ətimiz yoxdur.

Hər halda piyada atlıya və atlı dəmir yol qatarı ilə gedənə və havada uçana yoldaş olmayan kimi, biz müsəlman qövm və millətləri dəxi qədimi heroqlif şəklində düzülmüş əlifbamız ilə mədəniyyət aləmində bu qədər sibqət edən və hünərlər göstərən Avropa millətlərinə yoldaş deyilik və ola da bilmərik.

Mərhum Mirzə bu barədə yazır: "Əgər əlefbaye-melləte-eslam əlfabeti budi, nə sillabi və neveştən həm əz tərəfe-dəste-çəp betərəfe-dəste-rast budi, çenan ke, rəsme-xətte-əlfabetist, melləte-eslam dər aləme-sivilize, yə'ni tərəqqiyo mədəniyyət bər melləte-Orupa bişobhe sebqət costəndi, beelləte-in ke, dər ebteda toxme-sivilize dər xake-eslamiyan

* Firəng dilində xətti-alfabiti o xəttə deyilir ki, kəlmələr hürufi-məqtəə vasitəsilə tərtib olunur. Amma xətti-sillabidə kəlmələr hürufi-müttəsilə vasitəsilə düzülür. Xətti-alfabitidə hər bir hərf özünə məxsus şəkildə həmişəlik qalır; xətti-sillabidə bir hərf öz məqamına görə, neçə cür şəklə düşür. Bizim hərflər kimi kəlmənin başında bir şəkildə yazıldıqda ortasında başqa və axırında özgə şəkildə yazılır.

ağaze-ruyidən kərd. Əmma bevaseteye-səubəte-xətte-sillabiye-eslamiyan olumo məaref fi ma beyni-omume-ouzafe-in mellət tə'mim nəpəziroft və toxme-sivilize dər xake-eslamiyan puside, zay' gərdide və dər xake-Orupa bevaseteye-səhuləte-xətte-əlfabiteye-əhləş ruyənde şod.

Hezar əfsus ke, ouliyaye-melləte-eslam vocube-təğyire-əlefbaye-xodeşanra dərk nemikonənd və in mətləbe-rouşəntər əz aftabra nemifəhmənd və saere-omuratra əz qəbile-tənzimate-cədide və tə'mire-toroqe-cədidiyye və səfayene-boxariyye və keşidəne-cədavele-tiləerafiyye və təcdide-əsləheye-hərbiyye və əmsale-zalik ke, nesbət betəğyire-əlefba foruatənd bər in əhle-hərkar və bər in paybəste-hər divare-morəcceh mienkarənd, zəhi bədbəxtist ke, adəm dər in mellət əz aləme-ədəm beərseye-vocud qədəm qozarəd və həəqra befəhməd və nətəvanəd ke, behəmmellətane-nadane-xod befəhmanəd və beənduho həsrət əz donya berəvəd.

Emza: Mirza Fətholi Axundzade"[466].

Mirzeyi-mərhum böyük təmənnalarla tərtib qıldığı əlifbanın Rum və İranda qəbul olunmadığını, avam və kutahnəzər İran vəzirlərinin, xüsusən İstanbulda müqim İran səfiri Mirzə Hüseyn xanın büğz və ədavətini və filcümlə öz hali-dilini fars dilində yazılmış mövzun bir mənzumədə bəyan etmişdir ki, eynən və təbərrükən aşağıda dərc olunur. Bu mənzumə Firdovsiyi-Tusi əleyhirrəhmanın inşad qıldığı "Şahnamə"si tərzində yazılmışdır[467]. Bu kəlamdan Mirzə Fətəlinin fünuni-şeirdə mahir və xoştəb' bir şair olduğu zahir olunur.

Mənzumənin ünvanı bu sayaq yazılıbdır:

Mənzumeist ke, Kolinel Mirza Fətholi Axundzade – motərceme-caneşine-Qafqaz dər vəsfe-hale-xod qofteəst dər səneye – 1284:

Beənduho həsrət məra ruzeqar
Sər aməd dər in deyre-napaydar.
Bebesyare-tədbirha çəngzən
Həmibudəm əz ferte-hobbe-vətən.
Nəbəxşid səyəm vəli-haseli
Nədidəm dər in əsr sahebdeli.
Bozorqane-torkano İranzəmin
Həme xofte budənd ço xəlqe-Çin*
Cəvaniyəm rəft zəbun gəşt zur,
Cəvani nədidəm ba zouqo şur.
Səfər gərdəm əz rahe-dərya be Rum,

* Bu halda Çin xalqı da qəflətdən ayılıbdır, vəli İranzəminin böyükləri yuxudan doymurlar və hirs tamahdan bizar olmurlar.



Əlefbae-noura dər an mərzo bum*,
Nəmudəm beərkane-doulət təmam,
Xəyaləm bəsi poxte budo nə xam.
Yekayek beqoftənd sə'd afərin,
Cəhan şod beçeşməm ço xolde-bərin.
Məra paygəhe-biştər saxtənd,
Beən'ame-şahan benəvaxtənd –
Ke, naqah yek mərdəke-zərd-çehr**
Be came-moradəm bər amixt zəhr.
Be pişe-vəziran ura rah bud.
Məra doşməne-dino doulət nəmud.
Bedin tohməte-an mərde-napakzad
Məra pişe-hər kəs həmikərd yad.
Bevəhşət dər əfkənd torkanra,
Bozorqane-şurayo ərkanra,
Əz u hiç şod rənce-dəhsaleəm,
Şenid aseman əz zəmin naleəm.
"Resəd pak yəzdan beferyade-mən
Be məhşər setanəd əz u dade-mən"***
Şenidəm ke, babaş dər kudəki
Be Qəzvin bud əz saderuyan yeki.
Benaçar bər gəştəm əz xake-Rum –
Ke, mandən dər anca məra bud şum.
Ferestadəm an gəh be Tehran xəbər
Əz in rəftano amədəne-bisəmər.
Neveştəm yeki nameyi-delpəzir
Bename-vəzire-olum əz əbir.
Əlefbae-noura neşan dadəməş,
Dəre-nou beferdous beqoşadəməş.
Nədanəm məgər hemmətəş pəst bud.
Nədanəm məgər ruzo şəb məst bud –
Ke, nədad bər mən cəvab in vəzir,
Nəşod bər moradəm məra dəstgir.
Vəzire-digər dər ləbe-softe bud,
Dər in məsəle rə'ye-xod qofte bud –
Ke, ma xəlqe-İran ze xordo bozorg,
Ze kəbro ze tərsa, ze fərso ze tork,
Həme zirəko mə'rifətpişeim,
Ze fərte-zəkavət porəndişeim.
Ze doşvariye-xət nədarim bak,
Bekuran sazəd rəhnoma əz moğak****.

* Mirzənin Ruma səfəri hicrətin 1260-cı sənəsində olubdur ki, miladın 1863-cü ilinə mütabiqdir.

** Mirzə Hüseyn xana işarədir

*** İn do fərd əz Ferdousiye-Tusist ke, bemonasebət ariye şodəst. – Mirzə Fətholi

**** Moğak – çuxur və nahəmvar yer

Nəgirim nou xət əz hiç kəs. –
Ke mara xətto zehne-ma həst bəs.
Pəs an gəh əz in rə'y balide bud,
Kəfe-dəst bər riş malide bud.
Həme səfneşinan dər an əncomən
Bedu qoft: "Əhsənət, ey rəyzən.
Behərfe-dorostəd hezar afərin,
Behekmət nəgərdəd tora kəs qərin.
Delat rouşənəsto kəlamət səvab,
Nədarəd Ərəstu berəddəş cəvab".
Dəriğa şəhənşahe-bafərro huş
Ze kerdare-kuran neşinəd xəmuş.
Dəriğa ke, fərmandehe-dadgər
Nədid ni əlefbara sərbesər.
Dəriğa ke, dər əhde-firuze-u
Vəziri nədidəm ba aberu.
Həme portəmə, bihonəro bixerad,
Bexubi kəsi nameşan key bərəd.
Əgər çe dər ağaze-əhdəş be Şərq
Vəziri derəxşid manənde-bərq,
Vəli u vəziri ço Baris* bud –
Ke, dər molke-rusan vəzarət nəmud.
Ço hər kar mikərd bidəxəle-şah,
Ço Baris gərdid omraş təbah.
Həmin rəmzra fəhməd in padşah –
Ke, ura bəqa bad çon mehro mah.
Ke, doulət pərəstare-mellət bovəd,
Nə mellət, pərəstare-doulət bovəd.
Əya calese-məsnəde-Keyqobad,
Bər an şəhriyariyət cavid bad!
Şenidəsti axər ke, dər molke-rus
Çe xubi be mellət Aleksandrus
Be hemmət, beqeyrət, benamus kərd,
Benamavəri dər cəhan gəşt fərd.
Şenidəsti axer ke, Palmerston**
Çe kərde bəraye-Britaniyan?

* Boris Qodunov – rus ə'yanından (boyarlardan) birisinin adıdır ki, üç yüz əlli ilə bundan müqəddəm Rusiyada iğtişaş zamanı bir müddət vəzirlik edib, sonra məsnədi-səltənəti dəxi qəsb etmişdi. Ziyadə ağıllı və pürtədbir bir zat imiş. Vəli xəyanəti ucundan axırda bədbəxt və bədfərcam oldu. Heyfa ki, Mirzə Fətəli Borisə fe'lü əməlində oxşayan İran vəzirinin adını zikr etməyib mətləbi pərdəli söyləyir.

** Palmerston – İngilis dövlətinin vəziri olubdur ki, onun politikası sayəsində ingilis dövləti bir çox yerlərə malik olubdur və nüfuzunu Şərq və Qərbdə artırıbdır. Təvəllüd edibdir miladın 1784-cü sənəsində və vəfat edibdir 1875-ci tarixdə.



Şenidəsti axər to Vilhelmra*
Krale-xerədmənde-zielmra,
Nəyasayəd əz rənco kuşeş dəmi
Beheştəst molkeş bedourəş həmi.
Şenidəsti axər to Bismarkra**
Ke, əfraşt bər fərq dan fərqra.
Çe tədbirha sər zəd əz rə'ye-u,
Bəraye-vətən gəşte xod cəngcu.
Şenidəste axer ke, dər parsal
Gribaldi*** ba zəne-məhcəmal
Çe san cənghaye-dəlirane kərd,
Vətənra mosəffa ze bigane kərd.
Behər ca ke, məşğule-peykar bud,
Zənəş dər qəfayəş vəra yar bud.
Şenidəsti axər to Linkolnra****
Çe san kərd canra be mellət fəda.
Şenidəsti axər T'yerra***** ke, hal
Ze omrəş qozəşt əst həştad sal,
Bəraye-vətən daema dər ğəməst
Nə dərbənde-asayeşo derhəm əst.
Çe kərde vəziranət, ey padşah,
Be kerdare-işan to xod şo qovah.
Vəziran nəkərdəəst bireyb hiç,
Gəh əz dər dorude, gəh əz dərde-piç.
Pəs işan nəyərzənd yek cou bər an,
Ze dərgahət, ey xosrove-xosrovan,
Vəziran ba elmo hekmət bexah,
Nəcabət rəha kon, fəzilət bexah.
Ke, ta molk arayeşe-taze'i,
Begirəd fəra xor əndazei.
Əlefbae-noura bekar avərənd,
Nehale-səadət bebar avərənd.

* İndiki nemsə imperatoru Vilhelmin babasıdır. Ziyadə müdəbbir və millətpərəst bir padhaş imiş.

** Bismark – Almaniya dövləti vəziri-ə'zəmi olubdur. Təvəllüd edib miladın 1815-ci ilində; vəfat edib 1898-ci sənədə. Knyaz Bismark öz vaxtının ən müqtədir və dəqiq politikaşünaslarından hesab olunur. Onun vəzarəti zamanından Almaniya dövlətinin şə'nü hörməti uca məqama yetişdi.

*** Harribaldi – italiyalı bir bahadırın adıdır ki, vətənini biganələrin əlindən xilas edibdir. Təvəllüdü miladın 1807-ci, vəfatı 1882-ci sənəsində vaqe olubdur.

**** Linkoln – yeni dünyanın – Amerikanın cümhuriyyət rəisi olubdur. Amerikada həbəşlərin (qara qulların) hürriyyəti yolunda bahadıranə cəng edib, onları əsirlikdən azad edibdir. Təvəllüdü miladın 1809-cu, vəfatı 1895-ci sənələrində olubdur.

***** T'yer – Firəngistanın məşhur müvərrixi və sonradan bir çox böyük xidmətləri ifa edən millət hamisi və hürriyyət tərəfdarı olan böyük bir zat imiş. Təvəllüdü miladın 1797-ci və vəfatı 1877-ci illərində vaqe olubdur.

Xetab bər duste-xod ke, ebaret əz Ruhol-qodsəst:

Bəsi şekve xordəm, soxən şod deraz,
Qozəştəm, nəxahəm tora did baz.
Sepordəm beəhde-to in karra,
Sərəncame-in rənco bimarra[468].

Mirzə Fətəlinin bu mənzum şikvəvü naləsi Firdovsi Əleyhirrəhmənin Sultan Mahmud Qəznəvi[469] haqqında yazdığı həcvə bənzəyir. Hər iki kəlamın mənbəi bidadlıq və ədalətsizlikdən nəş'ət edən nalələrdir. Axundzadə ustadi-kamili məqamında olan Firdovsiyi-şirinkəlama peyrəvilik etməkdə artıq dərəcədə məharət büruz etmişdir. İranzəmin vəzirlərinə elə bir qara ləkə və həcv sikkəsi vurubdur ki, qiyamətədək baqi qalacaqdır və yumaq və qazımaq ilə getməyəcəkdir.

Mirzeyi-mərhum müsəlman əlifbasının təğyiri və təshihi uğrunda çox zəhmətlər çəkib, töhmət və məzəmmətlər eşitdi; ömürlər sərf qıldı, vəli işin axırını bir yana çıxarda bilmədi və ürəyi həsrətlə bu dünyadan getdi.

Əlifbanın təğyiri babında fars və türk dillərində bir neçə tutarlı məqalələr yazıb, möhkəm dəlillər ilə onun qüsurunu və islam aləminin tənəzzülünə bais olmasını sübut etmişdir.

Fransa ədib və mütəfəkkirlərindən Şarl Mister Osmanlı dövlətinin sədri-ə'zəmi Əli paşaya müsəlman əlifbasının qüsuru babında yazdığı məqaləni firəng dilindən farsa tərcümə edib Tehrana vəziri-əzəmə göndərdi. Və bundan əlavə "Fəqəreyi-əcibə" ünvanında əlifbamızın qüsuruna dair fars dilində türfə bir hekayə təhrir qılıbdır ki, oxuyanları İran tüccarının sadədilliyi və tərəfgirliyi heyrətə salır.

Mirzə Fətəli Axundzadənin bu yolda əkdiyi toxumlar indiyəcən səmər verməyibsə də, çürüyüb tələf də olmayıbdır; o toxumlar yavaş-yavaş göyərib bitməkdədir. Əlifbamızın pürqüsur olmağı hər yerdə anladılıb, rəfinə əlac və çarə axtarılmaqdadır. Təzə əlifba tərtib etmək fikrinə düşənlərin də ədədi çoxalmaqdadır. Əlan bu məsələ Osmanlı məmləkətində və İranda üləma, vüzəra və üdəbanın fikrü xəyalını işğal etməkdədir.

Təzə kitab yazanlar, üsuli-imla tərtib qılanlar, qəzet və jurnal verənlər hər birisi bir növ imla və üsuli-təhrir ittixaz etməklə çalışır ki, qarei onun yazdığını düz oxuyub, fikrini və mətləbini anlasın. Sabiqdə müsəlman əlifbasının qüsur və təbdilinə e'tina etməyən mərhum İsmayıl bəy Qasprinski[470] axır vaxtlarda üsuli-imlanı bilmərrə pozub və kəlmələri, – xah türui olsun, xah ərəb və əcəmi, – öz istədiyi tərzdə parçalayıb təzə bir səbkdə müsəlman hərfləri ilə "Tərcüman"da[471] məqalələr və sair əhvalat yazırdı. Üsuli-imlada vüqua gələn və yazımızda müşahidə olunan bu inqilabın, bu reformanın banisi mərhum Mirzə Fətəli olubdur.



Əlbəttə, çox müddət çəkməz ki, bu mühüm məsələ həll olunar və müsəlmanların əlifbası dəyişdirilib və asanlaşıb sair mədəniyyətli millətlərin əlifbası kimi, ülum və maarifin intişarına mükəmməl və mübərhən bir alat olar; inşaallah-taala...

Mirzə Fətəlinin komediyalarına gəldikdə qət'i surətdə deyə bilərik ki, rus drama yazanlarının babası Qoqol[472] və firəng drama yazanlarının babası və ustadı Molyer[473] olan kimi, türk-Azərbaycan ədiblərinin və komediyanəvislərinin atası və yolgöstərəni mərhum Mirzə Fətəli Axundzadə olubdur. O yazdığı komediyaların mislini təzə yazıçılarımız hərə yazıb bitirə bilməyiblər. Vəli onun sayəsindən bir neçə müqtədir ədiblər vücuda gəlibdir. O cümlədən Nəcəf bəy Vəzirov[474] və Əbdürrəhim bəy Haqverdiyev[475], Nəriman bəy Nərimanov[476] və Mirzə Cəlil Məmmədquluzadə[477] cənablarıdır ki, hər birinin bir neçə komediyaları və dramaya məxsus əsərləri vardır ki, indiki məişətimizin bə'zi övza'vü əhvalını və əhli-zəmanənin fikrü xəyalatını və nə yolda çalışmaqlarını eyni ilə yazıb öz əsərlərində göstərirlər. Bu ədiblərin və Mirzə Fətəliyə peyrəvlik edən sair dramanəvislərin vücuda gətirdiyi əsərlər barəsində öz məqamında müfəssəl mə'lumat veriləcəkdir.

Komediya yazmaq hər bir ədibin işi deyil. Ədəbiyyatın bu növündə əsərlər vücuda gətirmək üçün elm və savaddan başqa təcrübə, bilik və millətin məişətinə ətraflı bələdiyyat dəxi lazımdır. Bunlardan əlavə fitri bir iste'dad və yaradıcı bir qüvvə, bir təb'i-füsunsaz, beistilahi-türki "Allah vergisi" lazımdır ki, bir yandan görüb-eşitdiyini götürüb yetirə bilsin və bir tərəfdən öz fikrü xəyalatı ilə yoxdan var etsin.

Bu "Allah vergisi", yoxdan vücuda gətirmək qüvvəsi mərhum Mirzə Fətəlidə kəmalınca var imiş. Bu sözlərin doğru olmağına onun komediyaları möhkəm dəlil və adil şahiddir. Necə ki, Qoqolun Qorodniçisi, Xlestakovu, Dobçinski, Bobçinskisi hal-hazırda Rusiyanın bə'zi yerlərində müşahidə olunmaqdadırlar, habelə də Mirzə Fətəlinin Hatəmxan ağası, Hacı Qarası, Molla İbrahimxəlili, Namazı, Zalxası, Ağa Kərim Miyançısı və qeyriləri bu halda sağ və salamat bizim içimizdə dolanıb, hər biri öz fe'lü əməllərini işlətməkdədirlər.

Mirzə Fətəlinin komediyaları yazılan zamandan bizim vaxtadək altmış-yetmiş sənə gəlib keçibdir. Bu uzun müddətin ərzində – ki, yarım əsrdən ziyadədir, – məişətimizdə, dürüst diqqət olunsa, artıq bir tərəqqi əsəri görünməz; ata-babadan qalma köhnə adətlər və ayinlər üzrə güzəran edib yaşamaqda varıq. Xeyir və şər' ittifaqlarda işlənən bihudə məsarif və məxaricə diqqət olunsa, sözümüz təsdiq olunar.

Ata-babalarımızın batil əqidələrinə, kəsalət və bətalətlərinə varis olmuşuq. Bu axır vaxtlarda şəhərlərdə az-çox tərəqqi və təməddün əsərləri görünürsə də, əhli-dehat irəliki qərar üzrə avamlıq halında yaşayırlar; onların imdadına yetən yoxdur. Amma onları soyan və qarət edən çoxdur; bir tərəfdən tamahkar ruhanilər, bir yandan zülmkar polisə mə'murları və üçüncü tərəfdən yalançı millət dostları ki, ibarət olsun yarımçıq elm kəsb edənlərimizdən və quru isim ilə mə'dəni olan nücəbamızdan. Bu xüsusda Qasım bəy Zakirin tərcümeyi-halından və əsərlərindən mə'lumat verdikdə filcümlə söyləmişik. Dübarə təkrari-kəlam edib, mətləbə tul-təfsil verməyi artıq bildik.

Hər halda mərhum Mirzə Fətəlinin komediyaları məişətimizin təəccüblü bir aynasıdır ki, zahirimizi də və batinimizi də eynilə göstərir.

Müruri-əyyam ilə bu aynanın üzünə toz qonubdur. Bu tozu silib, aynanın üzünə sığal verib diqqət ilə ona baxsaq, öz surətimizi onda görərik və bir-birimizi tanıyarıq. Batini aləmimizə, ə'mali-naməşruəmizə və əf'ali-şəniəmizə diqqət yetirsək, xəcalət çəkib yəqin edərik ki, bu yarım əsrin müddətində çox da uzaq getməmişik, cüz'i dəgşiriliyimiz və təfavütümüz olubsa, o da zahiridir. Batini tərəfimiz mənən və əxlaqən irəliki qərar üzrə baqidir. Odur ki, Axundzadənin komediyalarını oxuyan bəsirət əhli bir tərəfdən gülürsə, bir tərəfdən də ağlayıb göz yaşı tökür. Gülmək görünür, amma ağlamaq görünmür; onun ağır damcıları ürəyin üstünə düşüb, onu yaralayır, dəlir...

Mirzə Fətəli komediyalarına müqəddimə olaraq ifadeyi-məram üçün komediya nə deməkdir və nə qisim təsnifatdan ibarətdir, teatr nədir və ondan təhzibi-əxlaqü adaba dair böyük mənfəətlər yetişməyini müxtğəsəran bəyan edir və türk dilinin imlası barəsində öz təsəvvüratını bildirib, komediya oxuyanlara və oynayanlara (artistlərə) bir para lazım olan bəyanat və düsturül-əməllər verir. Necə ki, mərhum yazır: "İnsanın təbiətində iki ümdə xasiyyət qoyulubdur: biri qəm və o biri fərəh. Ağlamaq əlaməti-qəm olduğu kimi, gülmək də əlaməti-fərəhdir. İnsana bir müsibət üz verəndə qəmnak olur. Əgər müsibət ağır isə, ağlayır və biləks ona bir şadlıq və fərəh üz verəndə gülür və könlü açılır.

İnsanın gülməyinə və ağlamağına fərəhin və müsibətlərin təqriri və təhriki dəxi səbəb ola bilər. Təqrir və təhrir surətində giryə və xəndəyə ümdə müəssir vəzi-hekayətdir.

Əksər övqat namərğub vəz ilə zikr olunan müsibətdən adam mütəəssir olmaz və lakin haman müsibət özgə pəsəndidə vəz ilə nəql olunduqda kəmayənbəği tə'sir bağışlar. Necə ki, naqis və kamil mərsiyəxanların məclislərində bu iki keyfiyyəti biz mükərrər müşahidə edirik.



Əgər nəqli-müsibət və ya behcət təb'aye və əxlaqi-bəşəriyyətin kəmali-filvaqe bəyan etməklə təbiəti-müstəmiə məqbulü müəssir düşdü, haman nəqlin vazeinə və müsənnifinə həkimi-rövşənrəvan və arifitəb'ayei-insani deyirlər və naqili-kamilinə süxənguyi-qabil..."[478]

Burada naqil, süxəngu və raviyi-şirinməqal ilə bizim işimiz olmayıb da, müsənnifi haqqında – yə'ni mərhum Mirzə Fətəli barəsində kəmalicür'ət ilə deyə bilərik ki, onun komediyalarını oxuduqda bizə yəqinlik hasil olur ki, bunların müsənnifi əlhəqq "həkimi-rövşənrəvan və arifitəb'ayei-insani"dir. Çünki bizim komediya yazanların heç biri Mirzə Fətəli kimi nə ürəkdən güldürür və nə doğrudan ağladır. Bu bacarıq və qabiliyyət və təb'ayei-insaniyyəyə bələdiyyət, bu ruhşünaslıq ancaq o mərhumun təmsilatında görünür. Mərhumun dramanəvislikdə izhar qıldığı qabiliyyət və kəmalat doğrudan da vəsfə gələsi deyil.

O təmsilatdan ələ alıb oxuduqda olduğumuz övza'vü zamanı bilaixtiyar unudub, özümüzü Mirzeyi-mərhumun yazdığı zamanda, vəsf qıldığı övza'vü mühitdə və əlvan dəstgah içində görürük. Əfradi-məclis guya bir-bir gözümüzün önündən növbənöv libaslarında gəlib keçirlər. Biz onların hərəkatü sükənatını, necə ki, var, müşahidə edirik; danışdıqları söhbəti eşidirik; gülənlər ilə gülüb, ağlayanlar ilə ağlayırıq.

Burada Axundzadənin yazdığı komediyalar ilə oxucularımızı aşina etməyi artıq bilirik. Zənni-acizanəmizcə əhli-savaddan az adam tapılar ki, məzkur komediyaları oxumamış olsun və bundan əlavə onlardan hər birisi dəfaat ilə səhneyi-tamaşaya qoyulubdur. Zaqafqaziyanın elə bir şəhəri və qəsəbəsi yoxdur ki, mərhum Axundzadənin komediyalarından bir-ikisi oynanılmamış olsun. Şayani-diqqət Axundzadənin komediyalarında səhneyi-tamaşaya gələn ünas tayfasıdır.

Mə'lum olsun ki, Axundzadənin əsrində arvad məsələsi məhəllimüzakirəyə qoyulmamışdı. O vaxtlarda müsəlman aləmində arvadların hüququ, hürriyyət və müsavatı barəsində bir söz də danışılmazdı və danışmaq da olmazdı. Əvvəl kəsi ki, arvadları da insan dərəcəsinə qoyub, onların haqqü hüququ barəsində söz açıbdır və onları səhneyi-tamaşaya gətiribdir, o mərhum Mirzə Fətəli olubdur.

Arvadların dolanacağı, fikrü xəyallarını, kişilər ilə rəftarü əlaqələrini və onların əhvali-ruhiyyələrini və sair müxtəlif sifətlərini mərhum Mirzə artıq məharətlə təhrir qılıbdır. Demək olar ki, Mirzə Fətəli bu vaxtacan gizlində, qara pərdələr altında və zülmət içində yaşayan ana-bacılarımızın üzərinə bir işıq qapısı açıbdır; onların nicat və səadəti üçün yol göstəribdir. Müsəlmanlar üçün təzə bir aləm kəşf edibdir ki, onsuz diriliyimiz, tərəqqi və səadətimiz qeyri-mümkündür.

Mirzənin müsəlman arvadlarını səhneyi-tamaşaya gətirməsi, əlbəttə, müasirlərinə xoş gəlməzdi. O cəhətə ona gizlində və aşkarda lə'nət oxuyub, olmazın sözləri haqqında deyirdilər.

Möhtərəm Əbdürrəhim bəy Haqverdiyev "Xəyalat" adı ilə yazdığı əsərində Hatəmxan ağa ilə Mirzə Fətəlinin arasında vüqua gələn nizavü davanı təhrir qılıb, Hatəmxan ağanın dilindən deyir: "Hələ bunlar hamısı dursun kənarda, sən mənim özümü məsxərəyə qoyubsan, bu heç. Bu övrət-uşaq ilə nə işin var? Mən özün hərçənd müsəlmanlıqdan kənarsan, amma yenə nə qədər olsa, sənin qanın müsəlman qanıdır. Heç sənə müsəlman ismətinə toxunmaq yaraşarmı? Qardaş, niyə mənim övrətimin, qızımın adını camaat bilsin? Eyib olsun sənin üçün, çox eyib olsun!"[479]

Hatəmxan ağa nəinki öz arvad-uşağının səhnəyə çıxmağına, hətta qeyriləri onların adlarını bilməyə də razı deyil. Belə şeylər onun qeyrət və namusuna toxunur, onu xalq içində bədnam edir. Bunların cümləsinə yenə haman bidin, laməzhəb Mirzə səbəb olubdur.

Bu da məişətimizdə yeni bir "reforma", təzə bir dəgişirilik, təzə adət və qanun... Bu yolda dəxi Mirzənin çəkdiyi cəfalar, eşitdiyi föhşlər və nalayiq sözlər və hər qisim tə'nələr hədsiz və hesabsızdır və təqrirə gələn deyil...

Diqqət yetirməli burasıdır ki, mərhum Mirzə Fətəli komediyalarında yazdığı arvadların cümləsi qeyrət, namus, ismət və hünər sahibləridir. Bu komediyalarda bir arvad nəzərə gəlməz ki. bihəya, bacarıqsız və yasar olsun. Bə'zilərinin öz kişilərindən zirək və bacarıqlı olmaqları müşahidə olunur.

Mirzə Fətəlinin təsnif qıldığı altı komediyalarının ancaq birində – "İbrahim Xəlil kimyagər"də arvad tayfasından bəhs olunur. Yerdə qalan beş komediyaların hamısında kişilər ilə arvadlar bərabər səhneyi-tamaşaya gəlib, öz fikirləri, işləri və dolanacaqları ilə bizi tanış edirlər. Sözümüzü sübuta yetirmək üçün mətləbə bir az tulü təfsil vermək lazım gəlir.

Mirzə Fətəli komediyalarında həyat səhnəsinə gətirdiyi arvadlar bunlardır:

1. "Müsyö Jordan" təmsilində Hatəmxan ağanın arvadı Şəhrbanu xanım. Hər cəhətdən öz kişisi Hatəmxan ağadan qoçaq. cür'ətli və bacarıqlı olduğu görünür.

Şahbaz bəy – ki, Hatəmxan ağanın qardaşı oğludur və qızı Şərəfnisa xanımın nişanlısıdır, – istəyir həkimi-nəbatat Müsyö Jordan ilə Parijə gedib, orada firəng dilini öyrənsin və mə'rifət kəsb etsin. Şəhrbanu xanım Şahbaz bəyin bu fikrindən duyuq düşüb istəyir mane olsun. Qeyz ilə



Şahbaz bəyə deyir ki, "Sən azıb yolundan və izindən çıxıbsan. Heç vaxtı Parijə gedə bilməzsən. Sən istəyirsən gedib orada üzüaçıq gəzən firəng arvadları ilə vaxtını keçirəsən və gülüzlü balamı gözüyaşlı qoyasan?! Müsyö Jordana bir toy tutaram ki, gəldiyi yolu da azar və Pariji də unudar".

Hatəmxan ağa Şəhrbanu xanım ilə bacarmır və Şahbaz bəyin Parijə getməyi baş tutmur. Komediyanın axırında Xanpəri nənə deyir: "Eh, xanım! Əgər kişilərin ağlı var, niyə biz onları hər qədəmdə min yol alladırıq və öz bildiyimizi edirik?!

2. "Hekayəti-xırsi-quldurbasan"da Namazın arvadı Zalxa Bayramın işini düzəltməkdə və tədbir tökməkdə artıq dərəcədə ağıl və fərasət büruz edir. Axmaq, qorxaq və bivec Tarıverdini aldadıb yoldan çıxardır və bacarmadığı işə, yə'ni quldurluğa göndərir. Zalxa bu barədə fikirləşib özözünə deyir: "Vallah, əgər Tarıverdi mənim sözlərimdən quldurluğa getsə, biçarənin heç təqsiri yoxdur. O neyləsin ki, bu viran olmuş ölkənin qızları quldurluq, oğurluq bacarmayanı sevmirlər. Divanbəyiyə deyən yoxdur ki, niyə biçarə gədələri oğurluqdan və quldurluqdan ötrü incidirsən? Bacarırsan, ölkəmizin qızlarına qadağan elə ki, quldur olmayan oğlanlardan zəhlələri getməsin. Onda mən zamin ki, qurd qoyun ilə otlaya".

Zalxanın bu sözlərində olan doğruluğa şübhə yoxdur. Qız tayfasının sevdiyi oğlan gərəkdir qoçaq və zirək olsun, aciz və qorxaq kişini ünas tayfası dost tutmaz. Xüsusən, keçmiş əsrlərdə, bas-tut, vur-öldür əyyamında qızın sevdiyi ancaq rəşid, qoçaq, quldurluqda adı çıxan oğlan olarmış.

Haman bu komediyada sadə bir kəndçi qızı Pərizadın cavan və qoçaq Bayrama olan təmiz eşqi və eşqində göstərdiyi dəyanət və səbat adamı heyrətə salır.

3. "Hekayəti-mərdi-xəsis"də Hacı Qaranın arvadı Tükəzin ərindən min kərə qoçaq, ağıllı və yaxşı olmağı görünür. Tükəz öz əri Hacı Qaraya deyir: "Sən xəsis, ölməli murdarsan. Səndən ömründə bir kəs bir xeyir görmür. Uşaq aşıq yığan kimi, sən də pulu yığmısan. Boğazın elə qurusun ki, su da ötməsin!.." Hacının acizliyini və qorxaqlığını zikr edib deyir: "Bu yaraqların iyirmisini üstünə taxsan da, mən arvadlığım ilə yenə səndən qorxmaram!.."

Həmçinin bu "Mərdi-xəsis" təmsilində gözəl, ağıllı və dəyanətli Sona xanım naçalnikə zamin olub, nişanlısı Heydər bəyi həbsdən və bazxastdan xilas edir və onu əyri yola getməkdən daşındırır.

4. "Sərgüzəşti-vəziri-xani-Sərab"da[480] vəzirin hərəmləri Ziba xanım və Şö'lə xanım və qaynanası Pəri xanım sadədil vəzirin başına kələk gətirirlər; onun başına badya geydirib Teymur bəyi evdən çıxardırlar.

Arvadlar bir-birini günüləyir, bir-birinin üstünə şər' atır. bir-birinin ayağından çəkir, amma öz sahiblərinə xəyanət göstərmirlər.

Nə Şö'lə xanımın və nə də Ziba xanımın Teymur ağa ilə gizlində heç bir əlaqəsi yoxdur. Şö'lə xanımın qız bacısı Nisə xanım hökumət və dövlət sahibi olan xana getmək istəməyib, can-dildən sevdiyi Teymur ağanı ona tərcih verir. Zülm və mürüvvətsizlik müzməhill olub, haqq və ədalət onlara qalib gəlir.

5. "Mürafiə vəkillərinin hekayəti"ndə Səkinə xanım o qədər mətanəti-qəlb, cür'ət, əqlü tədbir göstərir ki, adamın ağlı heyrətdə qalır ki, nə sayaq elm və tərbiyə görməmiş bir yetim qızda bu qədər kamal, mə'rifət və dərrakə olsun.

Bir tərəfdən qardaşının müt'ədən dul qalmış arvadını Təbrizin şeytan fikirli mürafiə vəkilləri əldə dəstaviz edib, ondan irs tələb edirlər, bir tərəfdən Ağahəsən tacirbaşının hiyləvü dəsisələri onu rahat qoymur, üçüncü tərəfdən onun şöhrətpərəst bibisi Zibeydə xanım istəyir onu könülsüz tacirbaşıya versin.

Hər tərəfdən bədxah, mühil və tamahkar adamlar... Səkinə xanım bu qədər hiyləsazların və tamahkarların hücumundan özünü itirməyib, vəsfə gəlməyən hünərlər zahir edir və düşmənlərinə qalib gəlir, bibisinə açıq deyir ki, "Mən Ağahəsənə getməyəcəyəm. Zira ki, o nadürüst oğlu altmış min tümən adın eşidib, onun üçün məni istəməyə talib olubdur. Yoxsa o, məni sevdiyindən ki, almaq istəmir! Əgər o məni alan idi, niyə qardaşım sağlığı heç bir ağız açmadı?"

Səkinə xanım Ağahəsənin özünə də deyir ki, "Mən sənə getməyəcəyəm!"

Ağahəsən deyir: "Xanım, məndən nə təqsir sadir olubdur ki, məni özündən uzaq edirsən?" Səkinə xanım cavabında deyir ki, "Heç bir təqsir sadir olmayıbdır. İndi mən özüm öz vəkiliməm. Mən sənə getmək istəmirəm; mən səni sevmirəm. Könülə ki, güc yoxdur?"

Ağahəsən deyir: "Xanım, bu söz sənə çox zərər gətirər, belə buyurma!"

Səkinə xanım cavabında deyir: "Hər nə bacarırsan, elə, əlindən gələni əsirgəmə, əsirgəsən namərdsən!"

Ağahəsən axırda daralıb dürüştlük ilə deyir: "Yaxşı! Sənə mən oyun tutum ki, dastanlarda deyilsin. Ölənədək dadı damağından getməsin!"

Səkinə xanım deyir: "Get! səndən qorxan səndən əskikdir, əlindən gələni beş qaba çək!"

Axırda Səkinə xanım müddəilərinə qalib gəlib cümləsini mə'yus və məhkum edirir.



Bu minval ilə oxucular özləri görürlər ki, Mirzə Fətəlinin təmsilatında zikr olunan arvadlar aciz və bacarıqsız adamlar deyillər, bəlkə onların əksəri kişilərdən qoçaq və hünərlidirlər.

Əlbəttə, bu qisim aqilə və cəmilə arvadların səhneyi-tamaşaya gətirilməsi səbəbsiz deyil. Mirzə Fətəli altmış sənə bundan müqəddəm öz müasirlərinə göstərir ki, sizin içinizdə belə gözəl canlar, belə namuslu və qeyrətli ana-bacılarınız, etibarlı arvadlarınız vardır. Vəli siz onları vücud hesab etməyib, hər qədəmdə hüquq və ixtiyarlarını tapdalayırsınız; haqsız incidib, xarü zəlil edirsiniz və belə cahilanə hərəkətinizdə məişətinizi pozğun edib, özünüzü və nəslinizi fəlakətə salırsınız.

Mirzə Fətəli Axundzadənin komediyaları bunlardır:

1. "Hekayəti-Molla İbrahimxəlil kimyagər". Keyfiyyəti dörd məclisdə bəyan olub itmama yetir. Təsnif olunubdur hicrətin 1267-ci[481] tarixində.

2. "Hekayəti-müsyö Jordan həkimi-nəbatat və dərviş Məstəli şah məşhur cadugər". Təmsili-güzarişi-əcib. Keyfiyyəti dörd məclisdə bəyan olur. Yazılıbdır 1267-ci sənədə.

3. "Hekayəti-xırsi-quldurbasan". Keyfiyyəti üç məclisdə bəyan olub itmama yetir. Yazılıbdır 1268-ci[482] sənədə.

4. Sərgüzəşti-vəziri-xani-Sərab". Təmsili-güzarişi-əcib. Keyfiyyəti dörd məclisdə bəyan olub itmama yetir. Yazılıbdır hicrətin 1267-ci[483] sənəsində.

5. "Sərgüzəşti-mərdi-xəsis – Hacı Qara". Təmsili-güzarişi-əcib. Keyfiyyəti beş məclisdə bəyan olur. Yazılıbdır 1269-cu[484] tarixdə.

6. "Mürafiə vəkillərinin hekayəti şəhri-Təbrizdə". Qəribə bir təmsildir. Keyfiyyəti bəyan olur üç məclisdə. Yazılıbdır 1272-ci[485] tarixdə

* * *

Ədəbiyyatın bu növü Mirzə Fətəli kimi qabil ədibin qələmindən əvvəlinci dəfə olaraq Azərbaycan türklərinin arasında vücuda gəldikdə cümləni heyrətə salır. Mirzə Fətəlinin zamanına kimi bu qisim əsərlər, yə'ni komediyalar müsəlmanlar arasında görülməmişdi.

Bu əsərləri mütaliə etdikdə guya hər kəs özünü, qohum-qardaşını və dost-aşnasını və filcümlə ətrafında dolanan adamları görür, onlar ilə danışır, söhbət edir...

Əvvəlinci imtahan, o da belə kamil və gözəl surətdə, eybdən xali, qüsurdan uzaq, nəzafət və mühəssənat ilə dolu; Azərbaycan türklərinin dolanacağının, adatü adabının həqiqət göstərici bir aynası.

Əlhəqq bu komediyalar xəzinə malıdır. Ərbabı nəzərində bunlar üçün qiymət bulunmaz. Odur ki, bu komediyalar səhneyi-tamaşaya qoyulduqda və çapdan çıxdıqda hamının fikrü diqqətini öz tərəfinə cəlb edir.

Əcnəbi qövmü tayfalarının gözü önündə təzə bir dünya açılır. Bizim məişətimizin və dolanacağımızın üzündən Mirzə Fətəli pərdəni çəkib, bizim varlığımızı və həyatımızı dünyaya kəşf edir. Ol səbəbdəndir ki, Mirzə Fətəlinin komediyaları hələ türk dilində çapa verilməmiş rus dilinə tərcümə olunaraq 1853-cü tarixdə – ki, hicrətin 1269-cu sənəsinə mütabiqdir, – təbdən çıxır*.

Bu komediyaların şöhrət və sədası sürətlə hər yerə dağılır, onların barəsində rus və Avropa dillərində çıxan jurnal və qəzetlərdə gözəl məqalələr yazılır, hər yerdə onların tə'rifi olunur. Çox çəkmir ki, Axundzadənin komediyaları İran məmləkətində də şöhrət kəsb edir. Şahzadə Cəlaləddin Mirzənin sərkatibi (sekretarı) Mirzə Cəfər onları türkdən fars dilinə tərcümə edib Tehranda çapa verir[486]. Heyfa ki, bu tərcümə indi nadir tapılan əsərlərdən olubdur.

Avropa üdəba və lissaniyyunu bu komediyalardan bə'zisini öz dillərinə tərcümə ediblər. 1882-ci sənədə İngiltərədə "Sərgüzəşti-vəziri-xani-Sərab" təmsili ingilis dilinə tərcüməsi ilə bir yerdə çapdan çıxır[487]. Bu tərcüməyə əlavə olaraq məxsus lüğət və bir para qeydlər qoşulur.

1886-cı tarixdə məşhur ədib Barbie de Meynard[488] Parijdə "Journal Asiatigue"[489] adlı cəridədə "Hekayəti-İbrahimxəlil kimyagər"i çap eləyir.

1889-cu ildə Stokholm lisaniyyun cəmiyyətinin jurnalında "Hekayəti-xırsi-quldurbasan" təb' olunur və haman sənədə Alfans Silyer (Alfons Cillere) ismində bir şəxs fars dilində "Vəziri-xani-Sərab" ilə "Mürafiə vəkilləri"ni çap etdirib[490]. Və yenə haman sənədə Vyana şəhərində prfessor Vurmund "Həkimi-nəbatat müsyö Jordan"ın fars dilindən tərcüməsini lüğatı və bə'zi qeyd və bəyanatı ilə məən çap etdirir[491]. Və həmçinin 1882-ci sənədə Tiflis şəhərində Nikolay Qulak[492] ismində bir şəxs ki, əlsineyi-Şərqiyyəyə, xüsusən fars dilinə dara idi, Mirzə Fətəlinin komediyalarını nemsə dilinə tərcümə edir**.

Mərhum Mirzə Fətəli Axundzadə yuxarıda zikr olunan komediyalardan başqa tarixi-islamiyyənin 1273-cü sənəsində – ki, miladın 1857-ci ilinə mütabiqdir, – "Aldanmış kəvakib" və yaxud "Hekayəti-Yusif şah"

* Mirzə Fətəlinin komediyaları "Aldanmış kəvakib" ilə bir yerdə türk dilində ancaq altı il rus çapından sonra – 1859-cu sənədə təb' olunur.

** Mə'lum ola ki, Qulak sabiqdə Tiflisdə əvvəlinci gimnaziyada nemsə dilinin müəllimi idi. Sonradan artıq sinnə dolmağa görə, qulluqdan çıxıb, ədəbiyyatla məşğul olardı. Həkim Xəyyamın "Rübaiyyat"ını və Füzulinin "Leyli və Məcnun"unu nəzm ilə rus dilinə tərcümə edirdi. O tərcümələrdən bə'ziləri "Kəşkül" qəzetində hissə-hissə dərc olunardı.



adında qəribə bir hekayət yazıbdır[493]. Bu qəziyyənin vüquu səfəviyyə padşahlarından Şah Abbasın zəmani-səltənətinə təsadüf eləyir. Bu təəccüblü əhvalatın İran-zəmində həqiqətdə vaqe olub, ya olmamağına söz verə bilmərik. Amma yəqinən deyə bilərik ki, bu qisim əhvalat və qəzayat orada baş verə bilər. "Aldanmış kəvakib"də Mirzə Fətəlinin ümdə mətləbi İran vəzirlərinin səyahət və avamlığını və öz ali mənsəblərinə əsla layiq olmamaqlarını göstərmək imiş.

İnsafən bu mətləbi müsənnifi-mərhum böyük məharət ilə bəyan edibdir. "Aldanmış kəvakib"i oxuduqda yəqinlik hasil olur ki, İran kimi böyük bir dövlətin viran olmağına, "dövləti-əliyyənin" belə zəif və nəhif hala düşməyinə "ümənayi-dövlət" və "üləmayi-giram" və "vüzərayi-zülehtiram" olubdur. Bu rə'y və qövlün haqq və doğru olmağını Şah Abbasın müqərrəb vəzirləri və ərkani-dövlət onun hüzurunda lisani-bəlağətsənci ilə sübuta yetirirlər. Onlardan hər biri öz qəbahət və səfalətlərini kəmali-iftixar ilə bəyan edir.

Qədim şövkətli və əzəmətli İranı xarab edən və pozğun hala salan vüzəra cahilanə işlərini və tədbirlərini hüsni-xidmət və böyük hünər məqamında qoyub, dövləti-əliyyəyə sədaqətlə xidmət etməklərini sübuta yetirmək istəyirlər. "Aldanmış kəvakib"i oxuyandan sonra Mirzə Hüseyn xanın mərhum Mirzə Fətəli Axundzadəyə nisbət büruz etdiyi büğzü ədavət hansı mənbədən cuş etməyi vazeh olur.

Axundzadənin komediya yazan müsənniflərə və həqiqi ədibə məxsusi olan qabiliyyətlərindən birisi də budur ki, mərhum öz təmsilat və hekayətlərində əhvalatı və keyfiyyəti söylənən adamların hər birini öz dili ilə danışdırır.

Əkinçidən tutmuş vəzirə və padşaha kimi hər hansı sinfin dilindən söz açırsa, elə bir sayaqla söyləyir ki, guya müsənnif haman o sinfin və dairənin özündəndir və yainki onların sözlərini eşitdikcə bir-bir sinəsinə yığıbdır. Bu qabiliyyətdən əlavə Mirzə Fətəlinin dilində artıq dərəcədə nəməkrizlik, zarafat və şirinlik var. Hər kəs onun kəlamını oxuyur isə, könlü açılır və dodağı altında öz-özünə gülür. Mirzənin təbiətindən zövqü xoştablıq mayası və yaranmasında zarafat və lətafət xəmirəsi olduğu üçün həmişə onun meyli zarafatçı, lətifəgu və güşadəqəlb adamlar ilə imiş. Məzəçilik və zərifanə danışıb-gülmək onun təbiətinin təqazası olduğu üçün bə'zi işləri və danışıqları dəxi başdan-ayağa gülünc və zarafat imiş. Onun baməzə işlərini və dilindən söylənən lətifələri və türfə sözləri cəm etsək, gözəl bir kitabça əmələ gələr.

Şah Abbasın vəzirləri padşahın hüzurunda ulduzların sədəmeyi-üzmasını dəf' etmək üçün artıq vüqar və təmkin ilə danışdıqları sözlərə

diqqət yetirilsə, haman sözlərin tamamisi boş və biməzmun və mayeyi-istehza olmağına şübhə qalmaz. Belə ki, sərdar Zaman xan özünün sahibi-əqlü tədbir olmağını hüzzari-məclisi-xassəyə bəyan etmək üçün əsla mətləbə dəxli olmayan Osmanlı qoşununun İran üstünə hücumundan söz açıb deyir: "Əgərçi bizim qoşunumuz hesab və ədədcə tayifeyi-Osmaniyyədən kəm deyildi, nəhayət, mənim heyfim gəldi ki, firqeyi-naciyənin qoşununu güruhi-zallənin müqabilində tərəfə verdirəm. Ona binaən əmr etdim ki, Osmaniyyə sərhəddindən ta nəhayəti-mülki-Azərbaycan tamam dehatın ziraətini xarab etsinlər və yolları pozsunlar.

Vəqti ki, Bəkir paşa (Osmanlı əsgərlərinin sərkərdəsi) sərhəddimizə daxil oldu, əgərçi müqabilində bizim qoşundan bir nəfər görmədi, amma yollar bir mərtəbədə xarab olunmuşdu ki, əsla özü ilə topxana gətirməyə qadir olmayıb, ancaq atlı və piyadası ilə ənva'i-zəhmətdən sonra Təbrizə varid oldu və hər tərəfə dəstələr göndərib, zəxirə təhsilinə iqdam etdi. Əlinə bircə həbbə və bir öküz və qoyun düşmədi. Naçar üç gündən sonra üftanü xizan, ac və əfsürdə Təbrizdən kusi-rehlət döyüb qaçdı. Bu tədbir ilə mülki-İran tayifeyi-biganənin hücumundan məhfuz qaldı.

Yolları pozmaq və körpüləri yıxmaq bir mərtəbədə tədbiri-müfid göründü ki, dövləti-əliyyə Bəkir paşanın qaçmağından sonra dəxi belə səlah gördü ki, onları həmişə bu qərarda baqi qoysun, dübarə bu tayifeyi-biganənin ehtiyatı ilə. Bu təriq ilə dövləti-əliyyənin qoşunundan bir nəfərin dəxi burnu qanamayıb, əsakiri-mənsurənin cümləsi həmsayə düşmənlərin vəhşəti üçün salim qaldı. Belə işlər xüsusunda astaneyi-əliyyənin qoca iti tədbir göstərməkdə aciz deyil. Amma kəvakib ilə müxalifət etməkdə ağlım hər bir əlacdan qasir görünür".

Sərdar Zaman xanın bu guna öz hüsni-xidmətlərini tə'rif etməyi, ağıllı və tədbirli binagüzarlıqlarını vəsf qılmağı doğrudan da adama gülünc gəlir; "əsakiri-mənsurə" "güruhi-zallə"nin hücumuna davam gətirə bilməyib qaçır. Vətənin uğrunda, onun mühafizəsi üçün bir damcı da qan tökülmür. Bu heç... Məqami-heyrət burasıdır: öz əlləri ilə vətənin viran olmağı, əkinçilərin ziraəti, bağbanların bağü bostanları dağılıb altıüstə çevrilməyi, malü mə'vaşinin pərakəndə olması; yolların xarablığı, körpülərin uçurulub dağılmağı kəmali-iftixarla şahın hüzurunda söylənir və bu sözlərdən padşahın "astaneyi-əliyyənin qoca iti"nə əsla qəzəbi tutmur. Bu çox qəribə haldır!.. Sərdari-rövşən-zəmirin tədbir və səlahdidi ilə yolların dağınıq və körpülərin uçuq halda qalmağı bir dərəcədə səlah göründü ki, onları bu qərarda baqi saxlamağa hökm olundu, zira ki, tayifeyi-biganənin hücumundan ehtiyatda olmaq lazımdır.



Həqiqətdə həm gülməli və həm ağlamalı haldır!.. Ümuri-məmləkət belə şəxslərin ixtiyarında olduğu əsnada abadiyi-vətən və tərəqqiyi-məmləkət, əlbəttə, qeyri-mümkündür:

Xanemani ke, to başi məhrəm,
Vay bər siyrəte-an əhle-hərəm[494].

Həmin bu qərar üzrə "məclisi-xassın" sair üzvləri dəxi – ki, ibarət olsun vəzir Mirzə Möhsündən, müstövfi Mirzə Yəhyadan və mollabaşı Axund Səməddən – öz əhməqanə tədbirlər ilə və xilafi-əqlü qanun əməlləri ilə qoca və şöhrətli İranı belə fəna hala salmaqlarını, əhaliyə həddindən ziyadə zülm etməklərini, dini-paki-Məhəmmədini pozub, başqa bir hala salmaqlarını iftixar ilə şərh qılıb həmaqət və səfahətlərini bəyan edirlər. Əgər doğrudan da işin künhünə diqqət yetirilsə, İranın viran olmasına və bundan sonra onun bir də həyat və ric'ətinə ümid qalmamasına ümdə səbəb tamahkar, şöhrətpərəst, dünyadan bixəbər, avam və cahil vüzəra ilə üləma olublar.

Mərhum Mirzə Fətəli Axundzadə öz zamanının fəridi və ürəfavü üdəba dairəsinin ruhu məqamında imiş. Cümlə əhli-qələm və sahibi-elmü idrak ilə tanış imiş; cümlə şüəra və üdəbaya ol mərhumun hüsni-tə'siri keçibdir. Necə ki, sabiqdə zikr olundu, onunla Qarabağın müqtədir şairi Qasım bəy "Zakir" təxəllüsün mabeynində dostluq və yaxınlıq var imiş və bu dostluğa ümdə səbəb hər iki ədib və şairin qələmi, türfə kəlamı və təblərində olan zərafət və nəzakət olubdur.

Zakir Qarabağ mahalında vüqua gələn əhvalat və güzarişatdan və orada sakin olan nücəba, ürəfavü üləma sinfinin əf'alü ə'malından və xüsusən divan əmələsinin bəd və bihesab işlərindən, elat və dehat əhlinin dolanacağından və tərzi-məişətindən mə'lumat toplayıb, vaxtbevaxt sadə və gözəl şeirlər vasitəsilə yazıb dostuna göndərərmiş.

Zakirin tərcümeyi-halını yazdıqda məzkur namələrdən nümunələr göstərmişdik; oraya rücu etməli.

Zakir xalqının dilini və dolanacağını çox yaxşı bildiyi üçün Mirzə Fətəliyə yazdığı namələrdə özünün həqiqi milli bir şair olduğunu göstərmişdir. Mirzə Fətəli isə hər şeydən artıq dost tutduğu öz millətinin sadə dili və sadə dolanacağı olduğu üçün Zakirin bu mili ruhuna və milli ədasına artıq dərəcədə əhəmiyyət verərmiş və necə ki, yuxarıda zikr olundu, bə'zilərin rəvayətinə görə. "Hacı Qara" təmsilatının əslü binasını və Mərdi-xəsisin keyfiyyəti-halını Mirzə Fətəliyə mərhum Qasım bəy nəql edibdir və həmçinin həkimi-nəbatat Müsyö Jordanın sərgüzəştinə dair bir parə təfsilatı mərhum Axundzadə Zakirin dilindən yazıbdır. Vəli Mirzə

Fətəli bu hekayətləri qəribə bir dona geydirib, mislü bərabəri olmayan komediyalar vücuda gətiribdir.

Sabiqdə zikr olunduğu üzrə mərhum Mirzə Fətəli dostluqda artıq sədaqət və etibar göstərib, Qasım bəyin xilası yolunda çox çalışıb və axırda onun təmizə çıxıb vətəninə qayıtmağına səbəb olur. Bu barədə Zakir dostunu tə'rif edib yazır:

Aşina, müsahib, yarü həmsayə
Lazımdır yetişə qövrə, harayə;
Kitabətin dəyər mülki-dünyayə,
Nə hacət istəmək simü zər səndən.

Tək yaradıb səni vahidü yekta,
Əxlaqına, ətvarına mərhəba!
Neyləmisən Molla Səfi, Bəybaba –
Məmnundu, əzizim, bu qədər səndən?

O vilanın yoxdur bu yer tək pisi,
Təqəllübü, hərzəkarı, xəbisi;
Yaxşı gördüm tamam əhli-Tiflisi,
Razıyam, nəhayət, biştər səndən.

Mirzə Fətəlinin Qasım bəyə yazdığı namələrdən ancaq bir mənzumə ələ düşdü ki, burada dərc olunur. Bu məktubu Mirzə Fətəli dostu Zakirə yazıbdır 1271-ci[495] tarixdə məhərrəm ayının ibtidasında Mehdiqulu xanın qızı Xurşidbanu bəyim Natavan haqqında. Məktubdan belə mə'lum olur ki, o vaxtları Qasım bəy xan qızına yaxın imiş. Mirzeyi-mərhumun yazdığı qafiyələr zarafat təriqi ilədir:

Qasım bəy, eşitdim yaxın olubsan –
Xan qızına, axır nədir bu rəftar?
Edibsən xubları yüz il imtahan,
Eylərsən onlara yenə etibar?

Yeyib otağında şamü naharın,
Kəsdiribsən yasdığının kənarın,
Eşidirsən şirin-şirin göftarın,
Kişi, sənin, vallah, əcəb işin var?!

Dediyin qafiyə ona xoş gəlib,
Qaçan bəxtin indi sənə tuş gəlib,
Sövdalı başına təzə huş gəlib,
Təəccüb eylərəm besyarü besyar.



Səni pərivəşlər salıb bu halə,
Döndəriblər əlif qəddini dalə,
Çəkərdin onlardan həmişə nalə,
Nədir yenə dildə əzbər olub yar?

Xan qızı məhvəşdir, el bilir, aləm
Məhvəşlər atəşdir, bizik əqli kəm,
Yüz il xidmət edə oda bir adəm,
Yenə düşən dəmdə ona, bil, yanar.

Xudadan istərəm versin muradın,
Yamanlığa hərgiz çəkməzəm adın,
Yolunda zəhmətin, rənci-ziyadın
Mən çəkdim, o etdi məni şərmsar.

Özgə cəfaların dursun kənarə,
Nə lazım hər birin salmaq şümarə?
Xeyr işinə onun mən o diyarə
Şadü xürrəm getdim, qayıtdım bəs xar.

O qafiyən mənə çox etdi əsər,
Qalmadı könlümdə ondan bir kədər;
Novcəvandır, təkdir, izədi-davər
Eyləsin ömründə onu kamgar.

Rəvadırmı çəkə bixürdü bixab
Bəstəri-möhnətdə bu qədər əzab?
Duayi-xeyrinə eyləyin şitab
Siz də mənim kimi hər leylü nəhar.

Belə pəriruyin, heç səni tarı,
Rəvadırmı qəmdən sola üzarı?
Həm xələfdən xali ola kənarı?
Olsun ona mövlam yavərü qəmxar.

Mənim var gərçi bir az günahım,
Sən get hüzuruna, ol üzrxahım,
Söylə ki, ey şahım, ey qibləgahım,
İncimə, gər etdim şikayət izhar!

Mirzə Fətəlinin bu qafiyələri sadə və rəvanlıqda Zakirin kəlamına bənzəyir. Çox ehtimal var ki, Zakirə dəxi bu şivədə açıq lisan ilə şeir yazmağı Mirzə Fətəli öyrətmiş olsun. İbtidayi-kəlamda Mirzə Fətəli Xurşidbanu bəyimdən bir azacıq gilayə edib, onun Mirzəyə nisbət izhar qıldığı kəme'tinalığına işarə edir. Bundan mə'lum olur ki, onların

mabeynində cüz'i bir soyuqluq bəhmə gəlibmiş. Vəli kəlamın axırında pakzəmir Mirzə öz xətasına müqirr olub, dostu Zakirdən təvəqqe eləyir ki, xan qızının hüzuruna gedib üzrxahlıq etsin və şikayət izhar qılmağından rəncidə-xatir olmasın.

Mirzə Fətəlinin bu kağızı Xurşidbanu bəyimin bəstəri-qəmdə mərizə olduğu zamanü hala təsadüf edir və yəqinlik hasil olur ki, Mirzeyi-məhrum bu şeirləri Qasım bəyin kəlamını oxuyandan sonra yazıbdır. Qasım bəyin kəlamından belə anlaşılır ki, Xurşidbanu bəyimin knyaz Xasaya getdikdən sonra bir müddət övladı olmayıb və övlad ümidi ilə ol mərhumə özünə müalicə etdirib ondan naxoş olubdur. Bu əhvalın haqq və doğruluğu Zakirin və Mirzə Fətəlinin qafiyələrindən aşikarən görünür.

Zakir yazır:

Sipəhri-bərinin hilalı sənsən,
Şərafətdə mələk misalı sənsən,
Gülşəni-Xəlilin nihalı sənsən,
Barvər istərəm xudadən səni.
Məsihi çıxardan ərşi-əlayə,
Salan üftadələr başını sayə,
Yetmişdə İshaqı verən Sarayə
Qurtarsın bu rəncü inadən səni.

Xan qızının müalicə etməyinə işarə:

Çubi-çini nədir, qibləsən, nəsən,
Təəccüb eylərəm bu əhvalə mən;
Dəstgirin olsun Hüseynü Həsən,
Fərağət olasan cəfadən səni.

Axundzadə yazır:

O qafiyən mənə çox etdi əsər,
Qalmadı könlümdə ondan bir kədər,
Nocəvandır, təkdir, izədi-davər
Eyləsin ömründə onu kamkar.

Belə pəriruyin, heç səni tarı,
Rəvadırmı qəmdən sola üzarı?
Həm xələfdən xali ola kənarı?
Olsun ona mövlam yavərü qəmxar.

Eşitdiyimizə görə, Mirzə Fətəlinin burada zikr olunan əsərlərindən əlavə yenə də bir çox farsi və türki əş'arı vardır və lakin, məətəəssüf, onları ələ gətirə bilmədik və həmçinin Rzaqulu xan "Hidayət"[496] təxəllüsün tarixinə yazdığı tənqidini və Tehran şairi "Sürüş"[497] təxəllüsün qəsidəsinə təhrir etdiyi iradları axtardıq, tapa bilmədik. Bu əsərləri Axundzadənin möhtərəm fərzəndi Rəşid bəy bizə və'd etmişdi, heyfa ki, ona da əcəl fürsət vermədi.

Mirzə Fətəli Axundzadənin əsərləri əlli-altmış sənə olar ki, çapdan çıxıb aramızda intişar tapıbdır. Vəli onların bizə çəndan tə'siri keçməyibdir və Mirzeyi-mərhumun qədri bilinməyibdir.

Əgər müsəlmanlar bilümum və Zaqafqaziya türkləri bilxüsus o mərhumun qədrini bilsə idik, haqqında bir yaxşılıq və ehsanat edərdik; yadigaranəsi üçün onun adına məktəblər, kütübxanalar, teatrlar açardıq, stipendiyalar tə'yin edərdik və bir çox gözəl işlərimiz ilə qədirşünaslıq vəzifəsini ifa edərdik. Hələ ki, meydanda gözəgələn bir şey yoxdur, və qeyz əzan ki, 1911-ci tarixdə mərhum Axundzadənin təvəllüdündən yüz il keçmək münasibəti ilə Bakıda, Tiflisdə və Zaqafqaziyanın sair şəhərlərində yubiley tərtib olunub, onun komediyalarından bə'ziləri səhneyi-tamaşaya qoyulub və xatirinə bir neçələri tərəfindən mütəəssir nitqlər söylənib, bununla qədirbilməklik və haqqşünaslıq vəzifəsi ə'da olundu[498].

Bu yubileydə söylənən nitqlərdə çox böyük vədələr verildisə də çox arzulardan dəm vuruldusa da, vəli heç birinə əməl olunmadı. Hətta Axundzadənin əsərlərinin – ki, ələn onlar nadir tapılır, – təzə çapına da şüru' olunmadı. Bu yubileydən nəticeyi – xeyir olaraq ancaq iki xırdaca əsər qaldı. Onlardan birisi möhtərəm Əbdürrəhim bəy Haqverdiyevin yazdığı "Xəyalat"dır ki, bir məclisdə mərhum Mirzə Fətəli yüz illik yubiləsi (yövmi-alisi) münasibətilə tərtib olunmuşdur. İkincisi həqirin "Mirzə Fətəli Axundzadə" sərlövhəsilə yazdığı risaleyi-yadigaranədir ki, bu da mərhumun təvəllüdündən yüz il mürur etmək münasibətilə təhrir qalınmışdır*.

Mirzə Fətəlinin qədir və qiymətini bilmədiyimiz üçün onun əsərlərinə də əhəmiyyət vermədik; onlardan hissə almadıq. Əgər Mirzənin yazdıqlarına diqqət yetirsəydik və onlara əməl etsəydik, əlbəttə bu qədər tənəzzül etməzdik və bu qədər dalda qalmazdıq. Başlayaq bir-bir sadalamağa:

Birinci bu ki, əgər əlifbamıza təğyir verib hürufatımıza asanlaşdırsaydıq, oxumaq və yazmaq alatü əsbabanı qaydaya salsaydıq, tə'lim və tədrisdə bu qədər çətinliyə düçar olmazdıq. Az vaxtda oxumaq və yazmaq öyrənib, çox elm və fənnlərə dara olardıq. Məktəblər küncündə cavan və gözəl ömürlər çürüyüb badi-fənayə getməzdi. Bizim içimizdə dəxi böyük

* Mirzə Fətəlinin yövmi-alisi münasibətilə yazılmış mənzumatdan bərgüzidəsi möhtərəm Abbas ağa Qayıbov Nazirin kəlamıdır ki, aşağıda dərc olunacaqdır.

və məşhur üləma və hükəma zühur edərdi; müqtədir ədiblər və qabil yazıçılar, şairlər görsənərdi; dilimiz və yazımız qaydaya düşüb rövnəq tapardı.

İkinci, Axundzadə komediyalarında, göstərdiyi eyiblərimizə diqqət yetirib, onların dəfinə və islahına çalışsaydıq, bu qədər avam qalmazdıq, içimizdə dolacağımızda müşahidə olunan küfr və zəlalət xilafi-əql və qanun əməllər cari olmazdı. Oğruluqdan və əyrilikdən ikrah edib daşınardıq; halal kəsb dalısınca gedib şə'nü hörmət kəsb edərdik; zindanxanalar və məhbəsxanalar müsəlmanlar ilə dolu olmazdı.

Üçüncü, arvadlarımıza tə'lim və tərbiyə verib, onlar ilə hüsnimüamilə etsəydik, hüquq və ixtiyarlarını müraat edib zülm etməsəydik, bu vaxta qədər avam halında qalmazdılar, caduya və bitiyə inanmazdılar; övladlarına gözəl tərbiyə verərdilər; ərlərinə və qardaşlarına çox işlərdə köməkçi olub, məişətimizə rövnəq və ziynət verərdilər; yaxşı işlərə bizi qeyrətləndirib, fəna işlərdən və qəbih əməllərdən çəkindirərdilər, daşındırardılar; vətənpərvərlik və millətpərəstlik və dindarlıq kimi uca və müqəddəs hissələri bizim qəlbimizdə oyadıb bəslərdilər.

Dördüncü, müsəlman məmləkətlərində, xüsusən İranzəmində ümuridövlətə mübaşir olan vüzəra və vükəla və sair ərkani-səltənət – ki, Mirzə Fətəlinin əsrindən indiyə kimi gəlib gediblər, – "Aldanmış kəvakib"də zikr olunan qüsurlarından diqqət yetirib məmləkətlərinin mə'muru və səlahı üçün sərfi-himmət etsəydilər, Yusif şah öz müvəqqəti əyyamisəltənətində işlətdiyi binagüzarlıqları və tədbirləri icra etsəydilər, müsəlman məmləkətləri hərgiz belə fəna və pozğun hala düşməzdi və əcnəbi millətlərin çəngali-təsərrüfünə keçməzdi. Onlar da sair dövlətlər kimi qüvvət və miknət kəsb edib əmnü asayış üzrə yaşardı.

Bu tedad etdiyimiz eyib və nöqsanlarımızdan maəda Mirzə Fətəli yenə də bir çox təsəvvürlərimizi, köhnə adat və ayinlərimizi istehza təriqi ilə öz komediyalarında göstəribdir. Amma onlar bizim diqqətimizi cəlb etməyibdir və haman köhnə adətlər və batil əqidələr üzrə yaşamaqda varıq. Mirzə Fətəlini, necə ki, lazımdır, biz tanımamışıq və əsərlərini diqqət ilə oxuyub öyrənməmişik. O mərhum öz əsrinin həkimi-rövşənzəmiri və filosofu olubdur. Onun kimi dərin fikirli, dəqiq və ruhşünas bir ədib Azərbaycan türklərinin arasında bu vaxtadək vücuda gəlməyibdir.

Axundzadə öz zamanının Tolstoyu və Musa Bigiyevi[499] olubdur. Vəli onun qədri bilinməyibdir. Azadə fikirli, saf əqidəli və əqli-səlimə itaətedici bir vücud olduğu üçün çoxları onu bidin və laməzhəb adlandırıb təkfir edərlərmiş. Əqidəsi ucundan onun ən yaxın dostları və əqrəbası axırda ondan üz çöndərib iba etmişlər və vəfatında təşyiyi-cənazəsinə və



namazına bir kəs gəlməyib, dörd nəfər hammal artıq əhanətlə ol mərhumun tabutunu məzarıstana aparıb, namazsız, duasız və təlqinsiz dəfn etmişlər[500].

İndi də Mirzə Fətəli Axundzadənin adı zikr olunanda üzlərini turşaldan saluslar az deyildir. O cümlədən, "Riyazül-aşiqin" sahibi M.Müctəhidzadə kitabının dibaçəsində vəsf qaldığı İskəndər bəy Rüstəmbəyovdur ki, bəndeyi-həqirin Mirzə Fətəli Axundzadənin təvəllüdündən yüz il mürur etmək münasibətilə tərtib etdiyi risaleyi-yadigaranəni görüb də mütəğəyyirhal olmuşdur və bizim haqqımızda nasəza sözlər söyləmişdir ki, "Mirzə Fətəli Axundzadə kimi laməzhab şəxsi yad edib, onun şə'nində kitab yazan özü də gərəkdir mürtəb olsun".

Bilmək gərəkdir ki, İskəndər bəy Rüstəmbəyov özü də ədəblik iddiasında olub, şeir və qəzəl deməklə fəxarət eləyir. "Riyazül-aşiqin" sahibi kitabını onun səlahdidi ilə tərtib qalmışdır və ol cənabı bu gunə vəsf edir: "Hicrətin min üç yüz iyirmi beşində[501] gün cənab sərkar İskəndər bəy Rüstəmbəyov-ki, cümleyi-ə'yani-vilayətdən darayi-zəkavətü mə'rifət və iqlimi-danişü kiyasətdə vaqeən İskəndəri-zaman və zülmati-Qarabağ içrə abaən cədd üçün abi-həyat mənbəicövdü ehsan idilər, – hüzuruna müşərrəf olub, ayineyi-qəlbimdə müsəvvər olan müddəamı nişan verdim və şəraiti-bəndəliyi yerinə yetirdim. Mumaileyh isə zəbani-gövhərnisarı ilə buyurdular ki, gərək bir töxmi-yadigar məzrəeyi-ruzigardə əkmək ki, əbnayi-vətən ondan nəf'bərdar olsunlar və mütaliəsindən (fayda) təhsil edənlər müəllifinə rəhmət oxusunlar. Və bir məcmuə yazılmaq gərəkdir ki, hər səhifəsi qeyrəti-arizi-hur və hər sətri rəşki-zülfi – qılmanibehişti-biqüsur ola və röyət edənlər mail və qəmləri zail olub, bu sözlərə mütərənnim olsunlar:

Bəh-bəh bu nə riyazdır, ey əndəlibi-can,
Yoxsa behişt qit'əsidir olmayır xəzan".[502]

Bəli, "iqlimi-daniş və kiyasətdə vaqeən İskəndəri-zaman və zülmati-Qarabağ içrə çün abi-həyat mənbəicövdü ehsan" olan Rüstəmbəyov cənabları Mirzə Fətəli Axundzadə kimi müqtədir ədiblərimizə və böyük mütəfəkkir və reformatorlarımıza lən oxuduqda işlərimiz artıq sürətlə surət tapar, daha tərəqqi etməyimizə şübhə yeri qalmaz...

Beş yüz sənə bundan müqəddəm Konstantski sobor ictimai qərardadı ilə Avropada Yan Qusu[503] əqaidi – diniyyəsi və azadeyi-əfkarı ucundan oda atıb yandırdılar. İndi bizim on doqquzuncu əsrin axırlarında və iyirminci əsrin ibtidasında, bu tərəqqi dövründə yaşayan millət və camaatı-

mız cəhalət və təəssübdə Qusun əsrində yaşayan fanatiklərdən dalda qalmayıblar. Əgər Mirzə Fətəlinin və Hacı Əziminin müasirləri əlində ixtiyar və hökumət olsaydı, bilaşübhə, hər ikisini oda atıb yandırardılar.

Yan Qus oda atılmazdan qabaq düşmənlərinə xitabən dedi: "Yüz ildən sonra bir laçın uçub gələr, onu tutub yandırmaq sizə müyəssər olmaz". Filhəqiqə, Qusun oda atılmasından yüz il keçmiş məşhur reformator Martin Luter[504] gəldi və Rim papasları pozğun hala saldığı həzrət İsanın dinini qəllü qəşdən təmizləyib safa çıxartdı.

İndi görək Mirzə Fətəli Axundzadədən və Hacı Seyid Əzim Şirvanidən sonra – ki, onlar müdam avam və hiyləgər ruhanilərin təzvir və fəsadları ilə cəngdə olub,-rütbəsiz bu dünyadan getdilər, müsəlmanların da Lüteri zühur edib onları haqqa irşad qılacaqdırmı?

Mirzə Fətəli Axundzadənin yüz illik yubiləsi münasibətilə Abbas ağa Qaibzadə "Nazir"[505] təxəllüs yazdığı kəlamı burada dərc etməklə onun barəsində bu qədər yazdığımıza hələlik iktifa edirik.

Kəlami-Nazir:[506]

Ey ədəbi-şəhirü bihəmta,
Mayeyi-fəxri-milləti-islam!
Ey xirədməndi-arifü dana,
Əhli-fəzlü kəmal, mərdi-tamam!

Vətən övladı cəm, olubdu bu gün –
Ki, səni layiqincə yad etsin.
Göstərib izzü ehtirami-bütün,
Sənə ixlasın izdiyad etsin.

Bu nə xoş gün, nə yaxşı saətdir,
Səni fəxr ilə yad edir millət!
Vətən üçün zəhi səadətdir –
Ki, oxur ruhi-pakına rəhmət!

Millətə şahrahi-elm açdın,
Mərhəba, ey mühəndisi-qadir!
Vətənə töxmi-mə'rifət saçdın
Sən, ey ustadi-kamilü mahir!

Eybü nöqsani-milləti bildin,
Etdin anı beeynihi təsvir;
Əməli-fasidin ə'yan qaldın,
Ta ki, islahına edə tədbir.



Yə'ni yazdın sən altı təmsilat,
Bir hekayət də mülhəq etdin ona;
Eşidən onu qaldı valehü mat,
Əl çalıb afərinlər etdi sənə.

Millətin müşkülata uğramağı
Xətti-müşküldən olduğun duydun;
Biliben özgə çarə olmamağı
Xətti təğyir üçün sən əl qoydun,

Bir əlifbayi-tazə tərh etdin,
Şivasi xoş, oxunmağı asan;
Rəsmi-tə'limi zikrü şərh etdin,
Qoymadın bir qüsuru, bir nöqsan.

Mətləbi qanmamış əgər də avam,
Sənə bər'əks getdi keçmişdə;
Bilməmiş məqsədü məramı tamam
Oldu mane sənə bu xeyr işdə.

Bilmədi ol ki, fikri batil imiş,
Sərbəsər xam imiş xəyalatı;
Məhz səndən nicat hasil imiş,
Sən imişsən açan mühimmatı.

Vətənin borcunu sən etdin ə'da,
Qəlbü vicdanın eylədin rahət;
Borclu qaldı vətən və leyk sənə,
Onu vadar edir bu gün qeyrət –

Ki, sənin borcunu ə'da etsin,
Ta ki, qəlbi tapa onun təskin
Cümlə övladını nida etsin –
Ki, bu işdə ola şərikü müin.

Nə sayaq borcu ol ə'da edəcək?
Deyə bilməm onu ələttəyin;
şə'ninə layiq iş bina edəcək?
Deyə bilməm bunu sərihü yəqin[507]

# MOLLA QASIM ZAKİR

Şəki şairlərindən Mirzə Fətəli Axundzadənin və qarabağlı Qasım bəy Zakirin müasiri olan Molla Qasım fəqir və biçiz bir molla imiş ki, öz vaxtında Nuxa şairlərinin ustadı hesab olunurmuş. Molla Qasımın atası dəxi molla imiş ki, ismi Molla Muraddır.

Molla Qasım Nuxa şəhərində Yuxarıbaş məhəllədə sükunət edərmiş. Tarixi təvəllüdü mə'lum deyil. Tə'lim və tərbiyəsi Nuxada atası Molla Muradın təhti-nəzarətində olubdur.

Təb'i-Səlim sahibi olduğu üçün hər qisim əş'ar və asar vücuda gətirmişdi. Şüğlü sən'əti məktəbdarlıq, mollalıq olubdur və lakin ol vaxtı mollalıqdan artıq bir mənfəət hasil olmadığı üçün kəsbi-məaş yolunda başqa işlərlə dəxi-kümdarlıq kimi məşğul olarmış. Məşhur qövlə görə, şairin dilində dügün, rəkakət var imiş. Çox vaxtı danışıq zamanında və acığı tutanda dili tutularmış. Amma şeir söyləyəndə rəkakətdən bir əsər görünməzmiş. Şe'ri çox rəvan oxurmuş. Nuxalı Molla Qasım Zakir qarabağlı Qasım bəy Zakir ilə həməsr imişlərsə də, bir-birini tanımazlarmış. Təəccüb burasıdır ki, hər iki şairin isimləri "Qasım", təxəllüsləri "Zakir" olubdur. Hər ikisinin təb'ləri mövzun və zərif olduğu üçün əksər ittifaqlarda birisinin kəlamını qeyrisinə nisbət edərlərmiş və halan ki, ərbabi-fəsahət hər birinə nəzər yetirdikdə təfavütünü görüb təşxis və təmyiz edər.

Molla Qasım təxminən altmış beş və ya yetmiş sənə bundan müqəddəm qırx beş sinnində vəfat etmişdir. Belə rəvayət olunur ki, Şirvan mahalında Molla Zakiri şairə bir qız şeir meydanında məğlub edibdir və şair bundan ziyadə mütəəssir olaraq zəhərlənib orada dəfn olunubdur. Bu rəvayətin doğruluğuna şübhə var. Əgər filhəqiqə Şirvan vilayətində belə bir şairə və Molla Zakir kimi müqtədir əhli kəlama faiq gələn qız olmuş olsaydı, hərgiz binişan qalmazdı, namü şöhrəti dillərdə söylənərdi və şeirlərindən bir əsər qalardı.

Molla Qasım Zakirin əsərləri çox isə də, dağınıq və pərişan haldadır. Onlardan bir parası cənab müfti Hüseyn əfəndi Qaibovun "Məcmuə"sində tapıldı və bir neçəsi pərişan övraqda göründü. Nümunə olaraq bə'ziləri burada dərc olunur.

Qəzəli-Molla Zakir:

Əsiri-bağı-hüsnün mən tək olsa bülbüli-şeyda,
Oxur kuyində zövq ilə "fəsübhanəl-ləzi əsra"[508]



İki məstanəvü məxmur çeşmin fikr edən tərsa
Unutmaz, dildə zikr eylər ki "amənna və səddəqna".

Əsasi-eşqi qurdun, keç fənadən, tut rəhi-üqba,
İcarət eyləmə kərkəs kimi dünyavü mafiha.

O tari-kakilin feyzin alıbdır gərdəni-mina,
Onunçün qarə geymiş ruzigarın ol şəbi-yelda.

Əgər ol mahrudən zərrə, Zakir, görməsəm beyza,
Axar seylabi-əşkim, çeşmeyi-qəmdən olur dərya.

Bu qəzəldən maədə Zakiri-Nüxəvinin iki natamam qəzəlləri xoşməzmun kəlamlar cümləsindən olduğu üçün aşağıda zikr olunur. Bu natamam qəzəllər müfti əfəndinin "Məcmuə"sindən götürülübdür.

Birinci qəzəl:

Könül əhli-cahan içrə olub bir şux dustağı,
O şuxun şux rəftarı çəkibdir sinəmə dağı,

Edibdir gözlərim yaşı binayi-ömrümü viran,
Mənim viran olan könlüm olubdur bayqu yığnağı.

Ləbi-lə'li-şəkərbarı lətafətdə, təkəllümdə,
Sanasan bağ ara titrər səbadən lalə yaprağı.

Nə hacət badəvü sağər, dağıtdın huşumu sərdən,
Məni məstü xərab etmiş o şuxun əyri baxmağı[509].

İkinci qəzəl:

Mey nəş'əsi gətirdi məni xüm ayağına,
Mən oldu rəhnüma yenə kövsər qırağına.

Bir büt xəyalü mehrimüzi aldı aqibət,
Sən'an kimi buraxdı biri tərsa dağına.

Lə'li-ləbin güzarına düşmüş həcər yolu,
Ya hindlər düzülmüş o Zəmzəm qırağına?

Şol türrələr ki, tərfi-bənaguşu bəkləyib,
Ömrüm quşudu yoxsa qonub gül budağına?

Eşqin əlacı olmaz, əgər gəlsə yüz təbib,
Ta həsrət ilə dəyməyə ləb yar dodağına[510]

Əyzən kəlami – Molla Qasım:

Göz qaldı yolunda, namdarım
Səbr etməyə olmadı qərarım.

Qurbanın olum, təğafül etmə,
Sənsiz mənim olmaz ixtiyarım.

Ey gənci-məlahətin ziyasi,
Sərmayeyi-dürri-şahvarım,

Gün kimi camalının yanında
Bir zərrəcə yoxdur etibarım.

Cəllad baxışlı, ahu gözlü,
Ey kakili-zülfi-şəkkbarım,

Yoxdur mənə sənsiz, ey yeganə,
Hicran günü yari-qəmküsarım.

Mən Zakiri-bəndeyi-qulaməm,
Sən xosrovi-eşq, tacidarım!

Müxəmməsi-Zakir:

Ağa, bu gülşəni-aləmdə bəndə xar qalsınmı?
Deyim dərgahına bir ərzi-halım var, qalsınmı?
Yazıb hali-dili şərh eyləyim, təkrar qalsınmı?
Özün insaf elə, könlümdə atəş bar qalsınmı?
Sənin tək mərd ağası olan naçar qalsınmı?

Sənin qurbanın ollam kim, neçün müşkülgüşasən sən!
Həqiqət dərdməndə görməyən möhnət rəva sənsən!
Şikəstəbəstələr xatirlərinə mumiyasən sən!
Təmamən əhli-dərdin dərdinə fikri-dəvasən sən!
Rəvadır bəstəri-zillətdə dil bimar qalsınmı?

Dedin məddahi – nakəs olma, əş'arə qələm çəkmə!
Cəfa vermə dili-əfkarına, cövrü sitəm çəkmə!
Bu dövrani-fənadən zərrəcə ahü ə'ləm çəkmə!
Buyurmuşdun səni bərdaşt qıllam, hiç qəm çəkmə!
Çəkir həsrət könül, bəs didə giryan, zar qalsınmı?

Sənə canım fəda olsun ki, sən ərbab-şövkətsən,
Hüzuri-vacibül-ərzim, neçün miri-vilayətsən,



Kərəm kanı, ədalət mə'dəni, bəhri-səxavətsən,
Çirağı-mə'rifət, həm pərtövi-xurşidi-himmətsən,
Könül ayinəsi, ey sahiba, bəs tar qalsınmı?

Keçər hər kimsənin rə'yincə, bir növ'i mədarı var,
Bu gülzari-fənadə könlümün çox ahü zarı var,
Rəvadırmı sənin tək dadrəs kim, tacdarı var,
Təmamən əhli şəhrin hər birinin kəsbü karı var,
Gəzib sərgəştə Zakir hər tərəf, bikar qalsınmı?

Bu müxəmməs mərhum Molla Zakirin öz dəstxəttilə göy və qalın kağız üstündə nəstəliq şivəsilə yazılmış bir əsərdir. Bu nadir nüsxəni cənab Rəşid bəy Əfəndizadə Nuxada tapıb, lütf üzü ilə bizə ianə etmişdir. Əgərçi məzkur vərəqparədə yazılmış xətt açıq oxunur və lakin Molla Zakir hürufi-müqətəə cümləsindən olan "د", "ر", "و" hərflərini bir sayaq üzrə – yə'ni cümləsini "د" hərfi kimi yazdığından və "nuni-səğir"in (ك) qabağına nöqtəli "nun"(ن) izafə etməklə əvvəl dəfə yazı bir az çətinlik ilə oxunur.

Bu müxəmməsdən Molla Qasım Zakir fəqir, möhtac və kəmbəzaət bir şəxs olduğu anlaşılır. Şair öz müasiri Şəki ağalarından miri-vilayət və sahibi-dövlət və hökumət olan bir vücuda kəmali-əczü inkisar ilə rücu edib, ondan bir mənsəb və qulluq istəyir. Şairin kəlamından mə'lum olur ki, məzkur ağa əhli mürüvvət və sahibi-mə'rifət bir şəxs imiş ki, məlcəi-füqəra və mərcu'i-züəfa hesab olunurmuş. Necə ki, şair onu bu ibarələr ilə vəsf qılır: "kərəm kanı", "ədalət mə'dəni", "səxavət bəhri", "mə'rifət çırağı" və "himmət şəmsinin pərtövü".

Müxəmməsin axırında şair öz dəstxəttilə bu sözləri də qeyd edibdir: "Çün vacib idi, hüzura ərzü təqrirü bəyan eylədik, sahib ixtiyarsız".

Bu ağa yəqin ki, Fətəli xanın oğlu mərhum Kərim ağa Fateh imiş ki, sahibi-mə'rifət və səxavət bir zat olduğu dillərdə söylənərmiş. Onun tərcümeyi-halı babında gələcəkdə mə'lumat veriləcəkdir.

Müxəmməsi-müstəzadi-Molla Zakir:

Sə'd bar şükr dideyi-xummarını gördüm,
Ey ruhi-mücəssəm!
Badami-siyəh, nərgisi-məstanını gördüm,
Qəm çəkmərəm ölsəm.
Ey sərvi-qəbapuş ki, rəftarını gördüm,
Oldusa qədim xəm.
Ömrüm başa yetdi güli-ruxsarını gördüm,
Vəslin mənə mübhəm.
Sabit olan ancaq sənin iqrarını gördüm,
Ey şahi-müəzzəm.

Nadir olu bir sən kimi sərdari-fərəhnak,
Ey bəxti-hümayun!
Haşa ki, sənin tək ola bir sahibi-idrak,
Hikmətdə Fəlatun.
Çün kakilin etdi neçə Harutu xətərnak,
Olmaz belə məftun.
Zülfi-siyəhindir səbəbi-qatili-Zöhhak,
Kar eyləməz əfsun.
Gisu demək olmaz, iki şahmarını gördüm,
Gənc üstünə məhrəm.

Vazeh görünür fe'li-ləbindən sənin, ey ruh,
E'cazi-Məsiha.
Gər qılsa təəmmül səni girdaba düşər Nuh,
Ey gövhəri-yekta!
Haşa ki, cəmalın tək ola lame'i-məftuh,
Mehrü məhi-dünya.
Müşki-Xütən ahulərini eylədi məcruh
Nəzzareyi-ziba.
Qəmzən həşəmi navəki-müjganını gördüm,
Dil oldu müsəmməm.

Eşq atəşinə yanmağa mərdanəlik istər
Həmtayi-səməndər.
Şəm'i-ruxi-cansuz ola, pərvanəlik istər,
Ey nuri-müsəvvər.
Mə'şuqə məgər aşiqə biganəlik istər,
Ey şahi-sitəmgər?
Gördüm səni, könlüm rəhi-bütxanəlik istər,
İnsaf elə, kafər!
Sən'an-sifət ol həlqeyi-zünnarını gördüm
İman evi bərhəm.

Qurtar məni-biçarəni bu hicrü bəladən,
Bəsdir bu mətalib.
Əl çək, dolanım başına, bu cövrü cəfadən,
Axır nə münasib?
Billah, sənə ustad deyirlər bu ə'dadən,
Hər nakəsə raqib,
Gündə neçə yüz laf uran mehrü vəfadən
İqrarına kazib.
Zakir, dediyin əhli-vəfa yarını gördüm
Əğyar ilə həmdəm.



Müxəmməsi-Molla Zakir:

Ey gül, bu lətafətdə sənə yoxdu qərinə
Müjdə veri Yusif bəsi hüsnün xəbərinə,
Eşqin neçə üşşaqi salır bəhri-dərinə,
Çatmaz ləbinin Xızrü Məsiha əsərinə,
Qəvvas ola gər məxzəni-dərya göhərinə.

Ey şahi-məlahət, bu raviş var ola səndə,
Bülbül oxuyur vəsfini gülzari-çəməndə,
Qəmzən oxu yüz qan elədi mülki-Xütəndə,
Xalın həbəş ahulərini saldı kəməndə,
Zülfi-siyəhin verdi nəsəq Çin şəhərinə.

Nə həddi var Əflatun edə lafi-kəmalın,
İskəndəri zülmətə salır şəhdi-zülalın,
İman evinin payəsidir nöqteyi-xalın,
Faiq gəlü bir zərrə sənin nuri-cəmalın
Çərxi-fələyin pərtövi-mehrü qəmərinə.

Eşqin ələmi saldı mənim canıma əxgər,
Ey bürci-səadətdə gəzən nuri-müsəvvər;
Ey qaməti tənnaz olan rövnəqi-məhşər,
Xaki-qədəmin feyzi əgər olsa müyəssər,
Kafərdi o kəs üz çevirə xüldi-bərinə.

Qorxum budu zəngari-xətin üz verə nagah,
Axşama dönə ruzi-ümidim mənim, ey mah,
Tə'n bəndə duasını qəbul eyləsə hərgah,
Əhdim budu, ey şux, cəfa yetməsin əsla
Əğyar əli ol daməni-vəslin kəmərinə.

Hicran ilə məsdud isə bu qəlbi-müzəyyən,
Ol navəki-müjganın edib sinəmi rövzən;
Qurbanın olum mən sənin, ey arifi-pürfən,
Ceyran quzusu etdi mənim könlümü məskən,
Səyyadi-qəza düşdü onun rəhgüzərinə.

Zakir sənə bildirmədimi elmi-nəsihət?
Var eşq təriqində neçə bari-riyazət,
Asan görünür xəlqə məgər xəncəri-ülfət,
Məstanə olub eyləmisən lafi-məhəbbət,
Tab eylə, könül, atəşi-eşqin şərərinə.

Qafiyeyi-Molla Zakir:

Bir namə yazmışdın, gözəllər şahi,
Gəldi, məni-mübtəlayə yetişdi.
Guşeyi-külahım fəxri-namədən
Gedib çərxi-müəllayə yetişdi.

Şəhbazi-aləmsən, istərəm səni,
Allahı sevirsən, unutma məni;
Guya ki, Yusifin gül pirahəni
Ol Yə'qubi-binəvayə yetişdi.

Kim əl çəkər sən tək nazikbədəndən,
Şəhbazi-bibədəl, gülpirəhəndən;
Ol zaman ki, xəbər bilmədim səndən,
Ahü naləm Məsihayə yetişdi.

Mən dönmənəm, ölsəm əhdü beyətdən,
Düşməsin məzacın istiqamətdən;
Gəldi namə sən tək mahtələtdən,
Başımıza şö'ləsayə yetişdi.

Sən Molla Zakirin qibləgahısan,
Məlahət şəhrinin padişahısan,
Aşiqi-sadiqin nəzərgahısan,
Səadətin Sürəyyayə yetişdi.

Molla Zakirin xoruzunu çaqqal aparır və Molla xoruzun səsini eşidib, dalısınca gedib, onu çaqqalın ağzından saldırır və xoruz nimcan olduğu əsnada şair ona xitabən istehza təriqincə bir neçə sözlər deyir.

Bizim əlimizə düşən nüsxədə şe'rin vəznü qafiyəsində qələt çox olduğu üçün düzgün oxunmağı müşkül oldu.

Bu şeirlər ilə Molla kəlamı xətm edir:

Əgər eşidibsən, olarsan təskin,
"İza caə əcəlühüm[511] ayəsin
Zakir kimi qəlbini tut mütməin,
Gedirsən cənnətül-mə'vayə, xoruz!

Müsəmməni-Molla Zakir:

Ey gül, sən əgər şəhi-cahansan!
Hökm eylə ki, nazənini-cansan!
Sərdari-əmiri-aşiqansan,
Bəhrami-xədəngi-zəmişansan.



Sən navəki-xəncərü sinansan,
Cəlladi-sitəmgəri-zamansan.
Öldür məni, vermə bir aman sən,
Bais ki, rəqibə mehribansan.

Ey Gövəri-Qülzümi-kəmalat
Ey nuri-xudavü mehri-zərrat,
Bir kimsəyə üz verən mühimmat
Sənsən ona müqtəzayi-hacat,
Bu fikri-məhal səndə, heyhat,
Dün nərgisi-məstin oldu isbat.
Dedi səni saqiyi-xərabat,
Əz badeyi-nazi-sərgiransan.

Ey pərtövi-asimani-qüdrət,
Ey mə'dəni-gövhəri-məlahət,
Ey lə'li-ləbi Məsihadət,
Səndən kimə eyləyim şikayət?
Hicran ilə keçdi ömrü müddət,
Ey rəsmi-vəfadə bimürüvvət,
Ey gülşəni-əhdi-bidəyanət,
Gər sərv ola qamətin, rəvansan.

Ey kişvəri-hüsn padişahi,
Ey əhli-ziya ümidgahi,
Ey bəndeyi-asi üzrxahi,
Ol külli-xəlayiqin ilahi,
Xəlq eylədi səbzəvü giyahi,
Gülzari-cəmalının gəvahi,
Ey əhli-bəsirətin pənahi,
Sən sün'i-bədii-laməkansan.

Zakir, bu nə afətü bəladır?
Bu hadisədən nə müddəadır?
Çün dil bu məşiyyətə rizadır,
Dünyada bu özgə macəradır.
Üşşaq olanın işi cəfadır,
Mə'şuqə həmişə bivəfadır.
Könlüm quşu tikmə bibinadır,
Bu nəxli-bəlada aşiyansan.

Vəsf və tə'rifi-dilbər babında tənzim olunmuş əş'ari-müsəddəsəni – ki, aşağıda zikr olunur, – bə'ziləri qarabağlı Qasım bəy Zakirə və bə'zi digəri nuxalı Molla Qasım Zakirə nisbət etmişlər. Bizim anladığımıza görə, bu kəlam gərək Qasım bəyin olsun[512]. Buna şiveyin-lisan dəxi

şəhadət verir və bundan əlavə çox ehtimal var ki, bu şeirləri Qasım bəy gülablı Kərbəlayı Səfi Valehin kəlamına nəzirə olaraq yazmışdır və Kərbəlayı Səfi də məzkur kəlamı, bə'zi rəvayətə görə, Molla Pənah Vaqifin fərmudəsi ilə təzə səbkdə inşa etmişdi*. Haman kəlam budur:

Gözləyən kimsə, gözüm haqqı, deməz ay sənə,
Nəçidir ay vəcahətdə ola tay sənə?
Sən kimi görüm onun çöhreyi-tabanımı var?
Xali-hindusumu var, zülfi-pərişanımı var?
Bir sarı rənglicədir əvvəli əyri nun tək,
Elə ki, keçdi iki-üç gün olu bir parə çörək.

Bə'zi məclisdə qədin sərvü sənubər oxunur,
Tanrı bilsin ki, bu saf qamətinə şər' oxunur.
Qamətin kimi onun seyri-xuramanımı var?
Əzmi-cövlanımı var, afəti-dövranımı var?
Bağ-bostanda əkər bağban onu tək-tək,
Bundan ötrü ki, kümə məsrəf olur tirü dirək.

Müddəilər gözünə nərgisi-fəttan desələr,
Kim inanır bu sözə, göz görə böhtan desələr.
Nərgisin çeşmi-xumarın kimi məstanımı var?
Tiği-bürranımı var, navəki-müjganımı var?
Yaz olur, həqdi bitər, bir şeyə olmaz o gərək,
Əqli zad gəsməz uşaqlar yığar anı görcək.

Ağzını duş biri qönçəyə nisbət söləmiş,
Heyf mən olmamışam, bu sözü xəlvət söləmiş.
Qönçənin ağzı nədir, ləfzi-dürəfşanımı var?
Lə'li-meygunumu var, gövhəri-qəltanımı var?
Həmdəmi xar, özü bibəhrəvü həm ömrü gödək,
Dağılır hər vərəqi bir tərəfə bad əscək.

Nə rəvadır, ləbi-lə'lin meyi-gülfam olsun,
Onu bədnam qılanlar özü bədnam olsun!
Lə'li-nabın tək onun duzluca xəndanımı var?
Abı-heyvanımı var, dərdlərə dərmanımı var?
Əslü zatı bu ki, bir bostlik ənguri-tənək,
Quyşaq üzüm suyuyü mənzili bir saxsı sənək,

* Kərbəlayi Səfinin şe'ri belə başlanır:
**Ləbinə nazlı yarın badeyi-gülfam dedim,**
**Tündü təlx oldu. mənə məstü cünun olma, – dedi.**



Zülfünə sünbüli-tər kim ki, desə, ölməlidir,
Urula payinə zəncir gərəkdir, dəlidir.
Sünbülün səfheyi-ruxsardə dövranımı var?
Ənbərəfşanımı var, nikhəti-rizvanımı var?
Bir ələfdir ki, yeyər daim onu at, eşşək,
Əvvəli gah təbah, axırı biqürb, təzək.

Ağzıma gendi desəm limu əgər püstanə,
Ol iki qübbeyi-nur, tazəvü tər püstanə.
Eyşü nuşində onun ləzzəti-ruhanımı var?
Səhni-meydanımı var, zövqi-firavanımı var?
Özü bədşəkl, ağızda təmi manəndeyi-zəg,
Bir malın qiyməti olmaz kişi satsa yüz ətək.

Ziynəti-kuyini gərdunə bərabər deyənin
Cırasan ağzı, qulağın döşünə hər döyənin –
Ki, göyün, hərzə kişi, lölöi-mərcanımı var?
Dürri-məknunumu var, lə'li-Bədəxşanımı var?
Sanıb əncüm görünür həqqi tühi tasi-fələk,
Çərx mir'atına yerdəndi düşüb əksi-çiçək.

Qoyma əğyarı səri-kuydə mə'va tutsun,
Aşiqi-sadiqini bülbüli-şeyda tutsun.
Zakirin kimi onun sövti'-qəzəlxanımı var?
Təb'i-mövzunumu var, şe'ri-nümayanımı var?
Eşidən incir onun tərzi-nəvasın bişək,
Şivəsi cəngü cədəl, naləvü əfğanı kələk.

# KƏRİM AĞA FATEH

Kərim ağa ibn Fətəli xan "Fateh" təxəllüs Şəki şairlərinin bərgüzidələrindən birisi hesab olunur. Kərim ağa Şəki xanlarının xanədanından olmağa görə, nəcib və alitəb bir zat imiş; familiyası – Şəkixanov. Mirzə Fətəlinin müasiri olubdur və onun xatirini əziz tutarmış və hər dəm ləyaqətli töhfələrlə Mirzəni yad edərmiş.

Fətəli xan Şəkidə xanlıq edən zamanı hicrətin 1235-ci[513] salında Şəki vilayəti Rusiyanın təhti-təsərrüfünə keçdi və Fətəli xan rus dövləti tərəfindən təsdiq olundu.

Fətəli xanın fərzəndi-ərcüməndi Kərim ağa atasının təhti-himayətində nəşvü nüma tapıb, gözəl tə'lim və tərbiyə almışdır. Fars və ərəbcə yaxşı savadı var imiş. Təb'i-səlim sahibi imiş. Özləri əhli-kəmal və sahibi-hal olduğu üçün üləma sinfini, üdəba və şüəranı ziyadə dost tutarmış və müdam məclisini onların vücudu ilə müzəyyən qılıb həqiqi xan tərzində güzəran edərmiş.

Kərim ağa Fateh hicrətin 1274-cü[514] tarixində Nuxa şəhərində yetmiş beş sinnlərində vəfat edibdir.

Fatehin öz əsərlərindən cəm olunmuş mükəmməl bir divanı vardır və lakin təb' olunmamışdır. Əsərlərinin çoxu fars dilindədir; türkcə olanları bunlardır ki, dərc olunur.

Peyğəmbərimiz Məhəmməd-əl-Mustafa səlləllahü əleyhin mədhində demişdir:

Düri-dəryayi-rəhmət, gövhəri-kani-vəfadır bu!
Güli-gülzari-izzət, sərvi-bağî-istəfadır bu!

Şəhi-bəzmi-nəbüvvət, sərvəri-mülki-risalətdir,
Məhi-bürci-şərəf, xurşidi-övci-ənbiyadır bu!

Qılan jəngi-günahı pak kim, abi-şəfaətlə,
Məhəlli-lütfi-həqq, danayi-sirri-kibriyadır bu!

Edib dini-mübini aləmi-rəşki-İrəm mülki,
Salıbdır rəxnələr kəffarə, şər'i-Mustafadır bu!

Fəzayi-məqdəmi təqbili-əşrafi-məlayikdir,
Türabi-bargahi qibləgahi-övliyadır bu!

Vücudunda ə'yan ayati-həq ərbabi-idrakə,
Məqami-qürbdə ayineyi-vəhdətnümadır bu!



Kəlami-əltəfi məxluqə rəhmət olmağı bişək,
Vücudi-əşrəfi dünyayə şəm'i-pürziyadır bu!

Sən ol valacənabın zikrini qıl hər dəm, ey Fateh –
Ki, dərd əhlinə zikri daima eyni-şəfadır bu!

Qəzəli-Fateh:

Gətir qəm dəfinə kim, badeyi-gülrəng, ey saqi,
Könül ol gülrüxün lə'li-ləbinin oldu müştaqi.

Düşüb səhralərə nəxcir çeşmin mübtəlasilə,
Geyik tək dərbədər kim, həm olub vəhşilər ortaqi.

Gözüm mərdümləri seyli-sirişkin payimalıdır,
Vətən bir kimsə qılmaz, hər məkan olsa su oynaqi,

Əcəbdir mey içib şəhdi-ləbindən zəhr peydərpey
Siyəhtalelərin dönmək rəvadır zəhrə tiryaqi.

Məni-divanə bənd oldum səri-zülfün həvasində,
Cünun əhli olur, əlbəttə kim, zəncir dustaqi.

Təbibə eylədim izhar dərdim, söylədi bilmən,
Əlacı yoxdur ol zəxmin, dəyibdir qəmzə qeynaqi.

Könül dağın nihan əğyardən qıl, əbsəm, ey Fateh –
Ki, görməzsən, nihan qılmış qərasın lalə yapraqi?

Mərhum Kərim ağa Fatehin burada təstir olunmuş hər iki əsəri onun alim və sahibi-təb'i-səlim olduğunu göstərir. Əvvəlinci kəlam – ki, Fateh peyğəmbəri-valatəbarımızın şə'ni-aliləri vəsfində deyibdir, – Nabi əfəndinin kəlamına bənzəyir. Onun ikinci kəlamı müasiri olan Qasım bəy Zakirin kəlamına oxşayır. Əfsus ki, Fateh türk dilində başqa əsərlər vücuda gətirməyibdir; gətiribsə də, onlardan bizim əlimizə düşəni olmadı.

# İBRAHİM ƏFƏNDİ NİCATİ

Nuxa şəhərində nəşvü nüma tapıb tə'lim və tərbiyə almış şüəradan birisi də mərhum İbrahim əfəndi ibn Mustafa əfəndi olubdur ki, Mirzə Fətəli Axundzadənin və Kərim ağa Fatehin müasiri imiş. Səhih mə'lumata görə, İbrahim əfəndi hənuz tifl ikən valideyni ilə məən Qazax mahalından mühacirətən Nuxa şəhərinə gəlib orada sükunət edərmiş. Onun abavü əcdadı ruhani olublar.

Belə rəvayət olunur ki, İbrahim əfəndi iyirmi beş sinninə çatınca zərgərlik edərmiş və o vaxta kimi bisavad imiş. Bir dəfə ona kağız yazdırmaq lazım olubdur və bu işdən ötrü əhli-savad bir şəxsin himmətinə rücu edibdir. Məzkur şəxs naməni yazdıqdan sonra ona bir növ töhmət izhar edibdir ki, sənə eyib deyilmi özün üləma nəsli ola-ola qeyrisinə halidilini kəşf qılıb məktub yazdırırsan? İbrahim əfəndi bu e'tirazdan xeyli mütəəssir və pərişanhal olub, iyirmi beş yaşında ikən başlayıbdır oxuyub yazmağa və bu yolda gecə və gündüz xürdü xabı özünə haram edib, elm və mə'rifət təhsilinə məşğul olubdur və axırda alim və fazil bir şəxs olub müdərrislik edərmiş. Təb'i-şe'riyyəsi olaraq bir xeyli əsərlər vücuda gətirmişdir. Vəli onlardan çoxusu dağılıb tərk olubdur. Əşar və kəlamının əksəri münacat, nə'ti-rəsul və qəsaid qismi əsərlərdir. Onlardan bir-ikisi nümunə olaraq burada yazılır.

Rəsuli-bərhəqqimiz Məhəmməd-əl-Mustafa həzrətlərinin şə'nialilərində deyibdir:

Sən ol şahi-risalətsən ki, oldun əvvəlül-əşya,
Ədayi-xidmətində daim olmuş asiman bərpa.

Qüdumi-zati-pakiçün döşənmiş ərzi-gunagun,
Qurulmuş üstünə bu nöh rəvaqi-xeymeyi-xəzra.

Olur "lövlak"dən məfhum ki, bais olduğundan sən,
Neçə min kainatı həqq ədəmdən eylədi peyda.

Təcəllayi-naharasa olan ruyində gisuni
Görən ixlas ilə əzbər edər "vəlleyl iza yəğşa"[515],

Ziyayi-sineyi-safın bəyanidə "ə'ləm nəşrəh"[516]
Mükəmməl gözlərinin mədhini sazağ edər inşa.

Nə əs'əd leyldir ol leyl ki, etdin asiman seyrin,
Bu seyrindən edər əbna "sübhanəl-ləzi əsra".



Büraqi[517] bərq rəftar ilə yetdin "qabi-qövseynə",
Bil, ondan keçməyin izhar edər məzmuni-"ovədna"[518].

Bulub feyzin, olub aşiq, qalıb heyranü sərgərdan,
Dolanır başına daim onun çün günbədi-mina.

Humayun bəxti-fərruxfal sən tək puri-dilcuyi
Nə hərgiz görməmiş Adəm, nə əsla doğmamış Həvva.

Görülmüş möcüzatın çox edəndə xəsmini ilzam,
Biri Qur'ani-baqidir ki, oldur ayəti-kübra.

Nə həddi var edə mədhin, Nicati, naqisü asi –
Ki, nə'ti-zatına nazil olub "Yasin" ilə "Taha"[519].

# SEYİD ƏBÜLQASIM NƏBATİ

Azərbaycan türklərinin müqtədir şairlərindən birisi də mərhum Seyid Əbülqasım "Nəbati" təxəllüsdür. Seyid Əbülqasımın vətəni Qaracadağda Üştibin, yaxud Üçdibin qəryəsidir ki, İran dövlətinə mütəəlliqdir və Muğan səhrasına yaxındır. Bu qəryənin ab-havası mötədil və torpağı münbitdir. Əhalisi salamat və kargüzar olduğu üçün mürəffəhhal yaşayırlar. Vəli zəmanənin övza'vü iqtizasından bixəbər və elmdən bibəhrədirlər, necə ki, dövləti-əliyyənin rəiyyətləri və rəncbərləri təmamən bu hal üzrə yaşamaqdadırlar.

Seyid Əbülqasım təvəllüd edibdir tarixi-hicriyyənin on üçüncü əsrinin ibtidasında – Nəsrəddin şahın atası Məhəmməd şahın zəmani-səltənətində[520]. Bir qəsidəsində məzkur şahı belə tə'rif eləyir:

Hərə bir şahə oldular məddah,
Mən kəmin bəndə şahi-İranə.

Şahi-mən şahi-müfəxxər Qacar –
Ki, salıb divi-zülmi zindanə.

Şəh Məhəmməd şəhi-Sekəndərşən,
İltifat etməz abi-heyvanə.

Xadimi-bargahi yüz Cəmşid,
Tə'n edər cahi min Süleymanə.

Bəxş edər murə mülki-dünyani.
Dür tökər gənci-lütfi hər yanə.

Dusti bilməsin ki, qəm nə imiş,
Düşməni ağnasın qızıl qanə.

Sən, Nəbati, duanı eylə təmam,
Nə işin var eşitdi şah ya nə?[521]

Əgərçi şairin sali-vəfatı dürüst mə'lum deyil, amma mötə'bər rəvayətə görə, tarixi-hicriyyənin on üçüncü əsrinin axırlarında – yə'ni min iki yüz yetmişinci illərin əvaxirində və həştadıncı illərin əvailində vəfat edibdir[522]. Vəfatı ömrünün müsinn çağında – yetmişində və ya yetmiş beşində vaqe olubdur. Buna şairin öz şe'ri dəlalət edir:

Mən dedim bəs Xançobani cavandır,
Bir igid oğlandır, bəvri-bəyandır,



Demə kim, qocalıb, qəddi kəmandır,
İndi gördüm, saqqalının çalı var[523].

Bundan əlavə onun qocalığına bu şe'ri-müstəzadı dəxi şəhadət verir:

Dövri-çərxdən olmuşam əlil,
Dizdə taqətim, gözdə nur yox.
Bir nəzər, əya şahi-lafətə,
Bu Nəbatiyi-binəvaya bax![524]

Eşitdiyimizə görə, bu halda Nəbatinin övladından bir neçə mötə'bər vaizlər və mərsiyəxanlar vardır.

Seyid Əbülqasımın bir neçə təxəllüsü var. Onlardan məşhuru bunlardır: "Nəbati", "Məcnun", "Şah" və "Xançobani".

Mərhum ziyadə müttəqi, dindar və pakdamən bir vücud olub ömrünün çoxunu zöhdü riyazətdə keçirərmiş. Riyazət əhli olduğu üçün əksər övqat dünya işlərindən əl çəkib və xalqdan qət'i-əlaqə edib e'tikafa əyləşərmiş. Bu e'tikaf və zaviyənişinliyi özü üçün böyük bir səadət hesab edib, həqiqət aləminə irişməyi və nihan sirrlərindən ittila' etməyi məhz vəhdət guşəsində bularmış. Ol səbəbdən deyibdir:

Guşeyi-vəhdət nə əcəb ca imiş,
Sirri-nihan onda hüveyda imiş.

Aşiqi-divanələrin mənzili, –
Rütbəyə bax, ərşi-müəlla imiş.

Qafil idim bu dili-viranədən,
Dil demə, oğlan, bu ki, dərya imiş[525].

E'tikafdan fariq olduğu zaman gahbir camaat arasına çıxıb söhbət edərmiş. Ziyadə fəsih və şirinzəban olduğu üçün çoxları özünə valeh və heyran edərmiş və müasirlərindən bir çoxu onunla mükaliməyə daxil olmağı və onun söhbətindən istifadə qılmağı özlərinə böyük bir feyzü qənimət hesab edərlərmiş.

Rəvayət olunur ki, Seyid Əbülqasım Üştibində əvvəlcə dərvişlər həlqəsinə daxil olub, onların içində nüfuzu artıbdır və sonralardan dərvişlərə mürşid olubdur. Bə'zi vaxtlarda ondan kəramət sadir olarmış; belə ki, bir para xariqüladə əlamətlərin ondan zühur etməyini görənlər olubdur.

E'tikafdan çıxan zamanı onun simasında başqa bir parlaqlıq və nuraniyyət cilvə edərmiş; özgə bir halətə düşərmiş və bə'zi vaxtı şövqü zövq ilə cuşa gəlib eşqdən, mey və məhəbbətdən dəm vurarmış. Necə ki, deyibdir:

Zöhdü səlatı çölə sal, Gəzgəza,
Mövsimi-eyşü meyü mina imiş.

Xançobani adi, Nəbati özü,
Bir üzü qırxıq, bığı burma imiş[526].

Nəbati artıq dərəcədə səxi, comərd və nəcib bir vücud imiş. Atası dəxi möhtərəm seyidlərdən imiş. Buna şairin kəlamı şəhadət verir:

Meydani-eşq içrə səyirtdim ati,
Müsəxxər eylədim Rumü Herati.
Möhtərəm oğluyam, adım Nəbati,
Zatımız haşimi, əslimiz ərəb[527].

Seyid Əbülqasımın ləqəbi "Möhtərəmoğlu" olduğuna onun bu şe'ri dəxi şəhadət verir[528].

"Möhtərəmoğlu" deyərlər mənə, adım Məcnun.
Bir adım Xançobani, bir bığı burma-burma[529].

Nəbati həzrət Əli əleyhissəlamın həqiqi və səmimi məddahlarından olduğu üçün ol cənabın vəsfi-şə'nində çox gözəl və qərra qəsidələr yazıbdır ki, hər kəs onları mütaliə etsə, onun qəlbində həqiqi bir vəcd və tərəb vüqua gəlir. Nəbati demək olur ki, öz mövlasına ürəkdən aşiq imiş və bu məhəbbəti ucundan ol şahi-dəryadilin və gövhəri-Nəcəf və mə'dəni-izzü şərəfin mədhində yazdığı bir kəlamında əndazədən çıxır və bir növ özünü şəkkaklar silkinə daxil edən kimi olur:

Mən ruzi-əzəldə sevmişəm bir şahi,
Allah deyər ona Əliallahi.
Hər kim ona Allah desə, kafirdir,
Şəkkakdır ol Nəbati tək, vallahi.

Divani-əş'arında ibtidayi-kəlamı həzrət Əlinin adı ilə bu sayaq başlayır:

İcade-bənaye-aləm əz name-Əlist,
Aine-nəbi ze zərbe-Səmsame*-Əlist.
Meyxaneyi-dəhr qayem əz həstiye-ust,
Abe-rox ze meye-came-qolfame-Əlist.
İn nəqşeneqare-sane'e-biçunəst,

* Səmsam – kəskin qılınc



Ya dəftəre-eşqe-Leyliyo Məcnunəst.
Hər səfheəş əz bağe-Erəm zibatər,
Hər noqteəş əz dorce-dore-məknunəst.
Əz gərdeşe-ruzeqaro doure-gərdun
Divane-mən əz rədif gərdəd birun,
Aşoftetər əz şekənce-zolfe-Leyli,
Julidetər əz məqale-hale-Məcnun.
İn reşheye-kelke-Maniye-nəqqaşəst,
Ya qeteye-meşke-aşeqe-qəllaşəst.
Bər təb'e-gohərbare-Nəbati əhsən,
Mətbutər əz ruye-bote-Cəmmaşəst*[530].

Xah türk dilində və xah fars dilində Nəbati yazdığı şeirlərdə bir qüsur yoxdur. Bə'zi kəlamlarında, məsələn, "Saqinamə"sində, fars lisanında yazdığı şeirləri türk dilində yazdıqlarına tərcih vermək olar. Bu "Saqinamə"nin axırını yenə həzrət Əli mədhinə çevirib, ol cənabın övsafi-cəmilə və əxlaqi həmidəsini bir-bir zikr qılıb, ol bəhri-hikmətə və sahibi-şə'nü izzətə xitabən deyir:

Şəha, şəhriyara, mən binəvara
Ze lotfət biyara ço mehre-monəvvər,
Əya, saqi, cəm şəvi şado xorrəm,
Fədaiye-to kərdəm, biya, mey biyavər.
Bedəh bade çon qol, bexan həmço bolbol –
Ke, kamət şod hasel, moradət moyəssər.
Əli qu, Əli qu, Əli cu, Əli cu.
Resi ta be hu-hu, əz in nam begzər,
Əli qu, Nəbati, ke, yabi necati,
To ta dər həyati bexan naməş əzbər[531].

Nəbatinin həzrət Əli şə'nində yazdığı qəsidələri dəxi səmimi-qəlbdən nəş'ət edən pakizə və həqiqi hisslərdir ki, oxuculara artıq dərəcədə tə'sir eləyir. Onları burada zikr etməyə ehtiyac yoxdur.

Tərcibənd səbkində yazdığı "Saqinamə"də dəxi Əsədullah Qalib Əliyyül-Mürtəza[532] haqqında gözəl mədhlər söyləmişdir. Nəbatinin bu "Saqinamə"si demək olar ki, onun cümlə kəlamının əfzəli və bərgüzidəsidir; bu sayaq başlanır:

Ey edən eşq naməsin inşa,
Vəh, düşüb başına əcəb sövda!
Qoygilən başə taci-bismillah,

* Cəmmaş – zəndvəst deyilən bütpərəst qövm

İbtida qıl sözü benami-xuda –
Ki, odur hər kəlamə sərmətlə –
Ki, odur sərvəri-hamə əsma'.
Qadirü zülcəlalü vəlikram,
Faliqül-həbb, xaliqül-əşya,
Sanei-ərşü fərşü şəmsü qəmər,
Aləmi yoxdan eyləyən peyda.
Ol xudavəndi-vacibüt-tə'zim,
Həyyü qəyyumü fərdi-bihəmta.
Əhsənül-xaliqin ləhül-izzə.
Vələhül-həmd vəssənaül-üla.
Adəmi o yaratdı torpaqdan,
Başına qoydu taci-"Kərrəmna".
Ondan oldu Məhəmmədi-ərəbi,
Sahibi-tacü təxti-ov-ədna.
Ey qələm, ey ənisi-əhli-bəyan,
Cəhd qıl etgilən sözü ziba.
Gəl, gətir badə, ey gözüm saqi –
Ki, verim çöhreyi-məqalə səfa.
"Şur"ü "Şəhnaz"dən çəkim ahəng,
Naləni eyləyim büləndava.
"Sövti'-Davudi" eyləyim zahir,
Gah "Hüseyni" gəhi "Zəminxara"[533].
Ta salım bu cahana bir ğülğül,
Başlayım tazə bir əcibə "Nəva".
Gələlər vəcdə aşiqü arif,
Düşələr rəqsə padişahü gəda.
Ucadan başla "Raki-Novruzi"[534]
Çulğasın nöh sipehri sövtü səda.
Şahi-islamə ruzü şəb nüsrət –
İstə həqdən həmişə, eylə dua.
Çəkgilən başə badeyi-eşqi,
Günbədi-çərxi eylə pürqövğa,
Şahi-Misri çıxartgilən çəhdən,
Aləmi eylə valehü şeyda.
Degilən, ya Əli, bəsövti-cəli,
Eyləmə hiç kimsədən pərva.
Himmət al pirdən, məhəd həqdən,
Dəmbədəm "hu" çəkib yolu başla.
Qoy qədəm rahi-eşqə mərdanə,
Gir xərabatə məst-məstanə[535].

Şair pirdən himmət və həqqdən mədəd diləyib sövti'-cəli ilə Əliyyül-Mürtəzanı zikr edib və dəmbədəm "hu" çəkib, rahi-eşqə şövq ilə, mərd-mərdanə qədəmgüzar olur və özünü fənafillah dəryasına qərq eləyir və



burada cürbəcür aləmləri seyr edib, vaxtbəvaxt saqiyi-ənisü canpərvərə rücu edib ondan lütfü kərəm istəyir.

Bu "Saqinamə"nin bir bəndində eşqi-həqiqi və məhəbbəti-ilahini vəsfü tə'rif edib, başqa bəndlərində gah hicrdən şikayət eləyir, gah mübtəlayi-dərdi-möhnət olmaqdan və əqlü kəmalı tərk edib Məcnun-sifət küçə və səhralarda vəhşiyanə cövlan etməkdən söz açıb artıq fəsahətlə öz hissiyyatını belə rişteyi-nəzmə çəkir:

Saqiya, dur gətir meyi-gülgun,
Məni qəm etdi lalə tək dilxun.
Hicr edib odlu sinəmi gülxən,
Dərd edib dağlı bağrımı kanun.
Əql-məqlü kəmaldan keçdik,
Gəl bir az da tutaq təriqi-cünun.
Yandıraq rəxtü təxti mərdanə,
Seyr edək küçələrdə çün Məcnun.
Gah edək rəqsü gah çərxə vuraq,
Gəh çəkək nalə məstü digərgun.
Gəh deyək şe'r-mer, gəh hədyan,
Gah məsti-şərabü gəh əfyun.
Gahi vəhşilər ilə həmcövlan,
Gah səhra gəzəkü gəh hamun.
Gahi heyrət çölündə sərgərdan,
Didə giryanü xatiri məhzun.
Gahi dağlarda valehü şeyda,
Gah əfsanəvü-gəhi əfsun.
Gahi xamuşü gəh süxənküstər,
Gahi Əshabi-kəhfi-cari-fünun.
Gəlsə təqrirə gər hekayəti-eşq,
Olu bir dəmdə min gəda Qarun.
Ey xoşaxoş o aşiqi-qəllaş –
Ki edə canı yarına qurbun*.
Əyyühəl-aşiqun, fədeytü ləküm,
İnnəküm məşərü və hüm yufun[536].
Badeyi-xümnişini ver, saqi,
Nə deyər bir görək o Əflatun[537].

Bu "Saqinamə"nin bir bəndində Nəbati bahar fəslini belə şairanə vəsf qılır:

Saqiya, gəldi novbahar yenə,
Mövsimi-gəşti-laləzar yenə.

* Qurbun – qurban mə'nasındadır. Qafiyə düz gəlmək üçün "qurbun" yazılmışdır

Vergilən bəzmə inbisatü şükuh,
Gəldi həngami-vəsli-yar yenə.
Nərgisi-məst yüz nəzakət ilə
Zülfünü etdi müşkbar yenə.
Şahi-gül çəkdi bürqəni üzdən,
Hüsnünü etdi aşikar yenə.
Kuhü səhranı əbri-neysani
Gör nə xoş etdi mərğzar yenə.
Rədi-ğərran çəkib ğəriyü xüruş,
Aləmə saldı xarxar yenə.
Şaxi-gül oldu məskəni-bülbül,
Laləni etdi dağdar yenə.
Hardasan ey şəkərləbü gülrux,
Ver, gözüm, cami-xoşgüvar yenə.
Gəl içək badə gül əyağında,
Bir edək şükri-kirdgar yenə[538].

Mey və məhbub barəsində yazıbdır:

Saqiya, ey nigari şirinfən,
Hardadır ol də'vayi-dərdi-həzən?
Təlxi-şiringüvar, yə'ni mey,
Mərd olur içsə gər onu hər zən.
Bu idi etdi şah Cəmşidi,
Həyyü cavid çün Üveysi-Qərən.
Ehtiram et ki, cami-Cəmdir bu,
Olma bədməst sən də çün Bəhmən.
Ələ aldıqca gözlə şərti-ədəb –
Ki, odur dərdi-eşqə çarə edən.
Hanı ol Kürdi-şiri-nərsövlət?
Noldu İsfəndiyari-ruhintən?
Məni yandırdı bir büti-sərməst,
Vəsfi-hüsni edib məni ələən.
Taqi-əbru kəmani-Sami-dilir,
Tiri-müjgani xəncəri-Bijən,
Qönçə ağzı çü püsteyi-xəndan,
Ləbi-lə'li əqiqi-sürxi-Yəmən.
Tərfi-ruxsari rövzətül-firdovs,
Sünbüli-zülfi rəşki-müşki-Xütən.
Xali-sərsəbzi dami-fitnəvü şər',
Çeşmi-sərməsti kani-sehrü fınən.
Sözü şəhdü şəkər, gözü şəhla,
Canü dil bəndüvani-çahi-zəqən.
Qıya baxmağı rəm yemiş ceyran,
Güli-ariz misali bərgi-səmən.



İşvəsi şux, qəmzəsi cəllad,
Qan içən həmçü zeyğəmi-ərcən.
Surətində xəcil məhi-ənvər,
Qəddi-bala besani-sərvi-çəmən.
Qoymaz aşiqdə nazı tabü təvan,
Öldürər gərçi olsa Əhrimən[539]...

Yenə bu "Saqinamə"də keçmiş padşahların şökət və əzəmətindən və namdar pəhlivanların qüvvət və hünərlərindən və aşiqi-biçarələrin hali-cigərsuzlarından söz açıb axəri-kəlamı həzrət Əli əleyhissəlama yetirib deyir:

Hanı şiri-xuda, şahi-mərdan
Sahibi-Zülfiqari-xunaşam.
Həl'əta şə'nü innəma şövkət
"Lafəta" mədhi-şahi ərşməqam[540].
Gər mürəkkəb ola cəmii-bəhar,
Cümlə əşcar əgər ola əqlam,
Ola katib təmami-xəlqi-cəhan,
Yazalar vəsfi-şə'nini müdam,
Aqibət qərqi-lücceyi-xiclət,
Matü məbhut qasirül-övham.
"Qulkəfa" haq deyəndə bir şahə,
Mən nə tə'rif edim, mənim ağam?!
Dur gətir badə, saqiya, ver cam,
Lovhəşəllah, gəlin edək bayram.
Çəkilək bağə, bir əyaq çəkək,
Döşənək gül əyağinə xoşkam.
Vəcd edək, mənzilə verək zinət,
Ruzü şəb vəcdə eyləyək iqdam.,
Qoy qədəm rahi-eşqə mərdanə,
Gir xərabatə məstü məstanə[541].

Seyid Əbülqasım Azərbaycan türklərinin Xacə Şəmsəddin Hafizi və Şəms Təbrizisi[542] və bə'zi məqamlarda Mövlana Cəlaləddin Rumisi mənzilindədir. Necə ki, Hafiz fəsahət və bəlağətdə şüərayi-farsın sərdəftəri olub, həmçinin Nəbati də Azərbaycan şüərasının fəsihraqıdır. Necə ki, şeir və kəlamında Nəbati Xacə Hafizə peyrəvilik göstərib, habelə də dünya zindəganlığında ustadi-kamili və mürşidi-mə'nəvisi tutduğu yol ilə gedib dərvişlər dairəsinə daxil olub, onlar ilə müaşirət və müsahibət edərmiş və dünyanın mal və dövlətinə mütləqa e'tina göstərməzmiş. Övqatını ibadət və riyazətdə və şeir yazmaqda keçirərmiş. Xacə Hafizə nisbətən qəlbində əlaqə tutduğu məhəbbət və sədaqəti aşağıda yazılan şeirlər vasitəsilə bəyan etmişdir:

Ey səba, ey bəridi-aşiqi-zar,
Kuyi-canane bircə var genə.
Açginən şahbaz tək şəhpər,
Eylə Şirazə bir güzar genə.
Hafizin ruhi-pakinə bizdən
Bir yetir eşqi-bişümar genə.
Bə'di-"əlhəmdü" sureyi-"ixlas"
Gör nədir bir o yari-ğar genə.
Məni-müştaqə bu hekayətdən
Gəldi nagəh nəvayə tar genə.
Dedi: ey dərdü qəm giriftari,
Çox dəxi etmə ahü zar genə.
Tutgilən daməni-təvəkküldən,
Əşqəri-eşqə ol səvar genə.
Qoy qədəm rahi-eşqə mərdanə,
Gir xərabatə məstü məstanə[543].

Yenə özgə bir yerdə Nəbati "Lisanül-qeyb" ləqəbi ilə məşhur olan ustadı haqqında demişdir:

Hafizin ruhuna ixlas ilə bir fatihə ver,
Çərxə vur, dövrə gəl, ey bəççeyi-ənqa, ənqa.
Tutiyi-bağı-cinan, bülbüli-şaxi-Şiraz,
Xaceyi-"Şəms" ləqəb, şairi-ğərra, ğərra[544].

Və yenə Şiraz bağının bülbüli-xoşəlhanı haqqında yazıbdır:

Fərəhəfzast dorərhaye-softeye-Hafez,
Fəni nəmud məra gənce-xofteye-Hafez.
Məlale-del bebərəd şe'rə-rofteye-Hafez,
Bər aseman çe əcəb gər ze qofteye-Hafez.
Səma Zohre berəqs avərəd məsihara[545].

Mə'lumdur ki, Xacə Hafiz, Şeyx Sə'di və Cəlaləddin Rumi kimi nəsihətamiz timsal və hekayətlər yazmaqla belə onlardan hissəi ittixaz etməyibdir. Ancaq mənən bir-birinə münasibəti olmayan qəzəllər vasitəsi ilə hissiyyati-təbiiyyəsindən və kəmalati-mə'nəviyyəsindən naşi hikmətasa və möcüznüma şeirlər yaradıbdır. Hər şe'rin və hər beytin təklikdə dərin mə'nası var. Hər bir kəlməsi böyük nəsihətdir. Tərzi-kəlamda və şiveyi-lisanda o qədər həlavət və fəsahət var ki, əhli-hal onu mütaliə etdikdə valeh olur, dimağı başqa bir zövq ilə vəsfə gəlməyən bir feyzlə dolur. Nəbati dəxi bir mətləbin üstündə dayanıb durmur, pənd və nəsihət deməkdən və xalqa yol göstərməkdən yaxasını kənara çəkib öz hissiyyatından və mə'nəviyyat aləmindən dəm vurur. Bu xüsusda ibtidayi-kəlamda şair özü



bunu iqrar edir ki, onun divanında qayda və nizam olmayacaqdır və mənən bir-birinə müxalif və müğayir şeirlər çox olacaqdır:

Əz gərdeşe-ruzeqaro doure-gərdun
Divane-mən əz rədif gərdəd birun,
Aşoftetər əz şekəncə-zolfe-Leyli,
Julidetər əz məqale-hale-Məcnun.

Başqa bir kəlamında şair öz halətini və dünyadan laqeyd olmağını, ata-ana və qohum-əqrəba tanımadığını, müəyyən bir fikrə və məsləkə qulluq etmədiyini, dost-aşnadan qət'i-ülfət etdiyini və şeirdə nizam və qayda gözləmədiyini bu sayaq nəzmə çəkir:

Bilmərəm səc' nədir, qafiyəni anlamaram,
Mən Qaradağlıyam, ver mənə xurma, xurma.

"Möhtərəm oğlu" deyərlər mənə, adım Məcnun,
Bir adım Xançobanı, bir bığı burma, burma.

Nə qələndərdi, nə dərviş, nə natiqü nə lal,
"Ma ərəfnak" deyirlər, budu həqqa, həqqa.

Bacı-qardaş deməz, ata-anasın bilməz,
Degilən bir ayı ya bir dədi-səhra, səhra.

Tərk edib yarü rəfiqi, çəkilib pünhanə,
Gecə-gündüz oturur vahidü tənha, tənha.

Şair dünyada çox yaşayıbsa da, amma kim və nə olduğunu, haradan gəlib və haraya getdiyini və nə növ icra və maddələrdən tərkib bulduğunu və hansı din və təriqətdə olduğunu dürüst tə'yin edə bilməyib, "dünya" deyilən bu vadiyi-heyrətdə avara və sərgərdan qalıbdır, müəyyən bir mənzilə vasil olmadığını və hələ məhbut, mütəhəyyir və ləng halında yaşamağını öz-özünə xitabən "nə mənəm, nə mən mənəm mən" deməklə böyük bir şəkkdə və iztirabda olmağını mövzun bir kəlamında bəyan edir. Haman kəlamı eyni ilə burada dərc edirik:

Nə mərizə, nə təbibəm, hələ ləng, ləng, ləngəm,
Nə həbibə nə rəqibəm, hələ ləng, ləng, ləngəm.
Nə mokəddər, nə şadəm, nə nehan nə aşekarəm,
Nə ze xakəmo, nə badəm, hələ ləng, ləng, ləngəm.
Nə ço ğonçe dər şekoftəm, nə nəəm, nə la şenoftəm,
Nə ğəməş bedel nəhoftəm, hələ ləng, ləng, ləngəm.

Nə şərabiyəm, nə bəngi, nə xəyaliyəm, nə rəngi,
Nə moğənniyəm, nə çəngi, hələ ləng, ləng, ləngəm.
Nə rəfiqe-bustanəm, nə qərine-qolestanəm,
Səke-kuye-delsetanəm, hələ ləng, ləng, ləngəm.
Nə setareəm, nə mahəm, nə gəda, nə padşahəm,
Bemiyane-in do rahəm, hələ ləng, ləng, ləngəm.
Nə zəmin, nə asemanəm, ən əz ino nə əz anəm,
Nə diyare-laməkanəm, hələ ləng, ləng, ləngəm.
Nə pəri, nə cenno ensan, nə mələk, nə huro qelman,
Nə fe'lanəmo, nə behman, hələ ləng, ləng, ləngəm.
Nə ze kano mədənəm, mən nə ze gənco məxzənəm mən
Nə mənəm, nə mən mənəm mən, hələ ləng, ləng, ləngəm.
Nə cəvanəmo nə pirəm, nə kəmanəmo nə tirəm,
Nə səğiro nə kəbirəm, hələ ləng, ləng, ləngəm.
Nə ze lə'le-bibəhayəm, nə ze dorre-bisəfayəm,
Nə nəva, nə binəvayəm, hələ ləng, ləng, ləngəm.
Nə holuliyəm, nə dəhri, nə kənariyəm, nə bəhri,
Nə riyaziyəm, nə cəfri, hələ ləng, ləng, ləngəm.
Nə monəccemən, nə kahen, nə sahero nə mədahen,
Nə bezarean gəvahen, hələ ləng, ləng, ləngəm.
Nə Nəbatiyəm, nə bəngi, nə mosəllayəm, nə cəngi,
Nə məcuso, nə ferəngi, hələ ləng, ləng, ləngəm[546].

Yenə başqa bir kəlamında Seyid Əbülqasım özünü mədhuş və heyran bir halda valeh və sərgərdan görüb kəmali-fəsahətlə məstanə halətini bu tövr bəyan edir:

Öylə məstəm bilməzəm kim, mey nədir, mina nədir,
Gül nədir, bülbül nədir, sünbül nədir, səhra nədir.

Od tutub canım sərasər yandı, amma bilmədim
Dil nədir, dilbər nədir, başımda bu sevda nədir.

Bilmədim ömrümdə hərgiz küfrü iman hansıdır,
Əhmədü Məhmud kimdir, Musiyü İsa nədir?

Şahbazi-övci-vəhdət, vahidü həyyü qədim,
Xaliqi-ərzü səma ol fərdü bihəmta nədir?

Sədri-eyvani-cəlalət, şəm'i-bəzmi-kainat,
Afitabi-ərşi-izzət "lafəta illa"[547] nədir?

Türrəhatı qoy kənarə, rəqsə gəl divanəvər,
Gəl, xərabət içrə gör bu şurişü qövğa nədir!



Dürdi-safi gözləmək vaxtı deyil, saqi, aman!
Şişə ver, peymanə ver, sağər nədir, səhba nədir?!

Dur, gözün qurbanıyam, məstanə gəl, rindanə ver,
Çox demə Cəmşiddən, İskəndərü Dara nədir?

Lövhəşəllah, kimdi bilməm eşq divanın yazan,
Aşiqü mə'şuq kimdir, Vamiqü Əzra nədir?

Şahidi-xəlvətnişinim etdi ruxsarın ə'yan,
Aşiqi-divanə gəl gör zahirü ixfa nədir!

Yetdi ömrün axirə, sən bir, Nəbati, bilmədin,
Kimdi bu gözdən baxan, ya dildə bu guya nədir?[548]

Nəbatinin bu şeirləri Şəms Təbrizi əleyhirrəhmənin aşağıda yazılan kəlamına çox bənzəyir. Təfavüt ancaq bundadır ki, Nəbatinin kəlamı rindanə və aşiqanə, amma Şəms Təbrizinin kəlamı həkimanə və fəlsəfanə əsərlərdir. Nəbatinin kəlamındakı atəşi-eşq, cuşi-zövq və şövq qareni vəcdə gətirir, Şəms Təbrizinin kəlamı isə onları dərin fikir və əndişəyə salır.

Budur Şəms Təbrizinin kəlamı:

Ruzha fekre-mən inəst, həme şəb soxənəm
Ke, çera ğafel əz əhvale-dele-xiştənəm.
Əz koca amədeəm, amədənəm bəhre-çe bud,
Bekoca mirəvəm, axər nənəman vətənəm.
Kist dər quş ke, u mişənəvəd avazəm,
Ya kodaməst soxən mikonəd əndər dəhənəm.
Kist dər dide ke, əz dide birun minegərəd,
Ya ke, canəst nəquyi ke, mənəş pirəhənəm.
Mən bexod namədəm inca ke, bexod baz rəvəm,
An ke, avərd məra baz bərəd bər vətənəm.
To məpendar ke, mən şe'r bexod miquyəm,
Ta ke, hoşyarəmo bidar yeki dəm nəzənəm.
Şəms Təbrizi, əgər ruy bema benəmayi,
Vəllah in qalebe-mordar behəm dər şekənəm[549].

Məşhur çarparəsində Nəbati püxtə və arif olmağa və mürği-Qafla həmzəban olub uca məqamlarda dövr etməyə və kuyi-eşqə dəlil bulmağa və nəqşi-bütdə sirri-vəhdəti görməyə və dünyanın çigunəliyinə mə'lumat yerişdirməyə çox səfər, təcrübə, bilik, məhəbbət, cür'ət və tərkisərlik lazım olmağını şairanə bəyan edib deyir:

Get dolangilən, xamsən hənuz,
Püxtə olmağa çox səfər gərək.
Mürği-Qaf ilə həmzəban olub,
Dövrə qalxmağa balü pər gərək.

Kuyi-eşqə gəl getmə bidəlil,
Quli-dəng tək düşmə çöllərə.
Ta ki, salikə rəhnümun ola,
Xizri-rəh kimi rahbər gərək.

Yox, yalan dedim, hərzə söylədim,
Vazehin deyim, doğru söyləyim,
Həqqə arifi vasil etməyə
Bir dodaqları xam şəkər gərək.

Zülfi-ənbərin, xali-nazənin,
Qönçə tək dəhan, qaşı cansitan,
Mahi-biqərin, şahi-gülruxan,
Nəstərən kimi simbər gərək.

Lalə tək üzü al yanaq ola,
Tazə gül kimi tərbuxaq ola,
Bir günəşqabaq, xoşməzağ ola,
Şux sərvqəd, zərkəmər gərək.

Həminan ola mehrü mah ilən,
Həmzəban ola nurü nar ilən,
Nitqi dilguşa, ləfzi canfəza,
Gənci-sinəsi pürgöhər gərək.

Həqqə aşina, xəlqdən cüda,
Eyləmiş ola nəfyi-masəva.
Həyyi-ləmyəzəd, fərdi-biməsəl,
Ol Məsih tək bipədər gərək.

Qoygilən qədəm deyrə lacərəm,
Nəqşi-bütdə gör sirri-vəhdəti,
Bu çigunədən vaqif olmağa
Bir cünuni-həq, mərdi-ər gərək.

Az danışgilən, olgilən xəmuş,
Etmə aləmə sirri-eşqi faş,
Burda durma çox, keç bu vərtədən,
Bu mə'qulə söz müxtəsər gərək.

Mən qılmayın çox da zahidi,
Üzrü var onun, aşiq olmayıb,



O, əbəs yerə xəlq olunmayıb,
Bağbanə bir kəlləxər gərək.

Ciddü cəhd qıl, arif ol, gözüm,
Elmi-eşqdən olma binəsib,
Cum bu bəhrə bir, tap bu gövhəri,
Aşiqəm deyən tərki-sər gərək.

Rah pürxətər, bəxt vajgun,
Zülfi-yar tək şəb siyahgun,
İndi qeybdən Xançobanına
Nəxli-Turdan bir şərər gərək.

Ya Əli, məni cami-eşqdən
Bir kərəm qılıb öylə məst qıl –
Kim, desinlə xəlq lal oturmağa,
Bu Nəbati tək bəxtəvər gərək.

Nə qədər ki, mərhum Seyib Əbülqasım müttəqi, haqpərəst bir zat imiş və nə qədər övqatını ibadət və riyazətdə keçirməyi sevərmiş, bir o qədər də bimə'rifət və biməhəbbət ibadəti, riyayi və zahiri zöhdü təqvanı dost tutmaz imiş, "bismillahı dərk etməmiş həmdə şərh verən" abidi-fasiqə və müfəttin vaizə canü dildən tə'n və nifrin oxuyarmış. Belə riyayi və yalançı zahidləri bə'zi kəlamlarında zahidlik isminə yaraşmayan sifətlə müttəsif qılmışdır:

Mən qılmayın çox da zahidi,
Üzrü var onun, aşiq olmayıb,
O, əbəs yerə xəlq olunmayıb,
Bağbanə bir kəlləxər gərək.

Və həmçinin məhəbbəti-ilahidən bixəbər və mə'rifəti-rəbbanidən bisəmər abidlərə xitabən demişdir:

Zahid, az danış, get, gözümdən it!
Eşqdən məni çox da danlama,
Mən məgər əbəs olmuşam dəli,
Bir o "mim"ü "dal", "ba"vü "ra"yə bax.

Məndən əl götür, ey uzunqulaq!
Zöhd satma çox, ey himar, məhz!
Dur ayağa bir, aç o kor gözün,
Bir o gözləri sürməsayə bax!

Burada Nəbati:

Mən məgər əbəs olmuşam dəli,
Bir o "mim"ü "dal", "ba"vü "ra"yə bax.

–beytində ona işarə edir ki, ruzi-əzəldən müdəbbiriləmyəzəl – ki, ibarət ola qadiri-zülcəlaldan, – onun xəmirəsini məhəbbətlə yoğurub, mə'rifət nuru ilə münəvvər qılıbdır, bərgüzidələr silkinə daxil və dünya qeydindən xilas və biehtiyac eləyibdir. Necə ki, özgə bir məqamda şair deyir:

Təbbali-qəza döydü mənim adıma axir
Bu təbli-cununu.
Səhrayə salıb etdi məni kuhdə məskun,
Bu gərdişi-gərdun.

Və habelə şair eşq əhlinin ustadı və sərxeyli olan Məcnuni-zəbunu və sonra Fərhadi-bimuradı yada salıb özünü dəxi onların silkinə daxil edib və hətta Fərhadi-qəmpərvərdən özünü artıq tutub deyir:

Əlminnətü-lilah oxudum elmi-lədünni[550]
Ustadi-əzəldən.
Feyzi-nəzəri etdi məni qabili-əsma',
Çün Xizri-müəlla.
Əfsus ki, aləmdə deyil dağ çapan oğlan
Fərhadi-hünərmənd,
Tə'lim edəydim ona mən dərsi-"səmi'na"[551]
Ta ayeyi-"övfa"[552].
Məcnun idi eşq əhlinin ustadı, həqiqət,
Pirimdən eşitdim.
Əfv eylə günahın sən onun, bari-xudaya,
Ovsilhu bi Leyla.
Hərçənd qaradağlıyam, yoxdu kəmalım,
Müşküldü kəlamım,
Hər fərdlə məsturdu bir dürri-müsəffa,
Yüz lölövü lala.
Yandı ciyərim, bəsdi, fəğan etmə, Nəbati,
Bir ləhzə tut aram.
Səhrayi-cünun içrə ol azadədil, amma
Tut daməni-mövla.

Və yenə Nəbati riyakar zahidin söhbət və ülfətindən peşman olub və yaxasını kənara çəkib deyir:



Mən hara, söhbəti-namaz hara?!
Məni azdırdı bu müsahibi-xam.
Dəftəri-eşqü babi-sövmü səlat,
Məbhəsi-xalü xət, rükuü qiyam.
Ey ələmdari-şahi-təşnəcigər,
Sənə qurban mənim atam-anam.
Hərə bir şahı sevmiş, əzəldən
Səni sevmiş Nəbatiyi-bədnam.
Gəh Əbülfəzlü gahi ya Abbas –
Deyərəm, eylədim sözü itmam.
Saqiyü camü şahidü gülü mül –
Bu idi, vəssəlam, vəlikram.
Gəl, gözüm, tut nəzərdə ol şahi,
Müxtəsər eylə, etmə çox ibram.
Qoy qədəm rahi-eşqə mərdanə,
Gir xərabatə məstü məstanə.

Aşağıda dərc olunan kəlamında Nəbati bir növ hali-dilini bəyan etmək üçün bəni-Haşim mahı, mənbəi-sövlət və şücaət Əliyyül-Mürtəza oğlu Həzrət Abbasdan mədəd tələb edir, xaməsinin tişeyi-Fərhaddan kəskin olmağını təmənna edir və divanəvər həlqeyi-zənciri meydani-tərəbdə silkələyib eşq ilə bir hay-huy çəkir. Bu sənada şairin qulağına Hatifdən nida gəlir ki, ey Nəbati, mətləbin rəva oldu, xatirini şad qıl! Və sonra münşiyi-divani-həqq şairə bu fərmanı verir ki, eşqdən lafü gəzaf vurub özünü öymə və aşiqəm demə. Bu yolda eşqi-məcazi yaramaz; bu yolda gərəkdir kərrat ilə canını bəlalara salıb, bərkidib polad edəsən və buteyi-ixlasda qəlbi-misi əridib iksiri-eşq ilə onu pak və saf qılasan və hər nisfişəbdə rahət yuxusundan ayılıb, əl-üzünə səfa verib, şövq ilə namixudanı vird edəsən, ta ki, bu minval ilə nəfsi-dunun köpəyi məqamında olan hirsü tamahı özünə ram edə biləsən və qəmkədeyi-üzlətə təb'ini mö'tad qılmağı bacarasan. Vəqti ki, bu imtahanlardan çıxıb və şərbəti-təcriddən bir cam içib özünü həlqeyi-ürəfayə və daireyi-hükəmaya daxil elədin, onda sənə eşq tilsiminin qıfılı fəth olunar. Bundan sonra rahifənada sənin nəfsinə bircə təvəkkül kifayət edər, bəşərti ki, su yerinə gözlərin yaşını Dəcleyi-Bağdad edib və yarın ətəyindən bərk yapışıb rahi-eşqdə müstəhkəm durasan. Bu halda aləmi öz əmrinə tabe edə bilərsən və xatirini zikrdən cənnəti-Şəddad qılsan da, vəsvəseyi-şeytan səni gümrah edə bilməz. Bundan sonra əgər Nəbati başqa məqamlarda səyahət etmək fikrinə düşərsə, onda onun başını tö'meyi-xəncər etməyə muxtarsan. Şairin öz kəlamına rücu edək:

Aşiqi-divanə, bir zümzümə bünyad qıl!
Xatirimi qüssədən bir nəfəs azad qıl!

Həlqeyi-zənciri bir silkələ, səslən yenə,
Eşq ilə bir hay-huy, şur ilə bir dad qıl!

Müddəti-axır bu ev bəzmgəhi-yar idi,
Heyfdi, bu mənzili yıxma, gəl abad qıl!

Mahəsəli məqsədin yar idi məqsud əgər,
Başini bu damdə daneyi-səyyad qıl!

Ruzi-əzəl aşiqə qismət olub xuni-dil,
Bax mənə bir sədrini kureyi-həddad qıl!

Yoxdu bizim sazımız, tari-xoşavazımız,
Tök üzə əşki-rəvan, naləvü fəryad qıl!

Mahi-bəni-Haşim ol Həzrəti-Abbasdən –
İstə mədəd, xaməni tişeyi-Fərhad qıl!

Müğbəçeyi-mütrübün burda yeri yox hənuz,
Ah çəkib dəmbədəm növhəvü bidad qıl!

Yetdi nida səminə Hatifi-lareybdən,
Mətləbin oldu rəva, xatirini şad qıl!

Münşiyi-divani-həqq yazdı bu fərmanı kim,
Bu neçə əbyatı da dəftərə irad qıl!

Laf urub eşqdən, adına aşiq demə,
Ya bu ki, bu rahdə canını fulad qıl!

Bu misi-qəlbi ərit buteyi-ixlasdə,
Vur ona iksiri-eşq, qabili-nəqqad qıl!

Nisfi-şəb olduqca dur əl-üzünə ver səfa,
Yatma dəxi, sübhə dək şövq ilə övrad qıl!

Ta ki, sənə ram ola hirsi-səgi-nəfsi-dun,
Qəmkədeyi-üzlətə təb'ini mö'tad qıl!

Şərbəti-təcriddən başına bir cam çək,
Get özünü daxili-həlqeyi-övtad qıl!

Ta ki, sənə fəth ola qıfli-tilismati-eşq,
Xəlq üzünə qapını şeşdəri-nərrad qıl!



Əşhəbi-sər-sər-xuram gərçi imanın qırıb,
Getmə, dur, ey biədəb, hörməti-ustad qıl!

Şamü səhər müttəsil həmdü yüz ixlas ilə
Ta nəfəsin var isə ruhun onun şad qıl!

Yar ətəyindən əlin üzmə, budur rahi-eşq,
Gözlə onu, aləmi tabeü münqad qıl!

Vəsvəseyi-Əhrimən gər səni gümrah edə,
Xatirini zikrdən cənnəti-Şəddad qıl!

Bir də Nəbati əgər meyli-səyahət edə,
Başın onun tö'meyi-xəncəri-cəllad qıl!

Digər bir kəlamında Nəbati könlünə xitab edib deyir: Bu qədər yatdığın bəsdir. Qəflət yuxusundan bir gözünü açıb bidar ol! Qönçə kimi pərdədə qaldığın bəsdir, bir zaman açılıb sən də bir şahidi-bazar ol! Zülmət diyarına qədəm basıb abi-həyatı axtar, irəli yeri, dönüb dala baxma, xövfü şəkkə düşmə! "Ləntərani"[553] əcəb bir əmrdir. Əgər həqiqi aşiqsən, Tura sarı yüyür, talibi-didar ol! Musa kimi əsanı yerə at və nəleyinini ayağından çıxart, onda nuri-həqq səndə təcəlla edər. Əgər həqqi tutub xalqı unutsan, İsa kimi göylərdə məqam tutarsan.

Əlli ilin müddətində bu qədər məscidə gedib-gəlməyindən nə hasil etdin? Hansı feyz və kəmalata nail oldun? Oğlun ölsün, bir usan, bəsdir bu qədər riyayi ibadət və zahiri taat! Bazar ol! Şəkk və səhvi qəlbindən çıxart, "qabili-məğfirəti-qadiri-qəffar ol-ol"!

Bu qədər guşeyi-mehrabə sığındın bəsdir,
Bir də meyxanəyə gəl, faizi-ənvar ol-ol!

Eşqi, aşiqliyi mən eyləmə, zahid, billah,
Əqlini başına yığ, aşiqi-bir yar ol-ol!

Seyid Əbülqasım öz təb'i-gövhərbarı və əş'ari-abdarı xüsusunda belə yazır:

Aç fəsahət qapısın, ey "ənə əfsəh" nəsli*,
Səndə mirasi-şəhənşahi-tədəlla görünür.

Şəms Təbrizi kimi mühyiyi-əmvat oldun,
Vəh, onun cilvəgəhi aləmi-bala görünür.

* Rəsuli-Əkrəmə işarədir

Təb'i-mətbuun edər Maniyü Ərjəngi xəcil,
Rəşheyi-kilki-tərin sehri-həlala görünür.

Bu nə pərvazdı, ey tairi-Simürğ-şikar,
Təhti-balında onun fövqi-Sürəyya görünür.

Sözü qıl şəhdü şəkər, ey ənə əmləh balası,
Məhəki-dürri-süxən surəti-Sədra görünür.

Həyy edər əzmi-rəmimi nəfəsi-müşkini,
Nitqi-şirini ara mö'cüzi-İsa görünür.

Qələmi-gövhərrizinə xitabən deyibdir:

Ey qələm, ey ənisi-əhli-bəyan,
Cəhd qıl etgilən sözü ziba.
Gəl, gətir badə, ey gözüm saqi –
Ki, verim çöhreyi-məqalə səfa.
Ta salım bu cahanə bir ğülğül,
Başlayım tazə bir əcibə nəva.
Gələlər vəcdə aşiqü arif,
Düşələr rəqsə padişahü gəda.

Bu babda yenə başqa bir kəlamında yazıbdır:

Kilki-süxənsəncü şəkkərrizə bax,
Gündü bu, ya gövhəri-inşa imiş?

Kağızı diba kimi gülgun edib,
Cümlə hünər bunda mühəyya imiş.

Nöqtələri hər biri bir qit'ədir,
Hərfləri hər biri bir pira imiş.

Haşimiyəm, varisi-fəxrül-kəlam,
Bizlərə bu şiveyi-aba imiş.

Padişahi-ərzü səmadır qələm,
Taci-səri-Xosrovü Dara imiş.

Bu qələmi-silsiləmudur ki, bu
Həmdəmi-hər arifü dana imiş.

Yenə bu xüsusda başqa bir yerdə yazmışdır:

Kağəzi-zərkeş gətir, ver mənə zərrin qələm,
Ta ki, mən inşa qılım eşqdə bu məhzəri.



Çünki tamam eylədim mən bu tərəbxanəni,
Hazır edin siz o dəm Maniyi-surətgəri.

Onda mənim şəklimi, surəti-dildarımı
Nəqş edə bu səfhədə, şad edə bu kafəri.

Getdi Nəbati özü, qaldı sözü yadigar,
Aşiq olanlar gəzər axtarı bu dəftəri.

Yenə öz təb'i haqqında buyurmuşdur:

Çox tə'rif eləmə baği-behişti, zahid –
Ki, onun kuyi, mənim rövzeyi-rizvanım bəs.

Bülbülü tutiyü qumri sənə ərzani ola,
Ey Nəbati, mənə bu təb'i-süxəndanım bəs.

Burada zikr olunan kəlamlardan başqa yenə Nəbatinin öz təb'i vəsfində mövzun şeirləri vardır ki, cümləsini yazmağa ehtiyac yoxdur. Biz ancaq bunu deyə bilərik ki, əlhəqq Nəbatinin təb'i gözəl və rəvan imiş. Ondan nəş'ət edən sözlərin çoxu lə'l və cəvahirə bərabərdir.

Gövhəri-nəzmdi ya silki-dürü lə'li-xoşab,
Şe'ri-rəngindi ya lölövü lala-lala.

Nəbati əleyhirrəhmənin başqa növ kəlamları ilə möhtərəm oxucuları daha da ətraflı aşina etmək qəsdi ilə təbərrükən bir neçəsini burada dərc edirik.

Müstəzadi-Nəbati:

Ta oldu sənin mehri-rüxün sünbülə mülhəq,
Ey mahi-mütəbbəq!
Sandım ki, günəş əbrə girib oldu mübərrəq,
Can oldu mühərrəq.
Mah üzrə düşən nöqteyi-xalın nə bəladır,
Ey gözləri cadu.
Heyrətdədi bu məsələdə cümlə müdəqqiq,
Acizdilə mütləq.
Bu dairədə nöqteyi-pərgar qalıb mat,
Şətrəncdə çün şah.
Girdabi-bəla içrə sınıb ləngəri-zövrəq,
Hər dəm deyər "həq-həq".
Bu acizü dərvişə əgər mürşidi-eşqin
Rüxsət verə, billah,

İsbat edərəm böylə ki, hamı deyə səddəq,
Həm ərşi-müəlləq.
Faş eyləməzəm mən dəxi əsrari-nihanı,
Yox, yox, qələt etdim.
Get, get, qanını heç yerə tökdürmə benahəq,
Ey cahili-əhməq!
"Bismillah"ı[554] dərk eyləməmiş "həmd"ə[555] yüyürmə,
Ey zahidi-gümrah!
Sərkərdəsiz aya görünüb bağlana səncəq,
Ləşkər tapa rövnəq?
Dəyməz iki dinarə sənin sövmü səlatın,
Sallanma behiştə!
Qəflətdən oyan, aç gözün, ol tazə müsəbbəq,
Manəndi-Fərəzdəq[556].
Keyfiyyəti-meyxanəni məsciddə kim anlar,
Gəl ol sözə vaqif.
Aldatdı səni cifeyi-dünyayi-müzərrəq,
Vur başına çün bəq.
Hümmət elə, aç sinəmi, qıl nitqimi guya,
Ey piri-xərabət!
Bu leyli-düça içrə məni qoyma müfərrəq,
Ey sübhi-müfəlləq.
Bu ərseyi-xunxardə dəm vurma, Nəbati,
Ol sakitü samit.
Guya sənə kəşf olmayıb əhvali-"ənəlhəq",[557]
Sən bilmədin əlhəq.

Qəzəli-Nəbati:

Cumdum yenə qəvvas tək dəryayə mən, dəryayə mən,
Qıldım nəzər bir löleyi-lalayə mən, lalayə mən.

Sən sanma mən bu bəhrdə hər inci, mirvari gəzəm,
Göz dikmişəm bir gövhəri-valayə mən, valayə mən.

Getdim biyaban gəştinə, urdum təcəlla dəştinə,
Etdim tamaşa Turdə Musayə mən, Musayə mən.

Çıxdım bu ərşin üstünə, baxdım büləndü pəstinə,
Pəs onda nagəh uğradım İsayə mən, İsayə mən.

Saldım tamami-aləmi gözdən, unutdum Adəmi,
Verdim könül bir vahidi-yektayə mən, yektayə mən.

Gəzdim səmavati tamam, hər mənzilə etdim xuram,
Qıldım güzər həm cənnəti-əlayə mən, əlayə mən.



Etdim tamaşa güllərin, həm xoşnəva bülbüllərin.
Saldım nəzər həm mənzəri-hurayə mən, hurayə mən.

Getdi sərimdən əqlü huş, bir guşədə oldum xəmuş,
Düşdüm əcayib mənzili-ixfayə mən, iifxayə mən.

Nə yatmış idim nə oyaq, nə atlı idim nə yayaq,
Bir vaxtı gördüm gəlmişəm dünyayə mən, dünyayə mən.

Leyli deyib çəkdim aman, qan-yaş töküb etdim fəğan,
Düşdüm yenə Məcnun kimi səhrayə mən, səhrayə mən.

Fani olubdur bu bədən, dur tap, Nəbati, bir kəfən,
Bu canı qurban eylədim Leylayə mən, Leylayə mən.

Əyzən qəzəli-Nəbati:

Ey könül, etmə şurü qövğa hiç!
Çəkmə bihudə rəncü qövğa hiç!

Bivəfa ömrə etibar etmə,
Olma aludə fikrə əsla hiç!

Xak olur aqibət fəqirü ğəni,
Hasili-malü mülki-dünya hiç!

Arif ol, arif, olma zahidi-xüşk,
İxtiyar etmə zöhdü təqva hiç!

Mübtəla olma nəş'eyi-bəngə,
Meyi-gülfam, cami-mina hiç!

Hümmət et, olgilən yəqin əhli,
Küfrü din bəhsin etmə qəta hiç!

Ey Nəbati, səninlə həqdir yar,
Qəm yemə aləm olsa ə'da hiç!

Mürəbbeati-Nəbati:

Səba, bu ərzimi yetir səyyadə,
Söylə bağışlasın xudayə məni.
Taqətim kəsilib künci-qəfəsdə,
Mürəxxəs eyləsin bir ayə məni.

Əgərçi bilirəm çoxdur günahım,
Dəxi ondan özgə yoxdur pənahım,
Degilən: ümidim vardır ki, şahım,
Əfv etsin ayeyi-vəfayə məni.

Gecələr sübhə dək işim nalədir,
Ağlamaqdan gözüm qan piyalədir,
Canım bütün qara dağlı lalədir,
Yetirsin Zəmzəmü Səfayə[558] məni.

Məlamət çəkməkdən yetişdim canə,
Əridi ürəyim, döndü al qanə,
Səba, ərzim budur şahi-cahanə:
Dəxi çox salmasın sədayə məni.

Nəbati, Məcnun tək gahi ağladın,
Uşaqları yığıb dəstə bağladın,
Gahi Qələndər tək özün dağladın,
Axır ki, gətirdin harayə məni.

Əyzən qafiyeyi-Nəbati:

Yenə gözüm düşdü bir məhcəmalə,
Ağ üzündə qara müşkin xalı var.
Həlqə-həlqə olub zülfi-müşkini,
Lövşəhəllah, əcəb qəddi-dalı var.

Yanaqları lalə, gözlər badami,
Bağrımı qan etdi lə'li-gülfami,
Nə oldular, ya rəb, Xosrovi-nami,
Xosrovü Şirinin min məqalı var.

De gəlsin saqiyə, qılsın büsatı.
Mürəttəb eyləsin bəzmi-nişatı,
Tez olun, yandırın şəm'i-simatı,
Döşəyin məclisə hər nə qalı var.

Səfheyi-ruxsarı bədri-münəvvər,
Döşənib üstünə zülfi-müənbər,
Dişləri mirvari, dəhanı şəkkər,
Ləblərinin əcəb dadlı balı var.

Gəzəsən aləmi cümlə sərapa,
Tapılmaz bir belə sərvi-dilara,
Dəyməz bir muyinə, həq bilir, haşa,
Hər nə bu dünyanın mülki-malı var.



Yəhərləyin görüm əsbi-gülguni,
Bivəfa görürəm çərxi-gərduni,
Bir də seyr eləyim-Tərfi-hamuni,
Divanə könlümün yüz məlalı var.

Mən dedim bəs Xançobani cavandır.
Bir igid oğlandır, bəbri-bəyandır,
Demə ki, qocalıb, qəddi kəmandır,
İndi gördüm, saqqalının çalı var.

Əyzən qafiyeyi-Nəbati:

Səba, məndən söylə o gülüzarə,
Bülbül gülüstanə gəlsin, gəlməsin?
Bu hicran düşgünü, illər xəstəsi
Qapına dərmanə gəlsin, gəlməsin?

Mən qurbanı olum ənbər tellərin,
Qönçə dodaqların, püstə dillərin,
O lalə ruxsarın, müşkin xalların,
Oduna pərvanə gəlsin, gəlməsin?

Gözüm çox həsrətdir xumar gözünə,
Günəş camalına, şəkər sözünə,
Utanıram, necə deyim üzünə,
Dərdin xəstə canə gəlsin, gəlməsin?

Nəbati istəməz sənsiz dünyani,
İzzəti, hörməti, şövkəti, şani,
Bir zada qalmayıb dəxi gümani,
Bu baş o meydanə gəlsin, gəlməsin?

Əyzən qafiyefi-Nəbati:

Şeyda bülbül, fəğan etmə, qəm yemə,
Bu gün-sabah gül açılır, yaz olur.
Əziz saxla, qənimət bil vücudun,
Vəfası yox gülün, ömrü az olur.

Degilən Fərhada, ey möhnətpişə,
Şirindən incimə, çal daşa tişə
Aşiq-mə'şuq arasında həmişə
İşvə olur, qəmzə olur, naz olur.

Gedər, candan çıxar daği-həsrətin,
Artar gündən-günə şanü şövkətin,

Sübhi-vəslə yetər şami-firqətin,
Diləyin, mətləbin hamı saz olur.

Xədəmələr durar sağü solunda,
Cəvahir bazubənd iki qolunda,
Fəvvarələr işlər daim göləndə,
Yaşıl başlı ördək olur, qaz olur.

Nəbati, sevmişəm bir dilsitanı,
Bir sözü gülşəkər, qönçədəhanı,
Dəxi faş eyləmə sirri-nihanı,
Aşiqin könlündə yüz min raz olur.

Əyzən mürəbbeati-Nəbati:

Yenə İskəndər tək düşdüm zülmətə,
Qabağımı kəsib yüz min bəhrü bər,
İgidliyin, mürüvvətin çağıdır,
Yetiş fəryadıma, ey Xizri-rəhbər!

Tülu' etməz nədən "şəmsi-vəzzüha"?![559]
Fənayə baş çəksin leylətüd-düca,
Yoxsa yatıb məgər nəsimi-səba,
Məşamıma yetməz nəfxeyi-səhər?!

Yarə qurban deyən dili lal etdim,
Möhr edib ağzımı tərki-qal etdim,
Əlif tək qəddimi bükdüm, dal etdim,
İndi görək bu kəmanı kim əyər?

Nəbati, mingilən Rəxşi-himməti,
Seyr elə sərbəsər dəşti-vəhdəti,
Qoyma çıxsın əldən vəqti-fürsəti,
Heyifsən, dünyadan getmə bixəbər!

Təcnisi-Nəbati:

Sənin tək şəhbazi-sərvqamətə
Bir cürə tərlanın ayağı gərək.
Gəmişən saatda kəbkü turaca
Qaynağının dəmi, ayağı gərək.

Əyninə geyəsən gündə minalı,
Beli bağlı xəncər, dəstə minalı,
Qurulsun məclisin cəngü minalı,
Əlində saqinin əyağı gərək.



Qabağınca neçə yedək çəkilə,
Səni görcək xanzadələr çəkilə,
Erişə şöhrətin Çinü Çəkilə,
Deyələr şahlığa ayağı gərək.

Səhər-axşam təb'lü nayın buğlana,
Çəkilə düşmənin darə bağlana,
Plov qazanların üstə buğlana,
Yaxşı bollu əti-ayağı gərək.

Səba, bu ərzəni ələ salma ya!
Mənim salamımı yetir Səlmaya*,
Niyə gərək məni yada salmaya,
Onun Nəbati tək ayağı gərək.

Yenə təcnisi-Nəbati:

Məcnunlar adını çəkən təhrirə,
Nola sərdəftərə o, yaza məni.
Deyirlər bu idi zikri Mahmudun:
Durun qurban edin Əyaza məni[560].

Yenə sağ qalmışam, belə yarə, mən,
Kəlbin tək kuyində yatam yerə mən.
Gizlin sirrim gedim deyim yarə mən,
Bir ağac götürə, ay əzə məni.

Saçı sünbül, üzü gül-gül, göz ala,
Göz istəməz gözlərindən göz ala,
Bu şan-şan bağrımı gül-gül göz ala,
Qənaət verginən a yaza məni.

Nəbati tək dəryaları üzəsən,
Siyah zülfün əfşan eylə üzə sən,
Qəmər tək buluddan bir çıx üzə sən,
Çox da verməgilən ayaza məni.

* * *

Eşqi başa vurub söz deyən aşiq,
Gəl görüm görmüsən bu göz kimi göz?
And olsun Allaha, həyyü layəzəl
Xəlq eləməz bir də bu göz kimi göz.

*Səlma – şairin sevgilisinin adıdır

Niyə zülfün yenə üzdən yan durmuş,
Məni oxlamağa Gəzgəz yan durmuş,
Çox fəqiri fələk yıxıb yandırmış,
Heç kafir görməsin bu göz kimi göz.

Bu müşkülün heç görünməz asanı,
Dağ-düyünün yoxdur dəxi a sanı,
Görüm Allah hifz eləsin a səni,
Bədnəzər düşməyib bu göz kimi göz.

Bilməm fələk məni kimə cur etdi,
Eşqim qurmamış qapdı, cur etdi,
Gözüm yaşı Nəbatini çürütdü,
Dilim yandı dedim: bu göz kimi göz.

* * *

Qafqaziyada və Azərbaycanın bə'zi nöqtələrində Molla Pənah dövrünə daxil olan və fövqdə isimləri zikr olunan şüəradan başqa bir çoxları da vardır ki, onların, məətəəssüf, tərcümeyi-hallarından və isim-nəsəblərindən, azacıq da olsa, mə'lumat kəsb etməkdə aciz qaldıq və bu yolda çox cüstücu etdiksə də, sə'y və təlaşımız bir nəticə vermədi.

Bu şairlərdən məşhur olanları Ağaməsih Şirvanidən və xacə Nişatdan sonra Şamaxı və Şirvan torpağında vücuda gələnləridir ki, fəzl və kəmalda və xüsusən şeir yazmaqda iştihar bulmuşlar.

Mərhuməl-məğfur Ağaəli bəy Əfəndizadənin bizə verdiyi mə'lumata görə Ağaməsihdən və Nişatdan sonra xaki-mübarəki-Şirvanda ərseyi-vücuda gələn şüəra – ki, ibarət ola Məhvəşidən, Zülalidən, Vaiz əfəndi Şirvanidən, Əsgər Şirvanidən, Nabi əfəndi Şirvanidən, Arif Şirvanidən, Lahici Şirvanidən, Hümməti Şirvanidən, Asəf Şirvanidən, Nəsimi Şirvanidən, Məhzun Şirvanidən, Molla Qədir Naci Şirvanidən və qeyrilərindən – hicrətin on üçüncü əsrinin əvvəllərində və bə'ziləri əvasitində zindəganlıq edib əş'ari-mütəfərriqədən səva bir namü nişan qoymayıblar. Bu şairlərin içində Məhvəşi, Vaiz Şirvani və Naci Şirvani kimi müqtədir, süxənvər və danişməndləri olubdur ki, hər biri təb'i-səlim sahibi imiş. Bunların ismlərini zikr edib də lazım gördük ki, hər birinin əş'ar və kəlamından bə'zilərini nümunə olaraq məcmuəmizə daxil edək.



## MƏHVƏŞİ ŞİRVANİ

Məhvəşi Şirvani on üçüncü əsrin əvayilində[561] Şirvan vilayətində Ağaməsih Şirvanidən sonra vücuda gəlibdir. Bir çox kəlamından – ki, bizim əlimizə düşübdür, – onun əhli-hal və sahibi-kəmal bir şairi-şirinməqal olduğu görünür. Hər qisim əş'arı vardır. Onlardan bir parası nümunə üçün burada təstir olunur. Peyğəmbəri-valatəbarımız Məhəmmədi-Mustafa həzrətlərinə olan məhəbbət və sədaqətini bu qəzəli-bibədəlində bəyan etmişdir:

Ey nigahi cansitan, çeşmi-siyahi dilfərib,
Qoymamışdır məndə qəmzən səbrü aramü şəkib.

Bəndeyi-biçarəyəm, avarə düşmüş kimsəyəm,
Qıl tərəhhüm mən fəqirə, olmuşam miskin qərib.

Gözlərin cəlladi-yaği, qaşların qövsi-qüzeh,
Kipriyin xunrizi-dövrandır, xətin nəqşi-əcib.

Şəhriyari-xubrusan, xosrovi-alinijad,
Mətlə'i-ənvari-həqsən, şafei-ruzi-həsib.

Dərgəhin darül-amandır, xakpayan tutiya,
Söhbətin ənfasə candır, rif'ətin əcza təbib.

Xatəmi-xeyli-rüsülsən, əvvəli-hirzi həyat,
Baisi-icadi-aləm, məhrəmi-sirri-mücib.

Məhvəşi bir kəmtərindər dəhr ara aramı yox,
Müntəzirdir rəhmətə, şəfqət elə bir şey nəsib.

Qəzəli-Məhvəşi:

Vermişəm dünya məta'ımn qarətə canənə mən,
Olmuşam məsrurü xürrəm, eylərəm şükranə mən.

Neylərəm qəmxanəni, qəm çəkməyə dünya üçün?
Eylərəm şükrü sənə ol xaliqi-sübhanə mən.

Dami-qəmdir bu cahan, meyl eyləmən ol danəyə,
Görmüşəm tüğyani-Adəm ismini dər danə mən.

Yar kuyi məskənimdir, istərəm ol kuyi mən,
Yarsız meyl etmənəm ol rövzeyi-rizvanə mən.

Yari-baqidir mənə, həmrahü həmxabım müdam,
Həmnişin, həmsöhbətəm ol qadirü yezdanə mən.

Mə'niyi-zatım nümayan, məndədir ənvari-həq,
Dərgəhi-piri-muğanəm, guşeyi-meyxanə mən.

Məndədir cami-sürahi, xəlvəti-kaşanə həm,
Cami-Cəmdir, Məhvəşi, peymanə o, məstanə mən.

Məhvəşinin bu növ mütəəddid şeirlərindən mə'lum olur ki, ol mərhum da Nişat kimi şüərayi-farsdan sufiməslək Şeyx Əttara, Şəms Təbriziyə və Mövlana Cəlaləddin Rumiyə peyrəvilik edib bir növ özü də həqiqətpərəst olmuşdur.

Məhvəşi şeyin zahirinə e'tina etməyib, hər yerdə onun həqiqətinə və batini aləminə diqqət yetirib mə'nayi-əzəlisini bilmək istəyir. Şair cümleyi-kainatda və kaffeyi-mövcudatda böyük hikmətlər və sirrlər hər dəmdə zahir olduğunu görüb də bir kəlamında deyir:

Yari-baqi oldurur əflakdə seyr eyləyən,
Baxgilən ibrət gözilə, görgilən əsrari-həq.

Sirri-həq mövcuddur hər dəmdə izhar eyləyir,
Gah dildə, gah güldə görsənir əsrari-həq...

Suya bax, daşdan çıxıb cari olur, aramı yox,
Gah gərmü gah sərdü mötədil əsrari-həq.

Aç gözün, qılgil nəzarə, hər yana baxsan, odur,
Vahid oldur, baqi oldur, münbəsit əsrari-həq.

Məhvəşi hər dəmdə görür gunə-gunə sirri-həq
Xud özü bir sirrdir, söylər özü əsrari-həq.

Şairi-həqiqətbin və xoşayin hər qisim mə'siyyətdən öz vücudunu pak və münəzzəh görüb və cami-bəqadan çəşidə edib, aqil və kamil bir vücud olmasını və sirri "ənəlhəqq" söyləməsini başqa bir kəlamında izhar eləyir və ibtidayi-kəlamı fatehi-Xeybər və saqiyi-kövsər, yə'ni Əli Heydəri-kərrarın mədhilə başlayıb, özünü bu sayaq nişan verir:

İçmişəm cami-əzəldən, olmuşam məstanə mən,
Saqiyi-kövsər Əlidir, olmuşam cananə mən.

Oldurur şahım, pənahım, məzhəbü dinim mənim,
Elmi-zahirdən, nə hasil, olmuşam biganə mən.

Oldurur elmül-lədünni, oldurur əsrari-həq,
Kəmtərin bir bəndəyəm, şükr eylərəm sübhanə mən.

Kə'bəni bütxanədən ayrı bilir zahirpərəst,
Məscidin tərkin qıldım, bəklədim meyxanə mən.



Məstü məxmur olmuşam, zahid, dəri-meyxanədə,
Söylərəm sirri-"ənəlhəq", olmuşam divanə mən.

Cənnətü firdovsi-ə'la vəsfini çox söyləmə,
Yar baqidir mənə, bil, baxmışam Fürqanə mən.

Oturub bir guşədə, taət edirsən xaliqə,
Niyyətin cənnət imiş, gör, söylərəm mərdanə mən.

Bil həqiqət həqqdən, vaiz, usan bu cəhldən,
Cənnət içrə izzi yoxdur, girmişəm rizvanə mən.

Kor olubsan, görməyirsən rö'yəti-cananını,
Məhvəşi, gəl qıl nəzarə, onda dür, dürdanə mən.

Məhvəşinin yuxarıda yazılan kəlamlarından – ki, mənən və bəlağət heysiyyəti ilə biqüsurdurlar, onun Füzuli əleyhirrəhınəyə və Nəbatiyə təbəiyyət göstərməyi zahir olur. Ehtimal var ki, Nəbati ilə Məhvəşi bir əsrin adamları olmuş olsunlar. Hər halda onların kəlamları bir-birinə çox bənzəyir: həm ləfzən, həm mənən.

Zahirpərəst vaizlərin haqqında demişdir:

Vaizin zahiri xoş, sirri-xudadən qafil,
Ümmiyi-əhməq imiş, batin işindən cahil.

Nə olur zöhdü riyadən, nə bilir bixəbəran,
Deməyin, mərdümi-dana, bulara siz aqil.

Əqli yox kövdən imiş, misli-bəhaim bifəhm,
Deməz insan bulara, mərdi-mübarək, qabil.

Uymagil nəfsə, fəqih, zöhdü riyadən bir usan,
Habili-xoşsiyəri qətlə yetirdi Qabil[562].

Dəhri-dun məzrəi-üqbadı, bil anı təhqiq,
Yaxşılıq töxmin əgər mərdümi-dana kamil.

Olma qafil, həzər eylə bu riya işlərdən,
Nəfsi-şuma uyuban etmə xəyalın batil.

Bir eşit Məhvəşinin pəndini, ey vaizi-şəhr,
Eşq dəryasına gir, eylə vücudun sahil.

Məhvəşinin bu qisim xoşməzmun kəlamı çoxdur və cümləsində şairin həqiqətbin və alitəbliyi görünür. Bir qəzəlində şairin təb'i övci-məqama pərvaz eləyib, şahbazi-fikri seyrəngahi-lahutda dövrü gərdiş eləyir. Bu halət üzrə şair bəşəriyyət halından çıxıb öz vücudunu gah gənci-əsrari-

xuda və mə'dəni-ənva'i-cəvahir və məxzəni-lə'lü gövhər bilir və gah göy üzündə gərdiş edən şəmsi-aləmara və səfheyi-asimanda bərq vuran seyheyi-səda və sair məxluqatın kaffəsinə məzhəri mənbə hesab eləyir.

Məhvəşinin bu kəlamında Şəms Təbrizinin tə'siri aşikarən görünür. Haman qəzəl budur:

Bir fəqirin şahasa, dərvişəm şeydasifət,
Bir gədayam birida, dərgahi-alimənzələt.

Müstəhəq biçizü miskin bəndeyi-azadəyəm,
Məxzəni-dürdanəyəm, əsrari-gənci-mə'rifət.

Gənci-əsrari-xudayəm guşeyi-meyxanədə,
Şəmsi-gərdunəm yəqin, seyr eylərəm dəryavü dəşt.

Eylərəm bir dəmdə seyr əflaki-gərduni təmam,
Mö'təkif bir guşədə xummarvəş bipavü dəst.

Xümnişinəm, çün Fəlatun hikməti-Rəhman[563] mənəm,
Pəhlivanəm çün Təhəmtən[564] olmuşam çalakü cəst.

Bərq uran göy səfhəsində seyheyi-əfğan mənəm,
Mə'dəni-ənva'i-cövhər məndədir, ey xudpərəst!

Sərfərazəm eşq ara, rindi-qələndərməşrəbəm,
Şəhriyari-arifanəm, tuqdari-tacü təxt.

Şahbazi-fikrətəm, seyrəngəhim lahutdur,
İçmişəm mey cami-həqdən, olmuşam azadə məst.

Saqiyi-rizvan qulami Məhvəşi küstaxdır,
Dəhr ara sərməst olubdur zahirən ol rə'yi səxt.

Qeysəri-gəbrnijadəm, xosrovi-xaqani-Çin,
Adili-Nuşirəvanəm, cami-Cəm, Cəmşidbəxt

Məhvəşinin bu məzmunda daha bir çox qəzəlləri vardır ki, cümləsini burada dərc qılmağa ehtiyac yoxdur.

Şair bəsirət gözü ilə ətrafına nəzər yetirib, tamami-məxluqatın axırını puç, zay və fani görüb, özü dəxi fəna arzusuna düşür, rahət və səadəti məhz fənada və aləmi-ədəmdə təhqiq edir və könlünü fəna mülkünə tərəf sövq edib deyir:

Fəna olmaq dilər könlüm əlayiqdən qutarmaqdan,
Fənadə işrətü qəm yox, misali-məstü heyrandır.



Necə ki, bu babda Füzuli Bağdadi həm demişdir:

Əlqissə, vücud dami-qəmdir,
Azadələrin yeri ədəmdir.

Belə olan surətdə mərgdən xövf etmək və fəna aləminə köç etməkdən mə'yus və mükəddər olmaq böyük bir səhv deyilmi? Həqiqəti-haldan bir növ bixəbər və qafil olmaq deyilmi? İnsan üçün ölüm haqqdır və ayeyi-vafi hidayə məzmununca "kullu şeyin halikun illə vəchəhu" – baqi və əbədi qalan ancaq bir qaliri-zülcəlaldır. Bu cəhətə dünyanın qəmin yeməkdən və övza'i-zəmanədən dilgir və şaki olmaqdan bir fayda yoxdur. Vəli insan necə ki, diridir, həyatın qədrini gərəkdir bilsin və həqq-taala ona mərhəmət qıldığı qüdrət və bacarığı xeyir işlərə və haqq yoluna sərf eləsin. Tək fəna arzulamaqdan bir mənfəət yoxdur və haqq-taalanın əmri bizə sə'y və təlaşdır. Zaviyənişinlik və bikarçılıqdan bir şey çıxmaz. Bizim bu əsri-şumda hətta mə'dəni tayfalar arasında dəxi diriliyi biməzmun bilib dünyadan və onun keşməkeşindən bizar olub canlarına qəsd edənlər az deyildir.

Axır vaxtlarda elə ittifaq düşür ki, paytaxt şəhərlərdə intihar edənlərin həddi və hesabı əndazədən çıxır və ricali-dövləti, polisə mə'murlarını, hükəma və fəlsəfə firqələrini fikir və əndişəyə salır. Bu hədsiz intihara səbəblər çoxdur. Vəli ümdəsi dünyadan bizar olub beş günlük həyatı püç və biməzmun bilmək əqidəsidir.

İslam aləmində dəxi bu fikir və əqidədə olanlar az deyildir. Təkcə Füzulinin:

Əlqissə, vücud dami-qəmdir,
Azadələrin yeri ədəmdir.

– şe'ri ona kifayət edir ki, çoxlarını qəfildən ayıldıb beş günlük dünya məişətinin puç və boş olmağı barəsində böyük əndişəyə salsın. Başqa bir əcəm şairi bu xüsusda demişdir:

Ma hiç, cəhan hiç, ğəmo şadi hiç,
Xoş nist bəraye-hiç naxoş budən.[565]

Mərhum Məhvəşi dəxi bu əqidədə olduğunu bir qəzəlində izhar qılıb deyir:

Şadiman ol, çəkmə qəm dünya üçün, ey nikmərd,
Səndə vardır əsli-mə'na, gövhəri-paki-xirəd.

Gün dolanır, ay olur, dövran keçir, olur xəzan,
Fəsli-gül keçdi – deyib olma, könül, aşüftəgərd.

Fanidir məcmu'i-əşya, sərbəsər hər nə ki, var,
Yerü göy, şəmsü qəmər, əncüm, kəvakib, bad, gərd.

Oldurur baği qalan, hər bir şeyin mə'nasıdır,
Qeyr yoxdur, hər nə görsən oldurur yektayi-fərd.

Şəkli-gunagun görünür dəhr hara bihəddü həsr,
Təlxü şirin, xubü ziştü bədsiyər, ruxsari-zərd.

Gör fənadə baqini, bilmən bu istiğna nədir,
Ey səmənbər nazlı yarım, söyləmə bir hərfi-rədd.

Yari-baqi cilvəsidir hər nə görsən, məhvəşi,
Müztəribhal olmagil, ey mərdi-arif, mö'təməd!

Həqq-taalanın tövhidi, qüdrət, əzəmət və bəqası xüsusunda və insanın zə'f, əcz və fənası barəsində Məhvəşinin yuxarıda tərqim olunan kəlamı xeyli pürmə'na və Füzulinin kəlamına bənzər bir qəzəldir. Bu misilli qəzəlləri çoxdur. Əşarın qəzəliyyat qismindən səva Məhvəşinin hər növ kəlamı vardır. Cümləsindən müsəlsəl və mövzun olanı tərcibənd və tərkibbənd kəlamlarıdır.

Bunlardan qeyri bir çox xoşməzmun və səlis müsəddəsat, müxəmməsat və mürəbbeatı vardır ki, cümləsinin buraya küncayişi yoxdur. Nümunə üçün onlardan birisi zeyldə dərc olunur.

Kəlami-Məhvəşi əleyhirrəhmə:

Piranəsərəm, şurü nəvadən xəbərim var,
Aşüftətərəm, sün'i-xudadən xəbərim var.
Seyr eyləmişəm, teyri-hümadən xəbərim var,
Bidar oturub badi-səbadən xəbərim var.
Çox eyləmişəm seyr, fənadən xəbərim var,
Gəl həmdəm olaq, əhli-bəqadən xəbərim var.
Çün mö'təkifəm, zöhdü riyadən xəbərim var,
Xəffaş niyəm*, mehrü ziyadən xəbərim var.
Hamu eləmən, yə'ni nəvadən xəbərim var,
Zahid deyiləm, sövmü səladən xəbərim var,
Saqi deyiləm, bəzmi-səbadən xəbərim var,
Hüdhüd deyiləm, şəhri-Səbadən xəbərim var[566]
Tuti deyiləm, mürği-Minadən xəbərim var,
Zalim deyiləm, əhli-cəfadən xəbərim var.
Vaiz deyiləm, xövfü ricadən xəbərim var,
Alim deyiləm, elmi-xəfadən xəbərim var.
Cahil deyiləm, "la" vü "ə'la"dən xəbərim var.
Qafil deyiləm, qalü bəladən xəbərim var,
Nadan deyiləm, eyni-rizadən xəbərim var,
Bidin deyiləm, əhli-vəfadən xəbərim var.

* Niyəm – nistəm, deyiləm. Xəffaş niyəm – gecəquşu, yarasa deyiləm



Çoxlar dolanıb dəhrdə dürdanə tapaydım,
Çoxlar dolanıb genc ilə viranə tapaydım,
Çoxlar dolanıb aşiqi-divanə tapaydım,
Çoxlar dolanıb məscidü meyxanə tapaydım,
Çoxlar dolanıb arifi-məstanə tapaydım,
Çoxlar dolanıb saqiyi-peymanə tapaydım,
Çoxlar dolanıb həmrəhi-mərdanə tapaydım,
Çoxlar dolanıb qabili-cananə tapaydım,
Çoxlar dolanıb meyveyi-bidanə tapaydım,
Çoxlar dolanıb şairi-fərzanı tapaydım,
Çoxlar dolanıb məcmə'i-əfsanə tapaydım,
Çoxlar dolanıb zivəri-kaşanə tapaydım,
Çoxlar dolanıb məsnədi-şahanə tapaydım,
Tənha oturub cümləni biganə tapaydım.

Dövran dolanır, yoxdur onun səbrü qərari,
Gündür dolanır, sübhü məsa yoxdu qərari,
Suya nə olubdur ki, edər növheyi-zari,
Azadə olan sərvi-səhin verməldi bari.
Nə zinət ilə güllər açıb nəxli-ənari,
Güllər – kimi əhmər, kimi abi, kimi sari.
Bu hikmətə bax, şəhdi-müsəffa verir ari,
Olmuş güli-həmra nə üçün munisi-xari?
Gənc üzrə qılıbdır nə üçün məskən mari.
Övza'i-cahan böylə olubdur niyə bari?!

Vaiz sözünə tutma qulaq, olma giranbar,
Bu cismi-lətifin eləmə cifeyi-murdar.
Olma nigəran zəxmeyi-qəmxanədə bimar,
Həsrətlə baxıb qeyrilərə eyləmə əfkar.
Dövranü zaman kimsə ilə olmadı qəmxar,
Budur qərəzin kim, olasan ona vəfadar?
Əsla eləmə zaye' özün dəhrdə, idbar,
Uyma onun ətvarına, ey mərdi-nikukar!
Biqiymət olub etmə özün zaye'vü biar,
Bu bəzmdə mərdanə dolan fe'li səzavar.
Bu pəndim eşit, işləmə, bəd olma xətakar,
Bir dürri-giranmayəsən, ey məxzəni-əsrar!

Bu zöhdü riyadən usan, ey zahidi-xudbin,
Olma nigəran nəfsin üçün dəhrdə qəmgin.
Səhrayə çıxıb seyr elə gil biqəmü bikin,
İbrətlə baxıb fikr elə, gör gülləri rəngin.
Nə şövkət ilə dağlar, olmuş belə səngin,
Nə tərz ilə bünyad olub dəhrdə maçin.
Nə rəng ilə güllər yetirib bağdə gülbün,

Nə vəch ilə aram deyil xuşeyi-pərvin.
Göy səfhəsi üzrə gör edib nəcmlər ayin,
Nə ətr saçıb bağdə nərgislə rəyahin.
Gülzarə çıxıb həşmət ilə Xosrovi-şahin,
Şahbaz baxıb gördü onun şövkətü cahin.

Vaiz nə bilir keyfiyyəti-cəhlü həqiqət,
Zahid nə bilir mə'rifəti-şərti-təriqət,
Ümmi nə bilir mərtəbeyi-keyfi-nübüvvət,
Nadan nə bilir nəş'eyi-sərşari-məhəbbət,
Naqis nə bilir nikü bədü qübhü qəbahət,
Aşiq nə bilir şiveyi-göftari-fəsahət,
Qafil nə bilir zövqi-ə'ləm, üsrətü işrət,
Zalim nə bilir mərhəmətü helmü mürüvvət,
Alim nə bilir nükteyi-tövhidi-şəriət,
Miskin nə bilir təntəneyi-hökmi-fəxarət,
Kuran nə bilir ruzü şəbü əhsəni-surət,
Şeyda nə bilir zivərü arayişü zinət,
Sərməst nə bilir qaideyi-söhbətü fikrət,
Bidar gərək arifi-huşyari-ədalət,
Pirani-rəhi-mərifətü munisi-vəhdət,
Bunlardı həqiqətdə olan qabili-qüdrət.

Ey vaiz, usan, eyləmə təkrar bu qali,
Yüz hiylə ilə cəm eləmə malü mə'nali.
Səhrayə düşüb eyləmə hər yerdə suali,
Cəm eyləməgil boynuna bu qədr vəbali.
Olma nigəran ruzi, həvəs eyləmə zari,
Bu şirkü riyadən uzaq ol, etmə xəyali.
Mərdanə dolan dəhrdə, bir eyləgil ari,
Olma nigarən cifə üçün, şükr elə bari
Azadərəviş dövr eləgil, etmə xumari,
Şeydasifət ol güşeyi-meyxanədə bari.
Gəl adəm ol, ey əhmaqi-sərgəştə, übali,
Axır günüdür, xar olub çəkmə məlali.

Ey Məhvəşiyi-suxtədil, xatiri dərviş
Bünyadi-cahan böylə olub, eyləmə təşviş.
Qəndü şəkərü zəhri-həlahil, əsəlü niş,
Fərzanəvü divanə qamu munisü həmxiş.
Gürgü, səgü gusaləvü büzqaleyi-büz, miş,
Əsbü şütürü şir, pələngü kəlü camiş.
Gürbə nədürür, ruzi olub onlar üçün muş,
Ağıl buna çatmaz, eləmə bunlara sən guş.
Bunlar həmə əsrari-xudadır, nə asan iş,
Dövranı-fələkdənmi olubdur yaz ilə qiş?



Ancaq özüdür eyləyən izhari-binaguş,
Sərməstləri kimdir edən dəhrdə mədhuş?
Məxmurlərə kimdi verən qüdrət ilə huş,
Məxluqlərə kimdi verən füshəti-daniş?
Fərzanə nikurə'y gərək, aqibətəndiş.

Məhvəşinin bu tərkibbəndində bə'zi mətləblər təkrar olunursa da (məsələn, riyakar zahidlərə və dünyagir vəzirlərə olunan töhmət və sərzənişlər kimi), bə'zi mətləblər dəxi vardır ki, şayani-diqqətdir.

Şair bir neçə məqamlarda mərhum müəllim Nacini öz əş'ari-hikmətamizi ilə yada salır və onun kimi bir çox nazik mə'nalar və mühüm işarələr üstə danışır. Həqq-taalanın bilinməz sirrlərini və ağlasığışmaz hikmətlərini yad edib mat və mütəhəyyir qalır və bir növ çaşmış halda deyir:

Bunlar həmə əsrari-xudadır, nə asan iş...

Bundan başqa bu tərkibbəndə Məhvəşinin gözəl bəndləri və tənbehləri dəxi vardır ki, onlara diqqət yetirməmək olmaz. Məsələn, bu dəhridunda beş günlük ömür üçün adam gərəkdir nəfsinə uymasın və fe'li-nasəza ilə özünü biar və biqiymət eləməsin.

Əsla eləmə zaye' özün dəhrdə, idbar,
Uyma onun ətvarına, ey mərdi-nikukar!
Biqiymət olub etmə özün zaye'vü biar,
Bu bəzmdə mərdanə dolan, fe'li səzavar.
Bu pəndim eşit, işləmə bəd, olma xətakar,
Bir dürri-giranmayəsən, ey məxzəni-əsrar!*

Məhvəşinin mütəəddid əsərləri bir yerdə cəm olunsa, mötə'bər bir divani-əş'ar hasilə gələr. Asari-nəfisələrindən bir çoxu alicənab Müfti əfəndinin "Məcmuə" təhrir olunmuşdur.

* Məhvəşinin bu şeirləri türk şairlərindən Əbdülhəqq Hamidin[567] "İbn Musa" nam əsərinə bənzəyir. Necə ki, İbn Musanın dilindən demişdir:

Bəhs etmə mənə dəğdəğeyi-yəs'ü əməldən,
Ol təcrübədən nəzdi-kəlamımda qina var.
Azadəsərəm qaileyi-şövqü kəsəldən,
Madam ki, əncami-həvadisdə fəna var.
Hər verdiyi çıxmaqda ikən aqibət əldən,
Dünya bu qədər rəğbətə olsunmu səzavar?!
Musayə nə qəm zərbeyi-cəlladi-əcəldən,
Ömründə fəna var isə namında bəqa var.
Məqsud budur eylədiyim sə'yü əməldən,
Musa denilir qübbədə bir xoşca səda var.

## MİRZƏ HÜSEYN "ZÜLALİ" TƏXƏLLÜS

Mirzə Hüseyn Zülali əslən şirvanlıdır. Tərcümeyi-halına dair mə'lumat cəm edə bilmədik. Eşitdiyimizə görə, Zülalinin nəslindən Şəmsəddin isimində və Zülalov familiyasında bir şəxs sabiqdə Gəncə şəhərində poçt-teleqraf kantorasında xidmət edirmiş. Mumiileyhə kağız göndərib Mirzə Hüseynin haqqında mə'lumat istədik, vəli cavabi-namə gəlmədi. Zülalinin əsərlərindən ancaq bir qəzəl tapdıq ki, zeyldə dərc olunur:

Qəzəli-Mirzə Hüseyn Zülali:

Gülü gülzarı dünyanın cəfayi-xarına dəyməz,
Meyi gülgun xumarı verdiyi azarına dəyməz.

Ola Qarun tək gəncin, müsaid olsa iqbalın,
Çəkən həsrət gedən dəm dövlətin idbarına dəyməz.

Güzidə mə'kulatın ləzzətin bilmək fəna üzrə
Bəqa zəqquminin bir qətrə zəhrimarına dəyməz.

Əgər kamil ola ol meypərəstin əqli başında,
Gəlib meyxanənin hər gün başi divarına dəyməz.

Qoyub xəllaqını məxluqdən hər kim dilər rizqin,
Onun "aməntü billah"[568] etdiyi iqrarına dəyməz.

Zülali bəzmi-ürfanda əgər lafü gəzaf etsə,
İnanman doğrudur göftarı, bu kirdarına dəyməz.



## VAİZ ƏFƏNDİ ŞİRVANİ

Mərhum Vaiz əfəndi Şirvan vilayətinin möhtərəm, alim və sahibi-kəmal və təcrübə şairlərindən hesab olunub, əş'ari-zərifələri ilə öz əsərində nam və şöhrət kəsb etmişdi. Onun qəzəllərindən bir neçəsi əlimizə düşdü. Nümunə olaraq aşağıda iki qəzəli dərc olunur.

Qəzəli-Vaiz əfəndi:

Mehrü-vəfasızların heç kim sözünü qanmaz,
Yəğmadən əl götürməz, bidaddən usanmaz.

Cahi-cahan gələndə bir tari-muy saxlar,
Üz döndərib gedəndə zəncir ilə dayanmaz.

Töhmət deyən öziçün, nə söylər özgəsiçün,
Utanmayan özündən heç kimsədən utanmaz.

Mün'im yalan deyəndə təsdiq edər xəlayiq,
Gər doğru desə müflis, heç kim ona inanmaz.

Ey dilbəri-sitəmgər, məğruri-hüsn olma,
Heç kimsənin çirağı sübh açılınca yanmaz.

Zərfin tünükdü*, zahid, bir cüş ilə daşarsan,
Dəryadilin məzacı seylab ilə bulanmaz.

Vaiz, sənin kəlamın hər biri niştər olsa,
Hər kəs edərsə qəflət ta həşrə dək oyanmaz.

Vaiz əfəndinin bu qəzəlində çox pürmə'na və həkimanə nöqtələr vardır ki, cümləsi indəl-üqəla məqbul və müstəhsəndir.

Bu həqir bəndə həmişə bu e'tiqad üzrədir ki, əksəri-ovqatda şəxsin xoşbəxt və rahat olması öz sə'yi ehtimamına bağlıdır. Hər bir iş insanın elm və kəmalından, bilik və təcrübəsindən asılıdır: "Zəhmət çəkməyən bal yeməz", "cəfa çəkməyən səfa görməz". Bu e'tiqadda ola-ola həqir bu doğrunu da inkar edə bilməz ki, insanın iqbalı açılanda və bəxti gətirəndə zəhmətsiz və məşəqqətsiz də hər tərəfdən onun üstünə dövlət və ne'mət axıb tökülür, hər yerdə ona hörmət və izzət görsənilir. Və bu bəxt gətirən vaxtı onun mal və dövlətini, cah və cəlalını saxlamağa "bir tari-muy" kifayət eləyir. Amma vay o gündən ki, bəxt insandan üz çevirə, iqbal gətirməyə.

* Tünük – dar və təng mə'nasındadır

Bu halda adam nə qədər çalışıb-əlləşsə və nə qədər canını zəhmət və cəfa oduna yaxsa, yenə də axırda biçiz və əliboş qalacaqdır. Budur ki, atalar deyiblər: "Çox çalışan çarıq yırtar". İnsandan dövlət və hörmət üz döndərib gedəndə, filhəqiqə, nəinki zəncir ilə, bəlkə heç bir qüvvə ilə onu saxlamaq mümkün olmaz. Vaiz əfəndinin bu misra'ında dəxi diqqət yetirməmək olmaz:

Utanmayan özündən, heç kimsədən utanmaz.

Doğrudan da öz eyib və qəbahətini görməyib, qeyriləri eyibləndirən və özgələrə töhmət edən şəxsdən nə hörmət və mərifət təmənna eləmək olar? Öz pozğunluqlarını görməyən, çirkin və nasəza əməllərindən utanıb şərm və həya etməyən adam, söz yoxdur ki, özgədən də utanmaz və bişərmanə sevmədiyi adamın haqqında hər qisim iftira və böhtanı söylər. Bu qisim adamlardan kənar dolanmaq eyni-məsləhətdir. Necə ki, deyiblər:

Abrını saxla abırsızdan,
Həyanı saxla həyasızdan.

Bəs, Vaiz əfəndinin bu beytinə nə irad tutmaq olar:

Mün'im yalan deyəndə təsdiq edər xəlayiq,
Gər doğru desə müflis, heç kim ona inanmaz.

Dünya yaranandan bu anacan Adəm atanın övladı öz şəxsi mənfəətlərini mülahizə edib dövlət və sərvət sahiblərindən qisim-qisim təmənnaları nəzərdə tutub doğrunun üzünə yalanın qara pərdəsini çəkməyə mö'tad olublar. Müflis və miskinlərin hünəri olmayıbdır ki, doğrunu kəmali-cür'ət ilə söyləyib, dürüğgu və hiyləbaz münəccimlərin yalanlarını batil eləsin və haqqı yetirsin. Belə ittifaqlarda hər tərəfdən onun üstünə tənpərvər və nəfspərəst dəni və firumayə şəxslər hücum edib ağzını qapayıblar və özünü də xalq içində bihörmət və biabır ediblər.

Ol səbəbdəndir ki, müsəlman qardaşların arasında yalan söyləmək və haqqı gizlətmək adi bir şey olubdur və hətta bə'zi ittifaqlarla hünər sayılır. Bu minval haqqa güc və zor edib kizb və yalana rövnəq verməyin adını "dürüği-məsləhətamiz" qoyub Şeyx Sə'dinin bu hikmətamiz sözlərini başqa dona geydirirlər. Odur ki, Vaiz əfəndi qeyri bir qəzəlində kinayə təriqi ilə demişdir:

Demək kim, xəlq ara birəğbətiz, iqbalımız yoxdur,
Zəmanə mövsimi-dəsmaldır, dəsmalımız yoxdur.



Kəmali-zatımızdır, şükrilillah, eybdən ari,
Rəvacın verməyə tə'rif edən dəllalımız yoxdur.

Hümayiz üstüxan ilə qənaətpişə kərkəs tək,
Şikari-cifeyi-dünya üçün çəngalımız yoxdur...

Ağız kəskinliyiçün dəxli çoxdur yal-kuppalın,
Şikəstəbəsteyi-fəqriz, yalımız, kuppalımız yoxdur.

Səbükruhül-müşərrəf məşrəbiz fariğ təkəllüfdən
Zəmanə əhlinə lazım olan sanbalımız yoxdur.

Zəmanə halidir, Vaiz, həya eylə həyasızdan,
Həyasızla həyasızlıq edəcək halımız yoxdur.

Mərhum Vaizin bu kəlamı dəxi onun müasirlərinin avam və zahirpərəst olmaqlarını şəhadət verir. Hər kəsin ki, saqqalı uzun və pəhnalı və cübbəsi faxir və papağı uca olubsa, onun hörməti artıq və sözü ötkən olubdur. Mərifət əhli isə şikəstəpər və müztəribbal olub özlərini avamın e'tirazından və cühəlanın zülm və sitəmindən kənarda saxlayıb, meydanı ağzı yallılara, yal və kuppal sahiblərinə veriblər.

# ƏSGƏR ŞİRVANİ

Əsgər Şirvanidən bir qəzəl burada təb' olunur:

Qəlili-dəhrdə, ey dil, bu ömri bivəfa gördüm,
Mən ol dünyapərəsti handa gördüm, bivəfa gördüm.

Xəyanətlər bəsa gördüm həqiqi aşinalərdən,
Təfəhhüs eyləyib biganələrdən aşina gördüm.

Bahari-ömr keçdi, olmadı kami-dilim hasil,
Güli-pəjmürdə gördüm, əndəlibi binəva gördüm.

Məhək daşına vurdum, çoxları mən imtəhan etdim,
Üzündə sikkə gördüm, qəlp gördüm, bədnüma gördüm.

Kimə kim, dərdimi izhar qıldım, istədim dərman,
Özümdən biştər dərdə onu mən mübtəla gördüm.

Əgər xişti təlavü nöqrə olsa günbədi-gərdun,
Mən anı xaksari-tirə üzrə ziri-pa gördüm.

Cahan mülkündə, cana, ömrə çox da e'tibarım yox,
Bəqa fikrində, ey Əsgər, bu dəhri həm fəna gördüm.

Fələyin dövründən və zəmanənin gərdişi-pürsitəmindən və dost-aşnaların bivəfalığından şikvə və nalə eləmək bizim keçmiş şüəra arasında ümumi bir rəsm və qayda olduğu üçün Əsgər Şirvani dəxi bu xüsusda bir əsər qoymuşdur. Bunun "Gördüm" qafiyəsi ilə yazdığı qəzəl Qazax şairi mərhum Mustafa ağa Qiyasbəyov "Nasir" təxəllüs nəzm qıldığı kəlamı yada salır.[569] Ancaq Əsgər Şirvaninin bu qəzəlində əvvəlinci beytin əvvəlki misrasında "dəhr" kəlməsi "ömr" kəlməsinin yerində və "ömr" ləfzi "dəhr" sözünün yerində iste'mal olunsaydı, şe'rin mə'nası daha da düzgün çıxardı. Çünki "dəhr" kəlməsi "zaman", "əhd" və "əbəd" mə'nasında iste'mal olduqda ona "qəlil" sözünü qoşmaq və "qəlil" sifəti ilə "dəhr" mütəssəf qılmaq dürüst gəlməz. Ömri-bəşər isə dəhrə nisbət, filhəqiqə, qəlil və qısa bir haldır ki, insan özünün qısaca ömründə gərəkdir haqqı və insafı əldən qoymasın, dinini dinara satıb axirət kəsbinin narına çalışmasın.

Bəs, əgər bizim dediyimiz kimi "dəhr" və "ömr" kəlmələri müqəddəm və müəxxər olunsa, onda haman misra bu qərar üzrə gərəkdir tərkib olunsun:

Qəlili-ömrdə, ey dil, bu dəhri bivəfa gördüm.



# QASIM ŞİRVANİ

Qasım Şirvaninin kəlamından bir əsəri-pürkədər Müfti əfəndinin "Məcmuə"sindən götürülüb burada dərc olundu:

Məqabirdən güzər etdim, əcayib mərdüman gördüm,
Qaranqu torpaq altında yatar cism ilə can gördüm.

Yoluxdum bir günəhkarə, günahindən üzü qarə,
Məta'indən ziyan etmiş beqayət peşiman gördüm.

Sınıq saxsı kimi başlar, çürümüş ol qələm qaşlar,
Tökülmüş inci tək dişlər, yatar pirü cavan gördüm.

Yumulmuş ol ala gözlər, qiyamət mənzilin gözlər,
Hanı şirin, şəkər sözlər, dəhanı bizəban gördüm.

Çürümüş ol gül əndami, tanımaz sübh ilə şami,
Alıbdır çevrəsin hami ilan gördüm, çiyan gördüm.

Kimi eyş ilə işrətdə, kimi zövq ilə söhbətdə,
Kimi rənc ilə möhnətdə qət'i halın yaman gördüm.

Qübur əhlin sənatini bəyan etdim sənə, Qasim,
Oturma yol yarağilə dəxi səni haman gördüm.

# MƏHCUR ŞİRVANİ

Məhcur Şirvaninin aşağıda dərc olunan tərcibənd kəlamı – ki, həbib və yarın fəraqında yazılıbdır, – onun rəvantəb' bir şair olmağına dəlalət eləyir:

Ey həbibim, həsrətindən çıxdı can, gəl, vəqtdir.
Ey büti-novrəstə, şuxi-mehriban, gəl, vəqtdir.
Ey üzü gül, kakili ənbərfəşan gəl, vəqtdir.
Ey müəttər qönçeyi-baği-cinan, gəl, vəqtdir.
Ey xoşəlhan tutiyi-şəkkərzəban, gəl, vəqtdir.
Ey nihali-qaməti sərvi-rəvan, gəl, vəqtdir.
Ey bizimlə həmdəmü yari-cinan, gəl, vəqtdir.
Ey cəmali mahtab, əbrukəman, gəl, vəqtdir.
Ey kərəmli xosrovi-aliməkan, gəl, vəqtdir.
Ey gözü cəllad, əli peyvəstə qan, gəl, vəqtdir.
Ey gözəllik mülkünün təxtinə xan, gəl, vəqtdir.

Neçə müddətdir sənin tək şəhriyarı gözlərəm,
Salmazam sənsiz gülüstana güzarı, gözlərəm,
Firqətindən yandırıb səbrü qərarı, gözlərəm,
Türfə ruxsarında xətti-müşkbarı gözlərəm,
Gözlərim yollardadır, mən ol diyarı gözlərəm,
Düşmüşəm qəm küncünə, sən qəmküsarı gözlərəm,
Çox çəkib hicrində cövr, intizarı gözlərəm,
İstəmən hurü mələk, sən gül'üzarı gözlərəm,
Tapmazam dünyada bir dövr mədarı gözlərəm,
Şimdi səndən əl çəkib rahi-məzarı gözlərəm,
Ey həbibim, həsrətindən çıxdı can, gəl, vəqtdir.

Ay ilə gün dövr edər eydi-vüsalın görməyə,
Mahi-nov sərgəştədir mişkin hilalın görməyə,
Şahi-hindu müntəzirdir xəttü xalın görməyə,
Tutilər dilxəstədir şirin məqalın görməyə,
Xızr sərgərdan gəzər şəhdi-zülalın görməyə,
Yer üzün tutmuş günəş ta payimalın görrməyə,
Sərv baş əymiş qiyami-e'tidalın görməyə,
Lalənin bağrında dağlar rəngi-alın görməyə,
Hurilər həsrət çəkər fəzlü kəmalın görməyə,
Arizu eylər məlayiklər cəmalın görməyə,
Ey büti-novrəstə, şuxi-mehriban, gəl, vəqtdir.

Söylə, ey dilbər, nədəndir bizi bizar etməyin,
Yarını əğyar edib, əğyarını yar etməyin?
Ey güli-nazik, nə işdir ülfəti-xar etməyin,



Hər yetən naməhrəmə dərdi-dil izhar etməyin,
Dostların düşmən sanıb qeyri-havadar etməyin
Tərk et, Allahı sevərsən, belə rəftar etməyin!
Xoşmudur eşq əhlini hicr ilə bimar etməyin,
Qəm qucağında işin əfğan, günün zar etməyin?
Dərdini dərd əhlinin yetməzmi tumar etməyin?
Mövsümi-güldür ki, lazım seyri-gülzar etməyin,
Ey üzü gül, kakili ənbərfəşan, gəl, vəqtdir.

Paybusun çun bahar əyyamı bağ istər səni,
Həsrətindən lalənin bağrında dağ, istər səni,
Cəm olub məhbublər açmış qucaq, istər səni,
Hər çiçək tutmuş əlində bir çirağ, istər səni,
Baş əyib olmuş bənəfşə bidəmağ, istər səni,
Rəgisü reyhanlar olmuş göz-qulaq, istər səni,
Gülbün möhnətdə əymiş qol-budaq, istər səni,
Rindlər meyxanədən çəkmiş ayaq, istər səni,
Seyr üçün qurmuş şəqayiqlər otaq fəraq, istər səni,
Bülbüli-zarə əsər qılmış fəraq, istər səni,
Ey müəttər qönçeyi-baği-cinan, gəl, vəqtdir.

Buyi-zülfündən cahana can verir hər dəm səba,
Aləmi avazeyi-hüsnün tutubdur cabəca.
Dərdməndin dərdinə şəhdi-ləbindən ver dəva,
Ey fəda olsun sənə yüz hur, səndən masəva,
Ah, neylim, eyləmiş dövran məni səndən cüda.
Səbrə müstəhkəm olaq, çün böylədir əmri-xuda,
Sən dəxi bir lütf qıl, çox eyləmə cövrü cəfa.
Aşiqi zar eyləmək munca nədir, ey bivəfa?
Bülbülün fəryadı qıldı dəhr gülzarın fəna,
Hər səhər mürği-baharıstan oxurlar mərhəba,
Ey xoşəlhan tutiyi-şəkkərzəban, gəl, vəqtdir.

Çün məni sərməst edib divanə qıldı zövqi-cam,
Ey pəri, sövdayi-eşqin tutdu könlümdə məqam.
Bu nə firqətdir, gözüm hicrində qan ağlar müdam,
Yox, canım, sənsiz qərarım hərgiz, ey tubaxüram!
Nolu xaki-dərgəhin olsa məni-gümgəştə nam,
Yanıram hicraninə pərvanəvəş ta sübhü şam.
İstərəm nari-fəraqından alam bir intiqam,
Aşiqə yarından amma intiqam almaq haram!
Padşahın təxtinə məndən səlam olsun, səlam!
Əzmi-gülzar etdilər şümşadü ər'ərlər təmam,
Ey nihali-qaməti sərvi-rəvan, gəl, vəqtdir.

Gözlərin yad eylərəm, ey şux, can qəsdindədir,
Nuki-müjganın qəmi ruhi-rəvan qəsdindədir.
Türrələnmiş hər dü zülfün din-iman qəsdindədir,
Qaşların əndişəsi min xaniman qəsdindədir,
Hər səri-müyin xəyalı bir məkan qəsdindədir,
Hər dü zülfün fikri yüz min mehriban qəsdindədir,
Novxətin şirazəsi xəlqi-cahan qəsdindədir,
Hər kəməndi-kakilin həft asiman qəsdindədir,
Mehri-hüsnün baş çəkib külli-İran qəsdindədir,
Cismimi yandırdı hicrin, şimdi can qəsdindədir,
Ey bizimlə həmdəmü yari-cinan, gəl, vəqtdir.

Cəm olub məhbublər bir yerdə məhfil bağlamış,
Dəstə-dəstə hurilər reyhan ilə gül bağlamış,
Hər sənəm ruxsarına susənlə sünbül bağlamış,
Gərdəni-aşiqlərə guya sələsil bağlamış,
Eşq zənciridir ol, ustadi-kamil bağlamış.
Gör nə möhkəm seyd qılmış, gör nə qabil bağlamış,
Zivəri-ruxsar edib hüsn üzrə hail bağlamış.
Bir neçə divanəsin ol qeydə mail bağlamış,
Hər tərəf güllər açılmış, lalə kakil bağlamış,
Hər şükufə göz açıb, hər səbzə bir dil bağlamış,
Ey cəmali mahtab, əbrukəman, gəl, vəqtdir.

Can verib didarına aləmdə bir ad istərəm,
Sanma eşqin tərk edib qeyri pərizad istərəm.
Bəndeyi-dərgahınam mən, səndən irşad istərəm,
Gecə-gündüz eyləyib əfğanü fəryad istərəm.
Hüsnünə qarşı duran əğyarı bərbad istərəm,
Dərd çəkmiş xatirim hicrində azad istərəm.
Cövşəni*-sinəm xədəngi-cövrə fulad istərəm,
Künci-möhnətdə dilim zikrinlə mö'tad istərəm.
Üz tutub pabusuna hər ləhzə münqad istərəm,
Qəm hücum etmiş bu gün, səndən bir imdad istərəm,
Ey kərəmli xosrovi-aliməkan, gəl, vəqtdir.

Mehrü eşqin, ey sənəm, məstü xumar etmiş məni,
Taci-zövq ilə cahanda namdar etmiş məni.
Cövr ilə dövri-fələk bədruzigar etmiş məni,
Suzdil etmiş vücudum, tar-mar etmiş məni,
Səbrü aramım alıb biixtiyar etmiş məni.
Xublər kuyində xaki-rəhgüzar etmiş məni.
Qəm bucağında sədayi-tə'n kar etmiş məni,
Ey güləndamım, fərağın biqərar etmiş məni,

* Cövşən – dəmir geyim, zireh



Mübtəlayi-möhnətin sə'd gunə xar etmiş məni,
Tə'n şəmşirin çəkib əğyar zar etmiş məni,
Ey gözü cəllad, əli peyvəstə qan, gəl, vəqtdir.

Yığdılar bazari-eşqi əhli-sövda, getdilər,
Dərdü qəm tərkin qılıb pakü müərra getdilər,
Gördülər dəhrin vəfasın cümlə ziba getdilər...[570]
Vamiqi-qərqi-bəla, Fərhadi-şeyda getdilər,
Vərqəvü Gülşa* ilə Məcnuni-rüsva getdilər,
Dözməyib bu firqətə Şirinü Leyla getdilər.
Bir dəxi dövran edib Yusif, Züleyxa getdilər,
Qoydular Məhcuru tək, məzlumü tənha, getdilər,
Ey gözəllik mülkünün təxtinə xan, gəl, vəqtdir.

* Vərqa və Gülşa – aşiqlər adıdır[571]

# ŞƏKƏR ŞİRVANİ

Bu şairin kəlamından Müfti əfəndinin "Məcmuə"sində ancaq bir müxəmməs tapdıq ki, eyni ilə burada dərc olunur.

## MƏKTUBA XİTAB

Səni bir səfheyi-əbyəz kitabət eylərəm, kağəz!
Hücumi-ləşkəri-qəmdən şikayət eylərəm, kağəz!
Yazıb hali-dilim şərhin, hekayət eylərəm, kağəz!
Mənim cananımı görsən, əmanət eyləqəm, kağəz!
Təmami-dostlara izhari-səlamət eylərəm, kağəz!

Yetib nazik əlin öpcək əzəl həmdü səna ilə,
Açılcaq, rubəru olcaq təvazö, xoş səfa ilə,
Nəzər məzmununa salsa bemətləb ibtida ilə,
Çəkib bir-bir sətirlərdən bəyani-müddəa ilə
Səni bir qasidi-əhli-fəsahət eylərəm, kağəz!

İnansən min qəmim vardır, yanımda qəmküsarım yox,
Fəğanım bülbülə bənzər, əbəs ki, gül'üzarım yox,
Gözüm, könlüm təmənnası, əlimdə ixtiyarım yox,
Onunçün bu cəhətlərdən həyata e'tibarım yox.
Qərəz beş gün hesab ilə əmanət eylərəm kağəz –

Ki, bilsinlər cudalıqda vücudum pürsiyasətdir,
Qalıbdır bir çürük canım, işim rəncü riyazətdir,
Müsahib yar vəslinə yetişmək xoş səadətdir,
Aradə nameyi-casus gəlib-getmək dəyanətdir,
Cavabın gəlməsə, billah, qiyamət eylərəm, kağəz!

Mühəqqər Şəkkəri-zarəm, digərgunəm məlalımdan,
Gərək təhrir edəm ancaq sözümdən, razi-halımdan,
Gətirdi kilki-müjganım, nələr keçdi xəyalımdan,
Dəvati-çeşmimə şəncərf töküldü əşki-alımdan,
Səni sürx ilə inşa'i-ibarət eylərəm, kağəz!



# NABİ ƏFƏNDİ ŞİRVANİ VALİYÜL-ƏSL

Nabi əfəndi Şirvaninin bir neçə qəzəlləri və müxəmməsləri səmahətli Müfti əfəndinin "Məcmuə"sində təhrir olunmuşdur. Onlardan atidə dərc olunmuş bir qəzələ iktifa etdik:

Əsrari-xətinlə dili mədhüş edə bilsəm,
Bir gəz qəmi-dünyanı fəramuş edə bilsəm,

Eylərdim iki dəstimi bir qifli mütəlsəm,
Ol qaməti-mövzuni dərağuş edə bilsəm.

Göstərməz idim kimsəyə heç ləzzəti-lə'lin,
Möhri-ləbim ol ne'mətə sərpuş edə bilsəm.

Etmək nə olur əncüməni-dəhri pərişan,
Bir gəz meyi-samanşikəni nuş edə bilsəm.

Verməz süxənaralıq ilə kimsəyə növbət,
Nabi dəhəni-xaməni xamuş edə bilsəm

## SƏNAİ ŞİRVANİ

Sənai Şirvanidən zeyldə təstir olunmuş qəsidə tapıldı:

Nişanın taci-dövlətdir, səadətlilərin dilbər,
Həm oldur qübbətül-Kə'bə onunçun Həcc olur əkbər.

Saçın "vəlleyl iza yəğşa" – dedi həblülmətin əmma
Hicabi-günbədi-xəzra düxani-udü ya ənbər.

Dü zülfün nafeyi-ahu, veribdir aləmə xoş bu,
Siyəhgun rəngdir hindu əlində xosrovi-xavər.

Nə xoş qüdrət iki guşun yaratmış xaliqi-yekta,
Birisi yasəmən tərhi, biridir həm güli-cəfər.

Qabağın mə'dəni-qüdrət, yədi-beyzadən əfzundur,
Mükəmməl səbheyi-xurşid, qəmər ondan tapar ənvər.

Qaşındır sureyi-"Yasin", misali-qabə-qövseyn tək
Yaşıl tozlu müqəvvəsdir betaği-məscidü minbər.

Siyəh kipriklərin etmiş müsəxxər rüb'i-məskuni,
Görəndə xeyli-üşşaqi atar səhmi, çəkər xəncər.

Dü çeşmin fitnələr başi, nə yəğmaçi müqəlliddir,
Çəkibdir sinəmə daği siyəh mərdümlərin, kafər!

Məşami-ənbəramizin gümüş məftulmudur, ya rəb –
Ki, məğzi-püstə, badamü nüql, xaneyi-şəkkər.

Üzün xurşidə tə'n eylər, bu söz mə'rufi-aləmdir,
Rüxündür ismətüd-dünya, onu mənzum edər əxtər.

Yanağın bir güli-tərdir, kimə bu gül müyəssərdir,
Camalın şəmsi-xavərdir, tutubdur aləmi yeksər.

Çəhi-Kən'anə manəndidir zənəxdanın bu vəch ilə,
Çıxar Yusif kimi andan düxani-qəlb əzin çakər.

Müəmma içrə mövhum nöqtəsidir lə'li-gülfamın,
Onu dərk eyləyən arif deyər yaqutdur, əhmər.

Dəhanın çeşmeyi-Zəmzəm dedim, yox qönçeyi-novxiz,
Ədəm dəryasından çıxmış məgər bu dürci-pürgövhər?!



Dişindir incilər xasi, dəhanın dürr dəryasi,
Birinin qiymətin bilməz verə xaqani-həft kişvər.

Məsih əlfazdən izharə yetmiş rütbeyi-canbəxş,
Ləbin feyzi əsər qılmış Məsiha nitqdən behtər.

Gümüş minamıdır qəddin, çəkilmiş gərdənin qu tək,
Zəhi ziba, mələksima, zəhi sün'i-cahanpərvər!

İki duşin fələk bürci, biri qövsi, biri əqrəb,
Veribdir piç-tab ilən iki giysulərin ənbər.

Dü simi saidin, sərvi qəddin firdovs bağında,
Yədüllah ilə peyvənddir iki şümşadü bir ərər.

Miyani-sədri-əbyazın büsati-bəzmi-xosrovdur,
İki şahzadeyi-rumi, biri qəndü biri şəkkər.

Zəhi hüsnü zəhi surət, təaləllah, zəhi sən'ət!
Nə qüdrətdir, bu nə hikmət, bu nə sima, bu nə peykər!

Əgər zahid səni görsə bu əltafü məlahətdə,
Döyər köksünə, qan ağlar tökər başına xakistər.

Səni bimislü bihəmta yaratmış xaliqi-əşya,
Pəripeykər, mələkmənzər, firiştəxu, səfidəxtər.

Təmənnayi-rüxündən mən' edib lütfün diriğ etmə,
Gözəlsən, şahi-aləmsən, Sənaidir sənə çakər.

Sənainin bu qəsidəsində mə'lum olunur ki, ol cənab xeyli gülşadətəb' və sahibi-zövq bir şair imiş ki, vəsfi-gözəldə bir qüsur qoymamışdır və ənva' istiarələr ilə sevdiyi dilbəri mədhü tə'rif qılmışdır. Bəli... Əfsus ki, bizim belə rəvantəb' və süxəndan şairlərimizin başqa bir doğru və salamat məsləkləri olmayıb da, təb'i-gövhərsənclərini bihudə sərf ediblər.

# LAHİCİ-ŞİRVANİ "ARİF" TƏXƏLLÜS

Bu şairin kəlamından bir qəzəl zeyldə dərc olunur:

Tutan kuyində məskən həsrəti-bağı-İrəm çəkməz,
Görən bir gəz səni ömründə hərgiz dərdü qəm çəkməz.

Ləbindən busə hər kim alsa əl'ömrül-əbəd, billəh,
Zülali-Xizri yad etməz, xəyali-cami-Cəm çəkməz.

Təmaşayi-fəzayi-gülşəni-kuyin edən aşiq
Keçər başindən, amma ol tamaşadən qədəm çəkməz.

Cəfalərdir mənə əğyardən, cövrü sitəm səndən,
Mənə rəhm eylə kim, munca bəni-adəm sitəm çəkməz.

Dəmadəm ahü fəğan eyləməkdən halımı, Arif,
Nə bilsin ol ki, etməz ahü vah dəmbədəm çəkməz.



# ASƏF ŞİRVANİ

Asəfin aşağıda yazılan qəzəllərindən onun xoştəb' və şirinkəlam bir şair olduğu anlaşılır.

Qəzəli-Asəf Şirvani:

Bilmən ərəqmidir rüxi-alında saqinin –
Ya didələrmi qaldı yanağında saqinin?

Sağər ki, duş saqini qılmışdı bidəmağ,
Ağlar gəzər müdam sorağında saqinin.

Dövranda ləhzə-ləhzə qızıl qanlar udduğum –
Olmuş ə'yan əlində, bucağında saqinin.

Tə'n böylədirmi, yoxsa həlakım zəmanədə
Qanlar[mı] kəf götürmüş ayağında saqinin.

Başına küllər olsun o pərvanənin, əgər
Yanmaqdan əl götürsə çirağında saqinin.

Mey nəş'əsində sanma ki, Asəf fitadədir,
Dövran həlakı olmuş otağında saqinin.

Yenə qəzəli-Asəf Şirvani:

Sövdayi-zülfi-yarə, könül, qılma çox həvəs –
Kim, sübh olunca hər gecə bidar olur əsəs.

Bülbüldə olsa suzi-cəmalın şərarəsi,
Hər naləsindən od tutar əşcarü xarü xəs.

Bir zəhrdir sözün ki, acıtmaz dimağını,
Bir şəhddir qəmin, qona bilməz ona məkəs.

Hicrində dad qılsam əgər tez apar qəmin,
Əzbəs ki, yox qəmin kimi bir mərdi-dadrəs.

Giryan göz ilə sineyi-əfkarə qaneyiz,
Bəsdir bizə fəzayi-Muğan, Dəcləvü Ərəs.

Rehlət səbahidir, nə yatıbsan, dur, ey rəfiq,
Yükləndi, getdi qafilə, fəryad edər cərəs.

Bir xuşə tuşə eylə bu xərmən kənaridən
Nigah mürği-fürsət uçub sınmamış qəfəs.

Asəf qəmində üz döşəyib xaki-heyrətə,
Qalmış həzinü bidilü bitabü binəfəs.

# ASƏF LƏNBƏRANİ

Bə'zi rəvayətə görə, Asəf Şirvanini müasiri olaraq "Asəf" təxəllüsü digər bir şair var imiş ki, əslən Qarabağ mahalında Lənbəran qəryəsindən imiş. Bu şairin ismü nəsəbi bir kəsə mə'lum deyil. Əgərçi filhəqiqə qarabağlı olsaydı, salxürdə şüəra və ədiblərimiz – ki, ələn hali-həyat üzrə baqidirlər, – onun barəsində az-çox mə'lumat verə bilərdilər. Vəli bir kəsdən səhih bir xəbər eşitmədik. Hər halda atidə dərc olunan qəzəli lənbəranlı Asəfə isnad verirlər:

Cismindimi, bilməm, görünür, pirəhən içrə,
Ya ruhi-rəvandır bu bədən içrə?

Kuyində yüz il zülfə əsir olsam usanmam,
Əzbəs ki, qara gün mənə xoşdur vətən içrə.

Bir şe'ri nəməkriz ilə ağzından öpərdim,
Gizlin gedə bilsəydim əgərçi süxən içrə.

Müjganların içrə sənin ol çeşmi-siyahın
Bir nərgisi tərdir ki, bitibdir tikən içrə.

Asəf güli-ruxsarını görmüşmü nigarın
Qönçə dəhəni açıla qalmış çəmən içrə?[572]

Bu qəzəldə "bir şe'ri-nəməkriz ilə" i. a. beytin məalını, yəqin ki, Asəf Lənbərani samanilər əsrində zindəganlıq edən məşhur "Əmmar" təxəllüslü şairin kəlamından iqtibas etmişdir. Əmmarın söz arasında gizlənib də yarın ləbindən busə almaq barəsində yazdığı şeir budur:

Əndər ğəzəle-xiş nehan xahəm gəşt,
Ta bər ləbe-to buse zənəm çon to bexani[573]

Asəf Lənbəraninin fövqdə dərc olunan kəlamından başqa bir neçə qəzəllər və bir müxəmməs Məhəmməd ağa Müctəhidzadənin "Riyazül-aşiqin" nam təzkirəsində zikr olunmuşdur. Vəli onların çəndan əhəmiyyəti olmadığı üçün təkrarən burada yazılmağı lazım görülmədi.



# NƏSİMİ ŞİRVANİ[574]

Bu şairin kəlamlarından ancaq bir qəzəlin yazılmasına iktifa etdik:

Dünü gün müntəzir oldum ki, bu pərgar nədir,
Gərdişi-çərxi-fələk, günbədi-dəvvar nədir?

Fələkin əsli nədəndir, mələkin əsli nədən
Adəmin surətinə bunca tələbkar nədir?

Bisütun çərxi-müəlləq nədən oldu tərtib,
Fələk altında qəmər, kövkəbi-səyyar nədir?

Məgəsin təbinə bax, bal nədən, zəhr nədən,
Yenə bu məsələdə nur nədir, nar nədir?

Tərki-dünya qılasan böylə Nəsimi olasan,
Ola bir gün deyəsən xirqəvü dəstar nədir?

# ŞEYX İBRAHİM QÜDSİ GƏNCƏVİ

Yuxarıda adları zikr olunan Şamaxı və Şirvan şairlərinin müasirlərindən Gəncə şəhərində məşhur olanları Şeyx İbrahim Qüdsi və Ağaismayıl Zəbih hesab olunur. Hər birinin tərcümeyi-halından burada mə'lumat verilir.

Mərhum Şeyx İbrahim Şeyx Həsən oğlu Şeyxzamanov Gəncə şairlərinin məşhurundandır. Təvəllüd edibdir Gəncədə hicrətin 1231-ci[575] tarixində, yüz sənə bundan müqəddəm. Şeyx İbrahim tə'lim alıbdır Gəncə pişnamazı mərhum axund Molla Hüseyndən. Mə'lum ola ki, mərhum Mirzə Fətəli Axundzadə da həmin bu müdərrisdən tə'lim almışdır.

Şeyx İbrahimin ərəbcə və farsca yaxşı biliyi var imiş və müqtədir türk şairlərindən birisi hesab olunur. Qüdsi müdərrislik ilə və bir tərəfdən Gəncə şəhərinin yaxınlığında vaqe olan İmamzadeyi-İbrahim türbəsinin mütəvəlliliyi ilə güzəran edərmiş. 1255-də[576] təəhhül edibdir. Belə rəvayət olunur ki, 1261-ci[577] ilə kimi hər sənədə bir qızı vücuda gəlir imiş.

1261-ci tarixdə haqq-taala ona bir oğul kəramət edibdir və şair bundan ziyadə xoşhal olub, ona "Əli Əkbər" ad qoyubdur və bu münasibətlə deyibdir:

Qəmfəza bəyani ke, dər məhzərəst,
Ze mən yadeqare-Əli Əkbərəst.
Keşidəm bəsi sağər əz xune-del,
Həmana ke, tarixe-an "sağər" əst.[578]

Şeyx İbrahimin bir təxəllüsü də "Naseh"dir və bəzən "Şeyx" dəki yazarmış. Qüdsinin gözəl qəzəlləri var. Onlardan bir parası türkcədir, amma əsərlərinin çoxu farsi dilindədir. Xacə Hafizin qəzəllərinə timsal olaraq bir çox qəzəllər inşad etmişdir:

Ney taqəte-del dari,
Ney forsəte-didari,
Ney forsəte-didari,
Ney taqəte-del dari.[579]

– beytlərilə başlanılan qəzəllər kimi.

Qüdsi cənabları şiəməzhəb saliklərindəndir. Gəncənin müxtəsər tarixçəsini general Lazarevin xahişinə görə, yazıbdır ki, onun müsəvvədəsi əldədir. Cümleyi-əş'arı dağınıq surətdə olduğu halda, eşitdiyimizə görə, hali-həyatda olan oğlu Şeyx İsa həzrətləri onları cəm etməkdədir. Ümidvar ki, tezliklə çapa verilsin.



Əşarından əlavə, "Tarixi-müqəddəs" kitabı dəxi tərtib edibdir və lakin mərhumun bu əsəri də hənuz çap olunmayıbdır. Çap olunmamış divanı da vardır.[580] Divanına daxil olan şeirlər və qəzəllər 150-dən ziyadədir. Cümlə qəzəlləri yeddi beytdən ibarətdir; artıq-əskiyi yoxdur. Əsərləri ələlümum üləma qisminin zəmminə və ruhani sinfinin çirkin və qəbih əməllərinə dair əsərlərdir.

Sabiqdə Gəncə şəhərində qəzavət edibdir və sonraları gimnaziya məktəbində müəllim olubdur. Belə ki, Gəncədə əvvəlinci əqaid və türk dilinin müəllimi bu zat olubdur. Bə'zi rəvayətə görə, Şeyx İbrahimin Şeyx Nizami ilə qərabəti var imiş.

Şeyx həzrətləri ziyadə müttəqi və dindar bir vücud olduğundan ülumi-ilahiyyəyə artıq bələdiyyatı var imiş və Qur'ani-şərifi əzbər bilirmiş. İdareyi-ruhaniyyədə Şeyx İbrahim rəqabət imtahanı verərkən Qafqazın fərmanfərması – namestniki knyaz Vorontsov həzrətləri də orada var imiş. Şeyxi-mərhumun imtahan vaxtında izhar etdiyi elm və kamalını müşahidə edib, ona afərin və təhsin oxuyub, öz qızıl saatını da bəxş etmişdir.

Şeyx İbrahim 1282-ci[581] tarixdə Gəncədə qəflətən vəfat edib; məqbərəsi İmamzadə qəbristanındadır. Şeyxi-mərhum ziyadə ağıllı, zəkavətli və hafizəli möhtərəm bir alim imiş. Aşağıda yazılan qəzəl şeyxin kəlamlarındandır:

Eşq məmnu' olsa, bəs icadi-hüsnə yox səbəb,
Əqli-qate' hökmünə zənni rəvayət neyləsin?

Eşqdir bais ki, Yusif qissəsi əhsəndürür,
Qövli-həqqi danmasın sahibqəvayət, neyləsin?

Hüsni-izhar etməyin hüsnünü zahid bilməsə,
"Küntü kənzən"[582] qövlünə yoxdur dirayət, neyləsin?

Vaiz olsa xudbəxud münkir gərəkdir olmaya,
Zahidin haqqı ona etmiş sirayət, neyləsin?

Hüsni-cazibdir və gər nə eşq olmaz kimsədə,
Eşqə gər dil verməsin sahibhidayət, neyləsin?

Şükri-ne'mət etməmək küfrandır çün, Naseha,
Hüsni-qədrin bilməsin sahibhidayət, neyləsin?

Mərhum şeyxin əsərlərindən bundan artıq nümunələr ələ düşmədi ki, burada dərc olunsun.

# AĞAİSMAYIL ZƏBİH

Ağaismayıl Zəbih Gəncənin adlı şairlərindən birisi hesab olunur. Ağaismayıl "Zəbih" təxəllüsünü götürməkliyə səbəb Həzrət İsmayıl ilə bir isimdə (adaş) olmağıdır. Çün Həzrət İsmayıl həqq-taalanını əmri ilə Mina dağına atası İbrahim Xəlilullah tərəfindən zibh olunmaq üçün aparılmışdı, o münasibətlə Ağaismayıl dəxi özü üçün "Zəbih" təxəllüsünü intixab etmişdir.

Zəbih mühacirətən xeyli müddət Təbrizdə iqamət edib, orada ticarət əmrinə məşğul olarmış və bir vaxtı orada tacirbaşılıq mənsəbinə dəxi yetişibdir. Dünyagörmüş və işaşıran bir vücud imiş. Bə'zi rəvayətə görə, sonradan yenə Gəncəyə müraciət edib və burada hicrətin 1285-ci[583] ili təxminən 70 yaşında vəfat edibdir. Amma səhihi budur ki, mərhum Ağaismayıl vətəninə müraciət etməyib, Təbriz şəhərində vəfat edibdir.

Zəbih xoşxülq və pürsavad bir vücud imiş. Fars şairlərinin əsərlərindən ittila'i-kamili var imiş. Türk və fars dillərində müxtəlif şeir və qəzəlləri vardır. Bundan əlavə Zəbih ziyadə xoşnəvis imiş. Farsca divanı vardır, heyfa ki, ələ keçmədi. Məktəbdar Mirzə Sadıq "Fani"[584] təxəllüslə Zəbihin arasında irsal-mərsul və təatiyi-əfkar vüqua gəlirmiş. Öz nəvəsi Xəlili tə'lim və tərbiyə üçün ilk dəfə məktəbə göndərdiyi vaxt Mirzə Sadığa yazdığı "Tövsiyənamə"dən bir-iki beyti əhibbalarının xatirində qalıbdır ki, burada zikr olunur:

Ey ke, mərdom yad girəd əz to tə'lime-ədəb,
Vey ze əsrare-məani vaqef əz əslo nəsəb.
Gər bovəd əz fəzlo elmət bər Xəlile-mən nəsib,
Nar bər vey nur gərdəd çon toi ərbabe-rəb.[585]

Və yenə Mirzə Sadıq Faniyə cavabən yazdığı farsül-ibarə bir kəlamından ancaq üç beyt ələ düşdü ki, onda qocalıqdan şikayət olunur:

Barilaha, kəs məbada dər cəhan başəd əlil,
Hər ke, şod piro əlil, an gəh şəvəd xaro zəlil.
Ab çon besyar manəd dər qədəh, gərdəd kəsif,
Mərd çon besyan lacərəm gərdəd kəsil.
Noktegirira məkon dər şe're-mən dər qafiye,
Əz qəfaviye-to inca nist coz ləfze-əmil[586]

Və yenə Mirzə Sadıq "Fani" təxəllüs onun mədhinə yazdığı bir kağıza cavabən bu beytləri yazmışdır:



Xaleqol-əş'ar mixani məra dər selke-nəzm,
Şaere-xoştəb'ra həstəm mənəş əbde-zəlil.
Ruzo şəb duri həmicuyəm əz in darol-ədəm,
Reşte'i bər gərdənəm əfkənde Musavo-Xəlil*[587]

Ağaismayıl Zəbihin hər qisim şe'rü kəlamları çox isə də, heyfa ki, ələ düşənləri az oldu. Onlardan bir neçəsi burada təb' olunur.

Müxəmməsi-Zəbih:

Bilmirəm bais nədir, qəlbim də seyran istəməz,
Könlümü tutmuş qübari-qəm, gülüstan istəməz,
Seyri-gülgəştü süfayi-bağü bostan istəməz,
Bərbətü rudü sürudi-ləhni-xoşxan istəməz.

Bə'zi əşxası görürsən qəddi manəndi-ə'ləm,
Zənn edirsən bu vəfa rahındadır sabitqədəm,
Yaxşıraqdır belə əşxasın vücudundan ədəm,
Hiyləvü məkr ilə daim dildə sövgəndü qəsəm,
Hər qəsəm ki, yad edər, guya ki, üsyan istəməz.

Neçə kəslər var, müsəlmandır deyirlər adına,
Şeytənət fikrindən özgə şey düşməz yadına,
Çox kəsin baisdir onlar fitnəvü əfsadına,
Görgəc iblis onları söylər tamam övladına:
Getməyin bu şəhrə kim, bu şəhr şeytan istəməz.

Bə'zi kəs inkar edər qanuni-şər'i ruzü şəb,
Bu şəriətdən qılar qanuni-rusi müntəxəb,
Etmədi inkar həqqi-Mustafa cüz Buləhəb,
Getməzəm şər'ə – sölərdi ol himari-biədəb,
Bizlərə şər' nə lazım kim, bu, divan istəməz.

Qalmayıb bir zərrə bu deyri-fənadə rəğbətim,
Az-çox var idi bu xəlq içrə şanü şövkətim,
Getdi əldən, günbəgün artar məlalü möhnətim,
İşrətü nazü nəimə qalmayıbdır ülfətim,
Şövkətü şanü cəlalü hökm divan istəməz.

Bu fələk gör kim, nə rüsvayi-cahan etmiş məni,
Acizü piri-əlilü natəvan etmiş məni,
Yoxsa bilməm çərxi-gərdun imtahan etmiş məni,
Bivəfa kəslər ilə çün həminan etmiş məni,
Sərfəraz etmək məni bu çərxi-dövran istəməz.

---

*Musa və Xəlil – hər ikisi şairin nəvələridir

Görmədim bu ruzigar əhlində bir sidqü səfa,
Gördüm onları tamamən bidəyanət, bivəfa,
Bir yalan sözdür adın qoymuş rəfiqü aşina,
Yox Əli, ali-Əlidən qeyri özgə rəhnüma,
Özgə bir ümmid ya bir özgə canan istəməz.

Etmə, ya rəb, həşrimi məhşər günü əğyar ilən,
İmtahan etmə Zəbihi-binəvanı nar ilən,
Həşrimi qıl ərseyi-məhşərdə həştü çar ilən,
Ol şəf'ii-ruzi-məhşər Heydəri-kərrar ilən,
Gər ola yüz min mürid, mürşidü səlman, istəməz.

İstədim kuyi-vəfada Qeys ya Fərhad olam,
Qoymadı bu çərxi-gərdun bir zaman dilşad olam,
Qeyrəti-xəsmi-əduyə gaveyi-həddad olam,
İstəməzdim bivəfalıq rəsminə mö'tad olam,
Əyləşən kəs zövrəqə, əlbəttə, tufan istəməz.

Ağaismayıl Zəbih bu müxəmməsində Molla Pənah Vaqif kimi öz əsrində yaşayan adamların rəzil əxlaqından və çirkin övsafından söz açıb onları bivəfa və biar, biqeyrət, mühil və yalançı olmaqlarını, haqqı inkar edib, dini-mübini-Mustafadan uzaq düşməklərini, rus[588] zakonunu şəriət qanununa tərcih etməklərini, dostluğun əvvəlinci şərti məqamında olan sidqü dəyanətdən bibəhrə olmaqlarını gözəl və mövzun şeirlər vasitəsilə bir-bir zikr qılır, əhli-zəmanədən üz çöndərir və Əliyyül-Mürtəzaya və onun övladına pənah aparıb həşr günündə onlardan kömək diləyir.

Zəbihin bu kəlamında olan bir bənd "Molla Nəsrəddin" jurnalında sabiqdə çap olunmuş "Cəhənnəm məktubu"nu yada salır[589] ki, şeytan zəmanə adamlarından şikayət edib deyir: "Nahaq yerə məni müttəhim edib hər məqamü məkanda mənə lə'nət oxuyursunuz. Neçə vaxt idi ki, mən Firəngistana getmişdim və mənim vücudum burada olmadığı halda Adəm atanın övladı o qədər fəsad və şərarət törətdi ki, o qədər görülməmiş işlər tutdu ki, onlar mənim heç xəyalımdan da keçməzdi". Sonradan şeytan Adəm atanın övladı tutduğu fəsad əməlləri bir-bir zikr edib deyir: "Özünüz insaf edib söyləyin, bu işlər mənim əməlimdir, yoxsa sizin öz işlərinizdir?"

Zəbih dəxi öz şəhərinin əhlindən şikayət edib deyir: Adlarını müsəlman qoyan neçə kəslər vardır ki, şeytanətdən başqa bir fikir və peşələri yoxdur. Onların xəyalı və tamam sə'yləri ancaq adamların arasında fitnə və fəsad salmaqdır. Belə adamları iblis gördükdə öz balalarına deyir: Balalarım, daha siz bu şəhərə getməyin, buranın əhli şeytan istəməz. Bunlar özü hər qisim fəsad və şərarət törətməkdə bibədəl və mahirdirlər..." Necə ki, Zəbih deyir:



Neçə kəslər var, müsəlmandır deyirlər adına,
Şeytənət fikrindən özgə şey düşməz yadına,
Çox kəsin baisdir onlar fitnəvü əfsadına,
Görgəc iblis onları söylər tamam övladına:
Getməyin bu şəhrə kim, bu şəhr şeytan istəməz.

Bizim elm və mə'rifətdən bibəhrə olan əhlin şeytandan artıq fitnəkar, şərir və fasid olmağını binəzir şairimiz Abbas ağa Qaibov "Nazir" təxəllüs təzə yazdığı "Molla və şeytan" ünvanlı hekayəsində[590] gözəl vəch ilə bəyan edibdir. Bu hekayənin barəsində öz məqamında danışılacaqdır.

Cənab Zəbihin yuxarıda yazılan müxəmməsindən onun müqtədir və xoştəb' azərbaycanlı bir şair olduğu görünür. Onun aşağıda dərc olunan kəlamı bu qövlümüzün doğruluğuna şəhadət verə bilər. Kəlami-Zəbih:

Mənim bu pir olan könlüm cahanda bir cavan istər,
İçib məst olmağa hər dəm şərabi-ərğəvan istər,

Gəhi eylər təkəllüm iddiasın bəzmi-ürfanda,
Gəhi rəzm etməyə Rüstəmsifət tirü kaman istər.

Gəhi xaki-məzəllətdə tutar Mənsur tək aram,
Gəhi Keyxosrovü Cəmşid tək təxti-Kəyan istər.

Gəhi azürdəvü dərviş İbrahimi-Ədhəm tək,
Gəhi cahü cəlali-Ərdəşiri-Babəkan istər.

Məqami-həqqi tapmaqda olur gah Nasiri-Xosrov,
Gəhi ol Xosrovi-Pərviz tək mülki-cahan istər.

Gəhi azərpərəstü gah qibti, gəh müsəlmani,
Gəhi bərzəx, gəhi duzəx, gəhi hurü cinan istər.

Gəhi süflitələb qə'ri-zəmində gavü mahi tək,
Gəhi ülvitələb seyri-səfayi-asiman istər.

Gəhi Bəhluli-divanə, gəhi Mollayi-Nəsrəddin,
Gəhi Buzərcmehrü şövkəti-Nuşirəvan istər.

Gəhi Sədiyü Hafiz, gəh Füzuli, gah Xaqani,
Gəhi Bağdad, gəh Şiraz, gahi İsfəhan istər.

Gəhi Mollayi-Rumi, gəh Nizami, gah Firdovsi,
Gəhi Rumi, Gəhi İran, gəhi Hindustan istər.

Gəhi dərsi-səbəqdə əcz edər şagirdi-məktəb tək,
Gəhi inşasına şagirdi-Mirzə Mehdi xan istər.

Mənə tə'n etmə, ey zahid, sənin zöhdün riyaidir.
Əgər zikr eyləyəm vəsfin sənin, bir dastan istər.

Bəsa zahidləri gördüm sənin tək sə'y edər, amma
Rəhi-təhqiqi tapmaqda ona çox imtahan istər.

Xərabət əhlinin eşqini bilməz zahidü müfti,
Ona eşqin yolun göstərməyə piri-muğan istər.

Deyil vaqif rümuzi-eşqə şeyxi-şəhrlə vaiz.
Olar gahi ələf çeynər, gəhi arpa-saman istər.

Vücudi-vəhdəti bilməz nifasü heyz mollasi,
Ona bürhani-qate' pənbədə bir qətrə qan istər.

Təriqətdən sual etsək, nəcasət fəslini söylər,
Həqiqət kəlməsindən lal olur, guya zəban istər.

Təriqi-həqqi tapmaq, istəməz maziyü müstəqbəl,
Nə nəhvü sərf, məntiq, nə bəyan ilə məan istər.

Məcaz əhli həqiqət rahini tapmaqda bimürşid,
Skəndərvar olur aciz, dəlili-karvan istər.

Zəbiha, ruzi-məhşərdə nədir üsyanına fikrin,
Nəzər lütf ilə gər qılsa əmiri-mö'minan istər.

Bu şərhin qilü qalından qübari-qəm tutub könlüm,
Uçub könlüm quşu hər ləhzə Azərbaycan istər.

Mərhum Zəbihin bu kəlamı mövzun və pürməzmun kəlamlardan biri-sidir. Burada şair müasiri Nəbati kimi, Şəms Təbrizi əleyhirrəhməyə təqlid və təbəiyyət izhar edərək könlünün müxtəlif hallarını və onda vaxtbəvaxt vüqua gələn arzu və təmənnaları şərh qılır.

Zəbih gəhi xaki-məzəllətdə Mənsur tək aramyab olur və gahi Keyxosrov və Cəmşid tək təxtü taci-Kəyan tələb edir; gahi dərvişsifət azadəlik xahiş eləyir və gahi Ərdəşir Babəkan kimi cahü calal şövqünə düşür; gəh azəri, gəh qibti və gəh müsəlman olmaq fikrinə düşür; gəhi yerin altında zə'm olunan qızıl öküzdən və zorba balıqdan söz açıb seyri-səfayi-asiman tələb edir; gəh bərzəxi və gahi də behişti-bərində hur, cinan təmənnalarına düşür və habelə şairin meylü könlü min cürə müxtəlif halətlərə düşüb cənnət və cəhənnəm misallı bir-birinə zidd, bər'əks şeylər və təmənnalar arzu eləyir. Bu qisim rəngarəng halətlər ancaq həqiqi şair misilli qeyri-adi və ziyadə əsaslı vücudların təbiət və məzaclarında müşahidə oluna bilər.



Zəbih öz hali-dilini və müxtəlif təmənnalarını zikr etdikdən sonra zahidi-zahirpərəstin vəsfi-halına şüru' edib deyir: Ey zahid, mənə tə'n etmə, sənin zöhdün həqiqi deyil, riyaidir. Siz zahidlər rümuzi-eşqə vaqif deyilsiniz, xərabət əhlinin eşqini zahirpərəst müfti və vaiz ola bilməz. Bu yolu göstərmək üçün piri-muğan lazımdır. Əgər sizdən təriqət məsələ-sindən sual olunsa, nəcasət fəslini söylərsiniz və həqiqət kəlməsinin mə'nasını dərk etməklə əcz göstərib, lal olub qalarsınız. Zira bu kəlməni şərhü bəyan etməyə başqa fəsahət və təlaqəti-lisan gərəkdir. O da ki, siz firqədə yoxdur.

Bu kəlamın axırkı beytində şair Azərbaycan vilayətini təmənna edib, sakin olduğu şəhərin qilü qalından şikayət edir:

Bu şəhrin qilü qalından qübari-qəm tutub könlüm,
Uçub könlüm quşu hər ləhzə Azərbaycan istər.

Burada Zəbih şikayət elədiyi şəhər yəqin ki, Gəncə şəhəridir. Aşağıda yazılan müxəmməsi-müstəzadında əgərçi şair bir növ Gəncəni başdan tə'rif və tövsif qılır, vəli onun əhalisinin eybü qüsuruna dəxi pərdə çəkmir, onları da nazik işarələr ilə göstərir və bundan masəva əsil Azərbaycan ki, Zəbihin könül quşu uçub onun tərəfinə meyl edir, qədim əsrdən İran dövlətinə tabe vəsi' bir vilayətdir ki onun mərkəzi Təbriz şəhəridir. Hər halda şair uzun müddət sakin olduğu şəhər əhlindən rəncidə və dilgir olub, başqa bir məhələ köçməyi arzu edir. Bu məhəl vətəni-mə'lufü Gəncədirmi, yoxsa Təbrizdirmi, Allah bilir.

Gəncə şəhərində sükunət edən ruhanilərin və müxtəlif əsnafların və peşəkarların vəsfi-şə'nində istehza və kinayə təriqi ilə inşad etdiyi müxəmməsi-müstəzaddır:

Könlüm həvəs eylər ki, qılım bir neçə əş'ar,
Əşari-dürərbar.
Lal olmaya nitqim, edə tuti kimi göftar,
Ya bülbüli-gülzar.
Bu rəsmdir əş'arə olub talib besyar,
Çün onda fərəh var.
Xəlqin görürəm əksərini mən kimi bikar,
Yüz dərdə giriftar.
Övsafını bu şəhrin edəm mən sənə izhar,
Ey arifü huşyar!

Əvvəl sölərəm məscidi, çün rövzeyi-cənnət,
Çox var bu şəbahət.
Olmaz bu cahanda belə mə'bədgəhi-millət,
Mehrabi-ibadət.
Yox eyb ilə bir nəqsi onun həqq-həqiqət,
Banisinə rəhmət.
Me'mari onun tərhini çəkmiş nə qiyamət,
Çox rənc ilə zəhmət.
Gəlməz bu cahan içrə dəxi bir belə me'mar,
Bu elmə səzavar.

Mollalarının hər biri əllamədir əlhəq,
Elm onları müştəq.
Qazisi qəzavətdə Şüreyh idi müvəssəq,
Fitvaları bərhəq.
Qanuni-şəriət tapıb onlar ilə rövnəq,
Sən söylə ki, səddəq.
Sübh olduğu tək əsrə kimi dərs de mütləq,
Təhsildir əlhəq.
İlkindidən axşama kimi bəhsi-səmavar,
Bir elmdi düşvar.

Düşdü güzərim hücreyi-axunda çü yeksər,
Gördüm neçə kəslər.
Dövründə oturmuş həmə əşxasi-müvəqqər*
Xoşqamətü mənzər.
Təşbih elədim hər biri [bir] Buzərü Qənbər,
Salmanə bərabər.
Guya dirilib tazədən Əmmar ilə Yasər,
Əshabi-peyğəmbər.
Ric'ət olub aya ki, gəlib Heydəri-kərrar,
Bu Cabiri-Ənsar.

Vəsf eylərəm əsnafları cümlə bu minval,
Məcmu'i xoşəhval.
Azdır buları mədh edə bir kimsə məhü sal
Yüz şairi-nəqqal.
Tacirlərini eyb edənin nitqi olur lal,
Mərdud olu filhal.
Bu şəhrdə kiçik yüz iyirmi iki baqqal,
Bir dənədi qəssal.
Sahiblərinə söyləsə hər kimsə ribaxar,
Müşrik olu murdar.

* **Müvəqqər** – möhtərəm, tə'zim və təkrim olunmuş olan



Vəh, vəh nə müəttər görünür firqeyi-dəbbağ,
Çün buyi-sərimsağ.
Rövğən küpünə daxil olub cümleyi-səbbağ*,
Guya ki, yeyib yağ.
Səllaxü** kirişçi ikisi oldular ortaq,
Sərmayə bağırsaq.
Ruxsarını əllafların gör nə olub ağ,
Çün pəşmi-Qarabağ.
Təbbaxləri gör nə edər təbxi-müləzzəz,
Çoxlar onu bilməz.
Pitipəz ilən paçəpəz, ustadi-həlimpəz.
Dükkanları məbrəz,

Kababçı əgərçi buların payinə gəlməz,
Bunları bəyənməz.
Halvaçıların mayəsidir quyruğu bəkməz,
Hər kim yeyə bilməz.
Biçarə sabunçu qalıb avarəvü bikar,
Öz halına ağlar.

Bu səfhəni gör kim, nə Gülüstani-İrəmdir,
Məxluqu sənəmdir.
Əfsus ki, bu şəhrin əhibbaları kəmdir,
Guya ki, ədəmdir.
Bə'zi görünür, tatü cühud ilə əcəmdir,
Sərriştəsi kəmdir.
Dərd olsa əgər bircə bu dünyada, nə qəmdir?
Nə cövrü ələmdir?
Ya rəb, eləmə dəhrdə, bir kimsəni bimar,
Ya qadirü qəffar!

Zakir ilə Vaiz o taydan gəli hər dəm,
Zakirliyə möhkəm.
Arşın yarım ağ ilə olub cümlə müəmməm,
Ol ömrləri kəm.
Sirab edə bilməz buları cud ilə Hatəm,
Dinar ilə dirhəm.
Eyvah, yaxın oldu yenə mahi-məhərrəm,
Tutmaqlığa matəm.
Məmlüvv edəcək ənbəri kirpilə ilanlar,
Bu mərsiyəxanlar.

* **Səbbağ** – boyaqçı
** **Sallax** – qoyun və qaramal başı kəsib soyan adam

Filcümlə İranın söyləyim vəsfini mənqul,
Ta olmaya çox tul.
İranda məgər qəhtdi bir adəmi-mə'qul.
Həm layiqü məqbul?
Bir gövdənin adını qoyub nayibi-konsul,
Qılmış bunu mərsul.
Təzkirə bahası deyibən nahəq alır pul,
Bu zalimi-məxzul.
Birdir buna dərfş ilə əfsungərü tüccar,
Dəllakü cəmadar.

Zəbihin bu müstəzadı artıq məharətlə yazılıbdır. Bu kəlamda səbat, ciddiyyət və təmkinlik ilə istehza və kinayə, ağlamaq ilə gülmək, şadlıq ilə qəm biri-birinə qarışıbdır. Burada bilmək olmur ki, şair doğrudanmı Gəncənin ruhanilərini və sair sən'ət əhllərini tə'rif və mədh eləyir, yoxsa onların üstünə gülür, rişxənd eləyir. Doğrudanmı Gəncə mollaları əllamədirlər və Gəncə qaziləri ümuri-qəzavətdə müvəssəqdirlər? Doğrudanmı qanuni-şəriət onların mübarək vücudları sayəsində rövnəq tapıbdır və sübhdən əsrə kimi onlar əziz vaxtlarını dərsü bəhsdə, tə'limü təəllümdə keçirirlər, yoxsa şair zərifanə onların üstünə gülüb kinayə edir?

Şairin sözünə inanmaq olardı, əgər samavar məsələsi araya gəlməsəydi. Hacıların vəsfinə dəxi hamı inanardı, əgər "ribaxarlıq" sözü açılmasaydı. Əgər şair möhtərəm hacıların ribaxar olmağını inkar edib deyir ki, onlara bir kəs ribaxar deyə bilməz, desələr "müşrik olur murdar", vəli bu sözlərin kinayə təriqi ilə söylənməsinə şübhə yoxdur. Çünki Gəncə tacirləri faiz və riba almasaydılar, onların bu sifəti hərgiz burada zikr olunmazdı.

Firqeyi-dabbağdan sarmısağın və bağırsağın "buyi-müəttəri" gəlmək sözlərindən şairin rişxənd etməsi zahir olur.

Sonra şair təbbaxları, bitibişirənləri və paçapəzləri, həlimaşı bişirənləri, kababçı, halvaçı və sabunçuları öz sən'ətlərinə müxtəs sifətlər ilə tə'rif edib "pitipəz ilə paçapəz", ustadi-həlimpəzin dükanlarını məbrəzə təşbih edir. Bundan sonra ətibba sinfinə keçir və onların kəmyablığından şikayət edir, tapılanları da ya tat olur və ya cuhud ki, təbabət elmində əsla sərriştələri olmur. Ancaq dərd üstünə dərd artırırlar. Ol cəhətdən şair deyir:

Ya rəb, eləmə dəhrdə bir kimsəni bimar,
Ya qadirü qəffar!



Xətmi-kəlamda şair məhərrəm ayında İrandan gələn əqrəbsənət və marsirət vaiz və mərsiyəxanları zikr edib, onların tamahkarlığından və biçarə fəhlələri, dərvişləri, əfsungərləri, dəllək və camədarları soyub çapovulçuluq edən nabəkar konsul nayiblərinin zülmü cövründən dadü fəryad edir. Bundan mə'lum olunur ki, İranın viran olmağı və onda əlan müşahidə olunan binizamlıq və ədalətsizlik xeyli zaman bundan müqəddəm başlanıbdır. Mərhum Zəbihin bu şe'ri-müstəzadı "Molla Nəsrəddin" jurnalına ən münasib və onun məsləkinə yaraşan mənzumələrdən birisidir.

Zəbih öz əsrinin Mirzə Ələkbər Sabiri olub. Əfsus ki, onun da qədri bilinməyibdir və əş'arına rəvac verən olmayıbdır.

# QƏBUL OLUNMUŞ ŞƏRTİ İŞARƏLƏR

A - Lütfəli bəy Azər. Ataşkədə, Bombey, H.1277.
AC - Mirmehdi Xəzani. Asarül-Cəmal (əlyazması), H.1296, RƏF, B-3336.
AD - Aciz. Divan, Təbriz, H.1273.
AƏT - Azərbaycan ədəbiyyatı tarixi, üç cilddə, Bakı, 1958; 1960.
AT - Azərbaycan tarixi, üç cilddə, Bakı, 1958; 1964.
BƏ - Molla Vəli Vidadi. Əsərləri, Bakı, 1957; 1968.
BM - Adolf Berje. Qafqaz və Azərbaycanda məşhur olan şüəranın əş'arına məcmuə, Leypsiq, 1867.
ƏND - Əlişir Nəvai. Divan (faksimile nəşri), M., 1964.
FD - Məhəmməd Füzuli. Divan, istanbul, H.1308.
FQ - Feyzulla Qasımzadə. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi, Bakı, 1966.
Gİ - Abbasqulu ağa Bakıxanov. Gülüstani-İrəm, Bakı, 1951.
H - Hicri.
HA - Həmid Araslı, XVII-XVIII əsrlər Azərbaycan ədəbiyyatı tarixi, Bakı, 1956.
HN - Firidun bəy Köçərlinin "Azərbaycan ədəbiyyatı tarixi materialları" əsərinin hazırki nəşri - Azərbaycan ədəbiyyatı, iki cilddə, Bakı, 2005.
İN - İlk nəşrdə - F.Köçərli. Azərbaycan ədəbiyyatı tarixi materialları, iki cilddə, Bakı, 1925; 1926.
İNİ - İlk nəşrdə "İdarə"dən verilmiş qeyd.
QƏ - Şəmsəddin Sami. Qamüsül-ə'lam, altı cilddə, İstanbul, H.1306-1316.
QM - Hüseyn əfəndi Qaibov. Məcmuə (əlyazması), RƏF, S-1901.
QMD - Hüseyn əfəndi Qaibov. Azərbaycanda məşhur olan şüəranın əş'arına məcmuə (əlyazması), dörd cilddə, RƏF, I cild, M - 131; II cild, M - 132; III cild, M - 133; IV cild, M -134.
M - Miladi.
MƏAD - Mirzə Həsən Əlqədari. Asari-Dağıstan, Bakı, 1903.
MV - Mirzə Yusif Qarabağı. Məcmueyi-divani-Vaqif və digər müasirin, Teymurxanşura, 1856.
ND - Nəbati. Divan, Təbriz, H.1305.
RA - Məhəmməd ağa Müctəhidzadə. Riyazül-aşiqin, İstanbul, H.1328.
RƏF - Azərbaycan Milli Elmlər Akademiyası Füzuli adına Əlyazmalar İnstitutu.
TN - Mirmöhsün Nəvvab. Təzkireyi-Nəvvab, Bakı, 1913.
YND - Yusif Nabi. Divan, İstanbul, H.1292.
ZƏ - Qasım bəy Zakir. Əsərləri, Bakı, 1964.



# İZAHLAR VƏ QEYDLƏR

[1] Əsərin avtoqrafı gürcü tarixçisi S.Esadzenin şəxsi arxivində (Gürcüstan Res. Mərkəzi Dövlət arxivi, fond: 1438, inv. №751. Рукопись работы Ф.Кочарлинского) saxlanılır. Əsərin çap nüsxəsi ilə avtoqraf arasında müəyyən fərqlər vardır. O, redaktor və senzura tərəfindən ixtisar edilərək çap olunmuşdur. Avtoqrafın sonunda 2 oktyabr 1902-ci il tarixi qoyulmuşdur.

F.Köçərlinin "Seçilmiş əsərləri"nə (Bakı, 1963. Tərtibçiləri: K.Talıbzadə, N.Məmmədov; redaktoru: K.Talıbzadə) salınarkən əsərin çap nüsxəsi əsas götürülmüş və həmin ixtisar edilmiş hissələr kvadrat mötərizələr içərisində mətnə daxil edilmişdir.

[2] *"Ataşkədə"* – XVIII əsrin sonlarında şair və ədəbiyyatşünas Lütfəli bəy Azər Bəydili (1711-1781) tərəfindən fars dilində yazılmış təzkirə. F.Köçərlinin əsər boyu "Ataşkədeyi-Azəri" adlandırdığı bu təzkirədə şairlər xronoloji və yaxud adlarının əlifba sırası üzrə deyil, coğrafi prinsip üzrə (məsələn, Gəncə şairləri, Şirvan şairləri, İsfahan şairləri və s.) təsnif edilmişdir.

Bu təzkirə bir neçə dəfə çap olunmuşdur. Ehtimal ki, F.Köçərli əsərin h.1277-ci il Bombey çapından istifadə etmişdir.

[3] *Məhəmməd Əmin Dilsuz və Məhəmməd Xəlifə Aciz* – XIX əsr Güney Azərbaycan şairləri.

[4] Divaninin şəxsiyyəti haqqında hələlik heç bir mə'lumat əldə edilməmişdir.

[5] *Molla Hüseyn Daxil və Əbülhəsən Raci (1831-1875)* – XIX əsr Güney Azərbaycan şairləri.

[6] *Sə'di Şirazi (1184-1291)* – böyük fars-tacik şairi, məşhur "Gülüstan" və "Bustan" əsərlərinin müəllifi.

[7] Tərcüməsi:

> Şeyx Sə'di Şirazda nəfəs almağa başlayandan
> Şirazlıların nazı fələyə çatdı.

[8] *Məhəmməd Füzuli (1494-1556)* – böyük Azərbaycan şairi.

[9] *FD, səh.28.*

[10] Böyük fars-tacik şairi Əbülqasım Firdovsinin (934-1020) "Şahnamə" əsərindəndir. Tərcüməsi:

> Dünyada gözəl sözdən yaxşı nə var?!
> Böyükdən və kiçikdən ona afərin olsun!
> Əgər Allahdan gözəl sözlər olmasaydı,
> Peyğəmbər bizlərə necə yol göstərərdi?!

[11] *Nizami Gəncəvi* (*1141-1209*) – böyük Azərbaycan şairi, məşhur "Xəmsə" əsrinin müəllifi.

[12] Nizami Gəncəvinin "Yeddi gözəl" əsərindəndir. Tərcüməsi:

Həm təzə, həm də köhnə olan şey sözdür,
Bu barədə çoxlu sözlər vardır.
Yaradılışda "kün" anasının
Sözdən yaxşı bir övladı olmadı.
O sözdə ki, eyib yoxdur,
O, qeyb evi xəzinəsinin xəzinədarıdır.
Eşidilməmiş dastanı o bilər,
Yazılmamış məktubu o oxuyar.
Bax, Allahın yaratdıqları içərisində
Sözdən başqa heç nə yoxdur.
İnsan oğlundan yadigar qalan sözdür
Ondan başqa hər şey boş şeydir (yeldir).

[13] Beyt Nizami Gəncəvinin "Sirlər xəzinəsi" əsərindəndir.
Tərcüməsi:

Sözdən yuxarıda oturan bir kəs yoxdur.
Bu dünyanın dövləti sözündür, vəssəlam!

[14] *Seyid Əzim Şirvani* (*1835-1888*) – məşhur Azərbaycan şairi.

[15] *Mustafa* – Məhəmməd peyğəmbərin ləqəblərindən biri.

[16] *...həl'əta...* – ...gəldi... Qur'an ayəsindən dini rəvayətə görə, Mədinədə Əli haqqında nazil olmuşdur. Şahi-"həl'əta" – Əliyə işarədir.

[17] *Mirzə Ələkbər Sabir* (*1862-1911*) – böyük Azərbaycan şairi.

[18] *Eynəli bəy Sultanov* (*1862-1935*) – görkəmli Azərbaycan ədibi və publisisti. 1886-1913-cü illərdə F.Köçərliyə 20 məktub yazmış və bu məktublar vasitəsilə ona Azərbaycan şifahi xalq ədəbiyyatı nümunələrindən əlavə, M.Sidqinin tərcümeyi-halını və Aşıq Abbas Tufarqanlı haqqında mə'lumat göndərmişdir. *Azərbaycan klassik yazıçı və şairlərinin ayrı-ayrı əsərlərinin siyahısı, Azərbaycan Milli Elmlər Akademiyası M.Füzuli adına Əlyazmalar İnstitutu, RƏF arx. 24, Q-1 (15).*

[19] *"Balalara hədiyyə"* – F.Köçərlinin 1912-ci ildə Bakıda uşaqlar üçün nəşr etdirdiyi məcmuə. Kitabda Azərbaycan nağıl, hekayə, məsəl, tapmaca, düzgü və s. toplanmışdır. İkinci nəşri: Bakı, 1967, tərtibçi B.Nəbiyev, üçüncü nəşri: Bakı, 1972. Əsərin avtoqrafı RƏF-də saxlanılır; şifri: S-226/880, həcmi: 88 səh.

[20] *"İrşad"* – 1905-1908-ci illərdə əsasən Ə.Ağayevin redaktorluğu ilə Bakıda nəşr olunmuş gündəlik ədəbi, elmi, siyasi-ictimai qəzet.

[21] *"Tərəqqi"* – 1908-1909-cu illərdə Ə.Ağayevin redaktorluğu ilə Bakıda nəşr olunmuş gündəlik ədəbi, siyasi-ictimai, iqtisadi qəzet.

[22] *"Təzə həyat"* – 1907-1908-ci illərdə H.Vəzirovun redaktorluğu ilə Bakıda nəşr olunmuş gündəlik ədəbi, siyasi-ictimai, iqtisadi qəzet.

[23] *"Molla Nəsrəddin"* – 1906-1931-ci illərdə böyük Azərbaycan yazıçı və jurnalisti C.Məmmədquluzadənin redaktorluğu ilə nəşr olunmuş həftəlik şəkilli satirik



jurnal (1906-1917-ci il, redaktorlar: S.Eynullayev [İbrahimov], Seyid Hüseyn və başqaları – Bakıda).

[24] *"İqbal"* – 1912-1915-ci illərdə Bakıda nəşr olunmuş gündəlik ədəbi, elmi, siyasi, iqtisadi qəzet. Müxtəlif vaxtlarda redaktorlar: S.Eynullayev [İbrahimov], Seyid Hüseyn və başqaları.

[25] *"Sədayi-həqq"* – 1912-1915-ci illərdə H.Vəzirovun redaktorluğu ilə Bakıda nəşr olunmuş ədəbi, siyasi-ictimai, elmi, iqtisadi qəzet.

[26] *"İqdam"* – 1914-1915-ci illərdə H.İ.Qasımovun redaktorluğu ilə Bakıda nəşr olunmuş iqtisadi, siyasi və ictimai qəzet.

[27] *Əhməd Cövdət Əfəndi* (*1822-1895*) – türk yazıçısı, tarixçisi və ictimai xadimi.

[28] *"Həyat"* – 1905-1906-cı illərdə Bakıda nəşr olunmuş siyasi-ictimai, ədəbi, elmi və iqtisadi qəzet. Redaktoru 1905-ci ildə Ə.Ağayev və Ə.Hüseynzadə, sonra Ə.Hüseynzadə olmuşdur.

[29] *Əli bəy Hüseynzadə* (*1864-1940*) – Məşhur Azərbaycan jurnalisti və yazıçısı. Azərbaycan dilini osmanlılaşdırmaq tərəfdarı olduğu və bu fikri təbliğ etdiyi üçün F.Köçərli onu "Molla Nəsrəddin" jurnalındakı "Ana dili" məqaləsində tənqid etmişdi. *"Molla Nəsrəddin", 16 sentyabr, 12 oktyabr 1913, №№ 22, 23; F.Köçərli, Seçilmiş əsərləri, səh.294.*

[30] F.Köçərli tərəfindən adı çəkilən bu məqalədə Ə.Hüseynzadə elm və texnikada ixtira olunmuş yeni cihazlara, təfəkkürdə yaranmış yeni mətləb və mə'nalara ad vermək üçün avropalıların latın və yunan sözlərindən istifadə etmələrini bəyənir, türkdilli xalqların isə bu məqsədlə ərəb və fars kəlmələrindən istifadə etmələrini məsləhət görür.

[31] *"Türk yurdu"* – 1911-1918-ci illərdə İstanbulda nəşr olunmuş ədəbi, siyasi-ictimai, iqtisadi jurnal. *Э.Ю.Гасанова. Идеология буржуазного национализма в Турции, Баку, 1966.*

[32] *Əhməd Hikmət bəy* (*1870-1927*) – türk yazıçısı və dövlət xadimi.

[33] *"Türk dərnəyi"* – 1908-1911-ci illərdə İstanbulda nəşr olunmuş jurnal.

[34] *"Xalqa doğru"* – 1912-1913-cü illərdə İstanbulda nəşr olunmuş qəzet.

[35] Xalq dilində işlədilən bir ifadədir. Tərcüməsi: Dil ərəb dilidir, fars dili şəkərdir, türk dili hünər.

[36] *Şəmsəddin Məhəmməd Xacə Hafiz Şirazi* (*1307-1389*) – böyük fars-tacik şairi.

[37] *Cəlaləddin Rumi* (*1207-1263*) – böyük türk şairi.

[38] *Şeyx Əttar* (*1119-1230*) – böyük fars-tacik şairi. "Nanü halva" Şeyx Əttarın deyil, Şeyx Bəhaəddin Amilinin əsəridir.

[39] *Ömər Xəyyam* (*1040-1123*) – böyük fars-tacik filosofu, alimi və şairi.

[40] *Ağaməsih Şirvani* – XVIII əsr Azərbaycan şairi.

[41] *Mirzə Nəsrullah Bahar Şirvani* (*1835-1883*) – məşhur Azərbaycan şairi.

[42] *Abbasqulu ağa Bakıxanov Qüdsi* (*1794-1847*) – məşhur Azərbaycan alimi, tarixçisi və şairi.

[43] Qubalı Xürrəminin şəxsiyyəti haqqında hələlik heç bir mə'lumat əldə edilməmişdir. XIX əsrin əvvəllərində Güney Azərbaycanında Xürrəm Qaracadaği (?-1825) adlı şair olmuşdur. Ola bilsin ki, F.Köçərli Xürrəm Qaracadağinin həyatı və yaradıcılığı ilə tanış olmadığı üçün onu qubalı hesab edib "Xürrəmi" kimi vermişdir.

[44] *Qasım bəy Zakir* (*1784-1857*) – məşhur Azərbaycan şairi.

[45] *Abdulla bəy Asi (1840-1874)* – Azərbaycan şairi, Qasım bəy Zakirin qız nəvəsi.

[46] *Mehdiqulu xan Vəfa (?-1900)* – XIX əsr Azərbaycan şairi, şairə Xurşidbanu Natəvanın oğlu.

[47] *Mirzə Rəhim Fəna (1841-1929)* – Azərbaycan şairi; Şuşada şair Hacı Abbas Agəhin evində "Məclisi-üns" ədəbi məclisinin təşkilatçısı.

[48] *Mirzə Mehdi Naci (1805-1883)* – XIX əsr Azərbaycan şairi.

[49] *İsmayıl bəy Nakam (1839-1906), Mirzə İsmayıl Bəzmi (1846-1888), Əbülqasım Nəbati (1812-1873), Mustafa ağa Nasir (1812-1873)* – XIX əsr Azərbaycan şairləri.

[50] *Molla Pənah Vaqif (1717-1897)* – böyük Azərbaycan şairi.

[51] *Yusif Nabi (1642-1712)* – böyük özbək şairi.

[52] *Əlişir Nəvai (1441-1501)* – böyük özbək şairi.

[53] *Sultan Süleyman Qanuni (1494-1566)* – 1520-1566-cı illərdə Osmanlı hökmdarı.

[54] M: 1495.

[55] Son tədqiqatda Füzulinin 1494-cü ildə Kərbəla şəhərində doğulduğu göstərilir. *AƏT, (I cild, səh.351).*

[56] Son tədqiqatda Füzulinin vəfatı tarixi 1556-cı il göstərilir, *AƏT, I cild, səh.358.*

[57] *FD, səh.168.*

[58] *FD, səh.4.*

[59] *FD, səh.64.*

[60] *Məhəmməd Cəlal. "Osmanlı ədəbiyyatı nümunələri", İstanbul, h. 1312, səh.10.*

[61] *Yenə orada, səh.11.*

[62] *FD, səh.7.*

[63] *FD, səh.7-8.*

[64] Füzulinin "Şikayətnamə" əsəri eyni zamanda "Nişançı paşaya məktub" adı ilə də məşhurdur. Ehtimal ki, bu, F.Köçərliyə mə'lum olmamışdır.

[65] Bu mə'lumatdan aydın olur ki, Füzulinin bir sıra əsərləri, məsələn, şairin ərəbcə "Divan"ı, "Mətləül-e'tiqad", "Rindü zahid" və b. əsərləri F.Köçərliyə mə'lum deyilmiş.

[66] *"Əxtər"* – 1875-1898-ci illərdə İstanbulda Güney Azərbaycan ziyalıları tərəfindən fars dilində nəşr olunmuş qəzet. Müdiri Ağaməhəmməd Tahir, redaktoru Hacı Mirzə Mehdi olmuşdur. İqtisadi, siyasi, ədəbi məsələləri əks etdirən bu qəzet əvvəlcə hər gün, sonralar isə həftədə iki dəfə çıxmışdır. *H.Hatəmi. Mühacir İran qəzetlərinin müstəmləkəçilik və imperializm əleyhinə mübarizəsi, Bakı, 1964, səh.78-79.*

[67] M: 1890.

[68] Tərcüməsi: Həqiqətdə sən hər şeyə qadirsən. *Füzuli. "Hədiqətüs-süəda", İstanbul, H.1303, səh.6-7.*

[69] *FD, səh.206-207.*

[70] *İsmayıl bəy Nakam. HN, II cild, səh.300-323.*

[71] *Mollaağa Bixud (1830-1892)* – XIX əsr Azərbaycan şairi.

[72] *Qövsi* – XVII əsr Azərbaycan şairi.

[73] *Molla Qədir Naci* – XIX əsr Azərbaycan şairi.

[74] Tərcüməsi: Eşq aşiqlər üçün hidayət yolunu işıqlandırdı.



[75] *FD, səh.119*

[76] *Şopenhauer Artur (1788-1860)* – alman idealist filosofu. Hər hansı tarixi-ictimai tərəqqini inkar etmiş, bədbinlik fəlsəfəsi tərəfdarı olmuşdur.

[77] Ərəb əlifbası ilə "kaf" (ك) və "nun" (ن) birlikdə yazıldıqda "kün" (كن) alınır ki, bu da ərəb dilində "ol" deməkdir. Qur'an ayəsinə görə kainat Allahın "kün" (كن) əmri ilə yaranmışdır. Bu söz Qur'anda bir neçə surənin ("Ali-İmran", "Ənam", "Nəhl" və s.) ayrı-ayrı ayələrində işlənmişdir.

[78] *...maərəfnak[ə]...* – ...səni tanımadıq... Dini rəvayətə görə Məhəmməd Allahla söhbət zamanı bu ifadəni işlədib demək istəmişdir ki, ey Allah, sən elə bir vücud, elə bir sirsən ki, biz səni lazımınca tanıya bilmirik.

[79] "Ruha xitab" və bir az aşağıdakı "Nəfspərəst qafilə xitab" sərlövhələrini F.Köçərli artırmışdır.

[80] *FD, səh.230-234.*

[81] *"Hədiqətüs-süəda", səh.290.*

[82] Parça Nizaminin "Leyli və Məcnun" əsərindəndir. *FD, səh.233.*

Sözün ləvazimatı şadlıq və nazdır,
Söz özünü bu iki vasitə ilə göstərir.
Sözün meydanı gərək geniş olsun –
Ki, təb' onda hünər göstərə bilsin.
İsti qumda və bərk dağda
Heç qiymətli söz demək olarmı?!

[83] *FD, səh.243.*

[84] *Yenə orada.*

[85] F.Köçərlinin "Qələmə xitab" başlığı ilə verdiyi bu parça poemanın "Səadətli bəy həzrətlərinin mədhi" hissəsindəndir. *FD, səh.244.*

[86] Bu beyt poemanın "Səbəbi-nəzmi-kitab" hissəsindəndir. *FD, səh.243.*

[87] Yusif Nabinin "Divan"ı H.1292-ci ildə (M.1875) İstanbulda çap olunmuşdur.

[88] Bu göstərilən şeir janrlarının hər biri divanda müstəqil bölmə təşkil edir və aşağıdakı həcmdədir; babül-mədh vənnə't, qəsaid, təxmis və maddeyi-tarixlər, səh.1-118; ardınca məsnəvilər, səh.1-38; rübaiyyat və qəzəliyyati-türki, səh.1-243; müqəttəat, səh.1-14; müəmmayat, səh.1-22; Divani-qəzəliyyati-farsi, səh.1-35; Xeyriyyeyi-Nabi, səh.1-64.

[89] *YND, Xeyriyyə, səh.4.*

[90] *Yenə orada.*

[91] *M: 1694.*

[92] *YND, maddeyi-tarix, səh.110.* Tərcüməsi:

Əzəli lütfə sığınan,
Mənim fitrətimin sərmayəsi olan Əbülxeyrin
Şərəfli təvəllüd tarixi
"Əz dərd xuda pənah darəd"dir.
(*"Allah onu bəlalardan saxlasın"dır.*)

[93] M: 1642.

[94] *YND. Xeyriyyə, səh.5.* Tərcüməsi:

Vətənim gözəl Rəha şəhəridir,
Bunları yazan vaxtda iqamətgahım Şəhbadır.
Elə bir Rəha ki, cənnət bağçasının bir nüsxəsi,
Xəlilülrəhmanın daimi yaşayış yeridir.
Elə bil Rəha ki, Şam ölkəsi ona həsrət çəkir,
"Bərd və səlam" möcüsəinin yeridir.

[95] *Yenə orada.*

[96] *YND. Rübaiyyat və qəzəliyyati-türki, səh.8.*

[97] *IV Sultan Məhəmməd* – 1642-1693-cü illərdə Osmanlı hökmdarı.

[98] *YND. qəsaid, səh.27-28.*

[99] Son tədqiqatda Yusif Nabinin 1712-ci ildə İstanbulda vəfat etdiyi göstərilir. *Vəsfi Mahir Qocatürk, "Türk ədəbiyyatı antolojisi", Ankara, 1967, səh. 190.*

[100] *YND. məsnəvi, səh.26-27.*

[101] *YND. məsnəvi, səh.27.*

[102] *YND. məsnəvi, səh.28.*

[103] *M: 1712.*

[104] *YND. maddeyi-tarix, səh.117.* Tərcüməsi:

Nabi sənin kiçicik ruhun nur dəryasına gəldiyindən
Bədən darısqallığından nicat tapdı, şadlıq dəryasına gəldi.

Gözə görünən və görünməyən mə'naların tarixşünasları
Dedilər: tarixin ardınca "Nabi behüzur aməd".
*(Nabi hüzura gəldi)*

[105] *YND. Xeyriyyə, səh.5.*

[106] Hədisdir. Tərcüməsi: Elm Çində də olsa onu öyrən!

[107] *YND. Xeyriyyə, səh.12-13.*

[108] *YND. Xeyriyyə, səh.22-24.*

[109] *YND. Xeyriyyə, səh.37-39.* F.Köçərlinin ayrı-ayrı başlıqlar altında verdiyi bu şeirlər divanda "Mətləbi-hüsni-kəlami-mövzun" sərlövhəsi altında getmişdir.

[110] *YND. qəzəliyyati-türki, səh.26-27.*

[111] *YND. qəzəliyyati-türki, səh.55-56.*

[112] *YND. qəzəliyyati-türki, səh.57.*

[113] *YND. qəzəliyyati-türki, səh.77.*

[114] *YND. qəzəliyyati-türki, səh.210.*

[115] *YND. qəzəliyyati-türki, səh.212.*

[116] Bu parçaya Nabinin divanında rast gəlmədik.

[117] Bu beytə Nabinin divanında rast gəlmədik.



[118] Beyt:

Əfzuniyi-həyat kim, azarlıqdadır,
Sərmayeyi-nicat səbükbarlıqdadır.

– mətləli qəzəlin məqtəidir. *YND, qəzəliyyati-türki, səh.53.*

[119] Beyt:

Çoxdan şikəstə eylər idin yar ne'mətin,
Olsa besərfində əgər saz dövlətin.

– mətləli qəzəldəndir. *YND, qəzəliyyati-türki, səh.120.*

[120] Parça:

Dərunimdə kədər var, yəs', ümmidə ləyaqət yox,
Vüsalə qabiliyyət, möhnəti-hicranə taqət yox.

– mətləli qəzəldəndir. *YND, qəzəliyyati-türki, səh.109.*

[121] Bu parça da Nabinin türkcə qəzəllərindən olub üç beyt ixtisarla verilmişdir. YND, qəzəliyyati-türki, səh.104.

[122] Beyt:

Xətti-rənc kənareyi-xətti-üzardə
Guya ki, bir səlam yazılmış kənardə.

– mətləli qəzəldəndir. *YND, qəzəliyyati-türki, səh.195.*

[123] Beyt:

Olmaq müyəssər olmadı dilbərlə rubəru,
Yollarda qaldı ayinəvəş çeşmi-arizu.

– mətləli qəzəldəndir. *YND, qəzəliyyati-türki, səh.178.*

[124] F.Köçərlinin "Nabinin müqəttəatından nümunələr" başlığı altında verdiyi parçaların hamısı şairin ayrı-ayrı qəzəllərindən götürülmüşdür. Müəllif divanındakı qit'ələrdən istifadə etməmişdir.

[125] Son tədqiqatda Əlişir Nəvainin təvəllüd tarixi 9 fevral 1441-ci il göstərilir. *İzzət Sultan. Nəvainin qəlb dəftəri. Daşkənd, 1969, səh.30.*

[126] M: 1460.

[127] *"Dəbistan"* – 1906-1907-ci illərdə Bakıda uşaqlar və müəllimlər üçün nəşr olunmuş jurnal. Naşir və redaktorları: Ə.İ.Cəfərzadə və M.H.Əfəndizadə.

Əliağa Həsənzadənin "Əlişir Nəvai" adlı məqaləsi həmin jurnalın 1907-ci il 3-cü nömrəsində çap olunmuşdur.

[128] *"Qamusül-ə'lam"* – türk alimi Şəmsəddin Saminin (1850-1904) altı cildlik lüğəti, İstanbul, H.1306-1316 (M.1888-1898).

[129] *ƏND, səh.3b.*

[130] *ƏND, səh.9a-9b.*

[131] M: 1501.

[132] Ə.Nəvainin əsərlərindən verilmiş nümunələr Ə.Həsənzadənin göstərilən məqaləsindən götürülmüşdür.

[133] *Nasir Xosrov Dəhləvi (1253-1325)* – məşhur fars şairi. Nizami Gəncəvinin ilk nəzirəçilərindən olub, "Xəmsə" yazmışdır.
[134] *Əbdürrəhman Cami (1414-1492)* – böyük fars və tacik şairi, məşhur "Həft övrəng", "Baharıstan", "Nəvəxatül-üns" və s. əsərlərin müəllifi.
[135] *ƏND, səh.13b.*
[136] *Həsən Qara Hadi (XIX əsr), Mirzə Əliəsgər Novrəs (1846-1918), Mirzə Cəbrayıl Süpehri (?-1902)* – Azərbaycan şairləri.
[137] Son tədqiqatda Gəncə zəlzələsinin tarixi 1139-cu il göstərilir. AT, səh. 166.
[138] *Şah Abbas Səfəvi* – 1587-1629-cu illər Səfəvilər sülaləsinin beşinci hökmdarı.
[139] *Nadir şah Əfşar (1688-1747)* – 1736-1747-ci illərdə İran şahı.
[140] *Pavel Dmitriyeviç Sisianov (1754-1806)* – 1802-1806-cı illərdə Qafqaz hərbi qüvvələrinin baş komandanı.
[141] *Fətəli şah* – 1797-1834-cü illərdə İran şahı.
[142] *Fələki Şirvani (1108-1146)* – XII əsr Azərbaycan şairi.
[143] *A, Şirvan şairləri.*
[144] M: 1165.
[145] M: XII əsrin ortalarında.
[146] *A, Şirvan şairləri:* Tərcüməsi:

Ey Xaqani, sözü yaxşı başa düşdüyündən
Gəl, sənə incə bir söz deyim, müftəcəsinə eşit:
O kəs ki, yaşda səndən böyükdür, onu həcv eləmə,
Ola bilər ki, o sənin atan olsun və sən bilməyəsən.

[147] Sovet ədəbiyyatşünaslarının tədqiqatında Əbülülanın bu beytindəki "İran" kəlməsi "Ərran" şəklində verilir və şairin azərbaycanlı olduğunu təsdiq edən dəlillərdən biri hesab olunur. AƏT, I cild, səh.67-68.
[148] Tərcüməsi:

Dünyanın anası məni doğan andan
Öz fəzlim və hünərimlə dünyada ustadam.
İndi altmış yaşım var, İran torpağından
Şirvana gələndə isə on altı yaşım vardı.
Demirəm ki, Keyxosrov və ya Keyqubadam,
Hökmdarı tə'rifləyən qoca bir kişiyəm.
Ey Əfzələddin, əgər düzünü soruşsan,
Sənin əziz canın üçün səndən narazıyam.
Sən bizim gözümüzün işığısan, övladımızsan,
Sən məni həm ata, həm də ustad çağırmısan.
Elə ki, mənim şagirdim olmağa meyl göstərdin,
Sənə qızıl və gümüş hədiyyə elədim.
Sənin tə'limində şəfqət kəməri bağladım,
Sənin dilini şairliyə açdım.



Elə ki, şair oldun, səni xaqanın yanına apardım,
Sənə "Xaqani" ləqəbini qoydum...
Sən ki, tez-tez mənim üstümə od kimi coşursan,
Nə sən su və odsan, nə də mən torpaq və küləyəm.

[149] M: 1126. Son tədqiqatda: 1141-ci il. *AƏT, I cild, səh.106.*
[150] *A, Gəncə şairləri; QƏ, VI cild, səh.45-89.*
[151] *Иоган Шерр. Всеобщая история литературы, т. I, СПб, 1879, səh.75; M., 1905, səh.108.*
[152] Tərcüməsi:

Ey Nizami, xəzinədən bəndi aç,
Nə vaxta qədər Gəncənin giriftarı olacaqsan?!
Dürr kimi Gəncə dənizində itsəm də
Qohistan [vilayətinin] Qum şəhərindənəm.

Son tədqiqatda Nizaminin Gəncədə doğulması qət'i müəyyənləşdirilmişdir. *AƏT, I cild, səh.106.* Prof. Y.Bertels:

Dürr kimi Gəncə şəhərində itsəm də
Qohistan vilayətinin Qum şəhərindənəm.

– beytin "İqbalnamə"nin bə'zi əlyazma nüsxələrinə sonradan qondarılma olduğunu sübut etmişdir. *Y.Bertels. Böyük Azərbaycan şairi Nizmi, Bakı, 1940, səh.26.*
[153] Tərcüməsi:

Torpağı Məsihə tutiyə bağışlayan,
Daşı Kəlimə kimya bağışlayan,
Sahəsi güllük, çiçəklik,
Şəkər qamışlığı və qərəfillik.

[154] *Atabəy Qızıl Arslan* – 1186-1191-ci illərdə Azərbaycan hökmdarı.
[155] *A, Gəncə şairləri.*
[156] Beyt Nizaminin "Xosrov və Şirin" əsərindəndir. Tərcüməsi:

Mənim e'tiqadıma və səmimiyyətimə nəzər saldı,
Həmdünyan kəndini mənə bağışladı.

Həmin kəndi şairə Qızıl Arslan bağışlamışdır.
[157] M: 1194.
[158] M: 1209. Son tədqiqatda da Nizaminin vəfatı tarixi 1209-cu il göstərilir. *AƏT, I cild, səh.112.*
[159] *Qriboyedov A.S. (1799-1827)* – rus yazıçısı və dövlət xadimi, "Ağıldan bəla" əsərinin müəllifi.

1827-ci ilin iyununda A.S.Qriboyedov A.Bakıxanovla birlikdə Nizaminin məqbərəsini ziyarət etmişdir. M.Рафили. Избранное, Баку, 1873, səh.179; И.К.Ениколопов. Грибоедов и Восток. Иреван, 1974, səh.129.

[160] *Mirzə Məhəmməd Axundov* – XX əsrin əvvəllərində tanınmış Azərbaycan maarif və ədəbiyyat xadimi, "Şeyx Nizami" əsərindən əlavə, "Əqaidül-müslimin", "Məclis yaraşığı", "sə'd Vəqqas" və s. əsərlərin müəllifi.

[161] *Axundov Mirzə Məhəmməd. Şeyx Nizami, Gəncə. Əhməd Hacı Həsənzadə mətbəəsi, H.1337 (M-1909) səh.19-20.*

[162] *Frans Franseviç Şarmua (1793-1868)* – fransız şərqşünası.

[163] *Mirzə Cəlal Yusifzadə (1862-1931)* – Azərbaycan jurnalisti və maarif xadimi

[164] Tərcüməsi:

Mə'nəviyyat və fəzilətim e'tibarilə şahların şahıyam,
Yeri, zamanı və asimanı hökmümlə tutmuşam.
Uca səsli nəfəsim zəng kimi gurdur.
Dünyanı ölçən qələmim dünya tutan bayraqdır.
Himmət başım Keyqubad papağını qoymuşdur,
Təntənə qanadım Qurxan bayrağından yüksəlmişdir.
Cavanmərdlik insafdan yarandığı kimi, söz də məndən yaranmışdır.
Təravət gənclikdən doğduğu kimi, hünər də məndən doğmuşdur.
Qəzəlim qulaqlarda ərğənun səsi kimidir.
Sən'ətim zövqlərə qırmızı şərab tə'siri bağışlayır.
Ulduzların əsas hərəkətvericisi mənəm, özləri tüfeylidir.
Göy təbəqələrində su mənəm, göy özü qabqacaqdır.
Boş yerə təbil çalmıram, əgər çalsam toy olar,
Boş yerə xütbə (moizə) oxumaram, oxusam, mahnı olar.
Mən ayam, amma ay kimi tutulub qaralmaram,
Mən dürrəm, amma dürr kimi ağarma xəstəliyinə tutulmaram.
Reyhan qönçəsi mehrəgan (payız bayramı) havasına bağlı olduğu kimi,
Məni dodağımın bir işarəsinə xalqların ürəyi bağlıdır.
Əgər bu sevinc meydanında mənim nəğmələrim olmasaydı,
Kim müğənni çağırardı ki, muğan meyi içəydi?
Sədəf kimi halal yeyənəm, gövhər kimi halalzadəyəm,
Haramzadədən uzağam, gecə-gündüz rəmanidəyəm.
Paxıl vələdüznadır, mən oyam ki, ulduzum
Yəmani (Süheyl; Sirius) ulduzu kimi vələdüzna öldürəndir.
O dəftərin başını bağla, bu qəsidənin qapısını aç,
Bunu fazillər mənzilbəmənzil hədiyyə aparırlar.
Xəzinəmdə bir şəvəm (qarq muncuq) də yoxdursa, nə üçün mən gövhər saçım?!
Xəritəmdə (süfrəmdə) bir gövhərim də yoxdursa, ağzımı nə üçün sədəflə doldurum?!
Ürəyim və dinim sınıb, yenə də döyüş həvəsindəyəm,
Başım, ayağım yalındır, yenə də keşikçilik iddiasındayam.
Ey hökmdar, ey padşah, mənə bir nəzər sal,



Sənin bu nəzərin sayəsində bədlikdən və bədgümanlıqdan çıxım.
Mənim ürəyim sənin hərəmindir, onu həsəddən qoru,
Mələk şeytanlarla bir yuvada yaşaya bilməz.
Kiçikliyimə baxıb məni incitmə, torpağım deyə məni alçaltma,
Təbimdən və varlığımdan ikiürəkliliyi və ondilliliyi çıxar.
Üzrümə görə günahımdan keç, oxşa, mərhəmət elə,
Xəcalətimə baxım ehtiyaclarımı duy!
Bütün yaranmışlara ölüm yazılmışdır,
Sən həmişə yaşayansan, əzəli və əbədi qalansan.
Sənə itaət etdiyimə görə, əbədi yaşayası olacağam,
Bu səadətim olmasa, nə mən, nə həyat?
Əgər Nizamidən bir günah baş vermişsə, onu bağışla,
Kimsə asimanın qəzasından yaxasını qurtara bilməz.
Əzəldən onun vücudunu səadətə yetirən sənsən,
Nəfəsi sona çatarkən də onu şəhidlər sırasına yetir.

[165] Tərcüməsi:

Dünən gecə meyxanaya getdim, mənim üçün qapını açmadılar,
Nə'rə çəkdim, fəryad elədim, heç kəs eşitmədi.
Ya şərab satanlardan heç biri oyaq deyildi,
Ya da mən heçkəsəm ki, heç kəs mənim üçün qapını açmadı.
Elə ki, gecə yarı oldu, bir az ondan çox ya az,
Bir rind başını pəncərədən çıxarıb mənə baxdı.
Ona dedim: – Aç qapını! Dedi: – Get, hərzə danışma!
Sənin üçün bu vaxt heç kəs qapını açmaz.
Bura məscid deyil ki, hər an qapısını açsınlar –
Ki, sən gec gəlib, tez yuxarı başda əyləşəsən.
Dünyanın hər yerindən bura yığışanlar var:
Hindu da, hörmizi də, mö'min də, xristian da, yəhudi də.
Əgər istəyirsən ki, piri-muğan sənə nəzər yetirsin,
Hamının ayağının torpağı ol ki, öz məqsədinə çatasan.

[166] *Mustafa ağa "Nasir" təxəllüs, HN, II cild, səh.243-254.*

[167] *Mirzə Həsən Əlqədari (1834-1913)* – məşhur Dağıstan yazıçısı, tarixçi və maarif xadimi.

[168] *MƏAD, səh.76-77.*

[169] *Gİ, səh.127.* Gİ-nin H.1260-cı (M.1844) ildə fars dilində yazılmış nüsxəsindən edilmiş bu tərcüməsində bir sıra şəxsiyyət və coğrafi adlar başqa nüsxələrlə müqayisə edilərək dəqiqləşdirilmişdir. Buna görə burada həmin nəşrdən istifadə edirik.

[170] *İzzədin Şirvani* – XII əsr Azərbaycan şairi.

[171] *A. Şirvan şüərası.* Son tədqiqatda Xaqaninin təvəllüd tarixi 1120-ci il, vəfatı tarixi 1199-cu il göstərilir. *M.S.Sultanov. Xaqani Şirvani. Bakı, 1954, səh.20, 33; AƏT. I cild, səh.84, 87.*

[172] Tərcüməsi:

Mən əsrin Hüseyniyəm, düşmənlərim isə Yezidim, Şimirimdirlər,
Günlərim aşura, Şirvan isə mənim üçün Kərbəladır.

[173] Tərcüməsi:

Nuhun o qədər də elmi yox idi,
Əgər mənim atam onun yerində olsaydı,
Onun tufanının üstündə
Elm ilə körpü bağlardı.

[174] Xaqaninin hazırcavablığını göstərən bu rəvayətə məzmunca oxşar bir rəvayət də Həbibi haqqında söylənilir. Hər iki rəvayətin məzmunu, demək olar ki, eynidir. *Köprülüzadə Məhəmməd Fuad. "Azəri ədəbiyyatına aid tədqiqilər", Bakı, 1926, səh.37.*

[175] Xaqaninin "Həft iqlim" adlı əsəri olmamışdır. "Həft iqlim" Əmin Əhməd Razinin (?-1593) tərtib etdiyi təzkirədir.

[176] *A, Şirvan şüəarası.* Tərcüməsi:

Ehtiyac karvanının yoldaşlığı ilə Hicaz səhrasına getmiş və yolda "Töhfətül-İraqeyn" nəzmə çəkmişdir. İnsafən, o, nəzm elmlərinin heç birində məşhur ustadlardan əskik deyil. Söz sən'ətində o, xüsusi üslub ixtiraçısı, yüksək mə'nalar və ürəyə yatan ifadələrin sahibidir.

[177] *Əsirəddin Axsikəti* – XII əsr Fərqanə şairi.

[178] Tərcüməsi:

Zamanın dövranını yaradan Allaha and olsun –
Ki, dövr mənim dövrümdür, zaman mənim zamanımdır.
Mə'nalar vəhyində şairlərin peyğəmbəri mənəm,
Çünki bu gün söz mö'cüzəsi mənim ifadəmdədir.

[179] M: 1196

[180] Parça şairin "Töhfətül-İraqeyn" əsərindəndir.
Tərcüməsi:

Ey oruc tutanların ağzının möhürü,
Bahar xəstəliklərinin can dərmanı,
Sənin qorxundan yaşıl niqabda
Yüz min gözəl gizlənmişdir.
Sənin mərhəmətindən iki beşikdə
İki hindu südəmər uşaq var.
Rumluların üzü səndən su alır,
Zəncilərin saçı qıvrımlığını səndən alır,
Rum dibaçəsi, səndən rəng alır,
Zəncilərin güzgüsü səndən pas alır.
Xəzinə açmadan qızıl səpirsən,



Əziyyət çəkmədən qızdırırsan.
Gah ömür doğan bir kövsər,
Gah can yandıran od olursan.
Özün lütlüyü seçdiyin halda
Hər kəsi gördükdə, ona zərbafta verirsən.
Hər ay asimanın peykinə (aya)
Xələt verir və geri alırsan.
Ya əlinin altındakılara xələt vermə,
Ya da öz verdiyini yenidən alma.
Mənim bacama nə üçün meyl eləmirsən,
Mənim bacamda ki, əjdaha yoxdur!
Sən onun bacasını işıqlandırırsan –
Ki, aşağı bacada ruzu tapır.
Müzayiqəsiz yağdırdığın nuru
Öz Xaqanindən əsirgəyirsən.
O kəsin ki, qızıla meyli çoxdur,
Onu qızılın qulu say, qızılı onun Allahı.
Hər kəsin ki, kisəsinə qızıl girdi,
Kisə kimi boğazına kəndir keçir.
Qızıl nədir? Sönmüş od kimidir,
Xəstə, ölü bir torpaq kimidir.
Lə'l hərçənd ki, xoşrəng bir qığılcımdır,
Daşın qəlbində donmuş bir qandır.
Kişi qızıl və lə'l ardınca qaçmaz,
O uşaqlar ki, qırmızı və sarı [rəngləri] sevər.

[181] Tərcüməsi:

Ey sübhdəm, gör səni hara göndərirəm,
Səni vəfa günəşinin yanına göndərirəm.
Bu başı möhürlü məktubumu o mehribana çatdır,
Kimsəyə xəbər vermə ki, səni hara göndərirəm.
Can bir an aram tapmır, keçəridir,
Yoxsa səni nə üçün belə tələsik göndərirəm?!
Xaqaninin ürəyinə gələn bu dərdləri [o nazəninə]
Bir-bir söylə, səni dərman üçün göndərirəm.

* * *

Məndə olan dərdi dərmanı satmaram,
Üstəlik əbədi sağlamlığı da versən, satmaram.
İnsanın cilvələnməsini korlara tapşırmaram,
Ölüqəlblilərə Məryəmin boyunbağısını satmaram.
Ey xacə, mən və sən bazarda nə sataq?
Sən şadlıq satmazsan, mən də qəmimi satmaram.

* * *

Zəmanə dərzisi heç kəsin əyninə
Elə bir köynək tikmədi ki, axırı don olmasın.

[182] Son tədqiqatda Fələki Şirvaninin təvəllüd tarixi 1108, vəfatı tarixi 1146-cı ildir. *AƏT, I cild, səh.69.*

[183] *"Təzkirətüş-şüəra"* – məşhur ədəbiyyatşünas Əmir Dövlətşah ibn Əlaüddövlə Bəxtişah qazi Səmərqəndinin təzkirəsi H.892-ci (M.1487) ildə fars dilində yazılmış bu əsər "Təzkireyi-Dövlətşahi" adı ilə məşhurdur.

[184] Orta əsrlər inzibati bölgüsündə "Azərbaycan" məfhumu altında indiki İran Azərbaycanı nəzərdə tutulurdu. Azərbaycanın cənub hissəsinə Aran, Naxçıvan, həmçinin İranın qərb vilayətlərindən İsfahan və Rey tabe idi. *AT, I cild, səh.159.*

[185] Azərbaycan atabəyləri dövlətinin banisi Şəmsəddin Eldəniz (1136-1175) nəzərdə tutulur.

[186] Sultan III Toğrul Şəmsəddin Eldənizin oğulluğu olmuşdur. Böyük Səlcuq hökmdarı Sultan II Toğrul (1132-1135) vəfat etdikdən sonra onun arvadı Mö'minə xatun Şəmsəddin Eldənizə ərə getmiş və Şəmsəddin Eldəniz Sultan III Toğrula atalıq etmişdir. *З.М.Буниятов. Государство Атабеков Азербайджана. Баку, 1978.*

[187] Sultan Məhəmməd Xudabəndə 1578-1587-ci illərdə Azərbaycan hökmdarı olmuşdur. *AT, I cild, səh.423.*

[188] Gİ: Katibi Turşizi. Ehtimal ki, F.Köçərli əlyazmasında "m" hərfini "ş" kimi oxumuşdur.

[189] Əsərin adı "Təlxisül-asar və əcayibül-məlikül-qəhhar"dır. Orta əsrlər Azərbaycan aliminin bu əsəri Paris milli kitabxanasında saxlanılan əlyazmasından (XVII əsrə aiddir) rus dilinə tərcümə olunaraq 1971-ci ildə "Nauka" nəşriyyatında çap edilmişdir. Kitaba əsərin faksimelisi də əlavə olunmuşdur. *Абд ар-Рашид ал-Бакуви. Сокрашение [книги о] "памятниках" и чудесах царя могучего, М., 1971, 336 səh.*

[190] *Xristian Daniloviç Fren (1789-1851)* – məşhur alman şərqşünası. 44 il Rusiyada yaşamış və rus şərqşünaslığının inkişafında böyük xidmətləri olmuşdur. "Ибн Фоцлан [Фадлан] и другие арабские источники о русах древних времен" əsərini 1823-cü ildə Peterburqda çap etdirmişdir. *Библиографический словарь отечесетвенных тюркологов (до октябрский период) М., 1974. səh.279-281.*

[191] M: 1500.

[192] *Mirzə Məhəmməd xani-dövvüm* – XVIII əsrin ikinci yarısında Azərbaycanın böyük feodallarından biri olan Bakı xanı, Abbasqulu ağa Bakıxanovun atası.

[193] *Şeyx Bəhaəddin [Məhəmməd Bəhaəddin Amili] (?-1620)* – I Şah Abbasın (1578-1629) zamanında yaşamış şiə ruhanilərindən olub "Bəhai" təxəllüsü ilə dini şeirlər və "Caməyi Abbasi", "Hədisi ərbəin", "Nanü halva", "Həblül mətin", "Xülasətül-hesab", "Kəşkül", "Səmədiyyə" və s. əsərlər yazmışdır.

[194] *Fətəli xan* – 1758-1789-cu illərdə Quba xanı.

[195] *Arçıblaq* – Arxipelaq. Egey dənizindəki adalara işarədir.

[196] *Gİ, səh.204-226.*

[197] Son tədqiqatda Məstəli Şirvaninin 1837-ci ildə vəfat etdiyi göstərilir. *AT, II cild, səh.941.*

[198] *Gİ, səh.226.*



[199] *Pənahəli xan* – XVIII əsr 40-cı illərin sonu – 1759-cu illərdə Qarabağ xanı

[200] Son tədqiqatda Şuşa şəhərinin salınma tarixi 1750-ci illərin əvvəli göstərilir. *Ə.B.Şükürzadə. Əhməd bəy Cavanşirin "Qarabağ xanlığının tarixi" (Bakı, 1961) əsərinə qeydlər, səh.50.*

[201] *Mirzə Camal (1773-1853)* – 1797-1822-ci illərdə Qarabağ xanlığında əvvəlcə İbrahim xanın, sonra isə Mehdiqulu xanın veziri. Ərəb, fars, ləzgi, avar dillərini yaxşı bilirmiş. "Tarixi-Qarabağ" əsərini yazmışdır. 1855-ci ildə onu A.Berje rus dilinə tərcümə edib "Кавказ" qəzetində (1855, №61) çap etdirmişdir. Həmin əsər 1959-cu ildə Azərbaycan dilində nəşr olunmuşdur (tərcüməçi: A.Babayev).

Mirzə Cəmal həmin mövzuda Azərbaycan dilində də əsər yazmışdır. Lakin onun orijinalı əldə edilməmişdir. Həmin əsərin RƏF-də M.M.Xəzani tərəfindən üzü köçürülərək şərh edilmiş iki nüsxəsi saxlanılır: M.M.Xəzani. Qarabağ tarixi, H.1294, M-191; Asarül-Cəmal, H.1296, B-3336.

F.Köçərli Qarabağ tarixinə və M.P.Vaqifin tərcümeyi-halına dair mə'lumatın mühüm hissəsini M.M. Xəzaninin "Asarül-Cəmal" əlyazmasından götürülmüşdür. Əsərdən istifadə edən F.Köçərli onun orijinal yaxud surət olmasının fərqinə varmamışdır. *Mirzə Cəmal Cavanşir Qarabaği, Qarabağ tarixi, Bakı, 1959; Araz Dadaşzadə. Molla Pənah Vaqif (həyat və yaradıcılığı), Bakı, 1966, səh.26-27; Əli Hüseynzadə. XIX əsrin ikinci yarısında Azərbaycan tarixşünaslığı, Bakı, 1967, səh.31-32; 113-118.*

[202] M: 1747.

[203] M: 1748.

[204] Qarabağ və Şəki xanlıqları Rusiya ilə 1805-ci ildə birləşmiş və bu haqda müqavilənamələr həmən il mayın 14-də (Qarabağ – Rusiya) və 21-də (Şəki – Rusiya) imzalanmışdır. AT, II cild, səh.12.

[205] *Xurşidbanu Natəvan (1830-1897)* – məşhur Azərbaycan şairəsi. Qarabağ xanlarından İbrahim Cavanşirin nəvəsi, Mehdiqulu xanın qızı. "Məclisi-üns" ədəbi cəmiyyətinin başçısı olmuşdur.

[206] M: 1897.

[207] M: 1900.

[208] İran şəhəridir. Böyük fars-tacik şairləri Sə'di Şirazi və Hafiz Şirazi bu şəhərdə doğulmuşlar.

[209] *Aşıq Əli Kəlibəri* – XVIII əsr Azərbaycan şairi.

[210] Qazax rayonunda üç Salahlı kəndi vardır: Daşsalahlı, Ortasalahlı və Qıraqsalahlı. M.P.Vaqif 1717-ci ildə Qıraqsalahlı kəndində anadan olmuşdur. *AƏT, I cild, səh.552; Araz Dadaşzadə. Göst. əsəri, səh.43.*

[211] Qarabağ hakimi İbrahim xan Vaqiflə birlikdə Tiflisə 1784-cü ildə səfər etmişdir. *Araz Dadaşzadə. Göst. əsəri, səh.64.*

[212] F.Köçərli M.P.Vaqifin əsərlərindən gətirdiyi misalların əksərini MV-dən götürmüşdür.

[213] *BM, səh.20-21.*

[214] *Qala* – Şuşa şəhərinə el arasında verilmiş ad.

[215] *Ахмед бек Джаваншир. О политическом существовании Карабахского ханства с 1747 по 1805 год. "Кавказ", 1884, №№139, 150, 154, 161, 167.*

**Müəllif əsərini 1901-ci ildə Şuşada kitab halında çap etdirmişdir. Kitabın ikinci nəşri (azərbaycanca), Bakı, 1961.**

[216] *Əhməd bəy Cavanşir (1828-1903)* – şair, tarixnəvis, mütərcim. F.Köçərli burada olduğu kimi, Həmidə xanım Dəvatın (Əhməd bəy Cavanşirin qızı, C.Məmmədquluzadənin arvadı) çap etdirdiyi "Asari-Əhməd bəy" (Tiflis, 1906) kitabına yazdığı müqəddimədə də Əhməd bəy Cavanşirin haqqında müfəssəl mə'lumat verəcəyini və'd elməişsə də, kitabda onun haqqında heç bir mə'lumata rast gəlmirik. Lakin əsərin II cildindəki "Mirzə Kazım Müttələ" oçerkindən göründüyü kimi (HN, II cild, səh. 220-226) əsərdə Əhməd bəy Cavanşir haqqında da oçerk olmuşdur. Ehtimal ki, həmin oçerk əsərin üçüncü cildində imiş ki, o da göstərildiyi kimi, hələlik əldə edilməmişdir.

[217] Tərcüməsi:

Fələyin mancanağından fitnə daşı yağır,
Sən əbləhcəsinə Şişə içərisində qərar tutmusan.

[218] S.Mümtazın arxivində olan bir qeydə əsasən müəyyənləşdirilmişdir ki, bu beyt Vaqifin deyil, fars şairi Dərginindir. *Araz Dadaşzadə. Göst. əsəri. səh.68.*

*Tərcüməsi:*

Əgər məni qoruyan mənim bildiyimdirsə,
O, şüşəni daşın ağuşuna qoruyar.

[219] AC, vərəq 65-71.

[220] Tərcüməsi: Canından əl çəkən adam ürəyində nə varsa, deyər.

[221] Fars atalar sözüdür. Hərfi tərcüməsi:

Cecə hamilədir, görək gündüz nə doğacaq.

[222] *Molla Vəli Vidadi (1709-1808)* – məşhur Azərbaycan şairi.

[223] *AC, vərəq 33-35.*

[224] *AC, vərəq 35.*

[225] Son tədqiqatda da M.P.Vaqifin oğlu Əliağa ilə birlikdə öldürüldüyü göstərilir. *AƏT, I cild, səh.557; Araz Dadaşzadə. Göst. əsəri, səh.53.*

[226] M.P.Vaqifin qəbri səliqəyə salınmış və üzərində şairin tunc büstü qoyulmuşdur.

[227] *Mirzə Yusif Qarabaği (1794-1864 )* – XIX əsr tarixçisi və şairi.

[228] *Mirzəcan bəy Mədədov* – XIX əsr şairi.

[229] Kitab "Məcmueyi-divani Vaqif və digər müasirin" adı altında çap olunmuşdur və onda Vaqiflə yanaşı Vidadi, Aşıq Pəri, Aciz, Sabit Şəqaqi və başqalarının da əsərləri çap olunmuşdur.

[230] *Adolf Berje (1828-1886)* – məşhur alman şərqşünası, Azərbaycan ədəbiyyatının ilk tədqiqatçılarından biri.

[231] Kitab "Qafqazda və Azərbaycanda məşhur olan şüəranın əş'arına məcmuədir" adı ilə çap olunmuşdur.

[232] Kitab "Qafqaz şüərasının məşhuru Molla Pənah Vaqifin ələ düşən əş'arına məcmuə" adı ilə çap olunmuşdur.

[233] F.Köçərlidən sonrakı tədqiqatda bu şe'rin Vaqifə deyil, Ağqız oğlu Piriyə aid olduğu aşkar edilmişdir. Onun mətni F.Köçərlidə 9, M.Y.Qarabaği və A.Berjedə 13



bənddən ibarət olduğu halda, S.Mümtazda 42 bənddir. *MV; BM, səh.24-28; S.Mümtaz, Vaqif, Bakı, 1925, səh.111-117.*

[234] Bu bənd şairin "Əsərləri"nin son nəşrlərində (Bakı, 1957, 1960, 1968. Tərtib edəni: H.Araslı) aşağıdakı şəkildədir:

Qıvrılır könlüm tüfəngdən dəm vuranda mar tək,
Od çıxar ağzımdan ol çaxmaği-atəşbar tək,
Gülleyi-əşki atar çeşmim şərarı nar tək,
Müşki barut ətrilə həm türreyi-tərrər tək,
Etmədi dimağimi mütləq müəttər bir tüfəng.

[235] *A.S.Puşkin (1799-1837)* – böyük rus şairi.

[236] *Məhəmmədqasım ağa* – Qarabağ hakimi İbrahim xanın oğlu.

[237] *Əbülfət xan Tuti (?-1839)* – İbrahim xanın oğlu.

[238] Bu bənd şairin əsərlərinin son nəşrlərinə düşməmişdir.

[239] Şairin əsərlərinin son nəşrlərində 20-yə yaxın qəzəli toplanılmışdır.

[240] Vaqif bu şe'ri Vidadinin:

Deyibsiz yə'ni gəlləm, gəldi bir xəbər, Vaqif,
Xilaf idi bu sözlər, ya peşimandır məgər Vaqif?

– mətləli qəzəlinə cavab olaraq yazmışdır.

[241] Fars-tacik şairi Sə'di Şirazi nəzərdə tutulur.

[242] Tərcüməsi:

Yar odur ki, yarın cəfasına dözsün,
Yarın təmənnası xatirinə öz təmənnasından əl çəksin.
Əgər həqiqi aşiqin bədəninə qılınc çalsalar, belə
O, öz xətasını görər, yarın xətasını görməz.
Yar ancaq zövq almaq üçün deyil,
Biz öz nəfsimizi yardan ötrü öldürdük.
Mən dostun astanasından başqa bir yol tanımıram,
Mən yar ayağının qoyduğu yerdən başqa yerə başımı qoymaram.

[243] *Ağa Hüseyn Arif (?-1805)* – Azərbaycan şairi.

[244] Son tədqiqatda Vidadinin şəmkirli olduğu və 1707-ci ildə Şəmkirdə doğulduğu göstərilir. *HA, səh.255; AƏT, I cild, səh.540.*

[245] Əhməd bəy Cavanşir. Göst. əsəri.

[246] *Mirmöhsün ağa Ağamirzadə Nəvvab (1831-1918)* – Azərbaycan şair, təzkirənəvis və musiqişünası, Qarabağda təşkil olunmuş "Məclisi-xamuşan" ədəbi məclisinin başçısı.

[247] *TN, səh.17-18.* M.P.Vaqifin 250 illik yubileyi zamanı (1969) tarix elmləri namizədi Ə.Şükürzadə "Molla Vəli ya Mirzə Vəli" sərlövhəli məqaləsində ("Azərbaycan" jurn., 1969, №4) bu vaxta qədər guya Mirzə Vəli Vidadinin Molla Vəli Vidadi ilə qarışdırıldığını sübut və M.Nəvvabın fikrini təsdiq etməyə çalışmışdır. Filoloji elmləri

namizədi Ş.Cəmşidov eyni adlı məqaləsində ("Azərbaycan" jurn., 1970, №1) həmin fikrin yanlış olduğunu göstərir.

[248] Son tədqiqata görə Vidadinin vəfatı tarixi 1808-ci ildir. *AƏT, I cild, səh.542.*

[249] *İza caəl-qəza ə'məl bəsər* – Qəza gələndə göz kor olar. Atalar sözünün təkrarı olan bir hədis.

[250] Yə'ni H.1280 (M.1780).

[251] Müsəddəsin bu axırıncı bəndi şairin "Əsərləri"nin son nəşrlərinə (Bakı, 1957, 1968) düşməmişdir.

[252] *Fəlyəzhəku...* – gərək gülsünlər... Qur'anın "Tövbə" surəsinin *...Fəlyəzhəku qəlilən vəlyəbkü kəsirən...* (gərək az gülsünlər, amma çox ağlasınlar ki, onların əməlləri mükafatlandırılsın.) ayəsindəndir.

[253] F.Köçərlinin qəzəllər sırasına daxil elədiyi bu şeir şairin əsərlərinin göstərilən nəşrlərində qoşmalar cərgəsində verilmişdir.

[254] *Məşədi Əyyub Baki (1866-1909)* – "Məclisi-fəramuşan" ədəbi məclisinin fəal üzvlərindən biri. RƏF-də şairin avtoqraf divanı saxlanılır (şifri: B-5615).

[255] Əbcəd hesabilə 47 rəqəmi م (m) və ز (z) hərflərindən ibarətdir. زمستان (zimistan) sözündən bu iki hərf düşəndə ستان (stan) qalır. "Fürsət gülə düşdü" – "gül" "stan" ilə birləşib "gülüstan" əmələ gətirdi.

[256] Son tədqiqatda Fətəli xanın 1758- 1789-cu illərdə xanlıq etdiyi göstərilir. *AT, I cild, səh.340.*

[257] M: 1758.

[258] M: 1767.

[259] *MƏAD, səh.126.* Tərcüməsi:

> Fələyin səhifələrinə parlaq xətlə yazıldı,
> Dünyaya Fətəlinin bayrağı qanad açdı.

Son tədqiqata görə Fətəli xan nə şair olmuş, nə də "Müştəri" təxəllüsü ilə şeir yazmışdır. Mirzə Həsən Əlqədari bu beytə əsaslanaraq Fətəli xanın şair olduğunu söyləmişdir, əslində isə həmin beyt Fətəli xanın sarayındakı şairlərdən birinə məxsusdur.

Mətndəki qəzəl də Fətəli xanın deyil. Qəzəlin son beytindəki "müştəri" kəlməsi hərfi mə'nasında işlənmişdir. Şairin təxəllüsü "Hali"dir. Əsil adı Fətəli bəydir. Gəncədə Ziyadoğlular nəslindən olan Fətəli bəy Ziyad oğlu Halinin RƏF-də saxlanılan B-2504 şifrəli divanında həmin qəzəl vardır.

"Asari-Dağıstan"dan istifadə edən F.Köçərli də Mirzə Həsən Əlqədarinin səhvlərini öz əsərində təkrar etmişdir. *Ənvər Şükürzadə. Fətəli xan şair deyildi, "Azərbaycan" jurn., 1974, №11.*

[260] *MƏAD, səh.126-127.*

[261] M: 1839.

[262] Ehtimal ki, F.Köçərli Ə.Tutinin şeirləri üçün RA-dan (səh.6-7) istifadə etmişdir.

[263] Tərcüməsi:

> **Sənin camalının əksini yuxuda gördüyüm gecədən**
> **Dünyada hər kimə ki, bağlı idim, ondan əlaqəni kəsdim.**



> Sənin üzünə and içdim ki, əgər behişt hurilərinin sorağını –
> Versələr də, səndən başqa yar axtarmayım.
> Hələ sənin vüsal şərabından piyalə başıma çəkməmiş
> Hicran saqisinin əlindən nə zəhərlər daddım!
> Yaşamaq ümidində idim, amma sənin qılıncının suyunu içdim,
> Vüsalının arzusunda idim, amma ayrılığını seçdim.
> Rəqib onu məndən incitmişdir, mən də onu rəqibdən,
> Əfsus ki, o, muradına çatdı, mən isə çatmadım.
> Mən dostdan başqasına ürək bağlamadığım təqsirilə
> Bir günahsızı öldürsünlər heç yerdə görmədim və eşitmədim...
> Sənin dodağını çox vəsf eləmişlər, amma bir kəsi
> Bu rəmzlərdə Tuti kimi söz hərifi görmədim.

[264] Gürcüstan Dövlət muzeyində Qövsinin naqis əlyazma divanı saxlanılır. Ehtimal ki, F.Köçərli bu əlyazmasından istifadə etmişdir. *M.Seyidov, Qövsi Təbrizi, Bakı, 1963, səh.22.*

[265] *Əlican Qövsi Təbrizi (XVII əsr)* – Təbrizdə anadan olmuş, ilk təhsilini burada aldıqdan sonra İsfahana getmişdir. Təvəllüd və vəfatı tarixləri hələlik dəqiq mə'lum deyil. *S.Mümtaz. "Qövsi", Bakı, 1925; İsmayıl Hikmət. "Azərbaycan ədəbiyyatı tarixi", Bakı, 1928; HA, səh.131-169; M.Seyidov. Göst. əsəri; AƏT, I cild, səh.506-516.*

[266] M: 1591.

[267] Tərcüməsi:

> Sənin olduğun yerdə heç kəs yoxdur.
> Məndən ora kim xəbər apara bilər?

[268]

> Təbriz açar könlümü, Qövsi, gər açılsa,
> Hərçənd ki, Firdovs Sifahanə yetişməz.

– beytindəki "Sifahan" İsfahan şəhərinə işarədir. Doğrudan da şair bu beytləri qürbətdə – İsfahanda olduğu zaman yazmışdır.

[269] M: 1766-1776.

[270] F.Köçərli XVIII əsrdə yaşamış Uğurlu xan ilə Qövsinin müasiri Uğurlu xan Ziyad oğlu Müsahibi səhv saldığından Qövsini M.P.Vaqifin müasiri hesab etmişdir. Halbuki o özü bir az əvvəl (HN, I cild) "Gülüstani-İrəm"dən istifadə edərək Uğurlu xan Ziyadoğlu Müsahib haqqında düzgün mə'lumat vermişdir.

[271] Son tədqiqatda Ağaməsih Şirvaninin XVIII əsrin əvvəlində Şamaxı şəhəri yaxınlığındakı Dədəgünəş kəndində anadan olduğu müəyyən edilmişsə də, onun təvəllüd və vəfatı tarixləri hələ dəqiq mə'lum deyildir. *HA, səh.245-254.*

[272] *Sultan Məcid Qənizadə (1866-1937)* – görkəmli Azərbaycan yazıçısı və maarif xadimi.

[273] MV.

[274] MV.

[275] *QM, səh.495.*

[276] *QM, səh.489-491.*

[277] Son tədqiqatda Nişat Şirvaninin XVIII əsrin əvvəllərində Şamaxıda doğulması göstərilirsə də, təvəllüd və vəfatı tarixləri hələlik dəqiq müəyyənləşdirilməmişdir. *S.Mümtaz. Nişat Şirvani, Bakı, 1925; HA, səh.185-188.*

[278] *QM, səh.418.*

[279] *QM, səh.419-420.*

[280] *QM, səh.420.*

[281] *QM, səh.418-419.*

[282] *QM, səh.329.*

[283] Tərcüməsi:

> Bacardığın qədər heç kəsin yanında sirr açma,
> Amandır, bu qapını heç kəsə açma!
> Əgər sirrlərin ürəyində gizlənərsə,
> O muradın tezliklə hasil olar.
> Peyğəmbər demişdir: hər kim ki, sirri gizlətsə,
> Tezliklə öz muradına çatar.
> Toxum torpaqda gizlənərsə,
> Bostan bitkilərinin başı olar.
> Qızıl və gümüş əgər üstüörtülü olmasaydılar,
> Onlar mədəndə nə vaxt pərvəriş tapardılar?!

[284] *RA, səh.35.*

[285] M: 1805.

[286] Nə F.Köçərlinin istifadə etdiyi H.Qaibovun "Məcmuə"sində, nə də "Azərbaycanda məşhur olan şüəranın əş'arına məcmuə" adlı dördcildlik əsərində Ağahüseyn Arif adlı şairə rast gəlmədik. Ehtimal ki, F.Köçərli Ağahüseyn Arifin şeirlərini "Riyazül-aşiqin"dən götürmüşdür. Həmin təzkirədə Ağahüseyn Arifdən üç şeir verilmişdir ki, F.Köçərlinin verdiyi şeirlərin eynidir. *RA, səh.35-37.*

[287] M: 1856.

[288] Tərcüməsi:

> O vaxtlar ki, bizim damağımız çağ idi,
> Hicrətdən altı yüz əlli altı il keçmişdi.
> Muradımız nəsihət demək idi, dedik,
> Allaha tapşırıb getdik.

[289] Tərcüməsi:

> Nə bir daha Sə'di gələr və nə də həmin dövran.

[290] *Seyid Nigari (1815-1885)* – XIX əsr Azərbaycan şairi. XIX əsrin ortalarında Qazax və Qarabağ tərəflərə yayılmış dini-siyasi təriqətin təşkilatçısı; *Mîrzə Məhəmmədtağı Qümri (1819-1891)* – XIX əsr Azərbaycan mərsiyə ədəbiyyatının nümayəndəsi.



[291] Tərcüməsi:

Təbriz səltənətində şanlı-şövkətli izzətli Ağa Mirzə Məhəmmədin karxanasında alicənab Mirzə Rza oğlu Məşhədi Məhəmmədin buyruğu ilə əsli mərhum İbn Mirzə Məhəmmədəli ibn Mîrzə Cəfər Xorasaninin – Məşhədin müqəddəs, nurlu, həyatində yerləşən abad olmuş, şöhrətli məktəbin banisinin (onlara min-min dəfə salavat və şadlıq olsun) nəslindən olan Xorasanda doğulmuş milanlı kiçik, fəqir Yusifül-Ələvi Əlmusəvi Təbrizinin xəttatlığı ilə cümə günü 1273-cü il məhərrəm ayının 2-də tamamlandı.

[292] M.Tərbiyətin "Danişməndani-Azərbaycan" əsərində (Tehran, 1936, səh.250) "Aciz" təxəllüslü iki şairin adı çəkilir: Xəlifə Məhəmməd Sərablı Aciz və Hacı Mîrzə Yusif Aciz. Birincinin Sərabda, ikincinin isə Mərənddə doğulduqları göstərilirsə də, onların təvəllüd tarixləri və hansı dildə yazdıqları haqda əsərdə heç bir mə'lumata rast gəlmirik.

Akad. F.Qasımzadə. Acizin adının Məhəmməd Xəlifə olduğunu göstərir. *FQ, səh.79.*

[293] *Kəyumərs, Cəmşid, İskəndər, Dara, Firidun, İrəc, Mənuçehr, Qubad* – Firdovsinin "Şahnamə" əsərinin qəhrəmanları.

[294] *Mir İmad Həsəni (?-1615)* – Şah Abbas dövründə yaşamış məşhur xəttat.

[295] *AD, səh.10-11.*

[296] *AD, səh.83.*

[297] *AD, səh.35.*

[298] *AD, səh.35-36.*

[299] *AD, səh.15.*

[300] *AD, səh.76-77. Son beytdəki "kəman" divanda: sinan.*

[301] *Rüstəm, Əfrasiyab, İsfəndiyar, Kudərz, Fəramərz, Bijən* – Firdovsi "Şahnamə"sinin qəhrəmanları.

[302] *AD, səh.83-84.*

[303] *AD, səh.81.*

[304] *AD, səh.82.*

[305] *AD, səh.82-83.*

[306] *AD, səh.6-7.* Son beytdəki: *Faruq* – xəlifə Ömərin ləqəbi; *Bubəkri-Siddiq* – xəlifə Əbubəkr Siddiqə işarədir.

[307] *AD, səh.9*

[308] *AD, səh.9-10.*

[309] *AD, səh.96.*

[310] *AD, səh.76.*

[311] *AD, səh.78.*

[312] *AD, səh.78.*

[313] *AD, səh.70.*

[314] *AD, səh.60-61.*

[315] *AD, səh.69.*

[316] *AD, səh. 78-79.*

[317] *AD, səh.38-39.*

318 Tərcüməsi:

Sənə yaxın olanın cavan bəxti var,
O qocalmaz, çünki uca behiştdədir.

319 Bu fikir mübahisəlidir.

320 F.Köçərlidən sonrakı tədqiqat göstərir ki, Sabit Şəqaqi İran Azərbaycanında Marağanın yaxınlığındakı Şəqaq kəndindəndir. Şair Mehdi bəy Şəqaqinin bacısı oğludur. 1799-cu ildə gənc yaşlarında vəfat etmişdir. 1000 beytə yaxın əsəri qılmışdır. *FQ, səh.78; Mahmud Mirzə Qacar. Səfinətül-Mahmud, Təbriz, H.1346, səh.672-673.*

M.Y.Qarabağinin əsərində Mehdi bəy Şəqaqinin adı altında bir qoşma və bir qəzəl verilmişdir. Qoşmanın son bəndində "Mehdi", qəzəlin başlanğıcında isə "Sabit" təxəllüsü işlənmişdir. Bu əsərdən istifadə edən F.Köçərli belə ehtimal etmişdir ki, "Mehdi" şairin adı olmuş, o, həm "Sabit", həm də "Mehdi" təxəllüsləri ilə yazmışdır. Halbuki yuxarıda göstərildiyi kimi, bunlar ayrı-ayrı şəxslər olmuşlar.

Akad. F.Qasımzadə bu məsələdə bir qədər dolaşıqlığa yol vermişdir: "F.Köçərli Qarabağinin kitabından Sabit Şəqaqinin adına olan qəzəli "Azərbaycan ədəbiyyatı tarixi materialları" əsərinə köçürmüş və onu Mehdi bəy Şəqaqiyə aid etmişdir" (FQ, səh.78). Halbuki F.Köçərlinin əsəri belə bir nəticəyə gəlmək üçün əsas vermir.

321 Tədqiqat əsərlərindən birində Rafeinin Şəki xanı Hüseyn xan Müştağın sarayında yaşadığı, başqa birində isə onun kəlibərli olduğu göstərilir. *S.Mümtaz. Məhəmməd Hüseyn xan Müştaq, Bakı, 1925, səh.17; H.Araslının M.P.Vaqifin "Əsərləri"nə yazdığı qeydlər, Bakı, 1968, səh.261.*

322 MV.

323 Tərcüməsi:

İstiot dənəsi də qaradır, ayüzlülərin xalı da,
Hər ikisi ürək yandırır, amma bu hara, o hara?

324 *Акты, собраные Кавказской Археографической Комиссии. Архив Главного Управления наместника Кавказа, тт. I-XII. Под. редакцией А.Берже, Тифлис, 1866-1904.*

325 M: 1774.

326 Bu misrada söz düşüb.

327 M: 1828.

328 *M.Y.Lermontov (1814-1841)* – böyük rus şairi.

329 Qubalı Ağabəy və Mirzə Babanın şəxsiyyətləri haqqında hələlik əldə heç bir mə'lumat yoxdur.

330 Tərcüməsi:

Şərarət vadisində oğruların ayağını kəsdi,
Ədalət qılıncından daim qan damar.

331 Tərcüməsi:

Nəhs, yolkəsən oğruların çoxluğundan
Bəzən ölünün kəfəni də oğurlanırdı.



332 *Ənvəri (?-1209)* – fars şairi.

333 *Rəxş* – "Şahnamə" qəhrəmanı Rüstəmin atının adı.

334 *Övc ibn Ənuq* – əfsanəvi surət. Əfsanəyə görə, guya o, dünyada ən nəhəng adam olmuşdur; ən dərin dənizlər belə onun topuğunda qalırmış.

335 *...küllü şe'yin halikün illa vəchəhü* – ...zatından başqa hər şey yox olur. Qur'anda "Qəsəs" surəsinin ayəsidir. Mə'nası: Allahdan başqa hər şey yox olur, məhv olur.

336 *Qarun* – eramızdan əvvəl yaşamış çox varlı və eyni zamanda çox xəsis və qəddar hökmdar. Rəvayətə görə Musa peyğəmbərin qarğışı nəticəsində öz dövləti ilə birlikdə yerə batmışdır.

337 M: 1841.

338 Əbcəd hesabı ilə "nov axərət" ifadəsindən hicri 1257-ci (M.1841) il alınır.

339 Əbcəd hesabı ilə deyilmiş bu maddeyi-tarix. H.1253-cü (M.1873) ilə mütabiqdir.

340 *Əbülvəlid Həssan ibn Sabit (?-674)* – məşhur ərəb şairi.

341 Tərcüməsi:

Şeir qoşan Salik qəvvas olarsa,
Qəzəl dənizindən gövhərlər çıxarar.

342 Son tədqiqatda "Quba"nın "qaya" mə'nasında olan "Quva" sözündəki "v"nin "b"yə çevrilməsi nəticəsində əmələ gəldiyi göstərilir. *А.Гусейнзаде. Об этимологии топонима Куба, "Советская тюркология" журн., 1971, №2, səh.125.*

343 M: 1847.

344 Tərcüməsi: Allah ona çox-çox rəhmət eləsin.

345 Son tədqiqatda A.Bakıxanovun Qafqazın baş hakimi general A.P.Yermolov tərəfindən Tiflisə də'vət olunub onun idarəsində Şərq dilləri mütərcimi vəzifəsinə düzəlməsi tarixi 1819-cu ilin dekabr ayı göstərilir. *F.Qasımzadə. A.Bakıxanov, Bakı, 1956, səh.22; AƏT, II cild, səh.66.*

346 *İvan Fyodoroviç Paskeviç (1782-1856)* – 1827-1856-cı illərdə Qafqazın baş hakimi.

347 *Gİ, səh.221-222.*

348 *Lacəbrə və latəfviz bəlhiyə beynəl-əmreyni* – nə cəbrdir, nə təfviz, bəlkə bu iki şeyin arasındadır. Bu, bir hədisdir. İslam dininin təriqətlər və cərəyanlarından olan cəbriməzhəblər elə hesab edirdilər ki, insanlar öz ixtiyarında deyil, istər xeyir və istər şərr işləri onlara Allah elətdirir. Ona görə də onlar şərr işlərdə özlərini deyil, Allahı müqəssir bilirlər. "Təfviz" isə bir növ bunun əksinədir.

F.Köçərliyə görə, A.Bakıxanovun əqidəsi bu məzhəblərin heç birindən olmayıb, onların ortasında orta bir yer tutmuşdur.

349 Tərcüməsi:

Hər kəs əməli özündən görməsə mö'min deyil,
Öz meylini haqqa tərəf salmayan kafirdir.
Dünyada qüvvəsiz hərəkət olmadığından
Əməl də bizim ixtiyarımızdadır, həm də dəyişilməzdir.
Ey Qüdsi, dostdan hər nə yetişsə, xoşdur,
Hər fəsadın arxasında yaxşılıq durur.

[350] Bu əsərdə təkcə Dağıstan deyil, Azərbaycan və xüsusilə Şirvan tarixinə aid mə'lumatlar da vardır.

[351] 1843-cü ildə A.Bakıxanov "Gülüstani-İrəm"i "История восточной части Кавказа" adı ilə rus dilinə tərcümə edir. 1844-cü ilin may ayında Tiflisə gəlib əsərin əlyazmasını general Neydqarta təqdim edir və onu çap etdirmək arzusunda olduğunu bildirir. General Neydqart əsəri 1844-cü ilin 25 avqustunda (3 sentyabr) Peterburqda hərbi nazir knyaz A.İ.Çernışova göndərir. 1845-ci ilin 8 (20) martında Çernışov A.Bakıxanovun əsəri haqda çar I Nikolaya mə'lumat verir. I Nikolay A.Bakıxanovu 800 gümüş manat məbləğində brilyant üzüklə mükafatlandırır və əsər rə'y yazılmaq üçün Elmlər Akademiyasına göndərilir Həmin gün Çernışov əsəri xalq maarif naziri Uvarova verir və imperatorun kabinetindən brilyant üzüyü alıb Tiflisə general Voronsovo Bakıxanova çatdırmaq üçün göndərir. Voronsov Çernışova 2 (14) may tarixli mə'lumatında brilyant üzüyü A.Bakıxanova çatdırıldığına xəbər verir. 1845-ci il martın 21-də (2 apreldə) EA-nın tarix-filologiya şö'bəsinin iclasında əsər akademiklər M.Brosse və B.Dorna təqdim edilir. Onlar "Gülüstani-İrəm"ə müsbət qiymət verirlər. 1845-ci ilin iyulunda (16 iyul) Çernışov əsəri Brosse və Dornun rə'yi ilə birlikdə Voronsova göndərib onun çapı barədə rə'yini və nəşr üçün nə qədər məbləğ lazım olduğunu bildirməyi xahiş edir. Voronsov Bakıxanovun əsərini nəşr etməyin böyük əhəmiyyəti olduğunu yazır. Başqa bir məktubunda Voronsov Çernışova yazır ki, A.Bakıxanov onun yanına gəlmiş və əsərin dövlət hesabına çap olunub özünün isə 3 min gümüş manatla mükafatlandırılması fikrində olduğunu bildirmişdir. 1845-ci il dekabrın 26-da (7 yanvar 1846) Çernışov Bakıxanovun fikrini I Nikolaya çatdırır və akademik Brosse və Dornun "Bakıxanovun əsəri Avropa tənqidinə davam gətirə bilməz" qeydini əsas tutaraq qərara gəlir ki, əsər dövlət hesabına nəşr olunmasın, amma müəllifə əsəri öz hesabına, çap etdirməyə icazə verilsin. Çar buna razı olur və beləliklə, əsər çap olunmur. *Э.М.Ахмедов. А.К.Бакыханов и его миропонимание (doktorluq dissertasiya, ADU kitabxanası. şifr: 1754), Bakı, 1966, səh.201-207.*

[352] M.Aslanov "Nəsihət"lər haqqında həqiqət" adlə məqaləsində ("Azərbaycan" jurn., 1971, № 2) sübuta yetirir ki, A.Bakıxanov "Nəsayih" əsərini (F.Köçərlidə: "Kitabi-nəsihət"; "Nəsihətnamə") farsca yazmış və o, 1907-ci ildə qubalı Seyid Rza Mirhüseyn tərəfindən azərbaycancaya tərcümə edilmişdir.

M.Hacınskinin Quba şairlərinin tərcümeyi-halı və əsərlərindən nümunələrlə bərabər F.Köçərliyə göndərdiyi azərbaycanca "Nəsihətnamə" həmin Seyid Rza Mirhüseyn oğlunun tərcüməsi imiş. F.Köçərli buradakı nəsihətlərdən 25-nin üslubunda müəyyən dəyişiklik edərək əsərinə salmışdır. Tərcümənin yeganə nüsxəsi RƏF-də (şifr: M-124, inv. 3557) saxlanılır.

[353] *Vəzirov Mirzə Əbülhəsən bəy Zöv'i* – XIX əsrin 60-cı illərində Novoçerkass gimnaziyası Şərq dilləri şö'bəsinin müəllimi.

Əsər 1861-ci ildə Peterburqda Elmlər Akademiyası mətbəəsində "Учебник татарско-азербайджанского наречия" adı altında çap olunmuşdur.

[354] Son illərdə A.Bakıxanovun bədii əsərləri toplanılaraq bir neçə dəfə çap olunmuşdur.

[355] *Mehdi bəy Hacınski (1879-1941)* – Azərbaycan jurnalisti, tənqidçi və teatr xadimi.

[356] A.Bakıxanovun göstərilən müxəmməsi jurnalın 1907-ci il 28-ci nömrəsində dərc olunmuşdur.



[357] *İvan Andreyeviç Krılov (1769-1844)* – böyük rus yazıçısı, jurnalist və tmsilçisi.

[358] İ.A.Krılovun "Eşşək və bülbül"ünü Abdulla Şaiq də tərcümə etmişdir. Ehtimal ki, F.Köçərli burada Abdulla Şaiqin tərcüməsini nəzərdə tutur.

[359] *"İbrahim bəyin səyahətnaməsi"* – İran Azərbaycanının görkəmli ədibi Hacı Zeynalabdin Marağayinin (1838-1910) əsəri. 1911-ci ildə Kərbəlayı Vəli Mikayılov əsəri azərbaycancaya tərcümə edərək (8 hissədən ibarət və hər hissə ayrıca kitab şəklində) Bakıda Orucov qardaşlarının mətbəəsində çap etdirmişdir.

[360] Tərcüməsi:

Ey bəlasına bədənim, canım fəda olan,
Ey Allah, mən qəm, əzab, bəla istəyirəm.
Dəli könlüm çıxmağa can atır,
Məni meyxanəyə tərəf çəkir.
Şövq özü oddur, biz pərvanəyik,
Lakin bircə buraxılışa (buraxılış vərəqəsinə ehtiyacımız var)
Bu yaranmışını təmiz yandır,
Yaralı sinəyə bir məlhəm bağışla.
Şirinin eşqi mənim başıma şur saldı.
Kuhkənin* külüngü yenə göyə qalxdı.
Mən kuhən deyiləm, Vamiq də deyiləm,
Mən nə Şirinə, nə də Ərzaya aşiq deyiləm.
Mən bir Leyliyə aşiqəm ki,
Karvan ondan zınqırov kimi daim şurü fəğandadır.
Onun karvanının dünya adlanan bir dəvəsi var ki,
Hamı onun yükünün altında acizdir.
Ey dünya heyranı və sərgərdanı olan,
Ey canım və bədənimlə qada-bəlasını aldığım,
Ey mə'şuq, aşiq, yar olan,
Ey qazi, Mənsur, dar ağacı olan,
Məgər dəli, ev odlandıran,
Elmdən xəbərsiz ürəyi mənə verdin?!
Öz məhəbbətlərinlə qarışdıraraq
Mənim daxilimə Leylinin məhəbbətini tökdün.
Leylinin eşqi qəlbimdə şələləndi,
Yenə ağıllı fikirlərim dəli oldu.
Tədbir zəncirini qırdım,
Bundan sonra mən zəncir istəmərəm.
Boynumdan bu zənciri aç,
Aparacağın yerə özüm gedərəm.
Ey nişansız, səni harada axtarım?
Sənin məkanın harada olduğunu bilmirəm.
Səni gah Kə'bədə axtarıram, gah kilsədə,
Səni gah öz yanımda tapıram, gah özgə yanında.

* Nizami Gəncəvinin "Xosrov və Şirin" əsərinin qəhrəmanı Fərhadın ləqəbi

Gah ənqa kimi nişansız kaşanədəsən,
Gah da şam kimi evin içində.
Sənin üçün bir mənzil bilmirəm,
Bu qədər bilirəm ki, ürəkdə sakinsən
Eşqə, onun qövqasına afərin!
Yenə eşq sövdasından bihuş oldum.
Eşq mənə başdan ayağa kimi od vurdu,
Əhsən sənə, ey qanlı eşq, əhsən!
Aləmə hay-küyü eşq salmışdır,
Şirləri eşq zəncirləmişdir.
Suyu və torpağı oda eşq çevirir,
Fələklər xərmənini eşq yandırır.
Şahları aciz və möhtac eşq edir,
Mahmudu Ayaza eşq bağlayır.
Yox, səhv oldu, mən hara, aşiqlik hara?
Eşq hər nalayiqi işindən yüksəkdir,
Eşqbazlıq hər oğulun işi deyil.
Qartalın işi milçəyi əlindən gəlməz.
Aşiqlik susuz Hüseynin işidir,
O, xəncər yarası üçün susuzdur.
O kafirlər din padşahına –
Nizə, qılınc və ox yarası vurduqca,
O, cigər yanğısı ilə deyirdi:
"Dirildim, başqa yara vur!"
Kaş ki, mənim yüz canım olaydı,
Hamısı canana fəda olaydı.
Əfsus, canım bir dənədən artıq deyil,
Dərvişin bundan artıq töhfəsi yoxdur.
O aşiqin beyni boşdur ki,
Dost yolunda özünü parçalaya bilmir.
Beyin nədir, dəri nədir, dost dostdur,
Aşiqlərin məqsədi eynən odur, odur!
Ey camaat, siz də elə bilirsiniz ki,
Mən susuzluqdan cana gəlmişəm?
Mən əgər su istəsəm, yer dəniz olar,
Dünyada torpaq tapılmaz olar.
Mən susuz deyiləm, özüm səlsəbil və Kövsərəm,
Başdan ayağa kimi dirilik suyuyam.
Hökmüm əgər bu dövranın əksinə olsa,
Asiman dayanar, yer hərəkətə gələr.
Ey kafirlər, bu pərdəni yırtın!
Bu solmuş bədəni buraxın!
Bu arıq bədən bizim aramızdadır, baxın! –
Bu pərdəni aradan götürün!
Yox, səhv oldu, bədən də candır,



Əgər diqqətlə baxsan, can da bədəndir.
Görmədin cənnət bağının bülbülü Mövləvi
"Məsnəvi"də necə demişdir:
"Bədən candan və can bədəndən ayrı deyildir,
Lakin heç kəsə canı görmək imkanı verilməmişdir"...

[361] Kitab 103 nəsihətdən ibarətdir.

[362] M: 1836.

[363] *M.F.Axundzadə (1812-1878)* – böyük Azərbaycan yazıçısı, mütəfəkkiri və ictimai xadimi.

[364] *Həsən bəy Məlikov Zərdabi (1837-1907)* – böyük Azərbaycan jurnalisti və maarif xadimi, ilk Azərbaycan qəzeti "Əkinçi"nin (1875-1877) banisi, redaktoru və naşiri.

[365] *Nikolay Alekseyeviç Nekrasov (1821-1878)* – böyük rus şairi, inqilabçı-demokratı.

[366] *İvan Sergeyeviç Turgenev (1818-1883)* – məşhur rus yazıçısı.

[367] *Lev Nikolayeviç Tolstoy (1828-1910)* – böyük rus yazıçısı.

[368] *Anton Pavloviç Çexov (1860-1904)* – böyük rus yazıçısı.

[369] *Zəhra* – İslam peyğəmbəri Məhəmmədin(s.s) qızı, I İmam həzrət Əlinin arvadı.

[370] *Mirzə Əbülhəsən Şəhid (?-1884)* – XIX əsr Azərbaycan şairi.

[371] Tərcüməsi:

Şəhid onun vəfatı ilinə bu misranı dedi:
Hezar ah əzin qamət, hezar əfsus.
*(Bu qamətə min ah, min təəssüf)*

[372] M: 1833.

[373] *Məhəmməd bəy Aşiq (1776-1861)* – Azərbaycan şairi.

[374] Cəfərqulu xan Nəva haqqında bax: *HN, I cild, səh.322-330.*

[375] M: 1839.

[376] Son tədqiqata görə Kərbəlayı Abdulla İbn Canının təvəllüd və vəfatı tarixləri 1777-1838-ci illərdir. *FQ, səh.45.*

[377] *Kərbəlayı Səfi Valeh* – XIX əsr Azərbaycan şairi.

[378] Bu şe'ri Valehə Abdulla İbn Canı yox, Aşıq Qənbər yazmışdır və Valehin cavabı da İbn Canıya deyil, Aşıq Qənbərədir.

[379] Tərcüməsi:

Şuşa məmləkətinin banisi ki, əzəmət və cah-cəlalda
Onun taxtının qübbəsi ayın pərdəsinə tə'nə vururdu,
Yə'ni fələk təmtəraqlı sərkərdə İbrahim xanın ki,
Qapısı dünyanın bütün xanlarının pənahı idi,
Bir parlaq gövhəri vardı.
Onun ay üzünün şüası günəşin başına papaq idi.
O pak Gövhər məscid və mehrabın banisi oldu,
Yüksək behişt əhalisinin hamısı buna şahid oldu.

Dua əhlinin qələmi onun tarixini yazdı:
"Bad peyvəstə Gühər dər sədəfi-lütfüllah".
(*Allahın Kərəm sədəfində Gövhər daimi olsun*).

[380] M: 1832.

[381] *RA, səh.76.*

[382] Tərcüməsi:

Ağa, böyük və yeganə Allah haqqı
Bu söz-söhbətdən əsla xəbərim yoxdur.
Çoxdandır ki, mən heç danışmıram, amma
Zəmanə adamları mənim adımdan danışırlar,
Qartal bir qırqovulu çəngəlinə alanda
Göydəki bütün sərçələr qışqırmağa başlarlar.

[383] Tərcüməsi:

Ey Həsən, ey gözəl sima sahibi, ey gümüş bədənli,
Ey vəfa gülüstanının təzə gülü və yasəməni,
Ey kamal məktəbinin şahanə dəftərinin yazanı,
Ey söz nəzminin mə'nalı dürrlərini aşkara çıxaran,
Ey rəmzləri, sətirlərin sözlərini yazanda
Qələmi Xita müşkünün üzərinə ənbər saçan,
Ey günəş, ey ay, ey təzə gül dəstəsi,
Ey ürəyin taqəti, bədən ruhunun munisi,
Şəksiz-şübhəsiz, sənin məskənin Şəki oldu,
Şəki şəhərində yerin, göyün ayı sənsən.
Ey sözləri gözəl danışıqlı tutiyə bənzəyən,
Sənin məktubunu bizə çatdı, çox şad olduq.
Nə rəvadır ki, bizim Yusifimiz mənim yanımdan uzaq olsun,
Mən də Yaqub kimi beytül-həzəndə* sakin olum?
Nə rəvadır ki, ürək fikir odundan kabab olsun,
Mən də Şuşada ağlayım, nalə eləyim?
Ey qədəminə dürlü göz yaşlarım səpilən
Və sənə bədəndə olan dünyanın canı qurban olan,
Sənin zülfünün və qəminin sövdası başımızda olduğundan
Halımız səhər-axşam pərişandır.
Ya öldür, ya başımıza yolüstu bir kölgə sal,
Ya da mənə de ki, eşq avarəsinin aşiqiyəm,
Yə'ni sənin həsrətindəyəm, məhəbbət və nəvaziş istəyirəm –
Ki, ya sən mənə çatasan, ya mən sənə.

[384] XIX əsr Azərbaycan şairi, Q.Zakirin dostu Baba bəy "Şakir" təxəllüsü ilə şeirlər yazmışdır. *S.Mümtaz. Baba bəy Şakir, Bakı, 1927; FQ, səh.178-184.*

* **Beytül-həzən** – hüzn evi. Dini əsatirə görə, Yaqub peyğəmbərin öz oğlu Yusifin həsrətilə bir guşəyə çəkilib yaşadığı ev



[385] "Tarixim"i əbcədlə hesabladıqda H.1261-ci (M.1845) il alınır ki, bu da Baba bəy Şakirin vəfatı tarixini göstərir.

F.Qasımzadə Şakirin təvəllüd tarixini təxmini olaraq 1869-cu il göstərir. *FQ, səh.181.*

Baba bəy Şakirin Qasım bəy Zakirlə ədəbi varislik əlaqəsi haqqında bax: *Əziz Məirəhmədov, Zakir və XIX əsr Azərbaycan satirası, "Azərbaycan" jurn. 1959, №5.*

[386] S.Mümtaz göstərilən əsərində Baba bəy Şakirin altı mənzum əsərini toplayıb çap etdirmişdir.

[387] M: 1766.

[388] M: 1776.

[389] M: 1834.

[390] *Xeybər* – Ərəbistanda qala. Əli bu qalanı fəth etmişdir.

[391] *Ceyhun* – Amu-Dərya çayının keçmiş adı.

[392] *Lövlak*[ə]... – əgər sən olmasaydın... Dini əsatirə görə, Allah Məhəmmədə xitabla demişdir ki, əgər sən olmasaydın mən heç kimə bir şey yaratmazdım, bütün aləmləri sənin xatirinə xəlq eləmişəm.

[393] *Zülcinah* – İmam Hüseynin atının adı.

[394] Qafiyəyə görə "xət" kəlməsi "xəd" kimi getmişdir.

[395] Tərcüməsi: Bu dünyada axırıncı günündür.

[396] Tərcüməsi: Qalx, Allahın icazəsi ilə qiyamət vaxtı çatıb.

[397] *Mərrix* – Mars planeti; *Ütarid* – Merkuri planeti; *Müştəri* – Yupiter planeti; *Zöhrə* – Venera planeti.

[398] S.Mümtaz Ağabağır Səfərəli oğlunun XVIII əsr Şirvan şairi olduğunu müəyyənləşdirmişdir. *S.Mümtaz. Ağabağır Şirvani. Bakı, 1928.*

[399] *Əsəd bəy Vəzirov* – XIX əsr Azərbaycan şairi.

[400] "Təmyiz" vəznə görə "təmiz".

[401] *RA, səh.58-59.*

[402] *Fir'on* – Qədim Misirdə hakimiyyət sürmüş şahların ləqəbi; *Haman* – Musa peyğəmbərin dövründə Misir Fir'onunun vəziri; *Zöhhak* – "Şahnamə"də zülmkar şah surəti; *Həccac* – *Həccac İbn Yusif əs-Sədəqi (661-715)* – çox zülmkar və qəddar Məkkə hakimi.

[403] M: 1860-cı il.

[404] Tərcüməsi:

Ey boynuəyri dəvə, bilirəm nə etmək istəyirsən,
Halva yemək üçün boynunu uzadırsan.
Səhər duranda qulaq as, elə ki, ölü gördün, coş,
Halva yemək üçün xurcunu çiyninə al.
Allah adamlarının süfrəsi arxasında şeytanı fikrinə gətirmə,
Halva yemək xatirinə qab-qacağını doldur.

[405] *Şeyxi* – Şeyx Əhməd Ehsayinin təsis etdiyi təriqət. Şeyxilər hədislərin həddən artıq çoxluğuna və sözsüz qəbuluna qarşı çıxır, onlara yeni şərhlər verir, sufiliyi və vəhdəti-vücud tə'limini tənqid edirdilər. *İslam ensiklopediyası, çoxcildlik, 11-ci cild, İstanbul, 1970, səh.479-480.*

[406] *Əliqulu* – Zakirin müasiri olmuş dindar Hacı Mirzə Əliqulu. Ərəb dilində bir neçə dini kitabın müəllifidir; *Əbdürrəhim* – Zakirin əleyhdarlarından olan bir axund.

[407] *Adıgözəl – Mirzə Adıgözəl bəy Qarabaği (1780-1848)* – "Qarabağnamə" əsərinin müəllifi.

[408] *İ.F.Kruzenştern* – XIX əsrin ortalarında Qafqaz və Zaqafqaziya Baş İşlər İdarəsinin rəisi.

[409] M.F.Axundzadə bəhsində F.Köçərli bu şe'ri verməmişdir.

[410] *Mirzə Haqverdi Səfa* – XIX əsr Azərbaycan şairi.

[411] *RA, səh.59-60.* Tərcüməsi:

Vəfalı dostlara çoxlu salamım var,
Şə'ninə söylənmiş əcəb gözəl sözüm var.
Bu ərzimdən çəkinmərəm, göz yuması deyiləm,
Çünki sizin yanınızda tam şöhrətim var.
Hərçənd ki, fələyin bu cür dövr etməsindən mat və piyadayıq,
Atı oğru apardı, cilovu əlimdə qaldı.
Bizim Şuşada halalla haram arasında fərq yoxdur,
Əgər qəbul eləsən, yorğa bir Rəxşim var.
Mənim məqsədimin hamısı zarafatdır, sidq ürəkdən deyil,
"Yox" sözümdən qorxmayın.
Ey Nəva, bil, əgər qazini razı salmasan,
Qiyamət gününə kimi səninlə daim mübahisəm var.

[412] *RA, səh.59-60.* Tərcüməsi:

Məhərrəm ayı gəldi, ürəyim ahla doldu,
Ürəyimin tüstüsü göyləri, ayın və günəşin üzünü örtdü;
Bahar buludu kimi fələyi əhatə elədi,
Belə ki, mələk fələkdə keçməyə yol tapmadı.
Cəbrayıl fələklərə gedib-gəlməkdən qaldı,
O, heyrət içində dedi ki, "Allah, sənə pənah!"
Məgər nə oldu ki, sübh yaxasın açdı,
Gecə qara yas paltarı geydi?
Qeybdən səs gəldi ki, "ya Əmin,
Kərbəla səhrasında qətlgaha bir bax,
Bu gün Hüseyn ibn Mürtəzanın qətl günüdür,
Bu gün bütün peyğəmbərlərin matəm günüdür".

[413] Kəndin adı Xındırıstan və Xınzırıstan kimi də yazılır.

[414] Q.Zakirin "Əsərləri"nə (Bakı, 1964. Tərtib edəni: S.Rüstəmov, redaktoru: H.Araslı) əsaslanaraq şairin əsərlərində getmiş səhvlər düzəldilmişdir. Həmin nəşr M.F.Axundzadənin arxivində saxlanılan "Divan" (RƏF, arx.2, Q-2 (15)) əsasında hazırlanmışdır. Bu divan üzərində M.F.Axundzadə redaktə işi apararaq mətndə bir sıra düzəlişlər etmişdir ki, tərtib zamanı divanın düzəlişdən əvvəlki mətni əsas götürülmüşdür.



Göstərilən nəşrin müqəddiməsində tərtibçi "Литература азербайджанских татар" əsərinə əsaslanaraq F.Köçərlinin Zakirin iki divanı olduğunu ancaq eşitdiyini, lakin onlardan heç birini görmədiyini yazır.

Əgər həmin əsəri yazanda F.Köçərli Zakirin əlyazma divanlarından heç biri ilə tanış deyildisə, "Azərbaycan ədəbiyyatı" əsərini yazanda şairin M.F.Axundzadədəki divanından istifadə etmişdir. F.Köçərli yazır "...çox arzu edirik o mərhumun dostu Axundzadə Mirzə Fətəliyə yazdığı divani-əş'arı çap oluna idi, haman səbkü qaydə üzrə ki, şair onu tərtib qılıbdır.

Məzkur divanda çox türfə qəzəllər və gözəl əsərlər vardır ki, cümləsini burada dərc etməyə imkan yoxdur" *HN, I cild, səh.395.*

[415] Bu hadisələrin ətraflı təsvir və izahı üçün bax: *Kamran Məmmədov. Qasım bəy Zakir, Bakı, 1957, səh.23-35.*

[416] Son tədqiqatlarda Konstantin Tarxan-Mouravov kimi verilir.

[417] M: 1855. Son tədqiqata görə, Zakir 1849-cu ildən təqib olunmağa başlamış və 1850-ci ildə Bakıya sürgün olunmuşdur. *Kamran Məmmədov. Göst. əsəri, səh.33.*

[418] TN-də (səh.34) Zakirin hicri 1271 (M.1855) ilə 65 yaşında, RA-da (səh.89) 1271-ci ildə vəfat etdiyi göstərilir.

[419] M: 1854.

[420] Son tədqiqata görə, Qasım bəy Zakir 1857-ci ildə Şuşa şəhərində vəfat etmiş və Mirzə Həsən qəbristanlığında dəfn olunmuşdur. *S.Mümtaz Qasım bəy Zakir, Bakı, 1925, səh.45; Kamran Məmmədov. Göst. əsəri, səh.45; FQ, səh.193.*

[421] Tərcüməsi:

Bu çirkin əxlaq və hərəkətlər tüf!
Bu cür adət-ənənəyə, rəftara tüf!
Zülmkara böyüyə lə'nət olsun,
Cəfakar əmirə tüf!
Əgər Tərxanilər bu cürdürlərsə,
O nacins və murdar nəslə tüf!
O böyük oğula "afərin olsun" ki, valideynlərinə
Xarvar-xarvar tüpürcək qazanar.
O naxələfin zatına, övladına
Ağıllılar lə'nət oxuyar, huşlu-başlılar tüfürərlər.
Əgər düzünü desəm, ona eyib deyil,
Qarabağın arsız əhalisinə tüf!
Zahirdə dost, batində düşməndir,
Tanışa, dosta, bütün pisürəklilərə, tüf!
Sözgəzdirəndən bu sirri gizlətmək lazımdır,
Qorxuram xəbər çatdırsınlar, tüf!
O adam ki, əl yerə qoydu.
Ondan bu cür fitnələr baş verər.

[422] Beyt böyük fars şairi Əbülqasım Firdovsinin "Şahnamə" əsərinin Sultan Mahmud Qəznəviyə həcv hissəsindəndir.

Tərcüməsi:

Şair inciyib həcv deyərsə,
O həcv qiyamətə kimi qalar.

423 *İsmayıl bəy Qutqaşınlı (1806-1869)* – Azərbaycan yazıçısı və hərbi xadimi.

424 *Mixail Petroviç Kolyubakin (1811-1868)* – 28 il Qafqazın müxtəlif yerlərində xidmət etmiş, Bakıda, Şamaxıda və Kutaisidə general-qubernator olmuşdur.

425 *Rəhim bəy Uğurlubəyov* – Mehdiqulu xanın naiblərindən biri. Tiflisdə mayor rütbəsində canişin idarəsində işləmişdir.

426 *Baharlı Mirzə İsmayıl* – Qarabağ atlı dəstəsinin döyüşçüsü. Zakirlə birlikdə Çar hərbi ekspedisiyasında iştirak etmişdir.

427 *Molla Səfi* – şair təbiətli məzəli bir adam olmuşdur. Bəy Baba – şairə Fatma xanım Kəminənin atası, "Fəna" təxəllüsü ilə şeirlər yazmışdır.

428 *İbn Ziyad [Übeydullah]* – ərəb qoşun sərkərdələrindən biri. Kərbəlada Hüseynlə vuruşmuş və onu məğlub etmişdir.

429 *Xandəmirov* – Şuşanın komendantı olmuşdur.

430 *K.D.Uşinski (1824-1870)* – böyük rus pedaqoqu, rus pedaqogika elminin banisi.

431 "Avlabar" deyilən yer nəzərdə tutulur.

432 *Kavus, Söhrab, Fəraməz* – "Şahnamə" qəhrəmanları. *Dəqyanus* – əsatirə görə eradan əvvəl yaşamış zalım yunan hökmdarı.

433 Bəylər və ağaların hüquqları haqqında I Nikolayın fərmanı 1846-cı il dekabrın 6-da verilmişdir. 1847-ci il aprelin 20-də və dekabrın 28-də "Kəndli əsasnamələri" adlanan sənədlər nəşr olunmuşdur. Bir az aşağıda F.Köçərli "Təzə bir zakon" dedikdə "Kəndli əsasnamələri"ni nəzərdə tutur. İstər 1846-cı il fərmanı, istərsə də 1847-ci il "Kəndli əsasnamələri" feodal sinfinin mə'nafeyini güdürdü. *AT, II cild, səh.98-100.*

434 Qasım bəy Zakir 73 yaşında vəfat etmişdir.

435 *Xosrov Pərviz, Fərhad, Şapur* – Nizami Gəncəvinin "Xosrov və Şirin" əsərinin qəhrəmanları.

436 *Əli-allahilər (ələvilər)* – İbn Hüseyrin təsis etdiyi təriqət. Əsas ideologiyası Əlini Məhəmməd peyğəmbərdən üstün hesab edərək, onu Allah kimi tanımaqdır. *Y.A.Belyayev. Müsəlman təriqətləri, Bakı, 1958, səh.85-88.*

437 *Yetər* – Cəfərqulu xanın arvadı.

438 *Abdulla paşa* – Abdulla İbn Canı.

439 *Hidayət* – Cəfərqulu xanın Yetərdən olan oğlu.

440 *Miklaçevski [Aleksandr Mixayloviç Miklaşevski] (1790-1831)* – 1829-cu il martın 17-də 42-ci Yeqor polkuna komandir tə'yin olunmuşdur. Rusiya – Türkiyə müharibəsindən sonra həmin polk Şuşaya gəlmiş və həmişəlik burada yerləşmişdir. 1830-cu ildə Car-Balakəndə ləzgilərin üsyanını yatırmaq üçün göndərilən hissələrə komandanlıq etmiş, 1831-ci ildə Teymurxanşuranın yaxınlığında Çumkeskənddə öldürülmüş və Şuşada basdırılmışdır.

441 *Bağır oğlu Məmməd, Məşədi Hacı, Əliqulu, Müqim* – tibbi təhsilləri olmayan ara həkimləri.

442 *Ərəstu [Aristotel] (e. ə. 384-322)* – böyük yunan alimi və filosofu; *Bokrat [Hippokrat] (e. ə. 460-377)* – məşhur yunan həkimi. Şərq poeziyasında Loğman adı ilə məşhurdur.



443 *"Töhfə"* – Tünkabunlu (İranda kənd adı) Məhəmməd Mö'min Hüseyni tərəfindən yazılmış tibb kitabı.

444 *"Qarabadın"* – həkim Şəfainin əczaçılığa dair kitabı.

445 Bu fikrin doğruluğunu sübut edən bir fakt hələ əldə edilməmişdir.

446 *MƏAD, səh.65.*

447 Son tədqiqatda Şəki xan sarayının tikilmə tarixi 1762-ci ildir. *AT, I cild. səh.414.*

448 *Baron Rozen Qriqori Vladimiroviç (1781-1841)* – general-adyutant, 1831-1837-ci illərdə Qafqazın baş hakimi.

449 *Voronsov Mixail Semyonoviç (1782-1856)* – 1844-1853-cü illərdə Qafqaz ordusunun baş komandanı və Qafqaz canişini.

450 M.F.Axundzadə Tiflis rus teatrında 1852-1853-cü illərdə "Xırsi-Quldurbasan" və "Vəziri-xani-Lənkəran" pyesləri tamaşaya qoyulmuşdur.

451 M.F.Axundzadə sağlığında onun komediyaları haqqında Berlin jurnallarında iki məqalə dərc edilmişdir. Birinci məqalə alman jurnalı "Magazin für die Literatur des Auslandes"in 14 avqust 1852-ci il, 98-ci nömrəsində "tatar komediyaları" başlığı altında, ikinci məqalə isə Müsyö Jordan və dərviş Məstəli şah komediyasının rus dilindən alman dilinə tərcüməsi ilə birlikdə "Arshiw für wissenschaftliche Kinde von Rusland" jurnalının 1852-ci il 11-ci nömrəsində dərc olunmuşdur. Hər iki məqalə və göstərilən komediyanın alman dilinə tərcüməsi imzasız çap edilmişdir. Həmin məqalələrin tərcüməsi "M.F.Axundzadə (Məqalələr məcmuəsi, Bakı, 1962)" kitabına ixtisarla daxil edilmişdir.

452 *Mixail Nikolayeviç* – çar II Aleksandrın kiçik qardaşı, 1862-1882-ci illərdə Qafqaz canişini.

453 *Fuad paşa* – Türkiyənin dövlət xadimi. M.F.Axundzadənin əlifba layihəsi Türkiyədə müzakirə olunarkən əvvəlcə bu islahatı təqdir etmiş, baş nazir olduqdan sonra isə Axundzadəyə kömək etməkdən boyun qaçırmışdır.

454 "Aldanmış kəvakib"i ilk dəfə M.F.Axundzadə özü rus dilinə tərcümə edib "Кавказ" qəzetində (1864-cü il, №№25, 27, 30, 31) "Обманутые планеты" adı ilə nəşr etdirmişdir.

455 *Mirzə Hüseyn xan* – XIX əsrin 30-cu illərində İranın Tiflisdəki baş konsulu, sonralar Fransada İran səfarətxanasının işçisi.

456 *Əli Süavi (1838-1878)* – XIX əsrin ikinci yarısında Türkiyədə qüvvətlənən Tənzimat hərəkatının fəal iştirakçılarından biri. Ərəb əlifbasının islahı tərəfdarlarından olmuş və yeni əlifba layihəsi düzəltmişdi. M.F.Axundzadə bu layihəni bəyənmiş və tənqid etmişdir. *M.F.Axundzadə. Əsərləri, üç cilddə, III cild, Bakı, 1955, səh.54-56.*

457 "Kəşkül" qəzetində M.F.Axundzadənin tərcümeyi-halı ixtisarla verilmişdir.

458 *Görkəmli ədəbiyyatşünas Ə.Ə.Səidzadə (1899-1970)* – Mirzə Şəfi Vazehin tədqiqatçısı. Nəşr etdirdiyi əsərlərində (Mirzə Şəfi Vazeh, Bakı, 1929; Мирза Шафи или Боденштедт, Баку, 1940; Мирза Шафи Вазех, Баку, 1969) şairin nəslən gəncəli olduğunu elmi dəlillərlə sübuta yetirmişdir. Onun tədqiqatına görə, Mirzə Şəfi 1794-cü ildə Gəncədə anadan olmuş, 1852-ci ildə Tiflisdə vəfat etmişdir.

459 *Şeyx Camaləddin Əfğani (1839-1897)* – yazıçı və jurnalist, panislamist ictimai-dini və mə'dəni hərəkatın başçılarından biri; Mirzə Mülküm xan (1833-1908)

– mütərəqqi İran publisist və ictimai xadimi, "Qanun" adlı qəzeti naşiri və redaktoru. M.F.Axundzadədə dost olub onun tə'siri ilə əsərlər yazmışdır.

[460] 1922-ci ilə qədər Mirzə Şəfinin əsərləri Almaniyada "Die Lider des Mirza Schaffi" ("Mirzə Şəfinin nəğmələri") adı altında 169 dəfə dərc olunmuşdur. *А.А.Сеидзаде. Мирза Шафи Вазех, Баку, 1969, səh.79.*

[461] F.Köçərlinin M.Ş.Vazeh haqqında bir-birinə zidd fikirlər söyləməsi onun şairi yaxşı tanımamasından, dərindən öyrənməməsindən irəli gəlir. Uzun müddət alman şairi və mütərcimi F.Bodenştedt (1819-1892) Mirzə Şəfinin əsərlərini alman dilinə tərcümə edib əvvəlcə onun, sonralar isə özünün adı ilə çap etdirmişdir. Son 50 ildə alimlər M.Şəfini dərindən öyrənərək onun haqqında qiymətli əsərlər yazmışlar. F.Bodenştedt isə plaqiatorluqda təqsirləndirilmişdir. Alman alimi (?) Leon Nebentsal ("Sevməyə daha çox əsas var" məqaləsində "Azərbaycan" jurn., 1971, №8) Mirzə Şəfi və Bodenştdet məsələsinə obyektiv mövqedən yanaşaraq alman şairi və tərcüməçisinin xidmətini və səhvlərini düzgün şərh etməyə çalışmışdır. Onun fikrincə Bodenştedt "Mirzə Şəfinin şöhrətini yalnız oğurlamamışdır, həm də Azərbaycan şairinin dünya şöhrəti qazanmasına yardım etmişdir". Bu fikirdə, əlbəttə, müəyyən bir həqiqət vardır.

[462] Son tədqiqatda: 1878-ci il fevralın 26-da. *FQ, səh.106.*

[463] Elmi əsası olmayan iddiadır.

[464] *"Кавказ"*- 1846-1916-cı illərdə Tiflisdə nəşr olunmuş ədəbi, elmi, siyasi-ictimai qəzet.

[465] "Мир Ислама" jurnalının 1913-cü il, II cild, VIII buraxılışında "T" imzası ilə çap olunmuş "Попытки Закавказских мусульман рефермироват свою азбуку" adlı məqalədən aydın olur ki, F.Köçərlinin həmin mövzuda çap olunmamış ikinci bir məqaləsi də olmuşdur.

[466] Tərcüməsi: Əgər islam xalqlarının əlifbası sillabi deyil, alfabiti olsaydı, yazmaq da soldan olsaydı, sivilizasiya aləmində, yə'ni tərəqqi və mədəniyyət aləmində islam xalqları, şübhəsiz, Avropa xalqlarından irəlidə olardılar. Çünki sivilizasiya toxumu ilk əvvəl islam xalqlarının torpaqlarında göyərməyə başlamışdır. Amma islam xalqlarının sillabi əlifbasının çətinliyi üzündən elm və maarif bu xalqların bütün təbəqələri arasında yayılmamış və sivilizasiya toxumu islam xalqlarının torpaqlarında çürüyüb zay olmuş, Avropada isə oranın xalqlarının alfabiti əlifbalarının asanlığı üzündən göyərmişdir.

Min təəssüf ki, islam xalqlarının başçıları öz əlifbalarının dəyişdirilməsinin vacibliyini dərk etmirlər və günəşdən aydın olan bu mətləbi başa düşmürlər. Yeniliklər haqqında, yeni yolların tə'miri haqqında, buxarla işləyən gəmilər, teleqraf telləri çəkmək, yeni hərbi silahlar hazırlamaq və digər bu kimi şeylər ki, əlifbanın dəyişilməsinə nisbətən ikinci dərəcəli işlər hesab olunurlar, onlara meyl edib rəğbət bəsləyirlər. İnsanın belə bir xalqın içərisində yoxluq dünyasından varlıq dünyasına qədəm qoyması, haqqı başa düşdüyü halda öz nadan millətini başa sala bilməyərək kədər və həsrətlə dünyadan getməsi böyük bədbəxtlikdir. İmza: Mirzə Fətəli Axundzadə.

[467] "Şahnamə"nin yazıldığı əruz vezninin mütəqarib bəhri (fəulun, fəulun, fəulun, fəul) nəzərdə tutulur.

[468] Tərcüməsi: "Qafqaz canişininin mütərcimi Kolonel Mirzə Fətəli Axundzadənin 1824-cü ildə öz vəsfi-halına dair dediyi mənzumədir:



Bu daimi olmayan dünyada
Mənim ömrüm kədər və həsrətlə başa çatdı.
Vətən sevgisi üzündən
Çox tədbirlərə əl atdım.
Amma sə'yim bir nəticə vermədi,
Bu əsrdə bir ürək sahibi görmədim.
Türklərin və İran torpağının böyüklərinin
Hamısı Çin xalqı kimi yatmışdılar.
Cavanlığım getdi, qüvvət zəiflədi,
Zövqlü, coşqun həvəsli bir cavan görmədim.
Dəniz yolu ilə Ruma səfər elədim,
Yeni əlifbanı o ölkədə
Bütün dövlət başçılarına göstərdim,
Fikrim çox bişmiş idi, çiy deyildi.
Bir-bir "Yüz afərin!" dedilər.
Dünya gözümdə behiştə döndü.
Mənim rütbəmi daha da ucaltdılar,
Şaha layiq hədiyyələrlə əzizlədilər.
Birdən bir sarı üzlü kişiciyəz*
Mənim arzu piyaləmə zəhər qatışdırdı.
Onun vəzirlərin yanına yolu vardı,
Məni dinin və dövlətin düşməni qələmə verdi.
O natəmiz kişi kimə rast gəldi,
Məni töhmətlə yad edirdi.
O, türkləri qorxuya saldı,
Şura və dövlət başçılarını qorxutdu.
On illik zəhmətim onun sayəsində heç oldu,
Yerdən nələmi göy eşitdi.
"Pak Allah mənim fəryadıma çatsın,
Qiyamətdə ondan mənim qisasımı alsın"**.
Eşitdim ki, atası uşaqlıqda
Qəzvində tüksüz adamlardan biri olmuşdur.
Çarəsiz Rum torpağından qayıtdım,
Orada qalmaq mənim üçün uğursuz idi.
Bu səmərəsiz gediş-gəliş haqqında
Tehrana xəbər göndərdim.
Elmlər nazirinin adına ənbərdən
Ürəkaçan bir məktub yazdım.
Yeni əlifbanı ona nişan verdim,
Onun üçün behiştə yeni bir qapı açdım.
Bilmirəm onun himməti alçaq idi,

* Mirzə Hüseyn xana işarədir

** Bu iki fərd Firdovsi Tusidən götürülmüşdür – Mirzə Fətəli

Yoxsa gecə-gündüz sərxoş olduğuna görə,
Nazir mənə cavab vermədi,
Arzumu həyata keçirməkdə əlimdən tutmadı.
başqa bir nazir də ağzını açıb
Bu məsələ haqqında öz rə'yini bildirmişdi –
Ki, biz İran xalqı kiçikdən-böyüyə qədər,
Atəşpərəstdən xristiana qədər, farsdan türkə qədər
Hamımız zirəkik və mə'rifət sahibləriyik,
Zəkavət üzündən həmişə fikirdəyik.
Yazının çətinliyindən qorxumuz yoxdur.
Çuxurdan çıxmaq üçün kora bələdçi lazımdır.
Heç kəsdən yeni yazı qəbul etmərik,
Bizə öz yazımız, öz fikrimiz kifayətdir.
Sonra bu fikri ilə lovğalanıb
Əli ilə saqqalını tumarladı.
O məclisdə sıra ilə oturanların hamısı
Ona dedi: "Əhsən sənə, ey rə'y deyən!
Doğru sözünə min afərin!
Hikmətdə heç kəs sənə bərabər ola bilməz,
Qəlbin işıqlıdır, sözün sağlam,
Ərəstu sənin dediyini rədd etmək üçün cavab tapmaz".
Təəssüf ki, fərasətli və huşlu şahənşah
Nadanların işindən sakit olur.
Təəssüf ki, ədalətli hakim
Bu əlifbanı başdan-başa görmədi.
Təəssüf ki, onun parlaq dövründə
Abırlı bir vəzir görmədim.
Hamısı tamahkar, hünərsiz, ağılsızdır.
Onların adını kim yaxşılığa çəkər?!
Hərçənd ki, onun dövrünün başlanğıcında Şərqdə
İldırım kimi bir vəzir parladı,
Ancaq o, ruslar ölkəsində vəzirlik edən
Boris kimi bir vəzir idi.
Bütün işləri şahın xəbəri olmadan gördüyü üçün
Ömrü Boris kimi zay oldu.
Həmən rəmzi bu padşah anlarsa,
Onun ömrü günəş və ay kimi olar –
Ki, dövlət millətin pərəstarı olmalıdır,
Nəinki millət dövlətin.
Ey Keyqubadın taxtında əyləşən,
Onun üzərində şahlığın daimi olsun!
Eşitdinmi ki, rus ölkəsində
Himmətlə, namusla, qeyrətlə
Aleksandr rus millətinə nə yaxşılıq etdi,
Ad çıxarmaqda dünyada yeganə oldu?



Eşitdinmi ki, Palmerston
Britaniyalılar üçün nələr etdi?
Vilhelm haqqında, o ağıllı, elm sahibi olan kral
haqqında eşitmisənmi?
Zəhmət və çalışmaqda bir an belə rahatlanmır.
Ona görə də mülkü behişt kimidir.
Bismark haqqında eşitdinmi –
Ki, başını göylərə yüksəltdi?
Onun fikrindən nə kimi tədbirlər baş verdi?
Vətəni uğrunda mübahisə etdi.
Eşitdinmi ki, inişil Haribaldi
Öz ayüzlü arvadı ilə
Nə kimi cəsarətli müharibələr etdi,
Vətənini yadlardan təmizlətdi?
Döyüşlə məşğul olduğu hər yerdə
Ona arvadı arxa oldu.
Sən Linkolnun
Canını millətə necə qurban verdiyini eşitdinmi?
T'yeri eşidibsənmi ki, indi
Onun səksən yaşı var?
Vətəni üçün həmişə kədərlidir,
O, pul və rahatlıq qayğısında deyildi.
Ey padşah, nazirlərin nə etmişlər?
Onların işinə özün vaqif ol!
Nazirlərin nöqsansız bir iş görməmişlər.
Onlar gah qarınlarının, gah da kisələrininin
dərdindədirlər.
Deməli onlar bir arpaya dəyməzlər.
Ey şahlar şahı, onları qapından qov!
Elmli, düşüncəli nazirlər axtar,
Nəcabəti burax, bacarıq axtar –
Ki, məmləkət yeni bəzəklə
İstədiyin qədər bəzənsin.
Yeni əlifbanı işə salsınlar,
Xoşbəxtlik ağacını bara gətirsinlər.
Əziz dostum Ruhülqüdsə xitab!
Çox şikayət elədim, söz uzandı,
Mən bu dünyadan köçürəm, bir daha səni görməyəcəyəm.
Bu işi, bu əzab-əziyyəti başa çatdırmağı
Sənin öhdənə qoydum.

[469] *Sultan Mahmud Qəznəvi* – İranda qəznəvilər sülaləsinin əsasını qoymuş Nasirəddin Səbüktəkinin oğlu. 997-ci ildə taxta əyləşmiş və uzun müharibələrdən sonra Əfqanıstanı, İranın şimal və orta ərazisini, şimali-qərbi Hindistanı işğal edərək böyük bir dövlət yaratmışdı.

[470] *İsmayıl bəy Qasprinski (1851-1914)* – tatar jurnalisti və yazıçısı, "Tərcüman" qəzetinin redaktoru və naşiri.
[471] *"Tərcüman"* – 1883-1916-cı illərdə Baxçasarayda tatar və rus dillərində nəşr oulnmuşdur.
[472] *Nikolay Vasilyeviç Qoqol (1809-1852)* – böyük rus yazıçısı.
[473] *Jan Batist Molyer (1622-1673)* – böyük fransız dramaturqu və yazıçısı.
[474] *Nəcəf bəy Vəzirov (1854-1926)* – məşhur Azərbaycan yazıçısı.
[475] *Əbdürrəhim bəy Haqverdiyev (1870-1933)* – məşhur Azərbaycan yazıçısı.
[476] *Nəriman Nərimanov (1870-1925)* – böyük Azərbaycan yazıçısı, dramaturqu, partiya və dövlət xadimi.
[477] *Cəlil Məmmədquluzadə (1866-1936)* – böyük Azərbaycan yazıçı, dramaturq və jurnalisti, məşhur "Molla Nəsrəddin" jurnalının (1906-1931) naşiri və redaktoru.
[478] Sitat M.F.Axundzadənin 1859-cu ildə Tiflisdə nəşr olunmuş "Təmsilat" ına yazdığı müqəddimədən götürülərək müəyyən dəyişikliklərlə verilmişdir. *Təmsilat, səh.1-4.*
[479] Ə.Haqverdiyev "Xəyalat" əsərini M.F.Axundzadənin 100 illik yubileyi münasibətilə yazmışdır. Pyes 1911-ci ilin dekabrında Bakıda M.F.Axundzadənin anadan olmasının 100 illik yubileyinə həsr edilmiş təntənəli gecədə tamaşaya qoyulmuşdur.
[480] M.F.Axundvun üçüncü dram əsəri olan "Sərgüzəşti-vəziri-xani-Sərab"ın adı bütün əlyazmalarında və ədibin 1859-cu ildə çıxan "Təmsilat"ında bu şəkildədir. Lakin sonralar Mirzə Məhəmməd Cəfər xan Qaracadaği onun əsərlərini farscaya tərcümə edərkən (1871-1874) Axundzadə ondan xahiş etmişdir ki, "Sərab"ı "Lənkəran" ilə əvəz etsin. Çünki bu əsərdəki hadisə dəniz kənarında baş verdiyi halda Sərab dəniz kənarından xeyli uzaqdır. Bundan sonra həmin əsər rus, fars və Avropa dillərində "Lənkəran xanın vəziri" adı il çap olunmuşdur. *FQ, səh.286.*
[481] M: 1851.
[482] M: 1852.
[483] Həmin əsəri M.F.Axundzadə 1851-ci ildə deyil, 1853-cü ildə yazmışdır.
[484] M: 1853.
[485] M: 1856.
[486] Mirzə Məhəmməd Cəfər M.F.Axundzadənin komediyalarını müəllifin müqəddiməsi ilə birlikdə və "Aldanmış kəvakib" əsərini 1871-1874-cü illərdə tərcümə edib 1874-cü ildə litoqrafiya üsulu ilə "Təmsilati-Mirzə Fətəli Axundzadə" adı ilə çap etdirmişdir. *Həmid Məmmədzadə. Mirzə Fətəli axundzadə və Şərq, Bakı, 1971, səh.208-218.*
[487] Qərbi Avropa şərqşünaslarından M.Haqqar və Q.Stranjın fars dilindən tərcüməsi Mirzə Məhəmməd Cəfərin mətni ilə bərabər çap edilmişdir.
[488] *Barbuye de Meynar* – XIX əsr fransız şərqşünası. Azərbaycan ədəbiyyatı haqqında çoxlu məqaləsi vardır.
[489] *"Jurnal Aziatik"* – 1832-ci ildən Parisdə çap olunan jurnal M.F.Axundzadənin "Molla İbrahimxəlil kimyagər" əsəri jurnalın VIII seriya, VII cild, yanvar nömrəsində nəşr olunmuşdur.
[490] Alfons Silye adları çəkilən komediyaları fransız dilinə tərcümə edərək böyük bir müqəddimə ilə 1888-ci ildə "Doux comedies turques de Mirza Feth-Ali Akhoundzade" ("Mirzə Fətəli Axundzadənin iki türk komediyası) adı altında Parisdə çap etdirmişdir.



[491] Vyana Şərq dilləri akademiyasının professoru, doktor Adolf Vurmund həmin komediyanı fransızcadan almancaya çevirib çap etdirmişdir.
[492] *Nikolay İvanoviç Qulak (1822-1899)* – Ukrayna ədəbiyyatşünası. Füzulinin "Leyli və Məcnun" əsərini ilk dəfə rus dilinə çevirmiş, lakin bu tərcümənin yalnız 32 beytini "Kəşkül" qəzetində (11, 14 sentyabr 1887, №54-55) çap etdirə bilmişdir. *А.А.Сеидзаде. Из истории изучения наследия Физули в русском востоковедении, Füzulinin 400 illiyi (Azərbaycan SSR EA Xəbərləri" jurnalının xüsusi nömrəsi). Bakı, 1958, səh.160-163.*
[493] M.F.Axundzadə "Aldanmış kəvakib" povestinin süjetinin qismən İsgəndər bəy Münşinin I Şah Abbasın tarixinə aid "Tarixi-aləmarayi-Abbasi" əsərindən götürmüşdür. *FQ, səh.313; AƏT, II cild, səh.246.*
[494] Tərcüməsi:

Bir ailəyə ki, sən məhrəm olasan,
Vay o ailə üzvlərinin mə'nəviyyatına.

[495] M: 1855.
[496] *Rzaqulu xan Hidayət (1810-1871)* – görkəmli İran tarixçisi, filoloqu və dövlət xadimi, "İctimai tarix" adlı tarixi əsərin, "Riyazül-arifin", "Məcməül-füsəha" təzkirələrinin və "Fərhəngi-əncümənarayi-arifi" adlı izahlı lüğətin müəllifi.
[497] *Süruş Mirzə Məhəmmədəli* – XIX əsr İran şairi. M.F.Axundzadə 1868-ci ildə yazdığı bir məqaləsində (məqalənin əlyazması M.F.Axundzadənin arxivindədir, RƏF, arxiv 2, inv. №87. Yazıçının əsərlərinə "Kritika" başlığı altında salınır) onun "Millət" qəzetində çıxmış qəsidəsini və başqa şeirlərini ciddi tənqid etmişdir. *Həmid Məmmədzadə. Göst. əsəri, səh.222-224.*
[498] Bu yubiley haqqında ətraflı bax: *Nadir Məmmədov. Azərbaycanda ilk ədəbi yubiley, "Azərbaycan" jurn, 1969, №5.*
[499] *Musa Bigiyev (1875-?)* – tatar jurnalisti və ictimai xadimi, "Ülfət", "Vəqt" və "Əlminbər" kimi mətbuat orqanlarında öz yazıları ilə iştirak etmişdir.
Musa Bigiyevin yaradıcılığının istər ideya-məzmununu, istərsə sən'ətkarlıq səviyyəisni nəzərə alaraq F.Köçərlinin bu müqayisəsini müvəffəqiyyətli hesab etmək olmaz.
[500] M.F.Axundzadənin vəfatı və dəfnini görkəmli Azərbaycan jurnalisti, alimi və ictimai xadimi M.Şahtaxtinski (1848-1931) "Yeni əlifba hərəkatının atası" məqaləsində ("Qızıl Şərq" jurn., 1923, №4-5) ətraflı işıqlandırmışdır. *Kəmalə Zeynalova, M.Şahtaxtinski M.F.Axundzadə haqqında, "Bakı" qəzeti, 15 avqust, 1969, №190.*
[501] M: 1907.
[502] *RA, səh.3-4.*
[503] *Yan Qus (1369-1415)* – böyük çex vətənpərvəri, XV əsrin I yarısında çex milli-azadlıq hərəkatının ilhamçısı.
[504] *Martin Lüter (1483-1546)* – Almaniyada dini-feodal istibdadı əleyhinə hərəkatın görkəmli xadimi, protestantizmin banisi.
[505] *Abbas ağa Qaibzadə Nazir* – XIX əsrin sonu XX əsrin əvvəllərində yaşamış Azərbaycan şairi.

[506] İNİ: Bu mənzuməti yubiley günü, dekabrın 22-də 1911-ci sənədə gürcü teatrında Tiflisdə Firidun Köçərli Mirzə Fətəlinin təsvirinə xitabən oxudu və bununla mərasimi-yövmi-ali başlandı.

[507] *Abbas ağa Nazir. Əş'ar (əlyazması), RƏF, B-6408. inv. 3129, vərəq 38-39.*

[508] *Fə sübhanəl-ləzi əsra...* – tə'riflər olsun o kəsə ki, apardı. Qur'anda "Bəni-İsrail" surəsinin başlanğıc kəlmələridir. "Fə" önqoşmasını şair artırmışdır.

[509] *QM, səh.512.*

[510] *QM, səh.512.*

[511] *...[fə] iza caə əcəlühüm...* – ...onda ki, onların vaxtı çatdı (gəldi) ... Qur'anda "Ə'raf" surəsində 32-ci ayənin bir hissəsidir. Ayənin tam mə'nası belədir: hər tayfanın bir vaxtı (əcəli) var, elə ki, onların vaxtı çatdı, nə bir saat tez, nə bir saat gec olar.

[512] Həmin şeir həqiqətən Qasım bəy Zakirin olub, onun əsərlərinə daxildir. *ZƏ, səh.261-263.*

H. Qayıbov onu Molla Qasım Zakirə aid etmişdir.

[513] M: 1820.

[514] M: 1857.

[515] *Vəlleyl[i] iza yəğşa...* – and olsun o gecəyə ki, günəş onu örtər... Qur'anda "Vəlleyl" surəsinin başlanğıc kəlmələridir.

[516] *Ələm nəşrəh...* – Məgər şərh etməmişik?.. Qur'anda "İnşirah" surəsinin başlanğıc kəlmələridir.

[517] *Büraq* – dini rəvayətə görə, Məhəmmədin meraca gedərkən mindiyi atın adı.

[518] *Fəkanə qabə qovseyni ov ədna* – iki kaman qədər, ya daha da az məsafədə oldu. Qur'anın "Nəcm" surəsindən ayə.

[519] *"Yasin"* – Qur'anda 36-cı surənin, *"Taha"* – 20-ci surənin adı.

[520] Son tədqiqata görə, Nəbatinin təvəllüd tarixi təxminən 1812-ci ildir. *FQ, səh.358.*

[521] *ND, səh.34.*

[522] Son tədqiqatda Nəbatinin vəfatı tarixi 1873-cü ildir. *FQ, səh.360.*

[523] *ND, səh.78.*

[524] *ND, səh.58.* Divanda bu şeir aşağıdakı şəkildə verildiyi üçün F.Köçərli onu yazılış şəklinə görə "şe'ri-müstəzad" adlandırmışdır:

Dövri-çərxdən olmuşam əlil, dizdə taqətim, gözdə nur yox,
Bir nəzər əya, şahi-"lafəta", bu Nəbatiyi-binəvayə bax!

Divanda və şairin "Əsərləri"ndə (Bakı, 1968) bu şeir çarpalar sırasına daxil edilmişdir.

[525] *ND, səh.50.*

[526] *ND, səh.54.*

[527] *ND, səh.55.*

[528] Son tədqiqatda göstərilir ki, Nəbati "Möhtərəmoğlu" ləqəbilə şeir yazmamış, atası həmin ləqəblə tanınmış ruhani olduğu üçün şair bə'zi əsərlərində özünə belə müraciət etmişdir. *FQ, səh.358.*

[529] *ND, səh.139.*

[530] *ND, səh.4-5.* Tərcüməsi:

Dünya binasının yaranması Əlinin adındandır.
Peyğəmbərin dini qanunları Əlinin qılıncının gücündəndir.



Dünya meyxanası onun varlığından mövcuddur.
Meyin üzünün suyu (abrusu) Əlinin qızılgül rəngli
piyaləsinin şərabındandır.
Bu naxış nə zinət misilsiz bir sən'ətkarındır,
Yoxsa Leyli və Məcnunun eşq dəfləridir?!
Onun hər vərəqi behişt bağından gözəldir,
Onun hər nöqtəsi gizlində saxlanılmış incinin
sandıqçasındandır.

Zəmanənin seyrindən və fələyin dövründən
Mənim divanım sıradan çıxar,
Leylinin zülfünün əzabından şiddətli,
Məcnunun halının sözündən dağınıq.
Bu damcı nəqqaş Maninin qələmindəndir,
Yoxsa avara aşiqin müşkünün parçasıdır?!
Nəbatinin gövhər saçan təb'inə əhsən –
Ki, o, cəmmaş bütünün üzündən ürəyaçandır.

[531] *ND, səh.11.*Tərcüməsi:

Ey şah, ey şəhriyar, mən binəvanı
Nurlu günəş kimi lütfünlə bəzə.
Ey Cəm saqisi, şad və sevincək olasan,
Sənə fəda olum, gəl, şərab gətir.
Gül kimi şərab ver, bülbül kimi oxu –
Ki, kamın hasil oldu, arzuna çatdın.
"Əli" çağır, "Əli" çağır, "Əli" axtar, "Əli" axtar,
"Hu-hu"ya çatanda bu addan keç.
Nəbati, "Əli" çağır ki, nicat tapasan,
Nə qədər ki, həyatdasan onun adını əzbər oxu.

[532] *Əsədullah Əbutalib Əliyyül-Mürtəza* – Əlinin ləqəbi.

[533] Divanda bu beyt üzərində (divanın öz katibi tərəfindən) düzəliş edilmişdir və bu, ehtimal ki, F.Köçərlinin nəzərindən qaçmışdır:

"Sövti' Davudi" eylədim zahir,
"Ləhni-İdrisi" eyləyim inşa.
Gəh "mübərqə", gəhi "Nişaburi"
Gəh "Hüseyni", gəhi "Zəminxara".

[534] *"Şur", "Şəhnaz", "Sövti'-Davudi", "Hüseyni", "Zəminxara", "Nəva", "Raki-novruzi"* – Şərq musiqisində muğam adları.

[535] *ND, səh.12-14.*

[536] Tərcüməsi:

Ey aşiqlər sizə qurban olum,
Siz toplaşıb durmusunuz, onlar isə öz əhlərinə vəfa edirlər.

[537] *ND, səh.21-22.*
[538] *ND, səh.14.*
[539] *ND, səh.27-28.*
[540] Tərcüməsi: Ərş məqamlı şahın tə'rifidir; başqa tə'rif yoxdur.
[541] *ND, səh.30-31.*
[542] *Şəms Təbrizi* – XIII əsr Azərbaycan şairi.
[543] *ND, səh.15-16.*
[544] *ND, səh.8.*
[545] *ND, səh.110.* Tərcüməsi:

Hafizin deşdiyi incilər fərəh gətirir,
Hafizin yatmış xəzinəsi məni dövlətləndirdi.
Hafizin qoşduğu şeir mənim qəlbimin qüssəsini aparar,
Asimanda Hafizin sözünü eşidən Zöhrənin Məsihi
Rəqsə gətirməsi təəccüblü deyil.

[546] Tərcüməsi:

Nə xəstə, nə həkiməm, hələ ləng, ləng, ləngəm,
Nə dost, nə düşmənəm, hələ ləng, ləngəm.
Nə kədərli, nə şadam, nə gizli, nə aşkaram,
Nə torpaqdanam, nə küləkdən, hələ ləng, ləng, ləngəm.
Nə qönçə kimi açılmaqdayam, nə qəmini ürəyimdə gizlətmişəm,
Nə "hə", nə "yox" eşitmişəm, hələ ləng, ləng, ləngəm.
Nə "şərabi"yəm, nə "bəngi", nə müğənniyəm, nə çəngi,
Nə "xəyali"yəm, nə "rəngi", hələ ləng, ləng, ləngəm.
Nə bostan yoldaşıyam, nə gülüstana yaxınam,
Yarın məhəlləsinin itiyəm, hələ ləng, ləng, ləngəm.
Nə ulduzam, nə ayam, nə gədayam, nə padşaham,
Bu iki yolun arasındayam, hələ ləng, ləng, ləngəm.
Nə yerəm, nə göyəm, nə bundanam, nə ondanam,
Nə məkansız yerdənəm, hələ ləng, ləng, ləngəm.
Nə pəri, nə cin, nə insanam, nə filan, nə behmanam,
Nə mələk, nə huri-qılman, hələ ləng, ləng, ləngəm.
Nə mədənəm, nə xəzinəyəm,
Nə mənəm, nə mən mənəm mən, hələ ləng, ləng, ləngəm.
Nə cavanam, nə qocayam, nə kamanam, nə oxam,
Nə kiçiyəm, nə böyüyəm, hələ ləng, ləng, ləngəm.
Nə lə'ldən az qiymətliyəm, nə az səfalı dürrəm,
Nə nəvayam, nə nəvasız, hələ ləng, ləng, ləngəm.
Nə "hüluli"yəm, nə "dəhri", nə "kənari"yəm, nə "bəhri",
Nə "riyazi"yəm, nə "cəfri", hələ ləng, ləng, ləngəm.
Nə münəcciməm, nə kahin, nə mədhiyyəçilərin sehrkarıyam,
Nə əkinçilərə gəvahın, hələ ləng, ləng, ləngəm.
Nə nəbatiyəm, nə bəngi, nə barışanam, nə davakar.
Nə məcusam, nə firəngi, hələ ləng, ləng, ləngəm.



[547] *Lafəta illa [Əli la seyfə illa Zülfüqar]* – Əlidən başqa cavan, Zülfüqardan başqa qılınc yoxdur.

Dini rəvayətə görə, guya Əli Xeybər müharibəsində Mərhəb adlı nəhəng bir pəhləvanla vuruşaraq onu Zülfüqar adlı qılıncı ilə iki bölmüş və bu zaman göylərdən həmin sədalar eşidilmişdir.

[548] *ND, səh.90-91.* Füzulinin məşhur:

Öylə sərməstəm ki, idrak etməzəm dünya nədir,
Mən kiməm, saqi olan kimdir, meyi-səhba nədir.

– mətləli qəzəlinə nəzirədir.

[549] Tərcüməsi:

Gündüzlər mənim fikrim, bütün gecələr sözüm budur –
Ki, nə üçün öz ürəyimin halından xəbərsizəm?
Haradan gəlmişəm, gəlməyim nə üçündür,
Axırda hara gedəcəyəm? Vətənimi göstərmirsən.
Qulağımda kimdir ki, o, səsimi eşidir,
Ya ağzımda kimdir ki, danışır?
Gözümdə kimdir, gözümdən kim bayıra baxır,
Ya da [olmaya] ona köynək olduğum candır ki, [bunu mənə] demirsən?
Mən bura özbaşıma gəlməmişəm ki, özbaşıma da gedim,
Məni bura gətirən yenə vətənimə aparar.
Elə fikirləşmə ki, mən öz xoşuma şeir deyirəm,
Nə qədər ki, huşluyam və oyağam, bir nəfəs belə çəkmərəm.
Şəms Təbrizi, əgər bizə tərəf üz çevirsən,
Vallah, bu murdar qəlibi əzişdirərəm.

[550] *Elmi-lədünni* – fitri iste'dad sayəsində adamın özünün qazandığı elmi bilik.

[551] *...səmi'na...* – eşitdik; dərsi-səmi'na – eşitməklə öyrənilən elm. Qur'anın "Bəqərə" surəsindən bu ayəyə işarə edilir: *Vəsməu, qalu, səmi'na* – Eşidin! – dedilər, eşitdik. Guya Musa peyğəmbərin yanında olanlar Tur dağında Allahla söhbəti zamanı ona gələn nidanı eşidirlər.

[552] *...övfa – ...vəfa elədi. Qur'anın "Ali-İmran" surəsindəki bir ayədən.*

[553] *...ləntərani...* – ...məni görə bilməzsən... Qur'anın "Əraf" surəsindəki bir ayədən. Guya Musa peyğəmbər Tur dağının başında Allaha müraciət edib deyir ki, ey mənim Allahım, səni görmək istəyirəm; nida gəlir ki, məni heç vaxt görə bilməzsən. Çünki Allah gözdə dərk olunan vücud deyil.

[554] *Bismillah...* – Allahın adı ilə... Qur'anda bütün surələr bu sözlə başlanır.

[555] *Həmd* – Qur'anın birinci surəsidir.

[556] *Fərəzdəq [Əbu Nüvas Həmmali ibn Ğalib]* – VII əsrin sonu – VIII əsrin əvvəllərində Kufədə yaşamış məşhur ərəb şairi.

[557] *Ənəlhəq* – Allah mənəm. Bu məşhur ifadə Mənsur Həllacındır. Buna görə də o, dara çəkilmişdir.

Bu ideya hürufilik dini-fəlsəfi və ədəbi-cərəyanında, o cümlədən İmadəddin Nəsiminin yaradıcılığınad böyük yer tutur.

[558] *Zəmzəm* – Məkkədə quyu; *Səfa* – yenə orada yer adı.

[559] *Şəmsi-vəzzüha* [*Vəşşəmsi və zühaha*] – and olsun günəşə və onun isti nahar vaxtına (gündüzünə). Qur'anda "Şəms" surəsinin ilk kəlmələridir.

Təfsirlərdə yazıldığına görə burada "günəş" dedikdə Peyğəmbər, "isti nahar vaxtı" dedikdə isə onun peyğəmbərlik dövrü nəzərdə tutulur. Nəbatinin "Şəmsi-vəzzüha" ifadəsi isə dini rəvayətə görə 12-ci imam kimi "zühur" edəcək Mehdiyi-Sahibəzzamana aiddir. Şair onun "zühuru"nu arzu edir.

[560] *Mahmud* – Sultan Mahmud Qəznəvi; Əyaz isə onun qulu Əyaz öz ağlı, kamalı və fərasəti ilə Sultan Mahmudun diqqətini cəlb etmiş və nəticədə onun ən sevimli, istəkli adamı olmuşdur.

[561] M: XVIII əsrin axırları.

[562] *Habil və Qabil* – Adəmin övladları. Əfsanəyə görə Adəmin ömrü sona yetəndə Allah tərəfindən ona əmr olunur ki, oğullarından birini yerində vəsi' qoysun. Qardaşlar arasında narazılıq olmasın deyə Adəm onlara təklif edir ki, hərəsi bir qurbanlıq götürüb dağa getsinlər. Onların hansının qurbanını od yandırarsa, o, onun yerində vəsi' olacaqdır. (Rəvayətə görə o zamanlar bir dağ varmış ki, ora qurban aparırmışlar. Əgər göydən od, yaxud ildırım gəlib qurbanı yandırsaymış həmin qurban qəbul olunarmış). Qardaşlar da belə edirlər. İş elə gətirir ki, Habilin qurbanı qəbul olunur. Elə Adəm də öz yerində vəsi' olmağa onu nəzərdə tutmuşdu. Bunu görən Qabil həsəddən öz qardaşının başına daş salıb onu öldürür.

[563] *Rəhman* – Allahın ləqəblərindən biri.

[564] *Təhəmtən* – "Şahnamə" qəhrəmanı Rüstəmin ləqəbi.

[565] Tərcüməsi:

> Biz heçik, cahan heç, qəm və şadlıq heçdir,
> Heçlik üçün narahat olmaq xoş deyil.

[566] Hüdhüd deyiləm, şəhri-Səbadan xəbərim var.

Rəvayətə görə Süleyman peyğəmbər quşların dilini bilirmiş. Onun qərargahında bütün quşların nümayəndəsi olarmış və hər quşun özünəməxsus yeri varmış. Bir gün Süleyman bütün quşları nəzərdən keçirərkən görür ki, hüdhüdün (şanapipik) yeri boşdur. Hüdhüdün izinsiz getməsi Süleymanı əsəbiləşdirir. O and içir ki, hüdhüd qayıdanda ona şiddətli cəza verəcəkdir. Bir qədərdən sonra hüdhüd qayıdır. Süleyman ondan harada olduğunu soruşduqda hüdhüd cavab verir ki, Səba şəhərinə uçmuş və orada bir səltənət tapmışdır. Həmin dövlətin padşahı Bülqeys adlı gözəl bir qadındır və camaatı günəşə sitayiş edir. Süleyman hüdhüdün günahından keçir. Sonra Süleyman Bülqeysə məktub yazıb ona günəşə sitayiş etməkdən əl çəkib onun dinini qəbul etməyi təklif edir. Bülqeys bu təklifi qəbul edir və nəticədə Süleyman peyğəmbər Bülqeyslə evlənir.

[567] *Əbdülhəqq Hamid* (*1851-1937*) – klassik türk şairi, dramaturqu və dövlət xadimi.

*Əbdülhəqq Hamid. Külliyati-asar. İbn Musa. İstanbul. H.1335. səh.352-353*

Son iki beytin ikinci misraları Ə.Hamiddə:



> Cismən o, fəna bulsa da ismində baqa var.

və

> Musa denilir ortada bir seytü səda var.

[568] *Əməntu billah* – Allaha əmin (arxayın) oldum. Mö'min müsəlmanlar, xüsusilə səfərə çıxanlar bu duanı oxumaqla özünü Allahın sərəncamına verib, ona arxayın olduğunu bildirirlər.

[569] Mustafa ağa Nasirin:

> Könül, gəldi gül əyyami, güzər eylə gülüstanə,
> Ki, onda bülbüli-təb'in gətirsin qönçə dastanə.

– mətləli qəzəli nəzərdə tutulur.

Əsgər Şirvaninin bu qəzəli Füzulinin məşhur:

> Vəfa hər kimsədən kim, istədim, ondan cəfa gördüm,
> Kimi kim, bivəfa dünyada gördüm, bivəfa gördüm.

– mətləli qəzəlinə nəzirədir. Ehtimal ki, F.Köçərli Füzulinin həmin qəzəlinə rast gəlməmişdir.

[570] Buradan aşağıdakı iki misra düşmüşdür:

> Qaldılar bidərdlər, həmdərdü həmta getdilər,
> Rövnəqü arayişi-bazari-dünya getdilər.

[571] *"Vərqa və Gülşa"* – XVIII əsr Azərbaycan şairi Məsihinin əsəridir. Deməli, F.Köçərli bu əsərdən xəbərsiz olmuşdur.

[572] Bu qəzəl Qaibovun "Məcmuə"sində Asəf Şirvaninin adına getmişdir. Ümumiyyətlə, RA-da Asəf Lənbəraninin adına verilmiş əsərlərin hamısı Qaibovun "Məcmuə"sində Asəf Şirvaniyə aid edilmişdir və bu məcmuədə Asəf Lənbərani adlı şairə rast gəlmirik.

[573] Tərcüməsi:

> Öz qəzəlimin içində gizlənəcəyəm ki,
> Sən oxuduqda dodağından öpüm.

[574] Son tədqiqata görə, İmadəddin Nəsiminin təvəllüd və vəfat tarixləri təxmini olaraq 1369-1417-ci illərdir. *İmadəddin Nəsimi. Əsərləri. üç cilddə. I cild. Bakı. 1973. səh.6.*

[575] M: 1816.

[576] M: 1839.

[577] M: 1845.

[578] Tərcüməsi:

> Hüzura gətirdiyim bu qəm artıran sözlər
> Məndən Əliəkbərə yadigardır.
> Ürək qanından başıma çox sağər (qədəh) çəkdim.
> Odur ki, onun tarixi "sağər"dir.

"Sağər"i əbcədlə hesabladıqda H.1261-ci il alınır.

[579] Tərcüməsi:

Nə qəlbində taqət var,
Nə görüş fürsəti.
Nə görüş fürsəti var,
Nə də qəlbində taqət.

[580] Şeyx İbrahim Qüdsinin göstərilən əsərlərindən heç biri hələlik əldə edilməmişdir.

[581] M: 1865.

[582] *Küntü kənzən [məxfiyyən]* – mən bir gizli xəzinə idim.

Dini rəvayətə görə Allaha isnad verilən bu hədisin məzmunu: Mən gizli bir xəzinə idim, istədim ki, məni tanısınlar. Buna görə insanları xəlq elədim (yaratdım) ki, bu xəzinə gizli qalmasın. Məni tanıyıb ibrət alsınlar.

[583] M: 1868.

[584] *Mirzə Sadıq Fani (1839-?)* – XIX əsr Azərbaycan şairi.

[585] Tərcüməsi:

Ey səndən camaat ədəb tə'limi alan
Və ey əsl-nəsəbləri sirli mə'nalardan xəbəri olan,
Əgər sənin elm və biliyindən mənim Xəlilimə nəsib olsa,
Onun üçün od nura çevrilir, çünki Allahlar Allahısan.

[586] Tərcüməsi:

İlahi, məbada dünyada bir kəs əlil olsun,
Hər kəs ki, qoca və əlil oldu, onda xar və zəlil olur.
Su qədəhdə çox qalarsa, bulanar,
Kişi çox yatarsa, əlbəttə, əzgin olar,
Mənim şe'rimdə qafiyədə irad axtarma,
Burada sənin qafiyəndən "əmil" sözündən başqa
heç nə yoxdur.

[587] Tərcüməsi:

Nəzm silkində məni şeir Allahı adlandırırsan,
Mən xoştəb' şairin zəlil quluyam,
Gecə-gündüz bu fani dünyadan uzaqlaşmağa çalışıram.
Amma Musa və Xəlil boynuma kəndir salmışlar.

[588] Çarizm nəzərdə tutulur.

[589] Ə.Haqverdiyevin "Molla Nəsrəddin" jurnalında (1907, №№3-7, 12, 13, 18, 21-22) "Xortdan" imzası ilə çap etdirdiyi "Cəhənnəm məktubları" əsəri nəzərdə tutulur.

[590] Abbas ağa Nazirin "Molla və şeytan" mənzum hekayəsi 1911-ci ildə Tiflisdə nəşr edilmişdir.



## KİTABDAKILAR

**FİRİDUN BƏY KÖÇƏRLİ**

**AZƏRBAYCAN ƏDƏBİYYATI**

İKİ CİLDDƏ

I CİLD

"AVRASİYA PRESS"
BAKI-2005

